# QOCALIĞIN MÜBARƏK!

*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun “Tarixin nəzəriyyəsi, mənbəşünaslıq və tarixşünaslıq” şöbəsinin müdiri, tarix elmləri doktoru, professor* ***Şahin Fazil oğlu Fərzəliyevin*** *doğumunun 80 illiyinə həsr olunur.*




BAKI–2021

*Azərbaycan Milli Elmlər akademiyasinin A.A.Bakıxanov adına Tarix İnstitutunun Elmi Şurasının 01.03.2021 tarixli 2 saylı qərarı ilə çap olunmuşdur.*

**Redaktor:** **Eynulla Mədətli**
*AMEA Fəlsəfə və Sosiologiya İnstitutunun icracı direktoru, tarix elmləri doktoru, Fövqəladə və səlahiyyətli səfir*

**Şahin FAZİL.** QOCALIĞIN MÜBARƏK!
Bakı: 2021, – 696 səh.

*“Tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyevin (Şahin Fazil) doğumunun 80 illiyinə həsr olunmuş bu iri həcmli toplu onun yaradıcılıq nümunələrini özündə bütünlüklə əks etdirmirsə də, bu alim-şair haqqında onu yaxından tanıyan və yaradıcılığını təqdir edib qiymətləndirən elm xadimləri və ədəbiyyatşünasların elmi-ədəbi fikir və düşüncələrini özündə ehtiva edir.*

*Hazırkı nəşr həm elmi-ədəbi ictimaiyyət, həm də geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.*

**ISBN** 978-9952-541-17-5

# MÜNDƏRİCAT

## ŞAHİN FAZİL, QOCALIĞIN MÜBARƏK!

*Qocalığın şəkəri var, qəndi var,*
*Şahin Fazil, qocalığın mübarək.*
*Qoca olub cavan qalmaq fəndi var,*
*Şahin Fazil, qocalığın mübarək!*

*İlhamındır, bir masadır, qələm, sən,*
*Əl çəkmirsən qələmdandan, qələmdən,*
*Neçə Divan yazacaqsan hələm sən,*
*Şahin Fazil qocalığın mübarək!*

*Şeir pərin harayına müntəzir,*
*Təbin müdam təzə sözə tələsir,*
*Nəzərlərin işıq gəzir, nur gəzir,*
*Şahin Fazil qocalığın mübarək!*

*Bu yaşda da neçə-neçə səfər, sən...*
*Qoca səyyah, yorulmadın məgər sən?*
*Qalmıramsa cavan kimi səfərdən*
*Şahin Fazil qocalığın mübarək!*

*Gözəllərə gözəl-gözəl qəzəllər...*
*Incə-incə, özəl-özəl qəzəllər...*
*Yayınmayır gözlərindən gözəllər,*
*Şahin Fazil qocalığın mübarək!*

*Göz qoyuram: Bu qocadır, bu qarı...*
*Zülfə qonub cavanlığın buxarı,*
*Ağ saç imiş qocalığın vüqarı,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Dönə-dönə alqışlayın qocanı,*
*Mən xoşladım, siz xoşlayın qocanı,*
*Deyingənsə, bağışlayın qocanı,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Hərdən fərəh, hərdən qəmdi qocalıq,*
*Gözdə olan nurdu, nəmdi qocalıq,*
*Hər ömürdə bir aləmdi qocalıq,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Qocalığı sən ki, fürsət bilirsən,*
*Hər gününü ömrə nemət bilirsən,*
*Hər adama deyil qismət, bilirsən,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Cavan gördün, vallah sevib qocanı,*
*Qoca gördün, billah sevib qocanı,*
*Qocalıbsa, Allah sevib qocanı,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Hafizəndə fərəh yaşar, qəm yaşar...*
*Yaxın oba, uzaq ölkə, çox diyar...*
*Əf+qanıstan yaddaşında bərqərar*
*Şahin Fazil, qocalığın mübarək.*

*Şeirin, elmin, qalaq-qalaq işlərin...*
*Yaş səksəndir, ürək isti, baş sərin,*
*Şahin Fazil, qocalığın afərin,*
*Şahin Fazil, qocalığın mübarək!*

*Saf qəzəlin bayraq tutan əlisən,*
*Havalısan, divanəsən, dəlisən,*
*Cavanlıqdan əl çəkməyən zəlisən,*
*Şahin Fazil qocalığın mübarək!!!*

*Azərbaycan Yazıçılar Birliyi*

## ŞAHİN FAZİL – 80

Azərbaycan Yazıçılar Birliyi— tanınmış şair, şərqşünas, mütərcim, alim və ziyalımızı 80 yaşı münasibəti ilə təbrik edir, yaradıcılıq yolunda daha böyük müvəffəqiyyətlərə çatmanızı diləyirik.

Quba şəhərində orta məktəbi 1958-ci ildə bitirdikdən sonra Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin fars dili şöbəsində təhsil almış, o zaman Tələbə Elmi Cəmiyyətinin üzvü olmuş, təhsil ilə yanaşı poeziyada öz qələminizi sınamış, klassik fars şairlərinin poetik nümunələrini dilimizə tərcümə etməyə cəhd etmisiniz. Ali məktəbin beşinci kurs tələbəsi olarkən SSRİ Iqtisadi Əlaqələr Dövlət Komitəsi tərəfindən Əfqanıstana tərcüməçi sifətilə ezam olunmuş (1963), orada bir il işlədikdən sonra müvəqqəti olaraq, Bakıya qayıdaraq dövlət imtahanlarını əla qiymətlərlə vermiş və yenidən həmin ölkəyə dönərək Şibirqan əyalətinin Səripol adlı şəhərində (Çin ilə həmsərhəd) daha 2 il əmək fəaliyyətində olmusunuz. 1966-cı ildə öz ilk xarici səfərindən qayıdaraq, təhsil aldığınız fakültədə dekan müavini vəzifəsində işləmiş, 1968-ci ildə Azərbaycan Elmlər Akademiyası Tarix İnstitutunun Aspiranturasına daxil olmuş, lakin yenidən Əfqanıstana ikinci dəfə göndərilmiş və tərcüməçilik fəaliyyətinizi davam etdirmisiniz. 1970-ci ildə Vətənə qayıdaraq 3 il AMEA Tarix İnstitutunun əyani aspirantı olmuş, bu müddəti başa vurduqdan sonra "Azərbaycanın orta əsrlər tarixi" şöbəsində elmi işçi vəzifəsində çalışmış, 1974-cü ildə azərbaycanlı salnaməçi Həsən bəy Rumlunun məşhur "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") adlı kitabını fars dilində qələmə alan Azərbaycanlı tarixçi Həsən bəy Rumlunun bu qiymətli salnaməsi əsasında XVI əsr mənbələrinin araşdırılmasına başlayaraq, yazdığınız dissertasiyanı müvəffəqiyyətlə müdafiə etmiş və tarix elmləri namizədi adına layiq görülmüsünüz.

1970-78- ci illər arasında Respublikamızın və bir sıra xarici ölkənin müxtəlif elmi orqanlarında orta əsrlər tariximizlə bağlı çoxsaylı məqalələriniz işıq üzü görmüşdür. Siz əfqan yazıçı və şairlərinin əsərlərini dilimizə çevirərək Bakıda, Azərbaycan müəlliflərinin yaradıcılıqlarından nümunələri isə Kabul şəhərində nəşr etdirmisiniz.

1978-82-ci illərdə Əfqanıstan hökmətinin dəvəti ilə yenidən Əfqanıstana qayıtmış, əvvəlcə həmin ölkənin müxtəlif nazirliklərində, sonradan isə Nazirlər Şurasında fəaliyyət göstərmisiniz. Qeyd olunmalıdır ki, beş il davam edən

üçüncü ezamiyyətiniz dövründə ölkəmizin bir sıra Azərbaycan ədiblərinin (Nəriman Həsənzadə, Nəbi Xəzri, Sabir Rüstəmxanlı, Xalidə Hasilova, Əhməd Elbrus, Zülfüqar Şahsevənli, Rüzgar Əfəndiyeva və s.) şeir və hekayələrini fars dilinə çevirərək Kabul şəhərindəki müxtəlif qəzet və jurnallarda çap etdirmisiniz.

Siz 1983-85-ci illərdə Elmlər Akademiyası Tarix İnstitutu Orta Əsrlər tarixi şöbəsində üç il baş elmi işçi vəzifəsində işləmiş, lakin yenidən Əfqanıstana dəvət olunaraq dördüncü dəfə ixtisasiniz üzrə tərcüməçilik fəaliyyətinizi davam etdirmiş, ölkənin Baş Naziri və SSRİ-nin oradakı Baş Müşavirinin mütərcimi olmuş, Əfqanıstanın üç Dövlət Medalı və SSRİ-nin Fəxri Fərmanları ilə təltif olunmusunuz.

Uzunmüddətli ezamiyyətlərə son qoyaraq Vətənə qayıtdıqdan sonra 1996-ci ildə "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" adlı doktorluq dissertasiyanızı müdafiə etmiş, 2004-cü ildə isə professor elmi diplomuna layiq görülmüsünüz.

Elmlər Akademiyasında işləməklə yanaşı illərlə ölkəmizin müxtəlif dövlət Universitetlərində (Bakı, Lənkəran, Sumqayıt) mühazirələr oxumuş, bir neçə Elmi Şuranın üzvü olmuş, on üç dissertasiya işinə rəhbərlik etmiş, onlarla dissertantin elmi opponent olmusunuz.

Sizin ədəbi fəaliyyətiniz də təqdirə layiqdir. Belə ki, Azərbaycanda XX əsrin ilk mətbu "Divan" kitabını yazmış və çap etdirmisiniz (1996). Indiyədək daha üç divanınız işıq üzü görmüş (2005, 2008, 2014-cü illərdə) və "Beşinci Divan" kitabınız nəşriyyata təqdim olunmuşdur.

Siz XIX əsrdən sonra ölkəmizdə təzkirəçilik ənənəsi unudulmuş olan ilk təzkirə kitabı yazmış və onu "Təzkireyi-Şahin" ("Şahinin təzkirəsi") adı ilə çap etdirmisiniz (2005). Hazırda 140 yaşlı "Məcməüş-şüəra"("Şairlər məclisi") adlı məclisin sədrisiniz və müasir şairlər tərəfindən əruz vəzninin daha da inkişaf etdirilməsində sizin xidmətiniz böyükdür. 50 ildən çoxdur ki, tədqiqatlarnızda şəhərlərimizin tarixi əsas yerlərdən birini tutur və siz ölkəmizin Şəki, Şamaxı, Qubadlı, Zəngilan həmçinin Quba bölgəsi haqqında dolğun söz deməyə çalışmısınız, "Quba tarixi" adlı böyük həcmli kitabınızın ikinci təkmilləşdirilmiş nəşri "TEAS-PRESS Nəşriyyat Evi" tərəfindən 2016-ci ildə çap olunub oxucu istifadəsinə verilmişdir.

Siz "XV əsr Azərbaycan dövlətlərinin quruluşu" adlı əsəri ərsəyə gətirib həmin dövrdə mövcud olmuş Azərbaycan Qaraqoyunlu, Ağqoyunlu və Şirvan dövlətləri haqqında xüsusi məlumat vermisiniz (2003).

Tarixi mənbələrin tərcüməsi sahəsində də zəhmətiniz önəmlidir. Böyük Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin (1560-1634) "Tarixe-aləmaraye-Ab-

basi" ("Dünyanı bəzəyən Abbasın tarixi") adlı iki böyük hissədən (üç cild) ibarət dünyada məşhur olan kitabını fars dilindən tərcümə edərək oxucu istifadəsinə vermisiniz (2010-2014). Bundan sonra da tərcümə sahəsindəki fəaliyyətinizi dayandırmamış və digər bir tarixçi Həsən bəy Rumlunun iki cildlik "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") kitabının tərcüməsini bitirmiş və çapa təqdim etmisiniz. Məlumdur ki, fars və osmanlı mənbələrinin tərcüməsi sahəsində də qələm işlətmiş 1722-ci ildə Səfəvilər Dövlətinin süqut tarixinə dair yazılmış Jozef Tiflisinin "Vaqiati-Mir Veys və Şah Sultan Hüseyn" (osmanlı dilindən), Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarixi" (fars dilindən) kitablarını dilimizə çevirmisiniz (1992-93-ci illər).

Şeirləriniz Əfqanistan, İran, Türkiyə, İraq və Yaponiyada çap olunmuşdur. 2009-cu ildə Yaponiyanın iki şəhərində (Sinday və Tokio) "XX əsr Azərbaycan milli tarixşünaslığı: tarixi təcrübə və müasir vəziyyət" adlı geniş məruzə ilə çıxış etmisiniz.

Barənizdə dissertasiya işi (Qiymət Məhərrəmlinin "Şahin Fazil Divanı və klassik ədəbi ənənələr") yazılmış və müdafiə olunmuşdur (2007). "Azərbaycan haykuları" (2007) adlı kitabınız haqqında yaponşünas tədqiqatçı Rəşad Quluzadə Bakı Dövlət Universitetinin Şərqşünaslıq Fakültəsində diplom işi yazmışdır (2011).

Xarici ölkələrə səfərlərə həsr etdiyiniz səfərnamələr (Əfqanistan, İran, Türkiyə, Yaponiya, Kipr, Polşa, sabiq Sovetlər ölkəsinin müxtəlif respublikaları və s.) kitab və məqalələr halında dəfələrlə nəşr olunmuşdur.

Klassik (Nizami, Xaqani, Sədi, Hafiz, Şah İsmayıl, Saib Təbrizi, Seyid Əzim Şirvani, Mirzə Ələkbər Sabir və s), habelə müasir şairlərin (Vahid, Şahid, Səməd Vurğun, Süleyman Rüstəm, Hacı Mail, Həkim Qəni, Yasin Xəlil, Əli Ələmi və s.) beyt və misralarına əsaslanmaqla yüzlərlə şeir-təzminlər qələmə almısınız ki, onlar Divan kitablarınızda öz əksini tapmışdır.

"Soqut və zəvale-Səfəviyan" ("Səfəvilərin süqutu və zavala uğraması") adlı kitabınız fars dilində İranda (2008), "Azərbaycan və Osmanlı İmperiyası XV-XVI əsrlərdə" monoqrafiyanız isə türk dilində Türkiyədə (2017) çap olunmuşdur.

Siz 30-dan çox kitab, 300 dən çox elmi məqalə, çoxsaylı publisistik yazı və Azərbaycan bəstəkarları tərəfindən bəstələnmiş mahnı mətnlərinin müəllifisiniz.

Hörmətli Şahin müəllim!

Sizi 80 illik yubileyiniz münasibəti ilə bir daha təbrik edir, uzun ömür, sağlam həyat və yeni-yeni uğurlar arzulayırıq!

**İsa HƏBİBBƏYLİ**
*AMEA-nın vitse-prezidenti,*
*akademik*

## ÖMÜR VƏ SƏNƏT DİVANI

Sözümə Şahin Fazilin (Şahin Fazil oğlu Fərzəliyev) qəzəlinin bir beyti ilə başlayıram:

*“Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur”.*

Vaxtın ölçüsü hüdudsuzdur. Vaxtdan istifadə isə hüdud daxilindədir. Vaxtı hədəri keçirmək, vaxtı bos-boşuna sərf etmək, ən nəhayət, vaxtı Şahin Fazil demişkən “vaxt qatili” olub onu öldürmək, əlbəttə vaxt tələb edir. Şairinsə buna vaxtı yoxdur. Nə yaxşı ki, yoxdur. Əgər olsaydı, gənclik dövründən başlamış indiyəcən davam edən vaxt ərzində bu alim-şair (yaxud şair-alim) bu qədər işləyə, çoxsaylı elmi və ədəbi əsərlər meydana qoya bilməzdi.

Şahin Fazilin sözü və özü. Mən onun sözünü özündən əvvəl tanımışam. Ötən əsrin son onillərindən başlayaraq indiyədək yaratdığı bütün divanlarında (Beş Divan!) bu şair-qəzəlxan qəzəl ədəbiyyatında hələ də özünə yer tutan və müasir ədəbi dilimizdə vətəndaşlıq hüququ qazanmayan əcnəbi söz və istilahlar işlədən, çoxmərtəbəli izafətlərlə dolu qəzəllər yaradan müasir mühafizəkar yazarlarla mücadilə aparır, onları klassik üslubda yazdıqları şeirlərini dövlətçilik rəmzlərimizdən biri olan müasir ədəbi dilimizin imkanları daxilində yazmağa sövq edir.

Hər şeydən əvvəl, qeyd olunmalıdır ki, Şahin Fazil XX əsrdə ölkəmizdə ilk mətbu “Divan” yazan və Divanlarının sayını tədricən beşə çatdıran və qəliz dilli müasir qəzəlxanlara, özünün təbiri ilə desək, “divan tutan” şairdir. Onun birinci divan kitabının ilk cümlələrində oxuyuruq: “Ulu pərvərdigara şükr olsun ki, nəhayət, əlli yaşımdan sonra ilham köhlənimi dördnala çapdım və az bir vaxtda, hal-hazırkı yüzilliyimizdə ana dilimizdə kiçik bir “Divan” yazaraq böyük bir rahatlıq tapdım. Bu mübarək qədəmin atılmasına və bu çətin yolda sevdalı ürəyimin bir neçə illik əziyyətə (bəlkə də ləzzətə) qatılmasına belə bir səbəb var: Həmişə dönə-dönə və yana-yana düşünmüşəm ki, “Divan” üzün illər boyu ədəbiyyatımızın və ədəbi həyatı-

mızın doğma övladı olduğu halda nə üçün indi yaranmasın və şeir pərimizin pərişan zülfü "Divan" darağı ilə daranmasın? Nə üçün müasir şairimiz bu yolda qələm işlətməsin, qədəm atmasın və məqsədə çatmasın? Nə üçün müasir oxucu sabiq ənənəmizi bir daha yad etməsin və müasir "Divan" mütaliəsi zövqünə yetməsin? Odur ki, özümün və gözümün zəifliyinə baxmayaraq, sözümün səyahətini "Divan" məmləkətinə tərəf yönəltdim, həmin məmləkət gülşəninə bir səbət gül səpdim və böyük bir şərəfə yetdim:

*Şahina, gül qoparır çoxları gülşənlərdən,*
*Gülşənə gül gətirən tazə qəzəlxanəm mən".*

Şahin Fazilin birinci və sonrakı bütün divanlarının "Dibaçə" ("Ön söz") və "Xatimə" ("Son söz") hissələrində şair özündən çox-çox yüzillər əvvəl mövcüd olmuş "qafiyəli nəsr" ("nəsre-mosəcce") qayda-qanuna riyayyət edir və ənənəvi nəsr nümünəsindən kənara çıxmır. Qələmini bu üslubda işlədən şair Məhəmməd Füzuli başda olmaqla divan bağlayan bütün şairlərə öz ehtiramını nümayiş etdirərək, aşağıdakı kimi sözünə davam edir:

"Böyük fəzilət əhli, fəzl sahibi, fazil şəxsiyyət olmuş Məhəmməd Süleyman oğlu Füzuliyə böyük ehtiramım və atəşin salamım var. Odur ki, təxəllüsümü onun şərəfinə "Fazil" götürmüşəm (elə rəhmətlik atamın da adı Fazil idi). Kaş Füzuli qəlbində cağlayan təbii fəzl bulağının bir qətrəsi Şahin Fazildə olmuş olaydı və hələlik pərdə altında qalan adım bulaq kimi saf və şəffaf şeir dünyasında fazil kimi qalmış olaydı:

*"Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur"*
*Gördüyüm müşkilləri əcdadlər görmüşdülər.*
*"Məndə tovfiq olsa bu düşvarı asan eylərəm!"*
*Meylini əcdaddən övladlər görmüşdülər.*

*Şahina, müdrik Füzuli söyləyib ki, sadə yaz,*
*Mən görən gerçəkliyi ustadlər görmüşdülər."*

Bu misralarda Şahin Fazil ustad Füzuliyə qovuşmaq, onun poeziya dünyasında özünü tapmaq səyləri ifadə olunmuş, dahi şairin sənət idealları ilə səsləşən prinsiplərini diqqətə çatdırmışdır. Bundan sonra Məhəmməd Füzulinin "qəlbində çağlayan fəzl bulağının bir qətrəsini" özündə görmək istəyən

Şahin Fazil niyyətini aşağıdakı kimi təqdim etmişdir: "Bəli, indi aldığım böyük təsəlli budur ki, mənim bu əsrin sonralarında gördüyüm gerçəkliyi fazil Füzuli XVI əsrin əvvəllərində görmüş, üzünü qəlizdilli qəzəlxanlara çevirmiş və belə demişdi:

*"Oldur qəzəl ki, feyzi onun am olub müdam,*
*Arayışı-məcalisi-əhli-qəbul ola.*

*Virdi-zəbani-əhli-səfavü sürur olub,*
*Məzmuni zövqbəxş, səriul-hüsul ola.*

*Ondan nə sud kim, ola mübhəm ibarəti,*
*Hər yerdə istimain edənlər məlul ola".*

Bu istiqamətverici misralardan göründüyü kimi, qəzəl ümmanının nəhəngi və irfan dünyasının vaqifi olan Füzuli türk qəzəlini sadə dildə yazmağı əhd və bu işə cəhd etmişsə də, öz dövrü üçün məqsədinə yetişmişdir. Şahin Fazil isə dahi şairdən beş yüz il sonra bu yolda öz mühafizəkar qələmdaşları tərəfindən nə qədər maniə ilə qarşılaşmış və təəssüf hissi ilə coşub daşmaqla sənət qayəsini diqqətə çatdırmışdır.

*Qəzəlimdən neçə göhvərşünasın yox xəbəri,*
*Hələ gizində qalan göhvərə bənzər qəzəlim.*

*Yazıram inci kimi saf qəzəllər, amma*
*Afərinlər yerinə görmədə xəncər qəzəlim.*

*Korlamaz ətrini misramın izafət qoxusu,*
*Təzə nərgiz sayağı rayihəli, tər qəzəlim*

*Bilməyir qədrimi "Məcməş-şüəra" həm hələlik,*
*Eybi yox, zərgəri heyran edəcək zər qəzəlim.*

*Ağqoyunlu Həsənin dövrü əgər olsaydı,*
*Neçə əhsən qazanar idi mənim hər qəzəlim.*

Lakin mən ədəbi-bədii mübarizədə bu gün bir qədər gərgin olsam da, tutduğum yolun düzgünlüyünə əminəm. Ümid edərəm ki, qəzəl

gülüstanımız alaqlardan tamamilə xali, qəzəlxanlarımız nəhayət ki, bu zəruri gerçəklikdən hali olacaqlar. Deyirəm ki,

*Bağibanəm, o alağ sözlərə ziddəm, Şahin,*
*Şeir bağimda mənim varsa alaq yanmalıdır".*

Şahin Fazilin qəzəldə dil saflığı uğrundakı mücadiləsinin ümdə məqsədi əruz vəzninin "gülşən və bağlarının tərtəmiz olması"na doğru yönəlmişdir. Şair haqlı olaraq əruzu korlayıb gözdən salmağı yox, bu klassik vəznə yaradıcı yanaşmaqla ondan müasir dövrün tələblərinə uyğun səviyyədə istifadə etməyi təşviq etmişdir. Onun «Azərbaycan şeirinin əruz gülüstanını» alaqlardan təmizləmək niyyəti sadəcə onun tərəfindən səsləndirilən çağırış deyildir, həm də ilk növbədə şairin özünün bunu əməl etmək nümunəsi kimi göstərdiyi sənət prinsipidir.

Şahin Fazilin 2018-ci ildə çap olunan və onun hər beş Divanının əsas məzmun və qayəsini əhatə edən 1224 səhifədən ibarət "Doğruya doğru" kitabını təkrar-təkrar varaqladıqdan sonra bir daha əmin oldum ki,o öz prinsipindən əl çəkən deyildir. "Mən özüm ixtisasca şərqsünas olduğum və mehrimi şeirə saldığım üçün müxtəlif şairlərin "Divan"larını, təbii ki, öz dillərində oxumuşam. Onların qədr-qiymətini bilmişəm və bu qənaətə gəlmişəm ki, hər "Divan"ın özünəməxsus siqləti və keyfiyyəti var. Öz milli dilinin sözlərini soraqlayan və "Divan" bağlayan hər şair ehtirama layiqdir. Orta əsrlər Azərbaycan ədəbi dili ərəb-fars sözləri ilə zəngin olmuşdur. Ərəb-fars sözlərindən bu gün də qaçmaq olmaz, lakin əgər onlar dilimizdə vətəndaşlıq hüququ qazanıbdırsa:

*Işim yoxdur nə cür yazmış qəzəl bildirki şairlər,*
*Bu gün şair sözün yazmaz qəliz şe'rin rəvan saxlar.*

Xalq şairi Rəsul Rza demişkən:

*"Mübarizə bu gün də var, yarın da,*
*Mən də onun ən ön sıralarında"*

Əlbəttə, ana dilinin saflığı uğrunda mübarizə dünən də olmuşdu və elə bu gün də Şahin Fazil və bir neçə qəzəlxan şairlər tərəfindən davam etdirilir. Çünki bu gün ana dilimiz ədəbi dil baxımdan çoxdan otu-

ruşmuşdur, bu dil dövlətimizin, o cümlədən bütün ədəbi-bədii əsərlərin, qəzet və jurnalların, radio və televiziyanın səlis və rəvan dilinə çevrilmişdir. Ona görə də ana dilin saflığı uğrunda mücadilə həmişə sənətkarlarımızı düşündürmüşdür. Məsələn, böyük yazıçı Cəlil Məmmədquluzadə Azərbaycan dilində qəliz qəzəl yazan bir şairin bir beytinə nəzər salaraq şeir müəllifini özünəxas yumor hissi ilə gülüş hədəfinə çevirmişdir:

*"Niyarbəxş əyuri ki, tərq-bərq olacaqdır,*
*Saki-çeşmi-nitafi-tü mehri-talei-pünhan..."*

Mən öz vicdanıma and içə bilərəm ki, bir belə kəlami-əbədzindəni indiyədək Azərbaycanın bərguzidə şairlərinin heç biri səhneyi-mətbuata çıxarmayıbdır. Mərhəba, Mərhəba! Siz öləsiz, qiyamət eləyib..."

Bütün bunlara görədir ki, Şahin Fazil yeni tarixi epoxanın tanınmış qəzəl ustadlarından biri kimi qəbul olunur. Şahin Fazil Azərbaycan poeziyasının çoxəsrlik divan şeiri ənənəsini yaradıcılıqla davam etdirən və bu klassik ənənəyə müasir dövrün ruhunu gətirən novator sənətkardır. Məhz Şahin Fazilin böyük səylərinin sayəsində XX əsrin ikinci yarısından sonra və XXI əsrdə divan ənənəsi bərpa olunmuş və yaşadılmış, yeni mərhələnin tələblərinə uyğunlaşdırılmışdır. Bu mənada Şahin Fazil müstəqillik dövrü Azərbaycan ədəbiyyatında yeni tipli divan şeirinin görkəmli yaradıcısıdır.

Azərbaycan tənqid və ədəbiyyatşünaslığı Şahin Fazilin divan yaradıcılığına yüksək qiymət vermişdir.

"Şahin Azərbaycanın son illərdə sıraları seyrəlmiş, indi az qala barmaqla sayılan kamil qəzəlxanlarında biri, yaradıcılıq fəaliyyəti baxımından onların arasında xüsusilə seçilən şairdir. O, öz poetik yaradıcılığı ilə yanaşı, elmi tədqiqatla məşğul olan bir araşdırıcı kimi də tanınır"— yazan akademik Bəkir Nəbiyev "Şahinin qanadları" adlı geniş məqaləsində Ş.Fazili "şeirin, o cümlədən də xüsusən qəzəlin dinclik nə olduğunu bilməyən cəfakeş fəhləsi" adlandıraraq qeyd edir: "O, müxtəlif illərdə irili-xırdalı bir neçə qəzəllər kitabı buraxdıqdan sonra ilk Divanını 1996-cı ildə nəşr etdirmişdir. "İkinci Divan"ının isə keçən il işıq üzü gördüyünü qeyd etmişəm. "Üçüncü Divan"ını da təzəcə tərtib edib qurtarmışdır. Və hazırda böyük həvəslə növbəti Divan üzərində çalışır". Akademik Bəkir Nəbiyevin bu məqaləsini yazdığı 2006-cı ildən sonra Şahin Fazil hər biri min səhifədən çox olan üçüncü, dördüncü və hətta beşinci Divan kitablarını da tamamla-

yaraq, oxucularının istifadəsinə verdi.

Hazırkı mərhələdə Divan ədəbiyyatı yaratmaqla Şahin Fazillə müqayisə ediləcək qələm əhli göstərmək çətindir.

Əməkdar elm xadimi, professor Qəzənfər Kazımovun "Şahin Fazilin Divan Xəmsəsi və onun dili haqqında" adlı məqaləsində oxuyuruq "Bəkir müəllim, hörmətli akademik dəlil-sübut olmadan söz deyən deyildi. Onun sözləri məni də düşündürdü, kitablarını götürüb vərəqləməyə başladım: Şahin Fazil. **Divan,** Bakı, Azərnəşr, 456 səh, 1996, Redaktoru Mir Cəlal Zəki; **"İkinci Divan"**, Bakı, 2005, 1268 səh. Redaktorları Həkim Qəni Hüseynov, Hacı Rafiq Şirvani; **"Üçüncü Divan"** Bakı 2008, 1382 səh., Redaktoru Ənvər Nəzərli; **"Dördüncü Divan"** Bakı 2014, 872 səh., Redaktoru Mir Cəlal Zəki Məştəqayi. Cəmisi 3987 səh. Səhifələr də dolu. Bəzi kitablarda olduğu kimi səhifədə bir şeir deyil, səhifə dolunca şeirlər verilmişdir. Çox vaxt 11-lik və 12-liklə. Di gəl hünərin var, vərəqlə, oxu, qurtar. **Olduqca gərgin bir ədəbi yaradıcılıq əməyi.** Nəzərə alınmalıdır ki, Ş.Fazilin bunlardan əlavə beş monoqrafiyası, üç yüzədək elmi məqaləsi, üç tərcümə kitabı və onlarla publisistik yazıları var. Hələ 20-dək şeir kitabı, 3 poema, xarici ölkələrə səfərlər və qələmə aldığı səfərnamələr... Bu yaxınlarda A. Bakıxanov adına Tarix İnstitutunun iki cilddə çap etdirdiyi 2506 səhifəlik İsgəndər bəy Münşinin "Dünyanı bəzəyən Abbasın tarixi" kitabının tərcüməsi... Papaq alta oğlanlar var, xəbərimiz yox... Hazırda yeni xeyirxah və çox vacib bir işlə - Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") əsərinin dilimizə tərcüməsi ilə məşğuldur".

Professor Qəzənfər Kazımovdan gətirdiyimiz bir qədər uzun sitat Şahin Fazilin bədii yaradıcılığı və elmi fəaliyyəti haqqında tam təsəvvür yaradır. Həqiqətən, həm elm sahəsində, həm də bədiyyat istiqamətində Şahin Fazilin çoxillik və çoxsahəli fəaliyyəti alim üçün də, şairlik baxımından da qibtəediləcək böyük hadisədir. Şahin Fazil qoşa qanad kimi bu istiqamətlərin hər birində dayanmadan və səmərəli şəkildə çalışmaqla tarix elminə və milli ədəbiyyatın inkişafına sanballı töhfələr verməkdə davam edir. Bütövlükdə onun yorulmaz fəaliyyətinin nəticəsi kimi meydana çıxmış əsərləri Azərbaycan ictimai elmlərini və milli ədəbiyyatımızı zənginləşdirən pozulmaz naxışlardır.

Şahin Fazilin Divanlar Xəmsəsi müasir Azərbaycan ədəbiyyatında bədii yaradıcılıqda dil faktorundan istifadəyə nümunədir. Şahin Fazilin qəzəl dilinə xüsusi diqqət yetirən və yüksək qiymət verən Qəzənfər Kazımov yazır: "Qəzəl dili şairləri klassik şeirdə işlənən izafət tərkiblərinə, əruzun

tələblərini ödəyən alınma kəlmələrə daha çox çəkir. Lakin Şahinin yaradıcılığının mühüm bir keyfiyyəti bundan ibarətdir ki, o, ana—Azərbaycan dilimizin söz sərvətinə daha çox üstünlük verir, bacardıqca qeyd etdiyim ifadə tərzindən qaçmağa çalışır. Əruz vəznində orta əsrlərə xas qəliz və dilimizdə vətəndaşlıq hüququ qazanmayan söz və istilahları, izafət tərkiblərini şeirlərinə gen-bol calayan şairləri tənqid edir... Qəzəli sadə bir dildə yazmaq, keçmişin qəliz ifadəlilik formalarından qaçmaq Şahinin əsas yaradıcılıq prinsiplərindəndir və o, Divanlarının dibaçələrində təkrar-təkrar qeyd edir ki, onu bu prinsipdən uzaqlaşdırmaq olmaz: "Qəzəlimi sadə dillə yazmağım bəzi mühafizəkar qəzəlxanların qəzəbinə səbəb olur və hərdənbir qulağıma onların "tənqidanə" sözləri gəlib çatır. Pərt olmuram. Çünki mən düzgün yoldayam. Qoy yorsunlar öz qəliz dillərini... Ana dili! Anamızın dili!!! Mən dilimi sidq-ürəkdən sevən adamam. Şeirlərimdən xəbərdar olan hər bir adam bunu təsdiqləyər".

Şahin Fazilin birinci "Divan"ı meydana çıxarkən alimlərin diqqətindən kənar qalmamış, hətta şair-tədqiqatçı Qiymət Məhərrəmli "Şahin Fazil "Divanı"ı və klassik ədəbi ənənələr" adlı dissertasiya işi yazaraq, 2007-ci ildə onu müdafiə etmişdir. Qiymət Məhərrəmli yazır: "Tədqiqatçı alimlərdən akad Bəkir Nəbiyev, professorlar Teymur Əhmədov, Sabir Əliyev, Tərlan Quluyev, Əlisa Şükürlü, Cənnət Nağıyeva və başqaları müasir Azərbaycan poeziyasının tanınmış nümayəndələrindən biri kimi Şahin Fazilin əruzvəznli şeirdə dil saflığı uğrunda apardığı ədəbi mübarizəni təqdir edərək, yaradıcılığına yüksək qiymət vermiş və sənətkarın zəngin irsinin geniş elmi tədqiqata cəlb olunmasının vacibliyini qeyd etmişlər".

Şahin Fazilin qəzəldə dil saflığı uğrunda apardığı 30 illik mübarizəsini əks etdirən polemika səciyyəli 2 məqalə hələ 2004-cü ildə diqqətimi cəlb etmişdi. Birinci məqalənin müəllifi elə Şahin Fazilin özü, ikincisininsə müəllifi isə ədəbiyyatşünas alim Vaqif Yusiflidir.

Şahin Fazil məqaləsində qəzəl janrının böyük ustadı Məhəmməd Füzulinin Azərbaycan poeziyasındakı xidmətlərinə yüksək qiymət vermiş, ədəbiyyatşünaslıq elmində "qəzəl şeirinin əvəzsiz, dahi sənətkarı" (Mir Cəlal), "müstəsna şair" (Y.Bertels) kimi böyük qiymət almış Məhəmməd Füzuli XVI əsrin ortalarından bu günədək bədii sözün ən nəhəng ustadlarından biri sayılmışdır. "Füzuli divanının dibaçəsində aydın olur ki, müəllif qəzəl janrını çox sevmiş, qəzəlin "şairin qüdrətini, naziminsə şöhrətini" artırdığını nəzərə çatdırmış... xüsusi olaraq qeyd etmişdir ki, elə qəzəl de ki, dövranda məşhur olsun, onun oxunması və yazılması çətin olmasın".

Daha çox fars dilində yazılmış qəzəli Azərbaycan dilinin tələblərinə uyğunlaşdırması Şahin Fazil tərəfindən Məhəmməd Füzulinin böyük sənət hünəri adlandırmış, Məhəmməd Füzulidən örnək kimi gətirilmiş aşağıdakı parça dahi şairin sübutu kimi diqqət mərkəzinə çəkilmişdir:

*"Ol səbəbdən farsi ləfzilə çoxdur nəzm kim,*
*Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur.*

*Ləhceyi-türki qəbuli-nəzmi tərkib etməyib*
*Əksərən əlfazı namərbutü nahəmvar olur.*

*Məndə tovfiq olsa bu düşvarı asan eylərəm,*
*Novbahar olğaç tikəndən bərgi-gül izhar olur".*

Bütün bunlarla bərabər, Şahin Fazilin fikrincə, ustad Məhəmməd Füzuli əruz vəznində yazılmış Azərbaycan qəzəlini türkcələşdirmək arzusunu tam olaraq həyata keçirə biməmişdir. Bu məsələdən danışarkən Şahin Fazilin yekun fikri belədir: «Gəlin Füzulinin, habelə Seyid Əzim Şirvaninin, Əbdülxaliq Cənnətinin, Məmo bəy Məmainin, Əbdülxaliq Yusifinin və habelə müasir qəzəlxanlarımızın asanlaşdıra bilmədikləri qəzəlimizi xəlqi sözlərimizlə yazaq. Gəlin, müasir ədəbi dilimizə hörmətlə yanaşaq. Gəlin, qəzəl gülüstanımızı doğma güllərimizlə bəzəyək».

V.Yusifli isə Şahin Fazilə müraciətlə yazır: "Yazırsınız ki, "Məndə tovfiq olsa bu düşvarı asan eylərəm" deyən Füzuli, həmin düşvarı asan edə bilmir, yəni qəzəllərində çətin qavranılan, dərk edilən, indinin özündə də anlaşılmayan ərəb və fars sözləri və ibarələri işlədir. Bu fikirlə razılaşmaq mümkün deyil. Elə bilirəm ki, məhz Füzulidən sonra bədii-fəlsəfi fikirmizin tarixində çox düşvarlar asan oldu."

Nəticə olaraq qəzəldə dil baxımdan sadələşdirmə «əməliyyatlarının» aparılmasını Şahin Fazil yeni tarixi epoxanın qəzəl şairlərinin üzərinə düşən vəzifə hesab edir. Fikrimizcə, bu şair dahi Füzulinin arzusunu həyata keçirmək sahəsində mühüm addımlar atmağı bacarmışdır. Uslub etibarilə klassik qəzəl üslubuna sədaqətini qoruyub saxlamış, qəzəlin asan oxunan bir janra çevrilməsinə nail olmaq üçün bütün gücü ilə çalışmışdır. Şahin Fazilin "Divanlar Xəmsəsi" ideya-məzmun etibarilə

olduğu kimi, dil-uslub baxımından da müstəqillik dövrünün sözünü ifadə bilir. Şahin Fazilin «Divan»ları qəzəlin XXI əsrə qədər gəlib çatdığını, yaşamaq haqqı qazandığını, yeni keyfiyyətlər qazandığını nümayiş etdirir. Bu mənada Şahin Fazil müstəqillik dövrünün Divanlar silsiləsini yaratmış qəzəlxanıdır.

Tarix elmləri doktoru, professor Şahin Fazil elm sahəsində də mühüm nailiyyətlərə imza atmışdır. O, Azərbaycan tarixşünaslıq elminə də səfəvişünas və osmanlışünas alim kimi daxil olmuşdur. Onun «Azərbaycan və Osmanlı imperiyası» monoqrafiyası orta əsrlər tarixinə həsr edilmiş əhəmiyyətli elmi əsərdir. Şahin Fazilin tərcüməsində İsgəndər bəy Münşinin «Dünyanı bəzəyən Abbasın tarixi» əsərinin nəsri Azərbaycan tarixşünaslığında nadir hadisə hesab edilməyə layiqdir. Tarixçi alimin «Quba tarixi» əsəri Azərbaycanda tarixi coğrafiya sahəsində yazılmış sanballı elmi əsərlərdən biridir. Şahin Fazilin səfərnamələri, xüsusən "Yaponiya səfərnaməsi" klassik səfərnamə ənənəsinə yeni tarixi şəraitdə yanaşılmasına mükəmməl bir örnəkdir.

Görkəmli şair-tarixçi alim Şahin Fazilin ömür və sənət Divanı davam edir.

**Kərim ŞÜKUROV**
*Tarix elmləri doktoru, professor,*
*AMEA A.A.Bakıxanov adına*
*Tarix İnstitutunun direktoru*

## ŞAHİN FAZİL VƏ DÖRD TARİXİ MƏNBƏNİN TƏRCÜMƏSİ HAQQINDA QEYDLƏRİM

Tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyevin (Şahin Fazil) geniş elmi və ədəbi fəaliyyətinin bir hissəsi olan xidmətləri haqqında sözə başlamazdan əvvəl mən möhtərəm oxuculara ensiklopedik biliyə malik olmuş Abbasqulu ağa Bakıxanovun tarix elmi barədə yazdığı bir-iki cümləni olduğu kimi misal gətirmək istəyirəm:

"Bu elm insanı gözəl əxlaqlı edir, ona dolanacaq və yaşayış işlərini öyrədir. Buna görə onu mənəvi elmlərin qiymətlilərindən hesab edib demək olar: tarix hökümsüz və zülümsüz elə bir hökmürandır ki, bütün Adəm övladı onun əmrlərinə boyun əyməkdədir. Onun təlim məktəbində dünyanın müəllimləri əlifba oxuyan uşaqdırlar... **Tarix elə bir danışmayan natiqdir** ki, sələflərin vəsiyyətini bütün təfsilat və tərifləri ilə xələflərə bildirir, ehtiyac və rifah səbəblərini, tərəqqi və tənəzzül yollarını anladır... **gələcəkdə törəyə biləcək əhvalatı keçmişin libasında insanın ibrət nəzərinə çatdırır...** Hər bir ölkənin tarixi orada yaşayan xalq üçün faydalıdır, çünki tarix ona öz millətinin təbiət və adətlərindəki xüsusiyyətləri bildirər, qonşu tayfaların rəftarından məlumat verər, müxtəlif xalqlarla saxlanan əlaqənin əsas xeyir və zərərini ona məlum edər"[1]

Hər şeydən əvvəl qeyd etməliyəm ki, Şahin Fazil şərqşünas-tarixçidir və əlli ildən çoxdur ki, tarixi mənbələrə əsaslanaraq qələmini doğma vətənimizin, habelə qonşu ölkələrin tarixinin öyrənilməsi və işıqlandırılması yolunda işlədir.

Ş.Fazil indiyədək dörd tarixi mənbəni yazıldığı dillərdən tərcümə edərək oxucu istifadəsinə təqdim etmişdir. **Həmin mənbələrin birincisi** Jozef Tiflisi adlı bir müəllifin qələmə aldığı "Vaqiati-Mir Veys və Şah Hüseyn" ("Mir Veys və Şah Hüseyn arasında baş verən əhvalatlar") əsəridir. Mütərcim yazır:

[1] A.A.Bakıxanov. Gülüstani-İrəm. Azərbaycan SSR Elmlər Akademiyası Nəşriyyatı, Bakı-1951, səh.1.

"1985-ci ildə Əfqanistanda olarkən, ölkənin Elmlər Akademiyasının "Dəri[1] Departamenti" şöbəsinin müdiri professor Əhməd Cavid mənə dedi: "Bizim Akademiyanın kitabxanasında XVIII əsrin I rübünə dair osmanlıca bir əlyazmanın foto sürəti vardır. Əlyazmanın əsli İstanbul Universitetinin kitabxanasındadır. Biz osmanlı dilini bilmədiyimiz üçün həmin əlyazmanı öyrənməkdən məhrumuq. Əgər imkanın olsa, o əlyazmanı dəri dilinə tərcümə etməyini xahiş edirik".[2]

Şahin müəllim o zaman Əfqanistanın Nazirlər Şurasında ölkənin Baş Naziri və Sovet İttifaqının Baş Müşavirinin tərcüməçisi vəzifəsində işləyirdi. "İmkanının məhdud olmasına baxmayaraq" prof. Ə.Cavidin təklifi ilə əlyazmanı tezliklə dəri dilinə tərcümə edib Departamentə təqdim etdi.

Ş.Fazil "Ön söz" də yazır: "Əsərin ilk cümləsindən sonra J.Tiflisinin kitabı nə vaxt bitirdiyini bildirən "1037-ci il" tarixi vardır. Hicri tarixlə yazılmış həmin rəqəm miladi tarixlə 1724/25-ci ilə təsadüf edir ki, beləliklə müəllifin öz səfərnaməsini nə zaman bitirdiyi barədə bizə məlumat verir. Əgər biz müəllifin 8 il İsfahanda yaşadığını nəzərə alsaq, məlum olur ki, "Vaqiati-Mir Veys və Şah Sultan Hüseyn" əsəri 1717-1725-ci illər arasında yazılmışdır."

Qeyd olunmalıdır ki, bu əlyazmada adları çəkilən Mir Veys əfqanların abdal tayfasından olan hökmüdarı, Şah Sultan Hüseyn isə İranın 9-cu Səfəvi padşahıdır.

Əlyazmanın ən yüksək məziyyəti onun Səfəvilər dövlətinin süqutu ərəfəsində baş verən Əfqanistan-İran siyasi münasibətlərinin, bu iki ölkə ilə bağlı olan ictimai-siyasi-iqtisadi məsələlərin, həmçinin ayrı-ayrı şəhər və xalqlar barədə qiymətli məlumat baxımından ilkin mənbə olmasındadır. J.Tiflisi məhz gördüyü hadisələri qələmə almış, müşahidə etdiyi məsələləri əks etdirmişdir.

J.Tiflisi baş verən hadisələrin təsviri ilə əlaqədar yeri düşdükcə, Azərbaycan, Dağıstan, Gürcüstan, Rusiya və başqa ölkələrlə bağlı olan məsələlədən də danışır. "Vaqiati- Mir Veys və Şah Hüseyn" əsərinin ən mühüm xüsusiyyətlərindən biri də orada ayrı-ayrı tayfa, xalq, ölkə, şəhər, qəsəbə və məhələlər haqqında məlumat verilməsidir.

Şahin Fazilin fars dilindən çevirdiyi **ikinci tarixi mənbə** polyak hə-

[1] Dəri və yaxud farsiye-Kabuli Əfqanistanda işlənməkdə olan fars dilidir. (Qeyd Şahin Fazilindir).

[2] Jozef Tiflisi. Vaqiati-Mir Veys və Şah Hüseyn ("Mir Veys və Şah Hüseyn arasında baş verən hadisələr"), Azərbaycan Dövlət Nəşriyyat—Poliqrafiya Birliyi, Bakı-1992, səh.3.

kimi, missioneri və tarixçisi Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarixi" ("Tarixi-səyyahi-məsihi") adlanan və Səfəvilər dövlətinin süqutu hadisəsinə həsr edilən ilkin mənbədir. Yuxarıda adı çəkilən Jozef Tiflisi, Fransanın İrana səfir yolladığı müsyö de-Qardan və Tadeuş Kruşinskinin əsərlərini mütaliə edən İran müəllifi Abbas İqbal Aştiyani bunların içərisində polyak müəllifinin əsərinə üstünlük vermişdir. O yazır: "Əfqanların istila hadisələrini öz gözləri ilə görən Kruşinskinin Qardan və onun mütərcimi "Gürcü Yusif"in həmin hadisələr barədə yazıları və qeydləri vardır. O cümlədən, müfəssəlliyi və dərinliyi baxımından Kruşinskinin yazdıqları daha mötəbərdir..."[1]

T.Kruşinski və əsəri haqqında başqa İran müəllifi Əbdürrəzzaq Məftun Dünbüli yazır: "Şah Sultan Hüseyn Səfəvinin hakimiyyəti zamanı məsihi millətindən olan bir səyyah İsfahana gələrək orada iyirmi altı ilə qədər zamanın qəzavü-qədərini müşhaidə etdi. O, zamanın hadisələrindən təcrübə əldə edən və məsləhətə qail olan bir şəxs idi. O, rüzigarın isti-soyuğuna düşmüş Qəndəharı əfqanların İsfahanı ələ keçirdikləri hadisələr haqqında böyük diqqətlə latın dilində [bir əsər] yazdı. Həmin əsər İstanbula çatdı. Rum xandgarının (sultanının—Ş.F.) saray adamlarından olan İbrahim adlı bir şəxs onu türk dilinə çevirərək "darut-təba'" adlanan İstanbul başmaxanasında "Bəsirətnamə" və "adı altında çap etdirdi. Həmin kitabın bir nüxsəsi İran dövlətinin nəvvabı və vəlihədi olan nayibüssəltənənin əlinə düşdü. O cənabın şərafətli əmrinə görə bu ibrətamiz kitabın fars dilinə tərcüməsi cahana pənah verən sarayın bəndəsi olan mənə—Nəcəfəli Əbdürrəzzaqa tapşırıldı..."[2]

"Tarixi-səyyahı-məsihi" əsərində əks olunan tarixi hadisələrin dəyəri olduqca böyükdür. Əsərin əvvəlində Şah Hüseyndən qabaq hakimiyyətdə olmuş Səfəvi hökmdarlarından müxtəsər şəkildə bəhs olunur. Sonra ayrı-ayrı başlıqlar altında əsasən Əfqanıstan—İran, həmçinin İranın Azərbaycan, Gürcüstan, Rusiya, Türkiyə, Dağıstan və başqa ölkələrə olan münasibətləri işıqlandırılır":[3]

T.Kruşinski Azərbaycandan bəhs edərək, onun ərazisinə İrəvan, Şirvan, Gürcüstan və Dağıstanın da daxil olduğunu bildirir.[4]

Orta əsr tarixi mənbələrinin dili olduqca poetik və şairanə olmuş,

[1] Y.T.Kruşinski Xristian səyyahın tarixi, Azərbaycan Dövlət Nəşriyyatı, Bakı-1993, səh.4
[2] Yenə orada "Məftunun müqəddiməsi" hissəsi, səh.1-2
[3] Y.T.Kruşinski Xristian səyyahın tarixi, Azərbaycan Dövlət Nəşriyyatı, Bakı-1993, səh.7.
[4] Yenə orada Bakı-1993, səh.9.

onlarda müxtəllif şeir parçaları da əks etdirilmişdir. Qeyd olunmalıdır ki, mütərcim Şahin Fazil həm də şairdir və "Xristian səyyahın tarixi əsərində gətirilən müxtəlif misra və beytləri də orjinala uyğun tərzdə tərcümə etmişdir.

Məsələn:

*"Mehrü məhəbbət də gərəkdir şaha,*
*Hirs ilə nifrət də gərəkdir şaha"*

Yaxud:

*"Sanma iş işgörənin məşvərətindən peyda,*
*Bütün işlər fələyin məsləhətindən peyda"*

Yaxud:

*"Asiman bəlası yerə enəndə*
*Kor olur, kar olur ağıllı bəndə".*

Yaxud:

*"Əgər bir adamın günü qaralsa,*
*Hamı pislik edər, yetişməz dada"*

Şahin Fazilin fars dilindən tərcümə etdiyi **üçüncü tarixi mənbə** azərbaycanlı İsgəndər bəy Münşi Türkmanın üç cildlik məşhur "Dünyanı bəzəyən Abbasın tarixi" ("Tarixe-aləmaraye-Abbasi") əsəridir. Qeyd etməliyəm ki, müəllif tərəfindən 14 il müddətində yazılmış bu möhtəşəm tarixi mənbə mütərcim tərəfindən də 14 ildə başa çatdırılmışdır. Əməkdar elm xadimi AMEA-nın həqiqi üzvü, tarix elmləri doktoru, professor Yaqub Mahmudov yazır:

"Azərbaycanın orta əsrlər tarixini, xüsusilə Səfəvi impersiyasının tarixini araşdırmaq üçün son dərəcə qiymətli ilk mənbə olan "Tarixe-aləmarye-Abbasi"nin doğma dilimizə bütöv halda tərcüməsi Azərbaycan tarix elminə çox mühüm töhfədir"[1].

"Tarixe-aləmarye-Abbasi" üç cilddən ibarətdir. Onun I cildi 1571-

[1] Bax: İsgəndər bəy Münşi. Dünyanı bəzəyən Abbasın tarixi (Ş.Fazil tərcüməsi), səh.IV.

1596, II cild 1587-1616, III cild isə 1617-1629-cu illəri əhatə edir.

Azərbaycan və ona qonşu ölkələrin tarixini özündə əks etdirən bu kitab da şe'r baxımından zəngindir. Məsələn, İsgəndər bəyin özü haqqında yazdığı mənzun fikirlər Şahin Fazilin tərcüməsində belə nəzərə çatdırılır:

*"Əgər indi mənə bəxtim olsa yar,*
*Ədəb mücrüsündən qıfılı açar.*
*Cavan şahzadəyə bəsləyib inam,*
*Alimlik mülkündə təxt ucaldaram.*

*Mə'na güllərindən yığıb rəngbərəng,*
*Hikmət dükanına verərəm bəzək.*
*Çoxlu dürr çıxarıb elm bəhrindən*
*Cahanı dürr ilə dolduraram mən".*[1]

Şahin Fazil fars dilindən tərcümə etdiyi **dördüncü əsər** XVI əsr Azərbaycan tarixçisi Həsən bəy Rumlunun iki cildlik "Tarixlərin ən yaxşısı" ("Əhsənüt-təvarix") kitabıdır ki, yaxın vaxtda işıq üzü görəcəkdir.

Əsər XV-XVI əsrlərin 1405-1577-ci illərini əhatə edir və Azərbaycan, habelə qonşu ölkələrdə cərəyan edən siyasi, ictimai, iqtisadi dini-məzhəbi, beynəlxalq, diplomatik münasibətləri özündə ehtiva edir. Təbii ki, Həsən bəy Rumlu da başqa orta əsr müəllifləri kimi öz tarix kitabında zərbülməsəllər, şe'r parçaları və s. kimi bədii və şairanə fikirləri ilə yeri gəldikcə əsərini daha oxunaqlı etmişdir. Məsələn:

"Qara Yusif [Qaraqoyunlu] cəng meydanında qantökən şir, işrət məclisində isə gövhərsəpən bulud idi. Ədaləti və insafı ilə tanınmış, əliaçıqlığı ilə məşhur olmuşdu:

*Ədlindən gözəllərin çöhrəsi tək, doğrusu,*
*Yanaşı dayanmışdı isti ataş, soyuq su.*

Bir-iki kəlmə də Şahin Fazilin özü və şəxsiyyəti haqqında fikrimi bildirmək istərdim: 80 yaşının içərisindədir, özünün və vaxtının qədrini

[1] Tarixe-aləmarye-Abbasi. I kitab, səh.4

bilən adamdır. Azərbaycan Yazıçılar Birliyinin üzvüdür, fars dili mütəxəssisidir. Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin Fars dili şöbəsini fərqlənmə diplomu ilə bitirmişdir, 13 il Əfqanistanın müxtəlif dövlət idarələrində, o cümlədən həmin qürbət ölkənin Nazirlər Şurasında tərcüməçi sifətilə çalışmış, orada 3 Dövlət medalı və Sovet səfirliyinin fərmanları ilə təltif olunmuşdur, 5 elmi monoqrafiya, 300-dən çox elmi məqalə, 5 "Divan" kitabı, onlarla səfərnamə qələmə almış və çap etdirmişdir, çoxsaylı publiksistik yazıları vardır.

Ş.Fazil bəzən özünəməxsus fikir, mülahizə və düşüncələrini poeziya dili ilə oxucu nəzirinə çatdıran şairlərdəndir. Məsələn, onun 2019-cu ildə tarixçilərə ünvanladığı bir şe’rini misal gətiririk:

TARİXÇİLƏRƏ!

*Tarixlərə yazılanı*
*təkrar-təkrar yazanlar var,*
*tarixlərdən pozulanı tarixçilər*
*"tam silinsin iz" deyərək*
*dönə-dönə pozardılar,*
*bu gün yenə pozanlar var,*
*tarixçilər,*
*əyrini düz görənlər var,*
*düzü əyri,*
*tarixçilər,*
*Özü əyri adamların*
*özləri tək sözü əyri,*
*tarixçilər.*

*Tarixçilər,*
*tarixçi var*
*tərif-tənqid mərəzinə olub düçar:*
*Dünən tərif,*
*bu gün tənqid...*
*Bu gün tənqid,*
*sabah tərif...*
*Amma, bunu bilmirlər ki,*
*əgər haqsız deyilirsə,*

*günah- tənqid,*
*günah-tərif!*

*Qorumaqçın ləyaqəti*
*yazmalıyıq həqiqəti,*
*tarixçilər.*
*Qoy hifz edək gerçəkliyə sədaqəti,*
*tarixçilər.*
*Tərif əgər haqlıdırsa tərifləyək,*
*tənqid əgər haqlıdırsa tənqidləyək,*
*sözümüzü gerçək yazaq,*
*düzgün deyək,*
*tarixçilər.*

*İllər boyu*
*ayaq açıb neçə təklif,*
*imzalanıb neçə qərar...*
*Işğalçını neçin haqlı,*
*bizi haqsız sananlar var?*
*Həqiqətdən, ədalətdən bəhs edənlər*
*haqq-ədalət xatirinə*
*işğalçıdan soruşsunlar:*
*Kim soyğunçu, kim talançı?*
*Kim doğruçu, kim yalançı?*

*Kim əzilən, kimidir əzən?*
*Kim dözməyən, kimidir dözən?*
*Əgər dərin düşünsələr,*
*suallarda məna dərin,*
*bu suallar vecinəmi*
*müvəqqəti hökmü olan,*
*sözü keçən*
*üzdən iraq*
*gözdəniraq xadimlərin?*
*o kəslərə*
*Çox sual var,*
*tarixçilər,*

*çox təəssüf, hələlik ki,*
*cavabsızdır bu suallar,*
*tarixçilər,*
*çox dolaşıq düyünləri*
*gərək açaq,*
*tarixçilər,*
*yorulmadan, qətiyyətlə*
*həqiqətin, ədalətin arxasınca*
*qaçaq, qaçaq,*
*tarixçilər,*
*qələmləri süngü edib,*
*qanla gedən yurdumuzu, mülkümüzü*
*qanla alaq,*
*tarixçilər,*

*Bəllidir ki, hər dövrdə, hər əyyamda*
*çox cəng olub, tarixçilər,*
*qəsbkarlar ac qurd olub,*
*pələng olub,*
*tarixçilər.*
*Həbs olunub Dərbəndimiz,*
*itirmişik Zəngəzuru,*
*Zəngilanı, Göyçəni biz,*
*Xudafərin dağıdılıb,*
*tarixçilər,*
*çox torpaqlar*
*işğallara məruz qalıb,*
*tarixçilər,*
*varımızı, malımızı aparıblar,*
*neçə bağı,*
*neçə dağı,*
*Qarabağı*
*torpaqımdan*
*torpaqkəsən qayçılarla*
*qayçılayıb qoparıblar,*
*tarixçilər.*

*Deməyək ki,*
*el uğrunda lap ölməyə biz hazırıq,*
*gəlin deyək*
*döyüşməyə, öldürməyə biz hazırıq,*
*gəlin deyək, gücümüz var,*
*zorumuzu bildirməyə biz hazırıq.*

*Olan-oldu, keçən-keçdi söyləməyək,*
*tarixçilər,*
*nikbinləşək, nalə-fəğan eyləməyək,*
*tarixçilər.*
*ötən çağdan,*
*olanlardan, keçənlərdən*
*ibrət alaq,*
*tarixçilər,*
*Dədə Qorqud babamızın*
*öyüdündən vəcdə gəlib*
*həzzə dalaq, ləzzət alaq,*
*Koroğludan qeyrət alaq.*
*Canımıza mətinliyi, mətanəti*
*edək calaq,*
*tarixçilər,*
*həqiqətə qiymət verib*
*biz həqiqi qiymət alaq,*
*tarixçilər!*

Şahin Fazil hazırda AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun "Tarixin nəzəriyyəsi, mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri vəzifəsində çalışır.

**Yaqub MAHMUDOV**
*Əməkdar elm xadimi,*
*AMEA-nın müxbir üzvü,*
*tarix elmləri doktoru, professor*

## BÖYÜK AZƏRBAYCAN TARİXÇİSİNİN MƏŞHUR ƏSƏRİ DOĞMA DİLİMİZDƏ

***İsgəndər bəy Münşinin "Tarixe-aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") əsərinin Şahin Fazil tərcüməsinə***

### ÖN SÖZ

Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunda Azərbaycan tarixinin indiyədək öyrənilməmiş qalan çoxsaylı problemlərinin tədqiq olunması diqqət mərkəzinə götürülmüşdür.

Azərbaycanın müxtəlif tarixi dövrlərdə itirilmiş torpaqlarının tarixinin araşdırılaraq bugünkü nəsillərə olduğu kimi çatdırılması tarixçilərin əsas tədqiqat obyektinə çevrilmişdir.

Azərbaycan tarixinin xüsusi məqsədlərlə təhrif olunmuş və saxtalaşdırılmış səhifələri də yenidən yazılır.

Tarixçilərimiz yuxarıda göstərilən şərəfli və mürəkkəb vəzifələri həyata keçirərkən son dərəcə ağır çətinliklərlə üz-üzə qalırlar. Başlıca çətinlik ilk mənbələrin qıtlığıdır. Daha doğrusu, müxtəlif xarici dillərdə olan və dünyanın bir çox ölkələrində saxlanılan ilk mənbələrin ölkəmizə gətirilərək nəşr olunmasına və tədqiqatçılara çatdırılmasına indiyədək lazımınca diqqət yetirilməmişdir. Bu bir yana qalsın, hətta ölkəmizdə saxlanılan arxiv sənədləri də nəşr olunmamış, geniş elmi dairələrə və oxucu kütləsinə çatdırılmamışdır.

Yuxarıda qeyd olunanları nəzərə alaraq Tarix İnstitutu xarici ölkələrin arxiv və kitabxanalarında saxlanılan ilk mənbələrin Azərbaycana gətirilərək nəşr olunması kimi çox mühüm bir layihənin həyata keçirilməsinə başlamışdır.

Az vaxt içərisində Tarix İnstitutunda bu layihənin həyata keçirilməsi sahəsində mühüm uğurlar qazanılmışdır.

"**Azərbaycan Xalq Cümhuriyyətinin tarixi Böyük Britani-yanın arxiv sənədlərində**" (Bakı, 2008), "**Azərbaycan xalqına qarşı 1918-ci il mart soyqırımı**"**nın I cildi** (Bakı, 2009), **"İrəvan əyalətinin müfəssəl dəftəri**" (Ba-

kı, 2009), **"İrəvan əyalətinin icmal dəftəri"** (Bakı, 2009), **İsgəndər bəy Münşinin** "**Tarixe-aləmarayi - Abbasi**" əsərinin doğma dilimizə tərcüməsi (Bakı, 2009), "**Gəncə-Qarabağ əyalətinin icmal dəftəri**" (Bakı, 2010), "**Azərbaycan tarixi arxiv sənədlərində (XVIII-XX əsrin əvvəlləri). I cild. Rusiya Dövlət Hərbi Tarix Arxivinin sənədləri**" (Bakı, 2010), "**Azərbaycan xalqına qarşı 1918-ci il Mart soyqırımı. III cild. Xatirələr**" **Sənədlər toplusu** (Bakı, 2010), "**Azərbaycan tarixi arxiv sənədlərində (1917–1920-ci illər). I cild. Rusiya Dövlət Sosial-Siyasi Tarix Arxivinin sənədləri**" (Bakı, 2010), "**Azərbaycan xalqına qarşı 1918–1920-ci illər soyqırımı. II cild, I kitab. Gəncə quberniyası**", "**Azərbaycan xalqına qarşı 1918– 1920-ci illər soyqırımı. II cild, 2-ci kitab. İrəvan quberniyasında soyqırımı**" və digər nəşrlər institut əməkdaşlarının Azərbaycan tarix elminə mühüm töhfələridir.

Azərbaycanın görkəmli orta əsr tarixçisi İsgəndər bəy Münşinin fars dilində yazdığı "Tarixe-aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") əsərinin bütöv halda doğma dilimizdə işıq üzü görməsi Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunda icra olunan **"Azərbaycan tarixinə dair ilk mənbələrin nəşri"** layihəsinin həyata keçirilməsi sayəsində əldə olunan növbəti uğur, həm də ən mühüm nailiyyətlərdən biridir.

İsgəndər bəy Münşinin adı yuxarıda qeyd olunan əsərinin ana dilinə çevrilərək geniş oxucu kütləsinə təqdim olunması, hər şeydən əvvəl, qədim tarixçilik ənənələrinə malik olan xalqımızın orta əsrlərdə də möhtəşəm tarix əsərləri yaratdığını sübut edir. **Başqa sözlə, Azərbaycan xalqı A.A.Bakıxanovun "Gülüstani-İrəm"indən çox-çox əvvəl də tariximizə dair qiymətli ilk mənbələr yaratmaq ənənəsinə və bu cür ilk mənbələri ərsəyə gətirən İsgəndər bəy Münşi kimi görkəmli tarixçilər yetirmək dühasına malik olmuşdur.**

**Azərbaycanın orta əsrlər tarixini, xüsusilə Səfəvi imperiyasının tarixini araşdırmaq üçün son dərəcə qiymətli ilk mənbə olan "Tarixe-aləmaraye-Abbasi"nin doğma dilimizə bütöv halda tərcüməsi Azərbaycan tarix elminə çox mühüm töhfədir.**

**Yeri gəlmişkən, böyük Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin məşhur əsərinin ana dilimizə tərcüməsinin özü də bir tarixdir.**

Bu əsəri hələ 1939–1950-ci illərdə Muxtar Əfəndizadə, F.Babayev və A.Qasımov Azərbaycan dilinə çevirməyə təşəbbüs göstərmişlər. Hazırda "Tarixe-aləmaraye-Abbasi"nin Muxtar Əfəndizadə tərəfindən tərcümə edilmiş 285 səhifəsi, F.Babayev tərəfindən dilimizə çevrilmiş 102 səhifəsi və A.Qasımov tərəfindən tərcümə olunmuş 27 səhifəsi Tarix İnstitutunun Elmi Arxivində saxlanılır (Bax: inventar №№ 934,910, 2078).

Bu qiymətli əsərin dilimizə peşəkar tarixçilər tərəfindən çevrilməsinə hələ XX əsrin 50-ci illərində tarixçi alim Əbülhəsən Rəhmani tərəfindən başlanmışdı. Lakin Ə.Rəhmani bu qiymətli ilk mənbəyə ayrıca tədqiqat əsəri[1] həsr etsə də, nədənsə, tərcüməni başa çatdıra bilməmişdi.[2] Sonralar bu iş institutun elmi tədqiqat planına daxil edilmiş və İsgəndər bəy Münşinin məşhur əsərinin bütövlükdə deyil, yalnız Azərbaycana aid məlumatlarının tərcümə olunması qərara alınmışdı. Əlbəttə, bu yanlış qərar idi. Və qərar olaraq da qalırdı. Nəhayət, 2004-cü ildə Tarix İnstitunda rəhbərliyə başladıq-dan sonra bizim təklifimizlə İnstitutun Elmi Şurası böyük Azərbaycan tarixçisinin "Tarixe-aləmaraye-Abbasi" əsərinin bütöv halda tərcümə olunmasını qərara aldı və həmin qərarın icrasına başlandı. Nəhayət, 2009-cu ildə "Tarixe-aləmaraye-Abbasi"nin Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü O.Ə.Əfəndiyev və onun yetirməsi N.S.Musalı tərəfindən tərcümə olunmuş başlanğıc hissəsi çapdan çıxdı.[3] Bu, əlbəttə, Səfəvi tarixinin öyrənilməsi işinə çox mühüm töhfədir.

Tarix İnstitutunun aparıcı elmi işçisi, tarix elmləri doktoru, pro-fessor Şahin Fərzəliyevin (Şahin Fazilin) oxuculara təqdim olunan bu tərcüməsi isə tam tərcümədir, daha doğrusu "Tarixe-aləmarayi-Abbasi"nin bütövlükdə tərcüməsidir.

"Dünyanı bəzəyən Abbasın tarixi"nin ("Tarixe-aləmaraye-Abbasi"nin) bütöv halda dilimizə çevrilməsi Azərbaycan tarix elminin mənbə bazasının zənginləşməsi baxımından çox mühüm hadisədir. Böyük Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin fars dilində yazdığı bu qiymətli əsərin müəllifin öz ana dilində nəşr olun-ması Azərbaycanın geniş oxucu kütlələrinin Səfəvi dövlətinin tarixi ilə bağlı biliklərini, məlumat dairəsini daha da genişləndirəcəkdir. Bu qiymətli ilk mənbə bizim üçün həm də ona görə dəyərlidir ki, orada yazılanlar xalqımızın tarixi barədə bizim öz tarixçimizin – Azərbaycan tarixçisinin yazdıqlarıdır.

İsgəndər bəy Münşi öz dövrünün görkəmli alimlərindən biri idi. Hərtərəfli biliyə, geniş dünyagörüşlü İsgəndər bəy tarix sahəsində zəngin biliyə malik olmaqla yanaşı, həm də şair, nasir, xəttat idi. Hesab elminə də yiyələnmiş, musi-

---

[1] А.А.Рахмани. "Тарих - и алем арай-и Аббаси" как источник по истории Азербайджана. Баку, 1960.

[2] Ə.Rəhmaninin "Tarixe-aləmaraye-Abbasi"dən etdiyi tərcümənin bir hissəsi (cəmi 47 səhifə) AMEA Tarix İnstitutunun Elmi Arxivində saxlanılır (Bax: inventar №49).

[3] O.Ə.Əfəndiyev və N.S.Musalı "Tarixe-aləmaraye-Abbasi" əsərinin bir cildini İran alimi İrəc Əfşarın nəşrindən tərcümə etmişlər. Bax: İsgəndər bəy Türkman Münşi. "Tarix-i aləmaray-i Abbasi" (Abbasın dünyanı bəzəyən tarixi), I cild, Bakı, 2009.

qi sahəsi ilə də maraqlanmışdı. Farscanı, ərəbcəni mükəmməl bilirdi. 1560–1634-cü illərdə ömür sürmüş İsgəndər bəy gənc yaşlarında Səfəvi ordusunda xidmət etmiş, Azərbaycan qızılbaş döyüşçülərinin hərbi həyatını yaxın-dan müşahidə edə bilmişdi. Sonralar Şah Abbas sarayında münşi vəzifəsində çalışmış İsgəndər bəy Münşi Səfəvi hökmdarını və onun vəziri Hatəm bəy Ordubadini bir çox hərbi səfərlərdə müşayiət etmiş, gördüklərini qələmə almış və "Tarixe-aləmaraye-Abbasi" adı ilə məşhur olan mükəmməl bir Səfəvi tarixi yaratmışdır.

"Tarixe-aləmaraye-Abbasi" üç clddən ibarətdir. Əsərin I cildi 1571–1586, II cildi 1587–1616, III cildi isə 1617–1629-cu illəri əhatə edir və iki kitabda çap olunmuşdur.

**Bu qiymətli əsərin yazılmasına müəllif ömrünün 14 ilini (1616– 1629) həsr etmişdir.**

"Tarixe-aləmaraye-Abbasi"nin əlyazmaları dünyanın müxtəlif ölkələrinin kitabxanalarında, o cümlədən Azərbaycan Milli Elmlər Akademiyasının Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda saxlanılır. Dünya ölkələrinin bir çox məşhur tarixçiləri, o cümlədən Azərbaycan tarixçiləri Azərbaycan, Cənubi Qafqaz, İran və digər Yaxın və Orta Şərq ölkələrinin tarixindən bəhs edərkən İsgəndər bəy Münşiyə dönə-dönə istinad etmişlər. Bu qiymətli əsərin müxtəlif hissələri Osmanlı türkcəsinə, ingilis, rus və başqa dillərə də tərcümə olunmuşdur. İsgəndər bəy Münşinin "Tarixe-aləmaraye-Abbasi" əsəri Azərbaycan Səfəvi sülaləsinin və dövlətinin, bütövlükdə Səfəvi imperiyasının tarixini araşdırmaq üçün ən qiymətli ilk mənbədir. Əsərdə bəhs olunan hadisələrin böyük əksəriyyəti müəllifin şəxsi müşahidələrinə əsaslanır. Və real tarixi faktlardır. Səfəvi hökmdarı Böyük Şah Abbas Səfəvi imperiyasının tarixi tor-paqlarını geri qaytarmaq üçün qalibiyyətli müharibələr apardığın-dan səfəvilərin hərbi-siyasi tarixini, xüsusilə Azərbaycan Səfəvi döyüşçülərinin cəngavərlik tarixini və xalqımızın hərbi sərkərdəlik keçmişini öyrənmək üçün "Tarixe-aləmaraye-Abbasi" əsəri misilsiz ilk mənbədir. Xüsusilə ona görə ki, İsgəndər bəy Münşi sadəcə olaraq salnaməçi deyildi. O, qələmə aldığı mövzuya ilahi bir münasibət bəsləyir, "Quran" ayələrindən faydalanır, hər hansı bir hadisədən bəhs edərkən özündən əvvəlki müəlliflərə də müraciət edir, onlar-dan iqtibaslar gətirir, yeri gəldikdə müqayisələr aparır, qələmə aldığı hadisələri və faktları təhlil edir. Bütün əsər boyu verdiyi çoxsaylı şeir parçaları, zərbi-məsəllər onun həm də istedadlı şair və xalq həyatının mahir bilicisi olduğunu göstərir.

Məsələn, İsgəndər bəy Münşi yüzillərlə müxtəlif Azərbaycan dövlətlərinin paytaxtı olmuş Təbriz barədə, bütövlükdə Azərbaycan haqqında çox qiymətli məlumatlar verir. O, qeyd edir ki, Təbriz "uzun müddət fərman verən

padşahların səltənət mərkəzi olmuşdur" ("Dünyanı bəzəyən Abbasın tarixi", Şahin Fazilin əlyazması səh. 560). Təbrizin "abadlığı və əhalisinin sayı elə bir həddə gəlib çatmışdı ki, bütün İslam şəhərləri arasında onun kimi əzəmətli, əhalisi çox olan və abad yer yox idi" ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 561). Bir çox ilk mənbələr kimi "Tarixe-aləmaraye-Abbasi" əsərində də vurğulanır ki, Azərbaycan bütövlükdə "İranın", yəni Səfəvi impe-riyasının əsas güc qaynağı idi ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 561). İsgəndər bəy Münşi qeyd edir ki, Azərbaycan bütün "Iran məmləkətinin əsas ləşkər (hərbi qüvvə – *Y.M.*) yığımı mərkəzidir" ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 558). Bu məlumat hərb tari-ximizi öyrənmək üçün çox qiymətli tarixi faktdır.

İsgəndər bəy Münşi Azərbaycanın digər şəhərləri və tarixi yerləri barədə də olduqca maraqlı məlumatlar verir. O, Şəki şəhəri və Şəki bölgəsindən bəhs edərkən "olduqca uca və möhkəm qala" olan Gələsən-Görəsən qalasından bəhs edir və yazır ki, "hələ şövkət sahiblərinin heç biri bu qalanı fəth edə bilməyib" ("Dün-yanı bəzəyən Abbasın tarixi", səh. 163). İsgəndər bəy Münşi dədə-babadan Şəkini idarə edən "Şirvanşahiyyə kökündən olan" Həsən bəydən və Şəki hakimliyindən bəhs edərkən bu diyarın möhkəm qalaları içərisində Sığnaq qalasının da adını çəkir, Şah Təhmasibin özünün məşhur sərkərdələrindən birini – möhürdar Şahqulu Sultan Ustaclını "qüvvətli döyüşçülərdən ibarət bir dəstə ilə Sığnaq qalasını fəth etmək üçün göndərdiyini" qeyd edir ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 163).

İsgəndər bəy Münşinin əsərində Şirvan haqqında, xüsusilə Şah Təhmasibin 1538-ci ildə Şirvana yürüşü barədə, "Şirvanın ən möhkəm qalası" olan Gülüstan qalası müdafiəçilərinin Səfəvi hərbi qüvvələrinə qəhrəmancasına müqavimət göstərməsinə dair çox maraqlı məlumatlar vardır ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 158).

"Tarixe-aləmaraye-Abbasi"də Dərbənd səddi ("İsgəndər səddi"), Narınqala, Dərbənd şəhəri barədə də maraqlı məlumatlar vardır. İsgəndər bəy Münşi qədim Azərbaycan şəhəri olan Dərbəndi, haqlı olaraq, "Şirvan Dərbəndi" adlandırır ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 487).

İsgəndər bəy Münşinin Naxçıvan, Ordubad, Şamaxı şəhərləri, Bakı qalası, Lənkəran, Şindan qalası, Qəhqəhə qalası və digər şəhərlərimiz, qalalarımız haqqındakı məlumatları olduqca maraqlıdır.

"Tarixe-aləmaraye-Abbasi" əsərinin çox qabarıq nəzərə çarpan xüsusiyyətlərindən biri də budur ki, onun müəllifi İsgəndər bəy Münşi öz əsərini zamanın tələbi ilə farsca yazsa da, müəllif bütün əsər boyu doğma Azərbaycanına sonsuz məhəbbət bəslədiyini oxuculara açıq-aydın hiss etdirir. İsgən-

dər bəy öz əsərində onun üçün doğma olan dahi Azərbaycan şairi Nizami Gəncəviyə tez-tez müraciət edir, onu "ariflərin ən böyüyü, adlı-sanlı Şeyx Nizami" adlandırır ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 278), dahi şairimizdən tez-tez beytlər gətirir. Və yaxud böyük Azərbaycan şairi Əfzələddin Xaqanidən bəhs edərkən yazır ki, Əfzələddin Xaqani Məhuçöhrü mədh etdiyi üçün özünə "Xaqani" təxəllüsü götürmüşdür. İsgəndər bəy Münşi digər bir məlumatında isə Şeyx Səfiəddin Səfəvi ilə İran şairi Şeyx Müslihiddin Sədi Şirazinin görüşündən bəhs edir və azərbaycanlı şeyxinin iranlı şeyxdən razı qalmadığını qeyd edir: "Şeyx Səfiəddin Şeyx Müslihiddin Sədi ilə söhbət etdi, amma onunla həmsöhbət olmaqdan xoşlanmadı" ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 28).

"Tarixe-aləmaraye-Abbasi"nin Azərbaycanla bağlı məlumatları içərisində Ordubad, Nəsirəddin Tusi və Hatəm bəy Ordubadi haqqında yazdıqları da tarixi keçmişimizin doğru-düzgün öyrənilməsi baxımından çox qiymətlidir. Qədim Azərbaycan şəhəri Ordubaddan ürəkdolusu söhbət açan İsgəndər bəy Münşi bu diyarı "bütün aləmdə məşhur olan cənnətməkan" adlandırır, Səfəvi-Osmanlı müharibələri zamanı işğalçılara dəfələrlə müqavimət göstərdiyi üçün Ordubadın hədsiz dağıntılara məruz qaldığını və buna görə də Böyük Şah Abbas tərəfindən bütün dövlət vergilərindən azad olunduğunu qeyd edir.

İsgəndər bəy Münşi öz əsərində Azərbaycan xalqının dahi oğlu "bəşəriyyətin ustadı", "millətin və dinin himayəçisi" Nəsirəddin Tusinin və böyük dövlət xadimi, Böyük Şah Abbasın baş vəziri Hatəm bəy Ordubadinin də məhz Ordubaddan olduqlarını xüsusi olaraq vurğulayır ("Dünyanı bəzəyən Abbasın tarixi", səh. 791).

Əlbəttə, böyük Azərbaycan tarixçisinin Azərbaycan-Səfəvi hökmdarı Böyük Şah Abbasın şərəfinə yazdığı "Tarixe-aləmaraye-Abbasi" kimi çox mötəbər bir tarixi mənbədə dahi Nəsirəddin Tusi-nin və böyük dövlət xadimi Hatəm bəy Ordubadinin Azərbaycan xalqının övladları olmasına dair tarixi həqiqətin təsdiq olunması Azərbaycan tarixinə çox qiymətli töhfədir.

"Tarixe-aləmaraye-Abbasi"nin bir ilk mənbə kimi digər bir xüsusiyyəti də Azərbaycan oxucusu üçün maraqlıdır. İsgəndər bəy Münşi öz əsərində yeri gəldikcə, daha doğrusu qələmə aldığı hadisəni fars dilində sərrast mənalandırmaq mümkün olmadıqda, öz doğma dilinə – Azərbaycan türkcəsinə müraciət edir. Və bununla həm doğma dilinin üstünlüklərini, həm də özünün milli mənsubiyyətini nəzərə çapdırır.

Bir sözlə, xalqımıza məxsus olan "Tarixe-aləmaraye-Abbasi" kimi qiymətli bir ilk mənbənin doğma dilimizdə bütövlükdə nəşr olunması ta-

rix elmimizə çox mühüm töhfədir. Və bu töhfə oxucu-larda, keçmişimizlə maraqlanan hər kəsdə doğma tariximizə sevgini daha da artıracaqdır.

**Bir neçə söz bu böyük, olduqca əhəmiyyətli və son dərəcə ağır işi başa çatdıran Şahin Fərzəliyev (Şahin Fazil) haqqında. Şahin ölkəmizdə fars dilinin ən yaxşı bilicilərindəndir. İxtisasca şərqşünasdır. Tarix elmləri doktorudur. Professordur. Tərcümə etdiyi əsərdə bəhs olunan dövrlə bağlı qiymətli tədqiqat əsərlərinin müəllifidir. Ömrünün 13 ilini Əfqanıstanda yaşamış, tərcüməçilik etmişdir. Əfqanıstanın dövlət medalları ilə təltif olunmuşdur. Şahin həm də görkəmli qəzəlxanımızdır. Onlarla şeir kitabı, bir neçə divanı və poemaları var. Azərbaycan şairlərinin əsərlərini farscaya çevirərək Kabulda, əfqan şair və yazıçılarının əsərlərini isə Azərbaycan dilinə çevirərək Bakıda nəşr etdirmişdir. Şahin Fazil bir sıra beynəlxalq elmi məclislərdə tariximizin ayrı-ayrı məsələlərinə həsr olunmuş məruzələrlə çıxış etmişdir.**

Şübhə etmirəm ki, böyük tarixçimiz İsgəndər bəy Münşinin "Tarixe-aləmaraye-Abbasi" əsərinin bütöv halda doğma dilimizdə ilk nəşri tarix elmimizin tarixində mühüm hadisədir. Və "Tarixe-aləmaraye-Abbasi"nin ölkəmizdə fars dilinin ən yaxşı bilicilərindən olan görkəmli alimlərimiz akademik Vasim Məmmədəliyev, tarix elmləri doktoru, professor Vaqif Piriyev və filologiya üzrə fəlsəfə doktoru, dosent Tofiq Cahangirovun yüksək qiymət verdikləri Şahin Fazil tərcüməsi uzunömürlü olacaqdır.

*2010-cu il*

**Yaqub MAHMUDOV**
*Əməkdar Elm xadimi,*
*AMEA-nın həqiqi üzvü,*
*Dövlət Mükafatı laureatı*

# DÖRD YÜZ İLDƏN SONRAKI GÖRÜŞ, YAXUD SALNAMƏÇİ HƏSƏN BƏY RUMLU VƏ TARİXÇİ ŞAHİN FAZİL

Azərbaycanın və qonşu ölkələr tarixinin XV əsrin əvvəli – XVII əsrin ilk otuz ilini əks etdirən iki Azərbaycan salnaməçisinin iki məşhur əsəri – Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» («Tarixlərin ən yaxşısı») və İsgəndər bəy Münşi Türkmanın «Tarixe-aləmaraye-Abbasi» («Dünyanı bəzəyən Abbasın tarixi») uzun illərdir ki, mənbəşünaslıq və tarixşünaslıqda tədqiqat obyekti olmuş, onlarla araşdırıcı bu əsərlərin məlumatlarından dönə-dönə bəhrələnmişlər. Olduqca əhəmiyyətli haldır ki, İsgəndər bəyin mə’lum tarix kitabı artıq tam halda çap olunmuş və oxucu istifadəsinə verilmişdir. Qeyd etməliyəm ki, əsəri üzərində 14 il çalışıb onu tamamlayan salnaməçinin fars dilində yazdığı kitabın dilimizə tərcüməsi üzərində şərqşünas – tarixçi Şahin Fazil (Şahin Fazil oğlu Fərzəliyev) də nə az, nə çox 14 il qələm işlətmiş və azərbaycanlı müəllifin əsərini Azərbaycan xalqına elə xalqın öz dilində çatdıra bilmişdir. Əlbəttə, bu iş olduqca ağır, lakin olduqca faydalı və şərəfli işdir. Lakin bu tərcümədən sonra Ş.Fazil bizim məsləhətimizlə ikinci azərbaycanlı salnaməçinin – Həsən bəy Rumlunun məlum əsərinin I cildinin tərcüməsi ilə məşğul olmağa başladı və 5 illik gərgin əmək sərf etdikdən sonra bu çətin işin də öhdəsindən gəlməyi bacardı. Daha 5 il ötdü, artıq əsərin II cildi də hazırdır. Hər ikisi yaxın aylarda çap olunacaq İnşallah!

«Tarixlərin ən yaxşısı» kitabını özünün tədqiqat mövzusu kimi götürən və 1970-ci ildən başlayaraq tədqiq edən tarixçi Ş.Fazil, əgər belə demək cayizsə, üzərindən dörd əsr keçdikdən sonra salnaməçi Həsən bəy Rumlu ilə «görüşdü», onun «icazəsini» aldı, «Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» əsəri üzrə)» adlanan namizədlik dissertasiyasını bitirdi, tarix elmləri namizədi elmi adına layiq görüldü (1974), eyni adlı monoqrafiyasını nəşr etdirdi (1983). Bundan sonra da Ş.Fazilin qələmi yazmaqdan qalmadı, müəllif qırx ildən çox bir müd-

dət ərzində 5 elmi monoqrafiya, 300-dək elmi məqalə, 30-dan yuxarı səfərnamə, 5 Divan kitabı və çoxsaylı publisistik məqalələr araya-ərsəyə gətirdi, üstəlik də tərcümə fəaliyyətini saxlamadı, və yuxarıda qeyd olunduğu kimi «Tarixlərin ən yaxşısı» üzərindəki işini başa çatdırdı, cildlərə hətta 500 səhifəlik geniş şərhlər də yazdı.

Həsən bəy Rumlunun tarix kitabının müxtəlif nəşr və tərcümə nüsxələri dünyanın bir sıra ölkələrində mövcuddur. Mən bu məşhur əsərin yayılma arealını müəyyənləşdirməkdən ötrü məşhur ingilis tarixçisi və ərəbşünası Çarlz Ambrouz Storinin (1888-1963) təxminən 40 il müddətində yazdığı «Fars ədəbiyyatı, Bio-biblioqrafik icmal» kitabına müraciət etdim. Tarixçi-şərqşünas 1405-1577-ci illərin tarixini əks etdirən «Əhsənüt-təvarix» əsəri haqqında olduqca qısa məlumat verərək, Həsən bəy Rumlunun mə’lum salnaməsinin hansı ölkənin kitabxana və əlyazma mərkəzlərində saxlanması haqqında geniş yazır, eyni zamanda əsərin tərcümələri barədə də oxucunu məlumatlandırır. Ç.A.Stori tərəfindən son hissələri XI və XII cildlər kimi təqdim olunan Həsən Rumlunun kitabı Ş.Fazil nəşrində iki cild, yaxud IX və X cildlər kimi təqdim olunur. İngilis alimi «Əhsənüt-təvarix»in saxlandığı kitabxanalar haqqında da ətraflı məlumat verir.

Həsən bəy Rumlu və əsəri haqqında ən müfəssəl məlumatı öz namizədlik dissertasiyasını yazarkən Şahin Fazil vermişdir. Amma Ş.Fazildən əvvəl bu barədə müfəssəl məlumat İran alimi və naşiri Əbdülhüseyn Nəvaiyə məxsusdur. Çapa hazırladığı «Əhsənüt-təvarix»in «Tərcüməçidən» hissəsində Ş.Fazil bunu etiraf edərək yazır:

«Qeyd olunmalıdır ki, Həsən Rumlu və onun məşhur əsərinə dair tarixi məxəzlər və ədəbiyyatda müəyyən məlumat mövcuddur, amma bu barədə ən geniş məqaləni İran alimi dr.Əbdülhüseyn Nəvai yazmışdır. Belə ki, müxtəlif əlyazma nüsxələri əsasında bu müəllifin 1970-ci ildə çap etdirdiyi «Əhsənüt-təvarix» kitabında «Müqəddimə» başlıqlı məqalə də verilmiş, Həsən Rumlunun yaşadığı dövr, yaratdığı əsər və tərcümeyi-halı haqqında məlumat nəzərə çatdırılmışdır».

Müəllif və əsəri haqqında Ə.Nəvaidən başqa məqalə hazırlayan Mürsəl Öztürk adlı türk tarixçisinin «yazdığı» məqalə xüsusunda isə Ş.Fazil bildirir:

«Əsərin elə həmin cildini (I cildini – Y.M.) türk dilinə çevirən tarixçi Mürsəl Öztürk özündən demək olar ki, heç bir əlavə etməyərək Ə.Nəvainin məlum məqaləsini olduğu kimi türk oxucularına təqdim etmişdir».

Ş.Fazil sözünə davam edir:

«Biz İran aliminin (Ə.Nəvainin – Y.M.) məqaləsini əsas götürərək Həsən Rumlu, onun yaşadığı dövr və əsəri haqqında öz sözümüzü deməyə çalışdıq, nəticədə geniş bir məqalə alındı».

«Əhsənüt-təvarix»in II cildinin bir hissəsini türk dilinə çevirəni isə Cavad Cavandır. Bu türk aliminin tərcüməsi 2004-cü ildə Ankarada nəşr edilərək oxuculara «Əhsənüt-təvarix (Şah İsmayıl tarixi)» adı altında təqdim olunmuşdur. Lakin həmin nəşr fəqət bir qədər əvvəl bizim mütərcimin əlinə düşdüyündən, o, bu nəşrin naşiri Şakir Keçəl və çevirəni Cavad Cavan xüsusnda hələ bir fikir söyləməmişdir.

«Əhsənüt-təvarix» əsərindəki hadisələr 170 ildən çox cərəyan edən siyasi, ictimai, iqtisadi, dini-məzhəbi, beynəlxalq, diplomatik münasibətləri əhatə edir. Həsən bəy Rumlu da başqa dövr tarixçiləri kimi, yeri düşdükcə Qur'ani-Kərimə, hədislərdən parçalara, eşitdiyi rəvayət və hekayətlərə, gördüyü və bəzən də iştirak etdiyi hərbi qarşıdurmalara, məşhur üləma, müctəhid, şair və başqa görkəmli şəxsiyyətlərin söhbətlərinə istinad edir, hərb səhnələrini müxtəlif nəzm, beyt, qəzəl, hətta ayrı-ayrı misralarla zənginləşdirir, daha da oxunaqlı edir. Kitabdakı hadisələr fəsillərə, fəsillər isə müxtəlif bölmələrə ayrılır, sonrasa vəfat edən şəxs və şəxsiyyətlərin qısa tərcümeyi-hallarını əhatə etməklə bitir. Baş vermiş hadisələrin ardıcıllığı pozulmur və hər ilin hadisələri onların baş vermə məkanından və zamanından asılı olmayaraq ilbəil təsvir edilir. Müəllifin gah vaqiə, gah qəziyyə, gah da əhvalat adlandırdığı hadisələr Yaxın və Orta Şərqin, Kiçik və Mərkəzi Asiyanın, Qərbi və Şərqi Avropanın dövr tarixinin əsasən siyasi hadisələrini əks etdirir. Onlara misal olaraq Azərbaycan, Xorasan, Mavərənnəhr, Diyarbəkir, Rum (Osmanlı dövləti), Kürdüstan, İraqe-Ərəb, İraqe-Əcəm, Fars əyaləti, Naxçıvan, Şirvan, Əfqanıstan vilayətlərində habelə Həsən bəyin təbiri ilə desək «Firəngistanda», o cümlədən Avstriya, Bosniya, Bolqarıstan, Böyük Yunaniyyə, Serbistan, Xorvatiya, Moldaviya, Albaniya, Hüngəri (Macarıstan), Rumıniya, İtaliya və başqa bölgələrdə cərəyan edən münaqişə, müharibə, kiçik və böyük cənglərlə əlaqədar məsələlər tarixçi qələmi ilə işıqlandırılır. Əsər habelə müxtəlif bəyliklər və dövlətlər, o cümlədən Teymurilər, Qaraqoyunlular, Ağqoyunlular, Osmanlılar (Rumlular), Cəlairlər, Qaramanlılar, Şirvanşahlar, Şam dövləti (Suriya), Gürcüstan, Gilan, Misir kimi tayfa dövlətləri, həmçinin türklər, türkmanlar, ərəblər, əfqanlar, firənglər, gürcülər, cığataylar, teymurilər, kürdlər, lurlar, qızılbaşlar, zülqədərlər, moğollar, oyratlar,

rumlular, şamlılar,ustaclılar, təkəlilər, əfşarlar, vərsaqlar, qacarlar adlandırılan tayfalar haqqındakı məlumatlarla zəngindir.

Hadisələri qələmə alarkən müəllif, təbii ki, yaşadığı dövrdə təkrar-təkrar işlənən **hərbi istilahlar** – ordu, qoşun, süvari, piyada, qol (cinah), qəlb (mərkəz), cəvanğar, yaxud meysərə (sol cinah), bərənğar, yaxud meymənə (sağ cinah), minqəlay (ordunun ön hissəsi), qorçi, qorçibaşı, kutval (qalabəyi), bahadır, mülazim, tərkeş (ox qabı), səqqa (suçu), əmir, məlikül-üməra, əmirül-üməra, qazi, qaziye-əskər, yeniçəri, axınçı, yasovul və s., **mülki istilahlar** – sədr, daruğə, təvaçi, xəzanəçi, ağruq, bukavul, vəzir, hakim, mustovfi, bərat, möhürdar və s. haqqında dolğun məlumat verir.

XV-XVI əsrlərin məşhur şəxsiyyətlərindən Əmir Teymur, Uluq bəy, Şahrux, Babur, Sultan Əhməd Cəlairi, Qara Yusif, Qara İsgəndər, Cahanşah, Uzun Həsən, Uğurlu Məhəmməd, Pirbudaq, Gödək Əhməd, Yaqub, Baysunqur, I İbrahim, I Xəlilullah, Fərrux Yəsar, I Şah İsmayıl, I Şah Təhmasib, II Şah İsmayıl, Pərixan xanımlar (Şah İsmayılın və Şah Təhmasibin qızları), Əlişir Nəvai, Sultan Hüseyn Bayqara, Sultan Əbu Səid, I Sultan Bayazid, II Sultan Bayazid, Sultan Məhəmməd Fateh, Sultan Səlim, Sultan Süleyman, Sultan Murad, Əbdürrəhman Cami, İmadəddin Nəsimi, Sam Mirzə və başqaları da Həsən Rumlu tərəfindən nəzərə çatdırılan simalardandır.

Tarixi və bədii qaynaqların demək olar ki, hamısı hərb təsvirləri ilə oxucu nəzərindən yayınmamış və Əbülqasim Firdovsidən tutmuş Həsən Rumluya qədərki bütün müəlliflərin (əlbəttə, onlardan sonrakılar da!) əsərləri döyüş səhnələri, təşbehli ifadələr, ruhlandırıcı ibarələr, rəngarəng şeir parçaları ilə zəngindir. Bu baxımdan sabiq tarix yazanlarla müasir dövr tarixçiləri arasında olduqca böyük fərq vardır. Biz oxucuları konkret təsvirlərlə məlumatlandırdıqca görürük ki, sabiq tarixçilər bütün savaşları şairanə fikir və obrazlı ifadə tərzi ilə qələmə gətirmişlər.

Məsələn, Şahin Fazil qələmi ilə son dərəcə bədii tərcümə olunan "Əhsənüt-təvarix"də Həsən Rumlu yazır:

«Almas şəfəqli şəmşirlər bahadırların başını yarır, ölümsaçan oxlar əcəl tikanı kimi canlara doğru tələsirdi».

Yaxud, «Parlaq xəncər toz zülməti içərisində çıraq kimi parlayır, atəş şüası kimi toz dumanını yarırdı. Xəncər dövran igidlərinin və dövr qəhrəmanlarının başlarını bədənlərindən ayırır, düşmənlərin ömür fidanlarını qoparırdı. Qılınc qan tökməklə torpağı lalə və ərğəvan rənginə boyayır, yeri

xal-xal qızardırdı».

Yaxud, «Hər iki tərəfin qoşunları bir-birinə doğru həmləyə keçdilər. At dırnaqlarından qopan tozanaqdan günəşin nur paylayan gözü örtüldü, ayın səhifəsi məhşər gününün asi adamlarının əməl səhifələri kimi qaraldı, küləklər və tozların qopmasından saf hava zəncinin çöhrəsi və həbəşin sifəti kimi qapqara oldu».

Savaşı, yaxud həyat tərzini poetik ifadənin beyt və misraları ilə bəzəyən Həsən Rumlunun ilhamı qanadlanır, Şahin Fazilin qələmi ilə onun şairanə ruhundan belə şeirlər pərvaz edirdi:

*Kəllələr meyvə tək torpağa düşdü,*
*Qarğaya, quzğuna ruzi yetişdi.*

Yaxud:

*Nadana öyüdün faydası varmı?*
*Su üstdə nəsihət yazmaq olarmı?*
*Gözəl söhbətləri eşidərmi kar?*
*Ölüyə təbibin faydasımı var?*

Yaxud:

*Qadınların içində sanmayın namərdi yox,*
*Mərddir həmin qadın ki, həmsərinin dərdi yox.*
*Elə gözəl qadın var erkək şirə oxşayar,*
*Əri şirə bənzəyən göyçək qadınlar da var.*

«Əhsənüt-təvarix»də Azərbaycan regionunda və oraya yaxın-uzaq ərazilərdə ömür sürüb fəaliyyət göstərən müxtəlif xalq və dövlətlər arasındakı münasibətlərə mütəmadi toxunulur, dövrün siyasi həyatı əks etdirilir. Bunlara misal olaraq Azərbaycan-Şirvan, Azərbaycan-Xorasan, Azərbaycan-Mavərənnəhr, Azərbaycan-Osmanlı, Xorasan-Xətay (Çin), Qaraqoyunlu-Cəlairi, Qaraqoyunlu-İraq, Qaraqoyunlu-Ağqoyunlu, Ağqoyunlu-Səfəvi, Ağqoyunlu-Gürcüstan, Misir-Kiçik Asiya, Osmanlı-Avropa, Osmanlı-Misir, Osmanlı-Suriya (Şam), Osmanlı-Bizans, Səfəvi-Özbək, Səfəvi-Şirvan, Səfəvi-Şəki, Səfəvi-Gürcüstan, Səfəvi-Türkman, Səfəvi-Hind, Səfəvi-Gilan, Səfəvi-İraq və s. dövlətlərarası beynəl-

xalq münasibətləri göstərmək olar.

Bu günədək Azərbaycan Qaraqoyunlu dövlətinin yaranması, quruluşu, idarəçiliyi, siyasi fəaliyyəti və s. haqqında bir sıra monoqrafik əsər və elmi məqalələr yazılmışdır. Həsən Rumlunun əsərində gah «türkman şəhriyarı», gah «dövrün bəbiri», gah «İran padşahı», gah da «Azərbaycan şəhriyarı» adlandırılan əsərlərdə Qara Yusifin dövlət bayrağının təsviri haqqında hələ tam dəqiq məlumat yoxdur. Həsən Rumlu isə **Qaraqoyunlu bayrağında şir şəklinin olduğunu** əsərinin h. 816 (m. 1413)-ildə baş vermiş «Qara Yusif Türkmanın Şirvan padşahı Sultan İbrahimlə hərb etməsi» fəslində bildirib yazır:

«Şeyx İbrahim, gələcəkdə baş verə biləcək hadisədən xəbərsiz halda Qara Yusifin ordusunu seyr etməyə başladı. Onun önündə ağır bir qoşun, cah-cəlallı bir dəniz dayanmışdı… Şirvanlılar və gürcülər Qara Yusif Türkmanın bayrağı üstündəki şir şəklini gördükdə köksünə düşən tülkü kimi meydandan qaçmağa başladılar».

«Əhsənüt-təvarix»lə tanış olarkən müəyyən şəxslərə müəllif münasibətinin özünü göstərdiyini, yəni münasibətin mənfi, yaxud müsbət olması dərhal özünü biruzə verir. Məsələn, Həsən Rumlu Qara Yusif şəxsiyyəti haqqında belə yazır:

«Qara Yusif cəng meydanında qantökən şir, işrət məclisində isə gövhərsəpən bulud idi. Ədaləti və insafi ilə tanınmışdı, əliaçıqlığı ilə məşhur olmuşdu.

*Ədlindən gözəllərin çöhrəsi tək, doğrusu*
*Yanaşı dayanmışdı isti atəş, soyuq su.*

Xoş əxlaqı ilə bütün adamlardan seçilirdi. Bütün işlərində o həmişə həzrət İlahi xofunu xatırlayır, insanlarla ədalətlə davranırdı».

Müəllif sözünə davam edir:

«Zalımların cəzalanmasına, məzlumların zülmünün rəf olmasına çalışırdı. Dünyadakı insanların ərzaqlarını təmin edən dehqan və əkinçilərə hörmət edir, məhsulların çoxaldılmasına çalışırdı. Məmləkətlərin zəbti və yolların qorunmasından ötrü ayrı-ayrı yerlərə naiblər və kamil amillər (məmurlar – Ş.F.) təyin edirdi. Əsgərlərin ülufələrinin (dolanışıq xərclərinin – Ş.F.) vaxtlı-vaxtında çatdırılması və haqqı olan şəxslərin mükafatlandırılmasını bir dəqiqə belə ləngitməzdi. Dini işlərin rəvacı, peyğəmbərin şər'i məsələlərinin yerinə yetirilməsi, məscidlərin inşası, xey-

riyyə binalarının tikilməsi və vəqflərin genişləndirilməsində sə'ylər edirdi. Üzüyünün üstündə bu sözlər yazılmışdı: «Ədalətlə işləyən adam məlik, zülmkarlıq edən adam isə həlak olar».

Şahin Fazil qeyd edir ki, Həsən Rumlu çox geniş mütaliəli tarixçi olmuşdur. Onun bəhrələndiyi müəlliflərdən bir neçəsini Təbrizdə doğulmuş, sonralar Teymura xidmət edərək onun tapşırığı ilə «Zəfərnamə» adlı əsər yazmış Nizaməddin Şamini, İranın Yəzd şəhərində dünyaya göz açmış, Heratda Teymurun oğlu Şahruxa və nəvəsi İbrahim Sultana xidmət etmiş, çoxsaylı şeirlərdən başqa «Zəfərnamə», yaxud «Fəthnameyi-sahibqranı», həmçinin «Zəfərnameyi-Teymuri» və «Tarixi-cahanqoşayi-Teymuri» adlandırılan tarix kitabı yazmış Şərəfəddin Əli Yəzdini, Heratda doğulmuş və Heratda da vəfat etmiş, «Mətləüs-sədeyn və məcməülbəhreyn» adlı məşhur kitabını gələcək nəsillərə ərməğan qoymuş Kəmaləddin Əbdürrəzzaq ibn Cəlaləddin İshaq Səmərqəndini, «Təzkirətüş-şüəra» əsərinin müəllifi Dövlətşah Səmərqəndini, «Kitabi-Diyarbəkriyyə» kitabının sahibi Əbubəkr Tihrani əl-İsfahanini, əsasən Xorasan padşahları və onların varisləri haqqında dəyərli məlumatlar verən «Rövzətüs-səfa» adlı ümumtarix kitabının müəllifi Mirxand təxəllüsü ilə tanınan Məhəmməd ibn Xandşah ibn Mahmudu, çoxcildli «Həbibüs-siyər» kitabını bəşəriyyətə bəxş edən Qiyasəddin ibn Hüaməddin Məhəmmədi, «Tarixi-torkiyi-rumi», yaxud «Tarixi-torki» adlanan naməlum müəllifin tarixi mənbəyini və sair başqa tarixçiləri misal çəkmək olar.

Yuxarıda məlumat verib «Əhsənüt-təvarix»də bir çox məsələlər, o cümlədən beynəlxalq əlaqələr haqqında dəyərli faktların olması barədə biz fikir bildirmişdik. Bu mövzu uzun illərdən bəri elə mənim də diqətimi özünə cəlb etdiyindən Həsən Rumlunun təfərrüatla verdiyi Xorasan-Çin münasibətindən bəhs etmək istərdim. Bildiyimiz kimi, XV əsrin əvvəlindən sonuna qədər Azərbaycan və bir sıra ölkələr teymurilərin təsir və nüfuz dairəsi altında olmuş, necə deyərlər, teymuri hökmdarlar onlardan ilbəil xərac almış, ata hökmdardan sonra hansı oğulun padşah olacağı haqqında qərar çıxarmış və yeni padşahın hökmdarlığını rəsmən təsdiqləmişlər. Məsələn, Qara Yusifdən sonra onun oğlu Qara İsgəndər Teymurun oğlu Şahruxun razılığı olmadığı üçün, nə qədər cəhd etsə də, Qaraqoyunluların rəsmi hökmdarı təyin olunmamış, onun vəfatından sonra hakimiyyətə Şahruxun razılığı ilə Cahanşah gəlmişdir. Çin imperatoru hələ Qara Yusifin dövründə Azərbaycanla əlaqə yaratmağa cəhd etmiş, bu Qaraqoyunlu hökmdarı ilə münasibət yaratmaq fikrində olmuşdur. Həsən Rumlunun məlumatına diqqət yetirək:

1421-ci ildə (hicri 825-ci il) iki il əvvəl Xətaya (Çin – Y.M.) göndərilmiş Şahrux Teymurinin elçiləri səfərdən qayıdıb Herata gəldikdən sonra bu Xorasan hökmdarı Heratdan, oğlu Uluğ bəy Səmərqənddən, başqa elçilərsə Bədəxşandan böyük bir elçilik heyəti yaradaraq Xətaya doğru yola düşdülər. Onların mənzil başına çatana qədər getdikləri marşrut xətti belə oldu: Herat-Bəlx-Səmərqənd-Daşkənd-Seyran-Moğol Eli (cığataylar – Y.M.) – Bilqutu-Kəngər çayı-Yıldız-Şirbəhram-Turfan-Qara-Xacə-Ata-Sufi-Qamel-Səksu-Qəmcu-Qəramin çayı-Xanbalıq-Sedinfu.

Xətay padşahı ilə görüşən elçilərə onun verdiyi suallar Azərbaycan tarixi üçün çox maraqlıdır «Əhsənüt-təvarix»də oxuyuruq:

«…Tanışlıqdan sonra, ərəb, fars, türk, moğol və Xətay dillərini bilən, padşahla elçilər arasında mütərcim (mətndə «kəlməçi» – Y.M.) olan, padşahın on iki divanından biri onun idarəsinə verilən Mövlana Hacı Yusif Qazi irəli gəldi, bir neçə nəfər dil bilən və ona tabe olan müsəlmanla birlikdə bu müsəlmanların yanında dayandı, elçilərə dedi: «Əvvəlcə diz çökün, sonra isə başınızı yerə qoyun». Elçilər üç dəfə başlarını yerə uzatdılar, amma alınları torpağa toxunmadı. Bundan sonra səltənət şüarlı əlahəzrət xaqanın (Şahruxun – Y.M.) və əmirzadə Baysunqurun məktublarını sarı atlasa büküb hər iki əli üstünə qoydu. Qayda belə idi ki, padşaha çatası hər şey sarı bir parça üstünə qoyularaq təqdim olunmalıdır. Mövlana Qazi irəli gəlib o məktubları götürdü və xacəsəraya (məhrəm xidmətçi – Y.M.) verdi. Xacəsəra onu padşaha apardı, padşah götürdü, açdı, baxdı və təzədən xacəsəraya qaytardı.

Bundan sonra padşah taxtdan endi, səndəliyə əyləşdi. Biri əba, (libasın üstündən geyilən geyim – Y.M.) ikincisi qəba (əlvan naxışlı və yaxası açıq xalat-Y.M.) olan üç min dəst libası əmirlərə, yaxın adamlara və onların fərzəndlərinə geyindirdi. Sonra elçilərin yeddi nəfərini irəli apardılar: Əmir Şadi, Xacə Göyçə, ondan sonra Sultan Əhməd, Xacə Qiyasəddin, Ərğodaq, Ərdəvan, Tacəddin Bəxşi. Onlara diz çökmələri buyuruldu. Padşah əvvəlcə səltənət şüarlı həzrət xaqanın hal-əhvalını xəbər aldı. Sonra soruşdu: **«Qara Yusif sizin xaqanınıza elçi göndərir və mal yollayırmı?»** Cavab verdilər: **«Bəli, elçi göndərir və mal yollayır».** Yenə xəbər aldı: **«Sizin yerdə taxıl bahadır, ya ucuz? Nemət boldurmu?»** Cavabında dedilər: **«Ucuzdur və nemət boldur», Dedi: «Bəli, əgər padşahın ürəyi öz Allahı ilə dürüst olarsa Haqq-təala da ona bolluq və nemət verər».** Yenidən dedi: **«Mən istəyirəm ki, Qara Yusifə elçi göndərim. Orada**

**(Azərbaycanda – Y.M.) yaxşı atlar vardır. Yollar arxayındırmı?». Dedilər: «Bəli, arxayınçılıqdır. Amma Qara Yusifin yanına getməyə əgər Şahrux Sultanın hökmü olarsa, getmək olar».** Cavab verdi: **«Bunu bilirik». Sonra dedi: «Uzaq yol gəlmisiniz, qalxın və aş yeyin».**

Qeyd etməliyəm ki, bu səfər 1421-ci ildə olmuşdur, o zaman Qara Yusif artıq sağ deyildi. Görünür, o zaman onun ölümündən hələ aylarla yollarda olan nə elçilərin, nə də Çin padşahının xəbəri olmamışdır.

Tarix boyunca günahkarlara, yaxud günahkar zənn olunan adamlara müxtəlif cəza üsulları tətbiq olunurdu. Orta əsr Şərq mənbələrində də cəzalar çox verilmişdir, lakin Çində verilən cəza üsulları oxucuda dəhşət doğurmaya bilməz. «Əhsənüt-təvarix»də oxuyuruq:

«…Günahsız adamları cəza meydanına (siyasətgah) göndərdilər. Xətay kafərlərinin qayda-qanunlarına görə onların dəftərlərində hər günahın cəzası göstərilmişdir. Ona görə də, bəzisinin boynu vuruldu, bəzisi dar ağacından asıldı, bəzisi tikə-tikə doğrandı. Kimisə əzabla öldürmək lazım gəldikdə, hökm olunur, onun başına bir miqdar əhəng sürtürlər ki, tüklərdən təmizlənsin. Sonra başının ətrafını bıçaq ilə kəsir, dərisini kəllədən çıxarırlar. Sonra dərisi çıxarılmış başı bir qədər də əhəngləyərək baş sahibini üç tərəfdən dara bağlayırlar: boynundan, belindən və baldırlarından. Bundan sonra əllər arxadan bağlanır və o, cəlladlarla üzbəüz dayanır. Əgər qətl hökmü çıxarılan yüz adam varsa, yüz nəfər kafər cəllad da onları öldürür. Bir cəlladın iki adam öldürməsi adət deyil. Günahkar, yuxarıda yazılan kimi, dara bağlandıqdan sonra bir cəllad əlində bir bıçaq və bir qarmaq (qollab) ilə yaxınlaşıb onun sinəsindən bir parça əti qarmaqla yuxarı qaldırır, bıçaqla kəsir. Sonra köksü üstündə bir dırnaq boyda, yaxud pələng dərisinin xalları həcmdə deliklər açaraq dərini suhan (yiyə) kimi deşik-deşik edir, daha sonra iki əli ilə sinəsini elə bərk sıxmağa başlayır ki, qan axmağa başlayır. Sonra isə qaynar su qazanı hazırlanır, başqa bir adam qaynar suyu aftafa ilə götürür və günahkarın yaralarının üstünə tökür, başqa bir adam isə əlindəki süpürgə ilə qan çıxan yerləri yuyur. O kafərlərin bəziləri bu əməliyyat zamanı nərə çəkir, bəziləri isə susur və dözürlər. Bu əməllər bitdikdə, yaraların yerini isti su ilə təmizləyir, günahkarın arxadan çiyninə iki bıçaq saplayırlar. Sonra bıçaqları çıxarıb, açılmış dəliklərin dağlanması üçün oraya qızdırılmış bir şiş soxurlar. Sonra şişi çıxararaq, gülabı şüşəyə doldurmaqdan ötrü işlədilən bir mis borunu (qəmqəmi) yaradan çıxarılan şişin yerinə qoyur və borunun içinə qaynar su tökürlər. Belə ki, suyun hərarətindən günahkarın qır-

mızı əti ağarır. Bu əməllər bitdikdən sonra, günahkar ölməyincə, kəsibdeşmə işləri təzədən başlayır».

**Şükür sənə, İlahi, bizdə də müxtəlif cəza üsulları olub, amma beləsi yox! – Ş.F.**

Bundan sonra "Əhsənüt-təvarix" yenə də «at mövzu»sundan bəhs olunur. Görünür Çin imperatoru yaxşı at vurğunu imiş. O, əbəs yerə Azərbaycan atlarını Çinə gətirmək istəmirmiş ki!.. 1420-ci ilin 19 yanvarında «elçiləri yenə çağırdılar. Onlar gəldikdən sonra padşah buyurdu: **«Mən ova gedirəm. Siz öz şonqarlarınızı (ov quşları – Y.M.) əlinizdə hazır saxlayın».** O, elçilərə bir qədər tənə edərək buyurdu: **«Sizlər bizdən yaxşı şonqarlar aparıb bizə pis atlar gətirirsiniz»**.

Məsələnin ardına diqqət yetirin. Çin imperatoru ovda olarkən məlum oldu ki, Şahruxun ona göndərdiyi at «padşahı üstündən yerə atmış və onun ayağı əzilmişdir. O, bundan qəzəblənərək hökm etmişdir ki, elçiləri həbs edib, Xətayın şərq şəhərlərinə göndərsinlər».

Bu hadisənin şərhindən məlum olur ki, niyə Çin imperatorunun könlündən Azərbaycan atları keçirmiş!

Şahin Fazilin tərcümə etdiyi «Əhsənüt-təvarix» əsərini diqqətlə mütaliə etdikcə burada nələr görmək olmur? Məsələn «Bu il Şirvanda taun oldu»; «Sultaniyyədə taun baş verdi»; Ulusların və tayfaların köçürülməyə məruz qalmaları…; Qəhətlik və aclıq…; Hakimiyyət uğrunda illərlə davam edən öldürücü çəkişmələr…; Şahzadələr arasındakı (qardaş olsalar belə) ölümlə nəticələnən səltənət iddiaları; Atanın oğulu, oğulun atanı həyatdan məhrum etməsi və s…

Hadisələrin şərhi gəlib çıxır 1434-cü (h. 838) ilə.

Xorasan hökmdarı Şahruxun Fəzlullah Nəiminin müridlərindən biri olmuş Əhməd Lur tərəfindən bıçaqlanma hadisəsi. Salnaməçi yazır:

«Bu il Şahrux padşah Heratın came' məscidindən çıxdığı vaxt hürufilərin sərdarı olan Mövlana Fəzlullah Astrabadinin (Nəiminin – Y.M.) müridlərindən Əhməd Lur adlı bir kətan geyimli (nəmədpuş) şəxs şikayətçi kimi əlində bir kağız tutduğu halda ona yaxınlaşdı. O həzrət (Şahrux – Y.M.) mülazimlərindən birinə onun məqsədini öyrənib, ərz etməsini buyurdu. Əhməd Lur qabağa gəlib, padşahın qarnına bir bıçaq sapladı. Mənqu Quçinin oğlu Əli Sultan onun qətlinə izn aldı və istədiyi şəkildə əmri yerinə yetirdi».

Bundan sonra XV əsrin ən müqtədir türk şairlərindən biri olmuş İmadəddin Nəsiminin öldürülməsi hissəsi gəlir. Şahin Fazilin diqqətlə

tərcümə etdiyi bir hissə Fəzlullah Nəiminin davamçılarından biri olmuş bu şair haqqında çox deyilmiş və çox yazılmış, Nəsimi ilə bağlı yazılanlardan biri də Həsən Rumlu tərəfindən qələmə alınmışdır. «Əhsənüt-təvarix»də oxuyuruq:

«Bu il 1434 (m.838)-cü ildə Seyid Nəsimi öldürüldü. Bunun səbəbi onun cavan bir [oğlana] bağlanması idi».

Fikrimizcə, bu eşq bağlantısı yox, arifanə və sufianə bir bağlantı (Mövlana Cəlaləddin Rumi və Şəms Təbrizi arasındakı bağlantı kimi – Y.M.) olmuşdur. Həsən Rumlu sözünə davam edir:

«Bir gün o cavan bir ox atdı. Seyid bu misraları dedi:

*Oxunu tuşla mənim üstümə ki, ox altdan*
*Baxdığın vaxt hədəfə, qoy mənə dəysin nəzərin.*

Bir gün Hələb üləmalarından biri ondan soruşdu: «Sən bu cavanın üzündə nə görmüsən?». Dedi: «Onun çöhrə aynasında Haqqın (Allahın – Ş.F.) surətini müşahidə edirəm».

Möhtərəm oxucu, gördünüzmü Nəsimi ilə həmin oğlan arasındakı sufiyanə bağlantını? Fikrimcə bu, Həsən Rumlunun məsələnin məğzinə daha dərindən yanaşmamasından irəli gəlir.

Bu sorğu-sualın davamını izləyin:

«Alim dedi: «O cavanı biz də görürük, amma Haqqın surəti bizim görüşümüzə dəymir». Dedi: «Bu Qaf dövlətinin ənqa quşu sizin qabiliyyətimizi (yəni, görmək bacarığınızı – Y.M.) özünə yuva edə bilməmiş, səadətin hüma quşu isə o böyük kölgəni sizin həşəmət başınıza salmamışdır».

Mən bu məqaləmdə məsələnin ardını da oxucu nəzərinə çatdırmaq fikrindəyəm. Yenə söz Həsən Rumlunundur:

«Seyid Nəsimi və o alimin arasında bu söhbət olduqdan sonra o şəxs üləmaların yanına getdi, onun dediklərinə bir neçə yalan sözlər də artırdı. Seyid bir gün bu qəzəli dedi:

*Həqbin nəzər olmazsa görməz məni bir kimsə,*
*Allahın üzün görməz xudbinsə əgər gözlər.*

*Qəlb ayinədir öylə, varsa görüşə təşnə*
*Musa kimi həzrəttək Tur içrə camal izlər.*

*Göz var isə hər kəsdə gördükdə o rüxsarı*
*Ənvarı-təcəllanı* bizlər kimi seyr eylər.*

*Gəldi o üzün kəşfi «Allah cəmil»**ilə,*
*Ölgünsə əgər bir qəlb bu şərhə nə söz söylər?*

*Rüxsarın ilə verdin göz nuri Nəsimiyə,*
*Görmürsə səni, qeyri bir şəxsi görər gözlər?*

Həsən Rumlu sözünə davam edir:

«O cavan daim Nəsiminin beytlərini söylərdi. Onu tutub soruşdular: «Bu Nəsiminin şe'ridir, yoxsa sənin?». Dedi: «Mənim şe'rimdir». Onu dar ağacından asmaq istədikdə, Seyid Nəsimi özünü çatdırıb «Mənim şe'rimdir» dedi. Buna görə də seyidin dərisini soydular. Dəri soyulan vaxt bədənindən çox qan axdığı üçün rəngi saraldı. Ona «Rəngini niyə saraltdın?» sualı verildikdə, dedi: «Mən eşqin doğulduğu yerdən zahir olan eşq asimanının günəşiyəm. Günəş isə qürub vaxtı saralır».

«Əhsənüt-təvarix» əsərində Qaraqoyunlu-Şirvan münasibətləri Qaraqoyunlu dövlətinin süqutuna qədər dostluq və həmkarlıq, gah düşmənçilik və müxalifət müstəvisində davam edir, birincilər ikincilərə qarşı gah hücuma keçir, gah da köməklik göstərirdilər. Məsələn, Şirvanşah I İbrahim qonşuluqda hökm sürən Qara Yusiflə gah hərb, gah da sülh məqamında dayanırdısa, onun oğlu Qara İsgəndərlə I Xəlillulah arasında ixtilaf da baş verməkdəydi, çünki İsgəndərin qoşunu hərdənbir tarac məqsədiylə Şirvana yürüş edirdi ki, həmin yürüşlərin biri haqqında Həsən Rumlu belə məlumat verir:

«Bu il (1434 – Y.M.) Əmir Xəlilullah, türkman (qaraqoyunlu – Y.M.) qoşunun hücumundan o diyarda böyük viranlıq yarandığı üçün, mülazimlərindən Xaliqverdi adlı bir şəxsi Şahrux padşahın dərgahına yolladı, Şirvanın vəziyyətini, oradakı dağıntı və dəyişiklikləri (extelal) ona ərz etdi. O, həmçinin Diyarbəkrə də bir qasid göndərərək, Qara Osman Bayandurdan kömək istədi. Buna görə də, Əmir Osman çoxlu döyüşçü dəstələri ilə öz yürüş bayrağını Azərbaycana tərəf qaldırdı».

* Ənvare-təcəlla – bu ifadədəki «ənvar» sözü «nurlar», «təcəlla» isə «gözə görünmə», «aşkar olma» mənasını verir (qeyd Ş.Fazilindir – Y.M.).

** Allah Cəmil – «Gözəl Allah» deməkdir (qeyd Ş.Fazilindir – Y.M.).

Müəllif sonralar Qaraqoyunlu-Şirvan münasibətlərinin nisbətən normallaşdığını göstərərək, Cahanşahın hətta öz oğlu Pirbudağa I Xəlilullahın qızını aldığını bildirir. Ümumiyyətlə, çox hallarda hökmdarlar dövlətlərarası münasibətlərin möhkəmlənməsindən ötrü tarixi ədəbiyyatda «kəbin diplomatiyası» kimi adlandırılan «diplomatik» addımlar atır, qız verib qız almaqla öz aralarında qohumluq əlaqələri yaradırdılar.

Əsərdə Azərbaycan-Osmanlı münasibətlərinin də Uzun Həsən hakimiyyətinin ikinci onilliyinədək normal şəraitdə davam etdiyi, sonradan kəskinləşdiyi və hərb şəraitində davam etdiyi təfərrüatla qeyd olunur.

Ş.Fazil tərcüməsindən aydın olur ki, Azərbaycan-Xorasan qarşılıqlı münasibətləri gah ziddiyyət, gah qarşılıqlı anlaşma, gah da qarşıdurma vəziyyətində davam etməkdəydi.

Azərbaycan və Mavərənnəhr dövlət qurumları arasında Teymur dövründən başlayaraq Sultan Əbu Səidin Uzun Həsən tərəfindən öldürülməsinə qədər nisbətən normal vəziyyət vardı.

Əsərdə dövranın böyük şəxsiyyətləri Ənvəri, Sədi, Nizamülmülk, Şah Qasim Ənvar, Uluğ bəy, Şərəfəddin Yəzdi, Nizaməddin Şami, Cələləddin Dəvvani, Əbubəkr Tihrani, Zəhirəddin Babur, Cahanşah Həqiqi, Şah İsmayıl Xətai, Kəmaləddin Behzad və başqaları haqqında, habelə onların əsərləri, şəxsiyyətləri və tərcümeyi-halları barədə heç olmasa adları çəkilməklə müəyyən məlumat vardır. Məsələn, Həsən Rumlu Uluğ bəyin hökmdarlığı, alimliyi və vəfatından elə məftunluq və təfərrüatla danışır ki, adam o nadir insanın yaradıcılığına heyran olmaya bilmir. «Əhsənut-təvarix»də oxuyuruq:

«O, fəzilətdə, ədalətdə və səxavətdə sorğu-sualsız və bənzərsiz idi, daim fəzl və kamal əhlinin yüksəlməsi üçün çalışırdı. İslam dünyasının onun kimi hikmətli, ədalətli və fəzilətli padşahı yox idi. Güclü hafizə qüvvəti vardı… İnşa etdiyi yerlərdən: Səmərqənddəki mədrəsə. Oraya çoxlu vəqf etmişdi. Həmin mədrəsədə yüz nəfər tələbə elm öyrənirdi. Səmərqənd yaxınlığında bir rəsədxana tikərək zic (ulduzların hərəkət və vəziyyətini təyin edən cədvəl – Y.M.) yazdı».

Həsən Rumlu məşhur nücumşünas Uluğ bəyi belə təqdim etdikdən sonra ondan əvvəl bütün zic yazanların adlarını birbəbir çəkir; Təhmufures, Əbrəxsin, Bəxtünnəsər, Menelaus, Bətləmyus, Əbu Məşər Bəlxi, Məcisti, Məmuni, Məhəmməd ibn Cabir, Xalid Mərvizi, Əxtəri Məssah, Üstürlabi, Əbu Reyhan Biruni, Hüsaməddin Salar, Ənvəri, Zahid Əbdürrəhman

Xazeni, Əlayi… və s. Olduqca fərəhli haldır ki zic yazanlar arasında bir nəfər Azərbaycanlı astroloqun da adı çəkilir: Fəridəddin Əbülhəsən Əli ibn Kərim Bakuyi! Bundan sonra Həsən Rumlu bir görün kimin ismini və əsərinin adını çəkir: «Həzrət xatəmül hükəma (həkimlərin sonuncusu), əfzəlül-üləma (alimlərin fəzilətlisi), xülasəte-sokkanül-ərazeyn (dünyada yaşayanlarn ən sevimlisi), nasehəl və s-səlatin (məliklərin və sultanların nəsihətverəni), varesül-ənbiya və-l mürsəlin (göndərilmiş nəbilərirn varisi), əkməlül-üləmaəl-motəqəddemin (əvvəlki və sonrakı üləmalarını ən mükəmməli), ostade-bəşər (bəşər ustadı), əqəle-hadiye-əşər (on nəfər yol göstərənin ən ağıllısı) Xacə Nəsirül-həqq və d-dünya (Allahın, dünyanın və dinin havadar Xacəsi) Məhəməd ibn Həsən Tusinin… hicri altı yüz altmışıncı ildə yazdığı «Zice-Elxani»!

Həqiqətən də, Həsən Rumlunun bizim Nəsirəddin Tusiyə verdiyi belə yüksək qiymət, əlbəttə, Şahin Fazilə və mən də böyük iftixar hissi yaratdı.

İndisə Həsən Rumlunun məlumat verdiyi iki məsələ xüsusunda danışmaq istəyirəm: Tüfəngin icadı və XV əsrin əvvəllərində mövcud olmuş gəmi növləri.

Əsərdə yazılıb: «Tüfəngin peyda olma səbəbi belədir: Firəngistanda, Fransa ölkəsində Feri Bedre adlı bir rahib qotur (cərəb) xəstəliyinə tutulmuşdu, nə qədər müalicə olunurdusa da, bunun heç bir faydası olmurdu. O vaxtlarda bir dərviş onun yanına gəlib dedi: «Əgər bu xəstəlikdən sağalmaq istəyirsənsə duzlu torpağı (şurezar) götürüb gərək onu kükürd və kömürlə bir yerdə həvəngdə (havun) döyəsən, sonrasa həmin məhlulu od üstünə töküb onun buxarına verəsən ki, bu mərəzdən şəfa tapasan». Feri Bedre bu göstərişə əməl etdi. Bir dəstə keşişin yanında düzəltdiyi məhlulu od üstünə qoyduqda, odda bir şölə göründü. Dedilər ki, bu məhluldan cəng silahı düzəltmək olar. Barıtı padşahın (Fransa kralının – Y.M.) yanına apardılar. O, barıtı bir qamışa doldurdu və ona od vurdular. Od qamışı partlatdı. Məhlulu qamış əvəzinə dəmirə doldurdular. O da partladı. Kükürdü bir qədər azaltdılar. İstədikləri alındı. Bu kəşfdən sonra yavaş-yavaş top və badlic (kiçik top – Y.M.) də peyda olundu».

Mən Həsən Rumlunun top-tüfəngin yaranma səbəbi barədə gətirdiyi məlumatı nə təsdiq, nə də inkar edə bilmərəm. Amma, deyə bilərəm ki, «Əhsənüt-təvarix» müəllifinin, görünür ki, mütaliə dairəsi geniş olmuş və o, müxtəlif mənbələr əsasında bu və ya digər hadisələr barədə fikir söyləmişdir.

İndisə, gəmiçilik tarixi. Müəllif bu haqda da məlumat verməyi özünə borc bilmişdir. Həsən bəy Rumlu 1499 (1501)-cu ildə II Sultan Bayazidin Avropaya hücumu ilə əlaqədar yazır:

«Bu il Sultan Bayazid… kafərlər diyarına tərəf yollandı. Döyüş alətləri, top, tüfəng yığdılar, hər diyardan çoxlu gəmi gətirdilər, onların içərisinə o cümlədən firəng və Rumeli dənizçilərinin (məllahan) «gukə» dedikləri iki gəmi, [habelə] toplar və zərbzənlər (qala döyəcləyən silahlar – Y.M.) yerləşdilər. Elə böyük gəmi düzəltməyə məliklərdən başqa heç kim qadir deyildir. Çünki hər bir gəminin qiyməti iyirmi dörd min əşrəfi puldur. Gəmilərin adları belədir: Gukə, mavnə, barçə, qədrəqə, qalyan (qalyun). Qədrəqə adlanan gəminin yelkəni (badban) yoxdur və kürəklə (paru) hərəkət edir, lakin bütün gəmi növlərindən sürətlidir… Gukə adı ilə tanınan gəmi ortasında ox olan kaman kimidir. Onun kamanı həmişə ox kimi rəvandır, oxu isə həmişə kaman kimi atılmağa hazırdır…Mavnə adlı gəmi növü geniş və açıq bir qala kimidir… Qalyan adlanan başqa gəmi növü mavnəyə oxşayır, amma ondan kiçikdir. Qalyan gəmilər arasında ən kiçik, lakin sürətli gəmidir».

Qeyd etməliyəm ki, Həsən Rumlu başqa dövlətlər və başqa dövlət başçıları haqqında ilbəil məlumat vermişdirsə də, onun sözünün yönü əsasən Azərbaycanla, o cümlədən Şirvanla bağlı mühüm hadisələrə istiqamətlənmişdir. Əsərin bir yerində deyilir:

«Bu ilin əvvəllərində (h. 822=m.1419) Qara Yusif Pirbudağı bir dəstə əmirlə Şirvana tərəf yolladı. Dərbənd qalasını mühasirəyə almaq çətin olduğundan geri qayıtdılar».

Müəllif Qara Yusifi «Azərbaycan şəhriyarı» adlandıraraq yazır:

«Bu il (h.822=m. 1419) Qara Osmanın oğlu Yaqub bəy cəng iddiası ilə qaladan çıxdı, döyüşdən sonra tutuldu. Pir Ömər (özbək hökmdarı – Y.M.) onu Təbrizə yolladı, özü isə Ərzincana döndü, amma sonra o, Qara Yusif Türkmanın yanına dilli-dilavər qasidlər yollayaraq kömək xahiş etdi. Azərbaycan şəhriyarı bu xahişin müqabilində… iyirmi min adlı-sanlı döyüşçünü Qara Osmanın dəf olunmasından ötrü Pir Ömərin mədədinə göndərdi».

Həsən Rumlu 30 il Qaraqoyunlu dövlətinin hökmdarı olmuş Cahanşah haqqında təfsilatla məlumat vermiş, onun siyasi həyatının müxtəlif epizodlarını, o cümlədən Uzun Həsənlə münasibət və münaqişələrini geniş şərh etmişdir. Müəllif bu Qaraqoyunlu padşahının mənfi xüsusiyyətlərindəki məqamları nəzərə çatdırmaqla yanaşı onun xislətin-

dəki müsbət cəhətləri də vurğulamışdır: «Cahanşah amma alimlər (ülə-ma) və şairlərə (şüəra) ehtiram edirdi, elə özü də şeir yazırdı. Təxəllüsü «Həqiqi» idi. O, öz şeirlər divanını Mövlana Camiyə göndərdi, cavabında isə mövlana bu beytləri yazıb ona yolladı:

*Humayun bir kitab? Dürr içində dürr!*
*Mənə gəlib çatan gövhərdir-nədir?!*
*Orda həm qəzəl var, həm də məsnəvi,*
*Həm dünyəvi əsrar, həm də mə'nəvi.*
*Hər şe'irin ilk beyti necə də parlaq,*
*Əzəl sübhündən də təbaşir tək ağ.*
*Son beytdən nə deyim? Sonuncu beyti*
*Əbədi bir feyzin əsl mənbəi.*
*Yalançı cahanda bu gözəl divan*
*«Həqiqi» bir şahdan vermədə nişan.*

Həyat müddəti altmış dörd yaş, səltənət əyyamı otuz il, məmləkətləri Azərbaycan, İraqi-Ərəb, İraqi-Əcəm və Fars [vilayəti] idi».

«Əhsənüt-təvarix»də Mavərənnəhrin ən böyük padşahlarından biri Sultan Əbu Səid və Azərbaycanın ən əzəmətli şahlarından Uzun Həsən qarşıdurması və birincinin ikinci tərəfindən öldürülməsi də təfərrüatla qələmə alınmışdır.

Xorasanın əzəmətli padşahı Sultan Hüseyn Mirzə Bayqaranın Uzun Həsənə yazdığı məktubun mətninin, habelə başqa namə və fərmanların məzmununun kitabda işıqlandırılması Həsən Rumlunun əsərində yer tutan ən maraqlı səhifələrdəndir.

Kitabda Uzun Həsənlə Sultan Məhəmməd Fatehin döyüşü (1473) müfəssəldir. Müəllif Ağqoyunlu qoşununun məğlubiyyətinin təsvirindən sonra yazır:

«Tarixe-torkiye-rumi» kitabında Həsən padşahın çərşənbə gününü özü üçün uğurlu saydığı yazılmışdır, çünki o, Cahanşah padşahı və Sultan Əbu Səidi çərşənbə günü ələ keçirmişdi, amma bu dəfə həmin gün cəngə gələrək məğlub edildi».

Həsən Rumlu özündən əvvəl yazılmış tarix kitablarından kompilyativ şəkildə istifadə etməmiş, bəzi tarixi hadisələri ciddiyyətlə dəqiqləşdirmişdir. Məsələn o yazır:

«Bu il (h. 888=m.1483) Qaraman vilayətinin padşahı Qasım bəy ibn İb-

rahim bəy ibn Məhəmməd bəy vəfat etdi. **Bu sətirlərin müəllifi Həsən – Əmir Sultan Rumlunun nəvəsi,** o sülalədən Qaraman vilayətində hökmran olan **altı nəfər adamı müəyyən etdi:** Məhəmməd bəy, İbrahim bəy, Məhəmməd bəy (İkinci Məhəmməd bəy – Y.M.), İshaq bəy, Pir Əhməd bəy və Qasım bəy. Onların hökmranlıq etdikləri müddət yüz on bir il oldu».

Ara-sıra əsərdə müəllifin tənqidi münasibətinə (P.Fazil yazır: hətta fələyə qarşı!) də təsadüf olunur: «Qəhr qəhrəmanı (burada Sultan Hüseyn Bayqara – Y.M.) onun qətlinə fərman verdi. Qəddar ruzigarın etdiyi işin nəticəsi və fırlanan (dəvvar) fələyin əziyyətverici oyunu belədir: Onun qürub şəfəqi günahsız adamların qanlarına qarışmış, sübhünün aydınlığı isə ədalətli kimsələrin nəfəsi ilə qaralmışdır».

Əlbəttə, əlim altında olan «Əhsənüt-təvarix» kitabı və onun müəllifi Həsən Rumlu haqqında çox yaza bilərdim, lakin yazdıqlarımla kifayətləndim, çünki yaxın vaxtlarda azərbaycanlı tarixçinin fars dilində yazdığı bu qiymətli kitab başqa bir azərbaycanlı tarixçinin – professor Şahin Fazilin dilində tərcüməsi ilə oxuculara təqdim olunacaq, bir tarixçi salnaməçinin və başqa bir tarixçi mütərcimin zəhməti qiymətləndiriləcəkdir, İnşallah!

İndi isə bir qədər şərqşünas tarixçimiz, fars dilinin mükəmməl bilicisi, 13 il Əfqanıstanın müxtəlif idarə, nazirlik və Nazirlər Şurasında ixtisası üzrə tərcüməçi işləmiş, zəhməti müqabilində bu dövlətin 3 Dövlət medalı və Sovetlər İttifaqının çoxsaylı Fəxri Fərmanları ilə təltif edilmiş, Əfqanıstanda olmadığı müddətdə özünün namizədlik və doktorluq dissertasiyalarını yazmış və elmi adlara layiq görülmüş, professor elmi adı almış, 5 monoqrafiya, 300-dən çox elmi məqalə, 20-dək şeir kitabı, o cümlədən 5 böyük həcmli «Divan» kitabları yazmış, Azərbaycan Yazarlar Birliyinin üzvü, 140 yaşlı tarixi «Məcməüs-şüəra» («Şairlər yığıncağı») adlı şairlər məclisinin sədri, AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun baş elmi işçisi, «Mənbəşünaslıq və tarixşünaslıq» şöbəsinin müdiri Şahin Fazil oğlu Fərzəliyev (Şahin Fazil) haqqında məlumat vermək istərdim:

Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsini 1964-cü ildə fərqlənmə diplomu ilə bitirən, sonrakı işgüzar və yaradıcı həyat işlərində dəfələrlə müxtəlif xarici ölkələrdə elmi ezamiyyətlərdə olan, Beynəlxalq Konfranslarda iştirak edən, çoxsaylı səfərnamələr və publisistik məqalələr yazan, səfərlərini Əfqanıstandan başlayıb hələlik Yaponiya ilə qurtaran, xarici dillərdəki 4 kitabın, o cümlədən İsgəndər bəy Münşi Türkmanın məlum kitabının dilimizə tərcüməsini tamamlayan,

«Əhsənüt-təvarix»in hər iki cildi üzərindəki işini bitirən və kitablara şərhlər yazan, 13 aspirant və dissertantın elmi rəhbəri, eləcə də 50-dən çox namizədlik və doktorluq işlərinin rəsmi opponenti olan, eyni zamanda «gecə-gündüz» şe'rlər yaradan Şahin Fazil mütəxəssislər tərəfindən dəyərləndirilən şəxslərdəndir.

Ş.Fazil şairdir. Şair olduğu üçün də, onun tərcümə etdiyi kitablardakı şe'rlər, başqa tərcüməçilərin etdikləri kimi sətri tərcümədə deyil, orijinala uyğun olaraq şe'r kimi də oxucu nəzərinə yetirilmişdir. Məsələn, daha böyük hakimiyyətə çatmaq uğrunda Pirbulaq Qaraqoyunlu ilə atası Cahanşah arasında gedən məktublaşma fars dilində olduqca poetik tərzdə yazılmış və mütərcim tərəfindən də olduqca şairanə tərcümə olunmuşdur. Ata şahzadə Pirbudağa yazır:

*Olma xilaf, ey xələfim, sən belə,*
*Mən günəşəm xəncərini at yerə.*
*Şah mənəm, mülkə mənəm hökmran,*
*Sənsə – xələfsən, özünü müt'i san.*
*Qəsd eləmə haqqımıza, ey həqir,*
*Ayinimiz qəsbi rəva bilməyir.*
*Rüstəmə Söhrab ki, qılınc qovzalı,*
*Sonda nə? Bədnamçılıq oldu adı.*
*Sanma çatar taxt ilə tac sən, sənə,*
*Sanma atamdan mənə, məndən sənə.*

Bağdad hakimi olan şahzadə Pirbudağın atası olan Azərbaycan hökmdarı Cahanşaha yazdığı mənzum şe'r parçası maraqlıdır. Öz şah atasının taxtına çıxmaq arzusunda olan şahzadə oğul ona belə deyir:

*Ey ki, sevinci, fərəhi dövlətin,*
*Qoy sənə qalsın o şanın, şöhrətin.*
*Çəkmə qılınc-qalxanı fərzəndinə,*
*Vurma zərər gövhəre-dilbəndinə.*
*Bəlli ki, sən mülkdə mahir adam,*
*Mən oğulam, sən atasan, olma xam.*
*Köhnə ağac bagə gər illət verər,*
*Tazə ağac isə lətafət verər.*
*Sən qocalıbsan, yaşa dərviş təki,*

*Sınsa əgər ox, kimə lazımdı ki?*
*Mən cavanam, bəxt cavan, yaxşı bil.*
*Sən bu iki gənclə savaşdan çəkil.*
*Bağdad özü şah bilir oğlunu,*
*Xamlıq olar versəm əlimdən onu.*
*Taxtımı almaq sənə bir xam xəyal,*
*Vermərəm əldən, bacarırsansa al.*

Məsələnin sonrasını nəsr ilə yazan Həsən Rumlu ata-oğul münaqişəsinin davamını belə ifadə edir:

«Nəhayət Pirbulaq bir dəstə adamı şəhərdən qovdu və bəzi əsgərlərin ona e'tibarı qalmadı, onların bir neçəsi qaçıb Cahanşah padşahın yanına gəldi, başqa bir dəstə isə fərar etməyə fürsət gözləyirdi. Pirbulaq bu vəziyyətdən xəbərdar olduqda həmin adamların bəzilərini qətlə yetirdi, bəzilərini də çaya tulladı. Şirvan padşahı Əmir Xəlilullahın qızı olan arvadlarından birini və [Qara] İsgəndərin oğlu Əlvəndin ölümündən sonra özünə arvad etdiyi digər arvadını qətlə yetirdi, fərar edən adamların fərzəndlərini və başqa əlaqədar şəxsləri dəryaya atdı və nəhayət özünə belə məsləhət gördü: Müxalifətdən əl çəksin, [atası ilə] sülhə gəlsin və barışıq təməlini möhkəmləndirsin».

Şahin Fazil «Əhsənüt-təvarix»in tərcüməsi prosesində ara-sıra yuxarı təbəqə adamlarının bəzi əxlaqdan uzaq hərəkətlərinə dözməyərək, onlara qarşı bir-iki sözlə də olsa öz münasibətini bildirməyə bilmir. Məsələn, əsərin əlyazma nüsxəsinin mütaliəsi vaxtı nəzərimi cəlb edən bəzi hadisələr elə mənə də olduqca ağır gəldi:

«Yenə bu il (h.873-m.1468/69) Mirzə Əbülqasim ibn Cahanşah padşah Miyanə yaxınlığında Həsənəlinin (qardaşının – Y.M.) fərmanı ilə öldürüldü. O, olduqca zalim və əxlaqsız adam idi. Kirmanda [olarkən] elan etdi ki, qadınlar çövkanbazi oyununa tamaşa etməyə gəlsinlər. Onların bir yerə yığışmalarından sonra o, öz iti yerişli şəhvət atını cövlana gətirib, gözəllərdən murad topunu ələ keçirirdi. Söyləyirlər ki, o, günlərin bir günü bir kəndə gəldi və şəriət hökmü olmadan bir qızın bəkarətini pozdu. Ertəsi il də yolu həmin kəndə düşdü. O yerin qadınlarının bəziləri qıza istehza ilə «damad gəldi» dedilər. Mirzə Əbülqasim o kəndə çatdığı vaxt o avara qızı məsələni öyrənməkdən ötrü yanına çağırdı. Qız qadınların tənəsini ona şikayət tərzi ilə danışdıqda Mirzə Əbülqasimin qəzəb atəşi şölələndi, hamıya car etdi ki, qoca olsun, ya cavan, bütün qadın və kişilər üç gecə- gündüz bir

yerə toplaşsınlar. Hamı yığılıb gəldikdə əsgərlər qadınları ərlərinin, ərləri isə qadınlarının qabağında zina, biabır, üzüqara və rüsvay etdilər» **(Allah onlara lənət eləsin! – Ş.F.)**.

Yaxud:

Həsənəli ibn Cahanşah padşah ibn Qara Yusif ibn Qara Məhəmməd ibn Törəmiş ibn Bayram Xacə. Həsənəlidə tam dəlilik nəşəsi vardı. Əmirlərinin və inaqlarının (yaxın adamlarının – Y.M.) arvadlarını bir yerə toplayır, özü onların arasında oturur, qadınlara rəqs etmələrini buyururdu, meyli düşən hər qadınla əylənirdi. Qəzəbi tutduğu hər kəsin arvadını ərindən boşatdırır, təlaq müddəti hələ bitməmiş onu başqa birinin nikahına verirdi. Həsənəli atların yallarını və quyruqlarını kəsdirir və hökm edirdi ki, qadınlar baldırlarını lütləyərək atlara minsinlər.

O, bu il (h.874-m.1469/70), yuxarıda yazıldığı kimi, öldürüldü **(Yaxşı oldu ki, öldürüldü! – Ş.F.)**

Yaxud:

Yenə bu il (h. 886-m.1481/82) Yaqub padşah qorunan ölkələrin (məmalike-məhruse) bütün vergilərini əhaliyə bağışladı **(Əhsən! – Ş.F.)**

Beləliklə, Həsən Rumlunun əsəri haqqındakı yığcam qeydlərimizi Şahin Fazilin dərkənarları ilə sizə bitirdik. İndisə «Əhsənüt-təvarix» kitabını bir neçə il ərzində sətir-sətir tərcümə etmiş Şahin Fazilin özü haqqında yazmaya bilmərəm. Mən onu çox yaxşı tanıyıram, işgüzarlığına bələdəm, elmi fəaliyyətini və tərcüməçilik qabiliyyətini təqdir edirəm.

**İndi isə müxtəlif alimlərin Şahin Fazil və əsərləri haqqında fikir və mülahizələrindən sətirlər:**

*AMEA-nın akademiki, N.Gəncəvi adına Ədəbiyyat İnstitutunun direktoru **Bəkir Nəbiyev**:*

«Şahin Azərbaycanın son illərdə sıraları seyrəlmiş, indi az qala barmaqla sayılan kamil qəzəlxanlarından biri, yaradıcılıq fəallığı baxımından onların arasında xüsusilə seçilən şairdir. O, öz poetik yaradıcılığı ilə yanaşı, elmi tədqiqatla məşğul olan bir araşdırıcı kimi tanınır. «Azərbaycan və Osmanlı imperiyası», «XV əsr Azərbaycan dövlətlərinin quruluşu», «Quba tarixi» kimi mötəbər monoqrafiyaların müəllifi, tarix elmləri doktoru, AMEA Tarix İnstitutunun şöbə müdiri, BDU-nun professorudur. Beləliklə də, poeziya və elm Şahin Fazilin çağdaş ictimai fikir fəzasında uğurlu mövqe tutmasına səbəb olan mötəbər qanadları-

dır. O eyni zamanda fəal ictimai xadimdir. Uzun illərdir ki, qiymətli ənənələrə malik olan «Məcməüş-şüəra» yaradıcılıq məclisinin sədri kimi fəaliyyət göstərir. Şair 1960-80-ci illər arasında dörd dəfə Əfqanıstanda uzun müddətli ezamiyyətlərdə olmuş, bu ölkənin bədiiyyat xəzinəsindən bir sıra tərcümələr etmişdir».

*AMEA-nın akademiki, BDU Şərqşünaslıq fakültəsinin kafedra müdiri, BDU İlahiyyat fakültəsinin dekanı* ***Vasim Məmmədəliyev****:*

«…Nəhayət, 2004-cü ildə İnstitutun Elmi Şurası direktor, millət vəkili, AMEA-nın müxbir üzvü, professor Yaqub Mahmudovun təşəbbüsü ilə «Tarixe-aləmaraye-Abbasi» əsərinin bütöv halda doğma dilimizə tərcümə edilməsini qərara aldı və tezliklə bu qərarın icrasına başlandı. 2009-cu ildə AMEA-nın müxbir üzvü O.Ə.Əfəndiyev və onun yetirməsi N.C.Musalı tərəfindən əsərin tərcümə olunmuş başlanğıc hissəsi çapdan çıxdı. Çoxcildlik əsərin yalnız birinci cildinin tərcüməsi. Bəs qalan cildlər? Xoşbəxtlikdən bu vacib işin öhdəsindən tanınmış şərqşünas, tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyev (Şahin Fazil) gəldi və məşhur tarixçimizin məlum kitabı 2010-2014-cü illərdə tam şəkildə işıq üzü gördü. Bu tərcümə mənbəşünaslıq tariximizdə çox əlamətdar hadisədir desəm, əsla yanılmaram… Hazırda o, başqa bir Azərbaycan tarixçisi Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» («Tarixlərin ən yaxşısı») kitabını tərcümə etməkdədir və onun min səhifədən ibarət I cildini artıq bitirmişdir. Mən sonda alim-mütərcim-şair dostuma yeni-yeni müvəffəqiyyətlər arzulayıram.

*Gəncə Dövlət Universitetinin professoru* ***Sabir Əliyev****:*

«Şahinin xoşbəxtliyindən, onun divanı XX əsrin məhz ilk və son divan nümunəsi olaraq qaldı… Şahin bir şair kimi təpədən – dırnağa klassikaya bağlıdır və onun əməli davamıdır… Açıq demək lazımdır ki, Şahin, az qala, qafiyə milyonçusudur; müqəffa sözlər tapmaq onun əlində, təkrar edirik, mum kimidir… Bu kitabı oxuyandan sonra istər-istəməz adam belə düşünür ki, Şahinin divanı heç kəsin divanından əskik deyil və o, bu tipli kitab üçün ancaq təhsinə layiqdir. Şahin bizim çoxdilli şairimizdir; o, Azərbaycan türkcəsi ilə bərabər farsca və dəri dilində də müxtəlif formalarda şeirlər yazır. Belə yaradıcılıq yolunda ona uğurlar diləyirik. Şair hər şeyi düz deyir, bircə şeyi səhv deyir:

*Hanı şerində izafət, hanı elmində xəta?*
*Şahinin qiymətini Azərbaycan bilmir.*

Xeyir, Azərbaycan xalqı Şahin Fazilin qədrini də bilir, qiymətini də verir. Təki hamının qəzəli Şahininki qədər sadə olaydı».

*AMEA A.Bakıxanov adına Tarix İnstitutunun direktoru **Yaqub Mahmudov**:*

«Dünyanı bəzəyən Abbasın tarixi»nin («Tarixe-aləmaraye-Abbasi»nin) bütöv halda dilimizə çevrilməsi Azərbaycan tarix elminin mənbə bazasının zənginləşməsi baxımından çox mühüm hadisədir. Böyük Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin fars dilində yazdığı bu qiymətli əsərin müəllifin öz ana dilində nəşr olunması Azərbaycanın geniş oxucu kütlələrinin Səfəvi dövlətinin tarixi ilə bağlı biliklərini, məlumat dairəsini daha da genişləndirəcəkdir… Bir neçə söz bu böyük, olduqca əhəmiyyətli və son dərəcə ağır işi başa çatdıran Şahin Fərzəliyev (Şahin Fazil) haqqında. Tarix elmləri doktorudur. Professordur. Tərcümələr müəllifidir. Ömrünün 13 ilini Əfqanıstanda yaşamış, tərcüməçilik etmişdir. Əfqanıstanın dövlət medalları ilə təltif olunmuşdur. Şahin həm də qəzəlxanımızdır. Onlarla şeir kitabı, bir neçə divanı və poemaları var. Azərbaycan şairlərinin əsərlərini farscaya çevirərək Kabulda, əfqan şair və yazıçılarının əsərlərini isə Azərbaycan dilinə çevirərək Bakıda nəşr etdirmişdir. Şahin Fazil bir sıra Beynəlxalq elmi məclislərdə tariximizin ayrı-ayrı məsələlərinə həsr olunmuş məruzələrlə çıxış etmişdir».

*AMEA Nəsimi adına Dilçilik İnstitutunun şöbə müdiri, Əməkdar elm xadimi, professor **Sultan Qəzənfər Kazım**:*

«Elm aləminə göz açdığımız gündən «Münşi» adını eşitmişik… A.A.Bakıxanov adına Tarix İnstitutunun ortalığa qoyduğu hər biri 1000 səhifədən artıq, iki nəfis cilddə (kitabda – Y.M.) «Dünyanı bəzəyən Abbasın tarixi» kitabı qarşımızdadır. Orta əsr aliminin bu nəhəng kitabı və onun tərcüməsi bir İnstitutun bir illik bütöv zəhmətinə bərabərdir. Mübaliğəsiz deyərdik ki, Tarix İnstitutu bir ildə heç bir kitab çap etdirməsə idi, bu kitab onun üzünü ağarda bilərdi… Kitab bədii əsər kimi oxunur. Hazırkı dövrdə bəlkə də bizim heç birimizin qələm tarixi həqiqəti, tarixi hadisələri bu cür yüksək səviyyədə əks etdirə bilmir. Tərcüməsi də gözəldir. Ş.Fazil tərcümə prosesində təhriflərə yol vermədiyini bildirmək üçün hər bir terminoloji sözün fars dilindəki orijinalını da qeyd etmiş-

dir… İndi Tarix İnstitutu Həsən bəy Rumlunun böyük əsərinin – «Əhsənüt-təvarix»in tərcüməsi ilə məşğuldur. Bu əsərin («Tarixe-aləmaraye-Abbasi»nin – Y.M.) ardınca Həsən bəy Rumlunun gəlişi və tariximizin bir çox qaranlıq səhifələri daha parlaq işıq saçacaqdır».

*Prof. **Q.C.Kazımov** «Şahin Fazilin «Divan» Xəmsəsi və onun dili haqqında» adlı məqaləsində isə yazır:*

«Şahin haqqında sözümə akademik Bəkir Nəbiyevin sözləri ilə başlamaq istərdim: «…Poeziya və elm Şahin Fazilin çağdaş ictimai fikir fəzasında uğurlu mövqe tutmasına səbəb olan mötəbər qanadlarıdır. Şahin şeirin, qəzəlin dinclik nə olduğunu bilməyən cəfakeş fəhləsidir». Qeyd edim ki, Bəkir müəllim-hörmətli akademik əlində möhkəm dəlil-sübut olmadan söz deyən deyildi. Onun sözləri məni də düşündürdü, kitablarını götürüb vərəqləməyə başladım. Şahinin yaradıcılığına nəzər saldıqda, adama elə gəlir ki, bunlar bir adamın işi deyildir və əgər bir adamın işi olsa idi, onu yormuş olmalı idi. Lakin Şahin müəllim yorulmaq nə olduğunu bilmir. Bu günlərdə söhbət zamanı 1000 səhifədən artıq bir həcmdə beşinci «Divan»ını bitirmək üzrə olduğunu qeyd edərək dedi: «Mən Divanlar Xəmsəsi yazacağam». Şahinin «Divan»ları müasirlərimizin bir çoxunun başa düşdüyü kimi adi şeir toplusundan ibarət deyildir. Müəllif «Divan» yaradıcılığının bütün ənənələrinə əməl etmişdir… Qəzəl yazanlarımızın bir qismindən fərqli olaraq, Şahin ilk növbədə ana dilimizin zəngin daxili imkanlarından istifadəyə üstünlük verir».

***Mir Cəlal Məştəqayi**:*

«Böyük Yaradana həmdü səna olsun ki, əruz və heca vəznlərində minlərlə şeir müəllifi olan Şahin Fazilə yaradıcılıq imkanı verdi və nəhayət uzun əsrlər boyu Yaxın və Orta Şərq ölkələrində, o cümlədən şimal Azərbaycanında xətir-hörməti olan ənənəvi «Divan» bu əsrdə (XX əsr – Y.M.) də yarandı. Şahin Fazil XX əsrdə fenomen hadisə saydığım «Divan» yaradıcılığını gerçəkləşdirmişdir».

M.C.Z.Məştəqayi başqa məqaləsində yazır: «Şahin olduqca çox mütaliə edir, öyrənmədiklərini soruşur, bilmədiklərini öyrənir… Onun yazdıqları uğurludur».

*AMEA Folklor İnstitutunun elmi işçisi **Qiymət Məhərrəmli**:*

«Şahin Fazil klassik divan ədəbiyyatı ənənələrini davam etdirməklə bərabər, mövzu rəngarəngliyinə, forma müxtəlifliyinə görə sələflərinin

yaradıcılıq irsinin tamamilə yeni yöndə inkişafına nail ola bilmişdir… Əsası 767-ci ildə Xəlil ibn Əhməd tərəfindən qoyulmuş ərəb əruzunun digər Şərq ölkələrində, o cümlədən Azərbaycanda geniş yayıldığı dövrdən başlayaraq, klassik şairlərimizin ədəbiyyat xəzinəmizi dünya şöhrətli sənət nümunələri ilə zənginləşdirdiyini nəzərə alsaq, XXI əsrə qədəm qoyduğumuz bu illərdə həm müasir, həm də klassik şeir formalarında, dövrün tələbləri ilə səsləşən sənət nümunələri yaradan şair Şahin Fazil poeziyasının əhəmiyyətini daha dərindən dərk etmiş olarıq».

***Ənvər Nəzərli:***

«Şahin Fazil klassik poeziyamızın, həm də türkdilli deyil, farsdilli poeziyamızın da bilicisi olmaqla yanaşı, klassik Azərbaycan ədəbi ənənələrini özünəməxsus təfəkkür tərzi ilə davam etdirən novator şairdir… Qələm Şahin Fazilin əlindən yerə düşmür».

*AMEA-nın A.Bakıxanov adına Tarix İnstitutunun elmi işçisi, fəlsəfə üzrə elmlər doktoru* ***Eynulla Mədətli:***

«Azərbaycan mənbəşünaslıq və tarixşünaslıq elmi Vətən tarixinin şərəfli səhifələrinə həsr edilən qiymətli bir əsərlə zənginləşib. Azərbaycan Milli Elmlər Akademiyasının Abbasqulu ağa Bakıxanov adına Tarix İnstitutunun "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri, tarix üzrə elmlər doktoru, professor Şahin Fazilin yeddi yüz səhifəlik, geniş əhatəli tədqiqat əsəri "Quba tarixi" uzun müddətdən sonra işıq üzü görüb… Fikrimcə, Vətən tarixi yüksək elmi təfəkkürlə yanaşı, həm də vətən-yurd sevgisi ilə yazılmalıdır. Professor Şahin Fazilin "Quba tarixi" kitabı məhz belə yazılıb».

AMEA-nın müxbir üzvü İlyas Babayev, professorlar Vaqif Arzumanlı, Vaqif Buduqlu Piriyev, Tofiq Mustafazadə, Kərim Şükürov, Qasım Hacıyev, Tərlan Quliyev, Teymur Əhmədov, Cənnət Nağıyeva, tarix üzrə fəlsəfə doktoru Fərəh Hüseyn və başqa elm adamları da bu tarixçi alim, habelə şair haqqında məqalələr yaxmışlar.

Mən Şahin Fazilə tariximizlə bağlı neçə-neçə mənbənin tərcümə etməsini arzulayıram.

*2020-ci il*

**Tofiq MÜTƏLLİBOV –** *şair*

## YENİ GÖRÜŞLƏR SEVDASI İLƏ

Elə şairlər var ki, onların tərcümeyi-halını öyrənmək üçün şe`rlərini oxumaq kifayətdir:

*Ürəyim qapıdır, taybatay açıq,*
*Yaxşı adamların üzünə, amma.*

deyən Şahin Fazil də belələrindəndir. Onun bu günlərdə çapdan çıxan "Yenə görüşərik" şe`rlər məcmuəsi dediklərimizi sübut edir. Şahin Fazil tarix elmləri namizədidir. Azərbaycan SSR Elmlər Akademiyasının Tarix İnstitutunda baş elmi işçidir. O, 13 ilə yaxın Əfqanıstanda işləmişdir. Bu müddət ərzində Şahinin istər Azərbaycanda, istərsə də əfqan mətbuatında bir sıra şe`rləri çap olunub. Kitaba giriş sözü yazan şair Nəriman Həsənzadənin qeyd etdiyi kimi "Şahin Əfqanıstandan təzə qayıtmışdı. Asiyanın qəlbində yerləşən bu qədim əfsanələr və dağlar diyarında çalışdığı müddət ərzində onlarla əfqan ədibinin poeziya və nəsr nümunələrini dəri (fars) dilindən ana dilimizə çevirib Bakıda nəşr etdirməklə yanaşı, neçə-neçə Azərbaycan şair və nasirinin əsərlərini də Kabulda çap etdirmiş, xeyirxah iş görmüşdür. Şahin qürbətdə çox qalmışdır, lakin Vətən həmişə onun xəyalında canlanmış, onu özünə sarı çəkmişdir".

Şahin Fazilin "Yenə görüşərik" kitabını vərəqlədikcə oradakı şe`rlərdən Vətən torpağının ətrini, şairin həsrətini duyuruq, bu həsrət notlarının mənalı şe`rlərə döndüyünün şahidi oluruq:

*Vətəndə qoymuşuq urəyimizi,*
*Vətən müqəddəsdir, Vətən əzizdir.*
*Vətəndən ayırdı vəzifə bizi,*
*Vətənə bağlılıq vəzifəmizdir*

misraları Şahinin şe`rlərinin leytmotivinə çevrilir. Onun "Əfqanıstan fəğanı" silsiləsini oxuduqca özümüzü şairin təzadlı boyalarla təsvir etdiyi həmin yerlərdə hiss edirik. Qulaqlarımıza topların gurultusu, mərmi səsləri gəlir. "Qürbətdə" şe`ri fikrimizi qürbətə qanadlandırır, "Yaralı yuxular" bizi diksindirir. "Şirin yuxuları yaraladılar" deyən şairin arzusu, məqsədi birdir:

*Kaş körpə səsləri ayılda bizi,*
*Bizi oyatmaya güllə səsləri.*

Bu qəbildən olan "Kəsik başın raket qəlpəsinə dedikləri" şe`rində də bu fikir, bu duyğu davam etdirilir:

*Kaş mənim ölümüm son ölüm olsun,*
*Kaş da sən olasan sonuncu qəlpə.*

Ş.Fazil Əfqanıstan silsiləsindən yazdığı əsərlərinin əksəriyyətinin mövzusunu həyatdan götürüb. O, əsasən, gördüyü, şahidi olduğu həyəcanlandığı hadisələri qələmə alır. Elə ona görə də bu nümunələr quraşdırmaçılıqdan, sözcülükdən, ritorikadan, süni pafosdan uzaqdır, həyatidir, təbiidir, yaddaqalandır. "Danış bala, danış" şe`ri bu qəbildəndir. Şe`rin girişində göstərilir ki, 1988-ci ilin may ayının 9-da axşam saat 18-də əksinqilabçı qüvvələr tərəfindən Kabul şəhərinə 17 raket atıldı. Onlarla adam həlak oldu, yaralandı. Raketin düşdüyü bir evdə yaşayan 10 nəfərlik ailənin cəmi bir üzvü təsadüfdən sağ qaldı. Hadisədən üç gün keçməsinə baxmayaraq həmin oğlan nə yeyir, nə danışır".

Şe`ri oxuduqca həmin oğlanın faciəsi bizi də sarsıdır. Şair minlərlə yetim qalmış uşağı həmin oğlanın simasında ümumiləşdirməyə çalışır. "Evə adam girər, dost-tanış girər, evə raket girdi o axşamüstü" deyərək şe`rinə ictimai məna verir:

*Səsin qırılmasın sınıq ney təki,*
*Danış, qoy səsinlə fitnə,şər sussun.*
*Danış bala, danış, elə danış ki,*
*Raketlər lal olsun, güllələr sussun.*

Vətən torpağının həsrəti, ayrılıq yollarının tərənnümü, "Yenə görüşərik" kitabının istər "Yaralı yuxular", istərsə də "Qoşmalar", "Bayatılar", "Nəğmələr" bölməsindəki poetik nümunlərin əsasını təşkil edir. Şair "Vətəndən aralı kövrək olmuşuq, anadan aralı balalar kimi" deyərək, qürbətdə yaşamağın ən ağır dərdolduğunu göstərir. Uzun illər Əfqanıstanda çalışan Şahinin cavan çağlarında qapqara saçlarının ağappaq ağarması təsadüfi deyil. Öz təbirincə desək, qara saçlarını qürbət ağardıb. Kitaba daxil edilmiş "Qürbət bayatıları" silsiləsi bunu bir daha sübut edir:

*Dağ çəkir,*
*Gecə mənə dağ çəkir.*
*Yatanlara nə var ki,*
*Nə çəkir, oyaq çəkir*
* * *
*Çiçək gözəl, gül gözəl,*
*Muğan gözəl, Mil gözəl,*
*Qürbətin balındansa,*
*Qudyalçayda gil gözəl.*

Yaxşı deyiblər ki, Əfqanıstan bir çoxları üçün əsl kişilik məktəbi oldu. Oğul və qızlarımız bu məktəbdə iradə, dözüm, mərdlik dərsini öyrəndilər. Sınaqlı günlər keçirdilər, imtahan verdilər. Şahinin dediyi kimi:

*Gəlmişəm cahana imtahan üçün,*
*İmtahan verirəm açıq-aşikar.*
*Mənim hər dəqiqə, hər saat, hər gün*
*Ömür müəllimə imtahanım var.*

Bəli, insan ömrünün sonuna kimi sınaq, imtahan qarşısında olur. "Mənim öz aləmim var, şe`r-söz aləmim var" deyimi Şahində istər ölkədə, öz doğma respublikasında, istərsə də xaricdə olanda poetik imtahan verib, sənətin əbədiyyətinə, ölməzliyinə inanıb. Qeyd edib ki, "öləndən sonra da şair danışır, şe`rini oxuyan oxucuların dodaqlaryla". Bunun üçün isə sənətin cığırları ilə addımlamağın lazım olduğunu duyan şair göstərir ki, poeziya əsl sınaq meydanıdır, əsl imtahandır. Dünyanın sirlərini, təzadlarını öyrənmək üçün o "Dünya ilə söhbət"ə girişir:

*"Biz varına şərik elə bir ucdan*
*Ruzunu bölərik elə bir ucdan,*
*Gələrik-gedərik elə bir ucdan,*
*Ey gidi dünya" – deyir.*

Lakin o dünyanın hansı ölkəsində olursa-olsun, Vətən üçün darıxır, "Qəribəm, vətənsizəm, vətən düşüb yadıma" deyir. Vətən torpağının işıqları həmişə onun gözlərində alovlanır. Doğma ocaqlardan qalxan tüstülər hər yerdə gözlərinə görünür.

Qızları Şahanə və Ülviyyəyə "O mənəm, sizləyəm olsam hayanda, O mənim kölgəmdir sizə köməkdir" deyir.

"Qayəm ömrüm boyu işıq yandırmaq" təbili Şahin öz şe`rləri ilə oxucuların qəlbində kiçicik də olsa ümid, əməl işığı yandırmağa çalışır, sevgilisinin simasında bütün gənclərə üz tutaraq "Gəl mənə özünün kədərini ver, mənsə verim sənə hər sevincimi" söyləyir.

Obrazlı deyim tərzi Şahin Fazilin bir çox şe`rlərinin əsasını təşkil edir. O, əsərlərinin təmtəraqlı sonluqla, dəbdəbəli, pafoslu sözlərlə tamamlamır. Məsələn, anası Gülcənnətin xatirəsinə həsr etdiyi "Vida" şe`rini belə yekunlaşdırır:

*Yoxluğun düz oldu, varlığın yalan,*
*Yaman üstələdi ölüm həyatı.*
*Sənə "gözlərini aç" – deyən balan*
*Sənin gözlərini özü qapadı.*

Yaxud "Ulduz müharibəsi" şe`rinin sonluğunu götürək:

*Bizim ulduzlarla nə işimiz var,*
*Çəkə bilmirik heç yerin dərdini.*

"Zəncir" şe`rinin ümumiləşdirilməsində şair elə zəncir arzu edir ki, "Bütün ölkələri, bütün elləri birləşdirə bilsin bir-birinə".

Kitabda şairin nəğmə mətnləri də verilib. Şübhəsiz ki, bunların içərisində yaxşıları var. Lakin həmin mətnlərin rədifləri təzə deyil, dəfələrlə işlədilib. Məsələn, "Səndən doya bilmirəm", "Sənin yerin görünür", "Baxışlarınla", "Sevgili yar gəlmədi", "Yadındamı" və s. Adlarını çəkdiyimiz nümunələrdə təzəlik, obrazlılıq yox dərəcəsindədir.

Kitabdakı bir çox şe`rlər bədii cəhətdən nöqsanlıdır. Məsələn,

*Dəbə minibsə də futbol oyunu,*
*Mən azərkeşiyəm poeziyanın .*

*("MƏN" şeirindən)*

*Tabından alıram tabımı inan,*
*Qəlbim tablamazdı tabsızlığına.*

("KƏDƏRLİ ÇAĞIMDA YAZDIĞIM ŞEİR" şeirindən)

*Bizim dövrlərdə şair yox olub,*
*Bəs tənqidçi neçə olubmu, görən.*

("SUALLAR" şeirindən)

Zəif məqaləni xatırladan bu beytlər Şahinin yaradıcılığında alaq otları kimi görünür. Ümumiyyətlə götürdükdə, "Yenə görüşərik" kitabında toplanmış şe`rləri şairin yaradıcılıq uğurlarından xəbər verir, ondan daha yaxşı əsərlər gözləməyimizə inam yaradır. Özü demişkən:

*Mən kürəyəm, mən ocaq,*
*Məndəki istəyə bax,*
*Özünü yandıracaq,*
*Yumruq boyda ürəyim,*
*Yumruq boyda ürəyim.*

Bəli, biz buna inanırıq.

*"Azərbaycan gəncləri" qəzeti, 1990.*

**Bəkir NƏBİYEV –** *Akademik*

## ŞAHİNİN QANADLARI

Bu yaxınlarda Şahin Fazilin "İkinci Divan"ını və yenə də onun "Təzkireyi-Şahin"ini aldım, həvəslə oxudum və hər iki kitabda qarşılaşdığım bəzi maraqlı mətləblər bu bir neçə səhifəni yazmağa məni həvəsləndirdi.

* * *

Şahin Azərbaycanın son illərdə sıraları seyrəlmiş. İndi az qala barmaqla sayılan kamil qəzəlxanlanrından biri, yaradıcılıq fəallığı baxımından onların arasında xüsusilə seçilən şairdir. O, öz poetik yaradıcılığı ilə yanaşı, elmi tədqiqatla məşğul olan bir araşdırıcı kimi də tanınır. "Azərbaycan və Osmanlı imperiyası", "XV əsr Azərbaycan dövlətlərinin quruluşu", "Quba tarixi" kimi mötəbər monoqrafiyaların müəllifı, tarix elmləri doktoru, AMEA Tarix İnstitutunun şöbə müdiri, BDU–nun professorudur. Beləliklə də poeziya və elm Şahin Fazilin çağdaş ictimai fıkir fəzasında uğurlu mövqe tutmasına səbəb olan mötəbər qanadlarıdır. O, eyni zamanda fəal ictimai xadimdir. Uzun illərdir ki, qiymətli ənənələrə malik olan "Məcməüş-şüəra" yaradıcılıq məclisinin sədri kimi səmərəli fəaliyyət göstərir. Şair 1960-80-ci illər arasında dörd dəfə Əfqanıstanda uzun müddətli ezamiyyətlərdə olmuş, bu ölkənin bədiiyyat xəzinəsindən dilimizə bir sıra tərcümələr etmişdir.

Elmi və ədəbi yaradıcılığının müxtəlif məqamları ilə əlaqədar olaraq Ş.Fazil tez–tez xarici ölkələrə səfərlərə gedir, beynəlxalq ədəbi məclislərdə, şeir gecələrində əsərlərini oxuyur. Elmi konqreslərdə məruzələrlə çıxış edir, müzakirələrdə fəal iştirak edir.

Şairi onun bir çox səfər yoldaşlarından fərqləndirən bir şakəri var. Özüm İranda, Iraqda, Türkiyədə dönə–dönə şahidi olmuşam ki, o, yalnız ədəbi, elmi toplantılarda deyil, mədəni tədbirlərdə, ən müxtəlif səciyyəli rəsmi görüşlərdə, avtobusda və təyyarədə də öz dəftər-qələmindən ayrılmır, təsirləndiyi bütün məqamları qeydə alır. Axşamlar mehmanxanada həmkarları istirahət edəndə, televizora baxanda Şahin bir tərəfə çəkilib öz yol qeydlərini səhmana salır, təkmilləşdirir, ancaq bundan sonra rahatlıq tapır. Bu cəhətdən onu görkəmli istiqlal şairimiz Xəlil Rza Ulutürklə müqayisə etmək olar. Şahinin bu qəbildən olan yol qeydləri və gündəlikləri bir müddət sona maraqlı şeir, məqalə və səfərnamələrə çevrilir, kitablar şəklində nəşr olunur.

* * *

Tanınmış füzulişünas, fılologiya elmləri doktoru, prof. Sabir Əliyev "Şahin Fazil Divanının poetikası" adlı məqaləsində onun hələ birinci divanından aldığı ümumi təəssürat əsasında yazmışdır ki, "şair bu kitabı üçün" ancaq təhsinlərə layiqdir" ("Hikmət" elmi araşdırmalar toplusu, N 95-6, 2005ci il). Sabir müəllim də, bu əsəri yüksək qiymətləndirən f.e.d., prof. Teymur Əhmədov da, f.e.d., əruzşünas Tərlan Quliyev də Divandakı qəzəllərin bədii keyfiyyətləri haqqında qənaətlərində tamamilə haqlıdırlar. Ş.Fazilin həm birinci, həm də təzə nəşr olunmuş ikinci Divanı məzmunca məqbul olduğu kimi, formaca da zəngindir. Həmin divanları poeziyamızın əlvan bir gülüstanına bənzətmək olar ki, onun hər çiçəyi öz biçiminə, rənginə gözəlliyinə xas olan ətir saçır. Buradakı dibaçə, minacat, qəzəl, qəsidə. rübai, təxmis, nəzirə, təkbeyt, hecanın rəngarəng bölgülərində yazılmış qoşma, gəraylı və bayatıların hər birinin öz təravəti var.

Qəzəl yazanlarımızm çoxundan fərqli olaraq, Ş.Fazil əsərlərində Ana dilimizin zəngin daxili imkanlarından maksimum dərəcədə istifadə etməyə üstünlük verir. Çağdaş oxucular üçün mənası aydın olmayan ibarəli ərəb ifadələri, mürəkkəb, çoxmərtəbəli fars izafət tərkibləri onun qəzəllərinə yaddır. Bu baxımdan yanaşdıqda Ana dilli Azərbaycan qəzəlinin keçdiyi təkamül və tərəqqi yoluna ümumi bir baxış belə deməyə əsas verir ki, qəzəlimiz tarixin müxtəlif mərhələlərində alınma sözlərə münasibət müstəvisində gah mürəkkəbdən sadəyə, aydınlığa, gah da sadədən mürəkkəbə doğru gedən enişli-yoxuşlu, bəlkə də dalğavari bir yol keçmişdir. Konkret desək məsələn, XIII-XV əsrlərdə yaşamış İzzəddin Həsənoğlu, Qazi Bürhanəddin, İmadəddin Nəsimi və Nemətullah Kişvərinin əsərlərinin dili XVI əsrin dahi şairi Füzulinin dilinə nisbətən alınmalardan istifadə etmək baxımından sadə olmuşdur. Şah İsmayıl Xətai, Qövsi Təbrizi, Saib Təbrizi, Molla Vəli Vidadi, Molla Pənah Vaqif, Heyran xanım kimi şairlərin dili isə bu baxımdan XIX əsrin böyük qəzəlxan S.Ə.Şirvaninin qəzəllərinin dili qədər qəliz olmamışdır. Görünür, ayrı-ayrı şairlərin dilinin bu və ya digər dərəcədə sadə, yaxud qəliz olması (ərəb və fars sözləri ilə həddən artıq yüklənməsi) dövrün ümumi ədəbi dil ənənə və meyllərilə yanaşı, eyni zamanda (bəlkə də daha çox) hər bir sənətkarın yetişib, şair kimi formalaşdığı konkret mühitlə, onun əsas təhsili ilə, bütün bunlardan doğan öz yaradıcılıq prinsipləri, poetik zövqü və fərdi sənətkar qənaətləri ilə şərtlənən bir məsələdir.

Əlimizdəki divan öz tərtib prinsiplərinə görə klassik irsin yaşam ənənələrinə əsaslanır. Onu yerli-yataqlı bir dibaçə müşayiət edir. Ardınca minacat, xütbə, sonra isə məsnəvi, qəzəl, qəsidə, ricu şəkillərində işlənmiş əsərlər gəlir. 50 ildən bəri yaradıcılıqla məşğul olan şair, ənənəyə uyğun olaraq, öz bədii və elmi əsərləri barədə ümumi məlumat verir, Azərbaycan qəzəlinin keçib gəldiyi tarixi inkişaf yolu barədə mülahizələrini söyləyir, I.Nəsimidən Ə.Vahidə qədər qəzəl korifeylərimizin böyük yaradıcılıq hünərlərini təsbit edir. O, qanuni iftixar duyğusu ilə etiraf edir ki, bir qələm sahibi kimi illər boyu sənət təcrübəsi keçəndən, götür–qoy edəndən sonra Ə.Vahidin yolunu özü üçün örnək seçmişdir. Azərbaycan qəzəlinin öz ənənəvi qaynaqlar ilə yanaşı, məhz Ana dilimizin geniş imkanları əsasında inkişafında Ə.Vahidin həqiqətən müstəsna xidmətləri vardır və Ş.Fazili də bu yolun yolçusu və istedadlı davamçısıdır. O, bəzilərinin iddia etdikləri kimi, qəzəli ancaq Azərbaycantürk mənşəli sözlərlə yazmaq tələblərindən uzaqdır. Dilimizdə vətəndaşlıq hüququ qazanmış yüzlərlə ərəb və fars sözləri var və onlar əsrlər boyu bizim üçün doğmalaşmış, ədəbi və elmi əsərlərimizdə, ümumiyyətlə, lüğət fondumuzda özlərinə möhkəm yer tutmuşlar. Çağdaş Azərbaycan qəzəlində də həmin sözlərin qanuni yer tutması çox təbiidir (vətən, qələm, eşq, novruz, kitab, pərvanə və s.). Şairin bəzi həmkarları ilə ixtilafına səbəb onların bir çox qəzəllərində ağına-bozuna baxmadan, vəzn və qafiyə xatirinə işlədilən mürəkkəb fars izafət birləşmələri, dilimizdə qarşılığı olan ərəb sözləridir (bülbül əvəzinə əndəlib, ay üzlü əvəzinə mahru, saç əvəzinə geysu və s.)

* * *

**Ş.Fazil şeirin, o cümlədən də xüsusən qəzəlin dinclik nə olduğunu bilməyən cəfakeş fəhləsidir.** Özünün dəfələrlə etiraf etdiyi və mətbu əsərlərində də göründüyü kimi, şeirlə məşğul olmadığı, yazmadığı, yaxud yazdığını təkmilləşdirmədiyi günü həyatından hesab etmir. O, müxtəlif illərdə irili-xırdalı bir neçə “Qəzəllər” kitabı buraxdıqdan sonar ilk Divanını 1996-cı ildə nəşr etdirmişdir. “İkinci Divan”ın keçən il işıq üzü gördüyünü qeyd etmişəm. “Üçüncü Divan”ını da təzəcə tərtib edib qutarmışdır və hazırda böyük həvəslə növbəti divan üzərində çalışır. Mən klassik qəzəlimizin tarixini xüsusi olaraq araşdırmamışam. Ancaq bilirəm ki, bizim Azərbaycan qəzəlxanlarından heç birinin Ana dilimizdə də bu qədər divanı yoxdur. Nəhayət, 2006-cı ildə nəşr etdirdiyi və bir qədər aşağıda barəsində nisbətən geniş danışacağım “Təzkire-

yi-Şahin"də göstərir ki, şair həqiqətən yaradıcı əməyi özü üçün şərəf bilən bir qələm və təfəkkür sahibidir. Əlbəttə, hər bir müəllifin yaradıcılığının məziyyəti təkcə onun əsərlərinin sayı, kitablarının həcmi ilə ölçülmür. Daha önəmli olan budur ki, şair nə yazır, nədən yazır və başlıcası, necə yazır. Ş.Fazilin əsərlərinin, o cümlədən "İkinci Divan"ındakı müxtəlif şeirlərin məzmunu mənalı və aktualdır. Mənəviyyatın paklığı, məhəbbətin ülviyyəti, vətənpərvərlik və insanpərvərlik duyğularının cazibəsi, pak əxlaq, insan vüqarı, vətənin gözəllikləri, təbiətin bakirliyi, "Torpaqdan pay olmaz!" doktrinasının müqəddəsliyi, mədəni irsimizi, mənəvi dəyərlərimizi qorumağın zəruriliyi, əruzla yazılan əsərlərimizdə dilin müasir tələblərə cavab verməsi uğrunda hikmət və qeyrət Divanda şairin dönə-dönə, usanmaq bilmədən, həm də dərin səmimiyyətlə tərənnüm etdiyi məqamlardır.

Çağdaş şeirmizdə xeyli qəzəl var ki, onları təşkil edən ayrı-ayrı beytlər hərəsi özlüyündə bu və ya digər konkret bir fikir yükü daşısa da, biri digərinə vahid süjet, yaxud məna ardıcıllığı ilə yox, daha artıq öz zahiri əlamətləri (vəzn, bəhr, rədif, qafiyyə) ilə bağlanır. Ş.Fazilin divanındakı qəzəllərin çoxuna isə, bütün bu deyillənlərlə yanaşı, həm də məntiqi ardıcıllıq, vahid süjet səciyyəvidir. "Məyus" rədifli qəzəlində olduğu kimi:

*Sənə daş yağmada hər gün, a vətən, daş məyus,*
*Tuta bilmirsə yağan daşı vətəndaş məyus.*

*Neçə illərdi bizi məyus eləyiblər yersiz,*
*Ola düşmənlərimiz biz təki, ey kaş, məyus.*

*Ola bilməz mənə qəm çəkmədə heç kəs həmtay,*
*Hamı məyus və pərişan, mən isə Baş Məyus.*

*Görəsən çox çəkəcəkdirmi bu qırğın, Yarəb?*
*Qanına qərq görüb yoldaşı yoldaş-məyus.*

*Şahina, heyf yaşım əsgəri yaşdan keçmiş,*
*Mən xəcalətli, ömür səksəkəli, yaş məyus.*

Divandakı "Güzgü", "Oldu", "Onu", "Dilləndirdi", "Qismət", "Düşdü", və s. rədifli digər qəzəllər də məhz bu cür təsir bağışlayır.

Bu kefiyyət Şahinin Qarabağ mövzusuna həsr etdiyi qəzəllərində də təzahürünü tapmışdır. Xüsusən, "Getmişdir" rədifli qəzəli müəllifin öz fərdi simasını əyani olaraq canlandırmaqla yanaşı, Divanda Qarabağ mövzusuna münasibətin ifadəsi baxımından da uyğurludur:

*Neçə ildir ki, əlimdən Qarabağ getmişdir,*
*Niyə rahət oturubsan, a vətəndaş, niyə?*

*Qara rəng qarə günün rəngi sayılmışsa əgər,*
*Sən qaragünlüdə Şahin, ağarıb baş niyə?*

Ümumiyyətlə, Qarabağ mövzusu Şahinin əsərində də əksini tapmış aparıcı mövzulandandır. Bu da vətəndaş şairin yaradıcılığı uçün tamamilə tabii olan bir əlamətdir. Təsadüfı deyil ki. Divanın dibaçəsində də şair sənat, üslub, dil. janr məsələləri ilə yanaşı, çağdaş gerçəkliyin ən vacib məsələsi olan Ermənistan–Azərbaycan—Qarabağ münaqişəsinə də münasibət bildirir və bu cür müqəddimələr üçün məqbul sayılan bir tərzdə yazır: "Pərvərdigara! Mənim səndən müqəddəs bir təmənnam var: Vətənim Azərbaycanı tapdalayan yağı düşməni yurdumdan kənar et, öz ümmətini darda, bəlada qoyma. Ele et ki, yarağımız əlimizdə, papağımız başımızda olsun. Elə et ki, düşmən caynağında qalan torpaqlarımız tezliklə azad olsun və biz üzümüzə dəymiş xəcalət şapalağının izini siləк!" Divanda məni mütəəssir edən qəzəllərin yalnız az bir qisminin adlarını çəkə, bəzilərindən isə müəyyən parçalar verə bildim. Təəssüf ki, belə müxtəsər bir yazıda təqdirəlayiq qəzəllərin hamısından xoşagələn nümunələri canlandırıb şərh etməyə imkan yoxdur. Lakin qeyd etməyi lazım bilirəm ki. Şahinin Divanında "Torpağım" rədifli qəzəlindən aldığım bu beyt kimi düşündürücü və ibrətamiz məqamlar istənilən qədərdir:

*Gəzirəm torpağımın üstə bu gün mən, Şahin,*
*Olacaq sinəmin üstündə sabah torpağım.*

* * *

Şahin etiraf edir ki, qəzəllərini yazarkən dilimizdə qarşılığı olan ərəb va fars sözlərini işlətmir. Lakin bundan belə nəticə çıxarmaq olmaz ki, onun əsərlərində ümumiyyətlə ərəb və fars sözləri yoxdur. Uzun əsrlər boyu davam etmiş ictimai– siyasi və ədəbi-elmi əlaqələrin, Qurani-Kə-

rimin və fars poeziyasının nəcib təsiri ilə Azərbaycan dili bu xalqlara məxsus bir çox qiymətli alınma sözlərlə zənginləşmişdir. Tək bircə kökdən (kətəbə) yaranmış kitab, məktub, katib, məktəb, kitabxana anlayışlarının dilimizdəki mövqeyini nəzərdən keçirsək, mətləb bir qədər də aydın olar. Fars poeziyasından aldığımız peymanə, divanə, pərvanə, meyxanə və s. sözlər də bu kimi. Şahin bu qiymətli xəzinədən sərbəst sürətdə bəhrələnərək yazdığı qəzəllərində xüsusi ehtiyac olmadığı halda, bir qədər yuxarıda qeyd etdiyimiz ərəb və fars mənşəli ibarə və izafətlərə müraciət etmir, onların Ana dilimizdə mövcud olan ekvivalentlərindən uğurla faydalanır. Bu münasibətlə şair iki minədək qəzəli, yüzlərlə qitə, təxmis, rübai, təzmin ve sairi qapsayan mətbu divanlannda çağdaş ədəbi dildə əıuz vaminda eser yazmağın maraqlı nəticələrini nümayiş etdirmiş və bu məsələdə inadkarlıq göstərən bəzi qələm dostlarım "yola" gətirməyə çalışmışdır. Belə yazmaq onun özü üçün də asan başa gəlmir. Şair etiraf edir ki,

*Üç qəzəl dəftəri cırdım ki, qəliz yazmışdım,*
*Həm itən vaxtıma, həm dəftərə heyfım gəldi.*

Beləliklə, Şahin qəzəllərimizin dili məsələsində tutduğu mövqedə ardıcıl və sabitqədəmdir. O, xüsusi iftixar duyğusu və canıyananlıqla təsbit edir ki, indi bizim müstəqil respublikamız, onun əsas atributlarından olan kamil dövlət dilimiz vardır. Azərbaycan ədəbi dili bu gün ölkəmizdə yazılan, nəşr edilib yayılan demək olar ki, bütün kitab, jurnal və qəzetlərin, radio və televiziya proqramlarının nəhayət, orta və ali məktəb şəbəkəmizdə həyata keçirilən tədrisin dilidir. Qəzəlxanlarımız da borcludurlar ki, şeirlərini məhz bu dildə yazsınlar. qəzəllərimizin dili aydın və anlaşılan olsun. Doğrudan nə üçün Ə.Vahidin, M.Şəhriyarın, S.Rüstəmin, M.Seyidzadənin, B.Vahabzadanin qəzəlləri dilinin saflığı baxımından bizim çağdaş qəzəlxanlara örnək olmasın? Paradoks səslənsə də belə bir sual vermək olar: Əgər çağdaş yazıçılarmız öz hekayə, povest və romanlarını orta əsrlərin nəsr dili ilə yazsalar, bu necə qarşılanar? Nə vaxtadək xüsusi şərqşünaslıq təhsili olmayan Azərbaycan oxucusu çağdaş qəzəli oxuyub başa düşmək üçün indi az ələ düşən, biblioqrafik nadirələrə çevrilmiş lüğətləri axtarıb onları maraqlandıran sözlərin mənasını tapmalıdı? Bu qənaətdəyəm ki, Ş.Fazil çağdaş qəzalxanlarımıza ünvanladığı dəvətində tamamilə haqlıdır:

Gəlin ədəbi dilimizə hörmətlə yanaşaq. Gəlin qəzəl gülüstanımızı

doğma çiçəklərimizlə bəzəyək!

Ş.Fazilin Divanı məhz bu tələblər əsasında hazırlanıb oxuculanı, mühakiməsinə təqdim edilmişdir. "İkinci Divan" Azərbaycan klassik divan ənənələri əsasında tərtib olunmuşdur və onda janrın bütün mövzu və formalarında şeir nümunələri var. Lakin mövcud divanların bir çoxunda indiyədək rast gəlmədiyimiz qoşmalar, gəraylılar, nəğmələr, bayatılar, təəssüfnamələr, səfəmamələr və digər şeirlər də bu divanda özünə yer almış və kitabı daha da zənginləşdimişdir. Elə buradaca qeyd edim ki, şairin öz divanına daxil etmədiyi əsərlərində də bu baxımdan bəzi yeniliklərlə qarşılaşmışam. Bu sözləri yazarkən Şahinin "Qırxnamə" ve "İlnamə" adlı tematik toplularını nəzərdə tuturam. 2001–ci ildə şairin həyatında böyük faciə baş vermiş, onun ömür-gün yoldaşı Tamrida xanım vaxtsız vəfat etmişdir. Bu ağır itki baş verəndən sonra Şahin hər gün özünü yazı masasının arxasında ovundurmuş və bu günlərin hər birində (bircə gün də ara vermədən!) yazdığı şeirləri müsibətin qırxıncı günündə "Qırxnamə, yaxud qırx şeirdən ibarət elegiya" adı altında tərtib edib əzizlərinə, qohumlarına, yaxın dostlarına paylamışdır. Bu elegiya elə həmin ildəcə "Əbilov, Zeynalov və oğulları" nəşriyyatında, müsibətdən keçən bir il ərzində həmin mövzuda yazdığı şeirləri isə 2002-ci ildə "Elnur–P" nəşriyyatında "İlnamə, yaxud səndən ayrı səninlə" adı altında ayrıca kitablar halında buraxılmışdır. Həmin kitabları oxuyarkən mən əzizlərinin vaxtsız itkisi münasibəti ilə görkəmli şairlərin yazdıqları əsərlərdən bəzi nümunələri xatırladım. Əbülhəq Hamidin məşhur "Məqbər" şeiri, xalq şairi Nəbi Xəzrinin Gülarə xanımın, xalq şairi Nəriman Həsənzadənin isə Sara xanımın əziz, unudulmaz xatirələrinə həsr etdikləri çox zərif şeir silsilələri nəzərimdə canlandı. Lakin Şahinin "Qırxnamə" və "İlnamə"si bu fonda da poeziyamız üçün formaca yenidir, məzmunca təsirlidir.

* * *

Bu gün biz klassik Azərbaycan şairlərinin əsərlərini gözəl tərtib və nəşr edilmiş kitablardan oxuyur, zövq alır, yetərincə faydalanır, lakin bəzən fərqinə varmırıq ki, bunun üçün ilk mənbə olaraq həm də təzkirələrə və onların tərtibçi-müəlliflərinə borcluyuq. Təzkirə təkcə Azərbaycanda deyil, bütün Yaxın Şərqdə geniş yayılmış poeziya məxəzi, ədəbi-elmi əsər növüdür. Bu və ya digər mərhələnin ictimai fikir tarixini, xüsusilə də müasiri olduğu ədəbi prosesi yaxşı bilən bəzi yaradıcı ziyalılar, birinci növbədə isə filoloqlar və şairlər özlərinin maraq və məlumat dairəsinə, poetik zövq-

lərinə uyarlı şairlərin əsərlərini toplamış, müəyyən prinsiplər əsasında sistemə salmış, onların tərcümeyi-halına dair, müxtəsər də olsa, məlumat vermiş, bu və ya digər əsərlərini çox yığcam təhlil etmişlər. Ədəbiyyat tarixlərinin mövcud olmadığı, ədəbiyyata dair dərslik və müntəxabatların, kitab və jurnalların yoxluğu şəraitində bu cür təzkirələrin avtoqrafları zaman-zaman müxtəlif katiblər tərəfindən köçürülmüş, mötəbər məxəzlərdə, qiymətli kolleksiyalarda qorunub saxlamış, mənəviyyat xəzinəmizin əziz yadigarı kimi bir nəsildən digərinə ötürülmüşdür. Lütfəli bəy Azər, Seyid Əzim Şirvani, M.Müctəidzadə, Mir Möhsün Nəvvab, Hüseyn Əfəndi Qayıbov, Cəfər Rəmzi və digər şair və alimlərin qiymətli təzkirələri, yaxud şeir müntəxabatları məşhurdur. Uzaq keçmişlərə dair poetik irsin toplanıb tədqiq edilməsində, ədəbi fakt və hadisələrin tarixlərinin dürüstləşdirilməsində, filoloji tadqiqatların aparılmasında, nəhayət, ədəbiyyat tarixlərinin və ayrı-ayrı poetik simalara həsr olunmuş monoqrafıyaların yazılmasında ilk məxəz kimi təzkirələrin çox böyük əhəmiyyəti var. Məşhur sənətşünas alim, musiqi tarixçisi, rəssam və şair Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsərindən sonra təqribən 100 il məlum səbəblər üzündən bizdə təzkirə yazılmamışdır. Şahin Fazil bu bir əsrlik sükut buzunu sındırıb "Təzkireyi-Sahin"i yazmaq, tərtib etmək kimi ağır bir işə girişmiş və onun öhdəsindən müvəffəqiyyətlə gəlmişdir.

Bu əsər təzkirəçilik tarixində indiyə qədər görünməmiş bir özəlliya malikdir. O, bizim ilk təzkirəmizdir ki, bir ölkənin, bir ədəbi nəslin, bir üslubun yox, bir poetik məclisin üzvlərinin həyat və yaradıcılığını əks etdirir. Bu janrda bizim hələlik həm də son əsərimiz olan "Təzkireyi-Şahin" XIX əsrin səksəninci illərində təsis olunub 40 ildən çox səmərəli fəaliyyət göstərən, sovet hakimiyyətinin ilk çağlarındaca "tovariş"lərin tələblərinə cavab vermədiyi üçün yasaqlanan, 1980-ci ildə ideoloji mühitdə özünü göstərən nisbi yumşalma zamanı fəaliyyətini bərpa edən və bu gün də öz ənənələrini davam etdirən "Məcməüş-şüəra" üzvlərinin yaradıcılığını əhatə edir. Bu münasibətlə Ş.Fazil bir çox mühüm tarixi, ədəbi qaynaqları oxumuş, məclis üzvlərinin istisnasız olaraq hər biri barəsində materiallan toplayıb araşdırmış, məclisin tarixinə dair mükəmməl monoqrafık məlumat vermiş, onun digər ədəbi məclislərlə əlaqəsini təhlil etmiş, 90-a yaxın məclis üzvünün, müxtəsər də olsa, tərcümeyi-halını vermiş və ən başlıcası, onların əsərlərindən səhih nümunələr təqdim etmişdir.

Mənbələrdə göstərildiyi kimi, "Məcməüş–şüəra"nın ilk yığıncaqları Məhəmmədağa Cürminin İçəri Şəhərdəki mənzilində keçirilmişdir. Sonra

bu yığıncaqlar növbə ilə məclisin digər üzvlərinin evlərində, yay aylarında isə Abşerondakı bağlarında baş tutarmış. Məqalə və xatirələrdən öyrənirik ki, sonralar məclisin bir neçə yığıncağı Bakıda Həkim Qəninin, Nardaranda Hacı Mailin, Kürdəxanıda Bakı radiosunun direktoru Soltan Nəcəfovun mənzillərində keçirilmişdir. 1980-ci ildə məclisin fəaliyyəti bərpa olunduqdan sonra onun yığıncaqları bir müddət Rüstəm Samitin Keşlədəki mənzilində keçirilmişdir (onun kiçik qardaşı, şair-tədqiqaiçı, filologiya elmləri namizədi Süleyman Rüstəmzadə mənim universitet yoldaşım və dostum idi. Dəfələrlə onların mənzilində olmuş, imamların şərəfinə verilən təziyə məclislərində, Füzuli ehsanlarında iştirak etmiş, "Məcməüş–şüəra"nın bir sıra üzvləri ilə ilk dəfə orada tanış olmuş, onlarla ünsiyyət tapmışdım. Azərbaycan Mədəniyyət Fondunun sədri, prof. Kamal Abdullanın dəvəti ilə məclis 1990–cı ildən öz yığıncaqlarını fondun Ü.Hacıbəyov küçəsindəki qərargahında keçirmişdir. Hazırda məclis fəaliyyətini Şirvanşahlar sarayında, onun üçün ayrılmış xüsusi salonda müntəzəm olaraq davam etdirir.

Barəsində məlumat və əsərlərindən nümunələr verilmiş məclis üzvlərinin bir qismini çağdaş oxucular nəsli görməyibsə də, poeziyamızın tarixində onların hər birinin özünəməxsus mövqeyi, adları-sanları, yadigar kəlamları vardır. Bunlardan "Məcməüş-şüəm"nın ilk sədri Məhəmmədağa Cürmini, katibi Ağadadaş Sürəyyanı, üzvlərindən Əbdülxaliq Cənnəti, Ağadadaş Müniri, Mirzə Məmməd Müsəvvir, Məşədi Azər Buzovnalı, Haşım bay Saqib, Ağakərim Salık, Əbdülxaliq Yusif, Məşədixanım Leyli, Muxtar Bisavad və başqalarının adları ədəbiyyat tarixlərində. müxtəlif tədqiqət əsərlərində dönə–dönə xatırladılmışdır. Onların əsərlərinin dadı–duzu barədə müəyyən təsəvvür oyatmaq üçün Əbdülxaliq Yusifin təzkirədən aldığım "Olsun" rədifli qəzəlindən bir neçə beyti buraya köçürürəm:

*"Razı oldun ki, könül hicr ilə bərbad olsun,*
*Oldu, bundan sora, ey məh, ürəyin şad olsun.*

*Yetməmiş vəslinə saldın məni hicr atəşinə,*
*Yaxşı yıxdın evimi, get, evin abad olsun.*

*Belə bir dərdü qəmü firqətə, ey şirinləb,*
*Bisütun tab gətirməz, o ki, Fərhad olsun!"*

Bizim nəslin yaxşı tanıdığı və bir çoxu ilə şəxsən ünsiyyətdə olduğum Əliağa Vahid, Cəfər Rəmzi, Rüstəm Samit, Ağaəmi Buzovnalı, Hacıbaba Hüseynov, Hacı Mail, Baba Pünhan, Əliəkbər Şahid, Nazim Rizvan, Elnarə Buzovnalı, Südabə Cəlil, Əlibala Səyyah da artıq dünyalarını dəyişmişlər. Allah hamısına qəni-qəni rəhmət eləsin! Məclis üzvlərindən Həkim Qəni, Ənvər Nəzərli, Əlibala Hacızadə, Ələmdar Mahir, Əli Rza Xələfli, Əlibaba Məmmədov, Qəşəm Nəcəfzadə, Amil Məlikzadə, Kamil Sərbəndi, Firidun Qurbansoy, İlqar Fəhmi, Mir Cəlal Zəki, Tacəddin, Sona Xəyal, Ramiz Faseh, Hacı Rafıq Şirvani, Ş.Fazilin özü və başqaları bu gün də yazıb–yaratmaqda və məclisin işində fəal iştirak etməkdədirlər.

Ənənəyə uyğun olaraq məclis üzvləri klassik poeziya nümunələrini, xüsusən də Füzuli qəzəllərini təhlil edir, onlardakı incə mətləbləri, dərin mənaları açır, dahi qəzəlxanın əsərlərinə yazdıqları nəzirə və təxmislərini, digər yeni əsərlərini oxuyub müzakirə edir, şeir sahəsində bacarıqlarını təkminləşdirirlər.

Dərin təəssüf duyğusu ilə qeyd edirəm ki, son yüz ildə Azərbaycan poeziyasının səmasında böyük qəzəlxan kimi parlayan və qəzəl şairlərimizə, o cümlədən Ş.Fazilə bu gün də pişrovluq edən ölməz Əliağa Vahidin əsərlərinə təzkirədə yer verilməmişdir. Halbuki bir çox yazılı mənbələr, o cümlədən də Rüstəm Samit və Həbəlkəkim Qəni dönə-dönə təsdiq edirlər ki, Ə.Vahid "Məcməüş-şüəra"nın üzvü olmuşdur. Şair haqqında məqalələrdə buna da işarə var ki, "Vahid" təxəllüsünü ona vaxtilə həmin məclisin tanınmış üzvlərindən Əbdülxaliq Yusif vermişdir.

Bəlkə də təzkirəçi belə güman edib ki, Vahid böyük şair olduğu üçün poeziya sevərlər onun əsərlərini onsuz da yaxşı bilirlər. Əlbəttə, bu, təzkirə praktikasında məqbul güman hesab edilmir. Füzulinin şöhrəti təkcə İraqı və Azərbaycanı deyil, bütün Yaxın Şərqi bürüdüyünə, xüsusən Azərbaycanda qəzəlləri hər bir ziyalının mənəvi dünyasını zənginləşdirdiyinə baxmayaraq, S.Ə.Şirvani öz təzkirəsində Füzulinin də əsərlərindən nümunələr vermişdi. Elə bilirəm ki, Ş.Fazil də öz təzkirəsində Ə.Vahid nümunələrinə layiqincə yer vermiş olsaydı, bununla "Təzkireyi–Şahin"in daha da sanballı çıxmasını təmin etmiş olardı.

Ş.Fazili öz təzkirəsini başlıca olaraq klassik ənənələr əsasında qurmuş, ona səmimi təsir bağışlayan yaxşı bir dibaçə (müqəddimə) yazmış, dibaçəsini maraqlı qəzəl, qəsidə və dördlüklərlə süsləmişdir. "Ədəbi məclisin tarixi seyri" adlı müqəddimə də qiymətli faktlara, arxiv sənədlərinə söykəndiyi üçün məqbuldur.

Burada Azərbaycan ədəbiyyatı tarixində özünə layiqli yer tutmuş "Divani-hikmət", "Gülüstan". "Əncümənüş-şüəra". "Fövcül-füsəha", "Beytüs–səfa". ”Məclisi–üns", "Məclisi–fəramüşan" kimi klassik ədəbi məclislərimiz, onların yaradıcılıq əlaqələri haqqında da yığcam icmal verilmiş, "Məcməüş-şüara"nın keçmişi üzərinə xüsusi tədqiqat işığı salınmış, onun təşkilatlanma tarixi bu tarixin hər iki mərhələsi, əsas, aparıcı üzvlərinin fəaliyyəti ardıcıllıqla canlandınlmışdır.

Bakı şairlər məclisinin tarixinə dair ayrıca oçerk verilməsi, deyildiyi kimi, ilk təşəbbüsdür və məqbuldur. Çox yaxşıdır ki, oçerk müəllifi tarixi fakt və sənədlərə əsaslanır və yeri gəldikcə, labüd müqayisələr əsasında onları dəqiqləşdirir. Təəssüf ki, bu mətndə bir qədər lüzumsuz təfərrüatçılığa yol verilmişdir. Belə hesab edirəm ki, oçerkde sözü gedən məclisin təsis olunma tarixi haqqında Cəfər Rəmzi, Rüstəm Samit, Həkim Qəni və digər mötəbər müəlliflərin yazdıqlarını bütün təfsilatı və stenoqrafık dəqiqliyi ilə verməyə ehtiyac yox idi. Təzkirəçi bu mənbələrdə bir–birinin təkrarı olan məqamları ixtisar edib izlədiyi məqsədə müvafıq motivləri seçsəydi, təfərrüatçıiğa yer qalmaz və yığcamlıq, konkretlik təmin olunardı. Bu naqislik təzkirəçinin Sona Xəyalla mübahisəsini əks etdirən səhifələrə də aid olub, mətnə sanbal yox, bir ağırlıq gətirir.

Qeyd olunduğu kimi, təzkirə mötəbər elmi-tarixi ənənə və prinsiplər əsasında hazırlanmışdır. Ş.Fazil Bakıda, Abşeronda yaşayıb zaman-zaman şeirimizə öz töhfələrini verən böyük bir yaradıcı ziyalılar qurumunun tarixinə zəruri işıq salmış, onları birləşdirən məclisin ədəbi-ictimai fıkir tariximizdəki rolunu şərh etmişdir.

Təzkirəçilər bir qayda olaraq seçdikləri bədii nümunələrin mətninə müdaxilə etmir, onları necə var—eləcə öz təzkiralərində yerləşdirirlər. Onlarla müəllifin yüzlərlə şeirindən hansı nümunələri seçməkdə isə təzkirəçi tam sərbəstdir, necə deyərlər, külli–ixtiyar sahibidir, təki onun seçdikləri şeir olsun və gələcək oxucu da buna daxilən yəqinlik hasil etsin. Ş.Ə.Şirvani öz təzkirəsinə yalnız Xaqani, Nəsimi, Füzuli kimi dünyaca məşhur dahilərdən deyil, Nişat Şirvani, Qövsi Təbrizi, Bahar Şirvani, Fəqir Ordubadi kimi digər klassiklərdən də şeirlər salmışdır və onların hamısını bədii yaradıcılığın kamil nümunələri hesab etmişdir. Bir sözlə, təzkirəçi öz gələcək oxucusuna təqdim etdiyi poetik nümunələrin qiymətli əsərlər olduğuna inanmasa, onları öz toplusuna daxil etməz. Ş.Fazil də əsasən bu yolla getmiş, öz təzkirəsi üçün “Məcməüş–şüəra" fərdlərinin saysız–hesabsız əsərləri arasından ən yaxşılarını seçmişdir.

Bununla belə, bu təzkirədə cəmlənmiş əsərlərin hamısı eyni səviyyədə deyil, onların arasında bədii cəhətdən kamil olmayanları da var. Ş.Fazil özü də etiraf edir:

*Amma elə kəslər də tutub yer bu əsərdə,*
*Əlbəttə, zəifdir hələlik elmü hünərdə.*

Məsələn, Əkrəm Şamxalın təzkirədəki yazılarına qətiyyən şeir demək olmaz. Onların məzmunu çox zəif, dili bərbaddır. Bu absurd yazılara məclis üzvlərinin münasibəti də mənə qaranlıq görünür və həmin yazıların Ş. Fazil kimi bir şairin nəzərindən yayınıb bu maraqlı tərkində özünə yer tutmasına dərindən təəssüflənirəm.

* * *

Bir neçə kəlmə də Şahinin Divanında müşahidə edilən kiçik qüsuru haqqında. Mən Ş.Fazili öz qəzəllərində hər sözü yerində işlədən, mətləbin zərifanə ifasına səy edən bir şair kimi tanıyıram. Lakin təəssüf ki, bəzi qələm yoldaşları ilə çağdaş qəzəl dilinin saflığı uğrunda apardığı mübarizə hərdən onu haldan çıxarır və şairin şe’rindən yanlış sədalar qopmasına səbəb olur;

*Dilindən ötrü yan, dilə nur çilə,*
*Şam əgər yanmırsa ziyısı yoxdur.*
*Füzuli diliylə, Seyid diliylə*
*Şeir yazan kəsin həyası“ yoxdur.*

*("İkinci Divıı", səh.476)*

Bu bəndin ilk beytində vacib bir yaradıcılıq problemindən söhbət açıldığı halda, ikinci beytində şairin özünün ifadə mədəniyyətinə yad olan bir amiranəliklə qeyri–poetik, hətta zərərli bir kredo öz əksini tapmışdır.

Müəllif mövqeyinə xələl gətirən bu cür nöqsana "Etməmişəm” rədifli qəzəldə də rast gəlirik.

*Gecəmi saqi ilə, meylə sabah etməmişəm,*
*Məscidə getməyirəm, çünki günah etməmişəm.*

*("İkinci Divan", səh.233).*

Bu beytdəki tezislə antitezis arasındakı məntiqi uyğunsuzluq göz qabağındadır. Aşkar görünür ki, növbəti beytlərdəki nigah, silah, pənah, ah, şah qəbilindən olan qafiyə cərgəsini tamamlamaq üçün günah sözü müəllifə lazım olub, o da bu şirnikləndirici imkandan vaz keçə bilməyib. Yoxsa kim bilmir ki, məscidə getmək üçün hansısa bir günah iş gömək lazım deyil...

Şərq klassikasının Məcnun, Leyli, Fərhad, Şirin, Vamiq, Əzra, Vis, Ramin, Vərqa, Gülşa kimi qəhrəmanları Divanda tez-tez xatırladılır. Amma bəzən təravətli poetik mətləbə xidmət etmədiyi üçün sadalama təsiri oyadır. Tuti və şəkkər, zər və zərgər tandemləri də bədii fiqurlar kimi bir çox qəzəllərdə təkrar olunur və istər-istəməz onları təravətdən salır.

* * *

Bu qüsurlarına baxmayaraq, Şahin Fazilin "İkinci Divan"ı və "Təzkireyi—Şahin"i onun yaradıcılığındakı irəliləyişdən xəbər verir. **Bu kitablar göstərir ki, Şahinin poeziya və elm qanadları hələ möhkəmdir və qocaman sənətkar bu qanadlarla yeni yaradıcılıq üfüqlərinə ucalacaqdır.**

*Azərbaycan Yazıçılar Birliyinin*
*aylıq ədəbi-bədii orqanı.*
*N-11, 2006, səh.174-182*

**Əlibala HACIZADƏ**
*Yazıçı, şair*

## ÖN SÖZ ƏVƏZİ YAXUD ŞAHİN FAZİL VƏ ONUN SƏFƏRNAMƏLƏRİ BARƏDƏ BİR NEÇƏ SÖZ

Qırx ildən çoxdur ki, onu tanıyıram. Keçən əsrin əllinci illərin in sonundan. Mən ali təhsilimi bitirmişdim, Şahin is yenicə oxumağa başlamışdı. Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsi tanış etdi bizi bir-birimizlə. Fakültəmizdə üç şöbə vardı: fars dili, ərəb dili, və türk dili. Biz bu seçimə Firdovsi, Nizami, Xaqani, Sədi, Hafiz və başqa şairlər vadar etmişdilər. Bəli, hələ orta məktəb illərindən bəzi tərcümə əsərlərini dön-dönə oxuduğumuz bu şairlər, poeziya kəhkəşanının sayrışan ulduzları tək əsrarəngiz ziyana malik olan bu şairlər məhz fars dilini öyrənmək həvəsinə salmışdılar bizi. Minətdarıq bu şairlərə. Onlar bizə dil öyrətdilər. Özü də necə bir dil! Elə Şahin Fazil demişkən:

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl...*

*...Hafizin şerini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.*

İllər ötdü. Şahin də təhsilini bitirdi. Hələ beşinci kursda oxuduğu zaman onu Əfqanıstan ölkəsinə işləməyə göndərdilər. Bir ildən sonra vətənə qayıdıb dövlət imtahanlarını verdi, fərqlənmə diplomu alıb yenidən qayıtdı Əfqanıstana. Daha iki il işlədi. Sonra Bakıya döndü və oxuduğu fakültənin dekan müavini oldu. 1968-ci ildə onun Əfqanıstana ikinci səfəri başladı. O zaman mən də ordaydım. Kabul şəhərində çalışırdım. Şahin işlədiyi Məzari-Şərif şəhərindən bir neçə günlüyə Kabula gəlib məni tapdı. Görüşdük, söhbətləşdik və... müvəqqəti ayrıldıq. Sonra yenə Bakı. Hər ikimiz Elmlər Akademiyasının qapıları daxilində çalışdıq. Mən Şərqşünaslıq, Şahin isə Tarix İnstitutunda. Hər ikimiz fars dilindəki əsərlərin tədqiqinə girişmişdik. Nəticədə fars dili bizi alim etdi. Yenə Şahin Fazil demişkən:

*Bu dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil,*
*Nurə qərq eylədi çox mənzili, yarəb, nə gözəl.*

Bu günlərdə İran İslam Cümhuriyyəti Mədəniyyət Mərkəzinin məsul işçisi aqaye-Musəvi mənə bir kitabın kompüter nüsxəsini verdi və oxuyub fikrimi bildirməyi xahiş etdi: Şahin Fazil. "İran səfərnamələri" kitabı evə gətirdim. Necə deyərlər, birnəfəsə oxuyub poetik xəyallara daldım. Qədim İran, füsünkar İran, onun bənzərsiz gözəlliyi, tarixi-mədəni abidələri, gəzməli-görməli yerləri, gözəl təbiəti ilə yanaşı gözəl təbiətli insanları gözlərim önündə canlandı. Sonra kitabı yenə əlimə götürdüm. Bir daha oxudum. Zövq ala-ala, ləzzət çəkə-çəkə oxudum. Iran barədə 9 səfərnamə və yüzədək qəzəl, qitə, təxmis, təzmin, mürəbee və bir neçə heca vəznli şer. Hamsı da şahinanə üslub və məharətlə yazılmış nəzm və nəsr nümunələri. Düşündüm: İran ölkəsi ilə son illərdə mədəni əlaqələrimiz çox genişləndiyindən oraya hər il yüzlərlə həmvətənlim gedib-qayıdır. Amma onların, demək olar ki, heç birisi səfərnamə yazmır, özünün İran görüşlərini qələmə almır, təəssüratlarını oxucularla bölüşmür. Şahin Fazil isə...

Mən Şahin Fazil qələmindən çıxan çoxlu mətbu məqalə oxumuşam. "İran səfərnamələri"indən başqa "İraq səfərnamələri" \Xurma kimi şirin Bağdad və Bağdad kimi şirin xurma"\, "Türkiyə səfərnamələri", "Gürcüstan görüşləri", "Dağıstan dəftəri", "Özbəkistan təəssüratları" və s. Vaxtının çoxu müxtəlif səfərlərdə keçən bu dərviş görnüşlü ağsaqqal, ağsaç adamın \şairin, alimin, publisistin, müəllimin\ "İran səfərnamələri"nin ayrıca kitab şəklində çapa hazırlanması isə, mən deyərdim ki, əlamətdar ədəbi hadisədir, ölkələrarası münasibətlərin daha da genişlənməsinə xidmət edən olduqca faydalı bir addımdır. Kitabı oxuduqda mən sanki Şahinin İranda olduğu yerlərə baş çəkirəm, görüşdüyü adamlarla görüşürəm, ziyarət etdiyi ziyarətgahlarda namaz qılıram, dua edirəm... Kitabı oxuduqca sanki İranda Şahinin təmasda olduğu dövlət xadimləri, alimlər, şairlər, nasirlər ilə görüşürəm, üzlərindən və sözlərindən nur yağan ziyalıları ilə ünsiyyətdə olub ziyalanıram... Kitabı oxuduqca yenə oxumağım gəlir, oxumağım gəldikcə yenə oxuyuram...

Bəli, bu 9 səfərnamədəki 9 məqalə və yüzədək şer məni ovsunladı, Şahinə "bərəkallah", kitaba "mərhəba", "İrana" əhsən"-dedim. Yadıma üç il bundan əvvəl düşdü. Adətən yubiley şerləri bir növ mədhiyyəni xatırladır, amma səmimiyyətlə deyirəm ki, mən Şahini bu qoşmada sa-

dəcə mədh etməyə çalışmamış, onu uzun illər boyu yaxşı tanıdığım bir şərqsünas, iransünas, şair, alim, müəllim, ziyalı, istedadlı, zəhmətkeş səxs kimi gözlərim önündə canlandırmış, ona deyəcəyim ürək sözlərimi poeziya dili ilə ifadə etməyə çalışmışam.

Mən bu müxtəsər ön sözümün sonunda iki divan hələ üçüncüsünü də yazır, iki tərcümə əsəri, yüzlərlə elmi məqalə, sayı ondan çox şer kitabı, dörd elmi monoqrafiya müəllifi olan Şahin Fazilə çoxlu səfər arzulayıram, çünki onun hər səfəri "Səfərnamələr" yaradır.

Şahin Fazil sənə hər sahədə uğurlar diləyirəm. Sənin gələcək "Səfərnamələr"ini oxumaq və onlara ön söz yazmağı arzulayan "əfqan" dostun Əlibala Hacızadə.

*(Şahin Fazil. İran səfərnamələri,*
*I nəşr, Bakı, səh. 7-10)*
*13 mart 2003*

**Sabir ƏLİYEV**
*Professor*

## ŞAHİN FAZİL DİVANININ POETİKASI

Azərbaycanda indiyə qədərki sonuncu divan Seyyid Əzim Şirvaninin adıyla bağlıdır. Lakin Seyyidin divanı XIX əsrə aiddir. Doğrudur, Seyyiddən sonra Vahidin gözəl qəzəlləri meydana çıxmışdır ki, onlar Füzuli qəzəlləri ilə yanaşı müasir Azərbaycan muğamlarının əsas söz mətnini təşkil edən sənət nümunələridir. Lakin bu da danılmaz həqiqətdir ki, divarı təkcə qəzəllər toplusundan ibarət deyil, qəzəllər, olsa-olsa divan anlayışının yalnız bir qismini təşkil edə bilər; məlumdur ki, divana qəzəllərdən başqa, ayrı-ayrı klassik şer şəkilləri, məsələn, qəsidələr, qitələr, rubailər, kiçik məsnəvilər, müxəmməs və tərkibbəndlər və s. də daxil olur. Bu, klassik Azərbaycan və ümumən Şərq divanının əsil siması adlandırıla bilər. Belə bir divana isə istedadlı şair, gözəl alim, tarix elmləri doktoru professor Şahin Fazilin 1996-cı ildə Azərbaycan Dövlət Nəşriyyatında çıxmış "Divan" şerlər külliyyatını misal göstərə bilərik. Şahinin xoşbəxtliyindən, onun divanı XX əsrin məhz ilk və son divan nümunəsi olaraq qaldı. Ancaq başqa şairlərin, məsələn, Füzulinin, Qovsinin, Seyyidin və başqalarının divanlarına nisbətən Şahinin divanı haqqında az yazılıb, başqa sözlə desək. divan müəllifi kimi onu az tanıyırlar. Görünür ki, ən mühüm səbəblərdən biri məhz tarixən "gecikmək" və ya qədim formaları əhya etmək mülahizələridir. Amma bunun nəyi pisdir ki, Şahin ustad bir şair olaraq dilimizin şıltaq əruza əvəzsiz yatımlılığnı dönə–dönə sübut edir! Bunun harası pisdir ki, Şahin ənənəvi Azərbaycan şeir mədəniyyətinin sirrlərindən bəhs açır, klassik formaların əhyası ilə məşğul olur. Bunun nəyi xoşagəlməzdir ki, Şahin şəkilcə ənənələrə bağlanıb, məzmunca xalis bugünün sözünü deyir! Şahin Fazilin "Divan"ı, təkrar edirik ki, hər cəhətdən klassik divan tələblərinə, lakin bununla yanaşı, həm də bu günün siyasi və ictimai istəklərinə cavab verən yaxşı və nümunəvi sənət toplularından biridir. Şahin Fazil hər hansı bir divan üçün zəruri olan bütün tələbləri ödəyir; bütün divanlarda olduğu kimi, Şahinin divanında da nəsri–müsəccədən (qafiyəli nəsrdən) ibarət "Dibaçə" və .) "Xatimə" verilir, bunun ardınca tövhid, münacat, nət və Peyğəmbərin mövluduna bağlı qəsidə gəlir, merac vəsf olunur, nəhayət, qəzəllər və başqa ənənəvi bölmələr açılır. Bizim haqqımız

yoxdur ki, böyük nailiyyət olan kiassik söz mədəniyyətindən nəyi isə "köhnəlib" deyə yoxluğa dəfn edək. Buna meyl bir boşluq və heçlik yaradardı, odur ki, xalq şairi Süleyman Rüstəm demişkən, "qəzəli də gözəl yazmaq lazımdır", bu mənada klassikaya müraciət tamamilə qanunauyğun və təbii bir haldır. Bu, həm də ənənəyə hörmət və bağlılıq deməkdir.

Şahin Fazil, bütün divanlılığı ilə yanaşı, qətiyyən müasir dünyəvi keşməkeşləri də unutmur, bir "sıra hadisələrə sağlam vətəndaş münasibətini bildirir və bizimlə birgə addımlayır. Onun şer və qəzəllərində külli miqdarda öyrədici not və məqamlar vardır ki, bunlardan feyzyab olmamaq olmur.

Şahinin ən seçilən cəhəti odur ki, o, əruz vəzninin seçmə ölçülərində əla qəzəl və şe’r nümunələri yarada bilir. Hətta, Şahinin bədii təcrübədə və heç bir əruz risaləsində olmayan yeni ölçülərə müraciəti də müşahidə olunur. Məsələn, onun aşağıdakı qəzəli əruzun heç bir yerdə qeyd olunmayan ölçüsündə yazılıb; doğrudur, bu ölçünün yarısı (məf-'Ulü fəUlün) işlənib, lakin bütövü Şahindədir:

*Sevda mənə həmdəm, həmdəm mənə sevda,*
*Qovğa mənə mübhəm, mühbəm mənə qovğa.*

Məf’Ulü fə’Ulün məf’Ulü fə’Ulün

Bu qəzəldə həm də eyni sözlə başlayıb qurtarma sənəti (rəddüləcüz–ələssədr) vardır. Bundan başqa beytlərdə, sözlərin tərsinə oxunuşu da görünür. Bu, əsil möcüzədir! Özü də Şahin əruzun əksər işlək ölçülərindən bəhrələnir.

Şahin Qarabağ işğalından qeyri–adi ağrı-acılar keçirir, qəzəllərində böyük ümid və inamla bunun qələbəmizlə qurtaracağını təsvir edir.

*Nə zaman pak olacaqdır Qarabağ torpağımız?*
*Nə zaman dərdü qəmü ahü fəğan olmayacaq?*

Şahinin ən gözəl və ən müasir cəhətlərindən biri də onun saf Azərbaycan türkcəsində yazmasıdır. Ərəb və fars izafətlərindən xali bir ədəbi dil görmək istəyən Şahin Fazilin qəzəllərinə baxsın:

*Öz sözlərimiz var isə, biganə gərəkmi?*
*Biganə sözə mən kimi biganə olan yox?*

Həm də o, nəinki saf dildə, müasir oxucunun tam anlayacağı üslubda yazmağı öz ədəbi işi ilə təbliğ edir, həm də qəliz və müəmmalı dildə yazanlann əleyhinə çıxır, onların dil oyunlarının aqibətinə gülür.

Şahinin qəzəllərində bir gözlənilməzlik var. Bunu aşağıdakı beytdən də görmək olar:

*Bəs yaşayım mən necə, ay başına döndüyüm,*
*Söyləmisən Şahinə: "ol mənə qurban, yaşa".*

Məlumdur ki, qurban olandan (öləndən) sonra yaşamaq mümkün deyil. Amma gözəl də öz inad və arzusundan dönmür.

Şahin mərd və mürüvvətli bir aşiq obrazı vasitəsilə belə deyir:

*Ovlağə gedərkən ovu yox, ovçunu ovlar*
*İmdad eləyən ahuya, ceyranə bir aşiq.*

Burada gözəl və gözəllik axtaran aşiqin gözələ və gözəlliyə qənim kəsilən kəmfürsətlərə güclü cavabı da vardır! Burada aşiqlə xain obrazları birləşib! Bu beytdə, belə demək mümkündürsə, bir qəribə türk iştiqağı da vardır (eyni kökə bağlı düzəltmə sözlər): ov, ovçu, ovlaq, ovlamaq. Bu tipli qəzəllərdə məhəbbət mövzusu ilə ictimai motivlər yanaşı işlənir. Yaxud, türk iştiqaqına aşağıdakı məqtə də misal ola bilər:

*Yaşadanlar yaşayırlar, yaşayaq, ey Şahin,*
*Yaşaram mən dəxi "Məcməş-şüəra" var olsa.*

Bu beytdə də yaşama–yaşatma fellərindən ustalıqla istifadə görünür.

Görün şair fıziki ölümündən sonrakı mənəvi həyatına inamım necə ifadə edir:

*Şahina, qətrə sədəf tək qayıdır dəryadən,*
*Dönərəm mən də geri bir gün öləndən sonra.*

Dəniz–sədəf-inci! Qiymət mənalarından yaranan bu beytin qonşuluğundakı beyt də olduqca mənalıdır:

*Kim deyir "hər bölünən şey daha təkmil olmaz"?*
*Mən ki təkmil elədim qəlbi böləndən sonra.*

Şahin oxucusuna hörmət qoyan şairdir; bunu onun özünə qoyduğu hörmətdən də görmək olar; o, özünə rəva görmədiyi şeyi oxucusuna da rəva görmür. Bunu biz onun adicə alliterasiya işlətmək ustalığında da görürük:

*Eşqə düşdükcə, a canan. niyə can coşmaqda?*
*Dedi: Candırmı coşan, cümlə cahan coşmaqda!*

Buradakı "C" samitlərinin düzülüşü xüsusi bir şirinlik yaradır
Yaxud:

*Biganəyə baxmır, bağa bağban özü oldu,*
*Öz qönçəsini tutmada Şahin hər əlində.*

Bu beytdə də "B" samitləri gözəl əda yaradır.

Şahin Fazil fikir və duyğu şairidir; onun qəzəllərində məna və musiqi qoşa addımlayır; bədii rövnəq və sənətlərdən də bol–bol istifadə olunur. Məlumdur ki, "şura" anlayışı yetmiş il ideal quruluş kimi təlqin və təbliğ edildi, onun iç üzü isə açılmadı. Sonralar məlum oldu ki, bu da elə xalqları mənən öldürən, onların dilini və dinini qadağan edən bir imperiya forması imiş. Şahin Fazil buna belə məna verir:

*Şura deyilən bir quruluş yaxşı dağıldı,*
*Andıqca o əyyamı ciyərqan oluram mən.*

Şairi ən çox yandıran da olur ki, bu quruluşda "qurunun oduna yaş da yanır", nahaqla yanaşı haq da odlanır:

*Od düşəndən bəri Şura deyilən səltənətə,*
*Nahəqin yanması yaxşı, niyə haq yanmalıdır?*

Şahin indiki zəmanədə də dərddən xali deyil, onun ən böyük dərdi Qarabağ dərdidir.

*Bilsin hamı: Dağ boyda çiynimdə qəmim vardır,*
*Dağlıq Qarabağ boyda dərdim, ələmim vardır.*

Şahin rəng və musiqi aşiqidir; onun bir qəzəlində sanki rənglər sərgisi açılır:

*Çöhrəm saralıb ay kimi, bağrım qana dönmüş,*
*Saçlar ağarıb, indi günüm qarə olubdur.*

Burada sarı (üz), qırmızı (qan), ağ (saç), qara (güzəran) timsalında rənglərin dürlü oyunlarından bəhs edilir. Onu da xüsusi olaraq qeyd etmək lazımdır ki, Şahin əruz vəznində çox asanlıqla şerlər yazır: sanki əruz ölçüləri; xüsusilə də rəməl və həzəc, onun əlində mum kimidir: o, bunlardan istədiyi şeyi düzəldib yarada bilir. Lakin Şahin Fazil əruzla bərabər heca vəznindən də böyük ustalıqla istifadə edib gözəl şerlər-qoşmalar, gəraylılar, bayatılar yazır. Yunus Əmrə ruhunda yazdığı "Sən dərviş olammazsan" bayatı silsiləsi müqəddəs irfan adamının parlaq obrazını təqdim edir. Çox maraqlıdır ki, bu əruz ustası, heca təşnəsi sərbəst üsulda da şerlər yazır. Heca vəzninin onbeşlik. ondördlük, onbirlik, səkkizlik. yeddilik növləri şairin daha çox üz tutduğu formalardır. Şahin Fazilin heca vəznində yazdığı ən uğurlu şerlərdən biri “Şahinin dəfni”dir. Görün bu gözəl şair ədəbi mənəvi diriliyini necə təsvir edir:

*Mənim tabutumu siz aparanda*
*Sizin ardınızca gələcəyəm mən...*

Bəli, əbədiyyət də ruhu diri olanlarındır. Ruhun diriliyi isə bu gəlget dünyasında ömrü fövt etməyib nəyəsə xeyirli bir işə sərf eləməyə bağlıdır.

Qəzəlxan Şahin yenə qəzəl yazır, divan bağlayır; klassikanı əbədi dirilik köynəyi sayır;

*İldə bir divan yaratmaqdır bu ildən məqsədim.*
*Məqsədin baş tutması söz yox ki, imkan ilədir.*

Bizə belə gəlir ki. buradakı "imkan“ sözü təkcə vəsait əndişəsi, dövlət qayğısı deyil, həm də qəzələ və ümumən klassikaya oxucu marağı mənasındadır.

Şahin bir şair kimi təpədən dırnağa klassikaya bağlıdır və onun əməli davamıdır. O bu həqiqəti yaxşıca dərk etdiyindəndir ki, qəzəllərinin əlifba sırası ilə düzülüşünə də xususi diqqət yetirmişdir.

Şahinin klassikaya bağlılığı həm nəzəri sahələrdədir, həm də əməli təmaslarda. Nəzəri sahədə ardıcıllıq klassiklərin yolu ilə getməkdir, onların işlətdikləri ölçü və şəkilləri davam etdirməkdir. Əməli təmaslar isə konkret olaraq şairlərə əyani münasibətdə meydana çıxır, onlardan əbədi sitat, epiqraf və sair verməklə görünür. Bu mənada min– illik Azərbaycan–Türk ədəbiyyatı Şahin Fazilin ən mötəbər dayağı və örnəyidir.

**Şahin Fazilin qəzəllərindən biri tamamilə yeni bir ölçüdə yazılmışdır:**

**Məf'Ulü məfA'llün məf'Ulü fə'Ulün**

**Bu əslində, məlum və məşhur bir əruz ölçüsünün sondan bir heca kəsilişidir və ilk dəfə işləndiyi üçün "Şahin həzəci" adlana bilər.** Həm də maraqlıdır ki, bu doqquz beytlik qəzəldə heç bir yerdə ölçü büdrəməsi görünmür. Ümumiyyətlə desək, Şahinin əksər qəzəlləri (bir neçə altıbeyitlik nümunəni çıxmaq şərtiylə). ən azı 8-l2, hətta. l9–20 beytlik həcmdədir. Bəziləri kimi, Şahin qəzəlin həcmini 4–5 beytə endirməyib, əksinə, 4-5 artırıbdır ki, bu da poetik hazırlığın yüksək zirvəsindən xəbər verir. Bu da maraqlı olmaya bilməz ki, Şahin Fazil ixtisasca şərqşünas tarixçidir və şairlik onun "Hobbiliyini aşmış hobbisidir".

Şahinin işlətdiyi əruz ölçülərinin sağlamlığı, dəqiqliyi və orijinallığı şersevərlərin, az qala heyranlığına səbəb olur, ona əsil şair nüfuzu qazandırır.

Şahinin işlətdiyi əruz bəhrləri öz müxtəlif növləri ilə xeyli çoxdur. Lakin bunlardan ən çox işlənəni həzəc və rəməl bəhrləridir.

Açıq demək lazımdır ki, Şahin, az qala, qafiyə milyonçusudur; müqqəffa sözlər tapmaq onun əlində, təkrar edirik, mum kimidir. Yüngül rəməl ölçüsü isə (fə'ilAtün fə' ilAtün fə'ilAtün fə'ilün) sanki Şahinin tənəffüsüdür: o həmişə bu hava ilə yaşayır...

Şairimizin işlətdiyi 20-dən çox əruz ölçüləri aşağıdakılardır:

**Həzəc bəhri:**

**1) dördbölümlü bütöv həzəc**

məfA'İlün məfA'İlün məfa'İlün məfA'İlün

*Zərər gördümsə kafərdən, müsəlmandan da xeyrim yox,*
*Nə halətdir, müsəlmandan müsəlman inciyib sanki.*

Bu ölçüdə Şahinin cəmi bir neçə qəzəli var, hiss olunur ki, bu ölçüdə yazarkən şair xeyli gərgin vəziyyət alır, söz seçiminə daha çox əmək sərf eləyir.

**2) Müstəzad həzəci**

Məf'Ulü məfA'İlü məfA'İlü fə'Ulün

*Göz vursa da ulduzlar içindən mənə Zöhrə,*
*Könlüm yenə, neynim ki, Sürəyyanı tutubdur.*

Bu ölçüyə bir də ona görə müstəzad həzəci deyirlər ki, bütün müstəzadlar bu ölçüdə yazılıb. Bu ölçüdə Şahinin xeyli qəzəli vardır.

**3) Dördbölümlü sınıq bütöv həzəc**

Məf'Ulü MəfA'ilün məf'Ulü məfA'İlün

*Ağsaqqal olubsanasa, yox, saqqala hacət çox,*
*Şahin bu cavan yaşda ağsaqqal olub getdi.*

**4) İkiböiümiü sınıq bütöv həzəc:**

Mə'fUlü məfA'İlün

*Qar yağdı, ayaz oldu,*
*Gül ömrü nə az oldu…*
*Yaş gözdə Araz oldu,*
*Getdi, nigəran getdi.*

(Bu qəzəlin əksər beytləri beləcə, daxili qafıyələrlə verilib və təəssüf ki, şair bunları dördmisralı deyil, ikimisralı yazıb). Bu ölçüdə Şahinin xeyli şeri var. Biri də belədir:

*Dünya, hanı ol nəslin—*
*Qeysin, Kərəmin, Əslin,*
*Leyla diləsə vəslin*
*Divanə gələr-gəlməz?*

**5) Leyli –Məcnun Həzəci:**
**Məf’Ulü məfA'Ilün fə'Ulün**

*Əllər üzünü sığallayardı,*
*Qollar belinə kəmər kimiydi.*

Bütün əruz ölçülərində, xüsusən də bu ölçüdə Şahin özünü suda balıq kimi hiss edir. Həmin vəzində onun bir neçə şeri var.

**6) Şahin həzəci:**
**Məf'Ulü məfA'Ilün məf'UIü fə'Ulün**

*Zalimlərə baxdıqda qeyzim elə artır,*
*Şəddad oluram, yarəb, Şəddad oluram mən.*

**7) Üçbölümlü bütöv naqis həzəc**
MəfA'İlün məfA'İlün fə'Ulün

*Bu gün kirpiklərim nəmdir, gözüm yaş,*
*Bugün yaş məsləhət, nəm məsləhətdir:*

Bu ölçüdə ikinci bir şerindən də bir beyt gətirək:

*Heca qəsrində mən şah olmasam da,*
*Əruzdur, Şahini şahanə eylər.*

**Rəməl bəhri:**
**1) Dördbölümlü bütöv naqis rəməl**
fA'ilAtün fA'ilAtün fA'iIAtün fA'ilün

*Sən cocuqkən Aminə həm köçdü, ey Dürri-yetim,*
*Gözlərindən axdı ümman, ya Məhəmməd Mustafa.*

*Allahım, sevdim səni, ən’amın üçün mərhəba,*
*Eşq Şahin Fazilə pakizə bir ən’am olub.*

Rəməlin bu ağır və ləngərli növündə Şahinin bir neçə qəzəli var.

**2) Üçbölümlü bütöv naqis rəməl**
fA'ilAtün fA'i lAtün fA'ilün

*Şahina, olduq müsəlman, həmçinin*
*Bütpərəstlik, Kə’bədir bütxanənəmiz.*

Bu ölçüdə də Şahinin bir neçə qəzəli var.

*lstərəm dünya xətadən yan ola,*
*Neyləyək, bizdən xəta əskik deyil.*

**3) Üçbölümlü qısa incə rəməl**
Fə'ilAtün fə'ilAtün fə'ilün

*Bu təmiz dil ki varımdır. çoxunun*
*Lal edir dillərini hərdənbir.*

**4) Dördbölümlü qısa-açıq bütöv rəməl**
Fə'iLatü fA'iIAtün fə'ilAtü fA'ilAtün

*Acı söz demək yaraşmaz bizə, ey nigar, tövbə,*
*Sənə intizar tövbə, mənə intizar tövbə.*

**5) Dördbölümlü qısa incə təməl _**
fə'ilAtün fə'ilAtün fə'ilAtün fə'ilün

Bu ölçü Şahin Fazil şerlərinin ən işlək olanıdır; şairin qəzəllərindən və ümumən şerinin 50–60 faizi bu ölçüdədir; Şahin bu ölçüdə özünü rahat və gümrah hiss edir; insafən, onu da deyək ki, dilimizə ən yatımlı və uyarlı ölçülərdən biri də elə budur. Bir misal:

*Bilirəm, getsə də canan, təzədən gəlməlidir,*
*Məni tərk eyləsə də can, təzədən gəlməlidir.*

**Rəcəz bəhri:**

**Şahin Fazil rəcəz bəhrinin elə bir növünü işlətmişdir ki, bunu ondan başqa heç kim tətbiq etməmişdir.**

**1) Rəcəzi-mürəbbə’i-müzmər-mürəffəl**

Müstəf'ilAtün müstəf'ilAtün

*Dərdim var öylə, dərmanı yoxdur,*
*Çünki bu dərdin loğmanı yoxdur.*

**Bu, Şahin Fazilin üçüncü vəzn yeniliyidir.**
**Müzare bəhri:**
Dördbölümlü sınıq bütöv müzare
Məf'Ulü fA'ilAtün məf'Ulü fA'ilAtün

*Güldür üzün, sözün gül, göz dəyməsin ilahi,*
*Mən bülbülün bu gündən gülzarı olmusan sən.*

**Səri bəhri:**
Fəal səri'
Müftə'ilün müftə'ilün fA'ilün

*Üz tutaraq göylərə, mən sevgimi*
*Sidq ilə peyğəmbərə göndərmişəm.*

**Xüsusi olaraq qeyd eləmək lazımdır ki, bu ölçü Şahin şerində çox fəaldır, bəlkə Mirzə Ələkbər Sabirdən sonra onu ən çox və ən sıx işlədən də elə Şahindir. Onun onlarla şeri bu ölçünün həm də bədii dilimizə və onun quruluşuna hədsiz yaxınlığından xəbər verir. Bu ölçünü yaxınlığı və yatımı əla duyduğu və realizə etdiyi üçün biz Şahinə xüsusi minnətdarlıq etməliyik. Əbədi–bədii dilin imkanları məhz belə hallarda və belə vasitələrlə üzə çıxır. !**

**Xəfif bəhri:**
"Fəal xəfif" adlandırılan ölçü Şahində qeyri-fəaldır; görünür, bunun səbəbi odur ki, həm onun təfilələri dəyişikdir, həm də eyni boylu rəməllə qarışmaq təhlükəsi var. Və təsadüfi deyildir ki, bu ölçüdə Şahinin cəmi 3–4 qəzəli var, bir də bu bəhrdə Füzulinin bir qəzəlinin təxmisi, vəssalam. (Amma bu təxmisdə də vəzn qüsurları var).
**Fəal xəfifl:**
Fə'ilAtün məfA'ilün fə'ilün

*Məni bir laləzar çəkməkdə,*
*Laləzar içrə yar çəkməkdə*

**Münsərih bəhri:**

Bu bəhr də Şahinin xeyli sıx işlətdiyi ölçülərdəndir.

**1) Dördbölümlü fəal münsərih:**

Müfə'ilün fA´ilün məftə'ilün fA'ilün

*Ey gözəlim, cismdə hər nə qədər can var,-*
*Canıma səndən səva sanma ki, canan var.*

(Ölçünün oynaqlığı nə qədər yaxşıdırsa, qafiyənin birhecalıq uzanması da o qədər yaxşı deyil)

**2) İkibölümlü münsərih:**

Müftə´ilün fAi´lün

*Var nigəranlıq neçin?*
*Bağda qaranlıq neçin?*
*Böylə yamanlıq neçin*
*Bülbülə olmuş yenə?*

Şahin özü bir qəzəlində münasibətini açıqca bildirir.

*Sahinəm, qalmıyıram mən qapanıb bir vəznə,*
*Əruzun faydası vardır və hecanın xeyri.*

Şahinin bəzi şerlərinin əruzdamı, yoxsa heca vəznindəmi olduğunu ilk oxuda seçmək olmur; məsələn:

*Yarpağı düşdükcə budaq ağlayır,*
*Bağbanı üzməkdə bu dağ, ağlayır.*

Elə bilirsən ki, bunlar 6-5 bölgülü heca vəznindədir, amma sonrakı misralardan öyrənirik ki, səri´ bəhrindədir.

Təəssüf ki, bu gözəl, ilhamlı, bilikli şair bəzən vəznləri bir–birinə qarışdırır. Məsələn, 9-cu səhifədəki "Lailahəilləlah" rədifli qəzəldə rəməl və “müctəs bəhrləri qarışdırılıb; halbuki bu qəzəlin bütün birinci misra-

ları, yaxşıdır ki, sağlam rəməl ölçüsündədir.

Şahinin şe’rləri klassik divan şəklində olsa da, onlarda əsil müasirlik ruhu döyünür, çağdaş ictimai-siyasi övqat görünür. Bircə missal: Şahin sovet imperiyasının əslində xalqlar həbsxanası, agalar-qullar məmləkəti, soyğunçular cəmmiyyəti olduğunu gözəl verir:

*Yetmiş il qırmızı bayraq bizi kor qoydu, yetər,*
*Baxaraq, bayrağın üstündə qızıl qan tapdım.*
*Təhqir etmiş bizi illərlə ”böyük qardaşımız”,*
*Mən ”müsəlman”ı kitablarda ”basurıımaıı” tapdım.*

Cənab Qoqolun "Taras Bulba"sında da beləcədir.

Yaxşıdır ki, Şahin "basurman" adının "yadelli; məhəmmədilər: müsəlman türklər" mənasında işlənməsinə dair rusların alimi S.İ. Ojeqovun lüğətinə əsaslanır.

**Qəzəlçilik yolunu tutmaqda Şahin əksər və ya bütün qəzəllərində açıq, yaxud dolayısı ilə Füzuliyə səmimi minnətdarlığını bildirir. Lakin Şahinə sadəcə Füzuliçi deyib dayanmaq olmaz. O, eyni zamanda müasir dövrün şairidir, bizim günlərin sənətkarıdır.** Etiraf etmək lazımdır ki, Füzuli şerlərində nə qədər parlaq, fikirlərində nə qədər dərin olsa_ da, dilində müasir oxucunu səsləyə bilmir, onunla ünsiyyətə girə bilmir. Ona görə də şairin “Leyli və Məcnun” poeması ' da, “Bənkü Badə” məsnəvisi də nəsrə çevrilib, müasir oxucunun dilində səsləndirilib.

*Söz mülkünü tə’mir eləyibdir o Füzuli,*
*Ey kaş, eyləyəydim təzədən tə’miri yaxşı.*

**Bəli, qəzəl dilinin köklü tə’mirə ehtiyacı vardı və o, indi mərhələ-mərhələ davam edir. Bu sahədə ilk cığırı Vahid açdısa. indi onun ən layiqli yolçusu Şahindir. Və biz xüsusi bir əminliklə deyirik ki, lap yaxın gələcəkdə "klassik qəzəl dilinin Şahin Fazil mərhələsi" də tez–tez işlənən bir ifadəyə çevriləcəkdir.**

*Çox yazdı qəzəl, Şahinə eyb eyləməsinlər,*
*Çox yazdı ki, olsun neçəsindən biri yaxşı.*

Burada azacıq həqiqətlə bərabər böyük bir şair təvazösü də var-

dır. Məlumdur ki, Füzulinin belə başlayan bir qəzəli vardır.

*Təriqi–fəqr tutsam tab' tabe' nəfs ram olmaz.*
*Ğina qılsam tələb, əsbabi–cəm'iyyət tamam olmaz.*

Çox-çox nəzirələr və bənzətmələr yazılmış bu yeddi beytlik qəzələ Şahin də on beytlik bir nəzirə ilə cavab vermişdir. Məsələ budur ki, Şahin bu qəzəlində də yüksək təvazə nümunəsi göstərib öz məğrur şair pilləsi ilə addımlayır.

Konkret olaraq demək lazımdır ki, Şahinin qəzəlxan kimi hazırlanmasında Füzulinin bu sahədəki böyük nüfuzu və uğurları çox mühüm, bəlkə də həlledici rol oynamışdır. Bunu Şahin özü də dənə-dənə qeyd edir. Şahin qəzəl sahəsində Füzulidən hansı xətlərə barışmışdır?

Birincisi, ayrı-ayrı mətləbləri aydın və kəsə demək Şahinin Füzulidən götürdüyü əsas keyfiyyətlərdəndir;

İkincisi, Şahin Füzulidən müxtəlif vəznlər öyrənib və bunu da öyrənib ki, hansı vəzn hansı mövzu üçün (nikbin ruh, bədbin əhval, qürur hissi və s.) daha münasibdir;

Üçüncüsü, Şahin Füzuli ilə ayrı-ayrı mövzularda birləşir; məsələn, "fəda", "qeyri"... tipli mövzular hər ikisində var;

Dördüncüsü, Şahinin Füzulidən öyrəndiyi ən mühüm bədii ünsürlərdən biri məhz qafiyədir; Füzuli babası kimi, Şahin də qafıyələrdə gül vurmaqda, ustalıq etməkdə, öndə getməkdə qabarıq nəzərə çarpır.

Nəhayət, beşinci, ümumiyyətlə, şairlik sirrlərinə yiyələnməkdə Şahinin kövrək əlindən tutan iki-üç şair varsa, biri, yəqin ki, Füzulidir. Şahin təxmislərinin ən çoxunu (11) Füzuli ilə bağlayırsa, bu da onun böyük şairə əlaqələrindən xəbər verir. Şair hər şeydə şairdir Füzulinin bu beytdə başlayan qəzəli var:

*Aldı gülzar içrə su əksi-üzari-alini,*
*Çəkdi güllər surətin mənzur edib timsalini.*

Bir qəzəli də belə başlayır:

*Hər görən eyb etdi abi–dideyi–giryanimi,*
*Eylədim təhqiq, görmüş kimsə yox cananimi.*

Birinci qəzəldəki fellərə fikir verək: almaq, çəkmək. mənzur etmək, göstərmək, yamaq istəmək, mərdüm etmək, sakin etmək, mən qılmaq, götürmək, sormaq; indi ikinci qəzəlin tellərinə baxaq: görmək, parə–parə etmək, eşitmək, rövşən eyləmək, almaq, qurtarmaq. Bunların hamısı təsiri fellərdir və hamısına da təsirlik hal sözləri (isimləri) tapmaq tələb olunur. Burada, istər–istəməz Şahindən əvvəl dahi ustaddan söz işlətmə səriştəsi öyrənən təkrarolunmaz Sabir yada düşür: onun "Zahidə təklif" şerində də bütün bəndlərin cam olan ilk dörd misra (4 bənddə 16 misra) bütünlüklə belədir, təsirli fellərdən və təsirlik hal fomalarından ibarətdir! Şahinin də 11 beytlik qəzəlində bu hala rast gəlirik:

*Tut əlimdən, gözəlim, gəl. sinəm üstündə yeri,*
*Sinəm üstündə alım mən ayağın ləzzətini.*

"Lənətini"... təsirlik hal forması bütün beytlərə səpələnmişdir! **Budur ustadlıq və səriştə, budur dilə bələdlik və zövqə sahiblik!**

"Divan" poetikası tələblərindən biri də müxtəlif "nəzm şəkilləri" işlətməkdir. Şahinin divanı bu cəhətdən tamam tələbləri ödəyir: kitabda qəzəl, qəsidə, qitə, rübai, münacat və tövhid ruhlu şerlər, təxmislər, tərcibənd və s. formalarda zəngin məzmunlu əsərlər vardır.

Tələblərdən biri də əruz səriştəsidir ki, bu barədə Şahinlə mübahisə açmağa dəyməz: hər şey yerindədir.

Divan tələbləri sırasında qafiyə və dil anlayışları da vardır ki, bunların haqqmda danışmışıq: Şahin qafıyə milyonçusu və dil ustasıdır. Badii sənətlər isə Şahində istənilən qədərdir.

Məsələn:

*O zamandan ki, yar olub pünhan,*
*Ölürəm aşikar gəlməzmi?*

Burada pünhan-aşkar təzad sənəti nümunəsidir.

*Ağ günə sövq et qaragün Məcnunu,*
*Leyli, salam vermə salam xətrinə.*

Burada ağ -qara təzadı vardır.

Hər şeydən əvvəl etiraz onadır ki, Füzulini təxmislərdən dördü tərcümələrə aiddir, bunları isə təxmis nümunələri kimi qəbul etmək çə-

tindir. Arzu budur ki, Şahin ya tərcümələri təxmis etmək təcrübəsini dayandırsın, ya da onları gözəl bildiyi farscadan təxmis etsin. Bu, necə deyərlər, "suyunun suyunu" xatırladır.

**Bu kitabı oxuyandan sonra istər-istəməz adam belə də düşünür ki, Şahinin divanı heç kəsin divanından əksik deyil və o, bu tipli kitab üçün ancaq təhsinə layiqdir. Şahin bizim çoxdilli şairimizdir; o, Azərbaycan türkcəsi ilə bərabər farsca və dəricə də müxtəlif formalarda şerlər yazır. Belə yaradıcılıq yolunda ona uğurlar diləyirik. Şair hər şeyi düz deyir, bircə şeyi səhv deyir:**

*Hanı şerində izafət, hanı elmində xəta?*
*Şahinin qiymətini Azəribaycan bilmir.*

**Xeyr, Azərbaycan xalqı Şahin Fazilin qədrini də bilir, qiymətini də verir. Təki hamının qəzəlləri elə Şahininki qədər sadə olaydı.**

*"Hikmət" Elmi Araşdırmalar Toplusu,*
*AMEA akad. Z.M.Bünyadov adına Şərqşünaslıq İnstitutu və*
*İİR-nın Azərbaycandakı Səfirliyinin Mədəniyyət Mərkəzi,*
*N-5-6, Bakı, 2005, səh.210-222*

**Vasim MƏMMƏDƏLİYEV**
*Akademik*

## QİYMƏTLİ TARİXİ MƏNBƏNİN DƏYƏRLİ TƏRCÜMƏSİ

Qədim dövrlərdən başlayaraq Azərbaycan tarixşünaslığının əsasını qoyan müxtəlif dilli çoxsaylı mənbələr mövcuddur. Məhz onların sayəsində ölkəmizin çoxəsrlik tarixinə dair kitablar yazılmış, monoqrafik əsərlər çap olunmuş, məqalələr qələmə alınmışdır. Bu qəbildən olan mənbələrin müxtəlif xarici dilləri bilən mütəxəssislər tərəfindən tədqiqata cəlb olunması, əlbəttə, mühüm məsələdir. Lakin unutmaq lazım deyil ki, geniş oxucu kütləsi bu və ya digər mənbəninin yazıldığı dilləri (ərəb, fars, osmanlı və s.) bilmir və onların tərcüməsini həmişə intizarla gözləyir. Məhz mütərcimlərin sayəsində İbn Xordadbehin, Fəzlullah Rəşidəddinnin, Hafiz Əbrunun, Nizaməddin Şaminin, Şərəfəddin Yəzdinin, Əmir Teymurun, Şah Təhmasibin, həmçinin Abbasquluağa Bakıxanovun məlum mənbələri Azərbaycan və rus dillərində oxucuların istifadəsinə verilmişdir. Son vaxtlarda Azərbaycan dilinə tərcümə olunmuş əsərlərdən biri də Səfəvi dövrünün ən məşhur tarixçisi İsgəndər bəy Münşinin "Tarixe –aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") kitabıdır ki, onun hər üç cildi, nəhayət ki, iki kitabdan ibarət olaraq nəşr edildi. Doğrudur, İsgəndər bəy Münşinin bu əsərinin tərcüməsinə əvvəllər də M.Əfəndizadə, Ə.Rəhmani, F.Babayev, A.Qasımov tərəfindən təşəbbüs göstərilmişdir və həmin tərcümələrdən fraqmentlər hazırda AMEA-nın Tarix İnstitutunun elmi arxivində saxlanılmaqdadır.

Nəhayət 2004-cü ildə İnstitutun Elmi Şurası direktor, millət vəkili, AMEA-nın müxbir üzvü, professor Yaqub Mahmudovun təşəbbüsü ilə "Tarixe-aləmarye-Abbasi" əsərinin bütöv halda doğma dilimizə tərcümə edilməsini qərara aldı və tezliklə bu qərarın icrasına başlandı. 2009-cu ildə AMEA-nın müxbir üzvü O.Əfəndiyev və onun yetirməsi H.S.Musalı tərəfindən əsərin tərcümə olunmuş başlanğıc hissəsi çapdan çıxdı.

Çoxcildlik əsərin yalnız birinci cildinin tərcüməsi. Bəs qalan cildlər? Xoşbəxtlikdən bu vacib işin öhtəsindən tanınmış şərqşünas, tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyev (Şahin Fazil) gəldi və məşhur tarixçimizin məlum kitabı 2010-2014-cü illərdə tam şəkildə işıq üzü

gördü. Bu tərcümə mənbəşünaslıq tarriximizdə çox əlamətdar hadisədir, desəm, əsla yanılmaram.

Azərbaycan tarixinin yüksəliş dövrlərindən olan XVI əsr və XVII əsrin ilk 30 ilində ölkəmizin ictimai, iqtisadi, siyasi, mədəni, diplomatik, ideoloji həyatında baş verən hadisələr İsgəndər bəy Münşinin ilkin mənbə kimi son dərəcə qiymətli olan əsərlərində ətraflı işıqlandırılmışdır. Təxəllüsü vəzifəsinə uyğun "Münşi", özü isə Azərbaycan türklərinin türkman tayfasına mənsub olan İsgəndər bəy (1560-1634) şərqsünaslıq aləmində çox tanınan müəlliflərdəndir. O, bu şöhrətə məhz ilk Səfəvilərin, xüsusilə Şah Abbasın tarixini əks etdirən "Tarixe-aləmarye-Abbasi" adlı əsərini yazmaqla yetişmişdir.

1560-cı ildə Azərbaycanın məlum türk qəbiləsində dünyaya göz açan İsgəndər bəy Türkman gənc yaşlarından müxtəlif elmlərlə məşğul olmuş, Səfəvi hökmdarı Şah Məhəmməd Xudabəndənin (1578-1587) süvari qulamlar xidmətinə qatılmış, sonra I Şah Abbas Səfəvinin (1587-1629) münşilərindən (katiblərindən) biri kimi ali divanda işləməyə başlamışdır. Prof. Ə.Rəhmaninin gəldiyi qənaətə görə, İsgəndər bəyin bir münşi kimi saray xidmətinə cəlb edilməsində Səfəvilər dövlətinin etimadlısı (etimadüddövləsi) həmyerlimiz Hatəm bəy Ordubadinin rolu olmuşdur. Əsərdə İsgəndər bəylə Hatəm bəy arasında olan dostluq münasibəti haqqında dəfələrlə məlumat verilmişdir.

Azərbaycanlıların etnogenezisində fəal istirak etmiş türkman tayfası XV-XVII əsrlər tariximizin dövlət quruculuğu sahəsində böyük nüfuz və fəaliyyətə malik olmuş, müstəsna xidmət göstərmişdir. Səlcuqilərin tərkibində İrana, Azərbaycana və Kiçik Asiya torpaqlarına gələn türkmanlar sonralar tərafdarı olduqları ağqoyunlulardan ayrılaraq qızılbaş tayfa birliyinin yaranmasında olduqca fəal iştirak etmişlər.

Şah ordusu məiyyətinin tərkibində müxtəlif səfərlərə və hərbi yürüşlərə çıxan İsgəndər bəy əsasən paytaxt İsfahan şəhərində yaşamışdır. Lakin Şah Abbasla birlikdə Azərbaycanın, demək olar ki, bütün böyük şəhərlərində, o cümlədən Təbriz, Ərdəbil, Naxcıvan, Əhər, Xoy, Maku, Gəncə, Ordubad, Şamaxı, Bakıda olmuş, öz münşilik fəaliyyətinə uyğun tapşırıqları yerinə yetirmişdir.

"Tarixe-aləmaraye-Abbasi" əsərinin müxtəllif əlyazma nüxsələri (tam, yaxud hissələrlə) dünyanın bir çox ölkələrindəki kitabxanalarda qorunmaqdadır. İngilis alimi Çarlz Storinin "Fars ədəbiyyatı" kitabının məlumatına əsasən bilmək olur ki, bir çox məşhur şəhərlərdə (Moskva,

Sankt-Peterburq, Daşkənd, istanbul, Edinburq, Kabul, Bağdad, Tehran, Berlin, İrəvan, Lahur, Pəncab, Məşhəd, Aliqarx, Qahirə, Mədrəs, Bakı, Tiflis, İsfahan, və s.) bu məşhur kitabın müxtəlif nüxsələri vardır.

Tarixe-aləmaraye-Abbasi" əsərinin mühüm fayda və əhəmiyyəti haqqında aşağıdakıları demək olar:

*XVI-XVII əsrlərdə idari və hərbi təsisatlar, həmçinin maddi və şəri məsələlərin işıqlandırılması;*

*Səfəvilərə qonşu olan bir sıra ölkə xalqlarının (osmanlılar, gürcülər, teymurilərin Hindistanda hakimiyyətdə olan padşahları, Mavərənnəhr türkləri və s.) adət və ənənələrinin təsviri;*

*Başqa kitablarda təsadüf olunmayan tarixi hadisələrin işıqlandırılması;*

*Səfəvi dövrünün alimləri, qoşun başcıları, hökümət vəzifədarları, rəssamlar, xəttatlar, şairlər və müsiqiçilərlə bağlı məlumatların verilməsi;*

*Dövlət işlərində və hərbi aparatda I Şah Abbasın hakimiyyəti illərində bir sıra tayfalar və onların başçıları, həmçinin müxtəlif vəzifələr haqqında geniş məlumatın nəzərə çatdırılması;*

Dövrümüzdə artıq unudulmuş nadir söz və istilahların işlədilməsi və s.

Qeyd etmək lazımdır ki, XVII əsrdə Səfəvi və Osmanlı saraylarından Qərb ölkələrinə göndərilən rəsmi dövlət məktubları, əsasən fars, qismən də türk dilində yazılmışdı. Məsələn 1618-ci ildə Rusiya çarı tərəfindən Səfəvi hökmdarının yanına yollanan yüksək dərəcəli səfirin gətirdiyi məktub türk dilində idi. İsgəndər bəy yazır: "Həmçinin bu il o uca sülalənin (romanovların) mötəbər əmir və knyazlarından (mətndə "kənnas") ibarət böyük bir elçi heyəti Xəzər dəryası və.s çöllərdən keçərək Şirvanın Dərbəndinə gəldi və Humayun şah Abbas məiyyətinin ardınca Ərdəbildən çıxıb Qəzvin darüssəltənəsinə çatdı. O elçi (səfir) də Səadətabad meydanında şahla görüş səadətinə yetişdi və mütərcim vasitəsilə padşah tərəfindən özlərinin ehtiyaclarını, xahişini və möhkəm birlik istəyini ərz edərək türk dilində yazılmış uzun bir məktubu şaha təqdim etdi".

Isgəndər bəy Münşi Ordubadda olarkən fars poeziyasının görkəmli nümayəndələrindən olan Hafiz Şirazini (1325-1390) xatırlayaraq yazır:

"Ordubad olduqca ürəkaçan və ürəyəyatan bir qəsəbədir. Onun şimal tərəfindən Araz çayı axır ki, Şirazın söz şahibi Xacə Hafiz o yerin gözəl sahillərinin mədhində buyurmuşdur:

*Ey səba, keçsən Araz sahillərindən sən əgər,*
*Torpağından busə al ki, qoy ətirlənsin nəfəs."*

*(Tərcümə Şahin Fazilindir)*

"Tarixe-aləmaraye-Abbasi" əsərinin dili mürəkkəb və rəngarəngdir. Həmçinin Qurani-Kərimdən gətirilən ayələr, müxtəlif misallar və zərb məsəllərlə zəngindir.

Yeri gəlmişkən qeyd etməliyik ki, Şahin Fazil nəşrinin nəzər-diqqəti cəlb edən cəhətlərindən biri də kitabın sonunda şərhlərin (250 s.) və göstəricilərin (şəxs adları, yer adları, hərbi, inzibati-idari istilahlar, tayfa adları, maddeyi-tarixlər və s.) verilməsidir.

Bəli, Şahin Fazil "Tarixe-aləmarye-Abbasi" kitabının tərcüməsini uğurla bitirdi. Hazırda o, başqa bir Azərbaycan tarixçisi Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") kitabını tərcümə etməkdədir və onun min səhifədən ibarət I cildini artıq bitirmişdir. Mən sonda alim-mütərcim-şair dostuma yeni-yeni müvəffəqiyyətlər arzulayıram.

**Könül BÜNYADZADƏ**
*AMEA-nın müxbir üzvü*

## TARİXİN POEZİYASI

Son vaxtlar yaddaş haqqında çox düşünürəm və bir daha əmin oluram ki, insanı insan edən, onu şəxsiyyət kimi tanıdan, sevdirən və ya rəzil edən onun yaddaşıdır. Bir dəfə gəldiyim qənaəti yenə təkrar edim: torpaqdan yaranan insanın ən "qiymətli daşı" əslində onun yaddaşıdır.

Maraqlıdır ki, yaşanan hadisəni anında təsvir etmək çətindi, çünki hisslər üstün gəlir. Yüksək dağlar uzaqdan yaxşı göründüyü kimi, baş verən hadisələrdən də uzaqlaşdıqca, onları daha aydın görmək, daha obyektiv dəyərləndirmək olur. Yaddaş olub bitənləri incə-incə ələyir, irisini-xırdasını arıtlayır, qılçığını, çürüyünü atır kənara, yerdə qalan saf, təmiz faktlar isə gözünü tikir insanın bacarığına, istedadına və vicdanına. Hər kəs yaddaşı ilə öz mənəviyyatına, şəxsiyyətinə uyğun davranır. Məsələn, dövrün siyasi şəraitinin tələblərinə uyğun olaraq tarix kitablarında bir balaca fakta elə don geyindirə, ona istədiyi kimi bəzək-düzək vura ki, yaddaşın özü belə çaş-baş qalar. Burada hökm yaddaşda yox, qələmi tutan əldə olur. O da lazımi məqamda balaca bir yalan qatmaqla böyük bir məqamı kökündən fərqli təqdim edə bilir. Yaradıcı şəxslərdə isə əksinə yaddaş qələmə hakim kəsilir və bütün qüvvə səfərbər olunur ki, bir tək o fakt vurğulansın. Fərq eləmir fırçadır, ya notlardır, qələmdir ya tişədir... hamısı lazımi məqamı qabartmağa çalışır.

Yeri gəlmişkən, eposları, mifləri bu sıraya aid etmək istəməzdim, çünki onlar özləri tarixdi və ayrıca açar-təhlil tələb edir. Məsələn, qədim german mifləri, alman saqaları bir millətin yaddaşının ifadəsidir, tarixdir, Vaqnerin onların əsasında bəstələdiyi üç hissəli "Tannhäuser" operası isə o tarixin bir yaddaşda əks-sədasıdır, nəsillərə xatırlatma, onların yaddaşlarının təzələnməsidir.

Belə nəticəyə gəlmək olar ki, əslində, belə sənət əsərləri tarixi yaddaşın bir anının ifadəsidir. Sanki həmin an tarixdən qopub düz sənətkarın ruhuna nüfuz edir və qalan şeylər görünməz qalır. Onu da mütləq əlavə edim ki, bu, bəzən şəxsi tarixçənin ifadəsi olur, bəzən də şəxsi çərçivədən çıxıb daha geniş üfüqlərdə pərvaz edir. Bu asılıdır həmin şəxsin istedadının miqyasından, düşüncəsinin səviyyəsindən. Bu yaddaş nə qədər iti, cilalanmış olursa, bir o qədər təqdim etdiyi əsərin də dünya

səviyyəli bir şedevrə çevrilmə imkanı var. Bunları sənət əsərlərində müşahidə etmək daha rahatdır. Məsələn, fransız rəssamı Ejen Delakruanın 1830-cu il iyul inqilabını təsvir edən "Xalqı aparan Azadlıq" tablosuna baxanda istər-istəməz o azadlığın arxası ilə getmək istəyirsən. Yaxud Viktor Hüqo "Səfillər"i ilə tarixin bir səhifəsini elə təqdim edir ki, özün də bilmədən düşürsən o günlərə, illərə, o küçələrdə dolaşıb, o parkların ağaclarının altında gizlənrisən, özünü barrikadada hiss edirsən. Hətta Miloslu Veneranın olmayan qolları, yaxud qədim yunanlara aid Nika ilahəsinin olmayan başı da hansı isə tarixdən xəbər verir. Bu səbəbdən Luvrda onların qarşısında dayanan tamaşaçılar tilsimlənmiş kimi dayanırlar, qeyri-ixtiyari öz yaddaşlarını işə salıb, çatmayan hissələri canlandırmağa, təsəvvüründə bərpa etməyə çalışırlar.

Qarşıdakının tarixi yaddaşını silkələyən, oyadan qüvvə poeziyaya da məxsusdur. Əslində şəxsi hisslərin, öz yaddaşının kiçik "tarixçəsinin rəvayətçisi" olmalı olan nəzm, misraların harmoniyası hər vaxt tarixin ağırlığına, sərtliyinə davam gətirə bilmir. Bəzən tarixin həqiqətini çatdırmaq üçün bir oda, yada poema lazım gəlir, bəzən bir misra da bəs edir. Lap Hadinin "Yox millətimin xətti bu imzalar içində" olduğu kimi. Bəzən tarix o qədər əsrarəngiz, sirli olur ki, silsilə şairləri cəlb edir özünə. Məsələn, Avropa şairlərindən Bayronun "Şərq poeması", Göethenin "Şərq-Qərb divanı", hətta Şərqə aid bir neçə nəsr əsəri də bir yerdə Şərqin tarixini, mənəviyyatını vermək üçün bir yerə toplanmalı olur.

Tarixi yaddaşın ifadəsi olan poeziya nümunələri Azərbaycanda da olub və var. Nizaminin "Xəmsə"sindən tutmuş, Səməd Vuğunun "Vaqif"inə, Hüseyn Cavidin "Azər"indən tutmuş Bəxtiyar Vahabzadənin "Gülüstan"ına, Qabilin "Nəsimi"sinə, Nəriman Həsənzadənin "Atabəylər"inə qədər. Bəli, tarixi msraların çərçivəsinə salıb, şeirin qanunlarına tabe eləmək elə də asan deyil. Yaxud misralarla tarixin çək-çevirini çatdırmaq, yüksək hisslərə köklənmiş poeziya ilə maddi dünyanın qara günlərini yazmaq asan iş deyil. Mən də bir şairin tarixi nəzmə çəkməsindən danışacam.

**Şahin Fazil öz Divanlarını və qəzəllər kitabını mənə bağışlayanda və mən onlarla tanış olanda ürəyimdən iki hiss keçdi: bu poeziyanın əsl mahiyyətinə dalmaq üçün ayrıca şahinşünas olmaq və klassik poeziyanın incəliklərindən xəbərdar olmaq ən vacib şərtdir. Yoxsa onların yazılma ustalığını duymadan, adi qafiyə düzülüşü kimi görərsən. Mən özümü poeziya bilicisi hesab etmədiyimə görə bu dərya qarşısın-**

**da vahimələndim**. İkinci məsələ olmasa yəqin ümumiyyətlə bu barədə söz açmazdım. Bu, Şahin Fazil poeziyasının tarixi yaddaşı ehtiva etməsi idi. Sonra öyrəndim ki, əslində Şahin müəllim elə tarixçi imiş və bu faktın onun poeziyasına hopması qanunauyğunluqdur. Bu şeirlərlə bir az yaxından tanış olanda isə bir xətti də sezdim. Böyük poeziyanın dərin məqamlarına baş vurmadan elə o xətdən danışacam.

Şair sanki Azərbaycan xalqının ulu tarixini xatırlatmağa özünü mükəlləf bilir. Bununla həm özünün və sözünün, həm də xalqının dərin və möhtəşəm kökləri olduğunu vurğulayır:

*Yenə özümüzə dönməliyik biz,*
*Alışıb-yanmasaq, sönməlik biz.*

Bu həmin "özmüz"ük ki, illərə, əsrlərə baxmadan öz varlığımızı qoruyub saxlamışıq, tarixə səs salmaqla kifayətlənməyib, həm də tarixi yazmışıq. Ancaq bu köklərdən danışanda Şahin Fazildə bir təlaş, narahatlıq hiss olunur. Çünki o da hiss edir ki, yalnız tarixə baxıb qürurlanmaq, köklərinə baxıb qürrələnmək azdır, bu gün də həmin "mən"i yaşatmaq lazımdır ki, sabah üçün tarix olsun. Bunu yalnız özümüz bacararıq. Etməsək, öz soyumuzu qurudarıq. Bəli, bu xalq o qədər güclüdür ki, onu yalnız özü çökdürə bilər.

*Su kimi axırıq axırımıza,*
*Çox laqeyd baxırıq axırımıza.*
*Özümüz çıxırıq axırımıza,*
*Bizim axırımız necə olacaq?*

Xalqın keçmişi və bu günü arasındakı ziddiyyətləri, uyuşmazlığı heç cür həzm edə bilməyən şairin poeziyasında tez-tez belə çək-çevirə, daha doğrusu, daxili mübarizəyə, gah keçmişlə, gah gələcəklə mübahisəyə rast gəlinir:

*Sual verən də mən, cavab verən də,*
*Nə qədər danışım özüm-özümlə?*
*Əzabkeş də mənəm, əzab verən də,*
*Nə qədər danışım özüm-özümlə?*

Əslində bu söhbət az əvvəl dediyim faktla əlaqəlidir: bir var insan özü-özü ilə danışa, düşməni də, dostu da özü ola, bir də var, bu monoloq

dialoqa, hətta poliloqa çevrilsin. Axı deməyə sözü, öyünməyə kimliyi olan, tarix yazmağı bacaran bir xalq durğunlaşdıqca, dünya tarixini də durğunlaşdıra bilər:

*Şeirin nə həvəsi, nə təbi gəldi,*
*Hər günüm gün-gündən əsəbi gəldi,*
*Mənə Allahınmı qəzəbi gəldi?*
*Nə qədər danışım özüm-özümlə?*

Divanlarında Şahin Fazil oxucuya sanki itməkdə olan bir obrazı tanıtmağa çalışır – böyük Xalqın möhtəşəm obrazı: hələ tam itməyib, sənin əlindədir onun itməməyi. Şair onu itirməməyin yollarını da bir-bir sadalayır. Şair bir az əziyyətlə, bir az narahatlıqla, amma çox sərt şəkildə sanki oxucunun düz gözlərinə baxa-baxa deyir. Bu sərtliyin içində vacib bir sual da durur: şəxsən sən bu qədər darmadağın olmuş dünyanın harasındasan?! Sən öz insanlığını, öz tarixi yaddaşını xatırlayırsanmı?! Yeni səhifəni yazırsansa, onu nə ilə yazırsan?! Sən bu gün əcdadınla fəxr etdiyin kimi, gələcək nəsil də səninlə fəxr edəcəkmi?! Olacaqlar sənin istədiyin, sənin adına layiq olmayacaqsa, günahkar kim olacaq?!

*İnsandakı o əzəmət, ehtişam itir,*
*Ürəklərdən neçə-neçə arzu, kam itir,*
*Nizam itir, salam itir, ehtiram itir,*
*Səcdə yoxsa, səcdəgahı dünya neyləsin?*

Əslində, bunlar çox ağır və məsuliyyətli suallardır və cavabı Şahin Fazilin bütün poeziyasında mövcuddur. Mən bilmirəm öz Divanlarında şair şeirləri hansı məntiqi ardıcıllıqla düzüb, ancaq mən qarşımda bir neçə şair obrazı gördüm. Gah cəmiyyətin ədalətsizliyindən yorulan bir ruh dinir:

*Neçə rəzaləti görməmək üçün,*
*Neçə xəyanəti görməmək üçün,*
*Neçə qəbahəti görmmək üçün,*
*Yuxudan oyanmaq istəmirəm mən.*

Gah haqq səsini ucaldıb dünyanın belə bağrını yarmaq istəyən üsyankar durur qarşında:

*Belə ucaldıqca Şahinin səsi,*
*Lərzəyə salacaq hələ çox kəsi...*
*Vallah, partlayacaq qulaq pərdəsi,*
*Dünyanın qulağı kar olub yenə,*
*Kar olub yenə!*

Gah da bu gündən üz döndərib yenə də tarixə üz tutan küskün şair pıçıldayır:

*Gözlərimdən həyat nuru*
*uçub gedib...*
*Getsin, nə qəm?*
*Füzulini təqlid edən*
*şairlərə vida edib,*
*Füzulini axtarmağa*
*Gedəcəyəm!*

Qəribədir, Şahin Fazili oxuyanda səbəbini bilmədiyim, bəlkə də bilib etiraf etmək istəmədiyim köhnə, lap köhnə bir kədər baş qaldırır içimdən, məni qüssələndirir, ürəyimi ovcunda sıxır. Düzdür, onun özü də bildirir ki,

*İşıq görünən zaman*
*İşığı görmək asan!*
*Şahin Fazil,*
*çalış ki,*
*Qaranlıqda işığı*
*Görməyi bacarasan!*

**Ancaq üzərinə yeriyən bu kədərdəki işıq da kədərlidir sanki...**

Yazı bitənə yaxın Şahin müəllim mənim diqqətimi daha bir şeirinə çəkdi: "Vətən"

Vətən
Əzəl
Ulu
Vətən

Bəşər
Dolu,
Vətən
İpək yolu
Vətən
Vətən
Vətən
***
Bu gül,
Bu çöp,
Çəmən,
O bağ,
O dağ,
O çən,
Bu qum,
Bu şum,
Bu dəm,
Vətən,
Vətən,
Vətən.
***
Vətən
Nicat
Bizə
Vətən
Büsat
Bizə
Vətən
Həyat
Bizə
Vətən
Vətən
Vətən...

*(Şahin Fazil. Dördüncü Divan, Bakı,*
*Elm və təhsil, 2014. Səh 484-485)*

Niyə məhz bu şeir? Axı kitabda Vətənə həsr edilmiş başqa şeirlər - də var... Anladıqlarımı bölüşüm:

Şeir xüsusi sərbəst üslubda yazılıb: Hər sətirdə yalnız bir-ikicə söz, hər biri də mütləq baş hərflə və Vətən sözünün dönə-dönə təkrarlanması. Düşünürəm ki, səbəbi möhtəşəmdir: Vətənə aid hər söz, hər vəsf yalnız böyük hərflə və yeni sətirdən deyilməlidir. Bir növ Vətən qarşısında sözlər də ayağa qalxıb, cərgəyə düzülür, çünki hər sözdə vətənin özü var. İkinci tərəfdən məlum olduğu kimi hisslər, həyacan, dolub-daşan düşüncələr çox olanda onları sözlərə köçürtmək, quru hərflərlə allı-güllü ifadələrlə çatdırmaq çətin olur. Belə olan halda, hər sözün nəinki baş hərfini, bütövlükdə özünüdə baş hərflərlə yazmaq az gəlir. Belə şeirin hər sözü həmin ruhun daşıyıcısına çevrilir.

**Bəli, Şahin Fazil poeziyasında çox mətləblər gizlidir və hər biri haqqında ayrıca söhbət açmaq mümkündür. Mən yalnız birindən – tarixdən danışdım. Yəni şairin gördüyü və fəxr etdiyi xalqın nümayəndəsinin bugünkü portretinin yalnız bir neçə cizgisindən söz açdım.**

Mən Şahin Fazili yubileyi münasibəti ilə təbrik edirəm. İlini yazmıram, bunu sadəcə tarixin bir hissəsi olaraq qəbul edirəm. Tarixin Şahin Fazil hissəsi kimi.

**Vaqif BUDUQLU-PİRİYEV**
*Tarix elmləri doktoru, professor*

## ŞAHİN FAZİL FƏRZƏLİBƏYLİ VƏ ONUN "QUBA TARİXİ" ƏSƏRİ BARƏDƏ BİR NEÇƏ SÖZ

Uşaqlıq illərindən tanıdığım Şahin Fazili görəndə yadıma qeyri-ixtiyari olaraq "Uzaq sahillərdə" filmindəki bir epizod düşür: Mehdi Hüseynzadənin ay işığında şəkil çəkdirdiyini görən partizan dəstəsinin rəhbəri soruşur: "Bilmirəm sən kimsən, kəşfiyyatçısan, ya rəssam?" Bəli, Şahin Fazili yaxından tanıyanlar da onu görəndə ani olaraq onun şairmi, alimmi olduğunu müəyyənləşdirməyə çalışır. Şahin Fazil həmin sahələrdən birinə daha çox meyl salsaydı onu ya şair, ya da alim adlandırmaq mümkün idi. Lakin, o, hər iki sahənin vurğunu, hər iki sahədə öz layiqli sözünü deyən ziyalıdır. Ovçuluğunu və həm də, insaflı olduğunu söyləyən görkəmli qəzəlxan, zəmanəmizin Füzulisi—Əliağa Vahid yalnız "Öz kəməndində düçar etdiyi ceyranı"—qəzəli sevdiyi halda Şahin Fazil bir qəlbə iki sevgi yerləşdirə bilmişdir. O, həm elmi, həm də şe'riyyatı eyni səviyyədə, eyni məhəbbətlə sevir.

Şahin Fazil respublikamızın tanınmış alimlərindəndir. Tarix elmləri doktorudur. Onun qələmindən Azərbaycanın orta əsrlər tarixinə dair 3 monoqrafiya, 100-dən artıq elmi məqalə çıxmışdır. "Azərbaycan XV-XVI əsrlərdə", "Azərbaycan və Osmanlı münasibətləri" və s. əsərlərində müəllif orta əsrlər Azərbaycanınıne qaranlıq və mürəkkəb sahifələrini işıqlandırır.

Şahin Fazil tanınmış qəzəl ustadıdır. Onun sadə dildə yazdığı duzlu qəzəllərinin toplandığı kitablar bunu söyləməyə əsas verir. S.Ə.Şirvanidən sonra "Divan" yaratmaq təşəbbüs və əldə etdiyi müvəffəqiyyət müəllifin bu sahədəki bacarığını, səriştəsini göstərən mühüm amil deyilmi?

Şahin Fazili səciyyələndirən əsas cəhətlərdən biri onun vətənpərvərliyi, elinə, obasına olan hədsiz məhəbbətidir. Şahinin qibləgahı Quba torpağıdır. "Hələ Kabulda ikən Şahdağı görsəndi mənə"—deyən şair haqlı olaraq soruşur: "Qubamdakı hüsn Kabulda varmı?" Bəli, bu torpaq onun üçün hər yerdən əzizdir. Müəllif "Mən Quba torpağını Kə'bədən az istəmirəm" deyir, onu Şərqin tanınmış söz ustadı Hafiz Şirazi kimi "türk gözəlinin hindu xalına" bağışlamır, vətəninin hər qarış torpa-

ğının qədrini bilir:

*Atamın kəndi o Qəçrəş, anamın gəldi Buduq,*
*Versələr istəmərəm Gəncəni, Dərbəndi mənə.*

Qubanın əsrarəngiz mənzərələri, təbiəti şairin ilham mənbəyinə çevrilmişdir. Qubanın tərənnümü onun qəzəllərinin əsas mövzularındandır.

Bəli, məhz belə bir ülvi məhəbbət alim-şair Şahini öz doğma diyarının tarixini yazmağa sövq etdi. Nəticədə, qısa dövr ərzində "Quba tarixi" adlı sanballı monoqrafik əsər meydana gəldi. Gərgin əməyin bəhrəsi olan həmin kitabda Azərbaycanın dilbər güşələrindən biri—Qubanın qədim vaxtlardan müasir dövrümüzə kimi olan tarixi şərh olunur. Müəllif kitabın yazılmasında orta əsr mənbələri ilə yanaşı, Qubaya həsr olunmuş tədqiqat əsərlərinin əksəriyyətindən istifadə etmiş və diyarın keçmişi və bu günü barədə yığcam və maraqlı əsər yaratmışdır.

Kitabın ilk fəslində Qubanın yaşayış məskəni kimi mövcudluğu, "Quba" toponiminin etimologiyası və XVIII əsrə qədərki dövrdə Qubanın tarixi şərh olunur, burada arxeoloji qazıntılar, Quba toponiminin izahı, həmin ərazidə yaşayan xalqlar, etnik qruplar, Qubanın orta əsrlər tarixi faktiki materiallarla əks olunur. Müəllifin Qubanın XI əsrdə tam yaşayış məskəni kimi mövcud olunduğunu qeyd etməsi məntiqidir.

Monoqrafiyanın mühim hissəsi Qubanın XVIII əsrdəki vəziyyətinə, Quba xalqlarının tarixinə həsr olunur. Şahin Fazil mövcud tarixi şəraiti, Quba xanlığnın təsisi, Fətəli xanın Azərbaycanı birləşdirmək uğrunda apardığı mübarizəsi, oğlu Şeyx Əli xanın fəaliyyəti, Quba xanlığı ilə bilavasitə bağlı olan Dərbənd, Bakı, Şamaxı, Cavad xanlıqları, Quba xanlığının Rusiya və Iran ilə münasibətləri, xanlığın siyasi-iqtisadi vəziyyəti, idarə sistemi və s. barədə maraqlı məlumat verir.

Daha sonra Qubanın XIX əsrdəki vəziyyətindən söhbət acılır. Burada Şeyx Əli xanın Rusiyaya qarşı mübarizəsi ön plana çəkilir, 1810, 1837 və 1877-ci il Quba üsyanlarının şərhi verilir, Şamil hərəkatının təsirinə münasibət göstərilir. Müəllif diyarın ərazisi, əhalisi, təsərrüfatı, mədəni həyatı, ədəbi mühiti barədə söz açır.

Kitabın son fəslində XX əsrdə Qubada baş verən hadisələr oxucuya çatdırılır. Bilindiyi kimi, əsrimiz Quba tarixi baxımından da zəngindir. Cəmiyyətdə baş verən hadisələr Qubadan yan ötməmiş və istər-is-

təməz bu diyara da öz təsrini göstərmişdir. Şahin Fazilin erməni qırğınları, "Daşnaksütyun" partiyası və havadarlarının Qubada törətdiyi dəhşətlər, bolşevik hərəkatı, onlara qarşı Quba qaçaqlarının (Mayıl, Həmdullah Əfəndi və Alının) mübarizəsi, M.C.Bağırovun fəaliyyəti barədəki qeydləri diqqəti cəlb edir. Fəslin sonunda Qubanın idarə olunmasına başçılıq etmiş şəxslərdən söhbət açılır, diyarın müasir vəziyyəti işıqlandırılır.

Bakı, Gəncə və s. şəhərlərə həsr olunmuş tarixi oçeklər kimi, "Quba tarixi" nin də geniş oxucu kütləsinin marağına səbəb olacağı şübhə doğurmur. Müəllifin kitabda verdiyi haşıyələr, Quba tarixi ilə bağlı sənədlərin tərcümələri və eləcə də qəzəlləri həmin marağı daha da artırır. Vaxtın azlığından nəzərə çarpan bəzi uğursuzluğa baxmayaraq, kitab oxuculara, xüsusilə Quba diyarı ilə maraqlananlara qiymətli hədiyyədir. Mən alim-şair dostuma yeni-yeni uğurlar arzulayıram.

*Bakı-2001*

**Vaqif PİRİYEV**
**Tofiq NƏCƏFLİ**

## "AZƏRBAYCAN VƏ OSMANLI İMPERİYASI"

Azərbaycan tarixinin orta əsrlər dövrünün tədqiqi sahəsində son illərdə mühüm uğurlar qazanılmışdır. Bu cəhətdən Ş.F.Fərzəlibəylinin – "Azərbaycan və Osmanlı imperiyası (XV-XVI əsrlər), Bakı, 1995 – monoqrafiyası diqqəti xüsusilə cəlb edir. Əsər Azərbaycan tarixinin mürəkkəb və tədqiqi xüsusi araşdırıcılıq bacarığı tələb edən aktual problemlərindən birinə həsr olunmuşdur. Müəllifin qeyd etdiyi kimi, XV-XVI yüzilliklərdə Azərbaycan-Türkiyə ictimai, iqtisadi, siyasi, mədəni və diplomatik münasibətlərinin öyrənilməsinin aktuallığı inkarolunmaz bir həqiqətdir, çünki həmin münasibətlərin obyektiv şəkildə tədqiqi bugünkü Azərbaycan-Türkiyə münasibətlərinin hansı zəmin üzərində yarandığını üzə çıxarır, bu ölkələr arasında vaxtilə mövcud olmuş müxtəlif əlaqələrin qarşılıqlı maraq və mənafe baxımından inkişaf etdirilməsinə imkan verərdi".

Monoqrafiya girişdən, 5 fəsildən, nəticə və istifadə olunmuş mənbə və ədəbiyyat göstəricisindən ibarətdir. Ş.F.Fərzəlibəyli əsər üzərində işləyərkən dövrün fars, ərəb, türk və Avropa dilli mənbələrindən geniş istifadə etmiş, tədqiq etdiyi problemin müxtəlif cəhətlərini araşdıran zaman tarixşünaslığımızda ilk dəfə olaraq epistolyar qaynaqlara (rəsmi yazışmalar, göndərilən fəthnamələr, təhniyətnamələr, ziraətnamələr və s.) müraciət etmişdir. Müəllif dövlətlər arasında qarşılıqlı münasibətlərin araşdırılmasında çox zaman ilkin qaynaq kimi hökmdarlararası yazışma sənədlərinə istinad etməklə düzgün elmi nəticəyə nail olmuşdur.

Monoqrafiyanın mühüm bir hissəsi XV əsr Azərbaycan dövlətlərinin (Qaraqoyunlu, Ağqoyunlu və Şirvanşahlar) Osmanlı Türkiyəsi ilə qarşılıqlı əlaqələrinə həsr olunmuşdur (s. 6-87). XI yüzillik Azərbaycanda müstəqil dövlətlərin təşəkkülü tarixində mühüm dövr kimi diqqəti cəlb edir. Teymurilərlə şiddətli mübarizə şəraitində yaranmış Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin qərb qonşuları, möhtəşəm Osmanlı imperiyası ilə qarşılıqlı münasibətlərinin yaranması, inkişaf etməsi məsələləri əsərin I və II fəsillərində ətraflı şəkildə öz əksini tapmışdır. Müəllif Qaraqoyunluların, eləcə də Ağqoyunluların Osmanlılarla qarşılıqlı münasibətlərinin XIV yüzilliyin sonlarından etibarən izləməyə başlamış

və onun inkişaf dinamikası dövrün ilkin qaynaqlarına əsaslanmaqla ətraflı surətdə tədqiq edilmişdir. Ş.F.Fərzəlibəyli Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin Osmanlı Türkiyəsi ilə münasibətlərini araşdırarkən bu münasibətlərin inkişafına təsir göstərmiş xarici amillərə də xüsusi diqqət yetirmişdir. Müəllifin problemin tədqiq olunmasına geniş kontekstdə yanaşması da bilavasitə bununla bağlıdır. Ayrı-ayrı siyasi məsələlər araşdırılan zaman Qaraqoyunlu-Ağqoyunlu, Qaraqoyunlu-Teymuri, Qaraqoyunlu-Şirvanşahlar, Qaraqoyunlu-Misir, eləcə də Ağqoyunlu-Teymuri-Avropa əlaqələrinə geniş yer verilməsini bununla izah etmək mümkündür.

Ağqoyunlu dövlətinin Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələri araşdırılan zaman müəllif mövcud olan tarixi əsərlərlə dövrün farsdilli qaynaqlarını və eləcə də müasir türk tarixçilərinin tədqiqat əsərlərini müqayisəli təhlil etmiş, Türkiyə tarixşünaslığında Ağqoyunlu dövlətinin Osmanlılar əleyhinə yeritdiyi siyasətə qarşı mövcud olan qərəzli münasibətə tutarlı cavab vermişdir. Ş.F.Fərzəlibəyli Ağqoyunlu-Osmanlı qarşılıqlı əlaqələrinin tədqiqindən belə nəticəyə gəlmişdir ki, bu dövlətlər arasında heç də həmişə düşmən münasibətlər olmamış, Avropa dövlətlərinin bütün təhriklərinə baxmayaraq, həm Uzun Həsən, həm də onun varisləri şəraitə uyğun olaraq qonşu dövlətlə xoş münasibət saxlamağa çalışmışlar. Tədqiqatçı XV yüzilliyin son rübündə Ağqoyunlu-Osmanlı siyasi əlaqələrinin qarşılıqlı mənafe əsası üzərində qurulduğunu ilkin qaynaqlara istinadən sübut etmişdir.

Əsərdə Şirvanşahlar dövlətinin Osmanlı imperiyası ilə siyasi diplomatik münasibətlərinin araşdırılması xüsusi maraq doğurur. Tarixşünaslığımızda ilk dəfə olaraq Ş.F.Fərzəlibəyli tərəfindən XV-XVI yüzilliklərdə Şirvanşahların Osmanlı Türkiyəsi ilə qarşılıqlı əlaqələrinin yaranması səbəbləri, həmin əlaqələrin yaranması səbəbləri, həmin əlaqələrin inkişaf istiqamətləri, əsas cəhətləri geniş şəkildə nəzərdən keçirilmişdir. Şirvanşahlar dövlətinin öz müstəqilliyini qorumaq məqsədilə gah Teymurilərlə, gah da Osmanlılarla yaxın münasibətlərə üstünlük verməsi tarixi faktlar əsasında açıqlanmışdır. Müəllif belə bir tutarlı elmi nəticəyə gəlmişdir ki, bütün XV əsr boyu Osmanlı sultanları və Şirvanşahlar arasında müntəzəm qarşılıqlı münasibətlər mövcud olmuş, tərəflər, elçilər vasitəsilə daimi əlaqələr saxlamış, diplomatik fəaliyyət canlı olmuşdur.

Şübhəsizdir ki, XVI yüzillikdə Şirvan-Türkiyə münasibətlərinin

möhkəmlənməsində müştərək dini məzhəbin- sünniliyin həm Türkiyədə, həm də Şirvanda geniş yayılması da az rol oynamamışdır. Digər tərəfdən, XVI əsr boyu fasilələrlə davam etmiş Osmanlı-Səfəvi müharibələri zamanı Osmanlı hökmdarları Şirvanın iqtisadi köməyinə ehtiyac duymuş, bu barədə öz xahişlərini məktubla yazıb bildirərək, Şirvanşaha göndərmişlər. Şirvan-Türkiyə münasibətlərinin bu axarda inkişafı əsərdə faktik materiallarla işıqlandırılmışdır.

Monoqrafiyanın geniş bir hissəsi Səfəvilər dövlətinin Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələrinə həsr olunmuşdur (s. 87-167). Müəllifin fikrincə, "XV əsrin müxtəlif dövrlərində Qaraqoyunlularla və Şirvanşahlarla sülh, gah da müharibə şəraitində yaşayan və həmin dövlətlərlə öz ictimai-iqtisadi, siyasi, dini və hərbi münasibətləri ardıcıl davam etdirən Osmanlı dövləti XV əsrin II yarısından başlayaraq əvvəlcə Səfəviyyə dərviş və şeyxləri, sonradan isə (XVI əsrdə) Səfəvi padşahları ilə qarşılıqlı münasibətlərdə olmuşdur. Bütün XVI əsr boyu davam edən həmin münasibətlər əsasən rəqabət xarakteri daşımışdırsa da, Osmanlı-Səfəvi əlaqələrində dinc yanaşı yaşamaq, bir-birlərinə müxtəlif məqsədlər daşıyan diplomatik elçilər yollamaq, məktublar, hədiyyələr göndərmək məqamları da az olmamışdır". Ş.F.Fərzəlibəyli Səfəvi-Osmanl münasibətlərini tədqiq edən zaman daha çox yazışma sənədlərinə istinad etmiş, onları dövrün digər yazılı qaynaqları ilə müqayisəli təhlil etmişdir. Tarixşünaslığımızda XVI yüzillik Səfəvi-Osmanlı müharibələri ətrafında tədqiq olunsa da, müəllifin tədqiqata geniş cəlb etdiyi epistolyar qaynaqlar problemi daha əhatəli açıqlamışdır.

Müəllifin qənaətinə görə, problemin tədqiqində ilkin mənbələrin, o cümlədən, Şərq mənbəşünaslığnda sənəd xarakterli tarixi qaynaqların- məktubların, hökmlərin, fəthnamələrin, səfir məlumatlarının diqqətlə öyrənilməsi qarşıya qoyulan mövzunun aktuallığını səciyyələndirən amillərdən olmuşdur. Tarixşünaslığımızda tarixi salnamə xarakterli mənbələr tədqiqatçılar tərəfindən geniş şəkildə istifadə olunduğu halda, əhəmiyyəti böyük olan sənədli mənbələr tədqiqata nisbətən çox az cəlb edilmişdir. Ş.Fərzəlibəylinin monoqrafiyası bu baxımdan əhəmiyyətə malikdir.

Əsərin son fəslində dövlətlərarası münasibətlərin tənzimlənməsində diplomatik görüşlərin əhəmiyyəti, elçilərin və elçi heyətlərinin bir ölkədən başqa ölkəyə göndərilmə rəmzi, elçi-səfirlərin dərəcələrinin müəyyənləşdirilməsi məsələləri hərtərəfli tədqiq olunmuşdur. Müəllif

ilkin qaynaqlardan geniş istifadə edərək XV-XVI əsrlərdə Azərbaycanla Osmanlı imperiyası arasındakı diplomatik münasibətlərin inkişaf etdirilməsində elçi-səfirlərin mühüm rolunu inkarolunmaz faktlarla göstərmişdir.

Monoqrafiya yüksək elmi səviyyədə yazılmışdır. Onun dili sadə, rəvandır və oxunaqlıdır. Şahin Fərzəlibəylinin "Azərbaycan və Osmanlı imperiyası" monoqrafiyası tariximizin orta çağlarının araşdırılması istiqamətində qazanılmış mühüm uğurlardandır. Azərbaycan tarixşünaslığında mühüm mövqe qazanacaq, onu zənginləşdirəcək layiqli töhfədir.

***"Bakı Universiteti" qəzeti,***
*5 aprel, 1996*

**Махмуд ИСМАИЛ**
*член-корреспондент АН Азербайджана*

# АЗЕРБАЙДЖАНО-ТУРЕЦКИЕ ОТНОШЕНИЯ В XV-XVI ВЕКАХ

Взаимоотношениям феодальных государств средневекового Востока и азербайджанских государств Гарагоюнлу, Агтоюнлу, Ширваншахов и Сефевидов, до сих пор не являвишимся объектом специального исследования, посвящена вышедшая недавно в свет книга Шахина Фазиля Фарзалибейли "Азербайджан и Османская империя (XV-XVI века)". Ее автор-достаточно известный в наших научных кругах ученый, более 30 лет занимающийся научно-исследовательской работой и написавший свыше 100 научных статей, в том числе две монографии. Его перу принадлежат и переводы двух исторических первоисточников с османского и персидского языков на азербайджанский.

В новой монографии ученого приводятся ценные мысли и суждения В.В.Бартольда, В.А.Гордлевского, И.П.Петрушевского, А.Д.Новичева, З.М.Буниятова, О.А.Эфендиева, Я.М.Махмудова, О.М.Онуллахи, М.Х.Гейдарова, С.Б.Ашурбейли, М.Х.Нейматовой, Ф.К.Мамедовой и многих ученых, касающиеся различных аспектов данной проблемы. Однако в качестве специального объекта изучения данная тема впервые стала разрабатываться именно Ш.Ф.Фарзалибейли.

Книга состоит из введения, пяти глав и заключения. В первой главе - "Государство Гарагоюнлу и Османская империя" говорится о кратком правлении династии Гарагоюнлу (1410-1467), вышедшей на политическую арену в восточных областях Турции в середине XIV столетия. Как отмечает автор, в конце XIV- начале XV века в Азербайджане сложились благоприятные условия для объединения страны под одной властью: Империя Великого Тимура слабела, и стремление азербайджанского правителя Султана Ахмеда Джалаирида и эмира Гара Юсифа Гарагоюнлу подыскать себе более сильного союзника привела к улучшению отношений с малоазийским Османским государством. Установление таких отношений фактически отвечало и интересам Султана Ильдырыма Баязида, поскольку в это время Теймурленг намеревался вновь включить в свою Империю земли Ближнего Востока

и Малой Азии.

Несмотря на создание Османско-Джалаиридско-Гарагоюнлинского союза, Теймурленг сумел добиться очередной победы. Тем не менее после его смерти (1405 г.) различные государства, включенные в состав его Империи, отделились друг от друга и стали обретать самостоятельность. В результате политики Гара Юсифа, в течение пяти лет подвергавшегося атакам ближних и дальных соседей, образовалось государство Гарагоюнлу, что стало знаменательным событием в жизни нашей страны.

Несмотря на неоднократные нападки на власть гарагоюнлинских правителей, предпринятые в 1410-1420 годах со стороны тимуридских и аггоюнлинских эмиров, они, хоть и с трудом, сумели сохранить целостность своего государства и даже расширить его пределы. В период правления Джаханшаха влияние Гарагоюнлу в Азербайджане сохранилось. Чтобы добиться успеха в восточном регионе, Даханшах делал ставку на османов, считая их своей надежной опорой Однако гарагоюнлиинско-аггоюнлинские отношения все более обострялись. Не удовлетворившись своим наследным владением в Диярбекире, Узун Гасан в 50-ч годах XV века сумел объединить в составе своего небольшого государства земли Гарагоюнлу, населенные армянами, и большую часть Курдистана. Джаханшах Гарагоюнлу в это время тщетно пытался вовлечь Османскую Турцию к выступлению против Аггоюнлу, а в 1467 году, подстрекаемый Султаном Мухаммедом II, он выступил с войском на Диярбекир. Однако, не сумев преодолеть сопротивления противника, гарагоюнлинские войска были вынуждены отступить. В результате противоречия, существовавшие при объединении этих двух племен, закончились поражением первого и победой второго из них. В Азербайджане утвердилась власть аггоюнлинских правителей.

Вторая глава книги также посвящена отношениям Аггоюнлу с Османсой Имперей. (Отмечу, что, несмотря на обилие разноязычных источников, содержащих материалы о всемирно исторических событиях того времени, ни в одном из них аггоюнлинско-османские отношения отдельно не освещались). Обращаясь к исключительно важным эпистолярным источникам, официальным перепискам, указам и другим документам, Ш.Ф.Фарзалибейли показал, что Узун Гасан став законным наследником Государства Аггоюнлу (1468-1501 гг), начал постепенно расширять свои земли, стремясь одновременно придать еще

больший размах торговым связям Азербайджана с государствами Малой и Передней Азии, а также Европы. Действительно, во второй половине XV века во всей Малой Азии и на Среднем Востоке не было правителей, могущественнее Султана Мухаммеда II и Узун Гасана. Можно только сожадеть о том, что в сфере экономических и военно-политических интересов эти две силы противостояли друг другу.

Взаимосвязи Азербайджанского Государства Аггоюнлу с Турцией продолжали развиваться неоднозначно, то усиливаясь, то ослабевая. Несмотря на потепление аггоюнлинско-османских отношений, наступившее после смерти Узун Гасана, Государства Аггоюнлу потеряло свою былую политическую мощь. Вопреки всем усилиям Султана Баязида, аггоюнлинцы нк сумели справиться со все более ширившимся кызылбашским движением, и в самом начале XVI века властью в Азербайджане овладели Сефевиды.

В главе "Государство Ширваншахов и Османская Империя" показано, что многие государства Ближнего и Среднего Востока, в том числе и область Ширван, сохранившие в начале XV свою номинальную независимость, не сумели, однако, выйти из-под влияния Тимуридов и Османов. Проводя осторожную и вместе с тем дальновидную политику в отношении всех государств, Ширваншахи продолжали поддерживать нормальные отношения с Турцией... Главы обоих государств вели друг с другом постоянную переписку. Между обеими странами существовали довольно оживленные дипломатические связи. Однако после прихода к власти Сефевидов независимости Ширвана был положен конец (1538 г), а в конце XVI века эта страна, по условиям мирного договора, заключенного между Сефевидами и Османами (21 мая 1590 г.), как и другие азербайджанские земли, была включена в состав Османской Империи. В книге отмечается, что период XV-XVI веков явился одним из важных этапов в экономической и общественно-политической жизни Ширванского государства.

В самой объемной главе монографии – "Государство Сефевидов и Османская Империя" показно, что Османское государство, находившееся на протяжении всего XV века в мире с гарагоюнлинцами, а с аггоюнлицами жившее то в условиях мира, то в условиях войны, продолжало последовательно развивать с этими государствами общественно-экономические, политические, религиозные и военные отношения.

Начиная со второй половины XV века Османское государства

установило взаимоотношения вначале с сефевидскими дервишами с шейхами, а впоследствии (в XVI века) - и с сефевидскими правителями. Несмотря на то, всем протяжении XVI века эти отношения носили в основном характер соперничества, тем не менее в османско-сефевидских отношениях было немало позитивного: оба государства продолжали обмениваться дипломатическими посланниками (посольскими миссиями), официальными письмами и подарками.

В этой главе Ш.Ф.Фарзалибейли на конкретных исторических фактах сумел убедить читателей в том, насколько умело пользовались Сефевиды религиозной идеологией для достижения своих политических целей. Поьными Помимо этого, в главе подробно говорится о военных и политических конфликтах, происходивших между Османами и Сефевидами в различные годы XVI века при борьбе за утверждение влияния в Азербайджане. Говоря, о сефевидско-османских взаимоотношениях, автор по мере возможности затрагивает и отношения Азербайджана с сопредельными государствами, в частности, с Гиляном.

В пятой главе, посвященной роли посланников с посольств в развитии дипломатических отношений между Азербайджаном и Османской Империей, автор справедливо отмечает, что в исторической науке вплоть до настоящего времени не существует специального исследования по изучению посольских отношений между Азербайджаном и Турцией в XV-XVI веках, несмотря на то, что данная проблема является одной из важных в деле изучения истории нашей дипломатии. Вот почему в своей монографии Ш.Ф.Фарзалибейли придает этой теме особое внимание.

В заключение отмечу, что монография Ш.Ф.Фарзалибейли, будчи самым ценным исследованием в своей области, - весьма интересный материал для современного читателя и для будущих поколений.

**Т.АЛИЕВ**

## С ВОЗВРАЩЕНИЕМ ВАС, СЫНОВЬЯ!*

Это было вчера. Закончился долгожданный вывод из Афганистана советских воинских частей. И наши сыновья братья, такие юные, с особой, афганской печалью в глазах, выполнив свой долг, возвращаются домой. Кровь, слезы, «черный тюльпан» – все это уже позади…

---

* Mən Əfqanıstanda uzun müddət işlədikdən sonra Vətənə qayıtdım (1988). Macəralar və siyasi toqquşmalarla dolu olan həmin ölkədə olduğum zaman oranın bir sıra şair və yazıçıları ilə tanış olmuşdum (Süleyman Layiq, Bareq Şəfii, Əbdülkərim Misaq və b). O şairlərin biri də Əzim Şəhbal idi ki Azərbaycan dilində ona ithaf etdiyim "Son güllə" adlı şe`rimi, görünür ki, əfqan qəzetlərinin birində fars dilində dərc etmişdilər. "Vışka" qəzetində təqdim olunan kiçik məqalənin və mənim şe`rimin kim tərəfindən redaksiyaya təqdim edilməsindən xəbərim yoxdur və T.Əliyevin kim olduğunu xatırlamıram. Buna baxmayaraq həmin müəllifə və şe`ri rus dilində işləyib təqdim edən məşhur mütərcim Aleksandr Xaldeyevə səmimi təşəkkürümü izhar edirəm.
"Son güllə" şe`rinin azərbaycancası belədir:

**SON GÜLLƏ**

*Şair əfqan dostuma – Əzim Şəhbala!*

Nə vaxt atılacaq sonuncu güllə?
Haçan qoyulacaq yerə silahlar?
Vida olunacaq nə vaxt nisgilə?
Haçan silinəcək könüldən ahlar?

Mərmi gərək deyil! Mərmi qan-qada!
Bəşərə həva tək səadət gərək!
Partlasın sonuncu bomba dünyada,
Ahuzar dağılsın uçub tüstütək.

Yaşasın adamlar üzügülər, şən,
Silinsin çöhrədən qorxu da, qəm də.
Atılsın sonuncu güllə tüfəngdən
Və gəlib yer tutsun mənim sinəmdə.

İnan ki, ürəkdən deyirəm bunu,
Təki həmin güllə sonuncu olsun,
Təki hamı bilsin son olduğunu,
O güllə qoy mənlə qəbrə qoyulsun!

***Şahin Fazil. DİVAN,***
*Bakı, Azərbaycan dövlət nəşriyyatı, 1996, səh. 428.*

В эти дни в редакционной почте было немало писем откликов на последние переходы советских воинских частей по афганской земле. Вот одно из них.

«Уважаемая редакция! Во время работы в Афганистане, куда я был командирован, мне случайно попалось на глаза стихотворение Шахина Фазиля «Последняя пуля» с посвящением афганскому поэту Азиму Шахбалу. Мне очень понравилось оно по своему содержанию и образности, и я попытался перевести его на русский язык. Если оно заинтересует вас, пожалуйста, опубликуйте."

***Ш.Фазиль***

**ПОСЛЕДНЯЯ ПУЛЯ**

*Когда же этот день в лучах рассвета*
*Наступит на израненной земле?!*
*Когда ж последней станет пуля эта,*
*Вчера лишь предназначенная мне?!*

*Когда же прозвучит последний выстрел,*
*Поставив точку в списке наших бед?!*
*Когда же, став последней в небе мглистом*
*Прочертит пуля свой последний след?!*

*На старте смертоносная ракета,*
*Так пусть последней станет и эта!*
*Пусть будет на земле последней эта*
*Надежды растоптавшая война.*

*Пусть грудь мою пронзит в огне и гуле,*
*В полете раскалившись добела, –*
*Шальная пуля. Только б эта пуля*
*действительно последнею была!*

***(Литературная обработка А.ХАЛДЕЕВА)***

*(Газета «Вышка», 16 февраля, 1989 г.)*

**Cəbi BƏHRAMOV**
*AMEA A.A.Bakıxanov adına*
*Tarix İnstitutunun icraçı direktoru,*
*t.ü.f.d, dosent*

## GÖRKƏMLİ TARİXÇİ, MƏTNŞÜNAS ALİM, TANINMIŞ ŞAİR ŞAHİN FAZİL OĞLU FƏRZƏLİYEV – ŞAHİN FAZİL – 80

Deyirlər alim ömrü, şair ömrü sonsuz və əbədidir. Onlar həmişəlik olaraq təkcə mənsub olduğu xalqın, millətin deyil, bütün bəşəriyyətin, insanlığın sərvətinə, inam və istinad mənbəyinə çevrilirlər. Qədim yunan, Roma, orta əsrlər Azərbaycan xalqının dünya elminə və mədəniyyətinə verdiyi dühalar bu gün də bütün dünya alimləri tərəfindən öyrənilir, tədqiq olunur, onların yazıb qoyduqları tarixi, fəlsəfi, riyazi, ədəbi-bədii əsərlər bu gün bir mənbə olaraq istinad ünvanıdır. Bu gün tarix, fəlsəfə, ədəbiyyatşünaslıq sahəsində yazılan və bütün akademik dünya elmi tərəfindən qəbul edilən yazılar yazılarkən bir mənbə olaraq bu dühaların əsərlərinə müraciət olunur. Homerin, Herodotun, Esxilin, Aristotetlin, Pifaqorun, Strabonun, Siseronun, Tasitin, Ptolomeyin, Polibinin, Əbu Dülafın, İstəxrinin, Təbərinin, Məsudinin, Xordadbehin, Məhsəti Gəncəvinin, Nizami Gəncənin, Əfzələddin Xaqaninin, Əbulüla Gəncəvinin, Sayib Təbrizinin, Fələki Şirvaninin, Nəsrəddin Tusinin, Fəzlullah Rəşiddədinin, Məhəmməd Füzulinin, İmadəddin Nəsiminin, Ömər Xəyyamın, Əlişir Nəvainin, Şah İsmayıl Xətainin insanlıq üçün, bəşəriyyət yazıb qoyduqları əsərlər bu gün dünya mədəni və mənəviyyatının çox sürətlə məhvə doğru getdiyi bir zamanda Azərbaycan xalqının dünya mədəniyyətinin inkişafına, insanlığın mənəviyyatının zənginləşməsinə verdiyi töhfə əvəzsizdir. Nizami, Füzuli, Nəsimi kimi dühalar dünya mədəniyyətinin qızıl səhifələridir və mən fəxr edirəm ki, dünyaya bu mütəfəkkirləri verən bir xalqın, millətin övladıyam. Bir də ona görə xoşbəxtəm ki, mən XX əsrdə Azərbaycan xalqının dünya elminə, mədəniyyətinə verdiyi bir çox dahilərin – elm və mədəniyyət xadimlərinin müasiri olmuşam, onlarla təmasda olmuşam, bir yerdə çalışmışam, onların elmi məktəbini keçmişəm.

Azərbaycan akademik milli tarix elminin yaradıcıları olan Əlövsət

Quliyevi, Əbdülkərim Əlizadəni, Ziya Bünyadovu, Əlisöhbət Sumbvt-zadəni, İqrar Əliyevi, Teymur Bünyadovu, Mahmud İsmayılovu, Dilarə Seyidzadəni, Tapdıq Novruzovu, İdeal Nərimanovu, Məmmədəli Hüseynovu, Məzahir Abasovu, Yaqub Mahmudovu, Nailə Vəlixanlını, ədəbiyyatşünas alimlərdən Həmid Araslını, Məmmədcəfər Cəfərovş, Yaşar Qarayevi, Bəkir Nəbiyevi, Rüstəm Əliyevi şəxsən tanımaq, onların elmi yaradıcılığı ilə tanış olmaq elm yoluna qədəm qoyan gənc tədqiqatçı üçün böyük bir səadətdir. Adları Azərbaycan milli elminin tarixinə düşən bu alimlər içərisində, həmin illər təmasda olduğum, Azərbaycanın orta əsrlər tarixinə dair yazdığı əsərləri oxuduğum, bu dövrə aid çox mükəmməl tərcümə etdiyi mənbələrlə yaxından tanış olduğum, tanınmış məşhur qəzəlxan şair kimi bədii yaradıcılığını böyük həvəslə izlədiyim beş divan müəllifi, tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyevdir. Ədiblər içində o Şahin Fazil kimi məşhurdur. Mən Şahin müəllimi 1982-ci ildən tanıyıram. O, 1940-cı ildə Azərbaycanın özünəməxsus gözəllikləri, öz əsrarəngiz təbiəti ilə seçilən Quba şəhərində dünyaya göz açıb. Dilə, ədəbiyyata, tarixə çox böyük maraq göstərib. 1959-cu ildə Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin Fars dili şöbəsinə daxil olub. V kursda oxuyarkən Əfqanıstana ezam edilib və il orada çalışdıqdan sonra Vətənə dönərək dövlət buraxılış imtahanlarını uğurla verir və yenidən bu ölkəyə dönərək burada daha iki il çalışır. Əfqanıstanda illik ezamiyyət başa çatdıqdan sonra Şahin müəllim 1966-1968-ci illərdə BDU-nun Şərqşünaslıq fakültəsində dekan müavini vəzifəsində çalışır. O 1968-cı ildə AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun əyani doktoranturasına daxil olur və elə həmin ildə yenidən Əfqanıstana ezam edilir. 1970-ci ildə ezamiyyət müddəti başa çatdıqdan sonra Şahin müəllim, 1970-ci ildə institutun əyani doktoranturasında təhsilini davam etdirir, 1973-cü ildə «Orta əsrlər tarixi» şöbəsində kiçik elmi işçi vəzifəsinə qəbul edilir. 1974-cü ildə Şahin müəllim «Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» əsəri Azərbaycan tarixinin mənbəyi kimi)» mövzusunda tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsini almaq üçün dissertasiya işini müdafiə edir və bu elmi dərəcə 1974-cü ildə keçmiş SSRİ Nazirlər Soveti yanında AAK-sı tərəfindən təsdiq edilir. Şahin müəllim 1970-1978-ci illərdə həm tarixi və həm də ədəbi mövzulara aid çoxsaylı məqalələr dərc etdirir. 1978-ci ildə Şahin Fərzəliyev üçüncü dəfə Əfqanıstan hökumətinin dəvəti ilə bu ölkəyə gedir və müxtəlif dövlət strukturlarında tərcüməçi olaraq çalışır.

Göstərdiyi fəaliyyətə görə Əfqanıstan dövlətinin üçmedalı və SSRİ hökumətinin müxtəlif fəxri fərmanları ilə təltif olunur.

Qeyd etməliyəm ki, hər dəfə Şahin müəllimlə söhbət edərkən Əfqanıstanda olduğu ezamiyyət zamanı bu ölkənin ictimai-siyasi həyatı ilə, o cümlədən ədəbi-bədii həyatı ilə bağlı çox maraqlı və diqqəti cəlb edən hadisələrdən söhbət açır və Azərbaycan tarixinə dair Əfqanıstanda çoxsaylı yazılı mənbələrin olduğunu deyir. Şahin müəllim fars dilinin bütün incəliklərini bilən bir mütəxəssis kimi, bu ölkədə rast gəldiyi, gördüyü, tanış olduğu mənbələrin Azərbaycan üçün nə qədər böyük əhəmiyyət kəsb etdiyini yorulmadan qeyd edir.

Bu da məlumdur ki, Azərbaycan tarixinə dair mənbələr içərisində farsdilli mənbələr çoxluq təşkil edir və onların öyrənilməsi, Azərbaycan dilinə tərcümə edilməsi heç də asan məsələ deyil. Hazırda Avropa ölkələrinin əksəriyyətinin, RF, Gürcüstan, İran, Türkiyə Cümhuriyyəti, Əfqanıstan, Mərkəzi Asiya ölkələri, Çin, Hindistanın arxiv və mənbə fondlarında Azərbaycan tarixinin qədim və orta əsrlər tarixinə dair hələ indiyədək öyrənilməmiş, tarix elminin dövriyyəsindən kənarda qalmış minlərlə əlyazmalar saxlanılır. Onların Azərbaycan Respublikasına gətirilməsi həm elmi-tarixi, həm də siyasi-strateji xarakter daşıyır, çox mühüm siyasi əhəmiyyət kəsb edir. Doğrudur bu sahədə institutun direktoru, akademik Y.M.Mahmudovun rəhbərliyi ilə çox böyük işlər görülüb. Belə ki, Ermənistanın böyük dövlətlərin hərbi, siyasi və ideoloji yardımlarına arxalanaraq Azərbaycan dövlətinə qarşı apardığı ideoloji müharibədə bu mənbələr ən güclü silah kimi istifadə oluna bilər. Lakin bu da bir həqiqətdir ki, Şahin müəllim XXI əsrin əvvəlində milli tarix elminin tarixşünaslıq və mənbəşünaslıq istiqamətində böyük bir elmi nailiyyətinə imza atdı. Tarix elmləri doktoru, professor Şahin Fərzəliyev 1996-cı ildə tərcüməsinə başladığı böyük Azərbaycanlı tarixçi İsgəndər bəy Münşinin «Dünyanı bəzəyən Abbasın tarixi» (3 min səhifəyə yaxın) əsərini mətnlərə şəhrləri yazmaqla Azərbaycan dilinə tərcümə etdi, 2010 və 2014-cu illərdə İnstitutun Elmi Şurasının qərarı ilə çap olundu. Bu doğrudan da milli tarix elmimiz üçün akademik Yaqub Mahmudovun dediyi kimi inqilaba bərabər bir iş idi. Əslində bu bir elmi tədqiqat müəssisəsinin görəcəyi bir iş idi, lakin bu böyüklükdə işi Şahin müəllim təkbaşına yerinə yetirməklə Azərbaycan aliminin həqiqi elmi gücünü nümayiş etdirmiş oldu.

Bu möhtəşəm işin davamı olaraq Şahin Fərzəliyev 2018-ci ildə di-

gər mühüm bir tarixi mənbəni – Həsənbəy Rumlunun «Əhsənüt-təvarix» adlı 2 min səhifədən çox fars dilində yazılmış XVI əsr mənbəsini Azərbaycan dilinə tərcümə edib, çapa təqdim etmişdir. Əslində bu yuxarıda qeyd etdiyim kimi, Azərbaycan milli tarix elmi üçün cahanşümul bir "hadisədir" desəm yanılmaram. Həmin tərcümə işləri işləri elmi əhəmiyyət daşımaqla bərabər, həm də siyasi dəyər kəsb edir, Şahin müəllimin tərcümə etdiyi bu mənbələr Azərbaycanın orta əsrlər tarixini daha müfəssəl tədqiq etmək üçün əvəzsiz məxəzlər sayılır.

Şahin Fərzəliyevin elmi yaradıcılığının mühim istiqamətlərindən biri də Azərbaycanın orta əsrlər tarixinə dair nəşr etdirdiyi çox sanballı monoqrafiyalardır. Onun 1996-cı ildə tarix üzrə elmlər doktoru elmi dərəcəsini almaq üçün müdafiə etdiyi «Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə» dissertasiyanın monoqrafiya variantı Azərbaycan Səfəvilər və Osmanlı imperiyaları münasibətlərinə dair çox zəngin mənbələr əsasında yazılmış qiymətli bir əsərdir ki, Azərbaycan dilində ölkəmizdə, türk dilində isə Türkiyədə çap olunmuşdur. Şahin müəllimin yazdığı «Quba tarixi»,həmçinin şərikli işlədiyi "Şəki tarixi", "Qubadlı tarixi" , "Zəngəzur tarixi" və digər əsərləri milli tarixşünaslığımız üçün çox böyük töhfədir. Hazırda tarix elmləri doktoru, professor Şahin müəllim Fərzəliyev Tarix İnstitutunun çox mühüm şöbəsinə – «Tarixşünaslıq və mənbəşünaslıq» şöbəsinə rəhbərlik edir və onun elmi rəhbərliyi ilə on üç nəfər tədqiqatçı tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsini alaraq profesional kadrlar kimi yetişmişlər ki, bu da onun milli tarix elminin inkişafına verdiyi çox böyük töhfədir. Şahin müəllim Fərzəliyevin milli tarix elmində Azərbaycanın orta əsrlər tarixini tədqiq edən professional bir tarixçi alim kimi tanınır və bu fikrin elmin əsası vardır.

Xatırlatmalıyam ki, onun tərəfindən 1992 və 1993-cü illərdə çap olunmuş osmanlı və fars dillərində olan iki tarixi mənbə də (Jozef Tiflisinin)(Vaqiati-Mir Veys və Sultan Hüseyn", habelə Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarix"i kitabları da ilkin mənbələr kimi olduqca qiymətlidir.)

Bütün bunlarla yanaşı, Şahin müəllimin həyat fəaliyyətinin mühüm bir hissəsini onun bədii yaradıcılığı təşkil edir. O, milli ədəbiyyat elmində həm də bir qəzəlxan şair kimi tanınır, Azərbaycanda ilk təzkirə yazan ədibdir. Onun başa çatdırdığı «Tərkireyi-Şahin» əsəri milli ədəbiyyat aləmində çox yüksək qiymətləndirilir. Onun başladığı 5 «Divani»nda əsasən əruz vəznində yazdığı şeirlər yer tutur. Şahin Fərzəliye-

vin ədəbi yaradıcılığı artıq elmi tədqiqat obyektinə çevrilmişdir. Onun «Divan»ı filologiya üzrə fəlsəfə doktoru Q.M.Məhərrəmlinin tədqiqat mövzusu olmuş və o, 2007-ci ildə "Şahin Fazil Divan və klassik ədəbi ənənələr" kitabını monoqrafiya halında çap etdirmişdir.

Azərbaycanın orta əsrlər tarixinə dair sanballı əsərlərin müəllifi olan Şahin müəllim Fərzəliyev, həm də yuxarıda qeyd olunduğu kimi, bədii yaradıcılıqla məşğul olur və o uzun müddətdir ki, «Məcməüş-süəra» («Şairlər məclisi») adlanan şairlərin toplandıqları 140 yaşlı ədəbi-bədii məclisə sədrlik edir. Bu il martın 27-də Şahin müəllim Fərzəliyevin 80 yaşı tamam olur. Mən onu həmişə cavan sayıram, doğrudur saçları qar kimi ağarsa da o, ruhən cavandır, çünki o qəzəlxan şairdir şairlər isə həmişə ruhən gənc olurlar. Şahin müəllim, çoxsaylı lirik şe'rlər müəllifidir, onun şeirlərinə bəstəkarlar çoxsaylı mahnılar bəstələmişlər. Ölməz şairimiz Səməd Vurğunun təbirincə desək, şair Şahin Fazilin saçları ağarsa da Vətəni və xalqı ona: «şair, nə tez qocaldın sən» - sözünü deməyəcək.

Şahin müəllim, 80 yaşınız mübarək olsun, Sizi bu yubileyiniz münasibəti ilə ürəkdən təbrik edir, bundan sonra da elmi və ədəbi yaradıcılığınızda sonu görünməyən uğurlar arzulayıram.

Məqaləmin sonunda Şahin Fazilin İsgəndər bəy Münşiyə ithaf etdiyi və "Dünyanı bəzəyən Abbasın tarixi" kitabına daxil edilən son dərəcə maraqlı qəsidəsini verməyi məsləhət bildim:

### QƏSİDƏ

*Hədərə verməyərək bir anı İsgəndər bəy*
*Etdi təsvir Azərbaycanı İsgəndər bəy.*

*Çox kitab yazmış olan çoxlu yazar var, amma*
*Bir kitab ilə tapıb ad-sanı İsgəndər bəy.*

*İranın tarixinə nəsr ilə "Şahnamə" yazıb*
*Bir də tə'rif elədi İranı İsgəndər bəy.*

*Əllərində qələmi tutması mə'lum məsələ,*
*Həm də tutmuşdu qılınc-qalxanı İsgəndər bəy.*

*Var idi bir neçə tarixçi Həsən Rumlu kimi,*
*Oldu tarixçilərin aslanı İsgəndər bəy.*

*Qazi Əhməd var idi, vardı Budaq Qəzvini,*
*Yaxşı ki, qoymadı boş meydanı İsgəndər bəy.*

*Topladı tarixi məktublarını şahlərin,*
*Münşi tək yazdı neçə fərmanı İsgəndər bəy.*

*Üləma əhli var idi o dövrdə—mahir,*
*Oldu bir çox üləma sarbanı İsgəndər bəy.*

*Meyli çox olsa da, məhdud idi imkanı fəqət,*
*Meylə uyğun elədi imkanı İsgəndər bəy.*

*Yazdı Hafiz ilə Sə'di və Nizami babadan,*
*Oxudu məsnəvini, divanı İsgəndər bəy.*

*Sevdi çox fənni, bilib cəbri, nücum elmini də,*
*Gözəl öyrəndi gözəl Qur'anı İsgəndər bəy.*

*Söz bağından dəmət hazırladı bağban sayağı,*
*Yığaraq dəstələdi reyhanı İsgəndər bəy.*

*Arabir yazdı coşub sevgi-məhəbbətdən də,*
*Hurini yad elədi, qılmanı İsgəndər bəy.*

*Etməmişdən hələ dünya evini tərk, əhsən,*
*Oldu üqba evinin heyranı İsgəndər bəy.*

*Şah Xətai—Səfəvilər bağının bağbanı!*
*Oldu tarix bağının bağbanı İsgəndər bəy.*

*Özü haqqında xəsisliklə yazıbdır, lakin*
*Gözləyibdir ədəbi-ərkanı İsgəndər bəy.*

*"Çox gəzən çox da bilər" söylədi əcdadlarımız,*
*Neçə yol gəzmədimi Şirvan İsgəndər bəy?!*

*Vəsfini eylədi türk ellərini sevgiylə,*
*Şəruru yazdı, Baki-Şabranı İsgəndər bəy.*

*Qəndəhar torpağını seyr eylədi rəğbətlə,*
*Gördü Gürcüstanı, Luristanı İsgəndər bəy.*

*Gəzdi dərviş sayağı çox yerini Qafqazın,*
*Süzdü tarixçi kimi çox yanı İsgəndər bəy.*

*Təbrizin təsviri verdi, Bəmə söz yazdı,*
*Xatirə saldı Reyi, Tehranı İsgəndər bəy.*

*Yazdı Dərbənd qalasından, elədi Gəncəni vəsf,*
*Muğanı, Naxçıvanı, Arranı İsgəndər bəy.*

*Şəkidən, Qəhqəhədən, Kiş qalasından yazdı,*
*Qələmə aldı neçə üsyanı İsgəndər bəy.*

*Qalalardan danışarkən o Gülüstan yazdı,*
*Sürxabı vəsf elədi, Sindnı İsgəndər bəy.*

*Yazdı cür'ətli qələmlə tatar həngaməsini*
*Tuş edib tənqidə bir çox xanı İsgəndər bəy.*

*Qələmə aldı Moğol dövlətinin tarixini,*
*Sə'y ilə izlədi Hindistanı İsgəndər bəy.*

*Neçə osmanlı-qızılbaş savaşından yazdı,*
*Yazdı onlarla qopan tüğyanı İsgəndər bəy.*

*Çox səfərlərdə ki, Şah Abbasa həmrah oldu,*
*Tə'rif etdi o böyük sultanı İsgəndər bəy.*

*Bilmirəm etdi ürəkdənmi Şah Abbasə dua?*
*Olmağa hazır idi qurbanı İsgəndər bəy.*

*Ordubad əhli olan var idi bir Hatəm bəy,*
*Etdi təqdir o böyük insanı İsgəndər bəy.*

*Sufi tək girdi təsəvvüf edilən ümmanə,*
*Bildi arif oluban irfanı İsgəndər bəy.*

*Təqdim etdi neçə xəlqi oxucu kütləsinə—*
*Ərəbi, həm giləki, əfqanı İsgəndər bəy.*

*Ölməyibdir, kitabı etdi onu var, Şahin,*
*Demirəm qeyrisi tək mən "Hanı İsgəndər bəy?"*

*2021*

**Tofiq NƏCƏFLİ**
*A.A.Bakixanov adına Tarix İnstitutunun şöbə müdiri, tarix elmləri doktoru*

## ELMƏ HƏSR OLUNMUŞ HƏYAT

*“Qələmin müqəddəs vəzifəsi millətin xoşbəxtliyi yolunda xidmət göstərməkdir”.*
***Cəlil Məmmədquluzadə***

Görkəmli tarixçi-şərqşünas alim, tarix elmləri doktoru, professor, nəcib, xeyirxah, ləyaqətli insan, tanınmış qəzəlxan Şahin Fazil oğlu Fərzəl!

Bu sıranı istənilən qədər davam etdirmək olar. Respublikamızda Azərbaycanın orta çağlar tarixi üzrə tanınmış mütəxəssislərdən biri, 38 kitabın və üç yüzdən çox yüksək elmi dəyərə malik məqalənin müəllifi, tanınmış qəzəlxanımız Şahin Fazilin bu günlərdə 80 yaşı tamam olur.

Bu tanınmış şəxsiyyət haqqında söz demək, fikir söyləmək şərəfli olduğu qədər də çətindir. Çünki nə qədər çalışıb ifadələrində yaxşıların yaxşısını, ləyaqətlilərin ən ləyaqətlisini seçərək onun layiq olduğu dərəcəni ifadə etmək üçün söz deməyə çalışsan da bunlar Şahin şəxsiyyəti yanında cuzi görünər. Xalqımızın dövlətçilik tarixinin tədqiqi yolunda göstərdiyi xidmətlər belə bir nəcib keyfiyyətli insanın ömür yolunun başlıca məzmununu təşkil etmişdir.

Onu başqalarından fərqləndirən, gənc tədqiqatçılara örnək olan, bizlərə sevdirən xüsusiyyəti, bənzərsizliyi – istər Sovet dönəmində, istərsə də müstəqillik dövründə Şahin Fərzəliyevin fikirlərinin, baxışlarının dəyişməz qalmasıdır. Sifarişlə tarix yazmaqdan uzaq olan Şahin müəllimin həmişə başlıca amalı – Azərbaycanın orta əsrlər tarixi məsələlərini şərəflə yazmasıdır.

Bütün tədqiqatçı ömrünü AMEA Tarix İnstitutu ilə bağlayan və hazırda bu elmi araşdırma ocağında “Mənbəşünaslıq və tarixşünaslıq” şöbəsinə rəhbərlik edən tarix elmləri doktoru, professor Şahin Fərzəliyev ölkəmizin görkəmli ortaəsrşünaslarından biri, sanballı əsərlər və elmi nəticələrinə görə tarix elmində seçilən-sayılan tarixçimizdir.

1940-cı il martın 27-də Azərbaycanımızın dilbər güşələrindən biri olan Quba şəhərində dünyaya göz açmışdır. O, 1959-cu ildə Şərq tarixinə və mədəniyyətinə, xüsusilə ədəbiyyata olan həvəsini nəzərə alaraq

sənədlərini Azərbaycan Dövlət Üniversitetinin Şərqşünaslıq fakültəsinə verir və Fars filologiyası şöbəsinə daxil olur, təhsilini fərqlənmə diplomu ilə başa vurur. 1963-cü ildə hələ 5-ci kursda oxuyarkən istedadlı gənc mütəxəssis kimi xaricə – Əfqanıstana tərcüməçi vəzifəsinə göndərilən Şahin Fərzəliyev 1988-ci ilədək müəyyən fasilələrlə 13 il ərzində Əfqanıstanın müxtəlif şəhər və vilayətlərində yaşayıb fəaliyyət göstərir. Lakin, tarix elminə olan maraq və həvəs onu tədricən elm sahəsinə istiqamətləndirir və o, həyatının əsas hissəsini məhz bu sahəyə həsr edir.

Ş.Fərzəliyev tarix sahəsində elmi fəaliyyətə başlamaq arzusu ilə 1970-1973-cü illərdə Azərbaycan SSR Elmlər Akademiyası Tarix İnstitutunun aspiranturasında təhsilini davam etdirir. Bu dövrdə Azərbaycan Səfəvi dövlətinin tarixinə aid farsdilli mənbələri tədqiq, tərcümə və elmi dövriyyəyə cəlb etməklə bu sahənin mənbəşünaslıq bazasının zənginləşdirilməsinə böyük ehtiyac duyulurdu. Təsadüfi deyil ki, Şahin Fərzəliyevin namizədlik dissertasiyasının mövzusu da bu istiqamətdə atılan uğurlu addımlardan biri oldu. Belə ki, o, mərhum professor Oqtay Əfəndiyevin elmi rəhbərliyi altında XVI əsr Azərbaycanlı tarixçi *"Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri Azərbaycan tarixinin mənbəyi kimi"* adlı namizədlik dissertasiyasını 1974-cü ildə müvəffəqiyyətlə müdafiə edib, sonrakı elmi fəaliyyətini bu sahədə tədqiqatlar aparmaqla davam etdirdi. 1983-cü ildə onun *"Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri əsasında)"* adlı monoqrafiyası nəşr olundu. Əsərdə dövr qaynağının verdiyi məlumatlar əsasında Azərbaycanın siyasi ictimai, iqtisadi, ideoloji diplomatik və s. tarixinin ən mühüm məsələlərinə aydınlıq gətirilir.

Tarix İnstitutunda bütün fəaliyyəti dövründə Ş.F.Fərzəliyev Azərbaycanın XV-XVI əsr dövlətlərinin orta əsr qüdrətini bu günkü nəsillərə çatdırmaq və öz elmi prinsiplərini sübuta yetirmək üçün Azərbaycan və İran tarixinə dair onlarla yeni əlyazmaları, ilk mənbələri aşkara çıxarmış, onları geniş oxucu və tədqiqatçıların ixtiyarına vermişdir.

Prof. Şahin Fərzəliyevin Azərbaycan mənbəşünaslığı sahəsində xidmətləri olduqca böyükdür. Orta əsrlər tariximizin müxtəlif problemləri ilə bağlı uğurlu və ciddi tədqiqatların müəllifi olan görkəmli alimimiz XX əsrin 80-ci illərinin sonlarından başlayaraq başlıca olaraq Səfəvilər dövlətinin tarixi ilə bağlı farsdilli qaynaqların və Osmanlı mənbələrinin tədqiqi və tərcüməsi ilə məşğul oldu. Osmanlı müəllifi Firudin Əhməd bəyin topladığı *"Münşəate-səlatin" ("Sultanlara aid yazışmalar")* adlı

məktublar məcmuəsindən Çaldıran savaşı ərəfəsində I Sultan Səlim ilə I Şah İsmayılın məktublarını; polyak səyyahı Yan Tadeuş Kruşinskinin şəxsi müşahidələri əsasında Səfəvilər dövlətinin süqutu, paytaxt İsfahan şəhərinin əfqanlar tərəfindən işğal olunması hadisələrindən bəhs edən *"Xristian səyyahın tarixi"* əsərini; Jozef Tiflisinin *"Vaqiati-Mir Veys və Şah Hüseyn"* adlı əsərini doğma dilimizə tərcümə edərək nəşr etdirdi.

XX əsrin 90-cı illərində Şahin müəllim doktorluq mövzusu üzərində gərgin işləməyə başladı. 1994-cü ildə onun *"Azərbaycan və Osmanlı imperiyası"* adlı monoqrafiyası işıq üzü gördü. Monoqrafiyada dövrün epistolyar qaynaqlarından geniş istifadə olunmaqla XV-XVI əsrlərdə Azərbaycan dövlətləri ilə Osmanlı imperiyası arasındakı qarşılıqlı əlaqələrə aydınlıq gətirildi. Tarixşünaslığımızda ilk dəfə olaraq Şahin müəllim Osmanlı müəllifi Firudin bəyin *"Münşəate-səlatin"*əsərindəki diplomatik yazışma sənədlərini, rəsmi məktubları tədqiqata cəlb edilərək Azərbaycan dövlətlərinin (Qaraqoyunlu, Ağqoyunlu, Şirvanşahlar, Səfəvilər) Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələri dərindən araşdırılmış, bəhs olunan Azərbaycan dövlətlərinin regionda baş verən hərbi-siyasi hadisələrdəki mövqeyini aydınlaşdırmışdır.

1996-cı ildə isə Şahin müəllim XV-XVI əsrlər Azərbaycan dövlətlərinin Osmanlı imperiyası ilə münasibətlərinin tədqiqinə həsr olunmuş *"Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə"* adlı doktorluq dissertasiyasını uğurla müdafiə etdi. O, 1999-cu ildə daha da təkmilləşdirilmiş olan *"Azərbaycan və Osmanlı imperiyası"* adlı fundamental monoqrafiyasını elmi ictimaiyyətin diqqətinə çatdırdı. Əsərdə Ş.F.Fərzəliyev dövrün ilkin qaynaqlarını, diplomatik yazışma sənədlərini, epistolyar mənbələri hərtərəfli tədqiqata cəlb edərək XV-XVI əsrlərdə Azərbaycan dövlətlərinin Osmanlı imperiyası ilə qarşılıqlı əlaqələrini hərtərəfli işıqlandıra bildi. Bəhs olunan dövrdə Azərbaycan dövlətlərinin yalnız Cənubi Qafqazın, deyil, Yaxın və Orta Şərqin hərbi-siyasi tarixində mühüm rol oynadığını tutarlı elmi faktlarla elmi ictimaiyyətin nəzərinə çatdırdı.

Yeddi cildlik "Azərbaycan tarixi"nin III cildinin müəlliflərindən biri olan Şahin müəllim Azərbaycanın orta əsrlər tarixinin müxtəlif məsələlərinin araşdırılmasında öz sözünü deməyi bacarmış tarixçilərimizdəndir.

Prof. Şahin Fərzəliyevin tarix elmimizə verdiyi ən böyük töhfə orta əsr görkəmli Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin fars dilində yazdığı *"Dünyanı bəzəyən Abbasın tarixi" ("Tarixe-aləmaraye-Abbasi")* əsəri-

nin ana dilimizə tərcüməsidir. Azərbaycan Səfəvilər dövlətinin yaranmasından I Şah Abbasın hakimiyyəti dövrü də daxil olmaqla tariximizi nəql edən və səfəvişünaslığın ən sanballı mənbələri arasında xüsusi yeri olan bu qiymətli ilkin mənbəyə dünya ölkələrinin bir çox məşhur tarixçiləri Azərbaycan tarixçiləri Cənubi Qafqaz, İran və digər Yaxın və Orta Şərq ölkələrin İsgəndər bəy Münşiyə dönə-dönə istinad etmişlər. «Tarixe-aləmaraye-Abbasi» əsəri Azərbaycan Səfəvi sülaləsinin və dövlətinin, bütövlükdə Səfəvi imperiyasının tarixini araşdırmaq üçün ən qiymətli ilk mənbədir. Əsərdə bəhs olunan hadisələrin böyük əksəriyyəti müəllifin şəxsi müşahidələrinə əsaslanır və real tarixi faktlardır. Səfəvi hökmdarı Böyük Şah Abbas Səfəvi imperiyasının tarixi torpaqlarını geri qaytarmaq üçün müharibələr apardığından səfəvilərin hərbi-siyasi tarixini, xüsusilə Azərbaycan Səfəvi döyüşçülərinin cəngavərlik tarixini və xalqımızın hərbi sərkərdəlik keçmişini öyrənmək üçün bu əsər misilsiz ilkin mənbədir. Xüsusilə ona görə ki, İsgəndər bəy Münşi sadəcə olaraq salnaməçi deyildi. O, qələmə aldığı mövzuya ilahi bir münasibət bəsləyir, Quran ayələrindən faydalanır, hər hansı bir hadisədən bəhs edərkən özündən əvvəlki müəlliflərə də müraciət edir, onlardan iqtibaslar gətirir, yeri gəldikdə müqayisələr aparır, qələmə aldığı hadisələri və faktları təhlil edir. Bütün əsər boyu verdiyi çoxsaylı şeir parçaları, zərbülməsəllər onun həm də istedadlı şair və xalq həyatının mahir bilicisi olduğunu göstərir.

Bu qiymətli əsərin müxtəlif hissələri osmanlı türkcəsinə, ingilis, rus və Azərbaycan dillərinə tərcümə olunduğu halda, əsərin bütöv olaraq ana dilimizə tərcüməsi son dövrədək mövcud deyildi. Bu əsəri hələ 1939-1950-ci illərdə M.Əfəndizadə, F.Babayev, A.Qasımov və Ə.Rəhmani Azərbaycan dilinə çevirməyə təşəbbüs göstərsələr də, müxtəlif səbəblərdən bu mənbənin tərcüməsi başa çatdırılmamışdı. Sonralar həmin iş Tarix İnstitutun elmi tədqiqat planına daxil edilmiş və onun bütövlükdə deyil, yalnız Azərbaycana aid məlumatlarının tərcümə olunması qərara alınmışdı.

Məsələnin vacibliyini nəzərə alaraq, 2004-cü ildə Tarix İnstitutunun direktoru vəzifəsinə təyin olunan prof. Yaqub Mahmudovun təklifi ilə institutun Elmi Şurası İsgəndər bəy Münşinin fars dilində yazdığı həmin kitabın əsərinin bütöv halda tərcümə olunması haqqında qərar qəbul etdi və həmin qərarın icrasına başlanıldı. İnstitutda həyata keçirilən bu qərar nəticəsində AMEA-nın müxbir üzvü, mərhum professor O.Ə.Əfəndiyev və onun yetirməsi N.S.Musalı tərəfindən əsərin tərcümə olunmuş birinci cildi 2009-cu ildə nəşr olundu.

Lakin orijinalda 3 cilddən ibarət olan İsgəndər bəy Münşinin *"Tarixi-aləmarayi-Abbasi"* əsərinin bütöv halda Azərbaycan dilinə tərcüməsi və nəşri məhz prof. Şahin Fərzəliyevin gərgin əməyi sayəsində mümkün oldu. Bu əsər, elmi şərhlərlə birlikdə ümumilikdə 2505 səhifədən ibarət olub iki kitab şəklində 2010-cu və 2014-cü illərdə nəşr olundu.

Azərbaycanın görkəmli orta əsr tarixçisi olan İsgəndər bəy Münşinin fars dilində yazdığı *«Tarixe-aləmaraye-Abbasi» («Dünyanı bəzəyən Abbasın tarixi»)* əsərinin bütövlükdə doğma dilimizdə işıq üzü görməsi Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunda icra olunan *«Azərbaycan tarixinə dair ilk mənbələrin nəşri»* layihəsinin həyata keçirilməsi sayəsində əldə olunan ən mühüm uğurlardan biridir. Azərbaycanın orta əsrlər tarixini, xüsusilə Azərbaycan Səfəvi imperiyasının tarixini araşdırmaq üçün son dərəcə qiymətli ilk mənbə olan «Tarixi-aləmarayi-Abbasi»nin doğma dilimizə bütöv halda tərcüməsi Azərbaycan tarix elminə çox mühüm töhfədir. Bu qiymətli ilk mənbə bizim üçün həm də ona görə dəyərlidir ki, orada yazılanlar xalqımızın tarixi barədə bizim öz tarixçimizin – Azərbaycan tarixçisinin yazdıqlarıdır.

Burada bir məsələni xüsusi olaraq vurğulamağa böyük ehtiyac vardır. Orta əsr mənbələrinin tərcümə olunaraq nəşrə hazırlanmasının olduqca mürəkkəb və çətin iş olduğunu mütəxəssislər yaxşı bilir. Bu işin öhdəsindən layiqincə gəlmək üçün əcnəbi dili bilmək heç də kifayət deyil, bununla yanaşı şair olmaq, orta əsr salnaməçilik ənənələrinin, dil və üslub xüsusiyyətlərinin gözəl bilicisi, mənbədə əks olunan dövrün yetkin mütəxəssisi, terminologiya və istilahlarda səriştəli olmaq vacib şərtlərdəndir. Mənbə üzərində son dərəcə məsuliyyət və vicdanla çalışaraq, tərcümə əsnasında həddən artıq yüklənmə və gərginliyin də səbəb olduğu göz əməliyyatından sonra belə işindən soyumayıb eyni əzmkarlıqla işləyib, sözün əsl mənasında gözlərinin işığı bahasına mənbəni tamamlayıb çapa təhvil vermək, əslində Şahin müəllimin göstərdiyi fədakarlıq nümunəsi idi.

Prof. Şahin Fərzəliyev Azərbaycan salnaməçilik məktəbinin incilərindən olan *"Dünyanı bəzəyən Abbasın tarixi"* əsərini ömrünün 14 ili ərzində gərgin zəhmət və yüksək tərcüməçilik məharəti hesabına ana dilimizdə ərsəyə gətirdi, mükəmməl elmi şərhlərlə təchiz etdi. Bu böyük uğuru nəzərə alaraq, müəllifi deyil, mütərcimi olduğu halda belə bu əsəri Şahin Fərzəliyevin elmi fəaliyyətinin "şah əsəri" adlandıra bilərik.

Sevindirici haldır ki, yorulmaz alim bu nailiyyət ilə kifayətlənmə-

yib hazırda digər görkəmli orta əsr Azərbaycan tarixçisi Həsən bəy Rumlunun *"Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı")* əsərini doğma dilimizə tərcüməsini də uğurla baş çatdırmışdır. Əsərin birinci cildinin şərhləri yazılmış və hazırda nəşrə hazırlıq işləri başa çatmaq üzrədir. *"Əhsənüt-təvarix"* əsərinin ikinci cildinin tərcüməsi də tam bitmişdir və onun şərhlərinin yazılması inanırıq ki, Ş.Fərzəliyev tərəfindən yaxın zamanlarda uğurla tamamlanacaq və əsər çap olunaraq tarixçilərimizin ixtiyarına veriləcəkdir. Bu, Şahin müəllimin 80 illik yubileyinə ən yaxşı ərmağan olacaqdır.

Prof. Şahin Fərzəliyevin doğma torpağa, elinə-obasına ülvi məhəbbətlə bağlı olması alimi öz doğma diyarının tarixini yazmağa sövq etmişdi. Qubanın tarixi keçmişi həmişə alimin maraq dairəsində olduğu üçün, özünün qeyd etdiyi kimi, Azərbaycan dövlətlərinin Osmanlı imperiyası ilə münasibətlər tarixini tədqiq etdiyi illər ərzində müxtəlifdilli ilkin mənbələrdə Quba haqqında mövcud olan məlumatların qeydiyatını aparmışdı. O, illər ərzində topladığı bu məlumatlarla yanaşı, orta əsr qaynaqlarını, epistolyar sənəd və diplomatik yazışmaları, tarixi əsərləri öz mütaliə süzgəcindən keçirərək, Qubanın IV əsrdə qədim yaşayış məskəni kimi yarandığı çağdan başlayaraq müasir dövrədək olan tarixini əhatə edən samballı bir əsər yazmağı bacarmışdı. Onun "*Quba tarixi*" adlı elmi monoqrafiyası ilk dəfə 2001-ci ildə işıq üzü görmüş, 2017-ci ildə isə təkmilləşdirilmiş ikinci nəşri çapdan çıxmışdır.

Əsərdə "Quba" toponiminin etimologiyasına aydınlıq gətirməyə çalışan tədqiqatçı Quba tarixinin ən şərəfli səhifələri barədə oxucuya ətraflı məlumat verir. Monoqrafiyada qubalı Şeyxəli xanın doğma yurdu uğrunda çar Rusiyasına qarşı apardığı mübarizə, döyüşlərdə çar zabit və əsgərlərinə boyun əyməyərək işğalçı orduya mütəmadi həmlələr yetirməsi, Quba bölgəsindən topladığı qüvvələrlə rusları qovub Qubadan çıxarmağa müvəffəq olması və dörd ay müddətində Quba vilayətini idarə etməsi kimi tarixi faktlarla bu şücaətli Vətən oğlunun barışmaz mübarizliyi oxucuya çatdırılır.

Prof. Şahin Fərzəliyevin həyatında və yaradıcılığında *"dağlar və əfsanələr diyarı"* adlandırdığı Əfqanıstan mövzusu dərin iz buraxmışdır. O, Əfqanıstanda fəaliyyət göstərdiyi 13 il ərzində Azərbaycan şairlərinin əsərlərini farscaya çevirərək Kabulda, əfqan şair və yazıçılarının əsərlərini isə Azərbaycan dilinə çevirərək Bakıda nəşr etdirmişdir.

Şahin Fərzə istedadlı bir şair kimi zəngin ədəbi yaradıcılığı, müa-

sir Azərbaycan poeziyasında seçilən mövqeyi, ədəbi dilimizə olan təəssübkeşliyi ilə ədəbiyyat tariximizdə də özünəməxsus bir iz qoymuşdur.

Onun məqsədi poetik yaradıcılığında forma etibarilə klassik ədəbi ənənələrə sadiq qalaraq onlara yeni ruh, yeni nəfəs verməklə yaşatmaq, yeni nəsillərə sevdirməkdir. Məhz bu düşüncə şairi XX əsrin sonlarında Azərbaycan ədəbiyyatında ilk mətbu *"Divan"ını* yaratmağa sövq etmişdir. Şair, məqsədini olduqca poetik bir ifadə ilə açıqlayır: yəni "müsəcce" ("qafiyəli") üslubu ilə belə "həmişə dönə-dönə və yana-yana düşünmüşəm ki, "Divan" uzun illər boyu ədəbiyyatımızın və ədəbi həyatımızın doğma övladı olduğu halda, nə üçün indi yaranmasın və şeir pərimizin pərişan zülfü "Divan" darağı ilə daranmasın? Nə üçün müasir oxucu sabiq ənənəmizi bir daha yad etməsin və müasir "Divan" mütaliəsi zövqünə yetməsin? Odur ki, özümün və gözümün zəifliyinə baxmayaraq, sözümün səyahətini "Divan" məmləkətinə tərəf yönəltdim, həmin məmləkət gülşəninə bir səbət gül səpdim və böyük bir şərəfə yetdim.

İndiyədək şairin dörd divanı işıq üzü görmüş və beşinci divanı çap üçün nəşriyyata təqdim olunmuşdur.

Şahin Fərzil klassik ənənələrə bağlı olmaqla yanaşı poetik yaradıcılığında novatorluqdan çəkinməyən, yeni ideyaları Azərbaycan ədəbiyyatına cəsarətlə tətbiq edən şairdir. Bir şair olaraq o, əmindir ki, klassik ədəbi irsimizin çağdaş ədəbiyyatımızda inkişaf yolu onu qəliz ərəb və fars tərkibli ifadələrdən, sadə oxucunun anlamadığı mürəkkəb ibarələrdən təmizləməkdən keçdiyinə görə, xalqın anlayacağı təmiz, saf, oxunaqlı dildə yazmağı tövsiyə edir. Şairin bu mövqeyi rəhbərlik etdiyi 140 yaşlı "Məcməüş-şüəra" ("şairlər məclisi") ədəbi məclisində mühafizəkar şairlər tərəfindən tənqid atəşinə tutullaraq qızğın mübahisələrə səbəb olsa da, o öz əqidəsindən dönmədi, saf dilli "Divanlar xəmsə"si yaratdı.

Qeyd etmək lazımdır ki, Şahin Fazil Azərbaycan ədəbiyyatında XIX əsrdən etibarən unudulmuş olan təzkirəçilik ənənəsini bərpa edən və *"Təzkireyi-Şahin" ("Şahinin təzkirəsi")* adı ilə təzkirə kitabı yazan və çap etdirən şairimizdir.

Şahin Fazilin yaradıcılığının digər maraqlı bir qolunu səfərnamələr təşkil edir. Tale, dünyanın bir çox olkəsinin qapılarını onun üzünə açmış, yaxın-uzaq diyarlara – Əfqanıstan, İran, Türkiyə, İraq, Rusiya, Dağıstan, Gürcüstan, Tacikistan, Özbəkistan, Türkmənistan, Qırğızıstan, Kipr, Polşa hətta uzaq Yaponiyaya səfərlər etmişdir. Səfərlərin ən uzun müddətlisi Əfqanıstana, ən çox saylısı isə İran İslam Respublikası-

nadır. Onun Türkiyə, İraq, Gürcüstan, Dağıstan, Yaponiya və İran səfərnamələri artıq çap olunaraq oxucuların ixtiyarına verilmişdir. Bu səfərnamələrin hər biri mənəvi dünyamıza, mədəniyyətimizə, dahi Füzulinin, Xaqaninin, Nəsiminin, Şəhriyarın dünyasına bir səfər, parçalanmış yurdumuzun iki qolu arasında mənəvi bir körpüdür.

Prof. Şahin Fazilin şeirləri Əfqanistan, İran, Türkiyə, İraq və Yaponiyada çap olunmuş, onun birinci Divan kitabı tədqiq edilərək Qiymət Məhərrəmli tərəfindən dissertasiya işi yazılmış və müdafiə olunmuşdur.

Tarix İnstitutunda işləməklə yanaşı, prof. Şahin Fərzəliyev uzun illər ölkəmizin müxtəlif dövlət Universitetlərində (Bakı, Lənkəran, Sumqayıt) tarixdən mühazirələr oxumuş, dövlət imtahan komissiyalarının sədri seçilmiş, bir neçə Elmi Şuranın üzvü olmuş, on üç dissertasiya işinə rəhbərlik etmiş, 50-yə yaxın tarix üzrə fəlsəfə doktoru və tarix elmlər doktoru dissertasiyalarına opponetlik etmişdir. O, Tarix İnstitutu nəzdində fəaliyyət göstərən ixtisaslaşdırılmış müdafiə şurasının üzvüdür.

Prof. Şahin Fərzəliyev Vətənə sıx bağlı olan tarixçi alimlərimizdən biridir. O, vətənə olan sədaqətini 50 ildən artıq elmi fəaliyyəti dövründə vicdanla zəhmət çəkməkdə, millət üçün faydalı elmi əsərlər yazmaqda, bu amala yorulmadan xidmət etməkdə görür. Görkəmli şərqşünas-tarixçi alimimiz ömrünün hər saatının, hər dəqiqəsinin qiymətini məhz bu meyarla ölçür.

“Tarixin öyrənilməsilə öləri olan hər bir şey ölməzlik, yox bilinən hər bir şey varlıq qazanır” – orta əsrlərin müdriklərindən birinə məxsus bu sözlər indi görkəmli tarixçi-şərqşünas alim Şahin Fərzəlievin tədqiqatları ilə həmahəng səslənir və onların əhəmiyyətini bariz şəkildə biruzə verir.

Yazmaq istədikləri, yazdıqlarından daha çox olan, daima yeni axtarışlar aparmaq, tarixin ənginliklərinə baş vurmaq və yazıb-yaratmaq əzmində olan, xalqımızın orta əsrlər tarixini zənginləşdirmək yolunda yeni-yeni elmi araşdırmalar, tədqiqatlar arayan Şahin Fərzəliyevə (Şahin Fazilə), elm və poeziya yolunda “şeir pəri”sinin pərişan zülfünü Divan darağı ilə darayan alim və şairə bu yolda uğurlar diləyir və həmişə belə nurlu və cavan qalmağı arzulayırıq! Şahin müəllim mənalı və şərəfli ömrünün kamil və müdrik çağlarını yaşayır. Qoy bu çağlar qərinələrə dönsün, həmişə işıqlı və sevincli olsun!

Məqaləmin sonunu şairanə pafosla “Yaşasın zəncir” deyib hayqıran Şahin Fazilin maraqlı bir qəzəli ilə bitirirəm:

*Söz sehrini dərk etdim, şairdən işıqlandım,*
*Nəsrin kökünə getdim, nasirdən işıqlandım.*

*Tədric ilə öyrəndim alimdən işıq dərsi,*
*Zənn eyləməsinlər ki, mən birdən işıqlandım.*

*Virandı mənim könlüm bir me'marın eşqiylə,*
*Tə'mir elədim qəlbi tə'mirdən işıqlandım.*

*Qur'anə yabançıydı Şura deyilən ölkə,*
*Təfsir oxudum çoxlu, təfsirdən işıqlandım.*

*Tə'sir çox olub—mənfi, rədd oldu həmin tə'sir,*
*Tə'sir çox olub—müsbət, tə'sirdən işıqlandım,*

*Əxz etdi işıq çox kəs, çatdım işığa mən həm,*
*Mirzə Əli Əkbərdən—Sabirdən işıqlandım.*

*Zəncirlidir aşiqlər, eşq zənciri möhkəmdir,*
*Şahin, yaşasın zəncir, zəncirdən işıqlandım.*

**P.S.** Qələmimin gərdişini saxlamaq istədim, lakin yadıma dörd yüz il bundan əvvəl yaşamış tarixçi Həsən bəy Rumlunun "Tarixlərin ən yaxşısı" kitabı və şair-tarixçi Şahin Fazilin həmin kitabın müəllifinə ithaf etdiyi şe'ri düşdü. O şe'ri hörmətli oxucuların diqqətinə yetiriəm:

QƏSİDƏ

*Elə ki, elmə əyan oldu Həsən bəy Rumlu,*
*Heçə tarixçiyə şan oldu Həsən bəy Rumlu.*

**

*Yazdı "Tarixlərin ən yaxşısı"nı* illərlə,*
*Cox məharətli yazan oldu Həsən bəy Rumlu*

**

*Neçə tarix kitabından ki, xəbərdar oldu,*
*Həm yazan, həm oxuyan oldu Həsən bəy Rumlu.*

* Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" kitabının adının tərcüməsi.

**

*Dövrü olduqca mürəkkəb və cətin dövr idi,*
*Amma huşyar cavan oldu Həsən bəy Rumlu.*

**

*Bir əmir var idi ki, "Tozqoparan"dı ləqəbi**,*
*Elmdə "Tozqoparan" oldu Həsən bəy Rumlu.*

**

*Oxuduqca onu biz bəlli olundu bizə ki,*
*Bir Həsən bəy nə zaman oldu Həsən bəy Rumlu.*

**

*Verdi təsvirini türk övladının dövrə görə,*
*Türk kimi hərbə rəvan oldu Həsən bəy Rumlu.*

**

*Neçə il əsgəri oldu səfəvi ləşkərinin****
*Qorçilik etdi, hayan oldu Həsən bəy Rumlu.*

**

*Əlinə aldı cilah atdı müxaliflərinə,*
*Neçə yol gülləbaran oldu Həsən bəy Rumlu.*

**

*"Qana-qan" əyyamı idi, döyüşüb comərdtək*
*Təpədən-dırnağa qan oldu Həsən bəy Rumlu.*

**

*Dövrünün fərdi kimi, cox şahı tərifləyərək,*
*Üsyana qarşı yaman oldu Həsən bəy Rumlu.*

**

*Neyləsin? Bir-birinə əks qızılbaşlərin*
*Hər birindən nigəran oldu Həsən bəy Rumlu.*

**

*Məskəniydi İrəvan torpağı türkün o zaman,*
*İrəvan səmtə rəvan oldu Həsən bəy Rumlu.*

**

*Yad edib cox şəhəri öylə - şəhərləşdi özü,*
*Təbriz oldu, Həmədan oldu Həsən bəy Rumlu.*

**

** Məşhur qızılbaş əmiri Piri bəy Qacar.
*** Şah alayının döyüşçüsü.

*Elə təsvir elədi Azəribaycanımızı,*
*Azəri, bəy ilə can oldu Həsən bəy Rumlu.*

**

*Sanıram cox bəyə bəylikdə o üstün gəldi,*
*Bəlkə də, cox xana xan oldu Həsən bəy Rumlu.*

**

*Barəsində neçə salnaməçinin çox sözü var,*
*Neçə xoş sözlə bəyan oldu Həsən bəy Rumlu.*

**

*Düzü-düz, əyrini-əyri yaza bilmiş qələmim,*
*Heç deyən varmı yalan oldu Həsən bəy Rumlu.*

**

*Sözü birdi, əməli bir, təməli möhkəmdi*
*Və həman idi, həman oldu Həsən bəy Rumlu.*

**

*Neçə tarixçi oğurluq eləyibdir ondan,*
*Qoymasınlar ki, talan oldu Həsən bəy Rumlu.*

**

*Torpaq üstündə gəzib sair adamlar sayağı,*
*Torpaq altında nihan oldu Həsən bəy Rumlu.*

**

*Nə zaman ölməsi haqda nə sənəd məlumdur,*
*Nə kitablarda əyan oldu Həsən bəy Rumlu.*

**

*Bəlkə cəng vaxtı onun üstünə ox tuşladılar?*
*Gülləyə bəlkə nişan oldu Həsən bəy Rumlu?*

**

*Cavan ikən ona munis idi Şah Təhmasib,*
*Deyə bilməm qocaman oldu Həsən bəy Rumlu.*

**

*Onu cəlb etdi məharətdə Pərixan Səfəvi*[*]
*Və Pərixanı duyan oldu Həsən bəy Rumlu.*

**

*Neçə il ötdü və Münşi kimi bir möhtərəmə,*
*Bu cahan boyda cahan oldu Həsən bəy Rumlu.*

[*] I Təhmasibin olduqca zəkalı və gözəl şair olan qızı Pərixan xanım

**

*Çaxdı şimşək sayağı tarixi qaynaqlarda,*
*İldırımtək cərəyan oldu Həsən bəy Rumlu.*

**

*Oxuyub tarixini mən əmin oldum, Şahin:*
*Bizə şöhrət ilə şan oldu Həsən bəy Rumlu!!*

**İradə ƏLİYEVA**
*Tarix üzrə fəlsəfə doktoru, dosent*

## ŞAHİN FAZİL VƏ... "POLŞA QIZI VARŞAVA"

Tarix elmləri doktoru professor Şahin Fərzəliyev! Mən Şahin müəllimi ilk dəfə qardaşım Şirinbəy Əliyevin müdafiəsi günü gördüm. Müdafiə Şurasının sədri akademik Yaqub Mahmudov Şirinbəyin elmi rəhbəri olduğu üçün iclası onun müavini Şahin müəllim aparırdı. Elə ilk baxışdan çox mülayim, nurani görünən Şahin müəllim qardaşım haqqında oluqca səmimi giriş sözü söylədi və onu əyləşənlərə təqdim etdi. Atam, anam o qədər qürurlanmışdılar ki!!!... Onların sevinc hissi mənə də keçdi. Heç tanımadığım Şahin müəllimi sonralar tam tanıyıb ona dərin ehtiram etməyə başladım. Tale elə gətirdi ki, 2005-ci ildə mən Akademiyanın Tarix İnstitutunda işə düzəldim. Şahin müəllimi orada görəndə elə sevinmişdim ki!.. Elə bil doğma adamımı görmüşdüm. Yaxınlaşıb "mən Şirinbəyin bacısıyam" dedim. Gülümsəyərək "xoş görüşdük" dedi. Yenə də Şirinbəy haqqında müsbət münasibətini bildirdi. Evə gəldim və evdəkilərə dedim ki, bilirsiniz, mən Şahin müəllimlə bir yerdə işləyəcəyəm.

İllər keçir, Tarix İnstititutunun direktoru Akademik Yaqub Mahmudovun təşəbbüsü və başçılığı ilə institutut əməkdaşları bölgələrə səfərlərə gedir, rayon camaatı ilə görüşlər keçirir, institutuda çap olunan əsərlər rayon kitabxanalarına hədiyyə verilirdi.

Bu səfərlərdən biri 2007-ci ildə Şəki, Zaqatala-Balakən rayonlarına oldu. Şahin müəllimin (Şahin Fazilin) bu səfərinin ilk şeirləri yazılmağa başlanıldı:

### ÇƏKİR

*Mənə fırça verin qüssə-qəm çəkim,*
*Rəssam gülü çəkir, yarpağı çəkir.*
*Dərd mənə şirindir, dəmadəm çəkim,*
*Gözlərim kədərdən göz dağı çəkir.*

*Xəciləm başdakı düm ağ qarımdan,*
*Ayrılıq varımdan, fəraq varımdan,*
*Neyləyim, hər zaman torpaqlarımdan*
*Beş namərd yapışır, yüz yağı çəkir.*

*Haçan güldürəcək bu aləm məni?*
*Həm sizi güldürsün dünya, həm məni.*
*Mən türk övladıyam, dəmadəm məni*
*Oğuzu, əfşarı, qıpçağı çəkir.*

*Gəlir qulağıma qeybdən səda:*
*"Göydən başıma nur saçılırsa da,*
*Əlin Haqq göyünə açılırsa da,*
*Torpaq ayağımı aşağı çəkir".*

*O qardan sovuşub, o buzdan keçib*
*Şəkiyə yetişdim Oğuzdan keçib.*
*Qorqud Dədəm çalan qopuzdan keçib*
*Ruhumu Babəkin yarağı çəkir.*

*Şahinəm, qəddimi əyə bilmərəm,*
*Kimsənin könlünə dəyə bilmərəm.*
*Kimi nə çəkirsə, deyə bilmərəm,*
*Məni bu yerlərin torpağı çəkir.*

*23.12.2007*

## ZAQATALA TORPAĞI

*Eşq ilə, sədaqətlə*
*Yanına yönəlmişik.*
*Şövq ilə, məhəbbətlə*
*Görüşünə gəlmişik.*
*Bu yerin, bu obanın*
*İlahi, qəlbimizdə*
*Ömr uzunu yaşaya,*
*Daim qala torpağı -*
*Zaqatala torpağı.*

*Bu yurd azərilərin,*
*Bu torpaq avarların,*
*Bu məskən saxurların,*
*Bu yer ingiloyların,*
*Neçə-neçə soyların,*

*Neçə-neçə boyların*
*Mədinəsi, Məkkəsi.*
*İlahi, torpaqlı et*
*Bu torpaqda hər kəsi.*
*Qoy çəksinlər ağuşa!*
*Yüz yaşa, yüz min yaşa*
*Dola-dola torpağı -*
*Zaqatala torpağı.*

*Müxənnəslər, yağılar*
*Çoxluq diləyi ilə*
*Az ikən çoxaldılar,*
*Müvəqqəti olsa da,*
*Qonşu köməyi ilə*
*Qarabağı aldılar.*
*Qətiyyən inanmıram*
*Haçansa, nə zamansa*
*Yağı ala torpağı -*
*Zaqatala torpağı.*

*Dürr kimi, mirvari tək*
*Bu yeri qorusunlar,*
*Torpağı su ilə yox*
*Ətir ilə yusunlar,*
*Gülab ilə yusunlar.*
*Hər kəsin ürəyinə*
*İstəkli canan kimi*
*Yarəb, cala torpağı -*
*Zaqatala torpağı.*

*Hamının vüqarıdır*
*Bura pak məskən kimi.*
*Hər sakinin yarıdır,*
*Bura dağ diyarıdır,*
*Bura bağ diyarıdır,*
*Bura tala torpağı -*
*Zaqatala torpağı.*

*Bu yurd Tomris qeyrətli,*
*İradəli, şövkətli*
*Ərəbzəngi yurdudur.*
*Bu yurd düşmənlər ilə*
*Döyüş, savaş, mə'rəkə,*
*Bu yurd "Cəngi" yurdudur,*
*Bu yer qala torpağı -*
*Zaqatala torpağı.*
*Zaqatala torpağı.*

24.12.2007

Müəllimin Balakənə yazdığı bir neçə xoyratı indiyəcən yadımdan çıxmır. Bu yerin gözəlliyi sanki əfsunlamışdı şairi:

*Balakənə,*
*Üz tutdum Balakənə,*
*Balanı böyük gördüm,*
*Dedlər "bala" mənə.*

* * *

*Balakəndi,*
*Bu şəhər Balakəndi,*
*Tarixin yaddaşında*
*Bürc kəndi, qala kəndi*

* * *

*Balakən var,*
*Qax mövcud, Balakən var,*
*Mən qəzələ bal əkdim,*
*Yaxşı ki, bal əkən var.*

Hamı heyranlıqla Şahin müəllimin elə həmin gün bu şeirlərini dinlədi. Növbəti günü toplantı Balakən rayonunda keçrildi. Şahin müəllim gecə Balakənə də şeir həsr etdiyini dedi və həmin şeirini konfransın sonunda iştirakçılara təqdim etdi. "Qaynayan bulaq" ifadəsi fikrimdən keçdi. Adamda nə qədər söz ehtiyatı olar? Sonralar Şahin müəllimlə birlikdə İnstitutun təşkil etdiyi Şəkidə, Lənkəranda, Qubada, Şəmkirdə, Gədəbəydə, Gəncədə Elmi konfranslarda olduq. Hara getdiksə mütləq Şahin müəllimin o yerlə bağlı şeiri olardı. Artıq buna alışmışdıq. Bir növ adət etmişdik buna. Müşahidə edirdim ki, hər yerdə əlində varaq var və

qələmlə nəsə yazır, hətta avtobusda, təyyarədə də yazır bu şair -alim. Deyir ki, vaxtımı öldürə bilmirəm, hökmən nəsə yazmalıyam. Onun bir qəzəlinin bir beyti hamımızın dilinin əzbəridir:

*Şahinəm, vaxtımı mən boş yerə öldürməyirəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur.*

Şahin Fazilin 20-dən çox şeir kitabı çap olunub ki, onların dördü dörd Divandan ibarətdir, hələ beşinci Divanı da bu günlərdə bitirib çapa vermişdir. Kitablarını əsirgəmədən hamıya paylayır. Mənə də çoxdan bir şeir kitabını vermişdi. Adı "Yenə görüşərik" idi. Onunla dəfələrlə görüşdük: iş yerində, konfranslarda, xarici-daxili ölkə simpozyumlarında, amma bu kitabı məndə qaldı, kitabını qaytarmadım. Kitabındakı bütün şeirləri xoşladım və kitabını qaytarmadım. Məsəl var, deyirlər: "Kitab verənin bir əlini kəsərlər, kitab qaytaranın hər iki əlini". Kitabını qaytarmadım. Lap kəssin iki əlimi də. Qaytarmayacağam, vəssalam! Həmin kitabdan bir şeir.

SUALLAR

*Kəndirsiz asılıb yer göydən necə?*
*Ləkə ay üzünə nədən düşübdür?*
*Nə təhər çevrilir gündüzə gecə?*
*Sirri bu sirlərin sirsizləşibdir.*

*Həmişə qırıbmı bəşəri bəşər?*
*Cahanda arxayın bir an olubmu?*
*Meymundan dönübdür insan deyirlər,*
*Bəs meymuna dönən insan olubmu?*

*Görəsən xəbislik yaranıb necə?*
*Paxıllıq nə zaman qəlbə düşübdür?*
*Ilk hərb yeri salıb nə vaxt təşvişə?*
*Torpağa haçan ilk qəlpə düşübdür?*

*Görəsən, ilk əğyar haçan doğulub?*
*Saf eşqi bürüyüb nə vaxt duman, çən?*
*Qədim dövrlərdə şair çox olub,*
*Bəs, tənqidçi necə, olubmu görən?*

*Suallar fikrimi yüz yerə çəkir,*
*Suallar həyatın özü haqqdadır.*
*Təbiətdə insan, insanda fikir,*
*Fikirdə suallar yaranmaqdadır.*

Həmin kitabı təkrar-təkrar oxudum. Sən demə bu şair qeyri-adi adammış. Belə ki, onda iki ürək varmış. Məhəmməd Füzuli "Aldanma ki, şair sözü, əlbəttə, yalandır" deyirsə də, mən Şahin Fazilə inandım. Özü belə etiraf edir:

*Mənim bədənimdə iki ürək var,*
*Sevinc birindədir, kədər birində.*
*Biri güldürərsə, biri ağladar,*
*Gülüş birindədir, qəhər birində.*

*Biri həyatıma düşməndir açıq,*
*O biri ömrümə verər yaraşıq.*
*Birində zülmət var, birində işıq.*
*Gecə birindədir, səhər birində.*

*Biri yuvasıdır ahın, gileyin,*
*Biri məskənidir əhdin, diləyin.*
*Şahin, bir həyatım iki ürəyin*
*Yaşayar birində ölər birində.*

Qəribə "nadinc" adamdır bu iki ürəkli (bəlkə də daha çox!) adam. Dinclik nə olduğunu bilmir. Hey yazır. Gördüklərini yazır. Təəssüratlarını yazır. Məruzələrini yazır. Səfərnamələrini yazır. Əfqanıstanı, İranı, Türkiyəni, Yaponiyanı yazır. Yazır və gəzir. Gəzir və yazır. Çoxlu səfərnamələr yazır. "Mənim hər səfərim səfərnamədir" deyən bu "səyyah"ın onlarca səfərnamə kitabları var. Məsələn "Polşa səfərnaməsi". 2017-ci ilin sonlarına yaxın, daha dəqiq desəm, noyabrın 26-dan dekabrın 1-dək Azərbaycanın Polşadakı səfiri cənab Həsən Həsənovun dəvəti ilə həmin ölkədə səfərdə olduq. Geri döndükdən sonra "Olaylar" qəzetinin beş sayında onun "Polşa səfərnaməsi" dərc olundu. Səfərnamədən sətirlər: "26 noyabr 2017... Saat 7:40. İstanbula uçmalıyıq. Təyyarədəyik. Yerimizdə oturmuşuq. Qarşımızdakı monitorlarda gedəcəyimiz yer, hava, yol xəri-

təsi və s. barədə altı dildə (türk, ingilis, ispan, fransız, rus və alman) məlumat gözə dəyir. Nərmin, mən və İradə yanaşı əyləşmişik. İradə dedi: "Şahin müəllim, sizin yeriniz Nərimlə mənim aramdadır narahat olmazsınız ki?" dedim: "İki gözəl arasında oturmaqdan kim narahat olar ki? beləcə söhbət edə-edə bir də gördük ki, Varşava hava limanındayıq".

Xatırlayıram. Elə həmin gün Şahin müəllim bu ölkədəki birinci şeirini yazdı:

VƏTƏN

*Sərvətim Şahdağdır, dövlətim Xəzər,*
*Düşmən gözündə ox, dost gözündə zər,*
*Gözmuncuğu asaq, ona göz dəyər-*
*Vətən!*

*Qaraca çobanın çomağı budu!..*
*Göyçə təmənnası, Şuşa umudu!..*
*Bir qanad qırığı, bir sərçə budu-*
*Vətən!*

*Babək cəngavərdi edəndə çəngi!..*
*Koroğlu qılıncı, Nəbi tüfəngi!..*
*Gözümdə kiçik yox, dünya nəhəngi!..*
*Vətən!*

*Bir nar dənəsidi, alma tumudu!..*
*Bir çimdik barıtdı, bir ovuc sudu!..*
*Lap bircə nəfərdən təşkil ordudu!..*
*Vətən!*

*Hey yada salıram ötən hicranı,*
*Neçə yadda qalan, itən hicranı...*
*Qürbətdə közərən Vətən hicranı*
*Vətən!*

*Qəlbimin ən həssas yükü-sevgisi!*
*Candan yox olmasın təki sevgisi!*
*Canda, harda olsam, Bakı sevgisi—*
*Vətən!*

*Şairdən söz uman Vətənin sözü!..*
*Bir dodaq sükutu, bir bulaq gözü!..*
*Vətəni yaradan Allahın özü*
*Vətən!*

*Vətən qismətimdir adıma düşən,*
*Şanım, şöhrətimdir adıma düşən,*
*Uzaq Polşada da yadıma düşən*
*Vətən!*
*Vətən!*
*Vətən!*

Polşada müxtəlif görüşlərimiz davam etməkdə idi. Torun şəhəri. Bütün gün davam edən maraqlı bir görüş... Yol uzunu Şahin müəllim "Polşa" adlı uzun bir şeir yazdı...

POLŞA

*Polşa, bugününü bəyəndim sənin,*
*Zəngin tarixini öyrəndim sənin.*
*Bu günə qədər*
*Nə qədər müsibət, nə qədər kədər*
*Görüb vətənin,*
*Görüb vətənim...*
*Qoy ulu Yaradan qorusun bizi,*
*Qoruyaq müstəqil vətənimizi!*

*Məkan yerindəydi, zaman ötürdü,*
*Əsrlər yüyürür, yaman ötürdü...*
*Canlanır gözümdə müxtəlif çağlar,*
*Bizim qoçaqlarla sizin qoçaqlar...*
*Ey Polşa diyarı, ey Polşa yurdu,*
*Illər ötməyirdi, sanki uçurdu,*
*Yersizlər gələrək yerliləşirdi,*
*Gəlmə adamlara qürbət də birdi,*
*Vətən də birdi...*
*Axan zamanıydı nahaq qanların,*

*Slavyanların, müsəlmanların...*
*Dostluq diləyərək biri-birinə*
*Saziş yaratdılar gözlənilmədən*
*Dördüncü Kazimir və Uzun Həsən-*
*Biri slavyan,*
*Biri müsəlman.*

*Müxtəlif hücumlar oldu sənə də,*
*Oldu mənə də.*
*Qılınclar doğradı, kəsdi yenə də...*
*Amma, xoş çağlar da gözə dəyirdi,*
*Üzə xoş günlər də gülümsəyirdi...*
*Ölkəm tək həmişə müstəqil sayıl!..*
*Ey Polşa, canlanır indi gözümdə*
*Cəsur Boleslavla*
*Cəsur İsmayıl-*
*Biri slavyan,*
*Biri müsəlman.*

*Dağınıq torpaqlar birləşdirildi,*
*Dağınıq diyarlar ərazisində*
*pərişan qalan,*
*Biri - digərindən aralı olan*
*Yeni iki dövlət yerləşdirildi-*
*Biri slavyan,*
*Biri müsəlman.*

*Əzaba, zillətə dözdük nə qədər...*
*Doğradı qılınclar, kəsdi qəmələr,*
*Amma yenə*
*Yeni*
*Zəifləmələr...*
*Sıxıntı, üzüntü zamanı oldu,*
*Bizim ölkələr*
*Bir neçə bolgünün qurbanı oldu,*
*Yenə də dəryatək axıdıldı qan,*
*Gördü çox sədəmə iki hökmdar,*

*Iki hökmran-*
*Biri slavyan,*
*Biri müsəlman.*

*Amma, öz hökmünü zaman elədi,*
*Üzün –üzün illər giryan elədi*
*Bizim yurdumuzu yenə də dövran-*
*Səni Rusiya,*
*Səni Prussiya,*
*Səni Avstriya,*
*Mənisə qonşum*
*Bir necə məkan.*

*Fikir məni yenə geriyə çəkdi:*
*Torpaqlar süngüylə bellənəçəkdi,*
*Əkinlər qan ilə sulanacaqdı,*
*Şəhərlər odlara qalanacaqdı,*
*Yandıran çox idi, söndürənsə az,*
*Ehtiyac dərindi, düşüncə dayaz...*
*Türk oğullarını bəzi kimsələr*
*Varşavaya sürgün eləyirdilər,*
*Olurdı çox kəsin həmdəmi, yarı*
*Odlar ölkəsiylə Polşa diyarı.*

*İyirminci əsr gəlib yetişdi,*
*Yenə də qan-qada araya düşdü...*
*Sonra azadlıq!*
*Səndə-sevinc, fərəh, məndəsə-şadlıq.*
*Nəhayət ayrıldıq şərikimizdən-*
*Rusiya əl çəkdi hər ikimizdən,*
*Gəlib çıxdı yeni dövr nəhayət,*
*Sən Respublika oldun, mən- Cümhuriyyət!*
*Sonra qırmızırəng bir "Qızıl ordu"*
*Aldı caynağına bu ulu yurdu.*
*Sonra müharibə-faşist bəlası!..*
*Nəhayət bunun da oldu xilası-*
*Şanlı müstəqillik gəldi ölkəmə!*

*Daşnaksa pusquda durub sən demə,*
*Tarixə yeni qan-qada saldılar,*
*Qarabağ yurdumu oda saldılar.*
*Var bizi istəyən, istəməyən də,*
*İndi müstəqilik Polşa da, mən də-*
*Biri slavyan*
*Biri müsəlman.*

*Ilahi, yer üzü nizamlı olsun,*
*Qələbə marşımız davamlı olsun.*
*Ruhumuzu oxşar iki dahi var:*
*ŞopenləÜzeyir—iki bəstəkar!*
*Biri slavyan*
*Biri müsəlman.*

*Polşa, bugününü bəyəndim sənin,*
*Zəngin tarixini öyrəndim sənin.*
*Bu günə qədər*
*Nə qədər müsibət, nə qədər kədər*
*Görüb vətənin,*
*Görüb vətənim...*
*Qoy ulu Yaradan qorusun bizi,*
*Qoruyaq müstəqil dövlətimizi!!!*

Ertəsi gün Varşavada heykəlləri ucalmış Süleyman bəy Sulkeviçin (1865-1920) və həmyerlimiz Vəli bəy Yadigarovun (1898-1971) ziyarətinə getdik. Qeyd olunmalıdır ki, onların ikisi də Azərbaycanla bağlı şəxslər olmuşlar. Krım türkü olan Süleyman bəy şərəfli bir ömür yolu keçmiş, Voronejdə Kadet korpusunu, Peterburuqda Artilleriya məktəbini bitirmiş, 1888-ci ildə Rusiya Baş Qərargah Akademiyasına daxil olmuş, Odessa Hərbi dairəsinin zabiti hərbi vəzifəsini daşımış, 1904-1905-ci illərdə Rusiya-Yaponiya müharibəsinin iştirakçısı kimi döyüşmüş, 1919-cu ildə Azərbaycana gələrək Azərbaycan Xalq Cümhuriyyəti ordusunu Baş Qərargah Rəisi vəzifəsinə təyin edilmiş, 1920-ci il aprel işğalından sonra bolşeviklər tərəfindən həbsə alınmış və Bayıl həbsxanasında güllələnmişdir.

Borçalının Təkəli kəndində zadəgan ailəsində doğulan Vəli bəy Yadigarovun da həyat yolu olduqca keşməkeşlidir. 1909-1916-cı illərdə Tiflis Hərbi

Gimnaziyasında təlim almış, Əlahiddə Qafqaz Korpusunun süvari hissəsində təcrübə keçmiş, I dünya müharibəsində Qafqaz cəhbəsinin korneti olmuş, 1918-ci ilin sentyabrından Milli Ordumuzda eskadron komandiri kimi çalışmış, 1921-ci ilin martına qədər bolşeviklərə qarşı vuruşmuş, əvvəlcə Türkiyəyə, sonra isə Polşaya mühacirət etmişdir... Mühacirətdən sonra Argentinada yaşayan Vəli bəy 1971-ci ilin dekabr ayının 13-də Buenos-Ayresdə Vəfat etmiş, öz vəsiyyətinə əsasən Polşada təkrar dəfn edilmişdir.

Beləliklə, hərb tariximizlə bağlı iki böyük şəxsiyyət. Onların hər birisi haqqında, düşünürəm ki, romanlar yazılarsa, olduqca maraqlı olar.

Əklil qoyma mərasimi. Hər iki heykələ baxırıq. Hamımız kədərliyik. Şahin müəllimin gözlərində yaş gördük.

Sonra başqa görüşlər. "Polşa səfərnaməsi"ndə oxuyuram: "... Oteldəyəm. Polşanın qız-qadınları çox gözəldir. Varşavanı Polşanın qızı kimi təsəvvürə gətirdim: Şarışın, ucaboylu, mavigözlü... Və "Polşa qızı Varşava" adlı bir şeir yazdım".

Bəli, Şahin müəllimin qələmi hər yerdə işləyir müxtəllif toplantı yerlərində, gəzintilərdə, görüşlərdə, otellərdə də...

Axşam. Gözəl bir restoran, adı "Podval" (polyakca "Podavle"). Şahin "Polşa qızı Varşava"nı bizə oxudu. Xoşumuza gəldi. Xüsusən Yaqub müəllimin. O şeiri siz də oxuyun, xoşunuza gələcək.

POLŞA QIZI VARŞAVA

*Neçə illər kədərə, zillətə qərq olsa belə,*
*Əllərindən neçə yol torpağı tərk olsa belə,*
*Yeri Avropadı- Qərb olmasa, Şərq olsa belə,*
*Çox şəhər varsa da, əlbəttə, bu gen dünyada,*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Çətin əyyamda görübdürsə asan günləri də,*
*Qismət olmuş daha çox ah-fəğan günləri də,*
*Amma qoymuş geridə xeyli yaman günləri də,*
*Çox təəssüf ki, cahan içrə hələ var dava,*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Nə qədər ölkəyə dəymiş qədəmim illərlə,*
*Qaynayıb –qaynamışam sülhsevər ellərlə...*
*Tanış oldum neçə ellərdə neçə dillərlə,*

*Gəzmişəm çox şəhəri – Minsk, Lvov, Poltava,*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Bir səfir ki, Həsənovdur soyadı, ismi Həsən,*
*Bizi dəvət eləyibdir bu diyara, əhsən!*
*Mahmudov Yaquba həm çoxlu təşəkkür bizdən!*
*Heyranı olmamışam çox səfərin mən əsla,*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Həm İradə, həmi Gülnur, həmi Nərmin gəldi,*
*Onlara yoldaş olub da, bura Şahin gəldi.*
*Niyyətim istəyim ilə necə də çin gəldi,*
*Qələmim öylə sevindi belə gəldi misra:*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Bu qərib ölkədə, şair, təzədən an gözəli,*
*Yaddaşından silə bilməz açı hicran gözəli,*
*Sanki hər qızı burada Azəribaycan gözəli,*
*Nə gözəl xalq, nə təmiz yurd, necə saf ab-hava,*
*Məni heyran elədi Polşa qızı Varşava.*

*Bir gözəl Polşalı canan mənə gəlsə alaram,*
*Lap Krakovda gedib, bəlkə də, məskən salaram,*
*Xeyir! Etdim zarafat! Ölkəmə sadiq mən adam!*
*Söylədim sözgəlişi mən bunu, Şahin, amma*
*Məni heyran elədi Polşa qızı Varşava!!!*

"Olaylar" qəzetinin Polşa səfərnaməsi dərc edilən dörd və beşinci saylarına göz gəzdirirəm. Şahin müəllim yazır:

"Otelə gəldik. Axşam H.Həsənov böyük lütfkarlıqla bizi yenə restorana (bu dəfə "Mövlana Cəlallədin Ruminin şərəfinə inşa olunmuş **"Movlana room"**a dəvət etdi. Şahin Fazil yazır:

"Gecədir. Ilham pərisi yanıma gəlmək istəyir. Beynimə qarmaqarışıq misra və beytlər dolmaqdadır. Işığı yandırıb qələmi əlimə aldım, dəftərimi dizim üstünə qoydum:

*Susuz çaydayam,*
*Yolsuz yoldayam,*

*Dağsız dağdayam,*
*Bağsız bağdayam,*
*Yersiz göydəyəm,*
*Göysüz yerdəyəm...*

Nə demək istədiyimi heç özüm də bilmədim. Bu misralar, bəlkə də, gələcəkdə tamamlayacağım şerin başlanğıcıdır...

Yenə yeni misralar:

*...Tərk etmək istərəm bədbinliyimi,*
*Qoy rahat yaşayım nikbinlər kimi...*

*Güman ki, əzəldən ulu Yaradan*
*Rahat yaşamağı mənə çox bilib.*
*Bəlkə də qəm çəkib dərd daşımaqdan*
*Mənim ürəyimin beli əyilib".*

Məqalənin ardını oxuyuram:

"Bu qarmaqarışıq fikirlərdən yoruldum. Sabah qayıdırıq Vətənə. Pəncərədən baxıram. Sulu qar yağır. Bir günüm də bitəcək. Bu gün Varşavadayam. Sabah isə Bakıda olacağam. Vida şeri yazdım:

SONET

*Varşava, səninlə görüş naminə*
*Istanbuldan uçub yanına gəldim.*
*Gözəl bir qadın tək göründün mənə.*
*Axı gözəlliyə sarı yönəldim.*

*"Əlvida soneti" yazmada qələm,*
*Sətirlər çoxalır varağımdakı.*
*Səni, çox güman ki, bir də görmərəm,*
*Əlvida Varşava, salam, ey Bakı.*

*Bu gün son görüşdür Polşa xanımla,*
*Sonuncu günümdür bu xanimanda.*
*Ruhum ilə sevdim, sevdim canımla-*
*"Səfərnamə" yazmaq həvəsi canda.*

*Gördüm günəşini, yağışını da,*
*Bu payız fəslində lap qışını da.*

Beləliklə, Şahin müəllimin bir neçə səfərnaməsi, xüsusən Polşa səfərnaməsi haqqında təfərrüatla yazdığı xatirə və şeirlər bir daha diqqətini özümə cəlb etdi və nəticədə bir qədər geniş olan məqaləmi bitirdim. Şahin müəllim, 80 illik yubileyinizi bir daha ürəkdən təbrik edirəm! Polşa qızı Varşavanı unutmayaq!

**Nəriman HƏSƏNZADƏ**
*Xalq şairi*

## TƏKİ GÖRÜŞ OLSUN

Şahin redaksiyaya gəlmişdi. "Ədəbiyyat və incəsənət" qəzeti Əfqanıstanla bağlı müsahibə hazırlayırdı. Müsahibənin fəal iştirakçılarından biri də Şahin idi. Söhbət əsnasında bildim ki, yaxınlarda biz onun "Yenə görüşərik..." adlı kitabı ilə görüşəcəyik. Mən başqa oxucuları üstələməyi, həmin şe'rlər kitabı ilə daha tez görüşməyi qərara aldım. Şahindən əlyazmasını xahiş etdim. Gətirdi. Varaqlamağa başladım. Ilk səhifə, ilk şe'r:

*"Gəlmişəm cahana imtahan üçün,*
*Imtahan verirəm açıq-aşikar.*
*Mənim hər dəqiqə, hər saat, hər gün*
*Ömür-müəllimə imtahanım var."*

Şahin ömrünün orta yaşındadır. Orta məktəb, ali məktəb, aspirantura illəri ilə yanaşı qürbətdə keçirdiyi illər də onun yaddaşında yaşayır. Tez-tez yaddaşının kövrək səhifələrini varaqlayır, xatirələr şe'rə dönür:

*"Insanlar cürbəcür: qəm, dərd edən var,*
*Səni min bir dərdə həmdərd edən var,*
*Mərdi qova-qova namərd edən var,*
*Ey gidi dünya..."*

Qürbət mövzusu...Dahi Nizamidən başlamış bu günə qədər yüzlərlə şairimiz bu mövzu üzərində işləmiş, ömürlərinin qürbətdə keçən illərini xatırlamış, qürbət, hicran şe'rləri yazmışdır. Şahin də elə. Onun "Əfqanıstan fəğanı" silsiləsindən bir neçə şe'ri var. Həmin şe'rlər əsasən Əfqanıstanın bu günü haqqındadır:

*"Gecə yuxumuza güllə atıldı,*
*Şirin yuxuları yaraladılar.*
*Görən, neçə ömrə zəhər qatıldı?*
*Görən, neçə həyat oldu tarmar?"*

Şahin Əfqanıstandan təzəcə qayıtmışdır. Asiyanın qəlbində yerləşən bu qədim əfsanələr və dağlar diyarında onun ömrünün düz on üç ili keçmişdir. Şahin bu müddət ərzində onlarla əfqan ədibinin poeziya və nəsr nümünələrinin dəri (fars) dilindən ana dilimizə çevirib, Bakıda nəşr etdirməklə yanaşı, neçə-neçə Azərbaycan şair və nasirinin əsərlərinin də Kabulda çap etdirmiş, xeyirxah iş görmüşdür. Şahin qürbətdə çox qalmışdır, lakin vətən həmişə onun xəyallarında canlanmış, onu özünə sarı çəkmişdir. Şahin deyəndə ki:

*"Vətəndə qoymuşuq ürəyimizi,*
*Vətən müqəddəsdir, vətən əzizdir.*
*Vətəndən ayırdı vəzifə bizi,*
*Vətəndə bağlılıq vəzifəmizdir!"*

onun vətənə bağlılığı tam şəkildə təcəssüm olunur.

"Yenə görüşərik..." kitabında müəllifin qəzəl, qoşma, bayatı və nəğmələri də verilmişdir. Şahinin qəzəlləri əvvəllər də çap olunmuşdur. Bu kitabdakı qəzəllərdə də qürbətin ağrısı, hicran və vüsal mövzusu əsas yer tutur:

*"Düşmüşəm mən neçə müddətdi fəraqdan-fərağa,*
*Baxıram yurduma həsrətlə qıraqdan-qırağa."*

Şahin ixtisasca şərqşünasdır. Zəngin Şərq poeziyasına, onun müxtəllif janrlarına yaxşı bələd olması bu kitabda özünün açıq şəkildə nəzərə çapdırır. Onun bayatıları Azərbaycan xalq yaradıcılığının zənginləşməsinə doğru atılan poetik addımlardandır:

*"Əzizinəm, Gəncə yox,*
*Heç belə işgəncə yox.*
*Ey Nizami Gəncəvi,*
*Nizami var, Gəncə yox.*

*Yad işgəncələnəydi.*
*Əllər pəncələnəydi.*
*Şəki Şəki olubdur,*
*Gəncə Gəncələnəydi.*

*Əzizim, qarabağlı,*
*Ürəyim hara bağlı?*
*Hər kim kimə bağlısa*
*Bu Şahin yara bağlı.*

“Yenə görüşərik...” kitabının əlyazmasını oxuyub qurtardım. Şahin, yenə görüşərik!

***(Şahin Fazil. Yenə görüşərik,***
***Bakı, Yazıçı, 1989, səh 3-5)***

**Qəzənfər KAZIMOV**
*Filologiya elmləri doktoru, professor*

# ŞAHİN FAZİLİN «DİVANLAR XƏMSƏSİ" VƏ ONUN DİLİ HAQQINDA

Şahin haqqında sözümə akademik Bəkir Nəbiyevin sözləri ilə başlamaq istərdim: **Şahin Azərbaycanın son illərdə sıraları seyrəlmiş, indi az qala barmaqla sayılan kamil qəzəlxanlarından biri, yaradıcılıq fəallığı baxımından onların arasında xususilə seçilən şairdir. O öz poetik yaradıcılığı ilə yanaşı, elmi tədqiqatla məşğul olan bir araşdırıcı kimi də tanınır. Poeziya və elm Şahin Fazilin çağdaş ictimai fıkir fəzasında uğurlu mövqe tutmasına səbəb olan mötəbər qanadlarıdır... Şahin şerin, xüsusən qəzəlin dinclik nə olduğunu bilməyən cəfakeş fəhləsidir".** (Bəkir Nəbiyev. Şahinin qanadları, "Azərbaycan" ədəbi–bədii jurnalı, N=II, 2006, səh. 174-175).

Bəkir müəllim -hörmətli akademik əlində möhkəm dəlil-sübut olmadan söz deyən deyildi. Onun sözləri məni də düşündürdü, kitablarını götürüb vərəqləməyə başladım: Şahin Fazil. **Divan.** Bakı, Azərnəşr, l996, 456 s.; Redaktoru Mir Cəlal Zəki; **İkinci_divan**, Bakı» 2005, 1268 səh.; redaktorları Həkim Qəni Hüseynov, Hacı Rafıq Şirvani; **Üçüncü divan**, Bakı, 2008, 1382 səh.; redaktoru Ənvər Nəzərli; **Dördüncü divan**, Bakı. 2014. 872 səh; redaktoru Mir Cəlal Zəki Məştəqayi. Cəmisi 3987 səhifə. Səhifələr də dolu. Bəzi kitablarda olduğu kimi, səhifədə bir şeir deyil, səhifə dolunca şeirlər verilmişdir. Çox vaxt 11-lik və ya l2-liklə. Di gəl hünərin var, vərəqlə, oxu, qurtar. **Olduqca gərgin bir ədəbi yaradıcılıq əməyi. Nəzərə alınmalıdır ki, Ş.Fazilin bunlardan əlavə, beş monoqrafiyası, üç yüzədək elmi məqaləsi, dörd tərcümə kitabı və onlarla publisistik yazıları da var. Hələ 20-dək şeir kitabı, 3 poema, xarici ölkələrə səfərlər və qələmə aldığı səfərnamələr... Bu yaxınlarda A.Bakıxanov adına Tarix İnstitutunun iki cilddə çap etdirdiyi 2506 səhifəlik İsgəndər bəy Münşinin «Dünyanı bəzəyən Abbasın tarixi**» kitabının tərcüməsi... **Papaq altda oğlanlar var, xəbərimiz yox... Hazırda yeni xeyirxah və çox vacib bir işlə – Həsən bəy Rumlunun «Əhsənüt–təvarix» («Tarixlərin ən yaxşısı») əsərinin dilimizə tərcüməsi ilə məşğuldur.**

Şübhəsiz, tarixçi alimin və şairin yaradıcılığı görkəmli elm adam-

larmızın diqqətini çoxdan cəlb etmişdir. Şairin ilk "Divan"ını tədqiqat obyektinə çevirən Q.Məhərrəmli yazmışdır: "Tədqiqatçı alimlərdən akademik B.Nəbiyev, professorlar T.Əhmədov, Ş.Əliyev, T.Quliyev, Ə.Şükürlü, C.Nağıyeva və başqaları müasir Azərbaycan poeziyasının tanımış nümayəndələrindən biri kimi, şair Şahin Fazilin əruzvəznli şeirdə dil saflığı uğrunda apardığı ədəbi mübarizəni təqdir edərək, yaradıcılığına yüksək qiymət vermiş və sənətkarın zəngin irsinin geniş elmi tədqiqata cəlb olunmasının vacibliyini qeyd etmişlər". (Qiymət Məhərrəmli. «Şahin Fazil "Divanı" və klassik ədəbi ənənələr», Bakı, 2007, səh.5).

"Üçüncü Divan"ın redaktoru və ön sözün müəllifi, ustad sənətkar, klassik şerin gözəl bilici və yaradıcısı Ənvər Nəzərli Şahin Fazili «novator şair» adlandırmış, onun «əruzun bütün bəhr və janrlarında» şeir yazdığını, «Azərbaycan ədəbi ənənələrini özünəməxsus təfəkkür tərzi ilə» davam və inkişaf etdirdiyini, təkcə «türkdilli deyil, farsdilli poeziyanın da bilicisi olduğunu», şeirlərinin «təqliddən uzaq olduğunu» xüsusi qeyd etmiş, onun ilk divanından aldığı təəssürat əsasında yazmışdır: «Həsənoğludan müasirlərimizə qədər şairlərin, demək olar ki, hamısının qəzəl yaradıcılığına az çox bələd idim. Şahin Fazilin qəzəlləri öz sadəliyi və mövzu dairəsi ilə onlardan kəskin surətdə seçilirdi». Ənvər Nəzərli təkcə poeziya sahəsində deyil, Şahinin tarix elmi sahəsində də yorulmaz tədqiqatçı olduğunu bir növ heyrətamiz şəkildə qeyd etmişdir: «Şah İsmayıl Xətai və digər Səfəvi şahlarının müxtəlif dövlət başçılarına farsca yazdıqları beş mindən artıq diplomatik məktubu araşdırıb təhlil etmək inanılmaz dərəcədə gərgin əməyin məhsulu idi».

Tanınmış füzulişünas, filologiya elmləri doktoru, mərhum professor Sabir Əliyev "Şahin Fazil "Divan"ının poetikası" adlı məqaləsində şairin birinci "Divan"ını ətraflı təhlil edərək məmnun-məmnun yazmışdır: "Şair bu kitabı üçün ancaq təhsinlərə layiqdır". ("Hikmət" elmi araşdırmalar toplusu, N 5-6, 2006)

**Şahinin yaradıcılığına nəzər saldıqda, adama elə gəlir ki, bunlar bir adamın işi deyildir və əgər bir adamın işi olsa idi, onu yormuş olmalı idi. Lakin Şahin müəllim yorulmaq nə olduğunu bilmir.** Bu günlərdə söhbət zamanı 1000 səhifədən artıq bir həcmdə beşinci "Divan"ını bitirmək üzrə olduğunu qeyd edərək dedi: "Mən Divanlar Xəmsəsi yazacağam". "Divanlar Xəmsəsi". Mənə elə gəlir ki, Şərq ədəbiyyatında hələlik ilk təcürbədir.

Şahin Fazilin birinci "Divan"ı çap olunduqdan sonar kitab disserta-

siya mövzusuna çevrilmişdir. Eyni zamanda məşhur şair və qəzəl ustası Hacı Mail "Divan"ı yüksək qiymətləndirərək yazmışdır: "Və, nəhayət, bu yaxınlarda Şahin Fazil tərəfindən XX əsr şimal Azərbaycanın birinci "Divan"ı çap olundu. Elə bu böyük həcmli kitabla da Azərbaycanın 100 ildən çox bir dövrünü əhatə edən ədəbiyyat tarixində ədəbi-bədii bir hadisə baş verdi: ölkəmizdə Seyid Əzim Şirvanidən sonra yazılmayan divan ədəbiyyatımızın ilk nümunəsi, elə müəllifin özünün dediyi kimi, "oxucu divanına" (mühakiməsinə) tapşırıldı".

Hacı Mail Şahinin "Divan"ına həsr etdiyi qəsidəsində də "Divan"dan razılığını bildirirdi:

*"Sahina, baxdım o gün tazə çıxan «Divan»ə,*
*Xoşuma gəldi, inan, and içirəm Qur'anə.*
*Sayılar, məncə, qaranquş bu kitab əsrimizə,*
*Qalmasın leyk o tək, and veririk Sübhanə".*

Şahinin "Divan" yaradıcılığını təqdir edən Azərbaycan Milli Elmlər Akademiyası Nizami Gəncəvi adına Ədəbiyyat Muzeyinin elmi işçisi Mir Cəlal Zəki Məştəqayi "Dördüncü Divan"ın əvvəlində yazmışdır. "Şahin olduqca çox mütailə edir, öyrənmədiklərini soruşur, bilmədiklərini öyrənir. Çünki "Divan" yazmaq şairdən böyük cəsarət tələb edir. Bu, olduqca məsuliyyətli işdir. **Şahinin başqa divan müəlliflərindən mühüm bir üstünlüyü vardır: ixtisasca şərqşünasdır, fars dilini mükəmməl bilir, ərəb dilindən xəbərdardır, orta əsrlərin qəliz dillərindən biri olan Osmanlı dilinə (fars, ərəb və türk dillərinin qarışığı olan dil) yaxşı bələddir. Yaxın və Orta Şərq ölkələrində yaradılan divan kitabları məhz bu dillərdə qələmə alınmışdır. Həmin kitabların original variantları ilə tanış olmadan, onlardakı incəliklərə diqqətlə nəzər yetirmədən "Divan" bağlamaq olmaz. Yəqin ki, məhz bu çətinliyə görə də son əsrlərin müqtədir şairləri belə, "Divan" yaradıcılığından sərf-nəzər etmişlər. Müasir dövümüzdə isə bir-birinin ardınca "Divan" kitabları (mən onları "kitabça" adlandırırdım) peyda olmağa başladı. Əlbəttə, Şahin Fazilin "Divan" larından sonra. Lakin məsuliyyətlə deyirəm ki, o divanların heç birində Şahin Fazil divanlarında olan əhatəlik və siqlət yoxdur". (Şahin Fazil. Dördüncü Divan. Mir Cəlal Məştəqayinin "Redaktordan" sərlövhəli məqaləsi, Bakı 2014, səh. 8-9)**

Müəllif bunu da qeyd edir ki, zəmanəmizdə "elə divançılar da var

ki, adamı təccübləndirir. Həcmcə balaca, məzmunca bəsit olan və "Divan" qayda-qanunlarına qətiyyən cavab verməyən lüzumsuz "əsərlər".

Müəllif (M.C.Məştəqayi) aşağdakı şeir parçasını verməklə Şahinin özünün belə "Divan" lara münasibətini qeyd etmişdir.

*Var eləsi hərzəvü hədyan yazır,*
*Varmı diyarımda ki, "Divan" yazır?*
*"Divan" adından necə də xoşlanıb,*
*Bir neçə cüt şeirini "Divan" sanıb.*
*Çatmağı, Şahin, sənə əhd eyləyib.*
*Bəzən iki "Divan"a cəhd eyləyib,*
*Var eləsi sürsə də nəzm atını,*
*Cəhd eləmir yazə minacatını.*
*Kim oxusa "Divan"ını mat qalar,*
*Yeddincə beyt ilə minacat olar?*
*Allaha hörmət bumu, izzət bumu?*
*Allaha diqqət və sədaqət bumu?*
*Dilbərə yüzlərlə sətir həsr edər,*
*Allahasa yeddicə beyt müxtəsər".*

Şahinin "Divan"ları müasirlərimizin bir çoxunun başa düşdüyü kimi adi şeir toplusundan ibarət deyildir. Müəllif "Divan" yaradıcılığının bütün ənənələrinə əməl etmişdir. Dörd "Divan"ın hər biri dibaçə ilə başlanmış, xatimə ilə bitirilmişdir. Dibaçə, minacat, nə't, bahariyyələrin hər biri qəzəllər, qəsidələr, məsnəvilər, qitələrlə bəzənmişdir. Dördüncü divanın «Xatimə»sində müəllif təkcə bu «Divanın necə başa gəldiyi barədə yazır: **"Altı il, ya altı ildə yazdığım on min beytdən çox şeir. Bəli, altı ildə on min beyt, yaxud 20 min misra, yaxud 100 minədək söz və ifadələr... Bu mürəkkəb zamanda, vətənim Azərbaycanda, işimin çox, gücümün az olduğu bu gərgin dövrdə bu qədər şeir yazmaq (özü də şerimizin əsasən bütün vəzn və bəhrlərində) asan iş deyil. Bu müddətdə bir neçə yaxın-uzaq diyarlara getmişəm, İrana, Türkiyəyə, hətta Yaponiyaya səfər etmişəm".**

Şahin Fazilin "Divan"larındakı şeirlərin – qəzəl, qəsidə, məsnəvi, qitə, mürəbbe, tərcibənd, müqəttəat, təxmis, təzmin, sürud, müsəbbe, təəssüfnamə, rübailər, təkbeytlər, dördlüklər, səkkizliklər, bayatılar, xoyratılar, mini poemalar və s-in əsas məzmunu məhəbbətdir-insana, yerə, gö-

yə, təbiətə məhəbbət. İnsanı tənqid edəndə də onu məhəbbətə, məhəbbətlə saflaşmağa, məhəbbətlə yaşamağa çağırır. Özü də deyir: "Hörmətli oxucu! Sən əgər mənim əvvəlki divanlarımı diqqətlə oxumusansa, oxuduğun səhifələrdəki şeirlərin əsasən Eşq mövzusunda olduğunu görmüsən. Yar eşqi, diyar eşqi, ana eşqi, elm eşqi, mütaliə eşqi, millət eşqi, təbiət eşqi və s." Göründüyü kimi, şair Şərq ədəbiyyatına məxsus yeni şeir formalarından istifadə etmişdir. Əbülqasim Firdovsinin, Əfzələddin Xaqaninin şeirlərinə təzminləri var. Ulu Şərqin 50-dən artıq şairinin şerinə təzmin yazmışdır. (Təzmin də qəzəl formasındadır, lakin bir misra və ya bir beyt başqa bır şairdən gətirilir. Belə misra və beytlər şerin əvvəlində, ortasında, sonunda verilə bilir, əksərən şeir həmin beytin rədif və qafiyəsi üzərində qurulur və ya beyt şerin qafiyə və rədifinə uyğun olur). Dəfələrlə İrana səfər etmiş, hər birində silsilə şeirlər ortaya çıxarmışdır. Heca vəznində də bir sıra şeirləri var və "müasir divan" prinsipi ilə onları da divanlarına daxil etmişdir.

**Qəzəl yazanlarımızın bir qismindən fərqli olaraq, Şahin ilk növbədə ana dilimizin zəngin daxili imkanlarından istifadəyə üstünlük verir. Hazırkı oxucular üçün mənası aydın olmayan ibarəli ərəb ifadələri, mürəkkəb çoxmərtəbəli fars izafət tərkibləri onun qəzəllərinə yaddır.** Bu baxımdan yanaşdıqda Azərbaycan-türk qəzəlinin keçdiyi təkamül və inkişaf yoluna ümumi bir baxış belə deməyə əsas verir ki, qəzəlimiz tarixin müxtəlif mərhələlərində alınma sözlərə münasibət müstəvisində gah mürəkkəbdən sadəyə, aydınlığa, gah da sadədən mürəkkəbə doğru enişli–yoxuşlu, bəlkə də dalğavari inkişaf yolu keçmişdir. Konkret desək, məsələn, XIII-XV əsrlərdə yaşamış İzzəddin Həsənoğlu, Qazi Bürhanəddin, İmaməddin Nəsimi və Nemətullahın əsərlərinin dili XVI əsrin dahi şairi Füzulinin dilinə nisbətən alınmalardan istifadə baxımından sadə olmuşdur. Şah İsmayıl Xətai, Qövsi Tabrizi, Saib Təbrizi, Molla Vəli Vidadi, Molla Pənah Vaqif, Heyran xanım kimi şairlərin dili isə bu baxımdan XIX əsrin böyük qəzəl şairi S.Ə.Şirvaninin qəzəllərinin dili qədər qəliz olmamışdır. (B.Nəbiyev) Görünür, ayrı-ayrı şairlərin dilinin bu və ya digər dərəcədə sadə, yaxud qəliz olması (ərəb və fars söz və ifadələri ilə həddindən artıq yüklənməsi) dövrün ümumi ədəbi dil ənənə və meyilləri ilə yanaşı, hər bir sənətkarın yetişdiyi, şair kimi formalaşdığı konkret mühitlə, onun təhsil sistemi ilə, şairin poetik zövqü və fərdi sənətkar qənaətləri ilə şərtlənmişdir.

Burada bir şeyi də qeyd etmək istərdik ki, bəzən qəzəl bir janr kimi, alınma hesab olunur. Lakin ədəbi mənbələrimizdən aydın olur ki, bir şeir

forması kimi, bu janrdan təbii– tarixi inkişaf prosesində Azərbaycan türk xalqı da istifadə etmişdir, yəni lap qədim dövrlərdən bu janr türk adı ilə Azərbaycan sənət adamlarının orijinal yaradıcılıq formalarından biri olmuşdur. «Mehr və Vəfa» poemasında eynilə qəzəl formasında aa, ab, ac... şəklində, sonda türki deyənin imzası ilə eynilə qəzəl şəklində şeirlər verilmişdir. Məsələn, onlardan birindən bir parça:

*"Yenə uşbu mürdə cismə can gəlür,*
*Sallanıb ol sərvi-xuraman gəlür.*
*Bağ behişt oldu, doludur gül ilə,*
*Bülbüli-şeydayə gülüstan gəlür..."*

Və nəhayət, l5-ci beyt:

*"Sol Vəfa kibi həzaran dilbərin*
*Qarşusuna mə'şuqi-heyran gəlür".*

Bunlar göstərir ki, fars və ərəb dilləri qəzəlin yalnız dil baxımından (və bəlkə də bəhrlərə görə) qəlizləşməsinə, mürəkkəbləşməsinə səbəb olmuşdur. lndi Şahinin fərasəti burasındadır ki, sanki sövqi-təbii ilə bu tarixi milliliyi anlayaraq, qəzəl–türkini öz yatağına oturtmaq istəmişdir.

**Şahin nikbin, həyatsevər adamdır. Bir belə zəhmətin qarşısında əməyinin qiymətləndirilməsinə sanki o qədər də acımır. Onsuz da yazılan qalacaq: "Qışdayamsa da, baharıma, yayıma, xəzanıma alqışdayam. Çünki həyatımın hər mövsümü mənə "yaşa!"-dedi, vaxtım hədər ötmədi, yazıb-yaratdım, müəyyən uğura çatdım. Artıq qocalıq öz gücünü göstərməkdədir:**

*Gül gətirirlər yanıma, almıram,*
*Xoşladığım güllər əlimdən düşür.*

Ş.Fazil yazır:

**"Vətəndə də qaldım, qürbətə də düşdüm, vüsalla da, hicranla da görüşdüm, həzz də, iztirab da çəkdim, kef də, əzab da çəkdim. Yer kürəsi adlanan böyük vət- ənimdə tədricən həyatın hər üzünü gördüm. Adamların arasında ara–sıra adam da gördüm... Yaşım 75-ə yaxınlaşır, amma həyat eşqim çağlayan bulaq kimi hələ də aşıb-daşır":**

*Şadəm ki, yeri, göyü yaratdın,*
*Şadəm ki, məni həyata atdın.*
*Şadəm ki, cocuqluğum yetişdi,*
*Şadəm ki, cavanlığım da keçdi.*
*Şadəm ki, o dövrdən uzağəm,*
*Şadəm ki, ahıl çağımda sağəm.*
*Şadəm , qəbul eyləsən duamı,*
*Sənsən mənə yazdıran kəlamı.*

Özünə baxırsan, ciddi, sakit, bir az fağır bir adama oxşayır. Di gəl bu dibaçələri oxuyanda gör Şahin kimdir: "Pərvərdigara! Çoxlu suallarım var Sənə: Niyə gətirdin məni dünyaya? Azərbaycan ölkəsinin Quba şəhərində mənim doğulmağım zərurət idimi? Sonra neçin məni Bakıya yolladın? Daha sonra niyə məni daha uzaqlara atdın və neçin mənə 13 qürbət ili yaşatdın? Neçin mütərcim oldum, müəllim oldum, şair oldum, alim oldum? Neçin "Divan" divanəsi etdin məni?" Şair "Xəmsə"nin yaranması üçün Nizaminin, "Leyli və Məcnun""un yaranması üçün Füzulinin doğulmalı olduğunu qeyd etməklə özünün də "Divan xəmsəsi" yaratmaq zərurətindən doğulduğu qənaətinə gəlir. Deməli, hər bir yaranmış zərurətdən doğulur.

**Dibaçələrdən birində yazır: "Tez-tez xəyallara dalır, gözlərimi kipriklərimlə çəpərləyir və ötən günlərimi, aylarımı, illərimi gözlərim önünə gətirirəm. Mənim həyatım hadisələrlə o qədər gərgin, başıma gələn əhvalatlar isə o qədər zəngin olmuşdur ki, yazmaqla başa gəlməz".** Divan ədəbiyyatı olsa da, "Divan" ədəbiyyatının bütün ənənələrinə əməl etməklə müasirliyi unutmamış, xalqımızın hazırkı dərdlərini qələmə almışdır. Yenə dibaçədə deyir. **"Ya Allah! Mənim çox böyük dərdim var. Çox ağırdır o dərd. Qarabağ dərdi! Torpaqlarımın keçən əsrin sonundakı işğalından iyirmi ildən çox vaxt keçdi. Qarabağsız vətənimin bütövlüyü heçdir. Neçə ildir gözümüdən yaş axır":**

*Var öylə kişi başda papağı ləçək etdi,*
*Yarəb, ləçəyi bir də papaq etmək olarmı?*

*Düşmənlərimiz qarə çəkiblər bağın üstdə,*
*Qarə bağı bir də Qarabağ etmək olarmı?*

Bu sözlərdə lənətə gəlmişlərin ucbatından düşmən əlinə keçən Qarabağın ürəklərə vurduğu yaralarla yanaşı, şairin dibaçə ənənələrinə ustalıqla əməl etdiyi də görünür, "Dədə Qorqud"dan gələn ritm, sonrakı dövrün qafiyəli nəsr ənənələri də qorunmuşdur.

Şahin gördüyü işin əhəmiyyətini, bədii yaradıcılıq sahəsində, "Divan"" yaradıcılığı sahəsində öz xidmətlərini belə qiymətləndirir: "XX əsrin ilk mətbu divan kitabı mənim kitabım oldu. XXI əsrin ilk divanını da ("İkinci Divan") mən çap etdirdim. XX əsrdə yazılan ilk təzkirə də ("Təzkireyi-Şahin") mənim adımla bağlıdır. Divanlara ad qoyulma məsələsinə gəldikdə isə yenə də birincilik iddiasında oldum. Hələ heç bir şair öz divanını sayla adlandırmayıb". Şahin bir alim, bir şair kimi üqbaya sidq–ürəklə inanan adamdır, hazırkı ömrün müvəqqəti bir ömür olduğunu, o dünyanı qazanmaq üçün vaxtı öldürməməyi, zəhmətsiz an keçirməməyı özünə şüar etmişdir: "Allahım, təbii ki, fani dünyada yaşayanların üqba dünyası da olacaqdır və bu iş haqdır. Odur ki, bu dünyada mənə müvəqqəti verilən ömrün səmərəli keçməsindən ötrü həmişə ciddi-cəhd etmişəm:

*Şahinəm, vaxtımı mən boş yerə öldüməmişəm.*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur?".*

Sovet dövründə Şahini nahaq tutmayıblar. Tutsa idilər, heç bu divanım da olmazdı, Sovet dövlətinin əleyhinə ötəri narazılığım da:

"Pərvərdiga! Ömrümün əlli ili dinlərin üzərinə qadaga qoyulan bir ölkədə keçmişdirsə də, dinsiz olmamışam. Sənə həmişə etiqadım olub, adını dilimdə vird etmişəm. Dörd yol Məşhədə, iki dəfə Kərbəlaya getmiş, müqəddəs imamlarımızın ziyarətində dualar oxumuşam. Bir neçə minacat, nət, qəsidə və məsnəvi qələmə almışam ki, başdan–ayağadək cənabınıza, peyğəmbərimizə və imamlarımıza həsr edilmişdir:

*Çox niyyətə, çox məqsədə yetdim bu həyatda,*
*Allahsevənəm, Şahinə Allah yar oldu".*

Doğrudur, inandıqlarına bütün varlığı ilə bağlıdır, buna görə də "çox niyyətə, çox məqsədə yetdim" deyir, amma mən onun bu qədər zəhmətinin bu dünyada cüzi bir qarşılığını aldığını görməmişəm, nədənsə, bu tərəflərə işıq düşə bilmir. Özü də təəccüblənir:

*Məmləkət elmi ilən, alimi ilən tanınır,*
*Alimin paltarı gündən–günə nimdaş niyə?*

**Şahin qəzəllərini Füzuliyanə müəmmalar üzərində qurmamışdır. Onun qəzəlləri daha çox Ruhi Bağdadi, Seyid Əzim Şirvani, Vahid qəzəlləri tipindədir və onlardan, təbii ki, daha sadə, daha aydın bir dildə yazılmışdır.** Lirik qəhrəmanın ürək çırpıntıları bizim təbii danışıq tərzimizə müvafiq şəkildə ifadə olunmuşdur, misraların məzmununu dərk etmək üçün xüsusi düşüncələrə dalmaq, yazıçı Mir Cəlal demişkən, gücənmək lazım gəlmir. Lakin ümumən klassik qəzəl ədəbiyyatından gəldiyi, farsdilli ədəbiyyata yaxşı bələd olduğu üçün klassik ədəbiyyatda bol-bol işlənən simvollardan da məhrum deyildir.

Qəzəl dili şairləri klassik şeirdə işlənən izafət tərkiblərinə, əruzun tələblərini ödəyən alınma kəlmələrə daha çox çəkir. Lakin Şahinin yaradıcılığının mühüm bir keyfiyyəti bundan ibarətdir ki, o, ana Azərbaycan dilimizin öz sərvətinə daha çox üstünlük verir, bacardıqca qeyd etdiyim ifadə tərzindən qaçmağa çalışır. Əruz vəznində orta əsrlərə xas qəliz və dilimizdə vətəndaşlıq hüququ qazanmayan söz və istilah, işlədən izafət tərkiblərini şeirlərinə gen–bol calayan şairləri tənqid edir. Şahinin bu fəaliyyətini Ənvər müəllim – Ənvər Nəzərli xüsusi təqdir etmişdir.

Deyildiyi kimi, Şahin çox müxtəlif bəhrlərdə şeirlər yazmışdır. Oynaq bəhrlər bu şeirlərdə xüsusi nəzərə çarpır.

Qəzəl elə janrdır ki, heca vəznindəki sadəlik, təbiilik ölçülərinə onu salmaq sanki şerin bu formasının təsrini azaldır. Odur ki bəzən Şahini çox sadəliyə enməkdə məzəmmət halları da olmuşdur. Qəzəldə ifrat sadəliyi düzgün bilməyən Ə.Nəzərli yazır: "Möhtərəm dostuma məsləhət görərdim ki, sadə qəzəllər yazmaqda davam etsin…" lakin "qəzəldə dil sadəliyinin özünün də həddini gözləmək lazımdır". Ə.Nəzərli bunu da göstərir ki, "sadə yazmağın özü qəliz yazanlara bir nümunə kimi kifayətlənir".

Qəzəli sadə bir dildə yazmaq, keçmişin qəliz ifadəlilik formalarından qaçmaq Şahinin əsas yaradıcılıq prinsiplərindəndir və o, dibaçələrdə təkrar–təkrar qeyd edir ki, onu bu prinsipdən uzaqlaşdımaq olmaz: **"Qəzəlimi sadə dillə yazmağım bəzi mühafizəkar qəzəlxanların qəzəbinə səbəb olur və hərdənbir qulağıma onların "tənqidanə" sözləri gəlib çatır. Pərt olmuram. Çünki mən düzgün yoldayam. Qoy yorsunlar öz qəliz dillərini... Ana dil! Anamızın dili!!! Mən dilimi sidq-ürəkdən sevən**

**adamam. Şeirlərimdən xəbərdar hər bir adam bunu təsdiqləyər".** (Şahin Fazil. Üçüncü Divan, səh. l4-18). Yenə:

*Bəzi kəslər dilənirlər o ərəb-farsdan söz,*
*Kirpikin cəminə müjgan dedilər, diksindim...*

*"Çəkib hambal sayağı saf qəzəlin zənbilini,*
*Sadə etdim qəzəlin mən o mürəkkəb dilini."*

Şahini həmişə düşündürən bir problem: "Axı türk sözləri ilə "nəzmi-nazik" yazmaq "düşvar" olsa da, mümkündür! Orta əsrlərdə yazıb–yaradan şairləri qoyaq bir kənara , bəs niyə bu günün qəzəlxanları yenə də qəzəli "düşvar" yazırlar" "Mən bu vacib məsələ xüsusunda 40 ildir ki, fəryad edirəm. Özündə iki minədək qəzəli, yüzlərlə qitə, təxmis, tərcibənd, tərkibbənd, mürəbbe, müsəbbe, təzmin, rübai və s. əruz vəznli şeirləri əks etdirən iki divanımda inadkar qəzəlxanlarımızın inadlarını qırmağa çalışmışam. Dəfələrlə onlara demişəm ki:

*Üç qəzəl dəftəri cırdım ki, qəliz yazmışdım,*
*Həm itən vaxtıma, həm dəftərə heyfim gəldi.*

Şahin özü haqqında belə cümlələr işlədir. «Şahin Fazil doğma Azərbaycan dilimizin qədrini bilən, amma bu dilin qədrini bilməyənlərin "qədrini" bilməyən şairdir. "Yenə də onun öz məqaləsinə göz gəzdirirəm: **"Bizim müstəqil respublikamız, milli dövətçiliyimizin atributlarından biri olan gözəl ana dilimiz Azərbaycan dilimiz var. Nə üçün Ə.Vahidin, M.Şəhriyarın, Mir Mehdi Seyidzadənin, Suleyman Rüstəmin, Bəxtiyar Vahabzadənin, Ənvər Nəzərlinin təmiz sözlərimizlə yazılmış qəzəlləri bizə örnək olmasın?" M.S.Ordubadi demişkən, nə üçün qəzəllərimiz oxucuları "qamuslara" baxmağa vadar etməlidir? Gəlin Füzulinin, habelə Seyid Əzim Şirvaninin, Əbdülxaliq Cənnətinin, Məmo bəy Məmainin, Əbdülxaliq Yusifin və habelə müasir qəzəlxanlanmızın asanlaşdıra bilmədikləri qəzəlimizi xəlqi sözlərimizlə yazaq! Gəlin müasir ədəbi dilimizə hörmətlə yunaşaq! Gəlin qələz gülüstanımızı doğma güllərimizlə bəzəyək!"**

Şahin dibaçələrdə dediyi bu sözləri qəzəllərində də demişdir:

*Bir qəmim var—o da dil saflığıdır şeir içrə,*
*Ola bilmir qəmə qəmxar qəzəlxanlarımız.*

Dibaçələrdən birində yazır: **«Iki gözlü evimdə iki yazı masam var. Hər masanın üstü qələm, varaq, kitab, dəftərlə doludur. Mütəmadi olaraq elmi məqalələr, publisistik yazılar, tərcümələr, səfərnamələr yazmaq kimi yaradıcılıq işlərimlə məşğulam. Elmlər Akdemiyasının elmi qrup rəhbəri, Bakı, Sumqayıt, Lənkəran Dövlət Universitetlərinin professoruyam... Şeirə gəldikdə isə, onu yazmadığım gün yoxdur—heç olmasa, bir beyt, heç olmasa, bircə misra. İlhamıma minnətdaram».**

Bu qədər zəhmət içərisində Ş.Fazil 12-13 ildir ki, sevgili həyat yoldaşını da itirmişdir:

*Urək qübar içində,*
*Qəlb ahüzar içində,*
*Mən məzar üstündəyəm,*
*Yarım məzar içində.*
**
*Kök atsın,*
*Gül əkdim ki, kök atsın.*
*Əkdiyim gülün kökü*
*Yarın əlinə çatsın.*

Şahin müəllim, Sən indi 75–dəsən. Gənclik qüdrəti ilə işləyirsən. Yaman gözdən uzaq olmaq, «Xəmsə"ni tamamlamaq arzuları ilə... Sən "Xəmsə"ni tamamlayacaqsan tezliklə! Özün demisən ki:

*Söz zərgəri oldum deyə zər var qəzəlimdə,*
*Zər var deyə şeir içrə zəfər var qəzəlimdə.*

***AMEA Nəsimi adına Dilçilik***
***İnstitutunun əsərləri, N2, 2015***

**Tofiq MUSTAFAZADƏ**
*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun*
*"Beynəlxalq münasibətlər tarixi"*
*şöbəsinin müdiri, t.e.d., prof.*

## YORULMAZ ALİM, BÖYÜK SÖZ SƏNƏTKARI

Şahin müəllim orta əsrlər üzrə ən tanınmış mütəxəssis, fars dilli mənbələrini dərindən öyrənən bir tədqiqatçıdır. Uca Şahdağın ətəyində füsünkar Qubada doğulub boya-başa çatmış Şahin elə bil dağ qartalının özüdür: dik qaməti və duruşu, qartal baxışları ilə.

Mən Şahin müəllimi 40 ildən çoxdur ki, tanıyıram. Onun bir çox məziyyətləri vardır. Əvvəla çox gözəl bir tədqiqatçıdır və yorulmadan çalışaraq tariximizə töhfələr vermiş və verməkdədir. O cümlədən XV-XVI əsrlərdə Azərbaycan-Osmanlı münasibətlərinə dair sanballı bir monoqrafiya həsr etmiş, Quba bölgəsinin qədimdən bu günədək tarixini tədqiq etmişdir. Nəinki Azərbaycanın orta əsrlər tarixinin bir sıra məsələlərini tədqiq etmişdir, eləcə də gözünün nurunu sərf edərək dəyərli ilkin mənbələr Yan Tadeus Krıjinskinin «Tarixi-səyyahi məsihi» («Xristian səyyahın tarixi») Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» («Tarixlərin ən yaxşısı»), İsgəndər bəy Münşinin «Tarixe - aləmaraye - Abbasi» («Dünyanı bəzəyən Abbasın tarixi») əsərlərini farscadan, Jozef Tiflisinin «Vaqiati Mir Veys və Şah Hüseyn» («Mir Veys və Şah Hüseynin vaqiələri») kitabını isə Osmanlı dilindən Azərbaycan dilinə çevirmiş, ətraflı şərhlər yazaraq çap etdirmişdir.*

Şahin müəllim, həm də zəmanəmizin ən məhsuldar şairlərindən biri olub Füzuli ənənələrini davam etdirmiş klassik ədəbiyyatımızın şah janrlarından biri olan 5 divan kitabı qələmə almışdır.

Şahin həm də çox gözəl insan, sədaqətli dostdur. Belə deyim var, soruşurlar: «Filankəs necə adamdır?» Cavab verir: «Yol yoldaşı olmamışam». Yəni yolda insanlar bir-birini daha yaxşı tanıyırlar. Ötən əsrin 80-90-cı illərinin əvvəllərində bizim ikimizi «Bilik» cəmiyyəti xətti ilə respublikanın müxtəlif rayonlarına ezam edirdilər. Mən daha çox siyasi məsələlər haqqında danışırdım, Şahin isə gözəl şerlər deyirdi ki, bu da auditoriyanın canlanmasına, görüşün çox maraqlı alınmasına səbəb

* Həsən bəy Rumlunun əsərinin hər iki cildi hazırda istehsalatdadır və yaxın günlərdə oxuculara çatdırılacaqdır – T.M.

olurdu. Ən başlıcası isə Şahin müəllim yaxşı yol yoldaşıdır. Bəzən gecələr görürdüm ki, o, öz yatağında qaranlıqda nə isə yazır. Sən demə ilhamı gəlib şeir yazırmış. Mən soruşurdum ki, niyə görə işığı yandırmırsan? Məlum olurdu ki, məni narahat etmək istəmir. Bir epizodu da xatırladım: 1990-cı ilin yayında Gəncədən geri qayıdırdıq. Şahin təklif etdi ki, axşam çatan qatara bilet alaq, səhər tezdən Bakıya çatarıq. Mən isə dedim ki, gecəni niyə itirək, saat $16^{00}$-da sürətli elektrik qatarı Gəncədən çıxır. Onunla gedərik və gecə saat 12-də Bakıya çatarıq. Lakin iş elə gətirdi ki, qatar yolda xeyli gecikdi və Bakıya gecə saat 1-dən sonra çatdıq. Qatardan düşərək taksiyə minib evə getmək istəyəndə əli avtomatlı rus əsgərləri bizi vağzaldan çölə buraxmadılar (O zaman Bakıda komendant saatı mövcud idi). Vağzalın gözləmə salonunda çox sıxlıq və bürkü vardı. Ağcaqanadlar da adamı dağıdırdı. Mən özümü günahkar hiss edirdim. Şahin bir dəfə də olsun gileylənmədi ki, bizim bu vəziyyətə düşməyimizin səbəbkarı sən oldun.

Arzu edirəm ki, dövlətimiz tərəfindən Şahinin əziyyəti qiymətləndirilsin, tezliklə o Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü seçilsin.

Şahin Fazil mənim fars və ərəb dillərində olan və nəstəliq xətti ilə yazılan şəcərə cədvəlimi (Babək İftixari ilə birlikdə) dilimizə tərcümə etmişdir ki, onu möhtərəm oxucularımızın nəzərinə çatdırıram:

***"Şəcərənamə"***

*Bismillahi-rəhmani-rəhim! Ey imdad dilədiyimiz [Böyük zat – yəni Allah!]. Öz kamil qüdrəti ilə elm yaradana şükür olsun! [Allah] bəzi adamlara ağıl və mərifət bəxş etməklə onları başqalarından ayırıb şərəfləndirdi. Daha çox ibadət və itaət etdiklərinə görə onların bir hissəsi doğru yola gəldilər. Məhəmməd peyğəmbərə salavat və salam olsun ki, öz göstərişləri ilə onları irşad yoluna yönəltdi və səadətə çatdırdı. Peyğəmbərin xanədanına və onun səhabələrinə də salam olsun ki, onlar alimləri düz yola yönəldən ulduzlar olmuşlar.*

*Və sonra! Günəş və Ay işığı kimi hamıya aydındır ki, şeytandan qaçmaq və düzgün hidayət olunmaq üçün bu aləmdə çox əlamətlər mövcuddur. [Allah biz] insanları və cinləri yalnız ibadət üçün yaratmışdır Şərif hədisə görə, Allah buyurur ki, insanları yaratmaqdan məqsədim bu idi ki, onlar mənim gizli sər-*

*vət olduğumu bilsinlər...** 

*... Əzəmətli şeyxlər kəramətli övliyaların yolu ilə gələnlərdir. Qütblərin qütbü, əziz şeyx Əbu Həmzə Müəmmər ki, onun ömrü neçə yüz ilə çatırdı və o, Məkkənin Haşimi qüreyş tayfasına mənsubdur və Əmire - möminin olan [Əlinin] xidmətində olmuş, ələmdarlıq etmişdir. Uzun həyat sürmüş bu şeyx ömrünün sonunda nəhayət Babul-əbvab olan Dərbəndə gəlib çatır, orada məskunlaşır. Hazırda onun mübarək və nurlu məzarı Qübbə vilayətinin Müsəmmat kəndində zaviyə və ziyarətgah adı ilə tanınır. İndi onun nəslindən törənən övladları və daşıdığı davamçıları aşağıdakılardan ibarətdir:*

*Şeyx Ramazan və Şeyx Səfər iki qardaş olub, onlara şeyxlik ataları Şeyx Pirimdən, Pirimə isə atası Pir Məhəmmədən, onları ataları Nemət, atası Zöhhad, atası Şeyx Bahəddin Həmzə, atası Şeyx Başir, Şeyx Əbu İshaq, Səhtiq və Şeyx Hacı Yusifdən qalmışdır. Şeyx Əbu Səhtiq və Şeyx Hacı Yusif xirqəni, səccadəni və elmləri öz ataları Şeyx Həsəndən almışlar. Şeyx Həsən və onun qardaşı Şeyx Hüseyn isə səccadəni ataları Şeyx Həmzədən götürmüşlər. Şeyxliyə Şeyx Həmzənin atası Şeyx Hüseyn, onun atası Şeyx Əbdülhəsən, onun atası Şeyx Əbül-Səhtiq, onun atası Şeyx İbrahim, onun atası Şeyx Səhiyar, onun atası Şeyx Əbül Həsən, onun atası isə şeyxlər şeyxi Əbül-Həmzə Müəmmərdən və o isə Həzrət Əli Əleyhüssalamdan yetişmişlər.*

*Hazırda bu sülaləyə mənsub sağ qalan şeyxlərin adları aşağıdakılardır: köhnə şəcərənin əsasına görə bu şəcərənamə hicri tarixlə 1262-ci ilin rəbüləvvəl ayının 5-də (miladi 1846) Şamaxı şəhərində köhnə şəcərə əsasında yazılmışdır. Təzə şəcərənamənin müəllifi Hacı İsrafil ibn Hacı İbrahim ibn Hacı Məhəmmədəli ibn Hacı Şərif Müzəffər ibn Hacı Əhməd Şamaxıda vəfat etmiş rəhmətliklərdir.*

*Şəcərə tərtib olunan vaxt bu şəcərəyə mənsub şeyxlər aşağıdakılardır:* ***Şeyx Molla Mustafa Əfəndi*, *Şeyx Molla Məhəmmədi – Şeyx Qasım Əfəndinin övladlarıdır. Şeyx Qasım Şeyx Vəlinin, o da Şeyx Molla Vəlinin oğludur.***

*Şeyx Molla Əbdulcabbar, Şeyx Məhəmməd, Şeyx Əhməd və Şeyx Mahmud bunlar Şeyx Molla Əbdul Haşimin övladlarıdırlar, Əbdul Haşim Şeyx Habilin, Habil isə Şeyx Molla Vəlinin övladıdır.*

* Bu Şəcərənamənin başlanğıcında yuxarıda qeyd olduğu kimi, 5 səhifə mətn Allahın sifətlərindən, onun bu sifətləri bəxş etdiyi bir sıra insanların xüsusiyyətlərindən və Allaha ibadət etməyin fəzilətlərindən bəhs olunur. Bu 5 səhifənin yazılmasından əsas məqsəd Allahı sidq – ürəkdən sevmək və onun övliyasının qulluğunda dayanmaqdır.
Qeyd: Biz əsasən ərəb dilində yazılmış həmin şəcərənamənin şeyxlər siyahısına aid olmayan başlanğıcdakı səhifəsini tərcümə etmədik – Ş.F. və B.İ.

***Şeyx Hacı İbn Şeyx Vəhhab, Şeyx Habil ibn Şeyx Molla Vəlinin, Şeyx Vəli**, Şeyx Piri və Şeyx Sultan Şeyx Nurəddinin övladlarıdır, Nurəddin isə Şeyx Vəlinin övladıdır.*

***Şeyx Molla Zəki, Şeyx Molla Mehdi** - Şeyx Əbdülhəlim Əfəndinin övladlarıdır. Şeyx Əbdul Həlim isə Şeyx Əbdülsəlimin, o da Şeyx Molla Şeyxəlinin övladlarıdır.*

***Şeyx Əli və Şeyx Həsən** Şeyx Mənsurun övladları, Şeyx İsmayıl Şeyx Əbdulsəlim Əfəndinin, o isə Şeyx Molla Əlinin övladlarıdır.*

***Şeyx Molla Nəzərəli və Şeyx İmaməli** isə Molla Xas Məmmədin, Şeyx Molla Xasməhəmməd Şeyx Piri Məhəmmədin, Şeyx Pir Məhəmməd Şeyx Nur Məhəmmədin o isə Şeyx Məhəmmədin oğullarıdır.*

***Şeyx Bəxş və Şeyx Baloğlan** Şeyx Ağa Sultanın övladları, Şeyx Sultan isə Şeyx Pir Məhəmmədin, o da Şeyx Məhəmmədin övladlarıdır.*

***Şeyx Zəhir, Şeyx Şərif** isə Şeyx Səfərin övladlarıdır, Şeyx Səfər isə Şeyx Bünyadın, Şeyx Bünyad Şeyx Pir Məhəmmədin, Pirməhəmməd Nurməhəmmədin, Şeyx Nur Məhəmməd isə Şeyx Məhəmmədin övladlarıdır.*

***Şeyx Saleh, Şeyx Sədi, Şeyx Şəhabəddin** – Şeyx Əli Məhəmmədin, o isə Şeyx Salehin oğludur.*

***Şeyx Abdullah ibn Şeyx Murad** Şeyx Salehin övladlarıdır.*

*Şeyx Gülməhəmməd Şeyx Məhəmmədin, o isə Şeyx Salehin oğludur.*

***Şeyx Teyyub və Şeyx Tahir,** Şeyx Həsən, Şeyx Mustafa, Şeyx Ağası, Şeyx Baloğlan, Şeyx Səməd, Şeyx Qurban Şeyx Abdullahın övladları, Şeyx Abdullah isə Şeyx Teyyubun, Şeyx Teyyub isə Şeyx Abdullahın, o da Şeyx Heydərin oğludur.*

***Şeyx Abdullah və Şeyx Hüseynqulu** Şeyx Yusifin, Şeyx Yusif isə Teyyubun oğludur.*

***Şeyx Məhəmmədəli, Şeyx Nurəli, Şeyx Mirza, Şeyx Səfərəli** – Şeyx Rahənin oğlanları, Rahə isə Şeyx Teyyubun oğludur.*

***Şeyx Molla Əbdürrəzaq və Şeyx Heydər** Şeyx Ramazanın oğlanları, Şeyx Ramazan isə Şeyx Seyid Məhəmmədin, o isə Şeyx Abdullanın, Şeyx Abdullah isə Şeyx Heydərin oğludur.*

***Şeyx Allahverdi, Şeyx İsa, Şeyx Bəşir** – Şeyx Molla Əbdürrəzagın övladlarıdır.*

***Şeyx Əbdülqəfur və Şeyx Əbdulqədir** – Şeyx Məhəmmədin oğlanları, Şeyx Seyid Məhəmməd isə Şeyx Seyid Məhəmmədin oğludur, Şeyx Seyid Məhəmməd isə Şeyx Abdullahın, o isə Şeyx Heydərin oğludur.*

***Şeyx Məhəmmədkərim və Şeyx Əbdulkərim** – Şeyx İsrafilin oğlanları, Şeyx İsrafil isə Şeyx Məhəmmədin, Şeyx Məhəmməd, Şeyx Tapdığın, Şeyx Tapdıq*

*Şeyx Abdullahın, Şeyx Abdullah isə Şeyx Heydərin oğludur.*

***Şeyx Məhəmmədsəlim Şeyx Mütəllibin,*** *o da Şeyx Tapdığın, Şeyx Tapdıq Şeyx Abdullahın, Şeyx Abdullah da Şeyx Heydərin oğludur*

***Şeyx Süleyman və Şeyx Əmir*** *– Əhmədin, Şeyx Eldar Şeyx Ağaməhəmmədin oğulları, Şeyx Məhəmməd isə Şeyx Mərzaninin, o isə Şeyx Cəlilin oğludur.*

***Şeyx Vəli Məhəmməd və Şeyx Məhəmməd Hüseyn*** *Şeyx Yarməhəmmədin oğlanları, Şeyx Yarməhəmməd isə Şeyx Mərzanın, Şeyx Mərza Şeyx Cəlilin oğludur.*

***Şeyx Vəhan və Şeyx Xassə Əli və Şeyx Yarəli*** *– Şeyx Nəbinin oğlanları, Şeyx Nəbi Şeyx Hacı Məhəmmədin, Şeyx Məhəmməd isə Şeyx Cəlilin oğlanlarıdır*

***Şeyx Novruzəli – Şeyx Hacıbabanın****, Şeyx Hacıbaba Şeyx Qasımın, Şeyx Qasım Şeyx Hacı Məhəmmədin, Şeyx Hacı Məhəmməd isə Şeyx Cəlilin oğludur.*

***Şeyx Səfərəli, Şeyx Seyid, Şeyx Xələf*** *– Şeyx Rzanın oğlanları, Şeyx Rza, Şeyx Hacı Məhəmmədin, Şeyx Hacı Məhəmməd isə Şeyx Cəlilin oğludur.*

***Şeyx Ağarəhim, Şeyx Əhməd və Şeyx Əbdüləziz*** *– Şeyx Camalın oğlanları, onlar Şeyx Məhəmmədqulunun, Şeyx Məhəmmədqulu isə Şeyx Rəfinin oğludur.*

***Şeyx Abdullah Şeyx İmanqulunun,*** *Şeyx İmanqulu Şeyx Kamalın, Şeyx Kamal isə Şeyx Şəfinin oğludur.*

***Şeyx Əliqulu Şeyx Kəlinin oğlu,*** *Şeyx Kəlinin isə atası Şeyx Əliquludur.*

***Şeyx Əbdurrəhman*** *– Şeyx Əbdülün oğlu, Əbdül – Şeyx Musanın, Şeyx Musa isə Şeyx Səfinin oğludur.*

***Şeyx Əbdülqəni, Şeyx Əbdülməbud, Şeyx Əbdülqədir*** *– Şeyx Abdullanın oğlanları, Şeyx Abdullah, Şeyx Molla—Şeyx Həbibullahın, Şeyx Molla Həbibullah isə Şeyx Səfinin oğludur.*

***Şeyx Talib*** *– Şeyx Mahmudun, Şeyx Mahmud isə Şeyx Talibin oğludur.*

***Şeyx Məhəmməd xan və Şeyx Əhməd xan*** *Şeyx Mənsurxanın oğlanları, Şeyx Mənsurxan Şeyx Cəbrayılın, Şeyx Cəbrayıl isə Talibin oğludur.*

***Şeyx Seyid Məhəmməd*** *– Şeyx Məhəmmədin oğlu Şeyx Məhəmməd Şeyx Kərimin, Şeyx Kərim isə Şeyx Lətifin oğludur*

***Şeyx Lətif və Şeyx Nuri*** *– Şeyx Əhmədin oğlanları, Şeyx Əhməd isə Şeyx Lətifin oğludur.*[1]

---

[1] Qeyd: Mənim nəsil ağacım—şəcərənaməm burada bitir. Şahin Fazilə və Babək İftixariyə daha bir təşəkkür edirəm!

**Eynulla MƏDƏTLİ**
*AMEA Fəlsəfə İnstitutunun elmi işlər üzrə direktor müavini, tarix elmləri doktoru*

## ŞAHİN FAZİL POEZİYASINDA QARABAĞ FƏRYADI

Tarix elmləri doktoru, professor Şahin Fazil (Fərzəliyev) bu günlərdə tamam olacaq 80 yaşının 60 ilindən çoxunu poeziyaya, ondan bir qədər azını isə tarix elminə həsr etmişdir. O, tarixçiliyə də Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Şərqşünsalıq fakültəsinin məzunu olaraq klassik Azərbaycan şeirinin təsiri altında, türk (azərbaycan) və fars dillərində olan ədəbi-tarixi abidələrimizin, əsərlərimizin onda yaratdığı maraqla gəlmiş və bu gəlişindən peşman da olmamışdır. Əslində, Şahin Fazil poetik yaradıcılığında tarixlə, tarixçiliyində də poeziya ilə elə qarşılıqlı vəhdətdə məşğul olmuşdur ki, ona birmənalı olaraq "şair tarixçi", ya da "tarixçi şair" də deyilə bilər.

Şahin Fazil XVI - XVII əsrin böyük Azərbaycan tarixçiləri Həsən bəy Rumlunun "Əhsənüt - təvarix" ("Tarixlərin ən yaxşısı") və İsgəndər bəy Münşi Türkmanın "Tarix-e aləm-e araye Abbası" ("Dünyanı bəzəyən Abbasın tarixi)"əsərlərini fars dilindən ana dilimizə yüksək ustalıqla tərcümə edəndə də, Azərbaycan tarixinin çox mühüm dövrlərini əhatə edən, təqribən dörd min səhifəlik bu ilkin tarixi qaynaqlara izahlar və şərhlər yazanda da şairlik istedadını ortaya qoymuşdur. Belə ki, həmin kitablardakı yüzlərlə şeir nümunələrini də nəzmlə, məharətlə dilimizə elə çevirmişdir ki, sanki onlar elə türkcə (azərbaycanca) yazılmış kimi dilimizə və qəlbimizə yatır. Şahin Fazilin beş min səhifəni aşan beş "Divan", professor Qəzənfər Kazımovun təbirincə "Divanlar Xəmsəsi" də onun klassik Azərbaycan şeirinin bu günkü davamçısı olaraq ədəbi mühitdə tanınmasına və qəbul edilməsinə səbəb olmuşdur. Onun klassik və müasir şeirin demək olar ki, bütün formalarında, əruz və heca vəznlərində, sərbəst ölçüdə yazdığı poetik əsərlərini, hətta yaponsayağı haykularını (bir az bizim bayatıya bənzər) ədəbi tənqid və təhlil edib dəyərləndirmək əlbəttə ki, ədəbiyyatçünasların görəcəyi işdir və bu sahədə də müəyyən işlər görülmüşdür.

Qısa da olsa qeyd etmək istərdik ki, Şahin Fazilin poeziyasında qəzəl janrının üstünlük təşkil etdiyi diqqəti cəlb edir, lakin bu adət etdi-

yimiz klassik fars-ərəb tərkibləri ilə dolu qəzəl deyildir. Bu tamamilə fərqli dil üslubu ilə, Süleyman Rüstəmin, Məhəmmədhüseyn Şəhriyarın, Əliağa Vahidin, Mirmehdi Seyidzadənin, Əli Şəminin, Yasin Xəlilin və başqalarının qəzəlləri kimi əruz vəznində Azərbaycan dilinin necə böyük imkanlarla dərin mənalı fikirləri ən gözəl şəkildə ifadə etməyin bariz nümunəsidir. Bir sözlə, Şahin Fazilin qəzəlləri ana dilinin bütün incəlik və gözəlliyini özündə cəmləşdirən qəzəllərdir. Bunların əksəriyyəti əruzun hansı bəhrlərində olursa-olsun axıcı, diləyatan, yaddaqalan, özü də eşq-məhəbbətdən, dini-irfani məzmundan daha çox ictimai-mənəvi məzmunlu qəzəllərdir. Haqlı olaraq akademik Bəkir Nəbiyev Şahin Fazili "qəzəlin dinclik bilməyən cəfakeş fəhləsi" adlandırırdı. Həqiqətən də, istər elmi fəaliyyətdə, istər ədəbi yaradısılıqda onun boş vaxtı yoxdur, çünki istənilən "boş" vaxt onun düşündüyü, yeni-yeni mövzulara keçid aldığı sakit hazırlıq dönəmidir. Özünün dediyi kimi:

*Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur.*

Heca vəznində yazdığı sadə xalq dilindəki şerlərinda olduğu kimi, Şahin Fazil vəzn, qafiyə, ritm xatirinə əcnəbi sözlərə, müraciət etmir, zəngin və ifadəli ana dilimizin imkanlarından məharətlə istifadə edir. Əbəs yerə deyildir ki, tanınmış filoloqlarımız, professorlar Qəzənfər Kazımov, Sabir Əliyev, Tərlan Quliyev və başqaları öz məqalələrində Şahin Fazilin divanlarını, onların dilini və qayəsini yüksək qiymətləndirmişlər. Doğrudan da, onun heç vaxt yazmaqdan dayanmadığı qəzəlləri, eləcə də 20 ildən artıq rəhbərlik etdiyi və hər həftə məclislərinin keçirildiyi "Məcməüş-şüara" ədəbi məclisindəki müasir qəzəlxanlarla yaradıcılıq işi poeziyamızın bu ***şah damarını*** daim canlı tutmaqdadır. Şahin Fazilın əlbəttə, çox incə, lirik şeirləri yüzlərlədir. Lakin indiki şəraitdə klassik şeirin ənənələrini yaşatmaq və divan ədəbiyyatını "diriltmək", eyni zamanda onu zənginləşdirmək gerçəkdən də xüsusi istedad və peşəkarlıq tələb edir. O, ədəbiyyatımızın bu ənənəvi sahəsindəki yaradıcılıq missiyasını özü daha sərrast ifadə etmişdir:

*Şahına, gül qoparır çoxları gülşənlərdən,*
*Gülşənə gül gətirən tazə qəzəlxanəm mən.*

Onun qəzəlləri "Doğruya doğru" adlandırdığı kitabında özünün qeyd etdiyi kimi, müasir dövrümüzün ədəbi dilindədir, mürəkkəb fars və ərəb tərkiblərindən azad, canlı, ifadəli və ahəngdar azərbaycan dilindədir:

*Qəzəldə millilik mütləq! Təmiz yaz saf əsər gəlsin!*
*Bu yolda şairə Rəbbim dəyanət ver, təpər gəlsin!*

Biz bu yazıda 80 illik yubileyi ərəfəsində təpədən dırnağa Azərbaycan vətənpərvəri olan, özünün ifadəsilə "atam ləzgi, anam buduqdur, özüm azərbaycanlıyam" deyən bu qocaman, lakin təpərli şairin poeziyasındakı Qarabağ dərdini, Qarabağ fəryadını qələmə almağı düşündük. Ona görə ki, Qarabağ mövzusu Şahin Fazilin bütün vətənpərvərlik şeirlərinin tam mərkəzindən keçən qırmızı xəttdir. Müstəqilliyin ilk illərində yazdığı bir şeirində o, bir peşəkar tarixçi olaraq zəmanənin gərdişindən dərs almayan xalqımızı da şair arabir yana-yana məzəmmət edir, bir zamanlar tarixdə ad qoyan, iz salan, dövlətlər qurmuş hökmdarlarımızı, qəhrəmanlarımızı köməyə çağırır, köməksizliyiə, əlacsızlığına üsyan edir:

*Niyə torpaqlarımı zəbt eləyib namərdlər,*
*Yanıram, ey Qarabağ, Azərbaycan yanıram.*

*Başımın tüstüsü əflakə çıxır görmürlər,*
*Ey urus, ey cuhud, ey türk, müsəlman, yanıram*

*Hanı şöhrət ki var idi, hanı şirvanlılarım?*
*Ağqoyunlu Həsənim – harda o sultan? Yanıram!*

*Niyə Şah İsmayılın xəncəri qalmış qında?*
*Düşmənimdən niyə axmır görəsən qan? Yanıram.*

*Yarmı nəzmin o Nizami deyilən şahından?*
*Hanı Xaqani kimi şe'rdə xaqan? Yanıram.*

*Kədərimdən yanıram, Şahinə su səpmə, gülüm,*
*Qoy yanım mən suya da eyləyib üsyan, yanıram.*

Qeyd edilməlidir ki, Şahin Fazilin ədəbi yaradıcılığına dair indiyədək bir neçə tədqiqat işi yazılsa da, ölkəmizin tanınmış alimlərinin kitab və məqalələri nəşr olunsa da, təəssüf ki, onun çoxşaxəli ədəbi yaradıcılığında vətənpərvərlik mövzusu, xüsusilə də onun Qarabağa həsr edilmiş yüksək poetik və məna tutumlu poeziyası ayrıca tədqiqata cəlb edilməmişdir. Belə poeziya nümunələri Şahin Fazildə hər zaman yaranır. Elə bu günlərdə akademik Yaqub Mahmudovun rəhbərlik etdiyi AMEA Abbasqulu Bakıxanov adına Tarix institutunun 2019-cu ildə hazırlayıb nəşr etdirdiyi elmi əsərlərin Milli Kitabxanada təqdimatı zamanı Şahin Fazilin yeni doğulan qəzəlini sahmana saldığının şahidi oldum, kitabın cazibəsinə həsr olunan bu qəzəldə bir çox mətləblərlə yanaşı, Qarabağ dərdi də var idi.

*Sualın cazibəsi var, cavabın cazibəsi,*
*Var gülün cazibəsi, var gülabın cazibəsi.*

*Qarabağ məsələsindən əzabım var mənim,*
*Hələ çoxmu çəkəcəkdir əzabın cazibəsi...*

*Haqq-hesab dövrü gələr, baxəbər ol ey düşmən,*
*Bizi qalib eləyər haqq-hesabın cazibəsi.*

*Səni eşq cazibəsi cəlb edər idi, Şahin,*
*Səni cəzb etmədə indi kitabın cazibəsi.*

Bu günlərdə Şahin Fazilə XIII əsr Azərbaycan ədəbiyyatının dəyərli türk (azərbaycan) dilli şeir nümunələrindən Səfəvilər sülaləsinin banisi Şeyx Səfiəddinin tarixçi professor Mehman Süleymanovun “Şeyx Səfiəddin” kitabından götürdüyüm bir neçə beytini oxudum:

*Göyərçin yolladım, yazdım sənə səndən şikayətlər,*
*Qolunda ol qanadlardır başıbağlı kitabətlər...*

*Səni Tanrı, necə səndən şikayət etməyim axır,*
*Hanı ol nazlı baxmaqlar, hanı gizlin işarətlər...*

Ertəsi gün bu aşiqanə qəzəlin təsiri və üslubu ilə yazdığı 11 beytlik qəzəl-təzmini mənə oxudu. Bir gecədə doğulan bu qəzəldə də Şahin

Fazil Qarabağ dərdini, köçkünlü, qaçqınlı, yaralı vətənimizin uzun sürən qaysaqlamamış yarasını yaddan çıxarmamışdı:

*Səfiəddin yazan beyti bəyəndim söylədim "əhsən"*
*Məni məşğul edir amma digər mövzu və söhbətlər....*

*Qarabağ torpağı bizdən haçandır gözləyir imdad,*
*Zülümlər qeybə çıxsınlar, iraq olsun əziyyətlər...*

*Ümidim çoxdur ey Şahin, səadətlər olar bol-bol,*
*Yerə yarəb, nəsib olsun nəhayətsiz səadətlər.*

Şahin Fazil hətta aşiqanə, konkret ünvanlı ilham pərisinə belə həsr etdiyi şeirlərində də Qarabağı unutmur. Onun poeziyasında Vətənlə sevgili yan-yana durur. Bu keyfiyyət onun 20 yaşındakı şerlərində də var, 80 yaşında yazdıqlarında da. Mənə elə gəlir ki, şairlər yaşlansalar da qoca olmurlar, çünki, onların ruhu həmişə cavandır. Tanıdığımız əksər şairlər ən gözəl şerlərini gənclik, yaxud cavan çağlarında yazmışlar. Yaşlıların da şerlərindəki fikir, müdrik ifadə və deyimlər daha xarakterikdir. Onlar az-az yazırlar, bəzən də bu şerlər o qədər də ürəyə yatan olmurlar, sanki ilhamsız. Sadəcə düşüncə və yazı texnikasının nəticəsi olaraq meydana çıxmış təsiri bağışlayırlar. Şahin Fazilə gəldikdə isə, onun ilham pərisi hər zaman başının üstündədir, qeyd dəftəri də dizinin. Görəndə ki, şahin (qartal) baxışları çox dərinlərə tuşlanıb, deməli içində şeir doğulur, həmin an qələmin kağız üzərində gərdişi başlayır. İlham pərisi ləngiyəndə "Mürəkkəbim ağlayır // Qələm gözləyir səni" deyir. (Bu günlərdə doğulan bu maraqlı şeirin mürəkkəbi hələ qurumayıb)

Qeyd edilməlidir ki, Şahin Fazilin Qarabağ mövzusuna birbaşa müraciəti ölkəmizdə erməni seperatizminin baş qaldırdığı və Ermənistanın işğal siyasətinin başlanması ilə eyni vaxta düşür. Bu zamana qədər bu mövzu onun ümumvətənpərvərlik şeirlərinin tərkibində yer alırdı. Amma quduz Ermənistanın işğalı başlayandan sonra bu mövzu Şahin Fazilin "sinə dağı" mövzusuna çevrilmişdir. Lakin o, Qarabağ şeirlərində sızlayıb ağlamır, əksinə bir şair qəlbinin çırpıntılarını vərəqə köçürür:

*Neçin könlüm xürrəm olmur, çağ olmur?*
*Neçin dağım bağça olmur, bağ olmur?*

*Qarabağın qara bəxti ağ olmur,*
*Ulu tanrım, bu dünyadan küsmüşəm.*

Yaxud bir başqa şerində Şahin Fazil yana-yana bir bayatı çəkir:

*Qarabağda yara – bağ,*
*Hara bağça, hara bağ?*
*Söyləməkdən "Qarabağ"*
*Dodaq göyərdi gömgöy.*

Ümumiyyətlə Şahin Fazilin 1990-cı illərin əvvəllərində Qarabağla əlaqədar şeirlərində daha çox bədbinlik və sarsıntı vardır. Nədən ana yurdumuzda düşmən at oynadır, doğma yurdu niyə qoruya bilmədik ? - bu suallar altında onun şair qəlbi sıxılır, suallarının cavabsızlığı da onu bir yandan üzür. Üzüntüdən də inləyən misralar çözələnir. Onun aşağıdakı qəzəli aydın göstərir ki, Qarabağ şair üçün sadəcə bir parça Vətən torpağı deyildir, bu, eyni zamanda millətimizin namus, qeyrət, ar məsələsidir:

*Zülmətdə çıraqsız kimiyəm mən Qarabağsız,*
*Odsuz və ocaqsız kimiyəm mən Qarabağsız.*

*Dostum qolunu çəkmə qolumdan ki, yıxıllam,*
*Neynim ki, dayaqsız kimiyəm mən Qarabağsız.*

*Cananə qəzəl yazmayıram xeyli zamandır,*
*Dildarə maraqsız kimiyəm mən Qarabağsız...*

*Günlərlə gərək mən "Qarabağnamə" yazaydım,*
*Amma ki, varaqsız kimiyəm mən Qarabağsız.*

*Bir ömrü Xudavənd hərəyə haqlı bilibdir,*
*Ömr etməyə haqsız kimiyəm mən Qarabağsız.*

*Şahin, qaragül bir papağım varsa da evdə,*
*Vallah, papaqsız kimiyəm mən Qarabağsız.*

Əslində Şahin Fazilin Qarabağla bağlı şeriləri, qəzəlləri, bayatıları, haykuları bir yerə yığılsa bu özünəməxsus bir "Qarabağnamə" sayıla

bilər. 1990-cı ilin əvvəllərində Vətən torpaqlarının bir-birinin ardınca düşmən əlinə keçməsindən ürək ağrısı ilə bəhs edən şair yazırdı:

*Sarmış Vətəni duman, İlahi,*
*Çox yaxşı-olub yaman, İlahi...*

*Qalmaqda bu gün ilan əlində,*
*Qıvrılmada Zəngilan İlahi...*

*Sınmış Laçının laçın vüqarı.*
*Ağlar Şuşa əhli qan, ilahi*

Qarabağ savaşı uzandıqca artıq bu şairin qəlbində bir nisgilə dönür, ürək ağrısı kimi onu göynədir:

*Zəfər istəyimi boğur hıçqırıq,*
*Çalınır çox hava, "Cəngi" çalınmır.*
*İndi Xan Şuşamın şüşəsi qırıq,*
*İndi Zəngilanın zəngi çalınmır.*

Şahin Fazil keçən əsrin 90-cı illərinin əvvəllərindən xəyanətkar qüvvələr tərəfindən Vətən torpaqlarının parçalandığını, satqınlıqla şəhər və rayonlarımızın müdafiəsiz buraxıldığını öz poeziyasında məzəmmət edir, özünə verdiyi suallara cavab tapa bilməyərək, öz şəxsində ümimiləşdirərək Vətəni müdafiəsiz qoyanları qəzəblə qınayır:

*Gözəl Qarabağı niyə itirdik?*
*O bağı, o dağı niyə itirdik?*
*Bu qədər torpağı niyə itirdik?*
*Nə qədər danışım özüm-özümlə?*

*Neçin bir kəniztək Şuşa satıldı?*
*Laçın bayquş adlı quşa satıldı,*
*Ağdam gəlmədimi xoşa, satıldı?*
*Nə qədər danışım özüm-özümlə?*

*Hanı şöhrətimiz Xocalı dədə?*
*Hanı ismətimiz Xocalı dədə?*

*Hanı qeyrətimiz Xocalı dədə?*
*Nə qədər danışım özüm-özümlə?*

*Bağban dərd içində, bağı qalmadı,*
*Bağında güllərin tağı qalmadı,*
*Daha ürəyimin yağı qalmadı,*
*Nə qədər danışım özüm-özümlə?*

Təqdirəlayiqdir ki, Şahin Fazilin son illərdəki Qarabağ şerlərinin əksəriyyətində dərd- kədərdən daha çox üsyan və qisas çağırışı vardır, Vətən torpaqlarının yağı düşməndən azad edilməsinə səfərbərlik dəvəti vardır, qələbəyə ümid və inam nidası vardır. Onun bir sıra şeirlərində şöhrətli, mübariz ulu babalarımızın müqəddəs ruhları naminə düşmənə qarşı qəzəb və nifrətlə dolu mübarizə əhval-ruhiyyəsi üstünlük təşkil edir:

*Harada o hunlar, hanı oğuzlar?*
*Yenə özümüzə qayıtmalıyıq.*
*Hanı o oğullar, hanı o qızlar?*
*Yenə özümüzə qayıtmalıyıq.*

*Xəyal arzulara dalıbdır yenə,*
*Ürəyi min güman alıbdır yenə,*
*Ümid özümüzə qalıbdır yenə*
*Yenə özümüzə qayıtmalıyıq.*

*Yenə özümüzə dönməliyik biz,*
*Alışıb-yanmasaq, sönməliyik biz,*
*Qıratı, Düratı minməliyik biz,*
*Yenə özümüzə qayıtmalıyıq.*

*Gülüstan, Türkmançay – xiffət dərsimiz,*
*Nə yaman uzandı həsrtət dərsimiz,*
*Ala bilmişiksə ibrət dərsi biz,*
*Yenə özümüzə qayıtmalıyıq.*

Şair inanır və oxucusunu da bu inama ruhlandırır ki, biz arxalı, yağı düşmənə qalib gəlib intiqamımızı alacağıq, torpaqlarımızı azad edəcəyik. Bir qəzəlində bu inamı olduqca şirin, ötkəm şəkildə ifadə edir:

*Sahib ollam yenə Xankəndimə, Allah qoysa,*
*Salaram düşmənimi bəndimə, Allah qoysa.*

*Pis günün ömrü çox olmaz, özüm ollam sahib,*
*Hər qarış torpağıma, kəndimə, Allah qoysa.*

*Azəribaycanı kafər ki, məəttəl qoydu,*
*Bir zaman mat olacaq fəndimə, Allah qoysa.*

*Qanlı caynaqlarını bənd eləmiş torpağıma,*
*Düşəcək caynağıma, bəndimə Allah qoysa.*

*Lap Pənah xan kimi, Şahin, buraraq bığlarımı,*
*Gedərəm mən yenə Xankəndimə, Allah qoysa.*

Şahin Fazil peşəkar fars dili mütərcimi kimi gənc yaşlarında Əfqanıstanda uzun müddət işləmiş, müstəqillik illərində dəfələrlə İranda, Türkiyədə, Yaponiyada, İraqda və başqa ölkələrdə səfərlərdə olmuşdur. Həmin ölkələrdə bir sıra müqəddəs məkanları ziyarət edən Şahin Fazilin arzusu biz Qarabağı düşməndən azad edəndən sonra Qarabağ torpağını öpərək ondan sonra müqəddəs Məkkə ziyarətinə getməkdir:

*Azad olsa Qarabağ üz tutuban Allahə*
*Gedərəm şövq ilə beytullaha Allah qoysa.*

*Ulu öndərləri hər yerdə ziyarət vacib!*
*Gedərəm çoxlu ziyarətgaha Allah qoysa.*

2016-cı ilin aprel döyüşləri bütün Azərbaycan xalqının milli ruhunu, döyüş əzmini hərəkətə gətirdiyi kimi, Şahin Fazilin də qarabağnamələrindən yan keçmədi. Bu qəzəldəki özünəməxsus qəhrəmanlıq və qisas hayqırtısı artıq təcavüzkara sərt bir xəbərdarlıq, qəti qələbimizə isə inamdan qaynaqlanır:

*Qarəbağdan qan iyi çoxdan çəkilmir, biz gərək,*
*Qan töküb, qan istəyək, yox başqa imkan, qan gəlir.*

*Dördcə günlük davadan sən yaz gələndə qorxmadın?*
*Sərt qışın gəlməkdədir, ey Ermənistan, qan gəlir.*

*Mərd igidlər, ər şəhidlər "intiqam al" qışqırır,*
*Torpaq altda hər şəhiddən, qan ki, hər an qan gəlir.*

Göründüyü kimi, bu qəzəl özü qarı düşmənə bir müharibə elanıdır, xalqımızın və ordumuzun intiqam əzmində olduğunun poetik ifadəsidir. Burada şair inamında qətiyyətli və hökmlüdür. Şair zəfər istəyinin bir an öncə yerinə yetməsinə can atır. Təsəvvür edə bilərik ki, biz Qarabağı, işğal altındakı bütün torpaqlarımızı azad edəndən sonra qocaman şairimiz nələr yazacaqdır. Əminik ki, biz də həmin zəfər nəğmələrinin şahidi olacağıq. Sonluğu da Şahin Fazilin bayatısı ilə bitirməyi uyğun bildik:

*Qan qalmaz, qada qalmaz,*
*Ürək fəryada qalmaz.*
*Alarıq Qarabağı,*
*Qarabağ yada qalmaz.*

**Eynulla MƏDƏTLİ**
*AMEA Fəlsəfə İnstitutunun*
*elmi işlər üzrə direktor müavini,*
*tarix elmləri doktoru*

## QUBA TARİXİ – VƏTƏN TARİXİNƏ QİYMƏTLİ TÖHFƏ

Azərbaycan mənbəşünaslıq və tarixşünaslıq elmi Vətən tarixinin şərəfli səhifələrinə həsr edilən qiymətli bir əsərlə zənginləşmişdir. Azərbaycan Milli Elmlər Akademiyasının Abbasqulu ağa Bakıxanov adına Tarix İnstitutunun Mənbəşünaslıq və tarixşünaslıq şöbəsinin müdiri, tarix elmləri doktoru , professor Şahin Fazilin yeddi yüz səhifəlik, geniş əhatəli tədqiqat əsəri — "Quba tarixi" uzun müddətdən sonra işıq üzü görmüşdür. Azərbaycan Respublikasının prezidenti İlham Əliyevin 2015-ci ilin noyabr ayında AMEA-nın 70 illik yubileyində tariximizin dərindən öyrənilməsi və təbliğ edilməsi sahəsində tarixçilərin qarşısına qoyduğu vəzifələri yüksək elmi məsuliyyət və milli təəssübkeşliklə yerinə yetirən Tarix institutunda hazırlanmış bu dəyərli kitabı on ildir Azərbaycan Respublikasının tarixini və mədəniyyətini, daxili və xarici siyasətinin ümdə məsələlərini, dünya ölkələri və təşkilatları ilə qarşılıqlı əlaqələrini mümkün olan bütün vasitələrlə yayan, ölkəmiz və xalqımız haqqında dolğun fikir formalaşdıran, bir sıra milli və beynəlxalq layihələri uğurla həyata keçirən Avropa Azərbaycan Cəmiyyətinin ("TEAS press Nəşriyyat evi") nəşr etmişdir. Milli əhəmiyyətli vəzifələri ardıcıl və yüksək səviyyədə həyata keçirən gənc ziyalı, TEAS- ın prezidenti Taleh Heydərovun təvazökar xidmətini burada ayrıca qeyd etmək lazımdır. Tarix institutunun direktoru, AMEA - nın müxbir üzvü, əməkdar elm xadimi, Azərbaycan Milli Məclisinin üzvü, professor Yaqub Mahmudovun və tarix elmləri doktoru, professor Tofiq Mustafazadənin redaktorluğu ilə tədqiqatçıların və geniş oxucu kütləsinin diqqətinə təqdim olunan bu sanballı əsərə İnstitutun görkəmli alimləri— AMEA-nın müxbir üzvü, professor İlyas Babayev, tarix üzrə elmlər doktoru, professor Kərim Şükürov və tarix üzrə elmlər doktoru Qasım Hacıyev yüksək rəy vermişlər.

Quba tarixi kitabı bundan əvvəl tarix elmimizdə hadisə sayılmalı olan, Azərbaycan və İran mənbəşünaslığının əsas simalarından biri, XVI

-XVII əsrlərin məşhur Azərbaycan tarixçisi İsgəndər bəy Munşi Türkmanın üç cildlik, iki min səhifəlik "Dünyanı bəzəyən Abbasın tarixi" ("Tarixe-aləm araye- Abbasi") mənbəsini fars dilindən böyük zəhmətlə tərcümə edən Sahin Fazilin Vətən tarixinə növbəti töhfəsidir. Qocaman tarixçimiz (əminəm ki, bu ifadəmdən inciməz, çünki bu ifadə ilə əsla onun fiziki yaşını nəzərdə tutmuram, bu günlərdə 76 yaşını haqlayan alim dostum iyirmi il əvvəl İranda işlədiyim zaman ilk dəfə gördüyüm kimidir, məncə heç bir il də qocalmamışdır, saç-saqqalı elə onda da bəyaz idi, indi də) Azərbaycanın orta əsrlər tarixinin peşəkar araşdırıcılarındandır. Bir sıra elmi monoqrafiyaların, İrana, Əfqanıstana, Yaponiyaya dair səfərnamələrin, xeyli sayda divanların və şeir kitablarının müəllifi olan bu şərqşünas alimin qəlbi eşq və ilhamla doludur və bu ilahi sərvəti ürəyəyatan qəzəlləri və özünəməxsus tərzdə yazdığı şeirləri ilə oxucularla paylaşmaqda xəsislik etmir, yeri gəlmişkən, özü də xəsis deyil, nə elmdə, nə də həyatda. Quba tarixinin yazılmasına da münasibətini o, doğulduğu ana torpağa övladlıq borcu ödəməsi kimi baxaraq belə ifadə etmişdir.

*Bu kitab — tarixi zəngin Qubamın tarixidir,*
*Yazdı ilham ilə Şahin, obamın tarixidir.*

Şahin Fazil yazır ki, əgər Azərbaycan torpağını tarixlərə şahid olan bir ağaca bənzətmək mümkünsə, Quba tarixi həmin ağacın bir budağıdır. Ağacın dolğun təsvirini verməkdən ötrü onun hər budağı, hətta hər yarpağı öyrənilməli, onu əhatə edən mühitə ayıq nəzər salınmalı, dərindən araşdırılmalıdır. Əslində, gərək bütün şəhərlərimizin, qəsəbələrimizin, kəndlərimizin tarixi yazılsın, gələcək nəsillərə çatdırılsın.

Orta əsr Azərbaycan, ərəb, İran, osmanlı tarixi qaynaqlarına istinad edən Şahin Fazil indiyədək elmi dövriyyədə olmayan, ilkin mənbə və sənədlərdə yatıb qalan çox maraqlı məlumatları araşdırılıb üzə çıxarmış, nəticədə Vətənimizin dilbər guşəsi olan Qubanın müfəssəl tarixini ərsəyə gətirmişdir. 19-cu əsrin görkəmli Azərbaycan tarixçisi A.A.Bakıxanova əsaslanan müəllif əsərdə Azərbaycan tarixində Şirvanın, burada da Quba və Dərbəndin tutduğu yerə diqqəti daha çox yönəltmişdir. Həm sasanilər dövründə, həm də ərəb xilafəti zamanında Qubanın, Şəkinin, Dərbəndin və Şirvanın digər məntəqələrinin əhalisinin türklərdən ibarət olduğunu, türk dilinin bölgədə aparıcı dil kimi tam yayıldığını (Azərbaycan türkcəsi

anlamında- E.M.) vurğulamışdır. Bu bölgədə ərəblərin xəzərlərlə iki əsr yarım davam edən müharibələri, xilafətin zəiflədiyi dövrdə baş verən hadisələri, monqolların, teymurilərin yürüşlərini, səfəvilərin və əfşarların zamanında Şirvandakı vəziyyəti, Qubada, Dağıstanda və ətrafdakı bölgələrdəki tarixi olayları çeşidli mənbələr üzrə qələmə almışdır. Tanınmış Azərbaycan arxeoloqu C.Ə.Xəlilovun tədqiqatlarına istinad edən müəllif Qubanın təqribən 1700 yaşı olduğu qənaətindədir. Əsərdə qeyd olunur ki, Quba adı Şirvanşahlar dövlətində yaşayış məntəqəsi kimi ilk dəfə XIII əsrdə "Dərbəndnamə" mənbəsində çəkilmişdir.

Şahin Fazil Quba tarixində ərəb müəllifləri İbn Hövqəl (XI əsr), Yaqut Həməvi (XIII əsr), Əbulfida (XIII-XIV) və başqalarından A.A.Bakıxanovun təqdim etdiyi maraqlı nümunələrə diqqəti cəlb etmiş, dövrün osmanlı qaynaqlarındakı maraqlı məqamları kitabında yerləşdirmişdir. Məsələn, Mustafa Ali Əfəndinin, "Künhül-əxbar" əlyazmasında qeyd olunur ki, 1578-ci ildə səfəvilərlə müharibədə Şirvanı ələ keçirən osmanlılar bu diyarı Böyük Şirvan və Kiçik Şirvan kimi iki əyalətə bölmüşdülər və mərkəzi Dərbənd şəhəri olan Kiçik Şirvanın 3-cü inzibati sancağı Quba idi. XVII əsrdə Səfəvilər dövlətində Quba Azərbaycanın əyalət şəhəri idi.

Nadir şahın hakimiyyəti (1736-1747) zamanı bu şəhərin Quba adlandırılmasını güman edənlər də vardır. Bu vaxtadək bu şəhər Qudyal adlanırmış. 1937-ci ildə Tiflisdə rus dilində nəşr edilmiş "Quba xanlarının fərmanları" kitabındakı 23 saylı fərmanda yazılmışdı ki, Şeyxəli xan 1807-ci ildən etibarən Qudyalın bir sıra kəndlərinin tiyul şəklində Ağa bəyə verilməsi haqqında göstəriş vermişdi.

Ş.Fazil Mahmud Qaşğariyə (XI əsr) əsaslanaraq Quba adının qıpçaqlarda, səlcuqlarda etnik nəsil bildirdiyinə diqqəti çəkir. Diqqətəlayiqdir ki, müəllif Quba-Qusar və Xaçmazda tarixən yaşayan bütün xalqlar barəsində həm ensiklopedik, həm də geniş təhlilli məlumatlar verir, onların mənşəyini, etnik quruluşunu, dilini, adət-ənənələrini təsvir edir, coğrafi adlarının ətraflı elmi şərhini verir. Azərbaycanın bu bölgəsində qədimdən sakin olan hunlar, sabirlər, xəzərlər, qıpçaqlar, oğuzlar, ləzgilər, tatlar, yəhudilər, xınalıqlar, buduqlar, qrızlar, ayrımlar haqqında maraqlı məlumatlar təqdim edir.

Kitabda XVIII əsrdə simal-şərqi Azərbaycan xanlıqlarının siyasi mərkəzi kimi Quba xanlığının tarixi daha geniş araşdırılmış, İran-Osmanlı müharibələrində Azərbaycanın Şirvan bölgəsində, o cümlədən

Qubada baş verən hadisə və münasibətlərə daha ətraflı yer verilmişdir. Quba xanlığının Rusiya ilə münasibətləri, Rusiya ilə İranın münasibətlərində Qubanın oynadığı rol, Quba xanlığının Dərbənd, Şamaxı, Bakı, Şəki, Qarabağ, Naxçıvan, İrəvan və digər xanlıqlarla münasibətləri ətraflı tədqiq və təhlil edilmişdir. Xüsusilə də, 1775-ci ildə Fətəli xanın Rusiyaya - çariça II Yekaterinanın sarayına nümayəndə heyəti göndərib İrandan tamamilə ayrılmaqla Rusiya himayəsində müstəqil hüquqla yer almasını xahiş etməsi, lakin gözlədiyi cavabı ala bilməməsi ilə əlaqədar məsələlər əhatəli araşdırılmışdır. Fətəli xanın gürcü knyazı II İrakli ilə siyasi sövdələşmələri, knyazla görüşüb nahar etməsi və bundan az sonra qəfildən xəstələnib vəfat etməsinə dair fikirlər maraq kəsb edir.

Professor Tofiq Mustafazadənin tədqiqatına əsaslanan müəllif Fətəli xanın şəxsiyyətini, onun Azərbaycan xanlıqlarını birləşdirib vahid dövlət yaratmaq cəhdini ilginc tarixi sənədlərlə oxuculara təqdim edir. Müəllifin məşhur Azərbaycanşünas alim Tadeuş Svyataxovskidən gətirdiyi sitat da çox xarakterikdir- « Fətəli xan öz qabiliyyəti və cəsarəti sayəsində böyük işlərə girişdi. Onun hədəfi, Quba mərkəz olmaqla,bütün Azərbaycanı birləşdirmək idi ».

Əsərdə Quba xanlığının qacarlar zamanında da İranla Rusiyanın siyasi münasibətlərində mühüm rol oynadığına ətraflı yer verilmişdir. Qeyd edilmişdir ki, XIX əsrin əvvəllərində Quba xanı Şeyxəli xan rus istilasına qarşı kəskin mövqe tutaraq ümumi müqavimət üçün işlər aparırdı, bu isə Rusiyanın Quba xanlığını işğal etmək niyyətini sürətləndirdi və 1806-cı ildə rus qoşunları Quba xanlığının əksər hissəsini işğal etdilər, lakin bununla Quba xanlığının ruslarla savaşı bitmədi, 1810-cu ildə İran şahzadəsi Abbas Mirzənin qoşunlarının Qafqaza - işğal olunmuş torpaqları Rusiyadan geri almaq niyəti ilə etdiyi yürüşlər zamanı Şeyxəli xan rus qoşunlarını Qubadan vurub çıxarmağa və dörd ay yenidən Qubanı idarə etməyə nail oldu. Bütün bu hadisələr kitabda sənədlərə və tarixi qaynaqlara əsaslanmaqla geniş şərh edilmiş, ruslarla qeyri-bərabər müharibədə Quba xanının ləyaqət və şücaəti vurğulanmışdır. Müəllif haqlı olaraq qeyd edir ki, 1813-cü ilin oktyabr ayının 11-də Rusiya ilə İran arasında bağlanmış Gülüstan müqaviləsinə görə Azərbaycanın bütün şimal xanlıqlarının (İrəvan və Naxçıvan istisna olmaqla ) , o cümlədən Quba xanlığının Rusiya tərəfindən ilhaq edilməsi bu bölgənin sonrakı taleyini tamamilə dəyişdi.

Kitabın təqdirəlayiq məziyyətlərindən biri də budur ki, burada

Rusiya—İran müharibələri nəticəsində Gülüstan (1813) və Türkmənçay (1828) müqavilələri ilə Azərbaycanın Araz çayından şimaldakı müstəqil xanlıqları Rusiya tərəfindən ilhaq edildikdən sonra Rusiyanın işğalçı siyasətinə qarşı Azərbaycanın bir çox yerində, o cümlədən Quba xanlığında qalxan üsyanlar barəsində ətraflı məlumatlar verilmişdir. Qeyd edilmişdir ki, xanlıqların ləğv edilib komendantların idarçiliyinə verilməsi hər yanda etiraz dalğaları yaratmışdı, lakin müstəmləkəçilik üsul-idarəsinə qarşı çıxanlara amansızcasına divan tutulurdu. Müəllifin görkəmli Azərbaycan ziyalısı, yazıçı-tərcüməçi Hüseyn Minasazovun 1926-cı ildə yazıb çap etdirdiyi Şirvan və Quba üsyanları haqqında məqaləsinə müraciət etməsi və oradakı maraqlı məlumatları kitaba daxil etməsi yerinə düşmüşdür.

Müəllif qeyd edir ki, Rusiya dövləti tərəfindən çar I Pyotrdan başlayaraq Cənubi Qafqazın müsəlman əhalisinin xaçlı ermənilər ilə «əvəz edilməsinə » yönəlmiş bir siyasət yeridilirdi, 1828-1830-cu illərdə İrandan və Türkiyədən Azərbaycana köçürülən 124 min ermənininin bir qismi də Şirvanda, o cümlədən Qubada yerləşdirilmişdi. Kitabda rus işğalından sonra 1831-ci ildə Quba əyalətində çarizmin idarəçilik sistemi, siyahıyaalma, vergi yığılması və başqa məsələlər haqqında da qiymətli məlumatlar verilmişdir. Bunların arasında « Quba əyalətinin kameral təsviri » kitabından gətirilən materiallar olduqca böyük maraq kəsb edir. A. Xotyanovskinin tərtib etdiyi bu kitabda Qubanın Qəçrəş kəndinin əhalisinin siyahısında ailə başçısı olan kişilərin sırasında (112 nəfər) bəhs etdiyimiz kitabın müəllifi Şahin Fazilin ulu babası Babay Daşdəmir oğlu da vardır.

Kitabda müəllifin özünün qeyd etdiyi kimi, Qubanın siyasi tarixinin ən şərəfli səhifələrindən olan 1837-ci il silahlı üsyanı barəsində geniş məlumat verilmişdir. Məsələn, Qafqaz Ali baş komandanı baron Rozen Qan çar I Nikolaya yazdığı raportda üsyanın səbəbinin yalnız çar ordusuna əsgər yığımı ilə əlaqədar görülən tədbirlərdən deyil, xalqın qəbul etmək istəmədiyi hərbi idarəetmə üsulundan qaynaqlandığını bildirmişdi. Əslində rus komendantlarının zülmü və talançılığı ilə yanaşı, bu idarə sisteminə xidmət göstərən yerli məmurların özbaşınalığı da xalqın hiddətini doğurmuşdu. Həmin dövrdə əhalinin çoxsaylı yazılı şikayətləri olmuşdu. Bunların əksəriyyəti Mirzə Fətəli Axundov tərəfindən tərcümə edilirdi. Bu ərizələrin içərisində Müşkür kəndinin sakinlərinin müraciətinin tam mətninin kitabda yer alması o zamankı ədalətsiz və tamamilə yad bir idarəçilik sisteminin doğurduğu həyəcanları bariz şə-

kildə göstərir. Quba əhalisinin böyük ümidlə xan adlandırdığı Hacı Məhəmmədin baççılığı ilə 12 min nəfərlik üsyançı xalq qoşununun çarizmin müstəmləkəçilik sisteminə qarçı mübarizəsinin kitabda geniş yer alması tarixi yaddaş baxımından çox əhəmiyyətlidir. Əlbəttə, bu üsyan amansızlıqla yatırıldı və üsyançılara rəhmcizcəsinə divan tutuldu.

Müəllifin məşhur fransız yazıçısı Aleksandr Dümanın Qafqaz səyahəti zamanı Quba haqqındakı təsviri materiallardan nümunələr gətirməsi indiki mənzərə ilə müqayisə baxımından maraq doğurur. Kitabda XIX əsrdə yaşayıb fəaliyyət göstərmiş Quba ziyalıları, müdrik və igid şəxslər, aşıq və sairlər, həmçinin həmin dövrün təhsil sistemi, təsərrüfat və məişət həyatı haqqındakı verilən tarixi məlumatlar bu gün üçün də çox dəyər kəsb edir.

Kitabın Quba XX əsrdə bölümü şübhəsiz ki, zaman yaxınlığı baxımından və siyasi keşməkeşliyindən dolayı daha ibrətamiz hadisələrlə zəngindir. Bu bölümdə Ş.Fazil Qubaya həsr etdiyi qəzəlindən bir beyti baş yazıya çıxarmışdır :

*Erməni soyqırımı…Şura…Siyasət dövrü…*
*Qubanın az idi, əfsus ki, rahət dövrü…*

Müəllifin bu fəsildə ermənilər və bolşeviklər tərəfindən amansızlıqla həyata keçirilən Quba qırğınları haqqınada sənədlərə və canlı şahidlərin söylədiklərinə əsaslanan məlumat və təhlilləri, ölkəmizin tanınmış tarixçilərinin tədqiqatlarından gətirdiyi iqtibasları gələcəkdə də bu dövrü araşdıracaq tarixçilər və siyasətçilər üçün etibarlı mənbədir. Qanlı repressiya illərində Quba əhalisinə, xüsusilə də ziyalılara, mötəbər şəxslərə qarşı Sovet rejiminin yeritdiyi genosid siyasətindən də kitabda ürək ağrısı ilə bəhs edilmişdir. Ürək necə ağrımasın? Axı millətimizi öz soykökündən, milli varlığından, dilindən, inancından ayrı salıb tədrici ölümə məhkum etmək niyəti ilə onun düşünən beyinləri, döyünən ürəkləri məhv edilirdi.

Kitabda müəllifin Akademik Həsən Əliyevə istinad edərək sovet qoşunlarının İrandan təcili çıxarılması ilə əlaqədar Stalinin Mircəfər Bağırovla telefon danışığından, həmçinin SSRİ Baş prokuroru Rudenkonun müttəhim Bağırovu dindirmə protokolundan gətirdiyi hissələr olduqca ilgincdir və bu böyük dövlət adamının ziddiyyətli şəxsiyyətini açmağa, hətta bir sıra milli fəaliyyətlərinin yüksək təqdirə layiq olduğu-

nu düşünməyə vadar edir. Çətin və mürəkkəb dövrdə, başqa millətlərdən olan doqquz partiya rəhbərinin bir-birini əvəz etməsindən sonra uzun illər Azərbaycana rəhbərlik etmiş qubalı Mircəfər Bağırovun məlum məhkəməsindən sonrakı həyatına da kitabda işıq salınır.

Kitabda Qubanın yəhudi qəsəbəsinin, ümumiyyətlə dağ yəhudilərinin tarixi, həyat və məişəti, inanc və ənənələri də ətraflı şərh edilmiş, yəhudilərin ölkəmizin ictimai, siyasi, elmi, mədəni həyatında tutduqları mövqe, oynadıqları rol vurğulanmışdır. Erməni işğalçıları ilə 1992-ci ildə döyüşdə şücaət və igidlik göstərmiş, həlak olandan sonra Azərbaycanın milli qəhrəmanı adına layiq görülmüş Albert Aqarunov haqqında qeydlər bu baxımdan çox əhəmiyyətlidir.

Professor Ş. Fazil kitabın « Quba rayonu Azərbaycanın dövlət müstəqilliyinin bərpasından sonrakı illərdə » bölümündə ulu öndər Heydər Əliyevin və Prezident İlham Əliyevin rəhbərliyi ilə bütövlükdə ölkəmizdə, o cümlədən Quba rayonunda həyata keçirilən irimiqyaslı, yalnız bu günə deyil, həm də uzun illər qabağa hesablanmış layihələrdən, əhalinin sosial-iqtisadi, mənəvi-siyasi inkişafındakı köklü dəyişikliklərdən söz açır. O, vurğulayır ki, XX əsrin 80-ci illərinin əvvəllərində Azərbaycanda ictimai- siyasi həyatın inkişafında mühüm irəliləyişlər Heydər Əliyevin şəxsiyyəti, onun çoxsahəli idarəçilik istedadı, siyasi-dövlətçilik fəaliyyəti ilə sıx bağlı idi. Heydər Əliyevin respublikamıza rəhbərlik etdiyi dövrdə xalqın həyatının və təsərrüfatının bütün sahələrində yüksəlişlə yanaşı, ölkənin iqtisadi zonaları, hətta ayrı-ayrı rayonları arasında istehsal üzrə səmərəli ixtisaslaşma da getmişdi. Ölkənin meyvə, tərəvəz istehsalında Quba və Xaçmaz rayonları Lənkəran-Astara və Şəki- Zaqatala ilə yanaşı əhəmiyyətli yer tuturdu. 1993-cü ildə artıq müstəqil Azərbaycana rəhbərlik etdiyi ilk gündən başlayaraq Heydər Əliyev ölkənin dövlət müstəqilliyini qoruyub saxlamaq və daha da möhkəmləndirmək tədbirləri ilə yanaşı, zəruri islahatların həyata keçirilməsinə, iqtisadiyyatın inkişafına xidmət edən mütərəqqi və demokratik qanunların qəbul edilməsinə nail oldu. Quba və qubalılar Azərbaycan dövlətçiliyinin yeni mərhələsində də fəal vətənpərvər mövqe nümayiş etdirdilər. Azərbaycan Respublikasının prezidenti, Ali Baş Komandan Heydər Əliyevin 2 noyabr 1993-cü il tarixində televiziya vasitəsi ilə ölkədə yaranmış ağır hərbi-siyasi vəziyyətdən çıxmaq, ölkəni üz-üzə qaldığı müstəqilliyi və dövlətçiliyi itirmək təhlükəsindən qurtarmaq üçün xalqa etdiyi tarixi müraciətə bütün Azərbaycan xalqı kimı, qubalı-

lar da böyük vətənpərvərliklə cavab verdilər. Bu çağırışdan az sonra təşkil olunan 487 nəfərlik Quba-Qusar könüllü batalyonu qısa təlimdən sonra Beyləqan-Ağcabədi-Füzuli bölgəsinə yola salındı.

Müəllif qeyd edir ki, Prezident Heydər Əliyevin 1998-ci ilin payızında Qubaya səfərindən sonra rayonun iqtisadiyyatının inkişafına diqqət daha da artırıldı.

Kitabın « Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev və Quba rayonunun sosial-iqtisadi vəziyyəti (2003-2012 ) » bölümündə şərəfli tarixi inkişaf yolu keçən, orta əsrlərin müxtəlif sınaqlarını adlayan, yeni dövrün və müasir günlərimizin daim genişlənən inkişaf dinamikasını ölkəmizin başqa bölgələrindəki kimi özündə əks etdirən, ölkəmizin sosial-iqtisadi, mənəvi və mədəni həyatında əhəmiyyətli rol oynayan, bütün sahələrdə inkişaf və tərəqqi edən Qubadan bəhs edilir. Müəllif qeyd edir ki, dövlət başçısı İlham Əliyevin Qubaya ardıcıl səfərlərinin başlanğıcını onun 11 oktyabr 2003-cü il tarixində Azərbaycan Respublikasının Baş naziri olaraq Olimpiya İdman Kompleksinin açılışı ilə əlaqədar Qubaya səfəri qoymuşdur. Sonrakı illərdə Prezidentin bu bölgəyə davamlı səfərləri böyük infrastruktur layihələrinin gerçəkləşməsinə, yeni-yeni kənd təssərrüfatı və sənaye sahələrinin yaranmasına və inkişafına təkan vermişdir. Diqqətəlayiqdir ki, 70 illik Sovet hakimiyyətində yolu olmayan tarixi Xınalıq kəndinə Qubadan 57 kilometrlik rahat yol çəkilmiş, müasir istehsal sahələri ilə yanaşı, rayonda təhsil, səhiyyə, idman, mədəniyyət və incəsənət sahəsində geniş quruculuq işləri aparılmışdır.

Müəllifin kitabda Qubanın elmi-ədəbi mühiti, yetişdirdiyi görkəmli şəxsiyyətlər, ictimai-siyasi xadimlər, elm, sənət adamları barəsində verdiyi dolğun məlumatlar da diqqətəlayiqdir. Burada qeyd etməyi lazım bilirəm ki, müəllif təvazökarlıqla öz adını bu sırada çəkməmişdir. Lakin vurğulamalıyam ki, kitabına yazdığı qısa ön sözündəki qəzəlinin son beyti belədir:

*Şahinin düzlüyünə Tanrı özü şahiddir,*
*Mən Quba torpağını Kə'bədən az istəmirəm.*

Fikrimcə, Vətən tarixi yüksək elmi təfəkkürlə yanaşı, həm də vətən-yurd sevgisi ilə yazılmalıdır. Professor Şahin Fazilin "Quba tarixi" kitabı məhz belə yazılmışdır.

**Əlizadə ƏSGƏRLİ**
*AMEA Nizami Gəncəvi adına Ədəbiyyat İnstitutunun elmi işlər üzrə direktor müavini, Filologiya elmləri doktoru, professor*

## ŞAHİN FAZİL DİVANLARININ BİRİNCİSİNƏ İNCƏ BİR NƏZƏR

Tarix elmləri doktoru, professor Şahin Fazil "Divan"larının birinci cildini (Azərnəşr, Bakı, 1996, 456 s.) mənə bağışlamışdı. Tanış oldum. İstedadına heyran qaldım. Mətnlər mükəmməl, dil və üslubu kifayət qədər aydın, duru və axıcı. Əruzu və hecası yerində. Klassik bədii ənənələri ilə birlikdə. Məhəbbət mövzusu ürək, beyin və ruhdan–bir insan fitrətindən başlanğıc götürüb halə-halə, dalğa-dalğa yayılır, hüdudsuzluğa, ənginliyə qovuşur. Vahid mövzu və haləsində, əhatəsində əlvan-əlvan, rəng-rəng motivlər. Müasirlik, çağdaşlıq "Divan" üçün təminat, yüksək səviyyə göstəricisi. Poetik Sözün gələcəyinə etibarlı əmanət!..

Şahin Fazilin bu "Divan"ı formaca, məzmunca Yaxın və Orta Şərqin "Divan" ənənələrinə bağlıdır. Mahir sənətkar islam təfəkkür qaynaqlarına, islam düşüncəsinə əsaslanmış, onları klassik şeir şəkillərində ifadə etmişdir. Lakin bu "Divan" müasir bədii fikir və düşüncəmizin daha çox ifadəsidir. "Divan" əruz və heca vəznlərinin imkanları əsasında bağlanmış, klassik "Divan"ların ənənəvi janrlarında, əruz vəznində – "Divan" şeirinin qaydaları, poetika tələbləri əsasında qələmə almışdır. XI-XVI əsrlərə qədər divan tərtibatı belə gəlmişdir. Məhəmməd Əmani, Şah İsmayıl Xətai öz "Divan"ını əruzda, klassik şeir janrlarında yazmaqla bərabər, oraya hecada, xalq-aşıq poeziyası üslubunda yazdığı şeirlərini də daxil etmişdir. Şahin Fazil də bu formanın davamçısıdır.

Şair Divanın ön sözünə (dibaçə) müsəcce (qafiyəli nəsr) səpkisində başlamışdır: "*Bismillahir-rəhmanir-rəhim!*

*Ulu pərvərdigara şükürlər olsun ki, nəhayət, əlli yaşımdan sonra ilham köhlənimi dördnala çapdım və az bir vaxtda, hal-hazırki yüzilimizdə ana dilimizdə kiçik bir "divan" yazaraq böyük bir rahatlıq tapdım. Bu mübarək qədəmin atılmasına və bu çətin yolda sevdalı ürəyimin bir neçə illik əziyyətə (bəlkə də ləzzətə!) qatılmasına belə bir səbəb var: həmişə dönə-dönə və yana-yana düşünmüşəm ki, "Divan" uzun illər boyu ədəbiyyatımızın və ədəbi həyatımızın doğma övladı olduğu halda, nə üçün indi yaranmasın və şeir pərimizin pərişan*

*zülfü "Divan"darağı ilə daranmasın? Nə üçün müasir şeirimiz bu yolda qələm işlətməsin, qədəm atmasın və məqsədə çatmasın? Nə üçün müasir oxucu sabiq ənənəmizi bir daha yad etməsin və müasir "Divan" mütaliəsi zövqünə yetməsin? Odur ki, özümün və gözümün zəifliyinə baxmayaraq, sözümün səyahətini "Divan" məmləkətinə tərəf yönəltdim, həmin məmləkət gülşəninə bir səbət gül səpdim və böyük bir şərəfə yetdim:*

*Şahina, gül qoparır çoxları gülşənlərdən*
*Gülşənə gül gətirən tazə qəzəlxanəm mən.*

Dibaçə ənənəvidir –füzuliyanədir, pafoslu, təntənəli, obrazlıdır. Şair Məhəmməd Füzuliyə ehtiramını bildirmiş, onun şərəfinə "Fazil" təxəllüsünü götürmüş, belə təvazö ifadə etmişdir ki, kaş onun da qəlbində fəzl bulağından bir qətrə çağlayaydı!

Qeyd olunmalıdır ki, Şahin Fazil Füzuli nəsihəti olaraq qəzəllərini, şeirlərini sadə dildə yazmağa səy göstərmiş, hətta bu yolda bəzi mühafizəkar qələmdaşları tərəfindən də qınanmışdır! Şair yazır:

"Etiraf etməliyəm ki, elə özüm də qəzəl yaradıcılığına qəliz qəzəllər yazmaqla başlamışam. Keçən əsrin 60-cı onilliyinin əvvəlləriydi. Əfqanıstanda işləyirdim. Mən həmin dövrdə o nəhəng qəzəl ustadımız Məhəmməd Füzulinin təsiri ilə qəzəl ümmanına girdim və boş vaxtlarımı onun gəliz qəzəllərinin mütalisi ilə keçirdim. Bir qədərdən sonra özözünə dedim: "Ey dadi-bidad, bu zəmanədə bu nə qəzəllərdir ki, qələmə alırsan və ərəb-fars sözlərini bilməyən kəsləri ələmi salırsan?" Bu münvalla bir neçə qəliz dəftərimi cırıb atdım və demək caizsə, təmiz qəzəllər yaratdım. Qətiyyən səhv etməmişəm və əlli ildir ki, bu olub ədəbi-bədii peşəm. Köhnə yoldan həzər etdim və sabiq yazılarımdan sərfnəzər etdim, çünki əcnəbi kəlmələr dilə "düşvar" gəlir və mən qəzəlxana qəzəli qəliz demək ar gəlir. İndi gəl qəlizdil qəzəlxanları inandır və onlara de ki, mən şərqşünasa qəliz nəzm etmək asan qəzəl yazmaqdan xeyli asandır: Məsələn:

*Dəstimə öylə ki, ol türreyi-tərrar gəlir,*
*Çeşmimə şəşəeyi- şöleyi-ənvar gəlir.*

*Ey mələkxu, daha mən əzmi-fəraq eyləmərəm,*
*Səni giryan gözəli gözlərimə tar gəlir.*

*Cari olduqca sirişkin sanıram, ey məhru,*
*Xiz edib sahilini ruyimə əbhar gəlir.*

*Xəndə et sən ki, şəvəm mən də sənintək xəndan,*
*Xəyyir ol, fikrimə əndişeyi-xəyyar gəlir.*

*Həbbəza, aşiqi təşbih edirəm mən nəxlə,*
*Sanıram əğyarı gördükdə xəsü xar gəlir.*

*Ey qəzəlxan nə zəbandır bu bəyan olmaqda?*
*Nə süxəndir bu düzürsən, bu nə göftar gəlir?*

*Yamayırsan dilinə sən ərəbi-farsı hədər,*
*Axı əbyate mürəqqe dilə düşvar gəlir.*

*Belə yazmaq qəzəli xeyli asandır, Şahin,*
*Mən qəzəlxanə bu cür nəzm eləmək ar gəlir".*

*(Şahin Fazil. "Doğruya doğru".*
*Bakı, "Elm və təhsil", 2018, 1224 s.; s.1181-1182).*

"Divan" müəllifi Azərbaycan şeirinin əruz gülüstanından bigümandır. O səbəbdən ki, "yazan da çətinlik çəkir, oxuyan da. İtib-batır alağın içində qızılgül də, süsən də, reyhan da". Söz ustadı fərqindədir: *"Öz milli dilinin sözlərini soraqlayan və "Divan" bağlayan hər şair ehtirama layiqdi!"*

Şahin Fazil "Divan"ının əsas mövzusu dediyimiz kimi sevgidir. Lirik "Mən" məhəbbətində cəfakeşdir, sevgilisinə etibarlıdır, onun intizarında, iztirabındadır. Məşuqunu görəndə ruhlanır, sevinci, nikbinliyi çoxalır, bədgümanlığı azalır. Bu məhəbbət kamala dolmur, yanğılı görünsə də, kama çatmır. Aşiq məhəbbətin cismani, zahiri deyil, onun metafizik, irrasional mahiyyəti ilə yaşayır. *Bu sevginin zahirində məlal, batinində kamal dayanıb.* Şahin Fazil sevgisində təsəvvüfə (sufiliyə), arifliyə (irfana) varır, müdrik və kamil olmaq istəyir. Fəqət əqlə, kamala yetmək mümkünmü? Mahiyyət və mənanın daimi olan ehtiyacı aşiqi mükəmməl olmaq iddiasına gətirib və o, inanır ki, yalnız müqəddəslərin, ənbiya və övliyaların qibləsini tutmaqla haqqa qovuşmaq olar! İlahi eşqə, Sözə və irfani hüsnə yetinmək olar! Şahin Fazil sevgi və qəzəl aşiqidir.

*Əyyami-qədimlərdən gələn əli əsalı dərviş, dili dualı mömin, ağ saçlı nurani və müdrik piranidir! Şahin Fazil sözün həqiqi və məcazi mənalarında həm klassikdir, həm də çağdaşdır!*

Şair toplusuna ictimai məzmunlu şeirlər də daxil etmişdir. Sənətkarın sosiallığı onun çağdaşlığıdır. Axı o, həm də zəmanəsini, zəminəsini yaşayır. Haqqın əmanət bildiyi ömür payını yaşayır. *Bu mənada Şahin Fazil Vətəndir, keçmiş, bu gün və gələcəkdir. Torpaqdır, Qarabağdır, mənəvi-əxlaqi dəyərdir.*

Ustad sənətkarın yazdıqları oxunaqlı, görümlü-baxımlıdır, məxmər kimi yumşaqdır, mənalı və məzmunludur, su kimi axıcı və rəvandır. Şair bu günkü zəngin ədəbi dilimizlə bədii üslubunu bülövə çəkmişdir. Poetik dilimizin imkanlarını ustalıqla səfərbər etmiş, ləyaqətlə sınamişdir. Və şair inanır ki, hələ neçə-neçə divanı ədəbiyyatın və əbədiyyətin yol yoldaşı olacaqdır...

Şahin Fazilin divanı *"Münacat, nət, qəsidə", "Qəzəllər", "Nəzirələr", "Təxmislər", "Tərci", "Sürud", "Qitələr", "Səkkizliklər", "Rübailər", "Dördlüklər", "Təkbeytlər", "Bayatılar", "İthaflar", Təbriklər", "Müxtəlif şeirlər", "Dəri dilində şeirlər" və "Xatimə"* hissələrindən ibarətdir.

Biz təhlilimizdə şairin dini mahiyyətli əsərlərinə üstünlük veririk. *Münacat* Quranın əl-Bəqərə surəsinin 199-cu ayəsi ilə başlamış (*"... və Allahdan bağışlanmaq diləyin, şübhəsiz ki, Allah bağışlayan və rəhm edəndir") və* səkkiz şeirdə ehtiva olunmuşdur. Birinci və ikinci şeirlər bilavasitə Allah-taalaya müraciətdir. *Əruzun dördbölümlü həzəc bəhrində, məfUlü, məfaUlü, məfaUlü, fəUlün təfiləsində* olub Allah-taalanın izzəti-cəlalını tərif edir:

*Bizlər nəçiyik, Aşiq özün, Yar özünsən,*
*Hər neməti yoxdan eləyən var özünsən.*

*İllətli edən hər şeyi, əlbəttə, səbəbdir,*
*Hər illətə, ey Tanrı, səbəbkar özünsən.*

*Canlandı yox ikən canı, torpaq idi Adəm,*
*Kamil yaradıbsan bizi, pərgar özünsən.*

*Hər fərdi özün xəlq eləyibsən, ulu Tanrı,*
*Hər fərdə şərafət bu ki, sərdar özünsən.*

*Şəkk eyləsə hər kim sənə insan deyil əlbət,*
*Əlbəttə ki, insanlara meyar özünsən.*

*Məzlumların əlləri hər dəm sənə doğru,*
*Qəddarı edən dərdə giriftar özünsən.*

*Səbr ilə əlac olmalı hər dərdinə fərdin,*
*Səbr etməyi vəhy ilə edən çar özünsən.*

*Hərçənd könül mülkümi Şahin bəzəyibdir,*
*Hər mülkə yəqindir bu ki, memar özünsən.*

Şeir *"özünsən"* rəfidi üzrəndə qurulmuş, bəndlər *aa, ba, ca...* qafiyə quruluşuna əsaslanmışdır. (Qəzəl,qəsidə, qitə, nət formalarında). *İkinci şeir* məsnəvi formalıdır, yəni aa, bb, cc... qafiyə quruluşundadır. *Əruzun üçbölümlü məfUlü, məfAilün, fəUlün təfiləsindədir.* Sanki Nəsiminin ilahiləri, nəfəs və təsəvvüfiləri ritmində, ahəngindədir. Şeirin musiqiliyi çoxdur, bunu əruzun uzun, qısa saitlərinin izlənməsi, şifahi xalq şeirlərinin təkərləmələri, bir az da Sabirin bəhri-təvillərinin havacatını yada salır; əlavə edək ifadə vasitələrinin fonetik anaforaları, leksik epiforaları, alliterasiya və assonanslarını:

*Qur'an ki inam yaratdı məndə* (m,n,a)
*Etdim sənə etiqad mən də.* (e,t,ə,m,n)
*Dəmdən-dəmə həsrətim yoxaldı,* (d,m,y,r)
*Ya Rəb, sənə heyrətim çoxaldı.* (ə, a, y, r)
*Quran da özün, quran da* sənsən, (d, a,ə,n)
*Ulduzları yandıran da sənsən* ( a, n, d)
*Yoxluqları var edən də* sənsən. (ə,a, n, l)
*Varlıqları xar edən də* sənsən. (a,r,ə,d)
Bir *zərrəni dağ edən də* sənsən. (r,i,d,ə)
Bir *nəhri bulaq edən də* sənsən. (r,b,d,ə,i)
*Şimşəkləri çaxdıran da* sənsən, (ş,ə,i,a,ə)
*Dəryaləri axtıran da* sənsən. (r,d,a,ə)
*Xəlq eyləmisən bu kainatı,* (ə,l,a,i)
*Sənsən yaradan bütün həyatı.* (a,t,d,y)

Bu münacatda lirik "mən" etirafları iłədir, cüz ilə küllün, vəhdətlə vücudun ifadəsidir.

*Üçüncü münacatın* rədifi *"La ilahə illəllah"*dır, 8 beytdir, *əruzun həzəc bəhrində,məfUlü, məfAİlün,, məfUlü, məfAİlün təfiləsindədir.* Şeirin ritmi, ahəngi bölgü, rədif, qafiyə ilə bərabər, sait və samit səslərin, fonetik hadisələrin bir-birini izləməsi və ahəng qanununda, sait və samit ahəngində, bədii mətnin özü və ideya-məzmunundadır:

*Söylədim hər nə qədər, "La ilahə illəllah",*
*Zəhmətim verdi səmər "La ilahə illəllah".*

*Eylədim həqqə dua, söylədilər yar gəldi,*
*Bu xəbər yaxşı xəbər, "La ilahə illəllah"...*

*Dilimin virdi olubdur bu gözəl kəlmə, dilim*
*Dedi hər şamü-səhər "La ilahə illəllah".*

*Qola qüvvət, gözə nur, əqlə səfa bəxş etmiş,*
*Yetirib qəlbə təpər "La ilahə illəllah".*

*Nəzərim göylərə sancıldı müdam Allahım,*
*Şahinə eylə nəzər, "La ilahə illəllah".*

Şahin Fazilin *dördüncü münacatı* üçbölümlü *əruzun həzəc bəhrində, məfUlü, məfAilün, fəUlün təfiləsindədir.* Bu münacatda lirik subyekt öndədir. Əgər əvvəlki münacatlarda Allaha xitab kainatın, varlığın, vəhdəti-vücudun Onun ətrafında, yektaya bağlılığındadırsa, bu şeirdə artıq Allahın varlığı subyektdə, lirik "mən"in mənəviyyatında, batinindədir. Lirik subyekt Allahından bağışlanmaq diləyir,– ömrün fəlsəfəsi budur. *Qüdrətli, ülvi, əzəmətli olmağı bacar və əfv et!* Şeir dialoji monoloqdur:

*İdrak da verən, kamal da sənsən,*
*Hicran da verən, vüsal da sənsən.*
*Sən – xaliqimiz, qərar sənindir,*
*Biz bəndənik, ixtiyar sənindir.*

Bədii mətnin sonunda şair *"görürsən"* rədifini verib, bu rədif bütün misralarda təkrirlənməklə (şifahi xalq şeirdə təkərləmə, zəncirbənd) ritmi sürətləndirib, vəcdi coşdurub:

*Tanrım, baxıb hər yanı görürsən.*
*İnsandakı şeytanı görürsən.*
*Şeytandakı nöqsanı görürsn,*
*Nöqsandakı tüğyanı görürsən.*
*Tüğyandakı meydanı görürsən.*
*Cövlandakı imkanı görürsən.*
*İmkandakı hər anı görürsən.*
*Hər andakı imkanı görürsən.*

*Beşinci münacat* əruzun dördbölümlü *məfUlü, məfaUlü, məfaUlü, fəUlün* təfiləsindədir. Artıq bu münacat – bədii mətn birinci şəxsə münasibətin təkindədir. Llirik "Mən" məmnundur, ruhlu, mənəviyyatlıdır, etiraflarıyladır. Batini onu xoşbəxt etmişdir. Çünki:

*Üz tutan göylərə sidq ilə mənəm hər dəfə*
*"Qülhüvallahu əhəd" söyləyənəm hər dəfə...*

*Nə gözəl səslənir, Allah, müdam "Bismillah",*
*Nə səlis yazdı bu məfhumu qələm hər dəfə...*

*"Qülhüvallah" desən, Şahina, "Allah" desən,*
*Səni tərk eyləyəcək dərdü-ələm hər dəfə.*

*Altıncı münacatda* lirik "mən" səhvini, günahını başa düşmüş, Allahından əfv diləmişdir. Şeir *əruzun ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir.*

*...Hərçənd babam namaz qılardı,*
*Pak isminə etiqadı vardı.*
*Yaddır mənə dəstəmaz, əfsus,*
*Mən qılmamışam namaz, əfsus,*
*"Birdir" – demişəm, – həyat əfsus*
*Mən verməmişəm zəkat əfsus.*
*Mən tutmamışam oruc, əfsus,*
*Ömrüm belə oldu puç, əfsus.*

Şair *yeddinci münacatda* təbii xəyalata dalır: *"Var çox səbəbi desəm səbəbmi?"* Odur ki, lirik "mən" səhvlərindən mətləb hasil edir, buraxdığı səhvlərini düzəltmək istəyir, laməkan fikrini vacib bilir, dualarına sığınmaq istəyir. Şeir *əruzun ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir.*

*Şahin, dəyişib zamanə indi,*
*Ver fikri o laməkanə indi.*
*Quranimə bəsləyib vəfa mən,*
*Gündüz-gecə eylərəm dua mən...*
*Ərzim bu və məsləhət sənindi,*
*Düzgün yola düşmüşəm mən indi.*
*Xətm oldu sözüm "Münacatınla",*
*Fəxr eyləyirəm o pak adınla.*
*Tez-tez deyərək də "La ilahə ..."*
*"...illəllah"ı eylərəm izafə.*

Şahin Fazilin *səkkizinci münacatı* hecadadır, müxəmməs üstündədir, beşinci misrasının təkrarı ilə tərcidir, 8 bənddir*, aabac, ddedc...* qafiyə quruluşundadır:

*Ötməyib ömrüm hədər*
*Cavabım ulduz qədər.*
*Günahlarım da olub,*
*Üzr günahdan betər,*
*Allah, bağışla məni.*

Müəllifin *nəti* 5 qəzəl və 5 rücudan (müraciət) ibarət olub Həzrət Məhəmmədin (s.ə.s.) mövludu münasibətilə yazılmışdır. Nət Quranın əl-Bəqərə surəsinin 252-ci ayəsi *("Sən həqiqətən göndərilən peyğəmbərlərdənsən"),* Quranın ən-Nisa surəsinin 80-ci ayəsi ilə başlanmışdır *("Peyğəmbərə itaət edən şəxs şübhəsiz ki, Allaha itaət etmiş olur").* "Peyğəmbərin mədhidir. Oynaq bəhrlərdədir. *Birinci qəzəl* əruzun *həzəc bəhrində, məfUlü, məfAİlün, məfUlü, məfAİlün təfiləsində* yazılmışdır:

*Zənn eyləmə gerçəklik hər fərdə görünməkdə,*
*Bir gerçəyin üstündə min pərdə görünməkdə.*

*...Göy qübbəsinin sirri göylərdəsə yəqin ki,*
*Yer kürəsinin sirri mehvərdə görünməməkdə.*

*Beynimdə lehimləndi məna, ulu bir məna,*
*Məna ki dedim "Allah-əkbər" də görünməkdə...*

*Şahin, o Məhəmməddi, gerçəkliyi görmüşdü,*
*Zənn eyləmə gerçəklik hər fərdə görünməkdə.*

*Birinci rücuda* şair Füzulidən poetik qüdrət, peyğəmbər salavatullahdan əfv, üzrxahlıq diləyir.

*İkinci qəzəl* tamamən mənalandırmadır. *Həzəc bəhrində, məfUlü, məfAİlün, məfUlü, məfAİlün təfiləsindədir:*

*Mən sözşünasam, söz ki bu dünyanı tutubdur,*
*Qəlbin gözü hər sözdəki mənanı tutubdur.*

*Alim o kəsə söylə ki, elmində ziya var,*
*Aşıq o kəsə söylə ki, sevdanı tutubdur.*

*... Şahin, bu nə sirdir, rəsul insanlar içində*
*Allah Məhəmməd təki insanı tutubdur?*

Şair *ikinci rücuda* cahiliyyətdən, vəhşiyyətə tövbədən danışmış, haqq elçisinin gəlişi və cümlə-xilqətin səhvlərə, günahlara tövbəsindən bəhs etmişdir. Leksik təkrirlərdən kifayət qədər istifadə lirik "Mən"in psixoloji-mənəvi emosiyasını, həyəcanlarını poetik ifadə etmiş, məsnəvi qafiyələr, səs və söz, ifadə uyuşmaları, təqti, assonans və alleterasiyalar, təkrirlər bolluğu, əruz vəzninin uzun və qısa saitlərə aludəliyi bədii mətni xeyli ahəngdar etmişdir. Rücu *əruzun ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir:*

*Birdən-birə zahir oldu elçi,*
*Mərd oldu, bahadir oldu elçi...*
*...Ya elçi, edəydi cümlə xilqət*
*Nöqsanlara tövbə, tövbə, tövbə.*
*...İnsanları sövq edirsə küfrə,*
*İnsanlara tövbə, tövbə, tövbə.*

*Üçüncü qəzəldə* Şahin Fazil sözün gücü ilə sehrbazlıq etmiş, heyrətamiz harmoniya yaratmış, sait və samit səslərin bir-birini izləməsindən, səs uyuşmalarından, fonetik, leksik təkrirlərdən, ahəng qanunundan, qafiyənin yeri və çeşidlərindən, əlvanlığından məharətlə, ustalıqla istifadə etmiş və *rucudakı* tövbə qavrayışını bütöv mətndə, əruzun *həzəc bəhrində, məfUlü, məfAİlün, məfUlü, məfAİlün təfiləsində* canlandırmışdır.

*Acı söz deməк yaraşmaz, bizə, ey nigar, tövbə,*
*Sənə intizar tövbə, mənə intizar tövbə.*

*Sənə tövbə bəlli olsa, əməlin təməlli olsa,*
*Təməlin əməli olsa ürəyində var tövbə.*

*Ümidim, ümidgahım yenə tövbədir pənahım,*
*Mənə cənnəti günahım gər ola, açar tövbə.*

*Bu sözə xətir qoyulsun, bu kəlam ətirlə dolsun,*
*Elə and içək ki, olsun bizə iftixar tövbə.*

*Sualım cavab alıbdır; O kitabdan qalıbdır,*
*O cənabdən qalıbdır bizə yadigar tövbə.*

*O kəlam məram olarsa, ona ehtiram olarsa,*
*Edəcək inam olarsa, bizi bəxtiyar tövbə.*

*Alışıb-yanır bu Şahin, yalanı danır bu Şahin,*
*Bunu and sanır bu Şahin ki, budur qərar: Tövbə!*

*Üçüncü qəzəlin üçüncü rücusunda* peyğəmbər salavatullahın (s.ə.s.) gəncliyindən başlamış, Ficar, Xeybər, Bədr, Uhud savaşlarına qədər islamın artan ehtişamından, rəsul-əkrəmin rəsulluğu, kamilliyi, haqq-ədaləti, fəziləti, iradəsi və səbrindən bəhs edilmişdir. Qəzəl *ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir:*

*Xoşbəxtlik imiş əzabı həqqin,*
*Vəhy oldu sənə kitabı həqqin.*

*İnsanə ləyaqət oldu ziynət,*
*Quranə məhəbbət oldu ziynət.*

*Dördüncü qəzəldə* Şahin Fazil hər beytdə bir motivə varmış, bədii mətni əlvan rənglərlə bəzəmişdir. Qəzəl *əruzun həzəc bəhrində, məfUlü, məfAİlün, məfUlü, məfAİlün təfiləsindədir.* Mahiyyətində dünyəvi və ilahi eşq, mərhəmət və insanpərvərlik dayanmışdır:

*Mən ki, söz zərgəriyəm, hey gəzirəm zər dildə,*
*Deyirəm gül bitə qoy, bitməyə xəncər dildə.*

*Başlaram sözlərimi yazmağa "Bismillah"la,*
*"Qülhüvallahu əhəd"dir daha əzbər dildə.*

*Allah-allah, necə avazdı gözəl "İnşallah",*
*Sanki axmaqdadı zəmzəm suyu, kövsər dildə.*

*Bu fəna mülkdə dil bağı gülüstan olacaq,*
*Var isə "lalə", qızılgül" və "sənubər" dildə.*

*Qeysin "eşq" kəlməsi Leylayə cəvahir kimidir,*
*Gözəlim, aşiqə vardır neçə cövhər dildə.*

*O şəkər dillə mənim ömrümü şirin elədin,*
*Ömür olmaz acı gər var isə şəkkər dildə.*

*Yaranıb xeyli gözəl söz cahan içrə, Şahin,*
*Ən gözəl sözsə "Məhəbbət" sözüdür hər dildə.*

*Dördüncü qəzəlin dördüncü rücusunda* – hasil olmuş *nətin* fikir şövqündən, fəzlindən bəhs olunmuş, şair 4 nətdə 4 savaba yetdiyini bəyan etmiş, şair yenidən sonuncu elçiyə – Məhəmmədi-Qureyşiyə üz tumuşdur. Rücu *ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir:*

*Ey fəxri olan bu kainatın,*
*Örnəkdi bizə bütün həyatın.*
*Göylərdə də iftixar özünsən,*
*Allahə yaxın ki var, özünsən!*

*Beşinci qəzəldə* –şair insanın haqqa doğru yol götürməsi, gözəlliyə yetməsi, zərrəcə Allaha yaxınlaşmasının hesabı, mahiyyət və fəlsəfəsi üçün həzrəti-rəsula hesabat vermiş və beşinci rücuda xitabın fəlsəfəsi

belə ifadə olunmuşdur. Qəzəl *ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir:*

*Hər nə'timi söyləmək – fəxarət,*
*Şənində şeir demək – fəxarət.*
*Çox şeirdə əks olub həyatın,*
*İslamə şərəfdi möcüzatın.*
*Göylərdə də iftixar özünsən,*
*Allahə yaxın ki var, özünsən!*

Nətlə başlayan şeir nətlə tamamlanmışdır. Şahin Fazil Quranın ən-Nisa surəsinin 170-ci ayəsini epiqraf gətirmişdir: *"Ey insanlar! Peyğəmbər Rəbbimizdən haqq ilə gəldi. Ona iman gətirin! Bu sizin üçün xeyirli olar"*. Sənətkar nətdə peyğəmbər-salavatullahın şərəfini bu düşüncələrlə vəsf etmişdir: *"Mürsəllər içində mötəbər, ziynəti-bəşər, sərvəti-kainat, sərdəftəri-möminat"*... Şair bütpərəstliyə alüdəlikdən, məstlikdən çıxmaq və islama varid olmağın şərafətini belə ifadə eləmişdir. Nət *ikibölümlü mütədarik bəhrinin fAilün, fəil təfiləsindədir:*

*Şəxsində cahan buldu elçi,*
*İslamə Məhəmməd oldu elçi*
*Bir böylə işə səbəb nə oldu?*
*Böylə rəvişə səbəb nə oldu?*
*Söz yox, səbəbə səbəb səbəb var,*
*Hər bir səbəbi bilir Səbəbkar!*
*Ey bizlərə dini sevdirən kəs,*
*İslamə səlam edən müqəddəs.*
*Ey göyləri dinləyən Rəsulim,*
*Xaliq sözünü deyən Rəsulim.*
*Hər ləhzə Sənə səlam bizdən.*
*Dərgahinə ehtiram bizdən!*

Şair rəsuli-əkrəmin dərgahına ehtiramdan, xitabdan sonra nəqletmə təhkiyəsində gerçəkləri poetik vəsf etmiş, *"Niyyət ki"* anaforası", *"yol açdı"* epiforası –bədii təkrirlər hissi-psixoloji halı xeyli gücləndirmişdir:

*Çəkdin nə qədər əzab-əziyyət,*
*Məqsudə yetişdi ali niyyət.*
*Niyyət ki ibadətə yol açdı,*
*Niyyət ki zərurətə yol açdı.*
*Niyyət ki şərafətə yol açdı,*
*Niyyət ki fəxarətə yol açdı.*
*Niyyət ki xilafətə yol açdı,*
*Niyyət ki qəzavətə yol açdı,*
*Niyyət ki cəsarətə yol açdı,*
*Niyyət ki həmiyyətə yol açdı,*
*Niyyət ki həqiqətə yol açdı,*
*Niyyət ki məhəbbətə yol acdı,*
*Niyyət ki şəfəqqətə yol açdı,*
*Niyyət ki ədalətə yol açdı,*
*Niyyət ki fəzilətə yol açdı,*
*Allahə ibadətə yol açdı,*
*Ey xidməti zəhmətindən üstün,*
*Ey zəhməti xidmətindən üstün.*

Bədii mətn–təsvir və ifadə, emfatik vurğular yenə xitablarla davam etdirilmiş, məsnəvi təhkiyəsi, nidalar dramatizmi gücləndirmiş, həmcins sadalamalar həyəcanların artan gücünü ifadə eləmişdir:

*Ey bizləri kamiran edən kəs,*
*Tanrı sözünü bəyan edən kəs.*
*"Tövhid" səsi sənə yetəndə,*
*Allah ilə söhbətin bitəndə,*
*Qurani-Kərim kəramət oldu,*
*İsmi-şərifin şərafət oldu.*
*Ey Məkkə-Mədinə iftixarı,*
*Ey cümlə müsəlmanın vüqari,*
*Ey cümlə müsəlmanın dühasi,*
*Ey müslimin ilki, ibtidasi*
*Ey cümlə müsəlmanın qüruri,*
*İslamımızı edən zəruri.*

Şahin Fazil mətnə 8 bəndlik *müxəmməs* əlavə etmişdir ki, *qiymətli şərəfnamədir*. *Dördbölümlü rəməl bəhrinin fAilAtün, fAilAtün, fAilAtün, fAi-*

*lün təfiləsindədir:*

*Tanrını yad eylərəm hər vədə, həm Peyğəmbəri,*
*Ən mübariz, ən mətin, ən möhtərəm Peyğəmbəri,*
*Anmada fikrim, düşüncəm dəmmədəm Peyğəmbəri,*
*İstəməkdir xislətim, mən istərəm Peyğəmbəri,*
*Ya Məhəmməd, Tanrının ey möhtəşəm Peyğəmbəri.*

Peyğəmbər-salavatullahın mövludu münasibətilə yazılmış qəsidədə belə bir ayə verilmişdir: *"Mənə itaət edən Allaha itaət etmiş olur. Mənə üsyan edən, Allaha üsyan etmiş olur." (Məhəmməd. "Hədisi-şəriflər"indən). Məhəmməd Allahın rəsulu və peyğəmbərlərin sonuncusudur"(Quran. Əl-əhzab, 40).*

Qəsidədə "Ya Məhəmməd Mustafa" rədifi ilə 25 beyt verilmiş, həyatından bəzi faktları xatırlanmış, əsasən, peyğəmbər-salavatullahın şəni vəsf edilmişdir. Fəqət şair ülvi insan, nəbi, rəsul, ilk müsəlman Məhəmməd Mustafaya dastan əvəzinə, qəsidə ithaf etdiyini də etiraf edir, suçlanır. Məhəmməd (s.ə.s.) çox soylara fəxr olan Qureyşilərdəndir. O, dünyaya gəlməmiş atası Abdullah həyatını dəyişmiş,rəsulun mövludundan öncə hicranı gəlmiş, hələ cocuqkən Dürri-yetimin Aminə adlı anası dünyadan köçmüş, əmisi Əbdülmütəllibin qayğısı ilə böyümüşdür.

Peyğəmbər (s.ə.s.) gənclik çağından müdrikləşmiş, xalq əqlinə heyran qalmış, Qurani-Kərim onun möcuzəsi olmuşdur. Əlbəttə, rəsulun Allahı təbliğ edən tövhidinə bütpərəstlər üsyan etmişlər. Lakin o, qeyri-adi fitrətilə zülmətdə çıraq tək parlamış, müqəddəs Kəbəni çıraqban eləmiş, cahiliyyət dövründə çox müslümə qüdrət vermiş, kafirləri pərişan qılmışdır. Düşmən təqibindən məcbur olub Məkkədən Mədinəyə hicrət etmiş, bəşər övladı kimi, Allahın lütfiylə meracda olmuşdur:*"Səndə Peyğəmbər dühası, Səndə məntiq, Səndə fiqh, Səndə hikmət, Səndə ürfan, ya Məhəmməd Mustafa".*

Sovet dövründə, 70 il Peyğəmbər-salavatullah mədh olunmamış, din qadağan edilmiş, artıq iblisi-məlun aradan götürülmüş, rəsuli-əkrəmin yenidən şəninə qiymətli sözlər söylənilmiş, "rəyincə dövran dövr etmiş", Şahin, Samit, Mahir, Mail tək qəzəlxanlar yetişmiş, bülbülə gülüstan bəxş olunmuşdur. *Türk Dəyanət vəqfinə bir "Nət" göndərdim bu* il,–deyən şair, çox nəzərdən qaldı pünhan, ya Məhəmməd Mustafa,– deyə giley edir, özündə ruhun rahatsızlığını bulur, xiffətlənir... Şeir *dördbölümlü rəməl bəhrinin fAilAtün, fAilAtün, fAilAtün, fAilün təfiləsindədir:*

*İndi ümmidim qalıb münsiflərin insafına,*
*Qıl kömək, lütf eylə ehsan, ya Məhəmməd Mustafa!*

*Mən bu gün nahəqq yerdə, Sən bu gün həqq yerdəsən,*
*Şahin olsun həqqə qurban, ya Məhəmməd Mustafa!*

... Şahin Fazil "Divan"da *289 qəzəl, 65 nəzirə, 23 təxmis, 1 tərcü, 1 sürud, 47 qitə, 7 səkkizlik, 46 rübai və dördlüklər, 38 təkbeyt, 32 bayatı, 23 ithaf və təbriklər, 38 müxtəlif şeir, dəri dilində isə 7 şeir* vermişdir.

Divanda qəsidə və nətdən sonra *nəzirələr* hissəsi gəlmiş və şair *65 nəzirə* yazmışdır, Şəms Təbrizi, Xacu Kirmani, Məhəmməd Füzuli, Məhəmməd Əmani, Osmanlı şairi Mustafa Naili, Allahi, Arif Şirvani, Seyid Əzim Şirvani, Məhəmmədağa Cürmi, Səməd Mənsur və Əlağa Vahiddən qaynaqlanmışdır. Bu nəzirələrin mövzu və motivləri sevgi, hicran, iztirab, əxlaq, sosial, təbiət, din, vəcd, Vətən – Azərbaycan, Qarabağdır:

*Qalx ayağa, yatma bu Şahin kimi*
*Səcdə elə yarə, dua vaxtıdır.*

Bu nəzirələr təbii ki, əruzdadır, forması: dübeytdir, hamısı rədiflidir, Məhəmməd Əmanidən olan nəzirə rədifli və qafiyəlidir. *Yox, yenə yoxdur yarım, əksi qabağımdadır, Zümzüməsi, şərqisi, rəqsi qulağımdadır* (M.Əmanidən). "Elə ki, oldu bu can sən gözəlin heyranı, Xoşlanıb sevgi odundan oda saldım canı" *(rəməldə),* "Təzədən gəlmiş o dilbər, məni salmış yadə, Sanıram yoxdu mənim tək sevinən dünyadə" *(rəməldə)* nəzirələri rədifsizdir. Qafiyəsi: *rədiflə özündən əvvəlki sözün qafiyələnməsi:*

*Leylinin Məcnun idi heyranı,*
Sənəsə *Azəribaycan heyran.*

*Rədifdən əvvəlki sözün qafiyələnməsi, yalnız mübtədası qafiyəli olan təkrirlər:*

*Dilbərim vədə verdi ki, gələcək,*
*Vədəsi əskik olmasın bizdən.*
*Şahinə çöhrəsi günəş kimidir,*
*Çöhrəsi əskik olmasın bizdən.*

Misradaxili qafiyələr:

*Zər nədir, zivər nədir, yaqut nədir, gövhər nədir?*
*Eşq bazarında, nigarım, ehtiram almaq gərək.*

Sadalama intonasiyalı qafiyələr: *üzüm* gülmür, *gözüm* gülmür, *sözüm* gülmür, əzabım var". Sadalama intonasiyalı və söz əvvəli ilə mətniçi qafiyələr: *səadətlər, sədaqətlər, şəfəqqətlər* çiçəklənsin, *xəyanətlər* tamam bitsin, *rəzalətlər* tamam olsun. Bölgünün ikinci hissəsində, təqtdə qafiyə:Təmənna eyləyərkən mən *vəfa, heyfa, cəfa* gördüm, Həzin könlümdə matəm var, o bir dəm şadiman olmaz. *Xüsusi isimlərdə belə qafiyə:*

*Bezdim Kərəm əfsanəsi, Rüstəm nağılından,*
*Meylim səni istər, Kərəmi, Rüstəmi neynir?*

Şahin Fazilin altı sənətkardan: Şah İsmayıl Xətai, Məhəmməd Füzuli, Seyid Əzim Şirvani, Mirzə Ələkbər Sabir, Məhəmmədağa Cürmi və Əlağa Vahiddən *təxmisləri* vardır. Ş.İ.Xətaidən 1, M.Füzulidən 11, S.Ə.Şirvanidən 4, M.Ə.Sabirdən 2, M.Cürmidən 1 və Ə.Vahiddən 3 təxmislər. Həmin təxmislərin bənd quruluşu demək olar ki, eynidir, yəni əksər bənd *aaaaa, bbbba, cccca, ...* şəkillidir.Təxmislər 14,15,16 hecalarına uyğundur, yəni əruzun əsasən həzəc, rəməl, mütədarik bəhrləri və onların müxtəlif növlərindədir. Belə demək olar ki, Şahin Fazil Azərbaycan əruzunun sanki əksər bəhrlərindən istifadə etmişdir. Sənətkar bəndləri əksər halda rədiflərə tabe tutmuş, nadir hallarda qafiyəli bənd quruluşundan faydalanmışdır.

Daha anlaşıqlı olsun deyə *M.Ə.Sabirdən* nümunə veririk. *Rəməldə:*

*Hansı aşiqdir görən mən tək peşiman olmasın?*
*Hansı dərd vardır ki,olsun , amma dərman olmasın?*
*İstərəm min bir qəm olsun, bircə hicran olmasın,*
*"İstəsən könlüm kimi zülfün pərişan olmasın*
*Ol qədr cövr et mənə ah etmək imkan olmasın".*

*Şahina, tüğyandı aləm , səbr elə, tüğyanə döz,*
*Olsa da zəqqum kimi dövran acı, dövranə döz,*
*Sən ki, mərdsən, hər bəlayə tab elə, mərdanə döz,*
*"Sabira, ümmidi-vəsl ilə qəmi hicranə döz,*
*Hansı bir müşküldü kim, səbr ilə asan olmasın?"*

Şahin Fazil divanında *1 tərci, 1 sürud və 47 qitə* vermişdir. Şair *"Mənə ol yar "yar" söylərdi"* misrası ilə başlayan tərcidə *"sözlərdi", "gəzdik", "hicranı", "olmuşdu"* rədifli mətnə "Bilmədim noldu ol cananə, Yenidən verdi yol hicranə" məsnəvi beytini 5 dəfə tərci – əlavə etmişdir.

Sənətkar klassik fars şairlərinin divanlarında işlənmiş *Sürud* janrından 1 şeirdə faydalanmışdır. Mətn mürəbbe formalı, 7 bənddir, qafiyə quruluşu *aaaa, bbba, ccca, ddda, ...* kimidir. Hər bənddə sonuncu misra:*"Gözəlim, mən yenə rüxsarını görmək dilərəm"* – sintaktik təkriri işlənmiş və yenə hər bənddə rədifdən istifadə olunmuşdur.

*Təkcə cismani gözəllikmi o rüxsardə var?*
*Ya ki, irfani gözəllikmi o rüxsardə var?*
*Yoxsa ruhani gözəllikmi o rüxsardə var?*
*Gözəlim, mən yenə rüxsarını görmək dilərəm.*

*Qitələrin* hamısı, demək olar ki, sevgi mövzusundadır, 43-ü rədiflidir. 4 qitə rədifsizdir, qafiyəlidir. Rədifsiz olanlar 11 hecalıya uyğundur. Qitələr 11,14,15,16 hecalıya uyğun olub əruzun, əsasən *həzəc, rəməl, səri, xəfif, mütədarik bəhrindədir*. Üçbölümlü bütöv naqis rəməldə:

*Yaxşı yaraqlanmalı söz ləşkərim,*
*Məğlub olar ordu –yaraqlanmasa.*

*Bir dəxi hicran ayaq açmaz bizə*
*Bəxtimizin yolları bağlanmasa.*

*Qəlbə xalından da qara xal düşər*
*Qarə saçın gündə daraqlanmasa.*

*Yan həmişə eşq oduna , ey könül,*
*Şölə görünməz ki, çıraq yanmasa.*

31, 34, 36 və 46-cı qitələr 10 hecalıdır, *əruzun mütədarik bəhrindədir.*

*Qələmim zənn elə xortum boyda,*
*Varağım sanki olub Qum*[1] *boyda.*

*Bir böyük çömçə ikən hicranım,*
*Azalıbdır, olub ovcum boyda.*

[1] İranın Qum adlı şəhəri – Ə.Ə

*Sanıram Təbrizi həm görsəm mən ,*
*Gileyim qalmayacaq qum boyda.*

*Niskilim xeyli azalmış Qumda,*
*Bir çinar idi, olub tum boyda.*

45-ci qitə 11 hecalıya uyğundur. *Üçbölümlü bütöv naqis rəməldədir:*

*Ey Yaradan, gəl mənə imdad elə*
*Bir neçə ziddiyyəti məlum edim.*

*Aya nədir niyyəti insanların,*
*İstəyirəm niyyəti məlum edim.*

*Hikmət olan sirri qılım aşikar,*
*Sirrə dönən hikməti məlum edim.*

*Şəxsi əməl, şəxsi fikir, şəxsi iş...*
*Lütf elə, şəxsiyyəti məlum edim.*

*Əyriliyi, doğruluğu, düzlüyü,*
*Mənliyi, heysiyyəti məlum edim.*

*Bəlli, kəmiyyət görünür gözlərə,*
*Bəs necə keyfiyyəti məlum edim?*

*Şərbət olan zəhri müəyyən qılım,*
*Zəhrə dönən şərbəti məlum edim.*

*Var iki can – birgə nədir, ayrı nə?*
*Mən nə təhər vəhdəti məlum edim?*

*Kim bizə haqq verdi ürək qırmağa?*
*Qoy bu səlahiyyəti məlum edim.*

*Bir belə ev yıxmağa, qan tökməyə*
*Bais olan hiddəti məlum edim.*

*Bəsdi qaranlıqda qara görməyim,*
*Saflığı, qüdsiyyəti məlum edim.*

*Yox buna şəkk, illəti var illətin,*
*Yardım elə illəti məlum edim.*

Şahin Fazil mükəmməl əruz təəssübkeşi olmasına baxmayaraq, divanına *heca vəznli çoxsaylı bədii şeirlər* də daxil etmişdir. Bunların mövzusu məhəbbət və onun aid olduğu əxlaqi motivlərdir.

"Divan"da 8 *səkkizliklər də* verilmişdir. 1-cisi 4+4+3, 2,3,4,5,6,7və 8-cilər 6+5 bölgülüdür. Onlar 2 bəndlik mətnlər olub qafiyə quruluşu birinci bənddə *abab,* qalan bəndlərdə *aaab* şəkillidir, bəzi səkkizliklər isə çapnaz qafiyəlidir, yəni *abab* kimi.

Şahin Fazil *rübailərlə dördlükləri* eyni başlıq altında vermişdir.Nədən? Hecada olanlar 4-lük, əruzla olanlar rübaidir. Fərq varmı? Bunların sayı cəmi 46-dır. 24 –ü rübaidir. Bir də fərq bu səbəbdəndir ki, bəzi heca şeirləri çarpaz qafiyəlidir : *abab.* Rübailər əruzdadır, *aaba* qafiyə quruluşludur. "Tanrı" şeiri. *Müzarədə:*

*Dərd əlindən ürəyim yarə olub, ey Tanrı,*
*Gözümün yaşları fəvvarə olub, eyTanrı.*

*Yar gedəndən bəri qar tək ağarıbdır saçlar*
*Hər günüm qır kimi qapqarə olub, ey Tanrı.*

Yaxud, *həzəcdə:*

*Dünya niyə dinc olmur, avazı həmin avaz,*
*Nadanı həmin nadan, qanmazı həmin qanmaz.*

*Çox-çox cavanın gördüm, sustaldı canım, amma*
*Hərçənd qocadır Şahin, pərvazı həmin pərvaz.*

Rübai və dördlüklərin mövzusu, əsasən, ictimai-siyasi və məhəbbət planındadır. Şeirlərin 22-si hecadadır. Bir nümunə: *4+4+3 bölgüsündə:*

*Yaranıbdır, ölməlidir bu dünya,*
*Varlığını silməlidir bu dünya.*
*Əvvəl-axır bu dünyanın axırı,*
*O dünyanın əvvəlidir bu dünya.*

"Divan"da *38 təkbeyt (müfrəd, bənd)* verilmişdir. Bunlar əruzda və hecadadır. Əruzda 30, hecada 8 təkbeytdir.*Əruzda:*

*Cümlə yoldaşlara təklif edirəm eşq yolun,*
*Bu yolun yoldaşı olmazsa, yol olmaz yoldan.*

Hecada:

*Torpağa gül deyil, güllə əkilir,*
*Susub Qarabağda bülbülün səsi.*

"Divan"da *32 bayatı* və *xoyratı* da verilmişdir. Bunların mövzusu *vətən, sevgi, kədər, ümid, təbiət, dünya, inam, yaş, həyat, ölüm, Araz, qocalıq, söz, ölüm, qocalıq, qala,– bir sözlə psixoloji-mənəvi və etik-estetik* olanlardır:

*Bir udum,*
*Su ver içim bir udum.*
*Dama-dama göl olar,*
*Dama-dama qurudum.*

*Bəzz qalasından olmaz,*
*Qız qalasından olmaz.*
*Nizaminin qurduğu*
*Söz qalasından olmaz.*

*Ey Vətənim, söz mənim,*
*Qələm mənim, söz mənim.*
*Hey baxıram hüsnünə,*
*Hüsn sənin, göz mənim.*

*Sevincə,*
*Sevil incə, sev incə.*
*Gəl, sevinək, qarışsın*
*Gülüm, sevinc sevincə.*

*Bir azdan,*
*Görüşərik bir azdan.*
*Ölsəm, qəbrim üstünə*
*Su çiləyin Arazdan.*

*Daşladı,*
*Fələk məni daşladı.*
*Cavanlığım bitməmiş,*
*Qocalığım başladı.*

*Bağbana gül gərəkdir,*
*Natiqə dil gərəkdir.*
*Sevgilim, sənə isə*
*Şahin Fazil gərəkdir.*

Şahin Fazilin *ithaf və təbriklərindən* 10 qəzəl Məhəmmədhüseyn Şəhriyar, 7 qəzəl Rüstəm Əliyev,1 qəzəl Ənvər Nəzərli, 1 qəzəl Rüstəm Samit, 1 qəzəl Ələkbər Şahid, 1 qəzəl Həkim Qəni, 2 qəzəl Sabir Əliyev, 1 qəzəl Məmməd Nuri, 1 qəzəl Hacı Mail, 1 qəzəl Ağaxan Abdullayev haqqındadır.

Şairin "Divan"ında *"Müxtəlif şeirlər"* başlığı altında heca vəznində 38 şeir vermişdir ki, onların əksəriyyəti *sevgi, öyüd-nəsihət, əxlaqi və sosial* məzmunludur.O,

7-liklər, 8-liklər, 9-luqlar, 10-luqlar, 11-liklər, 12-liklər,13-lüklər, 14-lüklər, 15-liklər, 16-lıqlar işlətmişdir. Şeirlərinin bəndi isə 2, 3, 4, 5, 6, 7... misralıdır.

"Divan"da 1 *hipostasa formalı* mətnə də rast gəldik, yəni 1 altı bəndik rədifsiz, qafiyəli qəzələ və 35 bəndlik çarpaz qafiyəli qoşmaya. Belə:

*...Mən eşqi pəsənd eyləyən aşiqlərə–munis,*
*Mən eşqi pəsənd eyləməyən adəmə yadəm.*

*Şahin, havatək hər adama sevgi gərəkmiş,*
*Oldun mənə Həvva, gözəlim, mən sənə Adəm.*

*...Yuxudan ayıldım qan-tərə batıb,*
*Elə ki, üzümü yana çevirdim*
*Gördüm ki, sevgilim yanımda yatıb,*
*Yeganə Həvvamı yanımda gördüm.*

"İlham pərisinə" şeiri isə anaklaza formalıdır, yəni mətnin misraları 7 və 11 hecalıdır:

*Çox gözəllər göz önündən yan düşür,*
*Sənsə mənim gərəyim.*
*Nə olsun ki, gözüm işıqdan düşür,*
*İşıqlıdır ürəyim,*
*Ey şux ilham pərisi!*

... Şahin Fazil ümumən zəngin əruz vəzninin bütün sirlərinə vaqifdir. O, şeirlərini bu vəznin əksər bəhrlərində yazmışdır. *Sənətkar milli ədəbi dilimizin hüdudsuz imkanlarından istifadə etməklə mükəmməl poeziyasına muğam nəfəsi gətirmiş, onlara heyrətamiz musiqi aşılamışdır:*

*Bu əruz vəzni, a Şahin, nə gözəl musiqidir –*
*Elə bil Qudyal axır, bəh, yenə Tərtər tökülür.*

Biz Şahin Fazil "Divan"larının birinci cildinə ötəri baxış ifadə etdik. *O, Sözə nəfəs ötürən sənətkardır. Bədii sözün namusunu, izzəti-nəfsini qorumaq, onu ucalarda saxlamaq, bədii mətnin damarlarına qan vermək, sənət üçün ürək qoymaq, zəka yandırmaq Şahin Fazil ruhunun ecazıdır.* Deyirlər ki, vaxt qızıl deyil, ondan artıqdır. Doğurdan da, belədir. Şahin Fazil poeziyası ömürlərdən vaxt qazanmaq əzmində, əzəmətində olan poeziyadir. Şahin Fazilin şeir "Divan"ı ömrümdən vaxt qoparıb yazıya gələn, əbədi yaşamaq haqqını bu cür də bəyan edən əbədiyaşar poeziyadır. *Söz Tanrının nəfəsidir! Söz Şahin Fazilin şüur və məfkurəsidir, Söz Şahin Fazilin kökləri, rişələridir!..* Unutmur ki, unudulmasın!

***23 yanvar – 9 fevral 2020-ci il.***

**İsmayıl MƏMMƏDLİ**
*AMEA Nəsimi adına Dilçilik İnstitutu,*
*Tətbiqi dilçilik şöbəsinin müdiri,*
*Filologiya elmləri doktoru, professor*

## ÖZÜ, SÖZÜ BÖYÜK VƏ DƏYƏRLİ OLAN ŞAİR VƏ ALİM DOSTUM ŞAHİN FAZİL

Hər bir bəşər övladı həyatda özündən sonra müəyyən nişanələr, izlər qoyub gedir. Bu, dünya bina olunandan belədir. Hərə öz sənətinə, peşəsinə münasib işlər görür, qurur-yaradır, yadigarını, könül əmanətlərini gələcək nəsillər üçün ərməğan edir. Bu mənada elm adamlarının fəaliyyəti, alim əməyi daha məsuliyyətli, şərəfli və çətin olması ilə seçilir. Biz bu günlərdə 80 yaşını qutladığı ömrünün 57 ilini təhsilə, elmə həsr etmiş A. Bakıxanov adına Tarix İnstitutu Azərbaycanın orta əsrlər tarixi şöbəsinin baş elmi işçisi, tarix elmləri doktoru, professor şair, tərcüməçi Şahin Fazil Fərzəliyev barədə danışmaq istərdik. Şahin Fazil tarix elmimizi inkişaf etdirən alimlərimizdəndir. 40 ildən artıqdır ki, onun imzası elmi, ədəbi ictimaiyyətə yaxşı tanışdır, doğmadır.

*"Şairlər, şairlər, bircə söz üstə.*
*Sübhədək yaxdınız ürəyinizi.*
*Sizi görmədilər heç vaxt diz üstə*
*Qəribə yaradıb təbiət sizi.*

*Şair – Fikirlərin çırpınan seli,*
*Şair – Həqiqətin müğənnisidir.*
*Şair – Təbiətin danışan dili,*
*Şair – Cəmiyyətin üsyan səsidir*

*Şair – Zəmanənin, əsrin vicdanı,*
*Şair – Tarixlərin şərəfi, şanı,*
*Şair – Bu dünyaya zamanın sözü.*
*Şair – Həqiqətin, haqqın aynası"*

Bütün bu keyfiyyətlər, açıqlamalar, qənaətlər sevimli şairimiz, istiqlal şairimiz, xalq şairimiz Bəxtiyar Vahabzadənin (bu şeiri Bəxtiyar müəllim 1969-cu ildə yazmışdır) obrazını, özünü bütünlüklə, təpədən

dırnağa qədər sözün tam mənasında bizə təqdim edir. Mən əsrdaşım, çağdaşım, şair, alim dostum, şərqşünas, tərcüməçi 50 ilin qələmdaşı olan, zəhmətkeş səbir mücəssəməsi Şahin Fazili də bu keyfiyyətlərlə, ürək genişliyi ilə, cəsarətlə səciyyələndirmək istərdim.
Şahin Fazil belə yazır:

*Kaman işığı var, tar işığı var,*
*İşığın avazla qışqırığı var.*
*Şimşək işığı var, bərq işığı var,*
*İşığın işıqdan fərq işığı var.*
*Ürək işığı var, göz işığı var.*
*Fikir işığı var, söz işığı var,*
*Qışqırır, işığın qışqırığı var,*
*Raket işığı var, peyk işığı var*
*Günəş işığı var, od işığı var*
*Qəlbimdə "işığa, oda şığı" var,*
*Qarabağ adında yurd işığı var.*
*"Yurd – düşmən əlində, yurda şığı" var.*
*Dünyanı işıqlı kəslər yaşadır,*
*Yaşasın işıq –*
*Xeyirli işıq,*
*Faydalı işıq,*
*İşıq görmək üçün bir yaranın işıq!*

*("İşıq" şeirindən, 2013)*

Diqqət etsək görərik ki, istedadlı, təkrarsız şair işıq sözünün, obrazının nə qədər dürlü-dürlü çalarını fərqləndirir, mənalar verir, mənalar qalereyası yaradır: Gözəl deyib:

*Ürək işığı var, göz işığı var*
*Fikir işığı var, söz işığı var...*

Şahin Fazil çağdaş dövrümüzdə, - XX yüz il XXI əsrin birinci 20 ilində klassik şeirimizin dəyərli, həmişə yaşamağa layiq olan (elə özü də bunu yorulmadan zənginləşdirib yaşadır) ənənələrinə söykənərək ulu Tanrını, Həzrət Peyğəmbəri, Həzrət Əlini mədh etmiş insanları düz,

doğru yola hidayət etmək üçün Allaha dualar, xitablar, səcdələr etmiş, bəşər övladlarını saflaşmağa çağırır.

Şair yazır: "Pərvərdigara! Əlli ilə yaxındır ki, şeir yazmaqdayam. Bu müddət ərzində sənin yardımınla on doqquz elmi, bədii və tərcümə kitabım çap olunmuş, iki yüzədək elmi, yüzdən bir qədər az publisistik məqaləm müxtəlif qəzet və jurnallarda dərc edilmişdir. Zənnimcə, söz zər, şair zərgərdir və şairdə zərgər diqqəti, zərgər dəqiqliyi olmalıdır ki, sözün qədrini zər kimi bilsin, kəlmələri, misra və beytləri zərgər səliqəsi ilə, sapa mirvari düzülən sayaq düzsün və ən əsası isə şair xalis, saf, tər-təmiz xəlqi sözlərdən bəhrələnməli, elə yazmalıdır ki, oxucu savadından... asılı olmayaraq şeirin mənasını başa düşsün, lüğət giriftarı olmasın."

Elə bir şair tapılmaz ki, o sözün möcüzəsindən, onun ilkinliyindən, qüdrətindən bəhs etməmiş, sözün tilsiminə düşməmiş olsun. Böyük Nizamidən bəri Xətai, Füzuli XX əsrdə Səməd Vurğun, Bəxtiyar Vahabzadə, Məmməd Araz... hamısı sözün qüdrətini vəsf etmişlər. Həmişə qayğılı, düşüncəli, qeyrətçələngli şairimiz Şahin Fazilin bu sözlərini yada salmamaq mümkün deyil: " Pərvərdigara! Əlimə qələm aldığım gündən etibarən mənim əsas qayəm öyrənmək olmuşdur. Ana dilimi öyrənməklə Ana Vətənimdə doğulub boya-başa çatan, bütün ömrü boyu vətənində yaşayıb-yaradan, yaxud durna quşları kimi qərib ellərə pərvazlanan şair və alimlərimizi öyrəndim, fars dilini mənimsəməklə yüzlərlə İran, Türkiyə və Azərbaycan ədibinin yaradıcılığı ilə dərindən tanış oldum, çoxmənalı ərəb kəlmə və istilahlarına bələd olmaqla bu zəngin dilin söz ehtiyatına heyranlığım artdı. Söz gülüstanımızın bağbanlarından biri olmaq qərarına gəldim. Həm heca, həm sərbəst, həm də əruz vəznində şeirlər yazmağa başladım və yaza-yaza müəyyən etdim ki, müasir Azərbaycan ədəbi dilinin imkanları hər üç vəznli poeziyamızı layiqincə zənginləşdirməyə qadirdir. Əmin oldum ki, şeir gülzarımızı əcnəbi söz və izafətlərdən təmizləmək imkan daxilində olan məsələdir, bir şərtlə ki, zəhmətsevər olasan və ana dilimizi ürəkdən sevən vətəndaşa çevriləsən."

Şahin Fazilin ürəkdən gəlib söylədiyi bu fikirləri hər bir yaradıcı insanın, elm və sənət adamını hamı məmnuniyyətlə qəbul edər. Ona görə ki, dil qəlblərin tərcümanıdır, dil insan hissiyatının, düşüncə və dünyayabaxışının ən ülvi ifadəsidir, izharıdır. Müdriklər də yerində deyiblər: ana dili ana südüdür. Ana dilinin nəfəsini, hikmətini, dadını-duzunu duymaq, onun məna dərinliklərinə varmaq üçün, görünür, təhsil, peşə, heç də həmişə əsas şərt, həlledici deyil. Bəllidir ki, Nəriman Nərimanov,

Mehdi Hüseyn, Məmməd Araz, Hikmət Mahmud, elə Şahin Fazil özü də dil və ədəbiyyat fakültəsini bitirməmişlər, amma onlar həm də ədəbiyyat adamları kimi, yazıçı, şair kimi ad qazanıblar. Şairlik Allah vergisidir, bu ali mərtəbə, bu ucalıq hər kəsə nəsib olmur. Yunanlar deyirdilər: "Şairlər anadan şair kimi doğulurlar." Ən əsası odur ki, sözü, mənanı duyasan, sözün damarını tutasan, ifadə etməyin sənətkarı, xiridarı olasan. Belə olmasaydı, bədii söz də, şifahi ədəbiyyat xəzinəsi də olmazdı, yaranmazdı. Bu mənada Şahin Fazil poeziyası da öz səmimiliyi, axıcılığı, qəlbə yatımlılığı, fəlsəfi fikir tutumluluğu ilə diqqəti cəlb edir.

Onun şeirlərində elə misralar var ki, sözün əsl mənasında sənət əsəridir, poetik kəşfdir:

*Sözdən əvvəl Sən var idin, səndən əvvəl heç nə yox,*
*Allahım, Rəbbim mənim, ey bəxş edən insanə söz.*

*Dəmbədəm, saatbəsaat, günbəgün can məst olur.*
*Gül dodaqla öylə ki, izhar edir cananə söz.*

*Bir söz ilən min könül abad olubdur, amma ki,*
*Hərdən etmiş çox könüllər mülkünü viranə söz.*

*Aqil adəm aqil adəmdən təmənna söz qılar,*
*Təsiri olmaz desə divanəyə divanə söz.*

*Yaxşı sözdən kim qaçıbdır, doğru sözdən kim qaçar,*
*Loğmana dərman nə lazım, söz verin loğmanə, söz.*

*Bəsdi yorduq, bəsdi vurduq, bəsdi qırdıq cəng ilə*
*Ey bəşər, meydan sözündür, söz gərək, meydanə söz.*

*Öz sözümlə yazmışam mən hər zaman öz şeirimi,*
*Öz sözüm varkən, gərəksizdir mənə biganə söz.*

Şahin Fazil də özündən çox-çox əvvəllər yaşayıb-yaratmış klassiklərimizin söz haqqındakı qızıl qiymətində olan hikmətlərini, dəyərləndirmələrini xatırladır, özü də bu mövzuya yeni yanaşma bucağı ilə baxmağı, yaratmağı sərrastlıqla bacarır:

*Hər gün həyatımdan ötsə də bir gün,*
*Gün deyə bilmirəm sevgisiz günə.*
*Fəqət yaşayıram mən sevgi üçün,*
*Kaş ömrüm bir sevgi günümdə sönə!*

Bu misraları oxuyarkən yadıma ölməz, nakam şairimiz Mikayıl Müşfiqin sözləri düşür: "Ən xoşbəxt günlərim şeirli günlərimdir."

Şahin Fazilin şeirlərinin demək olar ki, əksəriyyətində doğma yurdumuzun hər qarış torpağı, daşı, dağı, qayası, çayları, bulaqları nə qədər əziz olmasını, doğma olmasını fəhmlə də, görmək olar, onun sonsuz məhəbbət və iftixarla tərənnüm etməsi ilə də bilmək olar. O, bəzən vətənin obrazını, şeir başlıqlarına da çıxarıb adlandırır, vəsf edir: "Şahdağa, Şah dağıma", "Azərbaycan torpağı" (əslində bu mikropoemadır – 8 səhifədir) "Torpaq təşnəsi", "Vətən Azərbaycan", "Qaytarılmayan Şuşam" və b. poetik örnəklər. Şairin poeziya nümunələrində Borçalı, Dərbənd, Göyçəgöl, Quba, Təbriz, Araz, Sərsəng, Zəngilan, Zəngəzur, Şuşa, Laçın, Kəlbəcər, Qarabağ... bizim hər birimiz üçün doğma yer-yurd adlarımız şeir misralarından boylanır:

*Hay-hayın şeirinin*
*Misralarına hopub.*
*Bir də gördün Qarabağ*
*Diksinib harayından*
*Yağı əlindən qopub.*
*O zaman iqbalımız*
*Üzümüzə gülümsər,*
*O zaman, dostum, sənə*
*Yazaram təzə əsər.*

Şair başqa bir şeirində isə qəti inamla deyir:

*...Canlıdır, nəfəsi var,*
*diri qalan şəhiddi*
*Ölkəmiz sınaqlardan hökmən*
*qalib çıxacaq,*
*Durduqca dünya evi duracaq,*
*yaşayacaq*
*Azərbaycan torpağı*

Şahin Fazilin ilham pərisi həmişə onu yazıb-yaratmağa səsləyir, onu sakitləşməyə qoymur. Nə qədər zəngin mövzular, çeşid-çeşid mətləblər onu dinc buraxmır, yazdıqca-yazır, doymur ki, doymur.

Çağdaş dövrümüzdə klassik ənənələrə yenidən qayıdıb böyük nəhənglərin vaxtilə keçdiyi yola qayıdıb qələm işlətmək zarafat gəlməsin. XX əsrin və XXI əsrin bir mütəfəkkir övladı, şair oğlu 5 divan yaratmaqla bunları ənənəyə uyğun olaraq qəsidələr, mərsiyələr, qəzəllər, təzminlər, təxmislər, qitələr, səkkizliklər, rübai və dördlüklərdə, təkbeytlər, xoyratlar və bayatılarla və b. şeir janrları ilə dolğunlaşdırıb çağdaş oxucuların dövriyyəsinə vermək nər oğlu nərin işidir.

Şahin Fazil qələmini lirik və epik növün əksər janrlarında sınayıb, sərbəst şeirlərdə, əruzun və heca vəzninin bütün şəkillərində yazıb-yaradır, bu ədəbi-bədii irsi təşkil edən nümunələrin hamısını da ilhamının, istedadının gücü ilə ərsəyə gətirib. Onun əsərlərində əsas süjet xətti, oxucusuna çatdırdığı fikirlər, vəsf və tərənnüm etdiyi hadisələr, obrazlar, çıxdığı haşiyələr ədəbi-bədii tələblərə, ölçülərə, dil normalarına uyğunluq əndazəsindədir.

Neçə on illərin yaxın və etibarlı alimi, sənət dostum, dəyərli alim, vətəndaş şair, səriştəli, peşəkar tərcüməçi, həm də ləyaqətli, ziyalı fars və ərəb dillərinin gözəl bilicisi kimi həm vətənində həm də şərq ölkələrində tanınır. O bütün səviyyələrdə qəbul olunur. İran, Əfqanıstan, Türkiyə, Orta Asiya ölkələrində onun haqqında yüksək fikirlər söylənir, elmi-bədii yaradıcılığı dəyərləndirilir. Çox-çox şükürlər olsun ki, o cavanlıq enerjisi ilə yazıb-yaradır. Şahin müəllim sizin 80-ci baharınızı qutluyuram, 90, 100 yaşayasınız. Can sağlığı, yaradıcılıq sevincləri arzu və diləklərimlə sizi təbrik edirəm.

**Əsədulla CƏFƏROV**
*AMEA Arxeologiya və Etnoqrafiya İnstitutunun şöbə müdiri, t.e.d., prof.*

## TARİXİMİZİN FƏDAKAR VƏ ZƏHMƏTKEŞ TƏDQİQATÇISI

Tarix elmi bəşəriyyətin və cəmiyyətin ayrı-ayrı inkişaf xüsusiyyətlərini tədqiq etməkdə mühüm elmi əhəmiyyət kəsb edir. Bəşəriyyətin və Azərbaycanın keçdiyi tarixi inkişaf mərhələlərini təbliğ etmək hər bir ziyalının və savadlı insanın müqəddəs borcudur. Son 30 ildə Azərbaycanda və dünya miqyasında baş verən ictimai, siyasi proseslər göstərir ki, tarixi inkişaf mərhələlərini bilmək olduqca vacib bir problemdir. Tarixin dəqiq öyrənilməsində savadlı insanların, xüsusilə alimlərin müstəsna xidmətləri vardır və bu işdə xüsusi tədqiqat məktəbi keçmiş alimlərin yazdıqları əsərlər vasitəsilə insanlığın keçdiyi ayrı-ayrı inkişaf mərhələləri öyrənilir.

Azərbaycan tarixinin tədqiq olunmasında arxeoloji, etnoqrafik, numizmatik, paleocoğrafiya və yazılı mənbələr xüsusi əhəmiyyətə malikdir. Bu sahədə Azərbaycanın görkəmli alimi, tarix elmləri doktoru, professor, AMEA Tarix İnstitutunun şöbə müdiri Fərzəliyev Şahin Fazil oğlunun xüsusi xidmətləri vardır.

Müasir dövrümüzdə hər bir insanın keçdiyi həyat yollarına nəzər salmaq, onun ayrı-ayrı inkişaf mərhələlərinə səyahət etmək olduqca mənalı və maraqlıdır. Çünki hər bir inkişaf yollarında insanın keçdiyi mənalı ömrün ayrı-ayrı səhifələri həkk olunmuşdur ki, bu məsələnin müasir zəmanəmizdə olduqca mühüm mənəvi-əxlaqi əhəmiyyət kəsb edir.

Müasir dövrümüzdə inkişaf etməkdə olan gənc nəsil üçün tarix elmləri doktoru, professor, şair, şərqşünas, tərcüməçi və özəl əxlaqi-mənəvi keyfiyyətlərə malik Fərzəliyev Şahin Fazil oğlunun keçdiyi mənalı həyat, elm, tədris və yaradıcılıq fəaliyyəti örnək olmalıdır.

Xatırlatmaq istəyirəm ki, 2020-ci il martın 27-də xalqımızın yüksək mədəniyyətə malik alimi, ziyalısı, tarixçisi və şairi professor Şahin Fərzəliyevin 80 yaşı tamam olur. 1940-2020! Mənalı ömrün yuvarlaq tarixi! Ömrün daha da uzun olsun, ey Şahin Fazil!

Professor Ş.F.Fərzəliyev Azərbaycanın ən gözəl və səfalı diyarlarından biri olan Quba şəhərində anadan olmuşdur. Hələ uşaqlıq illərindən

Qubanın füsunkar təbiəti Şahini özünə valeh etmiş və o bu diyarın gözəlliyindən bəhrələnmişdir. Orta məktəbdə oxuyarkən Azərbaycanın tarixinə, mədəniyyətinə, incəsənətinə heyran olan Şahin klassik Azərbaycan şairləri Nizami, Xaqani, Füzuli, Seyid Əzim Şirvani, Qasım bəy Zakir, Mirzə Ələkbər Sabir və başqa mütəfəkkirlər əsərlərini dönə-dönə oxumuş və ilhamlanmışdır.

1958-cu ildə Quba şəhərində orta məktəbi müvəffəqiyyətlə bitirən Şahin Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin Fars filologiyası şöbəsinə qəbul olunmuşdur. Onun tələbəlik həyatı olduqca mənalı keçmiş, Azərbaycanın savadlı müəllimlərindən və alimlərindən bilik toplayaraq elmi yaradıcılığa maraq göstərməyə başlamış, səmimi şagird kimi ustadlarım verdiyi tapşırıqları vaxtı-vaxtında yerinə yetirərək professor və müəllim heyətinin rəğbətini qazanmışdır. Tələbəlik illərində çəkdiyi zəhmət və yuxusuz gecələr Şahin müəllimin bilik bazasını möhkəmləndirmiş və ona gələcək elmi fəaliyyətində stimul yaratmışdır. Ş. Fərzəliyev oxuduğu fakültəni fərqlənmə diplomu ilə bitirmişdir.

İlk əmək fəaliyyətinə Azərbaycandan uzaq bir diyarda yerləşən Əfqanıstanda mütərcim kimi başlayan bu gələcək alim 1963-1988-ci illərdə müəyyən fasilələrlə on üç il müddətində həmin ölkənin müxtəlif şəhərlərində fəaliyyət göstərmişdir. Şahin müəllimin Əfqanıstanda yüksək səviyyədə çalışması həmin ölkənin ali dövlət və hökümət orqanlarının xüsusi rəğbətini qazanmış və nəticədə Əfqanıstan Dövlətinin 3 medalı həmçinin SSRİ-nin Fəxri Fərmanları ilə təltif olunmuşdur.

Şahin Fərzəliyevin əsas arzusu Azərbaycanın orta əsr feodal dövlətlərinin tarixini tədqiq və təbliğ etməkdən ibarət olmuşdur. O, 1970-1973-cü illərdə Azərbaycan Elmlər Akademiyası Tarix İnstitutunun aspiranturasında öz təhsilini müvəffəqiyyətlə davam etdirmiş, 1974-cü ildə professor Oqtay Əfəndiyevin rəhbərliyi ilə "Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") əsəri Azərbaycan tarixinin mənbəyi kimi" adlı namizədlik dissertasiyasını müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi almışdır.

Şahin müəllim 1996-cı ildə «Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə» mövzusunda doktorluq dissertasiyasını müdafiə etmiş, 17 yanvar 1998-ci ildə ona AAK-ın qərarı ilə tarix elmləri doktoru alimlik dərəcəsi verilmiş, 2004-cü ildə isə O, Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə (8 oktyabr 2004-cü il) professor elmi adına layiq görülmüşdür.

Hal-hazırda Tarix İnstitutunda «Mənbəşünaslıq və tarixşünaslıq» şöbəsinin müdiri vəzifəsində fəaliyyət göstərir.

Həm də görkəmli şair olan Şahin Fazil XX əsrin birinci mətbu "Divan"ını yazmış və çap etdirmişdir (1996). İndiyədək onun daha üç "Divan"ı işıq üzü görmüşdür. 140 yaşlı "Məcməüş-şüəra" ("Şairlər məclisi") ədəbi məclisinin tarixini yazaraq "Təzkireyi-Şahin" adı ilə nəşr etdirən Şahin Fazil 1998-ci ildən "Məcməüş-şüəra"nın sədridir. Şeirləri Əfqanıstan, İran, Türkiyə, İraq və Yaponiyada çap olunmuşdur. 2009-cu ildə Yaponiyanın iki şəhərində (Sinday və Tokio) "XX əsr Azərbaycan milli tarixşünaslığı: tarixi təcrübə və müasir vəziyyət" adlı məruzə ilə çıxış edən Ş.Fazilin "Azərbaycan haykurları" adlı kitabındakı bir neçə şeri Tokioda dərc olunmuşdur. Şairin hazırda V böyük həcmli (1000 səhifədən çox) divanı çap prosesindədir.

Ş.F.Fərzəliyev onlarla yaxın və uzaq xarici ölkədə keçirilən Beynəlxalq Elmi konfranslarda iştirak etmiş, Azərbaycanın orta əsrlər tarixinə dair yüzlərlə elmi məqalənin və beş monoqrafiyanın müəllifi olmuşdur. Onun namizədlik və doktorluq dissertasiyaları tariximizin mürəkkəb dövrlərindən biri olan XV-XVI əsrlərdə ölkəmizin siyasi, ictimai-iqtisadi, diplomatik və ideoloji problemlərinin tədqiqinə (fars və osmanlı ilkin mənbələri əsasında) həsr edildiyindən mühüm elmi işlər kimi diqqəti cəlb etmişdir.

Ş.F.Fərzəliyev namizədlik və doktorluq dissertasiyalarının müdafiəsindən sonra çoxsaylı elmi məqalə çap etdirmiş, Azərbaycan Sovet və Naxçıvan Ensiklopediyalarında 100-ə qədər məqalənin müəllifi olmuşdur. Yeddi cildlik Azərbaycan tarixi kitabının müəlliflərindən biri olan alim Azərbaycanın orta əsrlər tarixinin müxtəlif tarixi problemlərini araşdırmış, öz sözünü deməyi bacarmış, çapa hazırlanan 3 cildlik «Azərbaycan tarixi» kitabının bir neçə fəsil və yarımfəsli üzərində elmi tədqiqat işi aparmışdır.

Ş.F.Fərzəliyev bir neçə monoqrafiyanın, o cümlədən «Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun «Əhsənüt-təvarix» əsəri üzrə), «Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə», «Quba tarixi», «XV əsr Azərbaycan dövlətlərinin quruluşu», həmçinin bir neçə fənn proqramı və dərs vəsaitinin müəllifidir.

Prof. Ş.F.Fərzəliyev eyni zamanda müxtəlif dövlət universitetlərində pedaqoji fəaliyyətdə də olmuşdur (Bakı Dövlət Universiteti, Sumqayıt Dövlət Universiteti, Lənkəran Dövlət Universiteti).

Son illərdə tərcüməçilik fəaliyyətini daha da genişləndirən alim fars dilində yazılmış iki böyük Azərbaycan tarixçisinin məşhur kitablarını dilimizə çevirmiş, bununla kifayətlənməyərək, onlara sanballı «Ön söz» başlıqlı məqalələr, həmçinin geniş şərhlər yazmışdır. Həmin kitabların birincisi XVI əsrin ikinci yarısı –XVII əsrin birinci rübündə yaşamış və Azərbaycan Səfəvilər dövlətinin tarixinə dair faydalı tarixi qaynaq həsr etmiş İsgəndər bəy Münşinin «Tarixe-aləmaraye-Abbasi» («Dünyanı bəzəyən Abbasın tarixi») əsərinin mükəmməl tərcüməsidir (Əsər 2010 və 2014-cü illərdə 2505 səhifədən ibarət çap olunmuşdur). İkinci qaynaq isə Həsən bəy Rumlu kimi Səfəvi dövrü tarixçisinin məşhur «Əhsənüt-təvarix» («Tarixlərin ən yaxşısı») salnaməsidir ki, kitabın I cildi üzərində tərcümə işi aparan alim onnnu və şərhlərlə birlikdə çap üçün hazırlanmış, II cildinin tərcüməsi isə bu il başa çatacaqdır.

Professor Şahin müəllim həm də Jozef Tiflisinin "Mir Veys və Şah Sultan Hüseyn", Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarixi" kimi dəyərli mənbələrini fars və osmanlı dillərindən tərcümə etmişdir.

Ş.F.Fərzəliyev müxtəlif problemlərə həsr olunmuş çoxsaylı məqalələr yazmış, həm Respublikamızda, həm də xaricdə keçirilən beynəlxalq elmi konfrans və görüşlərdə (Moskva, Ankara, İstanbul, Daşkənd, Təbriz, Mahaçqala, Kipr Respublikası, Polşa və s.) fəal iştirak etmişdir.

Yuxarıda qeyd olunduğu kimi, 2009-cu ildə Yaponiyanın Sinday Universitetinin dəvəti ilə həmin ölkədə olmuş, Azərbaycan tarixşünaslığına dair mühazirə oxumuşdur. Xalqımızın vətənpərvər övladı və tanınmış alimi kimi Azərbaycanın tarixi problemlərini istər ölkə daxilində, istərsə də xaricdə işıqlandıran Şahin Fərzəliyev çıxış etdiyi yerlərdə Azərbaycanın tutduğu mövqeyi cəsarətlə müdafiə etmişdir.

Ş.F.Fərzəliyev gənc elmi kadrların yetişdirilməsi sahəsində də səmərəli fəaliyyət göstərir. Onun rəhbərliyi ilə 13 nəfər tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsinə layiq görülmüşdür. Tarix İnstitutunun nəzdində fəaliyyət göstərən ixtisaslaşdırılmış Müdafiə Şurasının üzvü olan proffessor Ş.F.Fərzəliyev 10-dan çox kitabın elmi redaktoru olmuş, 50-yə yaxın tarix üzrə fəlsəfə doktoru və tarix üzrə elmlər doktoru dissertasiya işlərinə opponentlik etmişdir.

Professor Ş.F.Fərzəliyev tariximizin fədakar və zəhmətkeş tədqiqatçısı olmaqla yanaşı eyni zamanda tanınmış şairdir. Oxuculara məlum olsun ki, bu şair Azərbaycanın klassik poeziyasından ruhlanmış və 1996-cı ildə özünün birinci “Divan” kitabını çap etdirmişdir. Həqiqətən də divan

yazmaq olduqca çətindir və az yaranan şeirlər toplusudur. Əgər biz Azərbaycanın, eləcə də Şərqin ədəbiyyatına nəzər salsaq görərik ki, "Divan"ların sayı olduqca azdır. Bu gün cəsarətlə deyə bilərik ki, şair Ş.Fazilin yazdığı tarixi əsərlərlə yanaşı onun çap etdirdiyi "Divan"lar Azərbaycanın istər XX əsr, istərsə də XXI əsr ədəbiyyatında olduqca fenomen hadisədir. İstər fomra, istərsə də məzmunca Şahin Fazilin "Divan"larını oxuduqca oxucu onun savadına, dünya görüşünə heyran olur. Qələmə aldığı qəzəllər sırf ana dilimizdə - Azərbaycan türkcəsində yazılmış əsərlərdir, və oxucuya estetik zövq verir. Onun qələmindən çıxan bədii nəzm nümunələri oxucunu məftun edir və onları oxuduqca insanın yaşamaq, yaratmaq eşqini min dəfə artırır. Şair qəzəllərinin birində Allah-təalanı təqdir edir, göydən yerə enən Qur'anı və həmin kitabda tövbə xüsusunda deyilən məqamları oxuculara belə xatırladır:

*"Acı söz demək yaraşmaz, bizə, ey nigar, tövbə,*
*Sənə intizar tövbə, mənə intizar tövbə.*

*Sənə tövbə bəlli olsa, əməlin təməlli olsa,*
*Təməlin əməlli olsa ürəyində var tövbə.*

*Ümidim, ümidgahım yenə tövbədir pənahım,*
*Mənə cənnəti, günahım gər ola, açar tövbə.*

*Bu sözə xətir qoyulsun, bu kəlam ətirlə dolsun,*
*Elə and içək ki olsun bizə iftixar tövbə.*

*Sualım cavab alıbdır: O kitabdən qalıbdır,*
*O cənabdən qalıbdır bizə yadigar tövbə.*

*O kəlam məram olarsa, ona ehtiram olarsa,*
*Edəcək inam olarsa bizi bəxtiyar tövbə.*

*Alışıb-yanır bu Şahin, yalanı danır bu Şahin,*
*Bunu and sanır bu Şahin ki, budur qərar: Tövbə!"*

2007-ci ildə tədqiqatçı Qiymət Məhərrəmli "Şahin Fazilin divanı və klassik ədəbi ənənələr" mövzusunda yazdığı filologiya üzrə fəlsəfə doktoru dissertasiyasını müdafiə etmişdir. **İnanıram ki, bundan sonra**

**tarixçilərimiz də Şahin Fazilin tarixi əsərləri və etdiyi tərcümələri əsasında Azərbaycanın orta əsrlər tarixinin ayrı-ayrı səhifələrini tədqiq edəcək və nəticədə tariximiz daha da zənginləşəcəkdir.**

Şahin Fazilin qəzəlləri, nəzirələri, tərkibəndləri, qitələri, rübailəri, təxmisləri, bayatıları və digər müxtəlif fəlsəfi və tarixi mövzularda yazdığı şeir janrları insanı heyrətə gətirir, onun haqsızlıqlara qarşı mübarizliyi oxucuda təlqin hissini artırır və sən onun kompleks biliklərə malik olmasının əyani şahidi olursan.

Şahin Fazil tarixi inkişafın ayrı-ayrı mərhələlərini gözəl bildiyi üçün insanlığın ilk mərhələsi olan ibtidai icma - daş dövrünə aid yazdığı şeir insanı ədalətə, haqsızlığa qarşı mübarizəyə, vətənpərvərliyə, paklığa çağırır. Onun “İstəyirəm daş dövrünə qayıdaq” şeri bu baxımdan nümunədir:

*Salamatdı dərə, təpə, qaya, dağ...*
*Daş dövründə bomba-filan yox idi.*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə belə talan yox idi.*

*Zəhərlərin yoxdu hələ sorağı,*
*Dava-dərman görməmişdi bağça-bağ,*
*Mavi idi asimanın qucağı,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə boz asiman yox idi.*

*Tər-təmizdi suyu çayın, ummanın...*
*Arala bax, Xəzərə bax, Kürə bax...*
*Tənəzzülmüş təkamülü cahanın,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə belə cahan yox idi.*

*Halal əmək, halal yemək, halal su...*
*Əyri adam olunardı daşqalaq.*
*Daş var idi, yoxdu daş-qaş arzusu,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə rüşvət alan yox idi.*

*Kim görmüşdü torpaq yana, daş yana?*
*Daş—ox idi, balta idi, daş-bıçaq.*

*Müftə idi daş, yox idi karxana,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə daşı satan yox idi.*

*Get Azıxa, bəlkə yenə çənə var?*
*Qobustanda Qavaldaşa yenə bax.*
*Uzaq başı daş-daş oynayardılar,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə raket atan yox idi.*

*Bərabərlik üstün idi, baş idi.*
*Harda vardı bu cah-cəlal, təmtəraq?*
*Silahları sapand idi, daş idi,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə güllabaran yox idi.*

*Yuvasıyıq çox ağrının, göynəyin,*
*Gün-güzəran gah qaradır, gah da ağ.*
*Qocalmamış möhtacıyam eynəyin,*
*İstəyirəm daş dövrünə qayıdaq,*
*Daş dövründə eynək taxan yox idi.*

Şahin Fazilin çap etdirdiyi və əlimizdə olan 4 divanı 4951 səhifədən ibarətdir. Tanrıdan arzum budur ki, Şahin Fazil bundan sonra da qiymətli tarixi mənbələr və ədəbi-bədii mövzular üzərində qələm işlədərək "erməni mafiyasına" xidmət edən qüvvələr tərəfindən şairanə tərzdə saxtalaşdırılmış bəzi məsələləri önə çəkib, tariximizi və ədəbiyyatımızı daha da zənginləşdirsin. Bu yolda əziz dostum və qardaşım Şahin Fazilə Tanrıdan uzun ömür, iti gözlər, zəngin zehni düşüncə və yeni-yeni uğurlar arzu edirəm. Gün o gün olsun belə yüksək savada, əxlaqa, mədəniyyətə, dünyagörüşə malik Şahin müəllimin gələcək yubileylərini Qarabağ torpağımızda qeyd edək.

**Xeyirbəy QASIMOV**
*Tarix elmləri doktoru, dosent*

# AZƏRBAYCAN TARİX ELMİNDƏ ŞAHİN FAZİL FENOMENİ

Azərbaycanda tarix elminin kökü, qaynaqları yüzilliklərin dərinliklərinə gedib çıxır. Onun təkamülünün müasir mərhələsi isə ötmüş əsrin ilk onilliklərindən başlanır. Azərbaycan tarix elminin son yüz ili özündə təkrarsız adları, imzaları və ünvanları ehtiva edir. Vətən tarix elmində fəaliyyətinin əhəmiyyəti, mahiyyəti, əhatə və təsir dairəsi, elmi fəaliyyətinin gerçək nəticələri artıq zamanın sınaqlarından çıxmış, milli tarix elminin tarixini yazıb-yaratdığı qədər özü də tarixləşən müstəsna tarixçilər arasında Şahin Fazil oğlu Fərzəliyevin (Şahin Fazilin) xüsusi yeri vardır.

Görkəmli tarixçi, şərqşünas, tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyev Vətən tarix elmində bənzərsiz mövqeyi olan tədqiqatçılardan biridir. Ömrünün 80-ci baharını yaşayan Ş.F.Fərzəliyev xalqımızın orta əsr dövlətçilik tarixinin, Azərbaycan Səfəvi dövləti (1501-1736) tarixinin ən kamil araşdırıcılarındandır. Azərbaycan tarix elminin təqribən 50 illik dövrünün əsaslı problemlərinin həllində, aktual və perspektiv təmayüllərinin müəyyənləşdirilməsində, müasir nəzəri ölçü və məna kəsb etməsində bu alimin elmi irsinin aparıcı rolu danılmaz gerçəklikdir. Gözəl insan, böyük alim, təkrarolunmaz şair olan Şahin Fazil mənalı, yeni tarixçilər nəsli üçün örnək olacaq bir həyat yolu keçmişdir və elmi, poetik yaradıcılıq eşqi ilə yaşamaqdadır:

*İstilik-qanım kimi,*
*Bütünlük-canım kimi,*
*Nəzərim Təbrizimi,*
*Gözlərim Araz çəkir.*



*İllər yarışındayam,*
*Axırın başındayam,*
*Ömrümün qışındayam,*
*Amma məni yaz çəkir*

*(Şahin Fazil. Sözləri ecazdı Qusarçaylının.*
*Bakı: Elm və təhsil, 2019, s. 71).*

Sabitlik, nikbinlik, ardıcıllıq, xeyirxahlıq, insanpərvərlik, məqsədyönlülük Şahin Fazil fərdiyyətinin başlıca xüsusiyyətlərindəndir. Onun 1940-cı ilin baharından başlanmış ömür yolu, elmi yaradıcılığı, pedaqoji fəaliyyəti Azərbaycanda tarix elminin, şərqşünaslığın inkişaf stixiyası (təbiəti) ilə sıx bağlıdır. Şahin Fazil Bakı Dövlət Universitetinin (o zaman Azərbaycan Dövlət Universitetinin) Şərqşünaslıq fakültəsində təhsil almış, fars dilinin, ədəbiyyatının, Yaxın və Orta Şərq xalqlarının tarixinin incəliklərinə yiyələnmiş, ali təhsilini uğurla başa çatdırmış, 1963-1988-ci illər ərzində (fasilələrlə) Əfqanıstanda çalışmışdır. O, Əfqanıstanda işlədiyi illərdə Vətən tarix elmi ilə sıx bağlı olmuş, XX əsrin 70-ci illərində Azərbaycan SSR EA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun aspirantı kimi səmərəli fəaliyyət göstərmiş, O.Ə.Əfəndiyevin (1926-2013) elmi rəhbərliyi altında Həsən bəy Rumlunun (1530/31 - ?) "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") əsərini araşdırmış, bu əsərdə XV-XVI əsrlərin Azərbaycan tarixi ilə bağlı olan məqamları aşkar etmiş və "tarix elmləri namizədi" elmi dərəcəsini almış, 1983-cü ildə isə "Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri üzrə)" adlı monoqrafiyasını nəşr etdirmişdir. O, O.Ə.Əfəndiyevin dissertasiya müdafiə edərək "tarix elmləri namizədi" elmi dərəcəsini almış ilk aspirantıdır.

Ş.F.Fərzəliyev ötmüş əsrin 90-cı illərinin ortalarında (1996) XV-XVI əsrlərdə Azərbaycan Qaraqoyunlu, Ağqoyunlu, Şirvan və Səfəvi dövlətlərinin Osmanlı imperiyası ilə münasibətlərinə həsr olunmuş yeni dissertasiyasını uğurla müdafiə edərək "tarix elmləri doktoru" elmi dərəcəsini almışdır. 1994 və 1999-cu illərdə Bakıda, Azərbaycan Dövlət Nəşriyyatında nəşr edilmiş "Azərbaycan və Osmanlı imperiyası (XV-XVI əsrlər)" adlı monoqrafiyası alimin Vətən tarix elminə yeni və dəyərli töhfəsidir. Bu əsər bir neçə dəfə nəşr olunmuş, əsərin türk dilinə tərcüməsi 2017-ci ildə İstanbulda işıq üzü görmüşdür.

Şahin Fazil 2003-cü ildə ikinci dəfə nəşr etdirdiyi "XV əsr Azərbaycan dövlətlərinin quruluşu" adlı monoqrafiyası ilə Azərbaycan dövlətçilik tarixi problemlərinin qoyuluşu tərzində və həlli təcrübəsində özünəqədərki fikirlərə və mövqelərə rəğmən əsaslı dəyişikliklər etmiş, yeni metodoloji prinsiplər hazırlamışdır. "Dövlət quruluşu məsələsi dövləti olan bütün ölkələrə xas ən aktual məsələlərdən biridir, çünki hər hansı bir dövlətin inkişafı və davamlılığı məhz onun quruluşunun mahiyyətindən asılı problemdir, çünki dövləti yaşadan da, məhv edən də onun quruluşudur" (Şahin

Fazil Fərzəlibəyli. XV əsr Azərbaycan dövlətlərinin quruluşu. II nəşri. Bakı: Elm və təhsil, 2003, s. 4). Ş.F.Fərzəliyev XX əsrin 70-ci illərindən əsrimizin ikinci onilliyinin ortalarınadək AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun "Azərbaycanın orta əsrlər tarixi" şöbəsində çalışmışdır və hal-hazırda da doğma şöbəsi ilə səmərəli əməkdaşlığını, əlaqələrini davam etdirir. Onun milli ruhlu tarixçi kadrların yetişməsində, onların tarix elminə inteqrasiyasında həlledici rolu vardır. Azərbaycan Respublikasında xalqımızın orta əsrlər tarixinin tədqiqi ilə məşğul olan alimlərin əksəriyyəti bu alimin xeyirxah münasibətini görmüş, onun zəngin elmi təcrübəsindən faydalanmışdır. O, bir neçə monoqrafiyanın, yüzlərlə elmi məqalənin müəllifidir.

Görkəmli alim Azərbaycan tarixi ilə az və ya çox dərəcədə bağlı olan, fars dilində və Osmanlı türkcəsində tərtib olunmuş bütün qaynaqlara həssaslıqla yanaşır, bu qaynaqların tərcümə olunması sahəsində xüsusi fəallıq göstərir. O, gərgin əmək sayəsində İsgəndər bəy Münşinin Türkmanın (1560/61-1634), 2 kitabdan ibarət 3 cildlik "Tarixi-aləmarayi-Abbası" ("Dünyanı bəzəyən Abbasın tarixi" əsərini Azərbaycan türkcəsinə tərcümə etmiş və elmi ictimaiyyətə təqdim etmişdir. Şahin Fazilin 1993-cü ildə farscadan Azərbaycan türkcəsinə tərcümə etdiyi, vaxtilə polyak səyyahı Y.T.Kruşinskinin tərtib etdiyi "Xristian səyyahın tarixi" əsəri Azərbaycan Səfəvi sülaləsinin, dövlətinin son illərini əks etdirir. Hər iki əsər tariximizin həmin dövrünü tədqiq edən araşdırıcılar üçün yeni töhfələrdən idi.

Əslən gürcüstanlı olmuş, hələ uşaq ikən xarici dillər öyrənmək məqsədilə Fransaya getmiş, sonra isə "İrana" yollanmış, Fransa səfiri Gardanın tərcüməçisi olmuş, 8 il "İranda" yaşamış Yozef Tiflisinin "Vaqiati-Mir Veys və Şah Hüseyn" əsərini Şahin müəllim Osmanlıcadan Azərbaycan türkcəsinə tərcümə edərək 1992-ci ildə nəşr etdirmişdir.

Təbiətcə təvazökar insan olan Şahin Fazil tarix elmində inhisar mövqe tutmaq hissindən uzaqdır. Onun fikrincə, "durğunluq elmi (xüsusilə tarix elmini) tənəzzülə aparan haldır", "elmi dövriyyəyə daim yeni ilkin qaynaqlar cəlb olunmalı", Azərbaycan xalqının "araşdırılmış" kimi görünən məsələlərinə vaxtaşırı yeni tədqiqat obyekti kimi yanaşmalıdır, yalnız bu halda xalqımızın obyektiv tarixi gerçəkliklərini anlamaq və anlatmaq mümkündür. Şahin Fazil millətinə dərin sevgisini öz duyğuları, mənəviyyatı, poetik yaradıcılığı və gərgin elmi fəaliyyəti ilə sübuta yetirən, Azərbaycanın həqiqi müstəqilliyinə intellektual potensialı ilə xidmət edən ziyalıdır. Daim elmi və poetik axtarışlarda olan Şa-

hin Fazilin fəaliyyəti Azərbaycan hüdudları ilə məhdudlaşmır. O, ölkəmizdə və onun hüdudlarından şox uzaqlarda (Rusiya Federasiyasında, İran İslam Respublikasında, Türkiyə Cümhuriyyətində, Əfqanıstanda, Yaponiyada, Polşada və b. ölkələrdə) keçirilmiş bir çox konqres, konfrans və simpoziumlarda maraqlı, bənzərsiz məruzələrlə çıxış etmiş, Azərbaycanı və Vətən tarix elmini ləyaqətlə təmsil etmişdir. Şahin Fazil səfər etdiyi ölkələrdə keçən günlərini, həmin ölkələrlə bağlı olan təəssüratlarını yazdığı və nəşr etdirdiyi "Səfərnamə"lərində əks etdirmişdir. Həmin "Səfərnamə"lər alimin (və şairin) öz bilgilərini oxucularla bölüşmək duyğusunun, ehtiyacının göstəricisidir. Hal-hazırda Şahin Fazil AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunda "Tarixşünaslıq və mənbəşünaslıq" şöbəsinin müdiri vəzifəsində çalışır.

Ş.F.Fərzəliyev yalnız elmi tədqiqatla məşğul olmamış, Azərbaycan tarixinin tədrisi sahəsində də fəallıq göstərmişdir. O, uzun müddət ərzində Bakı Dövlət Universitetində, ölkənin digər ali tədris ocaqlarında (Lənkəran. Sumqayıt) yüksək səviyyəli ixtisas kursları aparmış, Azərbaycanın orta əsrlər tarixinə aid maraqlı, dərin məzmunlu mühazirələr oxumuş, xeyli aspiranta və dissertanta elmi rəhbərlik etmiş, onlara Vətən tarix elminə sevgi duyğusunu aşılamışdır.

Poetik yaradıcılıq tarixçi, şərqşünas, tərcüməçi, pedaqoq Şahin Fazilin gərgin, yorulmaz, məhsuldar fəaliyyətinin ayrılmaz, üzvi hissəsidir. Şahin Fazil ölkəmizdə və onun hüdudlarından kənarda görkəmli şair kimi də tanınır. O, 140 yaşlı tarixi "Məcməuş-şüəra" ədəbi məclisinin (məclis 1880-ci ildə yaradılmışdır) rəhbəridir, onun qələmindən həmin şairlər məclisinin tarixini əks etdirən "Təzkireyi – Şahin" kitabı çıxmışdır. Şahin Fazil Azərbaycan Yazıçılar Birliyinin üzvüdür, saf Azərbaycan türkcəsinin nümunələri olan iri həcmli beş "Divan"ın və bir çox şeir kitablarının müəllifidir. Görkəmli tarixçi-şairin duyğularını əks etdirən bir neçə misraya diqqət yetirək:

*...Alimə qiymət gərək,*
*Şairə hörmət gərək,*
*Diqqətsizlər nə çoxdur,*
*Görməyə diqqət gərək,*
*Bunlar görmürlər məni.*



*Padşahları görürlər,*

*Timsahları görürlər,*
*Uca məqamlar tutan*
*Məddahları görürlər,*
*Bunlar görmürlər məni.*



*Hicranlar məni gördü,*
*Əfqanlar məni gördü...*
*Yad ellərdə gördüyüm*
*İnsanlar məni gördü,*
*Bunlar görmürlər məni.*



*Allah mənə dayaqdır,*
*Vallah, mənə dayaqdır!*
*Uzaqlar nə yaxındır,*
*Yaxınlar nə uzaqdır,*
*Bunlar görmürlər məni.*

*(Şahin Fazil. Sözləri ecazdı Qusarçaylının.*
*Bakı: Elm və təhsil, 2019, s. 30-31).*

“Şeirim məqalə deyil, məqaləmsə şeirdir” (yenə orada, s. 16) deyən Şahin Fazil yalnız Vətən tarix elmində deyil, habelə Azərbaycan poeziyasında, ədəbiyyatında layiqli yerini tutur.

Zəhmətkeş, prinsipial alim, qayğıkeş, həssas insan, gözəl şair nümunəsi olan Şahin Fazil Azərbaycan tarix elmində, Vətən tarixşünaslığında və mənbəşünaslığında aparıcı mövqe qazanmış simadır, Azərbaycan tarix elmində bəlkə də tayı-bərabəri olmayan bir fenomendir. M.K.Atatürkün hələ 1921-ci ildə söylədiyi “Millətə əfəndilik etmək olmaz; xidmət etmək olar, bu millətə xidmət edən, onun əfəndisi olur” (Utkan Qocatürk. Atatürk. Bakı: Elm, 1991, s. 128) fikrini xalqın məhəbbətini qazanmış Şahin Fazilə də şamil etmək olar. Şahin müəllimə həm tarix araşdırmalarında, həm də ədəbi poetik yaradıcılığında yeni uğurlar arzulayır, böyük arzularının gerçəkləşməsini və onun daim sıralarımızda olmasını diləyirik!

**Tahir CƏFİYEV**
*Tarix elmləri doktoru, dosent*

## ŞAHİN FAZİLİN 80 İLLİK YUBİLEYİNƏ

1995ci ilin payızının ılıq nəfəsi duyulduğu günlərdən biri idi. AMEA-nın aspiranturasına qəbul gedirdi. Mən də sənədlərimi A.Bakıxanov adına Tarix İnstitutunun aspiranturasına təqdim etdim. Yazdığım referata rəy tələb olunurdu. İnstitutun o zamankı elmi katibi, mərhum tarixçimiz Gövhər xanım Məmmədova ilə birlikdə "Azərbaycanın orta əsrlər tarixi" şöbəsinə getdik. Otağa daxil olduqda burada mənim şəxsi tanışlığımın olmadığı, lakin azərbaycan tarix elminə dəyərli töhfələr vermiş insanlarla rastlaşdım. Otağın sağ küncündə iri masanın arxasında ağ-gümüşü saçları simasına qəribə yaraşıq verən bir insan diqqətimi cəlb etdi. Masasının üzərində çoxlu kitab və kağızlar olan bu adam nə isə yazır, hərdən ətrafda mükalimə aparan şəxslərin sorğusuna qısa, lakin tutarlı cavablar verirdi. Mənə onun masasının önündə olan köhnə divanda oturmaq üçün yer göstərildi. Şöbənin o zamankı rəhbəri, mərhum tarixçimiz professor Oqtay Əfəndiyev yazımla tanış olduqdan sonra – Şahin, bəlkə sən buna baxıb nəsə yazasan – deyə müraciət etdi.Şahin müəllimlə ilk şəxsi tanışlığımız belə başladı. Bu, mənim tələbə vaxtı oxuduğum və bir çox gizli mətləbləri mənə açan "Azərbaycan XV – XVI əsrlərdə ("Həsən bəy Rumlunun Əhsənüt-təvarix" əsəri üzrə) kitabının müəllifi Şahin Fərzəliyev idi. Şahin müəllimin müsbət rəyi ilə yeni bir yola qədəm qoydum. 1995-ci ilin sonunda o, mənə elmi rəhbər təyin edildi. Etiraf edim ki, üzərində işlədiyim XVI əsr osmanlı tarixçisi Xoca Sədəddin Əfəndinin "Tacüt-təvarix" əsərinin tapılması məhz onun elmi araşdırmalarının nəticəsi idi. 2007-ci ildə onun rəhbərliyi altında namizədlik dissertasiyası müdafiə etdim. Bu illər ərzində çox məsələləri onunla müzakirə etdik, çox qaranlıq məsələlər bizə agah oldu. Onu gözəl insan, bir neçə divan kitabının müəllifi olan şair kimi tanıdım. Şahin müəllim mənə təhlildə dəqiqlik, səbrli olma, boşuna danışmama kimi müsbət xüsusiyyətləri öyrətdi. 2014-cü ildən İnstitutun rəhbəri, akademik Yaqub Mahmudovun təşəbbüsü ilə yeni yaradılmış, elmi və məsuliyyət yükü ağır olan "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsi məhz Şahin müəllimə həvalə edildi. Şöbənin təsis olunduğu gündən 2018-ci ilədək burada elmi fəaliyyətlə məşğul oldum. Şahin müəllimin rəhbərliyi altında çalışdığımız dövrdə onun heyrətamiz işgüzarlığı bizə örnək oldu. Bəzən işdən yorulduğumuz anlarda Şahin Fazil, Eynulla Mədətlinin təklifi ilə öz şeirlərindən oxuyur, beynimizi biristiqamətli fikirləşmə yorğun-

luğundan xilas edirdi. Bəzən onun "Məcməüş-şüəra"dan qonaqları olurdu. Bunların arasında maraq dairəsi müxtəlif olan insalarla tanışlıq bizdə Şahin müəllimin ictimai fəaliyyəti barədə təəsurat oyadırdı.

Zənnimcə, Şahin Fazilin on illər ərzində tərcümə edib çapa hazırladığı İsgəndər bəy Münşi Türkmanın "Tarixe-aləmaraye-Abbasi" və Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" adlı tarixi mənbələri tarixşünaslığımıza əvəzsiz töhfələrdir. Müəllif əsərlərin orijinallığını və xüsusiyyətlərini hər vəchlə qorumağa çalışmış, eyni zamanda müasir oxucunun anlaya biləcəyi dildə tərcümə etmişdir. Həmin mənbələrin, eləcə də 1991 və 1992-ci illərdə osmanlı və fars dillərindən tərcümə və çap olunan Jozef Tiflisinin "Vaqeati- Mir Veys və Şah Hüseyn" həmçinin Yan Tadeüş Kruşinskinin "Xristian səyyahın tarixi" əsərlərinin işıq üzü görməsi Şahin müəllimin böyük uğuru, Azərbaycan tarix elminin qazancıdır.

Gözəl ata, müəllim, böyük alim,şeiriyyatda divan ənənəsini yaşadan şair və tarixçi Şahin Fazil Fərzəlibəylinin səksən illik yubileyi qarşısında ona ən xoş arzularımı bildirir, üzün ömür, can sağlığı xeyirli işlərində müvəffəqiyyətlər diləyirəm. Vətən tarixşünaslığının zənginləşməsində əvəzsiz xidməti olan Şahin Fazil Fərzəlibəyliyə bu yolda yeni-yeni elmi və poetic uğurlar diləyi ilə!

Şahin müəllimin elmi uğurlarından azacıq da olsa yazdım.Bəs poetik uğurlar? Çoxdur, lap çoxdur bu uğurlar. Şahin quşu qanadlarını gərir və uçur. Şahin müəllim də "xəyal təyyarəsi"ndə tez-tez pərvaz edir, şikara şığıyan şahin quşu kimi əngin göylərin seyrinə çıxır.

"Uçan adam" şeirini oxudum və bu şairin poetik seyrini gördüm. Siz də görün:

*Niyyətim təzədir, səfərim yeni,*
*Vida eyləmədən yer həyatına*
*Xəyal təyyarəsi aparır məni,*
*Uçuram göylərin yeddi qatına.*

*Mən yerdə o qədər səfa çəkmişəm,*
*Mən yerdə o qədər yer görmüşəm ki…*
*Göylərə uçmasam, qorxuram öləm*
*Ürəyimdə qala ürəyimdəki.*

*Gerçəyin üstündə pərdə görmüşəm,*
*Pərdənin altında dərd də, kədər də.*

*Yerdə rəzalət də, şər də görmüşəm,*
*Amma şərafət də görmüşəm yerdə.*

*Bə'zən yada salıb yanıq Kərəmi*
*Yanmışam, sinəmi dağlamışam mən.*
*Bə'zən bu yaşımda uşaqlar kimi*
*Bir küncə çəkilib ağlamışam mən.*

*Bə'zən həzzim acı, ovqatım yaman,*
*Bə'zən işim-peşəm darıxmaq olub.*
*Bə'zən üzərimə çökməyib duman,*
*Günüm saqqalımdan daha ağ olub.*

*Bə'zən dad etmişəm sözün əlindən,*
*Açılıb güllə tək qəlbimə dəyib.*
*Bə'zən çox adamı sevməmişəm mən,*
*Bə'zən çox adam da məni sevməyib.*

*Bə'zən asan işim qalıb çətində,*
*Bə'zən əziyyətim olubdur hədər.*
*Bə'zən Əfqanıstan məmləkətində*
*Mənə gül yerinə güllə veriblər.*

*Enişə-yoxuşa çox düşmüşəm mən,*
*Önümdə fərağın dağı da olub.*
*Bə'zən həyatımda hicranın gülən,*
*Vüsalın ağlayan çağı da olub.*

*Diləyib yoluma ömür nəsimi,*
*Eləyib təvəkkül ulu Allaha,*
*Şikara şığıyan bir şahin kimi*
*Göylərin seyrinə çıxıram daha.*

*Niyyətim təzədir, səfərim yeni,*
*Vida eyləmədən yer həyatına*
*Xəyal təyyarəsi aparır məni,*
*Uçuram göylərin yeddi qatına.*

Şahin müəllim mənim elmi rəhbərim olmuşdur. Elə bu gün də onu elmi rəhbərim sayıram!

**Fərəh HÜSEYN**
*Tarix elmləri doktoru, dosent*

# ŞAHİN FAZİL VƏ ONUN "ÇALDIRAN" ADLI EPİK POEMASI

Azərbaycan tarix elminin korifey simalarından olan professor Şahin Fərzəlibəylinin (Şahin Fazil) orta əsrlərə dair çoxsayılı tədqiqatları içində Səfəvi dövrü ilə bağlı elmi əsərləri və tərcümələri xüsusi yer tutur və olduqca qiymətlidir. Sırf bu mövzu ilə bağlı üç elmi monoqrafiyanın və onlarla məqalənin müəllifi, XVI-XVIII əsrlərə aid dörd mənbənin, o cümlədən İsgəndər bəy Münşi Türkmanın və Həsən bəy Rumlunun qələmlərindən çıxmış iki böyük həcmli əsərin fars dilindən tərcüməçisi və şərhçisi, dövrün bir sıra problemlərinin əsaslı şəkildə araşdırmacısı kimi Şahin Fazil səfəvişünaqlıq məktəbinə misilsiz töhfə vermiş və onu zənginləşdirmişdir.

Məlum olduğu kimi, Səfəvi dövrü Vətən tariximizin ən qüdrətli və eyni zamanda olduqca mürəkkəb və ziddiyyətli səhifəsini təşkil etmişdir. Tarixi sürəçlərin təsiri ilə baş vermiş və epoxanın rəmzinə çevrilmiş məşhur Çaldıran savaşı həmin dövrün keşməkeşliyini bütün dramatikliyi ilə özündə təcəssüm etdirən hadisə kimi qəbul olunur. Bu savaş müasir dövrün reallıqları ilə də aktual şəkildə səsləşdiyi üçün həm tarixi, həm də ictimai təfəkkürün maraq dairəsində olub müxtəlif yanaşmalara, şərhlərə və diskussiyalara mövzu olmaqdadır. Bu yanaşmalar arasında, təəssüf ki, bəzən tarixi reallıqları nəzərə almadan obyektivlikdən uzaq, qərəzli və hətta kimlərinsə maraqlarına xidmət edən zərərli görüşlərin ifadə olunmasının da şahidi oluruq ara-sıra. Belə olduğu halda bu tarixi olayı müxtəlif səpgili mənbələr əsasında dərindən araşdıran alimlərin fikirləri olduqca vacibdir. Bu baxımdan Osmanlı münasibətlərini, ələlxüsus Sultan Səlim və Şah İsmayıl arasında baş vermiş qarşıdurmanı ilkin mənbələrə, xüsusilə fars dilli və Osmanlı qaynaqlarına istinadən elmi əsaslarla ətraflı şəkildə tədqiq etmiş Şahin Fazilin bu mövzuya həm tarixçi, həm də qəlbinin hökmü ilə bir şair kimi yanaşması məntiqli və qiymətlidir. Beləliklə, 1990-cı ildə ərsəyə gəlmiş "*Çaldıran*" adlı epik poema elmi təfəkkürün və *"şahin quşu kimi xəyal qanadlı"* poetik təxəyyülün məhsulu kimi müəllifin bu mövzu üzərində düşüncələrinin və gələcək nəsillərə nəsihət mahiyyətində olan arzularının ifadəsidir:

*Bağışlasın oxucu,*
*Sındı qələm, yox ucu.*
*Çaldıranı yazmağa*
*Mənə gərək ox ucu!*

Əruz və heca vəznlərində yazılımış poemanın ana mövzusunu təşkil edən və əsərin ilk sətirlərindən sonuna qədər ürək yanğısı ilə ifadə olunan əsas motiv, 1514-cü ilin avqust ayının 23-də cəmi bircə gün cərəyan etmiş, lakin Osmanlı-Səfəvi münasibətlərində sitəmli və gəmgin bir səhifə kimi tarixə yazılmış, günümüzdə belə acı və kədər hissləri ilə qarşılanan Çaldıran cənginin yaşatdığı ağrı-acıdır:

*Ölən türk, öldürən türkdür, a Şahin,*
*Bu qırğınlar neçin var Çaldıranda?*

*Leş üstdən at sürən var Çaldıranda,*
*Ölən var, öldürən var Çaldıranda.*

*Müsibət var, bəla var, Kərbəla var,*
*Alan can, can verən var Çaldıranda.*

*Qaçıbmı Hörmüzün ruhi bu yerdən?*
*İlahi, Əhrimən var Çaldıranda.*

*Səfiəddin gəlibdir əldə kəşkül,*
*Cüneyd, Heydər, Həsən var Çaldıranda.*

*Qızılbaş müztərib, Osmanlı məyus,*
*Fəlakətlər görən var Çaldıranda.*

*O boz torpaq qızarmış, rəngin olmuş,*
*Qızıl başdan çəmən var Çaldıranda.*

*Ölənlərçin qəbir vardır, a Şahin,*
*Qalanlarçın vətən var Çaldıranda.*

Şair, qəlbini təlatümə gətirən düşüncələrini Çaldırana gah sanki ağı söyləməklə, gah gileylənərək, gah irad bildirməklə, gah da acı kinayə ilə bütün çalarları ilə ifadə edir:

*İlahi, indi kin var Çaldıranda,*
*Nə iman var, nə din var Çaldıranda.*

*...Yoluxmuş həzzə qüssə, eyşə qüssə,*
*Pərişan var, həzin var Çaldıranda.*

*Ölən Türk, öldürən Türkdür, a Şahin,*
*Bu qırğınlar neçin var Çaldıranda?*

Və yaxud

*Bu gün min-min yaraq var Çaldıranda,*
*Savaşlardan soraq var Çaldıranda.*

*Bu gün Yavuz Səlim, Şah İsmayıl var,*
*Bu gün dağ üstdə dağ var Çaldıranda.*

*Bu gün hər günkü şənlikdən əsər yox,*
*Bu gün nisgil, fəraq var Çaldıranda.*

*...Bu gün, Şahin, qızılbaş var bədənsiz*
*Bu qanlardan bulaq var Çaldıranda.*

Eyni zamanda şah və vətən uğrunda canlarından keçən igidlər üçün Çaldıran uca bir məqamdır, haqdır. Poemanın başqa bir hissəsində isə oxuyuruq:

*"Ölüm haqdır, yetək haqqa!", a Şahin,*
*Bu məzmunda qərar var Çaldıranda.*

Müəllif Çaldıran savaşının ərəfəsi və gedişatı zamanı baş verən hadisələri bədii üslubda, lakin tarixi faktlara sadiq qalaraq dəqiqliklə qələmə alır və bunun sayəsində poemada təsvir olunan hadisələr və tarixi

şəxsiyyətlər oxucunun gözü qarşısında bütün dolğunluğu ilə canlanır. Məsələn, Şah İsmayılın Çaldıran savaşının taleyini dəyişdirə biləcək qədər mühüm və mübahisəli taktiki qərarı, poemanın *"Hücum gecə deyil, səhər olacaq!"* adlı hissəsində açıqlanır. Məlum olduğu kimi, Şah İsmayılın yaxın silahdaşları olan Məhəmməd xan Ustaclı və Xəlifə Sultan, Osmanlı ordusunun say və silah sürsat baxımından üstünlüyünü nəzərə alaraq səhərin açılmasını gözləmədən elə gecə ikən hücuma keçməyi təkid etsələr də, bu təklif şah tərəfindən qəti şəkildə rədd edilmişdir. Həmin tarixi qərar, hər nə qədər Səfəvi ordusunu qazanıla biləcək üstünlüklərdən məhrum etmiş olsa da, mənəvi tərəfi ilə qızılbaş hökmdarının ləyaqət hissini hər şeydən uca tutmaqla ibrətamiz davranışını təsbit etmişdir ki, bu da poemada öz həqiqi əksini tapmışdır:

*Dedilər qəfildən onları basaq...*
*Xeyr, belə əməl yaraşmaz mənə,*
*Hücum gecə deyil, səhər olacaq,*
*İndisə ilhamım deyir "Yaz!" mənə:*
*"Mən ol şahbazi-kuhsarəm, baş əyməm qülleyi-Qafə,*
*Neçə ənqa kimi yavru uçurdum aşiyanimdə".*

*Mənim qürurum var, əzəmətim var,*
*Ulu bir ölkəyə hökmdaram mən,*
*Qəfil basqın edər karvanbasanlar,*
*Yolkəsən deyiləm, şəhriyaram mən...*

Və yaxud Şah İsmayılın, Osmanlılar tərəfində savaşan məşhur pəhlivan Əli bəy Malqoçoğlu ilə təkbətək tarixi döyüşünə həsr olunmuş poemanın *"Şah önünə şah çıxar..."* adlı digər hissəsində müəllif Şah İsmayılın qarşısına Sultan Səlimin özünün deyil, Malqoçoğlunun çıxmasına müasibəti şahın öz dilə ilə ifadə edir:

*Get, Səlim özü gəlsin,*
*Qoy qızıb gözü gəlsin.*
*Tüfəngi atsın yerə,*
*Əlində nizə gəlsin,*
*Əli bəy Malqoçoğlu.*

Şahin Fazil Şah İsmayılın müəllifi olduğu

*"...İşin düşər,*
*Gəlib-gedişin düşər,*
*Dişləmə çiy löğməni,*
*Yerinə dişin düşər"*

xoyratısından ilhamlanaraq Malqoçoğlunun acı əqibətini nəql edir:

*Gözləmir aman səni,*
*Tərk edəcək can səni,*
*Dişlərin sınacaqdır,*
*Dişləmə çiy löğməni*
*Əli bəy Malqoçoğlu.*

*Ah, coşur birdən-birə,*
*Şah coşur birdən-birə,*
*Qılınc elə işləyir,*
*Bölünür iki yerə*
*Əli bəy Malqoçoğlu.*

Poemanın əsas məramını, məğzini təşkil edən Çaldıran motivi fonunda və buna paralel şəkildə Şah İsmayıl obrazı canlandırılır. *"Sahibi-seyf və-l qələm"* sözləri ilə ulu əcdadına xitab edən Şahin Fazil, Çaldıran həzimətini yaşayan *"məlallı, yaralı"* Şah İsmayılla həmsöhbət olur, onunla mükalimə edib düşüncələrinə şərik olur. *"İki İraqın baş əydiyi, İranı və Şamı tutan, bir əli Xorasan bağlarında, bir əli Dəmavənd dağlarında olan, hətta kralların baş əydiyi əzəmətli bir hökmdar"* Çaldırandakı itkilərdən dolayı qəmə qərq olmuş, lakin qürurunu itirməmiş, qürurunu qorumuş Şah İsmayılın düşüncələrini Şahin Fazil dilə gətirir:

*"İsmayıl düşünür: "Yarəb, bu savaş*
*Gərək olmayaydı, tutmayadı baş.*
*Bu qədər inilti, ah olmayaydı,*
*Sultanəli Mirzə "şah" olmayaydı.*
*Bu qədər əsgərim qırılmayaydı,*
*Qoşunum, ləşkərim qırılmayaydı.*

*İgid Dədə bəyim xar olmayaydı,*
*Ərən Sarı Pirəm zar olmayaydı.*
*Güllə uçmayaydı, top atmayaydı,*
*Qılınclar başları qopartmayaydı.*
*Qanlar Çaldıranı suvarmayaydı,*
*Ağçay, Zeyvə çayı qızarmayaydı".*

Poemada Şah İsmayıl obrazı, bu tarixi şəxsiyyəti səciyyələndirən bütün cəhətləri ilə təcəssüm etdirilmişdir – bir şair, cəngavər, sərkərdə, hökmdar və mürşid-i kamil kimi. Belə ki, Şah İsmayılın şəxsiyyəti, poetik ruhu, cəngavərlik əqidəsi, sərkərdəlik məharəti, hökmdarlıq istedadı və mürşidi-kamillik məqamı kimi xüsusiyyətlərin məcmuəsindən təşəkkül tapmışdır və poemada da tarixi faktlara istinadən məhz bu məziyyətlərin təsvir olunması ilə bütöv bir Şah İsmayıl Xətai obrazı yaradılmışdır. Şah İsmayıl, sadalanan bu xüsusiyyətlərin hər birinin zirvəsindədir, kamillik dərəcəsindədir, hər birinə sadiqdir, birisini digərinə güzəştə getmir. Sərkərdə olduğu qədər şairdir, hökmdar olduğu qədər cəngavərdir və əsərdə bu, bədii üsullarla oxucuya çatdırılır: Çaldıran öncəsi gecədə şair Şah İsmayılın hökmdar Şah İsmayılla xəyali bir mükaliməsi bu baxımdan maraqlıdır:

*Sabah Şah İsmayıl cəngə gedəcək,*
*İndisə, qələm var əldə, yox yaraq.*
*Şeir səhər deyil, gecə bitəcək,*
*Hücum gecə deyil, səhər olacaq!!!*

Poemanın ən qiymətli və təsirli tərəfi, onu mənəvi yöndən zənginləşdirən ən önəmli cəhət isə, zənnimizcə, Çaldıranın bizə aşıladığı tarixi dərsin dərk edilməsinin və ibrət alınmasının vacibliyini Şahin Fazilin dilə gətirməsidir. Şair bunu həm poemanın *"Son söz"* hissəsində ağlayaraq varsağı söyləyən bir ozanın dili ilə, həm də şəxsən özünün adından qəzəl şəklində ifadə edir:

*"Neçin susadı qana*
*Osmanlıyla qızılbaş?*
*Neçin girdi meydana*
*Osmanlıyla qızılbaş?*

*...İnsafdan iraqdılar,*
*Mürvətdən uzaqdılar,*
*Sanki yalquzaqdılar*
*Osmanlıyla qızılbaş.*

Bu tarixi səhvin gələcəkdə bir daha təkrarlanmaması üçün şair gələcək nəsillərə xitab edir:

*Ey nəsillər, türkü türk zar eyləyib, xar eyləyib,*
*Ey nəsillər, bir nümunə, bir misaldır Çaldıran.*

*Şahina, qan ağlayırsan, xal düşübdür bağrına,*
*Xalqımın hərb tarixində qarə xaldır Çaldıran!*

Inanıram ki, bugünki Azərbaycan və çağdaş Türkiyə Respublikası arasında mövcud olan qardaş münasibət daim "İki millət, bir dövlət" şüarına sadiq qalacaq, onların münasibətləri başqa ölkələr üçün nümunə olacaqdır!

**Фарах ГУСЕЙН**
*ведущий научный сотрудник
Института истории им. А.Бакиханова,
доктор философии по истории*

## СТРАНИЦЫ ИНТЕРЕСНОЙ ЖИЗНИ

***Видному азербайджанскому историку и востоковеду, доктору исторических наук Шахину Фазилю исполнилось 75 лет.***

***Шахин Фазиль оглы Фарзалиев – видный ученый, посвятивший большую часть жизни интенсивной научной деятельности в отделе "Средневековая история Азербайджана" Института истории имени А.Бакиханова. В настоящее время он руководит учрежденным в этом отделе подотделом "История Азербайджана XIII-XVII вв." Шахин Фарзалиев автор более тридцати книг, в том числе 5-и исторических монографий, 4-х поэтических диванов, свыше 20-и книг стихов и более 200 научных статей, ему также принадлежит перевод 4-х исторических источников с персидского и турецкого языков.***

Шахин Фарзалиев был научным руководителем многих аспирантов и диссертантов, долгие годы занимался педагогической деятельностью, работал заместителем декана факультета Востоковедения БГУ. Многие труды известного ученого по истории, литературе, переводы исторических источников, а также книги в жанре "путевых записок" издавались как в Азербайджане, так и ряде зарубежных стран – Иране, Афганистане, Турции, Японии.

Шахин Фарзалиев родился в 1940 году в городе Губа. В 1958 г. поступил на отделение персидской филологии факультета востоковедения Азербайджанского государственного университета. Окончив университет с дипломом отличия, он в качестве переводчика был направлен для работы в Афганистан. Помимо основной специальности Ш.Фарзалиев интересовался историей и как следствие большую часть своей научной деятельности посвятил именно этой дисциплине.

Шахин Фарзалиев глубоко предан родной земле, именно любовь к Родине вдохновила ученого на создание исторического труда о родном

крае. Его монография "История Губы" впервые увидела свет в 2001 году, а совсем недавно к печати было представлено второе издание этого интересного научного исследования.

Ученый, посвятивший четверть века научному анализу истории взаимоотношений Азербайджана с Ираном и Турцией, в ходе своих научных исследований накапливал сведения о Губе, содержащиеся в разноязычных источниках. Тщательное исследование материалов средневековых источников, эпистолярных документов, дипломатических переписок и исторических трудов позволили создать этот ценный труд, посвященный истории Губы начиная с IV века и до наших дней. Относительно этимологии топонима "Губа", ученый выдвигает собственные предположения. Так, перечисляя существующие версии возникновения топонима Губа, связанные с упоминавшимся в труде Птолемея "География" албанским городом "Хобот", переселением в Азербайджан в VII веке арабских племен из местечка "Губа", расположенного вблизи города Медины, а также с рельефом расположения этого города на куполообразной высоте – *qübbə*, Фарзалиев все же допускает происхождение данного топонима от антропонима или этнонима.

В 1970-1973 гг. Ш.Фарзалиев обучался в аспирантуре Института истории имени А.Бакиханова. Это было время, когда благодаря исследованиям видных ученых Б.Н.Заходера, И.П.Петрушевского, О.А.Эфендиева, М.Ч.Гейдарова, А.А.Рахмани, С.М.Онуллахи и других началось формирование школы сефевидоведения. Новое направление нуждалось в обогащении базы источниковедения этой области путем перевода и исследования персоязычных источников, относящихся к истории государства Сефевидов (1501-1736), и поэтому не случайно, что кандидатская диссертация Ш.Фарзалиева была посвящена именно этому направлению. В 1974 году под научным руководством профессора Октая Эфендиева Ш.Фарзалиев защитил диссертацию на тему "Труд азербайджанского историка XVI века Гасан бека Румлу "Ахсан-ат-таварих" как источник по истории Азербайджана", что предопределило его дальнейшую научную деятельность. В те годы Шахин Фарзалиев занимался также исследованием и переводом персоязычных и османских источников. В 1996 году ученый защитил докторскую диссертацию на тему "Азербайджан и Османская империя", посвященную исследованию отношений Османской империи с азербайджанскими государствами XV-XVI вв. (Каракоюнлу, Аккоюнлу, Ширваншахов и Сефевидов).

Большим вкладом Шахина Фарзалиева в историческую науку стал его перевод на азербайджанский язык книги выдающегося историка, поэта, каллиграфа, государственного деятеля Искандер бека Мунши (1560-1634) "Украшающая мир история Аббаса". В этом ценнейшем труде повествуется об истории большого региона (Азербайджан, Иран, Ближний и Средний Восток, Кавказ), начиная от создания государства Сефевидов, включая период правления Шаха Аббаса I (1587-1629). Вне всякого сомнения, этот труд является одним из самых важных источников по изучению государства Сефевидов.

Необходимо отметить, что, начиная с конца 30-х годов прошлого века М.Эфендизаде, Ф.Бабаев, А.Гасымов, А.Рахмани приступали к переводу этого труда, но ожидаемого результата удалось добиться именно Ш.Фарзалиеву. В 2004 году, принимая во внимание научную значимость этого труда, Ученый совет института Истории по предложению его директора, члена-корреспондента НАНА Ягуба Махмудова принял решение о переводе его на азербайджанский язык. Тогда в рамках реализуемого Институтом проекта "Издание первоисточников по истории Азербайджана" в 2009 году был издан первый том этого источника в переводе на азербайджанский язык члена-корреспондента НАНА, профессора О.А.Эфендиева и к.и.н. Н.С.Мусалы. И, наконец, полный перевод на азербайджанский язык и издание 3-х томного труда Искендер бека Мунши стало возможным в результате поистине колоссальных усердий Шахина Фарзалиева. Вместе с научными комментариями 2505 страничный перевод был издан в двух книгах в 2010 и 2014 г.г. Безусловно, этот труд стал наивысшей заслугой в научной деятельности ученого.

Ш.Фазиль известен также и как талантливый поэт, его богатое литературное творчество отличается собственной позицией в современной азербайджанской литературе и очевидно, что он уже оставил след в истории нашей культуры. И если основной целью ученого Шахина Фарзалиева является придание нового духа классическим литературным традициям, то в поэтическом творчестве Шахина Фазиля четко прослеживается верность классическим традициям, стремление сохранить и передать их последующим поколениям. Вероятно, именно это и подтолкнуло его к созданию первого поэтического "Дивана" в азербайджанской литературе XX века.

Шахин Фазиль – поэт-новатор, смело применяющий новые идеи в отечественной литературе. При этом круг его интересов

выходит далеко за пределы Азербайджана. В феврале 2009 года он побывал в Японии, где познакомился с классической японской поэзией хайку. Шахин Фазиль настолько увлекся этим средневековым поэтическим жанром, что начал сочинять хайку на родном языке.

Пытливый ум Шахина Фазиля постоянно в поиске, у него много интересов и начинаний, он стремится к созданию новых произведений как литературных, так и исторических, Благодаря этому он занимает достойное место в азербайджанской литературе, и исторической науке.

**İmamverdi HƏMİDOV**
*AMEA Nizami Gəncəvi adına
Ədəbiyyat İnstitutunun şöbə müdiri,
filologiya elmləri doktoru, professor*

## ŞAHİN FAZİL SƏFƏRNAMƏLƏRİNİN ƏDƏBİ-TARİXİ ƏHƏMİYYƏTİ

Azərbaycanın da daxil olduğu klassik şərq ədəbi-mədəni irsi bəşər sivilizasiyasında böyük hadisə kimi dəyərləndirilir. Bu irsin əhəmiyyətli bir hissəsini istedadın bəhrəsi kimi təqdim edilən poetik yaradıcılıq və onunla bağlı olan digər sənət növlərinin məhsulu təşkil edir. Dini etiqad olaraq islam bir çox şərq xalqlarının birləşdirməklə onların yaradıcılıq məhsullarında müştərək cəhətlər, ortaq başlanğıclar yaratdı. Ədəbi yaradıcılığın forma və məzmununda, söz və məna gözəlliklərinin ifadəsində əldə edilmiş uğurlar elə bir səviyyəyə çatmışdır ki, onların təqlidi həm Şərq, həm Qərb mütəfəkkirləri üçün bir peşəyə çevrildi. Mən burada divan ədəbiyyatını həmin yaradıcılıqda bariz bir nümunə hesab edirəm. Axı divan bağlamaq, divan yaratmaq yalnız müqtədir şairə layiq bir iş hesab edilmiş, onun müəllifi sənətinin nüfuzu ilə bu addımı atmağa özünü haqlı bilmişdir. Divan adlanan məcmuədə orta əsr şairləri ən çox yayılmış poetik janrlarda və qaqfiyələri əlifbanın bütün hərfləri üzərində qurmaqda məharət nümayiş etdirməli idilər. Şairlər öz divanları ilə tanınır, qiymətləndirilir və şeir sənətini zənginləşdirirdilər. Şərq şairlərinin poetik qüdrəti Qərbin söz xridarları tərəfindən zaman-zaman nümunəyə çevrilmiş, onların sənəti müqabilində bacarıqlarını göstərməyə çalışmışlar. "İlahi “komediya” müəllifi italyan Dante, Əbuləla Məərrinin mövzu və motivlərində sınaqdan çıxdığı kimi alman Höte, Sə’di, Nizami, Hafiz və başqa dahiləri təqlid etməklə Qərb divanını bağlamağa qarışmışdır. Bəşərin yaradıcılıq yolu belədir.

Mən yalnız divanla bağlı fikirlərini məhdudlaşdırmaq istəmirəm. Orta əsrlər mədəniyyətində təzkirə, səfərnamə yazmağı da hünər sayıram. Axı o divanlar, təzkirələr, səfərnamələr olmasaydı, neçə-neçə qüdrətli söz sənətkarının, mütəfəkkirin, şəhid alimin həyatı və əsərləri haqqında məlumatları almaqda çarəsiz qalardıq, bir çox həqiqətlərdən xəbərsiz olardıq.

Bu baxımdan səfərnamə yazmaq, özü də dəyərli məlumat verən maraqlı səfərnamə yazmaq həmişə aktual olmuşdur. Əlaqələrin çox intensiv

olduğu, turizmin inkişafı üçün hər cür şəraitin yaradıldığı müasir dünyada bu janrda yazıların meydana gəlməsi bütün yönlərdən arzu olunandır. Əgər XI əsrdə Nasir Xosrov səfərnaməsini yazmasaydı Azərbaycan şairi Qətran Təbrizinin canlı danışıq dilinin fars dili olmadığı faktını haradan bilərdik? Yaxud Səmaninin "Kitab əl-ənsab" ("Nisbələr kitabı") və Yaqut əl-Həməvinin "Mucəm əl-udəba" ("Ədiblər ensiklopediyası") təzkirələri olmasaydı, tanınmış Azərbaycan şərhçisi və filoloqu Xətib Təbrizinin doğma Azərbaycan dili haqqında mötəbər məlumatın haradan alardıq. Yaxud XIV əsr ərəb səyyahı İbn Bətutənin səfərnaməsi olmasaydı, Kiçik Asiyada və Azərbaycan şəhərlərində əxi birliklərinin fəaliyyətlərinin yayılmasını ortalığa necə çıxarardıq? Və sairə, və sair.

Tarix elmləri doktoru, professor Şahin Fazil oğlu Fərzəliyev bu janrları XX əsrin sonunda Azərbaycanın ədəbi-tarixi həyatında ehya etmişdir. 5 divan, "Təzkireyi-Şahin", 23 onlarla səfərnamə müəllifi olan Şahin Fazilin əsərləri ədəbi-tarixi baxımdan əhəmiyyətlidir. **Düzdür, müasir dövrümüzdə Şahin kimi divan ədəbiyyatında iştirak etmək istəyən şairlərimiz var. Lakin Şahinin divan ədəbiyyatındakı hünəri – müasir Azərbaycan dilində klassik qəzəlin şirinliyini saxlamaq təcrübəsi və bu təcrübəyə çağırışı, məncə onun adı ilə bağlıdır.** Səfərnamə yaradıcılığına gəldikdə isə bu janrın dirçəldilməsi sahəsində Şahinin xidmətləri şəksizdir. Əlbəttə, müxtəlif beynəlxalq konfranslarda və elmi tədbirlərdə iştirak etmiş alimlərin arabir mətbuat səhifələrində bu yönlü yazıları maraq doğursa da həmin müəlliflər bu işi davamlı şəkildə aparmamışlar. Hələ keçən əsrin 60-cı illərində dünyanın bir sıra ölkələrində müxtəlif elmi tədbirlərə dəvət olunmuş tanınmış şərqşünas professor Rüstəm Əliyevin "Kommunist" qəzetindəki xatirələri o vaxtkı Azərbaycan cəmiyyəti tərəfindən böyük maraqla izlənilirdi. İki il öncə BDU-nun professoru Vaqif Sultanovun "Ədəbiyyat qəzeti"ndə yazdığı məqalələrdə Monqolustan səfəri zamanı qədim türk abidələrinin izi ilə gedərək təsvir etdiyi obyektlər elmi-kulturoloji baxımdan çox dəyərli və maraqlıdır.

**Mən hesab edirəm ki, Şahin Fazilin səfərnamə janrına müraciəti iki səbəbdən irəli gəlmişdir. Birincisi, o, bir şair kimi nizama düzdüyü sətirlərin mövzularının və motivlərinin çox hissəsini səfərlərdə aşkar etmiş, yaxud orada onu narahat etmişdir. İkincisi, Şahin Fazil oğlu Fərzəliyev tarixçi alim, tarix elmləri doktoru və professor olaraq olduğu ölkə və məkanların tarixi ilə istər-istəməz maraqlanır, tarixi bilikləri yada salır və elmi nəticələrini kütləvi oxucularına da çatdır-**

**maq istəyir. Heç şübhəsiz, onun aşağıdakı beyti eynilə səfərnamələrinin yazılması və yayılmasına da aiddir:**

*Şahinin "Divan"ı, Rəbbim, kömək ol, nəşr olsun,*
*İstəməz qəbr evinə sinədə "Divan" apara.*

Fikrimi təsdiqləyən daha bir faktı göstərmək istəyirəm: Şahinin elmi fəaliyyətində bir məqam yada düşür. O XVIII əsr polyak şərqşünası Yan Tadeuş Kruşinsinin "Xristian səyyahının tarixi" kitabını Azərbaycan dilinə tərcümə etmişdir. Səfərnamədə bu məlumat onda verilmişdir ki, o, Azərbaycan alimləri və jurnalistləri ilə birlikdə Tehrandakı "Şərqşünasların mədəniyyət sarayı"nda qolları kəsilmiş məşhur şəhidin dişində tutduğu qabda böyük yoldaşlarına su aparmasını əks etdirən tablonu müşahidə edir. Yaradıcı insan Şahin Fazilin assosiasiyasında bu anda buna bənzər hadisədən nəql edən polyak müəllifi, məqtəl janrının qəhrəmanı Hüseyni ibn Əli, əfqan döyüşçüləri, nəşəqçilər[1], Qarabağ uğrunda fədakar mübarizə və bu mövzuda yazdığı şeirin misraları yada salınır:

*Bu qoca canımda cövr edir yaram*
*Düşməni salmağa bəndə hazıram.*
*Nəşəqçi olmağa mən də hazıram,*
*Nəşəqçi gərəkdir bizə, nəşəqçi.*

**Şahin Fazil səfərnamələri onun müxtəlif tədbirlərlə bağlı olduğu ölkələrin tarixi və ədəbi həyatına aid məlumatlarla zəngindir. Sayca 30-dan artıq olan bu səyahətnamələr. Coğrafi baxımdan Yaponiya, Əfqanistan, İran, Türkiyə, İraq, Birləşmiş Ərəb Əmirlikləri, Naxçıvan, Özbəkistan və Rusiyanı (hələ başqa ölkələr də var) əhatə edir. Onlar ədəbi baxımdan poetik sənətin incəliklərini göstərməklə yanaşı müəyyən tarixi-elmi nəticələrin təqdim edilməsinə əsas verir.**

Şair düşüncəsinin məhsulu kimi səfərnamələrdeə müxtəlif lirik janrlarda yazılmış şeirlərdə Şahin həssas qəlbə malik şair kimi canlanır, şikayətini özünə yönəldir, fəxriyyə deməyi də lazım bilir. Belə məqamlarda onun fərdi duyğuları ictimai məna alır:

[1] –Nəsəqçi – XVIII əsrdə əfqanlar arasında düşmənlə döyüşdə yalnız hücuma keçməyi düşünən, geriyə dönməyi heç vaxt özünə rəva bilməyən, özünü fəda etməyə hazır olan döyüşçü olmuşdur.

*Məndən də bu dünyada zəngin bir adam varmı?*
*Qiymətli durum yoxdur, qiymətli kəlamım var.*

*Səyimlə, iradəmlə minlərlə şeir yazdım.*
*Vallah elə şahəm ki, minlərlə qulamim var...*

*Bir ölkəni, min əfsus, bir çay ikipay etdi,*
*Şirvanda Seyid varsa, Təbrizdə Hümamim var.*

Yaxud

*İrandə şahin quşunu görmədi Şahin,*
*Şahinlik edən indisə İranə mənəm, mən.*

Ədəbi baxımdan bu səfərnamələrin əhəmiyyəti ondadır ki, müəllifin iştirakçısı olduğu elmi-ədəbi tədbirlərdə Xaqani, Nizami, Füzuli, Şəhriyar kimi böyük Azərbaycan şairləri haqqında oxunan məruzələrin mahiyyəti verilməklə yanaşı onların sənətkarlıq qüdrəti və dünya şöhrətinə dair fikir bölgüsünün nəticələrinə dair məlumatlar da təqdim edilir.1-2 dekabr 1992-ci ildə "Dördüncü Beynəlxalq Şəhriyar konfransı"nın iştirakçıları qəbul edən İran İslam Respublikasının ali dini rəhbəri qeyd etmişdir ki, "Heydər babaya salam" təkcə Azərbaycan ədəbiyyatının deyil, dünya ədəbiyyatının şah əsərlərindəndir.

*"Tehranda ikən milli muğamım yada düşdü"*

Lirik şair Şahin səfərlərdə olduğu günlərdə vətən, doğma diyarla bağlı düşüncələrlə yaşamış və onları tərənnüm etmişdir. Belə hisslərin təsiri altında olan şairin ədəbi yaradıcılığı daha da zənginləşmişdir. "Qurban olum Azəribaycanə mən" deyən "Səyyah Şahin" nə qədər maraqlı məqamlarla rastlaşsa da "*Yurda dön, hər səfərin zilləti var*" deyir, doğma vətəninin cazibəsinin həmişə onun beynində olduğunu izhar edir:

*Vətən, çəkir ocaq məni*
*O bağ məni, o dağ məni,*
*"İstə, – deyir fəraq, – məni",*
*İstəmirəm, istəmirəm*

Yaxud

*Təşnəyəm öylə ki, indi Qubada olsaydım,*
*Qurudardım içərək bəlkə də Qudyal çayını.*

Doğulub böyüdüyü doğma Quba Şahini maqnit kimi özünə çəkir:

*Sultantanı dağların, şahı dağların*
*Şahdağ məni çəkir özünə sarı.*
*Məndə saflığı var saf bulaqların,*
*Bulaq məni çəkir özünə sarı.*

Şair bəzən səfərlərdə romantik xəyallara dalır, Dünya-axirət məsələsinə toxunur, vətən həmişə onun ürəyindədir:

*Ehey, o biri dünya,*
*Məni indiyəcən*
*Yerdən qopara bilməmisən...*
*Bağır gəlim*
*Yerdəki həyatımı verim bada,*
*Amma Tehranda yox, Bakıda!*
*Çağır gəlim.*

Göstərdiyim kimi Şahin Fazilin 5 divanına daxil olan şeirlərin böyük bir hissəsi məhz səfərlərdə yazılmış və orada onun poetik təbinin ilhama gəldiyi çox anlar olmuşdur. O, ümumiyyətlə poetik yaradıcılığında, o sıradan bu şeirlərdə divan ədəbiyyatına məxsus keyfiyyətlərə riayət etmiş, bir sıra hallarda yeniliklər yaratmışdır. Janr baxımından həmin şeirlər zəngindir: qəzəl, qəsidə, rübai, təzmin, təkbeyt, qitə, təxmis, sürud, bayatı və s. Təzmin etdiyi şairlərin fəaliyyət göstərdiyi yerlərdə olduqda Şahin Fazilin təxəyyülü onu klassikin yanına aparır, nəticədə təzminlər, nəzirələr, təxmislər yaranır. Məşhəd səfərində Qövsi Təbriziyə təzmin etdiyi 2 qəzəl kimi, Füzuli, Şəms Təbrizi, Xacu Kirmani, Hafiz Şirazi, Xətai, Nəbati, Qasım bəy Zakir,Seyid Əzim Şirvani, Sabir, Ə.Vahid və başqalarına yazdığı nəzirələr kimi.

Səfərnamələrdə təsvir edilən tədbirlər, görüşlər və şəxsiyyətlərlə bağlı bilgilər və məlumatlar çox vaxt yeniliyinə görə maraq doğurur. Məsələn, Şahin Fazil İraqda keçirilən "Mərbid şeir festival"ından bəhs etdik-

də oxucunun bu sahədə bilik dairəsi genişlənir. Məlum olur ki, hələ islamdan əvvəl cahiliyyə dövründə Ərəbistanın Bəsrə, Okaz, Mərbid kimi şəhərlərində vaxtaşırı toplanan bazarlarında ənənəvi alış-verişlə yanaşı şairlərin çıxışları şeirləşmələr də keçirilərdi. Bu ənənənin dəyərləndirilməsi olaraq hər il İraqda "Mərbid şeir festivalı" (və ya bayramı) keçirilmişdir. Tədbirlərdə iştirak edən şairlər yeni əsərlərini oxuyur, tənqidçilər mülahizələrini bildirirdilər.

Səfər qeydlərini yazıb nəşr etmək işini Şahin Fazil ədəbi hadisəyə çevirə bilmişdir. Belə ki, Şəhriyar şerinin sehrində olmuş ədəbiyyatşünaslar və şairlərin yığcam fikirləri gələcək tədqiqat işləri üçün qiymətli material ola bilər. Səfərnamələr boyu akademiklər Bəkir Nəbiyev, Ziya Bünyadov, Xalq yazıçısı Anar, professorlar Rüstəm Əliyev, Mübariz Əlizadə, d-r Cavad Heyət, d-r Zərrinkub, d-r Mənsur Sərvətian, d-r Qocatürk, Sönməz, Qafar Kəndli – Herisçi, Sabir Əmirov, həmçinin bu sətirlər müəlifinin Hacı Mailin düşüncə və mülahizələrinin təqdiminə yer verilmişdir.

Şahin Fazil səfərnamələrindən görür ki, Azərbaycan ədəbiyyatşünaslıq elminin uğurları beynəlxalq səviyyədə də yaxşı qarşılanır, alimlərimizin çıxışları təqdir edilir və yayılır. Bütün bunlar elmi əlaqələrin genişlənməsində əhəmiyyətli dərəcədə rol oynayır.

Şahin Fazil səfərnamələrindən aydın olur ki, Azərbaycan ədəbiyyatşünaslıq elminin uğurları beynəlxalq səviyyədə də yaxşı qarşılanır, alimlərimizin çıxışları təqdir edilir və yayılır. Bütün bunlar elmi əlaqələrin genişlənməsində əhəmiyyətli dərəcədə rol oynayır.

**Qeyrətli Azərbaycan övladı kimi Şahin Fazil də Qarabağ niskili ilə yaşayır, vətənin bir hissəsinin işğal altında olduğunu heç vaxt unuda bilmir**. Altıncı səfəri zamanı Allaha müraciətlə yazdığı minacatda (sonra bu şeir Şahin Fazilin ilk "Divan"ının başlanğıc şeirlərindən biri kimi) Qarabağı itirməyilə "bəxtinin qara olduğunu söyləyir:

*Ən pis günü də gördüm,*
*Kipriklə od götürdüm,*
*Ağ bəxtim qara oldu,*
*Qarabağı itirdim,*
*Allah, bağışla məni.*

Qarabağdakı indiki vəziyyət şairi həmişə narahat edir:

*Torpağa gül deyil, güllə əkilir,*
*Susub Qarabağda bülbülün səsi.*

Yaxud

*Dilbər Qarabağ dərdi mənim qəddimi əydi,*
*Çəkmiş Vətənim gör nə cəfa yad əlindən.*

Poetik marağı güclü olan Şahin olduğu ölkələrin ədəbiyyatını yaxşı bilməyilə yanaşı ölkənin ədəbi prosesini izləyir, yeniliklərə maraq göstərir. Bunun nəticəsidir ki, şair səfərnamələrdə həmin ölkə ədəbiyyatlarına aid olan janrlarda yeni şeirlər yazmışdır. Onun İranda surud, rücu, xoyrat və Yaponiyada hayku yazması sonralar da davam etmişdir. 2007-ci ildə Şahin Fazilin ayrıca "Azərbaycan haykuları" kitabı nəşr olunub. Onun haykularından bir-iki nümunə:

*Göz! Göz!*
*Bulağa göz dəydi və gözü qurudu.*
*Göz budu!*
* * *
*Aləmi bəzədi,*
*Özü isə lüt gəzdi.*
*Yazıq iynə*
* * *
*Kəlləm bərkdən də bərk,*
*Başımda qoz sındırma*
*Qozun sınar.*

**Şair Şahin Fazilin təqdir edilən daha bir cəhəti poetik sənətin sirrlərinə bələd olması, Azərbaycan dili ilə yanaşı fars və əfqan (dəri) dillərində də eyni uğurla şeir yazmasıdır.**

**Şahinin səfərlərdə yazdığı şeirlər, ümumiyyətlə onun poeziyası sənətkarlıq baxımından mükəmməl əsərlərdir. Məncə bunun səbəbi ondadır ki, professor Şahin Fərzəliyev şairlik istedadını zəngin farsdilli və türkdilli ədəbiyyat və tarix elmləri sahəsində biliklərlə yoğurmağı bacaran alimdir. Klassik və müasir qəzəl haqqında onun mülahizələri və mövqeyi hamıya bəllidir. Şahin qəzəlin dilini müasir Azərbaycan oxucusunun**

**səviyyəsinə uyğunlaşdırmağın tərəfdarıdır.Uzun illərdən bəri rəhbərlik etdiyi "Məcməüs-şüəra" məclisində, ("Şairlər məclisi") "Vahid" poeziya evinin tədbirlərində, bütün çıxışlarında və yazılarında bu mövqeini təbliğ edir. Ərdəbildə yazdığı bir qəzəldə qəlizdil qəzəlxana öyrədir ki,**

*"Kuh" gəl söyləmə, "dağ" düzgün olar,*
*"Ləb" demə bir də, "dodaq" düzgün olar...*

*Əl-ayaq eyləmə yad sözlər üçün*
*"Dəst" –"əl", "pa"sa–ayaq düzgün olar.*

Şahin klassik janr olan qəzələ yeni mövzular gətirir. Səfərnamələrdə yapon xarakiri və samuraylarına həsr etdiyi qəzəllər bu tiptədir. Əfqanistanda tüfənginin lüləsinə gül taxmış əsgərə müraciətlə yazdığı şeirdə sanki bütün bəşərin arzusunu və çağırışını ifadə etmişdir:

*Car çəkək, aləmə bildirək bunu:*
*Üzməsin canını atəş heç kəsin.*
*O qədər tıxasın güllər yolunu*
*Güllələr lülədən çıxa bilməsin*

Ölkələr gəzən, müasir dünyanın texnologiyasının şahidi olan Ş.Fazilin şeir dilində həmişə yenilik görünür, o, texniki-tərəqqi ilə bağlı sözləri də poeziya dilinə daxil edir:

*Sevirəm mən peykləri,*
*Onlar mənə əzizdir.*
*İnanın, nəzərimdə*
*"Əruz"da, "heca" da bir.*
*Mən bu peyklər içində*
*qocalmaq istəyirəm,*
*Şer üfüqlərində*
*vəzn kosmonavtitək*
*ucalmaq istəyirəm.*

Şeirlərdəki təsvir və tərənnümlərdə Şahin Fazil üslubu reallıq üstündə qurulduğundan yaşarıdır, eyni zamanda ənənənin davamıdır. Bu-

dur, şair Bakı-Astara yolu ilə Lənkəran səmtindədir. Sol tərəfdə Xəzər dənizi, sağ tərəfdə yaşıl tarlalar, çəltik zəmiləri, çay sahələri və silsiləvari uzanan Talış dağları. Bu mənzərə sərhəd keçidindən sonra da davam edir. Şair ilhama gəlir və vəsf edir:

*Aşağıda dəniz, yuxarıda dağ,*
*Aşağı Xəzərdir, yuxarı Zaqros.*
*İlin hər fəslində göydür bu torpaq,*
*Özündə saxlayıb baharı Zaqros.*

100 il öncə bu mənzərəni Azərbaycan və talış dillərində yazıb-yaratmış istedadlı şair Zülfüqar Əhmədzadə də belə vəsf etmişdir:

*Bir yanı dənizdir, bir yanı dağdır,*
*Behişt ki, deyirlər o buralardır...*

Səfərlər boyu yaranmış şeirlər Azərbaycanın həmin ölkələrlə ədəbi əlaqələrinin inkişafına təsir edir. Ədəbiyyatımızdakı Güney və Guzey Azərbaycanın ayrılıq motivindən yazmış Şəhriyar, Bəxtiyar Vahabzadə və onlarla digər şairlər kimi Şahin də bu hicranı çəkən müəllifdir. **2004-cü ildə Beynəlxalq Tehran Kitab sərgisi nəzdində ki, şeir məclisində illər boyu çəkilən həsrət və görüş haqqında oxuduğu şeir İranın Azərbaycanlı şairlərini riqqətə gətirmiş və onlar da bu mövzuda şeirlərini təqdim etmişlər.** Abdullahinin bu mövzuda yazdığı poemadan aşağıdakı sətirlər ənənənin davamıdır:

*Yazıldı qan ilə müqaviləsi,*
*Arzusun daşlara çaldı Gülüstan.*

2012-ci ildə Beytulla Cəfəri Şahin Fazilə həsr etdiyi bir qəzəlində yazır:

*Nisgil oldu Şəhriyarə Gəncə, Bakı, Naxçıvan,*
*Şəhriyarın yurdu Azərbaycana xoş gəlmisiz.*

**Şahin Fazilin İranla ədəbi, mədəni və tarixi əlaqələr sahəsində gördüyü işlər məşğul olduğu tarix və mənbəşünaslıq biliklərinə əsaslanır. Onun poeziyasında bu obyektiv cəhət əksini tapdığı üçün oxu-**

**cular tərəfindən qəbul edilir. Təsadüfi deyildir ki, Bəstəkar Tofiq Bakıxanov Şahinin İranla bağlı bir neçə şeirinə musiqi bəstələmişdir.**

Səfərnamələrdə Azərbaycanın VII əsrdən, üzü bəri tarixi, Azərbaycan-İran və Azərbaycan-Türkiyə əlaqələri tarixinin bir çox səhifələri yada salınır, bəzi detallar haqqında məlumatlar verilir. Budur, müəllif Astara-Qəzvin-Tehran yolu ilə gedir və düşüncəsi oxuyub öyrəndiyi və araşdırdığı tarixi hadisə və mövzularla məşğuldur: XV-XVI əsrlərdə bu yerlərdə (Gilanda) İshaqilər və Kiyalar sülaləsinin hakimiyyətdə olduğu vaxtlar; I Şah Təhmasiblə Əhməd xan Gilani arasındakı münasibətlər, onların şeirləşmələri, 1555-1590-cı illərdə Səfəvilər dövlətinin paytaxtı olmuş Qəzvin. Bu səhər hər şeydən əvvəl tarixçi Qazi Əhməd Qəffarinin doğulub böyüdüyü şəhər kimi prof. Şahin Fərzəliyevin yaddaşında qalmışdır.

Hər dəfə Təbrizə gedən müsafir Şahinin yolu Ərdəbildən keçəndə Şah İsmayıl Xətayi yada düşür. Müəllif Ərdəbildə bu Azərbaycanlı hökmdarın adı ilə bağlı yerləri, Şeyx Səfi büq'əsini ziyarət edir, şair ilhamının oyanmasını duyur və poetik əsərlər yaranır. Səfəvilər nəslinin tarixilə bağlı olan Lənkəran, Astara və Masallı rayonlarında Şahin Fazilin yol boyu diqqət verdiyi yerlər, ocaqlar unudulmaqdadır. Əlbəttə, onlara qayğını artırmaq lazımdır.

**Prof.Ş.Fərzəliyevin səyahətnamələri tarixi mənbə rolunu oynaya bilər. Belə ki, burda verilmiş məlumatlar tarixi qaynaqları araşdıran alimin fikirləridir. Səkkizinci səfərnamədə göstərilir ki, Şah İsmayıl Xətainin dördüncü babası Şeyx Sədrəddin Musa (Şeyx Səfiyəddinin oğlu) ana tərəfdən Lənkəranlıdır.**

Tehran, Təbriz və Urmiya universitetlərində təşkil olunmuş Beynəlxalq elmi konfranslarda ədəbi-kultural mövzularla yanaşı tarixi mövzularda dinlənilən məruzələr yeni tədqiqatlarla bağlı olur və maraqlı elmi fikirlər mübadiləsi baş verir. "Qafqazda – tarix beşiyində" və "Elxanilər dövründə İran mədəniyyəti" mövzularındakı konfranslarda Azərbaycan alimlərinin məruzələri alqışlarla qarşılanmışdır. Təbriz universitetinin rəsmisi dr Şəbaninin alimlərimizə verdiyi qiymətdə Səttar xan, Bağır xan yetirən Azərbaycan tərifl ənmişdir: "Azərbaycan ürəyimizdir, ruhumuzdur və qəlbimizin dərinliyində özünə yer tutmuşdur." **Şahin Fazil səfərnaməsindən öyrənirik ki, İranın ən qədim universiteti Təbrizdə təsis edilmişdir, hazırda bu şəhərdə 8 universitet fəaliyyət göstərir. 2000-ci ildə İranda 90 milyondan artıq kitab nəşr olunmuşdur. İran səfərnamələrində müəllif daha çox Cənubi Azərbaycan**

**haqqında məlumatları oxuculara çatdırmağa üstünlük verir. Budur, 1999-cu ildə Təbriz şəhərinin ostandarı deyir: "...Azərbaycan İran tarixində azadlıqsevərliyi ilə tanınır... İranda ilk kitabxana və ilk çapxana Təbrizdə yaranıb". Daha sonra öyrənirik ki, ustad Şəhriyarın uyuduğu "Məqbərətuş-şüəra"da ("Şairlər qəbristanlığı") 407 şair dəfn olunmuşdur: Xaqani, Mücirəddin Beyləqani, Qətran Təbrizi, Hümam Təbrizi və başqaları. Söz sənətkarı Şahin məşğul olduğu sahədə – tarixşünaslıqda nəticələr əldə etmək üçün hərtərəfli düşünməyi lazım bilir: xarakirilərə həsr etdiyi şeirdən öncə bu sözün etimologiyasını yapon xalqının tarixi boyu izahını verir.**

Səfərnamələr müəllifi müşahidə etdiyi bəzi hadisələrə diqqəti cəlb etməklə onları həll etməyin zəruriliyini bildirmək istəyir. 2012-ci ildə Urmiyada iştirak edən Şahin Fazil Urmiya gölünün quruma təhlikəsi altında olduğundan xəbər vermişdi:

*Qəlbimi qəm bürüyür,*
*Gözümü nəm bürüyür,*

*Bu gölün gəmiləri*
*Susuz qalıb çürüyür.*

**Şahin olduğu ölkələrin tarixindən elə məqamları oxuculara çatdırır ki, onlar haqqında məlumatlar ya yoxdur, ya da çox azdır. Digər tərəfdən müəlif əldə etdiyi və öyrəndiyi tarixi bilikləri tətbiq etmək üçün səfərnamə janrını münasib hesab edir. Bütün hallarda bu səfərnamələr maraqla oxunur. Şahin Fazil bu janrda bacarıqlı nasir və şair, tarixçi alim, qeyrətli vətəndaş kimi özünü göstərmişdir.**

Mən Şahin Fazili 80 illik yubleyi münasibətilə təbrik edir, onun gələcəkdə də çoxlu səfərə yollanmasını arzu edirəm. Axı səfərnamələr səfərlərdə yaranır...

**Mir Cəlal Zəki MƏŞTƏQAYİ**

*Şahin Fazilin birinci divan kitabının "Redaktor"dan hissəsi*

Böyük Yaradana həmdü səna olsun ki, əruz və heca vəznlərində minlərlə şe'r müəllifi olan Şahin Fazilə yaradıcılıq imkanı verdi və nəhayət uzun əsrlər boyu Yaxın və Orta Şərq ölkələrində, o cümlədən Şimal Azərbaycanında xətir-hörməti olan ənənəvi "Divan" bu əsrdə də yarandı. Əslinə qalsa, "Divan", çətinliyi səbəbindən başqa kitablara nisbətən olduqca az yaranan lirik şe'rlər toplusudur. Əgər min illik Şərq ədəbiyyatına nəzər salsaq, yaranan "Divan"ların sayı, zənnimcə, bir neçə yüz olar.

Şahin Fazil "Divan"ının ilk oxucusu özüməm. Etiraf etməliyəm ki, həmin "Divan"ın müəllifi redaktə zamanı mənim müvafiq və münasib təkliflərimi nəzərə almış, bəzi şe'rlər üzərində yenidən işləmiş, beləliklə də o, sayca onuncu olan bu kitabı ilə Şimal Azərbaycanının ədəbi həyatında XX əsrdə fenomen hadisə saydığım "Divan" yaradıcılığınını gerçəkləşdirmişdir.

Atdığın bu qədəm sayalı olsun, Şahin Fazil!

**Mir Cəlal Zəki MƏŞTƏQAYİ**
*"Dördüncü Divan" kitabının*
*"Redaktordan" hissəsi*

*Meyl ilə imkan münasib gərək,*
*Bir-birinə düz mütanasib gərək.*
*Böylə görüb meyl ilə imkanımı,*
*Xətm elədim bir neçə divanımı.*
*"Divan"ımın siqləti var, həcmi var,*
*Hər birisindən neçə divan çıxar.*

*(Şahin Fazil. Dördüncü Divan, Elm və Təhsil, Bakı,2014, səh.4)*

Bəli, Şahin Fazilin bir deyil, dörd "Divan" külliyyatı var. Beşinci yazmaqdadır. Qarşımda isə onun sayca dördüncü olan "Divan"ının əl-yazması durur. Bu "Divan" da şairin əvvəlki üç divanı kimi "siqlətli və həcmlidir".

Bildiyimiz kimi, ilk "Xəmsə"ni bənzərsiz şairimiz Nizami Gəncəvi qələmə almışdır. Sonrakı "Xəmsə" yazan şairlərin hamısı ilk "Xəmsə" müəllifinə minnətdar olmuş, onun adını dönə-dönə hörmət və rəhmətlə yad etmişlər.

Məktəbi Sirazi (XV əsr) "Leyli və Məcnun" məsnəvisində "özünün "Xəmsə" müəllifi kimi məşhur olduğunu və "Xəmsə" yazmaqda məqsədinini Nizamiyə sitayiş etmək olduğunu" qeyd etməklə dahi şaira öz qədrşünaslığını bəyan edir:

*"Dər qoftəne- "Xəmse"əm ke namist*
*Məqsud setayeşe- Nezamist".*

Əvvəlcə qeyd etmək istəyirəm ki, Şahin Fazil şərəfli bir ömür yolu keçmişdir. Amma bu bir ömürdə, sözün əsl mənasında, bir neçə ömür yaşamışdır ki, bu da hər kəsə nəsib olmur. Başqa sözlə, bir ömürdə öz elmi və ədəbi-bədii yaradıcılığı ilə bir neçə ömürdə mümkün ola bilən bir iş görmüşdür.

Ş.Fazil 10 il müddətində məhşur Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin (1560-1634) "Tarixe- aləmaraye- Əbbasi" ("Dünyanı bəzə-

yən Abbasın tarixi") əsərini fars dilindən Azərbaycan dilinə çevirib və iki kitabda nəşr etdirmişdir. Hal-hazırda başqa bir məşhur Azərbaycan tarixçisi Həsən bəy Rumlunun (1531-?) "Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") əsərinin fars dilindən Azərbaycan dilinə tərcüməsini bitirmək üzrədir.

Ş.Fazil "Azərbaycan XV — XVI əsrlərda" (Həsən bay Rumlunun "Əhsənüt- təvarix" əsəri üzrə), "Azərbaycan Və Osmanlı imperiyası XV-XVI əsrlərdə", "XV əsr Azarbaycan dövlətlərinin quruluşu" elmi monoqrafiyalarının müəllifidir.

Ş.Fazil vaxtila Jozef Tiflisinin "Vaqe'ate- Mir Veys və Şah Hüseyn" (Azərnəşr — 1992) və Jan Tadeş Kruşinskinin "Tarixe- sayyahe- məsihi" ("Xristian sayyahın tarixi",(Azərnəşr—1993) əsərlərini Bakıda çap etdirmisdir.

Bunlardan əlavə Ş.Fazil Firdovsinin "Şahnamə" əsərinin tərcüməsinin, Əsgər Şahinin "Füzuli "Divan"ının irfani şərhi" kitablarının redaktoru olmuş, fars və dəri dillərindən (Əfqanıstanda işlənməkdə olan fars dili belə adlanır) bir çox fars və əfqan şair və nasirlərinin əsərlərini Bakıda, N.Həsənzadə, S.Rüstəmxanlı, X.Hasilova, Ə.Elbrus, Rüzgar Əfəndiyeva və s. müəlliflərin bir sıra ədəbi nümunələrini tərcümə edib, Kabulda çap etdirmisdir. Şahin Fazilin rəhbərliyi altında 10-dək aspirant və dissertant dissertasiya müdafiə etmişlər. O, professor kimi uzun illər Bakı, Lənkəran va Sumqayrt dövlət universitetində mühazirə oxumuşdur.

Məlumdur ki, böyük şairimiz Seyyid Əzim Şirvanidən sonra XX əsrdə yazılmış ilk mətbu' "Divan" külliyyatını Şahin Fazil yazmışdır. Məhz Ş.Fazil ölkəmizdə bir yüzillik boyu qələmə alınmayan və çap olunmayan "Divan" bağladı və daha sonra müasir səbkdə digər "Divan"lar yaratdı. Beləliklə, onun qələmindən dörd divan çıxdı.

Şahinin birinci "Divan"ının redaktoru mən olmuşam. İndi isə dördüncü divan qarşımdadır. Bu yazıda şairin "Dördüncü Divan"ını təhlil etmək fikrim yoxdur. Mən əsasən onun bu kitabındakı "Minacat" və "Nə't" məzmunlu şeirlərinə geniş diqqət yetirməyi vacib hesab etdim. Cünki, şairin bu məzmunda yazdığı poetik nümunələr olduqca diqqatə layiqdir və vaxtaşırı "Divan" bağlayan bir şairin kimliyini və məharətini sübuta yetirir.

"Dördüncü Divan"ı artıq bəlkə də dördüncü dəfə vərəqləyirəm. Kitab, əlbəttə, dibaçə hissəsindən sonra minacatla başlayır. Minacat — Allah-təalanın vəsfi deməkdir. Minacat, kainatın və bütün aləmlərin yaradıcısı olan Pər-

vərdigarın tə'rifidir. Minacat, şairin Yaradan ilə söhbətidir. Minacat, Rabbin qüdrət və qüvvətini özündə ehtiva edən şe'r nümunəsidir. Şahin bu minacatını əruz vəzninin səri' bəhrində (səri'i -müsəddəsi-mətiviyi-məkşuf) qələmə almışdır. Müəllif bu yeni minacatına da təbii ki, "Bismillah" ilə başlayır:

*Bismillahir-rəhmanir-rəhim,*
*Əvvəlidir sözlərimin müstəqim.*
*Sonrakı hər kəlməyə məş'əl Odur,*
*Eyləyəsi müşkilimi həll Odur.*
*Var fərəhim, həzzimə me'yar Odur.*
*Yoxluğumu eyləyəsi var Odur.*
*Gizli deyil, var kədərim, var ahım,*
*Müşkilimim çarəsi—Bismillahım.*
*Ümmidi Bismillaha etməkdəyəm,*
*Ərzi ulu Allaha etməkdəyəm.*

Bəli, Şahin ərzini ulu Allaha etməkdədir. Onun ərzi isə çoxdur. O, hər şeydən əvvəl Allah-təaladan bu Divan"ını bitirmək üçün ömür möhləti təmənna edir:

*Sən kömək etsən yazaram şe'rimi,*
*Var həyanım çünki mənim Sən kimi.*
*Əllərimə dəftəri Sənsən verən,*
*Mən yazanam, sözləri Sənsən verən.*
*Qafiyəmi Sən gətirirsən sözə,*
*Gör necə ahəng verirsən sözə.*
*Görmədəyəm əldə qələm mat olur,*
*Söz ki, yazır, nə'tü minacat olur.*

Qeyd etməliyəm ki, bu "Divan"da daxil olmaqla Şahinin bu günədək yazdığı çoxsaylı minacat və nə'tləri vardır. Müasir "Divan" ədəbiyyatında hələ onun qədər ilhamlı şair görünmür. Onun çoxdan yazdığı bir şe'ri yadıma düşdü: "Kaş gözə gəlməsin ilhamım mənim". Bu şe'r çoxdan yazılıb. O zaman Qubada "Çaldıran" poeması (Şah İsmayıl Xətaiyə həsr olunan böyük həcmli dramatik bir poema) üzərində gərgin işləyən Şahin Fazil yazır:

*Əleyküm, ey Quba, salam, ey Quba,*
*Gözəllik önündə lalam, ey Quba.*
*Ilham elə coşub, qoynunda sənin*
*Gərək neçə müddət qalam, ey Quba.*
*Kaş gözə gəlməsin ilhamım mənim...*

*...Əzəllər duyardım özümdə ağrı,*
*Sanki ağrı idi sözüm də, ağrı,*
*Burda bütün günü yazıb-pozuram,*
*Elə bil azalıb gözümdə ağrı,*
*Kaş gözə gəlməsin ilhamım mənim...*

*...Suyun da bal kimi dadı olarmış,*
*Bulağın rübabı, udu olarmış,*
*Qəçrəş bulağıtək çağlayır ilham,*
*Canım, ilhamın da odu olarmış,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

İlahi, qoy Şahinin ilhamı gözə gəlməsin, qoy hələ minacat və nə’tlərini davam etdirsin, neçə-neçə “Divan”lar yazsın. Şahin olduqca çox mütaliə edir, öyrənmədiklərini soruşur, bilmədiklərini öyrənir. Çünki, “Divan” yazmaq şairdən böyük cəsarət tələb edir. Bu, olduqca məs’uliyyətli işdir. Şahinin başqa divan müəlliflərindən mühüm bir üstünlüyü vardır: — O,ixtisasca şərqşünasdır, fars dilini mükəmməl bilir, ərəb dilindən xəbərdardır, orta əsrlərin qəliz dillərinindən biri olan osmanlı dilinə (fars, ərəb və türk dillərinin qarşılığı olan dil) yaxşı bələddir.

Yaxın Orta Şərq ölkələrində yaradılan divan kitabları məhz bu dillərdə qələmə alınmışdır. Həmin kitabların orijinal variantları ilə tanış olmadan, onlardakı incəliklərə diqqətlə nəzər yetirmədən “Divan” bağlamaq olmaz. Yəqin ki, məhz bu çətinliyə görə də son əsrlərin müqtədir şairləri belə “Divan” yaradıcılığından sərfi-nəzər etmişlər. Müasir dövrümüzdə isə bir-birinin ardınca “Divan” kitabları (mən onları “kitabça” adlandırardım) peyda olmağa başladı. Əlbəttə, Şahin Fazilin “Divan”larından sonra. Lakin mə’suliyyətlə deyirəm ki, o divanların heç birində Şahin Fazil divanlarında olan əhatəlilik və siqlət yoxdur. Aralarında elə divancıqlar var ki, adamı təəccübləndirir. Həcmcə balaca, məzmunca bəsit olan və “Divan” qayda-qanununa qətiyyən cavab verməyən lü-

mumsuz "əsərlər". "Qoy desinlər ki, mən də divan yazıram" iddiası ilə əllərinə qələm götürən o şairlərin "əsərləri" haqqında Şahin Fazilin özü məndən əvvəl öz sözünü demişdir:

*Var eləsi hərzəvü hədyan yazır,*
*Varmı diyarımda ki, "Divan" yazır?*
*Varsa əgər, bəs niyə atmış gücü,*
*Çatsa da bir "Divan"a çatmış gücü.*
*"Divan" adından necə də xoşlanıb.*
*Bir neçə cüt şe'rini "Divan" sanıb.*
*Çatmağa, Şahin, sənə əhd eləyib,*
*Bə'zən iki "Divan"a cəhd eyləyib.*
*Var eləsi sürsə də nəzm atını,*
*Cəhd eləmir yazə minacatını.*
*Kim oxusa "Divan"ımı mat olar,*
*Yeddicə beyt ilə minacat olar?*
*Allaha hörmət bumu, izzət bumu?*
*Allaha diqqət və sədaqət bumu?*
*Dilbərə yüzlərlə sətir həsr edər,*
*Allahasa yeddicə beyt müxtəsər.*
*Yoxsa "Minacat" o "Divan" deyil,*
*Bəlli, "Minacat" işi asan deyil.*
*Çünki, minacat yazan şairin*
*Olmalıdır elmi dərindən-dərin.*
*Olmalıdır fəhmi genişdən-geniş,*
*Çünki, məharət tələb eylər bu iş.*
*Cəhd eləsə kim ki, "Minacat"ına,*
*Minməlidir mən kimi nəzm atına.*
*Bil ki, "Minacat" dərindən-dərin,*
*Söhbətidir Allah ilə şairin..*

"Minacat" haqqında daha nə yazım? Şahin minacat məzmunlu şe'ri elə ustalıqla səciyyələndirmişdir ki, başqa söz deməyə lüzum qalmır. Onun "Minacat"ında təkcə məsnəvi yox, qəzəl də, qit'ə də, qəsidə də vardır ki, bu tərzdə minacat yazmağın əsasını müasir dövrdə Şahin qoymuşdur.

Akademik Bəkir Nəbiyev yazır: "Şahin Fazilin divanlarını poeziyamızın əlvan bir gülüstanına bənzətmək olar ki, onun hər çiçəyi öz biçimi-

nə, rənginə, gözəlliyinə xas olan ətir saçır. Buradakı dibaçə, minacat, qəzəl, qəsidə, rübai, təxmis, nəzirə, təkbeyt, hecanın rəngarəng bölgülərində yazılmış qoşma, gəraylı və bayatıların hər birinin öz təravəti var". (Bax: Bəkir Nəbiyev. Şahinin qanadları, "Azərbaycan" jurnalı, Bakı, 2006, səh.174-175)

Obyektivlik naminə deməliyəm ki, bu vaxtadək müasir "Divan", o cümlədən minacat və nə't yazan şairlərin arasında Şahin Fazildən sonra Gülarə Munis tamamilə fərqlənir və Şahinin yolunu ardıcıllıqla davam etdirir.

Yenə qayıdaq Şahin Fazilin "Minacat"ına. Minacatnevislikdə təqlidçilik yolunu tutan, fikirlərini qəliz söz və ifadələrlə yazan, heç utanıb-çəkinmədən başqa şairlərdən göz görəsi oğurluq edən və təqlidçilik yolunu tutan şaircığazlara Şahin belə deyir:

*Kimliyini dərk eləyən şairəm,*
*Nəsri də nəzm ilə deyən şairəm.*
*Sadə qəzəl yazmağa etsək məram,*
*Saf qəzələ söz naxışı vurmuşam.*
*Sadə qəzəl yazmağa mail mənəm,*
*Niyyətinə əzm ilə nail mənəm.*
*Amma, təəssüf, elə insan da var,*
*Göz görə təqlidçilik etmiş şüar.*
*Çünki, şe'rdə hələ mahir deyil,*
*Öz izini açmağa qadir deyil.*
*Öz yolunu getməyi bilmir hələ,*
*Təqlidi etmiş özünə məşğələ.*
*"Oğru" deyirsən ona, almır vecə,*
*Oğruya yox ehtiramım zərrəcə.*
*Oğrunu faş eyləyərəm gün gələr,*
*Oğru haçan doğruya üstün gələr?*
*Ey ulu Xaliq, uca Pərvərdigar,*
*Oğru kəsi et sıramızdan kənar.*

"Dördüncü Divan"ında da "Bismillah" ilə sözə başlayan şair—

*Söz həmən, kəlmə həmən, cümlə həmən: Bismillah!*
*Başladım sözlərimə sidq ilə mən, Bismillah!*

yazaraq öz nə'tindəki məsnəvisini minacatından fərqli olaraq həzəc bəhrində (həzəci-müsəddəsi-əxrəbi-məqbuzi-məhruf) yazmış, bu dəfəki məsnəvisini də qəsidə, qit'ə və qəzəllərlə zənginləşdirmişdir:

*Bismillah ilə yazıldı nə'tim,*
*Etdim bu sözə həmişə tə'zim.*
*Bismillah ilə şe'r dəyərli,*
*Bismillah ilə qələm şəkərli.*
*Dörd nə'tim olub şe'r bağımda,*
*Yazdım bunusa xəzan şağımda.*
*Sinnim təzə yetmişi keçibdir,*
*Nə'tin sayısa beşi keçibdir.*
*Ey elçi, Xuda veribdir ilham,*
*Təb' ilə bu nə'tə olsun əncam.*
*Nə'tim, kömək eylə nurlu olsun,*
*Yarəb, kömək et uğurlu olsun.*
*Qoyma ürəyimdə ğəm göyərsin,*
*Güc ver mənə ki, qələm göyərsin...*
*Qoyma ki, bu nə't sonuncu olsun,*
*Qoy nöqtə deyil, nida qoyulsun.*

Şahin Fazil bu nə'tində müasir dünya ölkələrinin vəziyyətinə də nəzər yetirir, Əfqanıstan, Çeçenistan, Misir, İraq, Tunisdə baş verən qırğınları xatırladır, Qərbin Şərqə hücumlarını pisləyir, Qarabağı da xatırlayaraq Peyğəmbərdən (s) kömək istəyir:

*Küfrü Yerdən büsbütün yan eyləməkdən ötrü sən,*
*Çək kəmanı, tut qılıncı, tovla xəncər, ya nəbi.*

*Ölkəmin bir parəsində cövlan eylər yağılər,*
*Bir tərəfdə ordu var, bir yanda ləşgər, ya nəbi.*

Şahin Fazil olduqca məhsuldar şairdir. Ildə cəmi-cümlətanı 5-6 şe'r yazanları "ilhamı qısır" şairlər adlandıran şair—

*Təb'im elə coşğun ki, bu dövranə sığışmır,*
*Ruhim, elə zənn eyləyirəm, canə sığışmır.*

deyir və mən onun bu sözlərindən təkəbbürdən, lovğalıqdan qətiyyən əsər-əlamət görmürəm.

"Dördüncü Divan" kitabı da şairin əvvəlki divanları kimi müfəssəldir. Orada, təbii ki, minacat və nə'tdən başqa yüzlərlə qəsidə, qəzəl, bəhriyyə, nəzirə, mürəbbe', tərci'bənd, rübai, bayatı, xoyratı, dördlük, təkbeyt, hayku (və vaka), o cümlədən çoxlu heca və sərbəst vəznli şe'rlər toplanmışdır. Şahin çoxsözlü şairdir!

*Gör nə qədər dəftərə söz yazmışam,*
*Dəftəri "Divan" eləyən şairəm.*

deyir Şahin.Yaxud:

*Xor baxmağı var milli dilə bir neçə şəxsin,*
*Mə'nən elə şair öləcəkdir gələcəkdə.*

deyir Şahin.Yaxud:

*Bəzi kəslər dilənirlər o ərəb-farsdan söz,*
*"Kiprik"in cəminə "müjgan" dedilər, diksindim.*

deyir Şahin. Yaxud:

*Əl boyda olan dəftərə "Divan" adı qoyma,*
*Bağla elə divan ona dəftər deməsinlər.*

Möhtərəm oxucu,belə misalların sayını artırmaq olar, lakin buna lüzum yoxdur. Özün oxuyub Şahin Fazilin "Divan"ı ilə başqalarının divanları arasındakı fərqi dərhal görəcəksən.

Şahin yazır. Həmişə yazır. Elmi əsərlər yazır, divanlar yazır, səfərnamələr yazır. Onun yazdıqları uğurludur. Zənn edirəm ki, onun "Dördüncü Divan" kitabı da divanlara qiymət verən şe'r sevərlər tərəfindən əvvəlki divanları kimi yüksək qiymətləndiriləcəkdir.

***(Şahin Fazil. Dördüncü Divan, səh.4-13)***

**Nazim MƏMMƏDOV**
*AMEA A.A.Bakıxanov adına*
*Tarix İnstitutunun baş elmi işçisi,*
*tarix elmləri doktoru*

# PAK, QAYĞIKEŞ VƏ TƏMƏNNASIZ İNSAN, DƏYƏRLİ VƏ MÜDRİK ALİM

Dünya xalqları öz igid oğulları, görkəmli ziyalıları, şair və yazıçıları, alimləri və siyasətçiləri ilə tanınır. Bəziləri yaxşı qələmi, alimliyi, bəziləri vətənpərvərliyi, dərin düşüncəsi, sadəliyi, təvazökarlığı ilə seçilir. Həyatda elə insanlar var ki, onun üzərində bütün yüksək keyfiyyətlər cəmləşmişdir. Məhz, haqqında söz açdığımız və hər birimizin qəlbində ideal bir insan kimi kök salmış Şahin Fərzəliyev belələrindəndir. Şahin müəllim haqqında çox böyük məmnuniyyətlə qələmə aldığım bu sətirlər qəlbimin dərinliklərində çoxdan yer tutan xoş məramlı ülvi hisslərin təzahürü, Azərbaycanın qayğıkeş ziyalısına, insanları hər zaman ədalətə, birliyə, barışa, sülhə, dostluğa səsləyən bir insana bəslədiyim səmimi hörmət və ehtiramın ifadəsidir. Çoxdan tanıdığım və hörmət bəslədiyim son dərəcə səmimi, geniş ürəkli, humanizmin simvolu olan Şahin Fərzəliyev həm də sözün əsl mənasında xoşbəxt taleli, həqiqi ziyalılarımızdandır. Sadəlik, təvazökarlıq, xeyirxahlıq, ədalətlilik, ləyaqətlilik, humanistlik, vətənpərvərlik Şahin müəllimi həmkarlarına, dostlarına və bütövlükdə xalqımıza sevdirən üstün keyfiyyətlər sırasında əsas yer tutur. Onu tanıyanlar mənimlə sözsüz razılaşarlar ki, Şahin müəllim xoş rəftarı, yüksək **ünsiyyət mədəniyyəti ilə** seçilən müdrik alimdir.

Şahin müəllim qeybətdən, dedi-qodudan çox uzaq olan ideal insandır. Uzun müddət bir otaqda oturub bu ideal insanla dərdləşmək xoşbəxtliyi mənə qismət olmuşdur. Mən şahidəm ki, onunla, kiminsə qeybətini edəndə o bu mövzudan qaçmağa cəhd edər, söhbətin sənətini dəyişərdi. Bir dəfə ona sual verdim ki, nə üçün belə xoşagəlməz söhbətlərdən uzaq qaçırsan? O cavabında bildirdi ki, "mənim qəlbim təmizdir, millətimin hər biri mənim üçün əzizdir. Əgər qəlbimdə insanlara nifrət yaranarsa mən yazmaq qabiliyyətimi itirərəm". Bax beləcə Şahin müəllim hər birimizin qəlbində daha da ülviləşdi, sadələşdi, ucaldı və dahiləşdi.

Şahin müəllimin geniş diapozonlu mütaliəsi, xüsusən də, mənbələri orijinaldan oxuyaraq incəliklərinə qədər bilməsi hər kəsdə heyran-

lıq doğurur. Bəzən, saatlarla müxtəlifdilli mənbələr, onların Azərbaycanla bağlı məqamları barədə yorulmadan danışır, şanlı tariximizin hansı dövrü, hansı sahəsi olursa-olsun sualları düzgün cavablandırır. İstər həmyaşıdları, istərsə də sonrakı nəsillərin nümayəndələri olan tarixçi həmkarları hər zaman və hər yerdə onun yaxşılıqları və xeyirxah əməlləri barədə ürək dolusu danışırlar.

**Tarix elmləri doktoru, professor Şahin Fərzəliyev h**azırda özünün şərəfli və mənalı ziyalı ömrünün 80-ci baharanı yaşayır. Bu təvazökar insan elə parlaq ömür yolunun sahibi, çoxsaylı əsərlərin, elmi araşdırmaların müəllifidir ki, onun nəticələri Azərbaycan tarixini və ədəbiyyatını zənginləşdirmiş, Şahin müəllimə böyük nüfuz və hörmət qazandırmışdır.

Əsil ziyalı ömrünü yaşayan, Şahin müəllim sadə, lakin olduqca şərəfli bir tərcümeyi-hala malik şəxsiyyətlərdəndir: Şahin Fazil oğlu Fərzəliyev 1940-cı il mart ayının 27-də Quba şəhərində anadan olmuşdur. 1948-ci ildə Quba şəhər 3 saylı orta məktəbə qəbul olunmuş və 1958-ci ildə həmin məktəbi bitirmişdir. 1959-1964-cü illərdə S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinin Fars dili şöbəsində təhsil almış, 1963-cü ildən (hələ tələbə ikən) 1988-ci ilədək 13 il müddətində (1963-1966, 1968-1970, 1978-1982 və 1985-1988-ci illərdə) Əfqanıstanda fars dili mütərcimi vəzifəsində işləmişdir. O, 1970-73-cü illərdə AMEA Tarix İnstitutunun aspiranturasında oxumuş və 1974-cü ildə XVI əsr Azərbaycan tarixçisi Həsən bəy Rumlunun fars dilində yazdığı "Əhsənüt- təvarix" ("Tarixlərin ən yaxşısı") əsəri üzrə dissertasiya mövzusunu müdafiə etmişdir. "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" adlı ikinci dissertasiyanı isə 1996-cı ildə müdafiə etmiş, ona 17 yanvar 1997-ci ildə AAK-ın qərarı ilə tarix elmləri doktoru alimlik elmi dərəcəsi verilmişdir. 2004-cü ildə professor elmi adına layiq görülən bu tarixçi Azərbaycanın orta əsrlər tarixinin müxtəlif dövrlərini əhatə edən 5 monoqrafiya, həmçinin 300-dən çox elmi məqalə müəllifidir və onun indiyədək 38 kitabı, o cümlədən 4 Divanı, fars və osmanlı türkcəsi dillərində çap olunmuş 4 tərcümə əsəri, 20-dən çox şeir kitabı oxucuların mütaliəsinə verilmişdir.

Bir daha vurğulamaq istərdim ki, müasir Azərbaycan elminin təşəkkülündə və inkişafında Şahin Fərzəliyevin xidmətləri misilsizdir. O istedadı və əməyi sayəsində adi müəllimlikdən ədəbiyyatşünas-tarixçi alim, professor dərəcəsinə qədər yüksəlmişdir. Onun dəyərli əsərləri təkcə ölkəmizdə deyil, xarici dövlətlərdə də alimə böyük nüfuz qazan-

dırmışdır. Belə ki, 1970-ci ildən bu vaxtadək onlarca Beynəlxalq və yerli elmi konfranslarda (Əfqanıstan, İran, İraq, Türkiyə Yaponiya, Kipr və Sovetlər İttifaqının müxtəlif respublikalarında) məruzələrlə çıxış etmişdir. Azərbaycan elminə şərəf və şöhrət gətirən Şahin müəllim Azərbaycan Yazarlar Birliyinin 2013-2014-cü il üçün Prezident təqaüdünə layiq görülmüşdür. Mənəvi mühitimizin müstəqillik dövründəki təkamülündə Şahin Fərzəliyevin böyük xidmətləri olmuşdur. O, hazırda AMEA Tarix institutunun "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri vəzifəsində işləyir.

Mənim üçün, Şahin Fərzəliyev şair və tarixçi kimi qoşa qanadlı bir insandır, yəni onlardan biri digərinin ilham mənbəyidir. "Qoşa qanadlı" Şahin Fazil haqqında "Şahinin qanadları" adlı geniş həcimli məqalə yazan akademik Bəkir NƏbiyev onun qanadlarının birinin məhz poetik qanad olduğunu bildirir. Poetik qanad! Bu qanad şairi daim pərvazlandırır və kim isə ona şeir yazdırır. Kimdir o, kim? Kimdir ki, Şahin Fazilə şeir yazdırır? Bu sualın cavabı şairin aşağıdakı şerindədir:

MƏNƏ YAZDIRAN VAR ŞEİRLƏRİMİ

*Şeirim mənimkimi? Hansı əsasla?*
*Bu çətin sualın mənası dərin.*
*Dərk edə bilmirəm, bilmirəm əsla*
*Kimdir müəllifi bu sətirlərin?*

*Bəzən bir namərdin etdiyi tənə*
*Sinəmə sancılan güllə, ox olur.*
*Ona tənə dolu cavab yerinə*
*Nə təhər olur ki, şeir doğulur?*

*Sözdən birdən-birə cinas düzəlir,*
*Bir özgə aləmdir aləmim mənim.*
*Məzmunla qafiyə necə düz gəlir?*
*Verər sualıma cavab kim mənim?*

*Kimdir yazdıranı? Mənəm yazanı!*
*Elə ki, yazıram qışım yaz olur.*
*Necə baş verir ki, şeir divanı,*
*Nə təhər olur ki, "Xəmsə" yazılır?*

*Şeir yazdıranın sirli səsini*
*Qulağım eşitmir, qəlbim eşidir.*
*Düzəldir hər sətrin qafiyəsini,*
*O, hər qəzəlimin cəfakeşidir.*

*O Gözəgörünməz göydənmi enib?*
*Qələm hey köçürür o söyləyəni.*
*O hansı qüvvədir məni bəyənib?*
*O hansı qüdrətdir tapıbdır məni?*

*Necə məlum edək həqiqəti biz?*
*Ürəkdə suallar, önümdə vərəq.*
*Nə təhər olur ki, məhəbbətimiz*
*Yazılır kağıza misralanaraq?*

*Mənə açıq deyil hələ ki, bu sirr,*
*Beynimə cürbəcür suallar dolur:*
*Bir İlyas nə təhər Nizamiləşir,*
*Bir seyid nə üçün Nəsimi olur?*

*Qorxuram bu yükə ürək dözməyə,*
*Bu şairlik nədir, bu peşə nədir?*
*Niyə aludəyəm misra düzməyə?*
*Məni vadar edən bu işə nədir?*

*Tanrım, göz yumanda bu cahana mən*
*Görə bilərəm şeir pərimi?*
*Mənə diktə edən kimdir görəsən?*
*Mənə yazdıran var şeirlərimi.*

Şübhəsiz, Şahin Fərzəliyevin geniş kontekstdə işlədiyi Qarabağ mövzusunun təməl daşı müəllifin elmi istiqamətində tədqiqatlarından öncə bədii mətnlərdə, yaşadığımız taleyüklü problemlərin onun daxili dünyasına vurduğu dərin təsirdə qoyulub. Onu da qeyd etmək yerinə düşərdi ki, incə zövqlü şair və həm də mənbəşünas alim olan professor Şahin Fərzəliyev 2009-cu ildə Yaponiyanın Sinday Universitetinin dəvəti ilə həmin ölkədə olmuş, Azərbaycan tarixşünaslığına dair mühazirə oxumuşdur. Azərbaycan xalqının vətən-

pərvər övladı və tanınmış alimi kimi Azərbaycanın tarixi problemlərini istər ölkə daxilində, istərsə də xaricdə işıqlandırmış Şahin Fərzəliyev çıxış etdiyi ölkələrdə Azərbaycanın tutduğu mövqeyi həmişə cəsarətlə müdafiə etmişdir.

**Ömrünün 80 ilini pak, təmiz və təmənnasız yaşayan professor Ş.F.Fərzəliyev gənc elmi kadrların yetişdirilməsi sahəsində çox səmərəli fəaliyyət göstərmişdir. Onun rəhbərliyi ilə 13 nəfər tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsinə layiq görülmüşdür. Tarix İnstitutunun nəzdində fəaliyyət göstərən ixtisaslaşdırılmış Müdafiə Şurasının üzvü olan prof. Ş.F.Fərzəliyev 10-dan çox kitabın elmi redaktoru olmuş, 50-yə yaxın tarix üzrə fəlsəfə doktoru və tarix elmlər doktoru dissertasiyalarına opponentlik etmişdir. Azərbaycan Yazıçılar Birliyinin üzvü olan alim Əfqanıstanın 3 Dövlət medalı və SSRİ-nin bir neçə Fəxri Fərmanı ilə təltif olunmuşdur.**

Şahin Fərzəliyev zəngin insandır, dünya mənəvi xəzinəsini bir insanın əxz edə biləcəyi qədər zəngin ziyalıdır. O, vaxtını qətiyyən boş keçirmir,

*"Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur".*

deyərək gecə-gündüz qələmini işlətməkdən yorulmur. Şahin Fazilin, "Kim isə yuxumu götürüb qaçır" adlı şeiri onun "gecə" şeirlərindəndir:

*Elə ki, yumuram gözümü gecə*
*Hansı bir qüvvəsə gözümü açır.*
*Yatmağa qoymuram özümü gecə,*
*Kim isə yuxumu götürüb qaçır.*

*Gecə ilham pərim gülür üzümə,*
*Gecə səhərəcən şeir deyirəm.*
*Qayıtmasın deyə yuxu gözümə*
*Hərdənbir qolumu çimdikləyirəm.*

*Bəzən qələm altda cırılır varaq,*
*Bəzən axtarıram "Qələmim hanı?"*
*Bəzən misra-misra pıçıldayaraq,*
*Rahatsız edirəm mənlə yatanı.*

*Canda söz atəşi, kəlmə közü var,*
*Küllə örtülməsin közümün üstü.*
*Yataqda qaralır bəyaz varaqlar,*
*Masaya çevrilir dizimin üstü.*

*Bəzən ürək deyir, bəzən dil deyir,*
*Arada sözlərin cəngi görünür.*
*Səhər açılanda əlimdə şeir,*
*Balışda mürəkkəb rəngi görünür.*

*Özümü yalandan öyə bilmərəm,*
*Demirəm hər vədə sözüm çox olur.*
*Özgə şeirləri deyə bilmərəm,*
*Mənim şeirlərim gecə doğulur.*

*Belə artırıram şeir varımı,*
*Azalmır bu varın istəyi canda.*
*Bəzən qaranlıqda yazdıqlarımı*
*Oxuya bilmirəm sübh açılanda.*

*Beləcə-beləcə çoxaldı şeir,*
*Beləcə-beləcə çoxaldı misra.*
*Bəzən bir gecədə beş-altı şeir,*
*Bəzən bir gecədə beş-altı misra.*

*Elə ki, yumuram gözümü gecə*
*Hansı bir qüvvəsə gözümü açır.*
*Yatmağa qoymuram özümü gecə,*
*Kim isə yuxumu götürüb qaçır,*
*Kim isə yuxumu götürüb qaçır...*

Pedaqoq Şahin Fərzəliyev Respublikamızın müxtəlif təhsil müəssisələrində Azərbaycan tarixi, Türk və Qafqaz xalqları tarixi və başqa mövzularda mühazirələr oxumuş, gənc nəslin ideya-siyasi tərbiyəsinin formalaşmasına öz layiqli töhfəsini vermişdir. Şahin müəllimin ən böyük, ən müqəddəs arzularından biri də, sevdiyi xalqına layiqli xidmət etmək olmuşdur ki, bu sevgi ona el məhəbbəti bəxş etmişdir. Şahin mü-

əllim ziyalılarımıza bir örnəkdir desək yanılmarıq.

Şahin müəllimin xalqımıza göstərdiyi misilsiz xidmətləri haqqında çox danışmaq olar. Bu səmimi, obyektiv fikirlərin sonunda ziyalıların, həmkarlarının, tələbələrinin, yetirmələrinin soydaşlarının qəlbində özünə böyük hörmət və nüfuz qazanmış Şahin müəllimi ömrünün bu müdriklik çağında anadan olmasının 80 illiyi münasibətilə səmimi qəlbdən təbrik edir, ona uzun və mənalı ömür, möhkəm cansağlığı arzulayır, həyatda və əməli fəaliyyətində daha böyük zirvələr fəth etməsini Ulu Tanrıdan təmənna edirəm!

**Aynur NURAY (BƏŞİRLİ)**
*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun şöbə müdiri, fəlsəfə doktoru*

## ŞAHİNİN UÇUŞU

Bilmirəm ona bu adı kim verib. Niyə verib. 80 il əvvəl ata-analar övladlarına Şahin adı verəndə nə düşünürdülər. Özündən soruşa da bilərdim. Bəlkə, haçansa soruşdum. Hələ ki, buna ehtiyac duymuram...

Mənim üçün adlar kateqoriyalara bölünür. Uşaq adları, cavan adları, qoca adları. Yəni elə adlar var ki, onun sahibini heç vaxt qoca təsəvvür edə bilmirəm. Daha doğrusu, mənə elə gəlir ki, həmin adların yanında “baba” sözü səslənə bilməz. Məsələn, Elşən baba. Çətin gəlir mənə. Amma Süleyman adı kökündən baba olmaq üçün yaranıb – Süleyman baba. Yəqin, bu cür yanaşma sırf süuraltı prosesdir, onun nələrin əsasında yaranmasını ancaq güman edə bilərik...

Mənim ilk tanıdığım Şahin məhlə uşağı idi. Altı yaşında biz təzə evə köçdük. Şahini sonralar görmədim, yaddaşımda elə uşaq kimi də qaldı...

...Doxsanıncı illərdə Dubayda buraxılan ingilisdilli jurnalda bir quş şəklinə rast gəldim, sahibinin əlində oturmuşdu, çox məğrur və iti baxışı vardı. Quşun adı ingiliscə yazılmışdı – falcon. Tərcüməsini axtardım. Şahin çıxdı. Sən demə, sahinlərlə indi də ova çıxanlar varmış...

...Yeri gəlmişkən, qədim türk dilində bu quşun adı salurdur. Dəqə Qorqudda da var. Salur Qazan, yəni Şahin Qazan. Şahinlə yox, özü salur kimi ova çıxan Qazan...

Nə isə... Şahin müəllimin adı mənim üçün linza kimi toplayıcı bir addır. Onda şahinlərlə bağlı bütün bilik və assosiyasiyalar birləşir. Bu xəyali linzada fiziki linzanın əsas xüsusiyyəti var: o da alışdıra bilər...

***

Fəridə laborantdır, Şahin müəllimin şöbəsində işləyir. Bizim Nərminin rəfiqəsidir. Hərdən köhnə iş otağımıza gələrdi. Günlərin birində söhbəti müdirindən saldı. Özünəməxsus ləhcəsi ilə “Biy, elə şeir yazır”, - dedi. “O qədər yazır ki. Mən də kompyuterdə yığıram”.

“Xoşlamırsan şeiri?” – soruşdum.

Özünə xas səmimiyyətlə: “Yox, mən şeir xoşlamıram,”- dedi...

"Qalxım yuxarıya, birdən məni axtarar".

Yuxarı, yəni ən yuxarı qat...

Mənbəşünaslıq şöbəsi sonuncu qatdadır. Bura heç lift də axıra qədər qalxmır. Liftdən sonra pilləkanla bir az özün qalxmalısan. Qalxdıqca bilmirsən minbərə çıxırsan, ya rəsədxanaya...

***

Günlərin birində mən də sonuncu qata qalxdım. Akademiyanın ən ürəkaçan qatına. İşıqlara qərq olmuşdu...

Fəridə kompyuterinin arxasında oturmuşdu, yazıya hazır vəziyyətdə. Şahin müəllim taym-aut götürmüşdü. Qonaq qəbul edirdi. Qəhvə təklif etdi. İstəmədim. Kitab bağışladı. Aldım. "Azərbaycan haykuları"...

Şahin müəllimin haykularını çox sevirəm... Haykularda şahin var. Onları yazmaq üçün iti reaksiya, sözü bir dəfə demək lazımdır. Fikrin üstünə şığımaq, beynin dərin qatlarından qoparaq qafiyələrin caynağına keçirmək, sonra səmaya uçuşa buraxmaq... Hayku üçün şahin təbiəti və ruhu gərəkdir...

*Dumanı dağ üstündən*
*qaldırmaq istəyirəm,*
*Don Kixotam...*

Şahin müəllim mənə də "hayku yaz",- deyir. Mən hayku yaza bilmirəm. Haçansa yazacağama söz də vermirəm. Amma Şahin müəllimə söz verdim ki, onu yaxşı bir qəhvəyə qonaq edəcəyəm...

***

Sözümün üstündə durdum. Qəhvədən dada-dada ona ən çox sevdiyim şerlərimdən birini, "Lələk" şeirini söylədim:

*Bir lələk uçurdu göydə*
*Asudə-asudə...*
*Bir lələk süzürdü göydə*
*Divanə-divanə...*
*Ayrılıb Vətənindən*
*Üzülüb qu bədənindən*
*Uçurdu göyün "qu" desən,*
*qulaq tutulan ənginliyində...*
*Uçurdu yüksüz,*

*Qayğısız, hürküsüz...*
*Arxada qalmışdı*
*Qəfil güllə qorxusu.*
*Arxada qalmışdı bir ovçunun toru,*
*Arxada qalmışdı vurulmaq,*
*Bir qadın əlində yolunmaq,*
*Qu balışa tük olmaq...*
*Bir lələk uçurdu qu kimi,*
*Ayrılıb dəstədən, üzülüb qu bədənindən.*
*Unutmuşdu keçmişi...*
*Xəbərsizdi gələcəkdən,*
*hara enəcəyindən...*

İlk misralar səslənər-səslənməz Şahin müəllim dedi ki, şeir məni tutdu.

Bir neçə gendən sonra Şahin müəllim mənə özünün "Lələk" şeirini oxuyurdu:

*Bir durna quşu vardı,*
*Bir səmanın havasında*
*Havanın uçuşu vardı,*
*Uçuşun küləyi vardı,*
*Küləyin ağuşunda*
*Bir durna lələyi vardı...*
*Bir lələk uçurdu göydə.*

*"Allah" adlı hökmran həmənki işindəydi,*
*Yer Kürəsi adlı məkan həmənki vərdişindəydi,*
*Buludlar üzürdü səma içində,*
*Durnalar ötürdü hava içində,*
*Asiman həmənki kimiydi,*
*Çən-duman həmənki kimiydi,*
*Yenə də nizamla fırladırdı fələk yeri,*
*(Hər zaman hərəkətdə görək yeri),*
*Durnadan ayrılmışdı bir lələk,*
*Ləkəksiz qalmışdı bir durna*
*Yəqin ki, göynəyirdi bir lələk yeri.*
*Bir lələk uçurdu göydə...*

*Köçəri quşlar*
*dəstə-dəstə uçurdular,*
*Gümrah-gümrah, qıvraq-qıvraq uçurdular,*
*Xəstə-xəstə uçurdular...*
*Qol-qanadlar uçurdular,*
*Boyunlar, başlar uçurdular,*
*Quşlar uçurdular dəstə-dəstə,*
*Bir lələk tək uçurdu...*

*Bir lələk uçurdu göydə...*
*Mələklər, ruhlar uçurdular,*
*Adamlardan ucalan*
*fəğanlar, ahlar uçurdular,*
*Hələ axirət günü uzaqdaydı,*
*Savablar, günahlar uçurdular...*
*Bir lələk uçurdu göydə...*

*Bir durna qatarı*
*Sivri bir ox uçluğu şəklində*
*millənə -millənə uçurdu,*
*Öz lələk bacılarından ayrılan*
*Və səmada tək qalan lələk isə*
*Yellənə-yellənə uçurdu...*
*Bir lələk uçurdu göydə.*

*Bir durnanı lələkli edən*
*lələk bacıların biri azalmışdı,*
*bacı lələklərin biri tək qalmışdı...*
*Bir lələk uçurdu göydə.*

*Sanki öz uçuşuna vurula-vurula,*
*Sola sağa,*
*Sağa sola*
*burula-burula*
*Bir lələk uçurdu göydə.*

*Hələ ki, dayanmırdı bir yerdə,*
*Hələ ki, göydə*

*uça-uça vurnuxurdu...*
*Bir lələk uçurdu göydə.*

*Durna qatarı isə gedirdi,*
*Heç onun veçinə deyildi*
*bir durnanı lələkli edən*
*lələk bacıların biri azalmışdı,*
*Bacı lələklərin biri tək qalmışdı...*
*Bir lələk uçurdu göydə.*

*Yerə düşəcəyini*
*bilə-bilə uçurdu,*
*sevinə-sevinə,*
*gülə-gülə uçurdu,*
*Bir lələk uçurdu göydə.*

*Hazırda*
*Bir azca*
*Mənə bənzəyirdi lələk—*
*Mən yerdə tənha,*
*O, göydə tək...*
*Bir lələk uçurdu göydə.*

*Ey lələk,*
*Ey göydə təklənən lələk,*
*Tərk etmisən lələk bacılarını,*
*təksən.*
*Onsuz da bir azdan yerə düşəcəksən,*
*təklənməyəcəksən daha,*
*Hələ ki, keyfini çək.*
*Ey lələk,*
*Bir azdan təkliyin itəcək,*
*Və*
*mənim barmaqlarım arasında,*
*varaqlarım üstündə*
*bir lələk bitəcək*
*və adın dəyişəcək—*
*olacaqsan qələm...*

*Bu dəm*
*Sədayi-qaibanədən*
*Bir səs eşidirəm:*
*Həmişə dövr edən görək fələyi,*
*Hər zaman hərəkətdə görək aləmi,*
*Azaldı bir durnanın lələyi,*
*Çoxaldı bir şairin qələmi...*

*...Bir lələk uçurdu göydə...*

Bu günlərdə Şahin müəllimin 80 illiyindən söz düşəndə mənə dedi ki, heç nə yazma, elə "Lələk"i təhlil et, bəsdir. Dedim ki, şeirə nə təhlil. Siz mənimkini öz şeirinizlə təhlil etdiniz. Tamamlandı...

Düzü, səksənillikdən xəbərim yox idi. Sağ olsun Fəridə. Ondan xəbər tutdum...

***

Fəridəni liftin qarşısında gördüm. Şahin müəllimi xəbər aldım.

- Şahin müəllim necədir? Yenə də yazır?
- İndi bir az azalıb. Səksən illikdir axı. İndi kitab çıxarırıq.
- Yaxşı ki dedin. Mən də yazaram...
- Yazın. Mən də yazmışam...

Fəridənin yazı yazması, düzü, məni bir az çaşdırdı.

- Doğrudan? Axı sən şeir xoşlamırdın...
- İndi xoşlayıram. Şahin müəllimin şeirlərini yaza-yaza şeiri sevdim. Bir şeiri vardı, yazanda ağlamışdım... Elə gözəl şeir idi ki...

Liftin qapısı açıldı. Bizdən başqa bir nəfər də içəri girdi. Düymələri basdıq. 5, 6, 9...

- Sən yuxarı qalxırsan. Ən yuxarıya?
- Hə, Şahin müəllim deyir ki, biz Allaha daha yaxınıq.

Liftdəki üçüncü adam qımışdı:

- Onda göydələnlərdə yaşayanlar gərək Allaha hamıdan yaxın olsunlar,- dedi. Hamımız susduq...

Birimiz beşdə, birimiz altıda, birimiz də yuxarı qatda liftdən çıxdıq. İnanan inansın, inanmayan inanmasın. Mən Fəridənin Allaha yaxın qata qalxdığına inanırdım... Şahinlərin uçduğu qata...

**Dilavər ƏZİMLİ**
*Tarix üzrə fəlsəfə doktoru, dosent*

# ŞAHİN FAZİLIN BATİNİ DÜNYASINA QISA BİR NƏZƏR

Şahin Fazil haqqında yazmaq olduqca çətindir. Çünki bu insana olan sözləri tapmaqda çətinlik çəkirəm. **Belə insanlar min ildən bir doğulurlar. Allah ona böyük istedad vermişdir. Bu insan dərin tarixçidir, şərq elmlərinə vaqif alimdir, xüsusi istedada malik tərçüməçidir, mənbəşünas və mətnşünasdır. Ən başlıcası isə istedadlı şairdir. Bu gün ölkəmizdə əlinə qələm alıb şeir yazanlar çoxdur. Amma Şahin Fazil kimi şairlər çox azdır. Bu insan Azərbaycanda XX əsrdə sərbəst, əruz və heca vəznlərində yaranan yeni Divan ədəbiyyatının ən qadir müəllifidir. Seyid Əzim Şirvanidən sonra kimsə buna cəsarət edə bilmədi. Amma Şahin Fazil etdi və bacardı. Çünki Allah-təala ona qeyri-adi istedad bəxş edibdir.** Mən təbiətcə sufiliyə yaxın olduğumdan Şahin Fazilin divanlarında bu istiqamətdə şeirlər axtarışına çıxdım. Nələr tapdım, nələr... Bu şeirləri yalnız təbiətcə sufi olan bir insan yaza bilərdi. Bu insan bizim içində bulunduğumuz və "Yalan Dünya" adlandırdığımız dünyanın adamı deyildir. Bu insan ayri bir dünyanın sakinidir. Bu insanda Yaradanın bütün təmiz əlamətləri, sifətləri öz əksini tapıbdır. Bu insanda Allahın bir çox sifəti təcəssüm edibdir. Allahın adlarına nəzər yetirməklə müqayisə aparmaqla belə müqayisə edə bilərik:

ALLAH — bütün gözəl sifətləri özündə ehtiva edən; ƏL-VAHID — yeganə; ƏL-ƏHƏD — bənzərsiz; ƏS-SAMƏD — ehtiyacsız; ƏL-AXİR — hər şeydən sonra mövcud olacaq; ƏS-SƏMİ — hər şeyi eşidən; ƏL-BƏSİR — hər şeyi görən (haqq-nahaqq); ƏL-QƏDİR — hər şeyə qüdrəti çatan; ƏL-ƏVVƏL — hər şeydən əvvəl mövcud olmuş; ƏL-QAHİR — zalımları qəhr edən; ƏL-ƏLİYY — yüksək, uca; ƏL-Ə'LA — ən yüksək, ən uca; ƏL-BAQİ — əbədi, daimi qalar; ƏL-BƏDİ — həmişə ixtira edən; ƏL-BARİ — yaradıcı; ƏL-ƏKRƏM — ən kəramətli; ƏZ-ZAHİR — aşkarda olan (yaxud aşkardakıları bilən); ƏL-BATİN — gizlində olan (yaxud gizlindəkiləri bilən); ƏL-HƏYY — diri; ƏL-HƏKİM — çox hikmətli; ƏL-ƏLİM — hər şeyi bilən, çox elmli; ƏL-HƏLİM — çox mülayim; ƏL-HƏFİZ — ən yaxşı qoruyucu, mühafizəçi; ƏL-HƏQQ — həqiqət axtarışında olan; ƏL-HƏSİB —

hər şeyi hesaba alan; ƏL-HƏMİD — həmd edilən (yaxud həmdə layiq); ƏL-HƏFİYY — öz yaratdıqlarını çox sevən; ƏN-NUR — nurlu; ƏR-RƏBB — bəsləyən, pərvəriş edən; ƏR-RƏHMƏN — mərhəmətli; ƏR-RƏHİM — mərhəmətli; ƏR-RƏUF — mehriban, şəfqətli; ƏR-RAİ — hər şeyi görən; ƏR-RƏQİB — nəzarətçi, keşikçi; ƏZ-ZARİ — yaradan (yaxud bəndələrinin aqibətini müəyyən edən); ƏS-SƏLAM — hər təhlükədən salamatlığa çıxaran, əmin-amanlıq və salamatlıq verən; ƏR-RƏZZAQ (ƏR-RƏZİQ) — ruzi verən; ƏL-MÖ'MİN — iman bəxş edən (yaxud iman bəslənilən); ƏL-MÜHƏYMİN — himayə edən; ƏL-ƏZİZ — çox izzətli; ƏL-CƏBBAR- zalımlara əziyyət verən; ƏL-MÜTƏKƏBBİR — məqamı uca tutulan, böyüdülən; ƏS-SƏYYİD — ağa, başçı ƏŞ-ŞAHİD — hər şeyə şahid və nəzarətçi olan; ƏS-SADİQ — sədaqətli; doğrucul; ƏT-TAHİR — pak, saf; ƏL-ĞƏNİYY — ehtiyacsız, varlı; ƏL-ĞİYAS — köməkçi; ƏL-FATİR — yaradan, vucuda gətirən; ƏL-FƏRD — tək, yeganə; ƏL-FƏTTAH — çətinlikləri həll edən; ƏL-FALİQ — dan yerini yaran, parçalayan; ƏL-QƏDİM — əzəli, olmadığı zaman təsəvvürə gəlməyən; ƏL-MƏLİK — mülk sahibi; ƏL-QÜDDUS — müqəddəs; ƏL-QƏVİYY — çox qüvvətli; ƏL-QƏRİB — çox yaxın; ƏL-QƏYYUM — dayanıqlı, sarsılmaz, sabit; ƏL-QABİZ — sıxan, canları alan, və ya qəbz edən; ƏL-BASİT — açıb sərən və ya səxavətli; QAZİYUL-HACAT — hökm verən, ehtiyacları həll edən; ƏŞ-ŞAFİ — şəfa verən, sağaldan; ƏL-MƏCİD — şan-şöhrətli, əzəmətli, ulu; ƏL-VƏLİYY (ƏL-MÖVLA) — dost (ağa, sərvər); Əl-LƏTİF — lütf edən; ƏL-MƏNNAN — bəndələrinə çox ehsan edən; ƏL-MÜHİT — hər şeyi əhatə edən; ƏL-MÜBİN — hər şeyi bəyan edib aşkarlayan; ƏL-MÜQİT (ƏL-MÜĞİS) — ruzi verən (dada yetişən, yardımçı); ƏL-MUSƏVVİR — hər şeyi formaya salan; ƏL-KƏRİM — çox kəramətli; ƏL-KƏBİR — çox böyük; ƏL-KAFİ — kifayət edən, hər şeylə kifayətlənən; KAŞİFÜZ-ZÜRR — zərərin üstünü açıb ifşa edən; ƏL-VİTR — tək-tənha; ƏL-ƏZİM — əzəmətli; ƏL-VƏHHAB — nemət bağışlayan; ƏN-NASİR — köməkçi, yardımçı; ƏL-VASE — çox əhatəli, geniş; ƏL-VƏDUD — bəndələrini çox sevən; ƏL-HADİ — hidayət edən, doğru yol göstərən; ƏL-VƏFİYY — vəfalı, sadiq; ƏL-VƏKİL — himayəçi; ƏL-VARİS — qiyamətdə hər şey məhv olduqdan sonra tək qalacaq vücud; ƏL-BİRR — yaxşı sifətlərin sahibi; ƏL-BAİS — qiyamətdə ölüləri diriləcək zat; ƏT-TƏVVAB — tövbələri qəbul edən; ƏL-CƏLİL — cəlallı; ƏL-CƏVAD — səxavətli; ƏL-XƏBİR — hər şeydən xəbərdar; ƏL-XALİQ — xəlq edən, yaradan; XEYRUN-NASİRİN — ən yaxşı yardımçı; ƏD-DƏYYAN — hesabat gününün sahibi, hakim; ƏŞ-ŞƏKÜR — şükr edilən (yaxud şükrə layiq);

ƏS-SANE — yaradıcı; ƏL-ƏDL — ədalətli (yaxud ədalətin özü); ƏL-ƏFÜVV — əfv edən, bağışlayan; ƏL-ĞƏFUR — günahları bağışlayan.

**Mən bu siyahını elə-belə təqdim etmədim. Siyahıya diqqətlə baxsanız bu adlardan çoxunun Şahin Fazildə əks olunduğunu görəcəksiniz.** ALLAH — bütün gözəl sifətləri özündə ehtiva edəndir. Mübaliğəsiz deyə bilərəm ki, bu sifətlərin əksəriyyəti Şahin müəllimdə vardır. Demək, Şahin müəllimin simasında Allahın ən gözəl xüsusiyyətləri təcəlla etmişdir.

Şahin müəllim ƏL-VAHID — yeganədir, ƏL-ƏHƏD — bənzərsizdir, ƏS-SAMƏD — ehtiyacsızdır, ƏL-VİTR — tək-tənhadır, ƏL-ƏZİM — əzəmətlidir, ƏN-NASİR — köməkçi, yardımçıdır, ƏL-VƏFİYY — vəfalı, sadiqdir, ƏL-VƏKİL — himayəçidir, ƏL-BİRR — yaxşı sifətlərin sahibidir, ƏL-CƏLİL — cəlallıdır, ƏL-CƏVAD — səxavətlidir, ƏL-ƏDL — ədalətlin özüdür.

Bu siyahını uzada da bilərəm. Görün bu adamın xüsusiyyətlərində Allahın neçə adı özünü göstərir. Belə insanlar sufi həyatı yaşayır. Onlar bizim üçün tənhadırlar, amma həmişə çoxluqdadırlar. Çünki fənafillahdırlar, bəqabillahdırlar. Onların aləmi bizim düşündüyümüz aləm deyildir. O aləm dünya var olduqca var olar, ta qiyamətə qədər. Onlara verilən görəv budur. Şahin Fazil də xoşbəxtdir ki, ona bu cür görəv verildi. Əgər bu görəv verilməsəydi, Şahin Fazil nəfs əsiri olardı, dünyagir olardı, ömrünü kiməsə yarınmaqla yaşayardı. Nə yaxşı ki, Uca Tanrı onu bunlardan qorudu və qarşımızda əzəmətli Şahin Fazil dayandı. Hər bir insan dünyaya hələ gəlməmiş Uca Tanrı ona bütün yaxşı keyfiyyətləri bəxş edir. Amma çoxları bunu qoruyub saxlaya bilmir. Yaşadığı mühit, böyüdüyü ailə həyatı elələrinə ayrı keyfiyyətlər aşılayır və nəticədə həmin adamlar Tanrının də nəzərindən düşür. Amma Şahin Fazil elə bir ailədə dünyaya göz açdı ki, o, bu xüsusiyyətləri nəinki qoruyub saxladı, həm də artırdı. Onun fəaliyyət dairəsində də ancaq özü kimi ləyaqət sahibləri oldu. Sevinirəm ki, bu insanı tanıdım və onun fəaliyyət dairəsində mən də oldum... Onunla bir yerdə olmaq, söhbət etmək, onu dinləmək Uca Tanrının bizə verdiyi ən böyük lütfdür!!!

**Şahin müəllim sufiliyə çox yaxındır desəm, yanılaram, Şahin Fazil sufilik aləmində dolaşır, onun içində ərimək istəyir, amma bütünlüklə daxil ola bilmir. Çünki daxil olsa, indiki Şahin Fazil olmayacaqdır!!! Bunu mən bütün varlığımla hiss edirəm. O, dərviş kimi od tutub yanır!!!! Dəviş yolunun yolçusudur!!! Şahin müəllimin mürşüdü bir olan Allahdır. Allaha doğru gedən yol ilə irəliləyən və sufi düşüncələri ilə odlanan Şahin müəllim!!! "Sən dərviş olammazsan" şeirində yazdığın kimi...**

"Dilin ilə şaxarsan,
Çox mahnılar oxursan,
Vara-yoxa baxarsan,
Sən dərviş olammazsan"

**Yunus İmrə**

"Dərvişlik pək uludur,
Sən dərviş olammazsan"

**Şah İsmayıl Xətayi**

*Umacağın böyüksə,*
*Sən dərviş olammazsan,*
*Tamah qəlbinə yüksə,*
*Sən dərviş olammazsan.*

*Dərvişlik meyli ilə,*
*Kəşkül də alsan ələ,*
*İstəyini ram elə,*
*Sən dərviş olammazsan.*

*Tənbur, rübab çalsan da,*
*Səhralarda qalsan da,*
*Tərki-dünya olsan da,*
*Sən dərviş olammazsan.*

*Xam xəyala düşmə sən,*
*Gəl bu yolu seçmə sən,*
*Var-yoxundan keçməsən*
*Sən dərviş olammazsan.*

*Qalxsan da dağdan-dağa,*
*Keçsən də bağdan-bağa,*
*Nə var səyyah olmağa?*
*Sən dərviş olammazsan.*

*Yorğanın duman olar,*
*Döşəyin saman olar,*

*Ovqatın yaman olar,*
*Sən dərviş olammazsan.*

*Şair ola bilərsən,*
*Nasir ola bilərsən,*
*Nazir ola bilərsən,*
*Sən dərviş olammazsan.*

*Zəfər çala bilərsən,*
*Şəhər sala bilərsən,*
*Lap şah ola bilərsən,*
*Sən dərviş olammazsan.*

*Dərviş sərvət istəməz,*
*Dərviş "mənimdir" deməz,*
*Dərviş sənə bənzəməz,*
*Sən dərviş olammazsan.*

*Əhdi, peymanı bərkdir,*
*Hökmü, fərmanı bərkdir,*
*Dərvişin canı bərkdir,*
*Sən dərviş olammazsan.*

*Düşüb yollara qaçır...*
*Ayağı yara, qaçır...*
*O, qaçır, hara qaçır?*
*Sən dərviş olammazsan.*

*Gündüz gündür ocağı,*
*Gecə aydır çırağı,*
*Küləklərdir darağı,*
*Sən dərviş olammazsan.*

*Nədir ürəyindəki?*
*Dinməzdir balıq təki,*
*Yalqızdır xalıq təki,*
*Sən dərviş olammazsan.*

*Görmüşük çox pisliyi,*
*Apara ox pisliyi!*
*Bir kəsə yox pisliyi,*
*Sən dərviş olammazsan.*

*"Yahu!... Yahu!..."dilində,*
*Dəstərxanı belində,*
*Çəkmələri əlində.*
*Sən dərviş olammazsan.*

*Yox söyüşü, qovğası,*
*Yox dayağı, arxası,*
*Qulağında sırğası,*
*Sən dərviş olammazsan.*

*Söyüş söyən kişi deyil,*
*Yalan deyən kişi deyil,*
*Hər kişinin işi deyil,*
*Sən dərviş olammazsan.*

*Tamah nədir bilməyir,*
*Günah nədir bilməyir,*
*Nigah nədir bilməyir,*
*Sən dərviş olammazsan.*

*Qənaət!-şüarıdır,*
*Ləyaqət!-qərarıdır,*
*Sufi yadigarıdır,*
*Sən dərviş olammazsan.*

*Dərviş əhdi qətidir,*
*Tənhalıq-niyyətidir,*
*Allahın hikmətidir,*
*Sən dərviş olammazsan.*

*İşrətdən uzaq olar,*
*Qeybdən iraq olar,*
*Töhfəsi yrapaq olar,*
*Sən dərviş olammazsan.*

*Dirriyi, varı olmaz,*
*Bağçası, barı olmaz,*
*Dərvişin yarı olmaz,*
*Sən dərviş olammazsan!!!"*

**İrfan elmindən bizə bəllidir ki, sufi dünyaya, maddi olan hər şeyə göz yuman, Tanrıya qovuşmaq (yüksəlmək) eşqi ilə yaşayan, əxlaqını və mənəviyyatını durmadan kamilləşdirməyə çalışan kimsədir. Bu əlamətlər Şahin müəllimdə bütünlüklə özünü göstərir!!!** Görün bu barədə Şahin Fazil nə yazır:

*"Dərvişəm, Tanrıma "hu" deyirəm, "hu",*
*Dilimdə həmişə "yahu" olacaq.*
*Sən həsəddən ölsən, həyatın boyu*
*Etdiyin yaxşı iş tək bu olacaq."*

Dilində Allahdan başqa kimsə olmayan ustad Şahin Fazil!!! Sən ənginliklərdə uçan şahinsən, Şahin!!! Sən yalnız uçmaq üçün yaranmısan!!! Ona görə də Tanrımız sənə bu ilhamı verdi!!! Daima göylərdə uçursan!!! Sən başqaları kimi sürünmək üçün yaranmadın!!! Koramal kimi ilanlar sürünməyi ilə fəxr edir!!! Koramal haradan bilsin ki, göylərin ənginlikləri, əzəməti nədir!!! Ömrü boyu sürünüb və nail olduqlarına da sürünməklə nail olubdur. Göylərin əzəmətini Göylərdə qanad çalıb Ucalıqlara baş vuranlar bilər!!! Sən bunlardan birisən, Şahin Fazil!!!

Sən başqa cür də ola bilməzdin!!! Olsaydın Uca Tanrı ilhamını əlindən alardı!!!

Sən yazırsan ki:

*"Mənə Nuh ömrü nəsib olsa idi, ey Şahin,*
*Kim bilir mən yaradardım neçə "Divan" əsəri."*

Əslində sənə Nuh ömrü verilib, Şahin Fazil!!! Yaratdığın divanlar Nuh ömründən də artıq səni yaşadacaqdır!!! Min illər keçəcək və divanlarını vərəqləyən hər kəs üçün daima yaşar olacaqsan!!! Nizami kimi, Nəsimi kimi, Füzuli kimi, Seyid Əzim kimi!!!

Necə də gözəl yazmısan:

*"Ruhun ölməzliyi haqqında qəzəllər çoxdur,*
*Qayıdıb ruh deyirlər təzədən canə gəlir.*

*Bu əgər böyləsə Vahid yenə peyda olacaq,*
*Görərik Mirzə Ələkbər yenə dövranə gəlir.*

*Yuxu gördüm ki, dirilmiş təzədən Seyyid Əzim,*
*Bu həmin Seyyid Əzim idi ki, Şirvanə gəlir?*

*Məncə irfan ilə, mə'nadə təsəvvüf birdir,*
*Neçə mə'na ki, təsəvvüfdədi irfanə gəlir."*

Əmin ol, Şahin Fazil!!! Sənə Tanrı elə məqam verib ki, yenə qayıdıb bu dünyaya gələcəksən!!! Tənasüx nəzəriyyəsi! Ruhun cism öləndən sonra qayıdaraq yenidən hansı bir cisməsə qayıdaşı! Amma o qayıdış fərqli qayıdışdır!!! Bunu məndən sorma!!! Özün yaxşı bilirsən!!!

Necə ki, yazmısan:

*"Nəzərim dəymədə hər ləhzə İmadəddinimə*
*Və "Ənəlhəq"dəki mənasını görməkdə gözüm.*

*Baxaraq diqqət ilə hər tərəfə, ey Şahin,*
*Tanrının nurü təcəllasını görməkdə gözüm."*

Yaxud:

*"Qeysin xəbəri vardı, Leylanı bilirdim,*
*Mən məktəbə getməzdən sevdanı bilirdim."*

*"Dünya hələ bilmirdi varəmmi, yoxammı,*
*Amma, mən isə, Şahin, dünyanı bilirdim"*

Yaxud:

*"Mənsur, "Ənəlhəq"deməsəydi yaşayardı,*
*Şahin, yaşamaqdan ötəri söylə "Ənəlhəq".*

Şahin Fazil, dünyanı ilham gözü ilə anladın!!! Ona aşiq oldun!!! Onu yaradana aşiq oldun!!! Bundan böyük xoşbəxtlik varmı? Ölüm sənin üçün dirilikdir!!! Buna inan!!! Bu fani dünyanın nə olduğunu gözəl bilirsən!!! Üqba aləminin də necə gözəl aləm olduğunu bilirsən!!! Necə ki. yazmısan: **"Pərvərdigara! Fani dünyanı tərk edib üqba aləminı köçməyə tam hazıram. Ölümdən sonra dirilmək də var. Bilirəm ki, "Allah haqdır, ölüləri dirildər və hər şeyə qadirdir. Və eləcə də qiyamət günü çatacaq: Buna heş şübhə yoxdur. Və Allah qəbirlərdə olan ölülərin hamısını dirildəcək" ("Quran", Həcc surəsi, 6-7-ci ayələr). "Zalikə biənəllahə huvəl-həqqu və ənnəhu yühyil-mövta və ənnəhu-əla külli şəyin qədir. Və ənnəs-saətə atiyətun la rəybə fiha və ənnəllahə yəbəsu mənfil qübur". Ümidim cənnətə düşməkdir, çünki mən bilən cəhənnəmlik əməldə bulunmamışam.**

*"Gərək əzm ilə, inam ilə ölüm, ey Şahin,*
*Deyələr göydəkilər: Cənnətə sən xoş gəldin!!!".*

İstədim bu yerdə sonluq edəm... Amma ürəyimdən aşağıdakı cümlələr də keçdi: Şahin Fazil, ən məşhur ilahiyyatçılar belə cənnətin nə olduğunu dərinliyi ilə aça bilmirlər. **Cənnət bizim dini, Allahı əlində alət edən din xadimlərinin dedikləri kimi deyildir. Cənnət görünməyən deməkdir. Görünməyəni necə təsəvvür etmək olar? Onu bilirəm ki, Cənnət deyilən şey ruhun yenidən Allaha qovuşmasıdır!!!** Ruh deyilən şey Allahdan qoparaq bizim cansız bədənimizə girmiş və yenidən bədənimizi tərk edib Allaha doğru qayıdacaqdır. O insanlar sənin kimi həyat sürüblər ki, onların ruhu yenidən Allahına qovuşmuşdur!!! Hamının yox!!! Çünki hamı o ruhu təmis saxlaya bilməyibdir!!! Amma sənin kimilər onu təmiz saxlamışlar!!! Sənin ruhun həmişə cavan olmuşdur!!! Mövlana Cəlaləddin Rumi yazır: *"Ruh bir bülbülə bənzər... Bülbül güllü-çiçəkli ağaca qonduğu kimi, ruh da sağlam bədənə daxil olar. Bədən nə qədər sağlam olarsa, ruh da sağlam olar və bülbül kimi ötər. Bədən sağlamlığını itirəndə isə ruh onu tərk edər. Çünki bülbül də çiçəyi olmayan ağaca qonmaz. Xəstə bədən ruhu saxlamaq üçün çox çalışar. Amma bacarmaz. Ruh bədəni tərk edər, bədən də onu qaytarmaq üçün çox çalışar. Amma bacarmaz, cansız qalaraq qurumuş oduna bənzər. Belə adamların da ruhu sərgərdan gəzər və Allaha qovuşa bilməz. Çünki ruhun içərisində olan həmin bədənlər sağlam həyat sürməmiş, insanlığa yaraşmayan hərəkətlər etmişlər. Belə adamlar üçün bundan*

*sonra cəhənnəm başlayar".*

**Şahin Fazil, sənin kimi insanların ruhu isə həmişə bədəndə qalmaq istər. Çünki sənin bədənin bu ruh üçün gözəllikdir, gözəllik dünyasıdır!!! Çünki bədəninin içi Tanrı nuru ilə işıqlanmışdır. Sənin qəlbin, nurlu qəlbin bütün bədənini işıqlandırır. Belə bədəndən ruh getmək istəməz. O zaman gedər ki, Allah ona əmr edər ki, qayıt yanıma!!! O da qayıdar və belə insanlar əbədilik Cənnətdə olarlar!!! Allahtəala da istədiyi vaxt onların ruhunu yenidən sevdiyi insanların bədənlərinə qaytarıb dirilik bəxş edər!!! Sən belə insanlardansan, Şahin Fazil!!!**

**Allahverdi ƏLİMİRZƏYEV**
*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun*
*"Azərbaycanın qədim tarixi" şöbəsinin müdiri,*
*Tarix üzrə fəlsəfə elmləri doktoru, dosent*

## SÖZ SƏRRAFI HAQQINDA QEYRİ-ADİ SÖZ

(Şahin müəllim haqqında düşüncələrim)

Görkəmli tarixçimiz və şairimiz Şahin Fazil onu az-çox tanıyan hər bir soydaşımızın hörmətlə və diqqətlə unikal şəxsiyyətlərdəndir və onunla bağlı xatirələri bölüşmək də hər kəsə nəsib olmur. Eşidəndə ki, Şahin müəllimi tanıyanların xatirələri toplusu nəşr olunacaq, xeyli sevindim və həmin topluda onun haqqında ürəyimdən keçənləri dilə gətirmək üçün yer ayırdıqlarına görə bu nəcib əməlin təşəbbüskarlarına min əhsən dedim. Poetikadan uzaq adam kimi bəri başdan deyim ki, söz sərrafı olan adam haqqında qeyri-adi söz söyləmək olduqca çətindir, amma deməsəm də olmur.

Xoşbəxtliyin formulu tapılmadığından ona münasibət fərqlidir. Bəziləri onu var-dövlətdə, kimi şan-şöhrətdə, qeyriləri uğurlu ailə həyatında, kimisi can sağlamlığında, başqa biri uzunömürlükdə, digəri qibtə etdiyi insanın səviyyəsinə yüksəlməkdə, kimisi də...Bir sözlə, xoşbəxtliyin nə olduğu sualına birmənalı cavab yoxdur. Mənə elə gəlir ki, xoşbəxtliyə verilən qiymət insana ətrafındakıların münasibəti ilə təyin olunmalıdır. Müəyyən dərəcədə həyat təcrübəsi olan hər kəs bu və ya digər tanışının müqayisəli təhlilini aparmaqla öz-özlüyündə beynini məşğul edə bilər zənindəyəm. Mənim nəzərimdə xoşbəxt insanlardan biri də şəxsiyyətinə yüksək dəyər verdiyim, hörmətini uca tutduğum Şahin müəllimdir. Onunla şəxsa tanışlığımın yaşı 10 ildən bir qədər artıqdır. Əvvəllər nəzərimi sıravi iş yoldaşlarımdan biri kimi, Tarix institutunda çalışan həmkarlarımdan fərqlənməyən elm xadimi kimi cəlb edən Şahin müəllimə olan münasibətim qısa vaxt ərzində mütəmadi ünsiyyətimiz sayəsində əziz bir qohuma olan rəğbətim qədər yüksəldi. O, hər şeydən əvvəl, mənəviyyat adamıdır. Məsəl var, deyirlər: "Görünən dağa nə bələdçi". Orta əsr filosoflarını xatırladan zahiri görünüşü, əsilzadələrə yaraşan xoş çöhrəsi onun alicənablığından xəbər verir. Həyatı boyu siyasətdən bəlkə də uzaq olmadığından uzaq olduğundan içində yaşatdığı elmi yaradıcılıq aurası və poetik dünyası bir-birinə elə qarışıb ki, nə mərhum sovet hö-

kuməti ondan bir zərər gördü, nə də indi yaşadığımız müstəqil respublikamıza ondan ziyan gəlməz.

Dostları və tanışları onu daha çox şair kimi tanıyır; bildiyim qədər 5 divan müəllifidir. Özü də dost və tanışlarına biganə olmadığından onların şəninə şeir qoşur. Mən də istisna deyiləm. Evlərinin eyvanında rəngsaslıq işləri görən vaxtlarda qonşu otaqda makina maşınının səsi eşidirdim; sonra bildim ki, mənə həsr etdiyi şeiri yazırmış. Elə bir mötəbər tədbir və ya yığıncaq xatırlamıram ki, orada Şahin müəllim yeni yazdığı və ya tədbirin ruhuna uyğun şerini səsləndirməsin. Onun poeziyasının mövzu dairəsi genişdir. Düşünərək yazan və düşündürərək dinlətməyi bacaran şairdir. Arazın ayırdığı milli faciəmizə, Qarabağ probleminə, şəhidlərimizə, ictimai və məişət motivlərinə, vətən sevqısı və eşq kimi əbədi mövzulara həsr etdiyi şeir nümunələrinə ürəyini, ruhunu qoyur. Bildiyim qədər Şahin müəllimin qəzəllərinə mahnılar da qoşulub və onlar tanınmış müğənnilərimizin repertuarında bu gün də məsələn "Bağiban" qəzəli səslənməkdədir. Fars dilində yazdığı şe′rlərinin Əfqanıstanda və İranda necə sevildiyi haqqında çox eşitmişəm. Onun poetik incilərinin Türkiyədən olan arkadaşlarımız üçün səsləndirildiyinin şahidi olmuşam. Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 100-cü ildönümü münasibəti ilə 2018-ci ildə Şəmkir şəhərində elmi-kütləvi tədbir keçirilirdi. Həmin günlər Yazıçılar İttifaqının xətti ilə respublikamıza dəvət olunmuş qardaş Türkiyədən olan yazarlar və ədəbiyyat xadimləri də bu tədbirdə iştirak edirdilər. Tədbir rayon icra hakimiyyətinin təşkil etdiyi banketlə müşayiət olundu. Şahin müəllim özünəməxsus təmkinlə "ceyran südündən" bala-bala gillədərək sağlıqlarla poetik misralarını dinləyicilərə çatdırırdı, qafiyəli şerə tamarzı olan türk müsafirlərimiz də bundan zövq aldılar. İndi də institutumuzun həmkarlar təşkilatının xətti ilə keçirilən bayram məclislərində Şahin müəllimlə eyni masa arxasında əyləşməyə çalışıram. Bilirəm ki, masadan qalxdıqda halım taraz, kefim əla olacaq. Şahin müəllim özü də, qədeşlər demişkən, "çörey vərən" adamdır. Evində iş gördürdüyü ustaların zəhmət haqqını artıqlaması ilə ödəyər, yedirib-içirməmiş yola salmaz. Onun aurasında qeyri-adilik var. Təsadüf elə gətirdi ki, bir dəfə aynəbəndini plastik şüşəbəndlə bağlamaq, digər halda su qızdırıcıda yaranan nasazlığı aradan qaldırmaq üçün ayrı-ayrı vaxtlarda məndən tanıdığım peşəkar ustalara ehtiyacı olduğunu bildirdi. Qəribədir ki, hər iki halda gətirdiyim ustalar ovsunlanmış kimi, "ona nə qiymət deyim, bazburutundan ehtiyat edirəm" dedilər və sonda, gəldiklərinə peşman olmadılar. Şahin müəllimlə tanışlığım həyatı-

mın qazancıdır. Özünə də zarafatla demişəm: “Səninlə cavanlığımda tanış olsaydım, ya mən səni meypərəst edəcəkdim, ya da sən məni şair”. Şahin müəllim bu gün də klassik qəzəl poeziyamızın ənənələrini yaşadır. Məsələn, onun 2012-ci ilin yanvarında yazdığı aşağdakı qəzəlində təbiət təsviri ilə yanaşı ictimai, hətta siyasi çağırışlar da yer tutur:

*Yenə qış gəldi, soyuq düşdü, külək qışqıracaq,*
*Şaxtanın cövrünü gördükdə ürək qışqıracaq.*

*Zirvənin donması bəlli, donacaq dağ ətəyi,*
*Geysə də əyninə qar kürkü, ətək qışqıracaq.*

*“Kömək ol bizlərə, yarəb” deyərək insanlar*
*Neçə il bundan əzəl olduğu tək qışqıracaq.*

*Yerin altındakı səsdən xəbərin olsa əgər,*
*Eşidərsən yerin altında böcək qışqıracaq.*

*Çoxalır get-gedə seytanları dünya evinin,*
*Bu qədər şeytana baxdıqda mələk qışqıracaq.*

*Ayılaq, eyləməyək zülm, fələk indi susur,*
*Elə bir gün gələcəkdir ki, fələk qışqıracaq.*

*“Kişi ol, aç ləçəyi!” –gəldi səda göylərdən,*
*Bağlanan başlara minlərlə ləçək qışqıracaq.*

*Olacaq bizlərə məxsus itən torpağımız,*
*Düşmənin məkrini gördükcə kələk, qışqıracaq.*

*Qışqır, ey Şahini –Fazil, diləyindir Qarabağ,*
*Tutmayan baş hələlik böylə dilək qışqıracaq.*

Şahin müəllim gözəl həmsöhbətdir. Əksər hallarda onunla elmi polemikam həlim axarı ilə gözlənilmədən, lakin yerinə düşən məzəli əhvalatla, baməzə zarafatla və ya lətifə ilə tamamlanır.

Onun müsbət xüsusiyyətlərindən birii də xeyirxahlığıdır. Eşitdiyimə görə bəzi əməkdaşlarımıza maddi yardım göstərməklə onları sıxıntıdan xilas edib. Əqidəsində təmiz olması hər kəsə bəllidir. Elə bir şəxs ta-

pılmaz ki, ondan rüşvət aldığını iddia etsin və ya kiminsə dissertasiya müdafiəsinə süni əngəl yaratsın, kiminsə əsərinə rəy yazmaqdan imtina etsin. Təbiətcə sakit, aza qane olan, çoxa iddia etməyən, dünya malına tamahı solmayan Şahin müəllim bugünkü cəmiyyətimiz üçün nadir olan təvazökar və alicənab insanlardandır; cəmiyyəti də belələri yaşadır.

Şahin müəllim haqqında bu qısa xatirəmin sonunda deyəsən özümdə insan xoşbəxtliyinin digər mühüm kriteriyasını üzə çıxardım. Əgər səni həmfikir insanlar əhatələyirsə və onlarla ürəyənin istədiyi kimi, sıxıntı çəkmədən, ünsiyyət qura bilirsənsə, deməli xoşbəxtliyi başqa yerdə axtarmaq vaxt itkisidir. Ey Şahin müəllimi dost, yoldaş və sirdaş bilənlər, özünüzü xoşbəxt hesab edə bilərsiniz !

Şair Şahin Fazilin "Maska" adlı bir şeiridə var. Oxudum, xoşum gəldi. Həmin şeirin qəhrəmanı da ömrü boyu maskasız olan Şahin Fazildir ki, "Maska"nı bu məqaləmin sonuna əlavə edirəm. Maskasız olaq!

*Maskadan qorxuram ömrüm boyu mən,*
*Örtük mənlik deyil, maskaya yadam.*
*Üzü maskalamaq gəlmir əlimdən,*
*Qoy mənə desinlər "Maskasız Adam".*

*Sifətə həvəslə maska taxan var,*
*Az da hörmətim yox onu geyənə.*
*Şərəfsiz olanlar maskalanırlar,*
*Maskasız yaşamaq şərəfdir mənə.*

*Maska daşımaram üzümdə bir dəm,*
*Ondan qorxacağam nə qədər sağam.*
*Əgər bircə dəfə maska geyinsəm*
*Onu ömrüm boyu daşıyacağam.*

*Maskadan qorxuram...*

Amma təəssüf ki, dünyamıza gözəgörünməz koronavirus (Covid-19) daraşmışdır və hamımız ara-sıra maska (Şahin demişkən "yaşmaq") taxmağa giriftar olmuşuq, lakin bu şəxs maska taxsa da, maskasızdır!!!

**Elmar MƏHƏRRƏMOV**
*Tarix üzrə fəlsəfə doktoru, dosent*

## ŞAHİN FAZİL HAQQINDA SÖZÜM

Şahin müəllimi 1975-ci ildən tanıyıram. O vaxtlar Şahin müəllim cavan bir oğlan idi və təzəcə müdafiə etmişdi. Mən həmin dövrdə Bakı Dövlət Universitetində axşam bölməsində oxuyurdum, gündüzləri isə Azərbaycan EA Tarix İnstitutunda təsərrüfat sahəsində işləyirdim. Bir il sonra Şahin müəllim bizə ixtisas fənnindən – "Qaraqoyunlu, Ağqoyunlu dövlətləri və onların Osmanlılarla münasibətləri" tarixindən dərs deməyə başladı. Bu da bizim elmi söhbətlərimizin genişlənməsinə gətirib çıxardı. Məlum oldu ki, Şahin müəllim həqiqətən bir şahindir və çoox, lap çooox yüksəkliklərdədir. Özünəlayiq yerdə qərar tutub. Bu da Şahin müəllimin təkcə işlədiyi şöbənin əməkdaşları ilə, mənimlə, ətrafdakılarla deyil, İnstitutun bütün əməkdaşları ilə, Akademiyanın, Yazıçılar İttifaqının, jurnalistika aləminin bir çox nümayəndələri ilə dostluğuna səbəb olmuşdu.

1978-ci ildə Şahin müəllim tərcüməçi kimi 3-cü dəfə Əfqanıstana getdi. O vaxtlar biz buna adi bir hal kimi baxırdıq. Çünki bizim İnstitutda daha bir neçə nəfər ərəb ölkələrində tərcüməçi işləyirdi. Yalnız 1979-cu ildə sovet qoşunları Əfqanıstana daxil olandan sonra başa düşdük ki, həmin ölkə ilə əvvəlki yaxınlaşmanın arxasında hərbi müdaxilə məsələsi planlaşdırılıbmış. Bunun SSRİ-nin ABŞ-la olan qarşıdurma olduğunu hamı başa düşürdü və heç mətbuat da gizlətmirdi. Ərəb ölkələrində, xüsusilə də İsraillə baş verən savaşlar bütün bunların dünya ağalığı uğrunda SSRİ-ABŞ qarşıdurmasının nəticəsi olduğunu aydın göstərirdi. Həmin illərdə mənim xalaoğlum Nazim Məmmədov da Əfqanıstanda tərcüməçi işləyirdi. Biz də həmişə Allaha dua edirdik ki, həmin ölkələrdə vuruşan əsgərlərimiz, tərcüməçilərimiz və digər sahələrdə çalışanlarımız sağ-salamat Vətənə qayıtsınlar.

Şahin müəllim Əfqanıstana etdiyi bu uzunmüddətli səfərindən qayıtdıqdan sonra (1983) 1980-ci illərin əvvəllərində baş elmi işçi, indiki təbirlə desək, aparıcı elmi işçi vəzifəsinə keçirildi. O vaxtlar bu vəzifəyə keçmək çox çətin idi. Bunun üçün elmi attestasiyadan keçəndən sonra Moskvadan əlavə icazə alınmalı idi.

Şahin müəllim 80-ci ilin ortalarında (1985-88) yenidən Əfqanıstana tərcüməçi kimi getdi. Biz bunun səbəblərini dəqiq bilmirik, bəlkə də bu, o dövr sovet hakimiyyətinin ciddi tələblərindən biri imiş. Şahin müəllim ciddi adam olduğundan bu barədə danışmır da.

Şahin müəllim 1988-ci ildə ölkəyə qayıtdıqdan sonra artıq Sovet imperiyasında təlatümlər başlamışdı. Qarabağ iddiasına düşən ermənilər bu nəhəng imperiyanı Sov.İKP-nin yeni rüşvətxor rəhbəri "Mişa konvertik"in – Mixail Sergeyeviç Qorbaçovun sayəsində əllərində oyuncağa çevirmişdilər. Onun hesabına SSRİ-də hansı məsələyə müraciət olunurdusa, oradan ən azı bir-neçə erməni çıxırdı. Şahnazaryan, Aqanbekyan, Qdlyan, Primakov (ana xətti ilə)... və başqaları vaxtilə dünyaya meydan oxumuş bu dövləti yerdə sürüyürdülər. Açıq hiss olunurdu ki, Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi məsələsi artıq həll olunub. Bu da öz növbəsində ölkədə xalq hərəkatının genişlənməsinə səbəb oldu. Azərbaycan Respublikasında Vətənin bütövlüyünü qorumaq xatirinə bir sıra adlar altında ziyalılardan və gənclərdən ibarət müstəqil qurumlar yarandı və bir müddət sonra bunların bir qismi Azərbaycan Xalq Cəbhəsi adı altında birləşdilər. Bizim İnstitutda da bu cəbhənin özəyi yaradıldı və paralel olaraq həm bizim dilimizdə, həm də rusca həftəlik "Azərbaycan" adlı ictimai-siyasi-tarixi məcmuənin nəşrinə başlanıldı. İnstitutun vətənpərvər əməkdaşları böyüklü-kiçikli bu məcmuənin hazırlanması və nəşri üçün əllərindən gələni edirdilər. Təkcə onu demək kifayətdir ki, məcmuənin yayım dairəsi Vladivostokdan Riqaya və Praqaya qədər geniş bir sahəni əhatə edirdi.

Məcmuənin Azərbaycan dilindəki nəşrinin 11-ci sayında (29 noyabr 1989-cu il) hörmətli Şahin müəllimin tarixçilərə ünvanlanmış həqiqəti əks etdirən dəyərli tənqidi bir şeiri çap olunmuşdu. Mən bu şeirin indiyədək heç bir yerdə çap olunmadığını nəzərə alıb, Şahin müəllim haqqında yazımın sonunda, əlbəttə əgər müəllif özü buna etiraz etməzsə, onu bütünlüklə çap olunmasını istərdim.

Şahin müəllim 1996-cı ildə «Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə» mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş və tarix elmləri doktoru elmi dərəcəsi almış, bir qədər sonra isə geniş aspektli elmi fəaliyyətinə görə professor elmi adına (2004) layiq görülmüşdür.

Şahin müəllimin yaradıcılığı onun təkcə tarixçiliyi və tərcüməçiliyi ilə bitmir. O, həm də gözəl şairdir. Onun bağladığı beş divan dünyada təkdir. Mənim bildiyimə görə hələ bu qədər divan bağlamış şair yoxdur və olmayıb. Şahin müəllimin bədii yaradıcılığı ilə bağlı Qiymət Məhərrəmli 2007-ci ildə "Şahin Fazil "Divan"ı və klassik ədəbi ənənələr" adlı elmi-tədqiqat işi yazıb və dissertasiya müdafiə edib.

Şahin müəllim doğulub boya-başa çatdığı Qubanın tarixi ilə bağlı gözəl kitablar da yazıb. Bir sözlə, Şahin müəllim hərtərəfli inkişaf etmiş nadir istedadlı, millətin üzünü ağ edən şəxsiyyətlərdən biridir. Onun yaradıcılığı

cavanlığından yetkinliyinədək millətə xidmət üçün olub. Şəxsən mən inanmaq istəyirəm ki, Şahin müəllim hələ neçə divan da bundan sonra yazacaq.

Şahin müəllimin istedadı tərcümə sahəsində də özünü göstərir. Azərbaycanın məşhur tarixçiləri Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" ("Tarixlərun ən yaxşısı") və İsgəndər bəy Münşinin "Tarixe-aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") əsərlərini ilk dəfə olaraq bütünlüklə dilimizə tərcümə etmişdir. Tərcümə edib demək asandır. Ancaq bu kitabların hərəsinin neçə min səhifədən ibarət olduğunu düşünəndə adamı qara basır. Şahin müəllimin tərcüməçiliyindən danışanda Jozef Tiflisinin "Vaqeati-Mir Veys və Şah Sultan Hüseyn", Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarixi" kimi dəyərli mənbələrin orijinaldan tərcüməsini də mütləq qeyd etmək lazımdır. Var olasınız, Şahin müəllim.

Şahin müəllim hazırda Tarix İnstitutunda "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri vəzifəsində fəaliyyət göstərir.

O, vaxtaşırı yaxın və uzaq xarici ölkələrdə keçirilən beynəlxalq elmi konfranslarda iştirak və doğma Azərbaycanın orta əsrlər tarixinə dair məruzələrlə çıxış edir, tariximizi təbliğ edir. Şahin müəllim bir çox topluların, kollektiv monoqrafiyaların, ensiklopedik nəşrlərin də həmmüəllifidir.

Şahin müəllimin universitetlərdəki pedaqoji fəaliyyəti də təqdirəlayiqdir. O, Bakı Dövlət Universiteti, Sumqayıt Dövlət Universiteti, Lənkəran Dövlət Universiteti və daha haralarda mühazirələr oxumamışdur!..

Şahin müəllim İnstitutun Elmi Şurasının və İnstitut nəzdində fəaliyyət göstərən Dissertasiya Şurasının da üzvüdür. O, bir çox gənc kadrların yetişdirilməsində milli tariximizə öz töhfəsini vermişdir. Bir sözlə, Şahin müəllim haqqında yazmaq və danışmaq üçün saatlar yox, günlər və həftələr lazımdır. Mən Şahin müəllimə yenə də çoooox, laaaaap çox böyük yaradıcılıq imkanları arzu edirəm!!

Indi isə onun "Tarixçilərə" adlı şeiri. Hörmətlə, tələbəniz Elmar Məhərrəmov:

### TARİXÇİLƏRƏ

Biz harda axtaraq sədəfi indi,
Dəniz bulanıqdır, a tarixçilər.
Sizsiniz oxumun hədəfi indi,
Sizə tuşlanan ox mənə də dəyər.

Tutmuşuq ilbəil iş planları,
Planda əks olub "igidliyimiz".

Tərif eləmişik ağ yalanları,
Təhrif eləmişik gerçəkliyi biz.

Yazmışıq, pozmuşuq nə qədər hədər,
Demişik "bahardır", görmüşük qışdır.
Bizim durğunluqda indiyə qədər
Bizim təqsirimiz az olmamışdır.

Kimə ki yapıldı "kommunist" adı
Tərifləmişik.
Tərifə ehtiyac oldu-olmadı
Tərifləmişik.
Qorxaq "qəhrəmanı" ata mindirib
Tərifləmişik.
Göy dəniz suyunu nöyütləndirib
Tərifləmişik.
"Zavodlar, mədənlər, fabriklər gərək".
Tərifləmişik.
Havanı tüstüylə zəhərləyərək
Tərifləmişik.
Düz işə pəl vuran bürokratları
Tərifləmişik.
Əl çalan, əl vuran bürokratları
Tərifləmişik.
Heç nə anlamayan çox anlamazı
Tərifləmişik.
Neçə rüşvətxoru, vəzifəbazı
Tərifləmişik.
Qondarma planlar, saxta planlar...
Tərifləmişik.
Bizim evimizi yıxdı yalanlar,
Tərifləmişik.
Guya hər qarış yer "gülüstan" olub,
Tərifləmişik.
Beşillik planlar kəsirlə dolub,
Tərifləmişik.
Guya hər elmimiz "tüğyan eləyib",
Tərifləmişik.

Tərif işimizə ziyan eləyib,
Təriflərmişik.
Sınaqdan çıxmayan neçə "izm"i də
Təriflərmişik.
"İnkişaf eləmiş sosializmi" də
Təriflərmişik.
Gah nala döymüşük, gah da ki, mıxa,
Təriflərmişik.
Yaman öyrənmişik sitatçılığa,
Təriflərmişik.
Meydanda, küçədə, döngədə şüar,
Təriflərmişik.
Şüarın sayı yox, qarışqanın var,
Təriflərmişik...

Bəli, məddahların məddahı bizik,
Nə qədər məqalə-filan yazmışıq.
Ağ kağız üstündə tələm-tələsik
Qırmızı rəng ilə yalan yazmışıq

Bizim cəmiyyətdə, bəllidir ki, bu
Uğur da çox olub, qələbələr də.
Həyata keçibdir nə qədər arzu
Əzmimiz nəqş olub neçə zəfərdə.

Amma, haray salıb neçə göstəriş,
Fərmanlar yağış tək səpələnibdir.
Çox uğurlu addım, çox uğurlu iş
Uğursuz qələmlə ləkələnibdir.

Tərif xəstəliyi çox qəddi əyib,
Fəlakət gətirib neçə nəfərə.
Birinci addımı çox tərifləyib
İkinci addımda dəymişik yerə.

Yazmışıq, pozmuşuq, nə qədər hədər,
Demişik "bahardır",görmüşük qışdır.
Bizim durğunluqda indiyə qədər
Bizim təqsirimiz az olmamışdır.

**Yaşar ƏLİYEV**
*AMEA-nın Fəlsəfə, Sosiologiya və Hüquq İnstitutunun şöbə müdiri, Fəlsəfə doktoru, Azərbaycanın fəxri prokuroru*

## ŞAHİN FAZİL HAQQINDA BİR NEÇƏ SÖZ

Yaxın keçmişdə əziz və çox hörmətli dostlarım Xudu Məmmədov, Bəxtiyar Vahabzadə və Nurəddin Rzayevlə oturub dərdləşir, milli mentalitetimizdən, dəyərlərimizdən, bizi duyğulandıran, narahat edən dərdi-sərimizdən söhbət edirdik. Belə bir sual yarandı ki, yaxşı deyirik ki, türklər bizim qardaşımızdır, bəs İrandakı azərbaycanlılar nəyimizdir?

Xudu Məmmədov özünəməxsus təbəssüm və məntiqlə dedi ki, türklər bizim qardaşımızdır, İrandakı azərbaycanlılar isə elə biz özümüzük. Aforizimə bənzər bu söz mənim yaddaşıma həmişəlik həkk olundu.

Son vaxtlar İranla bağlı mövzular, söhbətlər, siyasi və ictimai fikirlər müxtəlif olduğu qədər də anlaşılmazlıq yaratmışdır.

Etiraf edirəm ki, İranı mənə tanıtdıran, onu mənə yaxın və doğma edən əziz dostum, dəyərli tarixçi alim, professor şərqşünas Şahin Fazil olub. Yaxınlarda onunla görüşdük. Yenicə işıq üzü görmüş "İran səfərnamələri" kitabını mənə verdi. Iyirmi üç dəfə İrana səfər edən şairin bu ölkədəki insanlarla tarixi, ictimai, siyasi və ədəbi görüşlərindən bəhs edən bu kitabın özünəməxsus maraqlı məqamları vardır. Kitabda Türkiyə, İran, Azərbaycan və başqa dünya ölkələrinin görkəmli alimləri, yazıçı, şair və ictimai xadimlərinin adı çəkilir, onların yaradıcılığı barədə maraqlı misallar göstərilir, demək olar ki, İranın bütün şəhər və vilayətlərinin İran tarixindən olduqca zəngin tarixi keçmişindən danışılır. Olaylar, rəvayətlər və faktlar elə səlis və dolğun surətdə oxucuya çatdırılır ki, kitabı oxuyandan sonra elə bilirsən ki, sən özün bir-bir həmin şəhər və vilayətləri gəzmisən. Ümümiyyətlə, "İran səfərnamələri" kitabı qeyd etdiyim məlumatlar sarıdan ən dəyərli bir kitabdır.

Lakin mən oxuculara kitabın digər bir məziyyətindən, dəyərindən, Şahin Fazilin qələmə aldığı şeir dünyasından danışmağı özümə borc bildim.

Ümümiyyətlə, Şahin Fazilin yaradıcılığı ilə hər bir görüş yaddaşıma elə həkk olunur ki, onun təsirindən heç vaxt qutara bilmirəm. Qə-

zəlləri və başqa şeirləri məndə yeni hisslər, yeni duyğular yaradır, həyat eşqimi artırır, dünyamı mənalandırır.

*"Uçdu,*
*Zəri qaldı əlimdə,*
*Zər borcluyam kəpənəyə"*

Bu adi **Azərbaycan haykusu** olsa da, nə qədər gözəldir.

*"Üzümə ləkə düşdü,*
*Ürəyimdən qorxuram,*
*Ey ləkə",*

sözləri ürəyi, vicdanı kimi təmiz olan şairin həyat kredosudur.

Şahin Fazil olduqca səmimi şairdir. Nadir hallarda, ildə bir dəfə də olsa kiçik bir səhvə yol verəndə də günahını boyununa alan, utanan, onu özünə dərd edən insandır.

*Gəldi kədər, cumdu qəm,*
*Gözlərimi tutdu nəm.*
*Özüm öz gunahımı*
*Bağışlaya bilmirəm,*
*Allah bağışla məni,*
*Allah bağışla məni!!!*

Çox gözəldir, deyilmi əziz oxucu? Başqa bir şeirində *"Qaçmaq da igidlikdəndir, qaçım səhvimdən",* deməklə bizi duyğulandırır.

Şahin Fazil üçün mövzu qıtlığı yoxdur. Kabulda tüfənginin lüləsinə gül taxmış bir əsgər görən şair elə o andaca üzünü əsgərə:

*"Lülə dibçək olub bir qızəlgülə,*
*A şair, seyr elə bu mənzərəni.*
*Xeyir, seyr eləmə, bunu vəsf elə,*
*Qoy bu hal ilhama gətirsin səni".*

Rəssama:

*"A rəssam, yaxın gəl, bu lövhəni çək,*
*Gülün necə böyük ecazı varmış.*

*Qızılgül nəinki güldana bəzək,*
*Hətta tüfəngə də bəzək olarmış".*

Bəstəkara:

*"Aç not dəftərini, a bəstəkar, sən,*
*Belə gözəl mövzu düşərmi ələ?*
*Bəşəri zövq alıb güllü tüfəngdən*
*"Gül və tüfəng" adlı nəğmə bəstələ",*

deməklə onlara mövzu verir. Şair bu şeiri ilə bütün insanları bəşəri bir humanizmlə sülhə, əminamanlığa çağırır:

*"Car çəkək, aləmə bildirək bunu.*
*Üzməsin canını atəş heç kəsin.*
*O qədər tıxasın güllər yolunu,*
*Güllələr lülədən çıxa bilməsin".*

Şahin haqqında yazılarımın birində onun Qarabağla bağlı yüzdən artıq şeir yazdığını və hər birinin yüksək səviyyəli, poetik ruhlu olduğunu demişəm.Qarabağ dərdimizi heç vaxt unutmayan şair dostum "İran səfərnamələri" kitabında da öz əhdinə sadiq qalmış, Qarabağımızı belə yad edir:

*İtirdim Qarabağı*
*Indi gəz, ara bağı...*
*Ey Koroğlu papağı,*
*Papağıma nə oldu?*
*O bağımdı, o dağım,*
*Hərəsi dağım-dağım...*
*Şuşa, hanı ocağım,*
*Ocağıma nə oldu?...*

Kitabda çoxlu sayda qəzəllər vardır. Bu qəzəlləri oxuduqca ürəyim fərəh hissilə dolur, Azərbaycan türkcəsində yazılmış bu qəzəllər, qürur hissimizi bir daha artırır. Şahin Fazil yaradıcılığının ən dəyərli cəhəti odur ki, o, qələmə aldığı bütün şeirlərini, o cümlədən qəzəllərini bugünki çağdaş Azərbaycan dilində yazır.

Onuncu səfərnaməsində şair yazır: "Kaş hamının fərəhi sevinc ilə qoşa dayana, dərdi bir yana, kədəri isə bir başqa yana gedə. Otağımda

təkəm. Bakını və dostlarımı xatırladım. Tofiq Cahangirov yadıma düşdü. Gözəl fars dili mütəxəssisidir. Əruz ədəbiyyatını sevir, qəzəl yazmaqda mənim mövqeyimi müdafiə edir. Mövqe isə belədir: Bu günün Azərbaycan qəzəli bu günün dilində də yazılmalıdır! Bu gün Füzulinin , Seyid Əzimin, lap Vahidin də ərəb-fars sözlərindən bəhrələndikləri şeir dilindən qaçmaq və xəlqi qəzəl yazmaq lazımdır. Yazıq canım, neçə illərdir ki, bu yolda qələm işlədirəm, amma əleyhdarlarım çoxdur”...

Sonda bu fikrimin təsdiqi üçün Şahin Fazilin bir qəzəlini oxuculara təqdim edirəm:

*Necə işdir ki, bizi çərx müdam aldatdı,*
*Məni saqi, səni mey, saqini cam aldatdı.*

*Əyrini əyri yolundan düzə çəkmək—müşkil,*
*Amma, düzlük gəzəni əyri adam aldatdı.*

*Hər haram iş görənin qanı halal olmalıdır,*
*Bir də gördün halalı gəldi haram aldatdı.*

*Huri xoşdursa da, yox qılmana rəğbət məndə,*
*Qəznəvi Mahmudu bir adi qulam aldatdı.*

*Istədim güclü şeir yazmağı,heyfa ki, məni*
*Fars şeirində olan nəzmü nizam aldatdı.*

*Əqlini vermə əlindən, ayıq ol, ey Leyli,*
*Bir də gördün ki, səni İbni-Salam aldatdı.*

*Şahinin şeiri də irfaniləşir, ey Xəyyam,*
*Məni saqi, səni mey, saqini cam aldatdı.*

Əziz dostum, qardaşım Şahin! Bir daha “İran səfərnamələri” kitabının nəşri ilə əlaqədar səni ürəkdən təbrik edir, uzun, sağlam və mənalı ömür, yeni-yeni yaradıcılıq uğurları arzulayıram.

**Əzizağa ELSEVƏR**
*Tarix üzrə fəlsəfə doktoru, yazıçı*

## "DƏRVİŞ GÖRÜNÜŞLÜ ADAM..."

İstedadlı yazıçı Əlibala Hacızadənin məslək, əqidə, inam dostu Şahin Fazil haqqında dediyi bu kəlamla yazıya başlamağım təsadüfi deyil. Çünki ikisi də şərqşünas, alim, ədəbiyyatımızın haqqı ödənilməyən " qara fəhləsi" və ikisi də Əfqanıstanın odundan- alovundan keçib gəlmiş əzabkeşlərdir. Dostluqları, qardaşlıqları da səngər dostluğu, qardaşlığı qədər möhkəm, sarsılmazdır. Əlibala müəllim haqq dünyasına qovuşsa da, Şahin müəllimin timsalında elə o dostluqlarının işığında da yaşadığını düşünürəm, görürəm. Taledən qismətimə yazılan o da xoş bir qazancdır ki, bu böyük şəxsiyyətlərin çoxsaylı görüşlərinin müəyyən qisminin şahidi olmuş, onlardan çox şey öyrənib, çox da faydalanmışam. Onların hər ikisi yaşca məndən böyük olsalar da, heç vaxt o fərqi hiss etdirməmiş, sadəlik və səmimiyyət dolu baxışlarında ən gözəl duyğu və düşüncələrə yol açan ovqat yaratmışlar.

Zamanın insanları sınağa çəkdiyi, sözün təsir gücünün azaldığı, qələmin nüfuzdan düşdüyü, Əlibala müəllim demişkən: " Kitabın kitabının bağlandığı vaxt" o, heç də biganələr kimi, " mənə qəzəl oxuma!" yox, tez-tez: " Şahin, bir qəzəl oxu!"-deyər, Şahin Fazilə " dərviş görünüşlü ağsaqqal" kimi baxardı. Şahin müəllimdən söz düşəndə, heç vaxt barmaqları arasından siqareti əskik olmayan yazıçı sümürdüyü siqaretin tüstüsünü əlləri ilə yüngülcə qova-qova: " Onun içində haqdan gəlmə bir işıq, alicənablıq var!"- söylərdi.

Dərvişlik bir müdriklik, haqsızlığa, laqeydliyə, biganəliyə qarşı etiraz və daxili dünyasına baş qoyaraq öz doğma hissləri ilə tək-tənha yaşamaqdır. Öz oduna alışıb, öz oduna yanmaqdır. Sonra o odlar-alovlar içindən sıyrılıb, müqəddəs, əbədiyaşar, əfsanəvi Simurq quşu kimi doğulub yenidən dünyaya gəlməkdir.

İnsan taleyinə yazılan hər tanışlıq hələ dostluq deyil. Dostluq- inam, əqidə, ikinci məndir. Şahin Fazillə ilk tanışlığım yaxşı yadımdadır. 1984-cü ilin noyabr ayının son günləri idi. Sanki, ılıq bir payız havası tökülən qızılı-çəhrayı yarpaqların, səmada qatarlanıb uçan durnaların həsrətinə köklənmişdi. "Məhsul bayramları", çal- çağır qəribə bir ovqat yaratmışdı. Elə bil ki, həqiqətin səsi boş xəyallar, boş gurultular içində itib- batmışdı. "Azərbaycan qadını" jurnalının baş redaktorunun müavini Svetlana xanım Nə-

cəfovanın qapısı ağzında 11-ci saydakı səhifələri vərəqləyirdik. Tanış olduq. Həmin sayda mənim " Payız neyləsin" hekayəm və onun iki şeiri (" Məktub" və "Qızlarımın anasına" ) çap olunmuşdu. Düzü, " Məktub" şeiri məni bərk tutmuşdu. Üç ay idi ki, şəhərə gəlmişdim, işim də pis deyildi. " Elm" nəşriyyatında redaktor işləyirdim. Mühit ziyalı mühiti idi, hər tanışlıq müsbət bir yenilik vəd edirdi. Ancaq kənd havası, neçə il dərs dediyim məktəb, deyib-güldüyüm insanlar, təqaüd yaşında olan valideyinlərim yadımdan çıxmırdı. Rəngli kino lenti kimi hər gün yuxularımdan keçib gedirdilər. Üç bəndlik şeir elə bil ovqatıma biçilmişdi. Kiçik həcmində böyük məna tutumu vardı. Şair qəlbən o hissləri yaşamış və o hissin kövrəklik yükünü misra-misra varlığımıza köçürtmüşdü:

*Çoxdan görünmürsən bu yerlərdə sən,*
*A bala, evimiz sənsiz darıxıb.*
*Həmişə yolunu gözlədiyimdən*
*Gözüm hey yol çəkib, yoluna baxıb.*

Beləcə, Şahin Fazillə təsadüfdən doğan tanışlığımız dostluğa çevrildi. 1990-cı ildə onun nəşriyyatımızda çap olunan " Qəzəllər" kitabının da nəşriyyat redaktoru oldum. Mən ondakı sədaqətə, etibara, təmənnasızlığa, səmimiyyətə vuruldum. Çoxçalarlı, çoxsahəli yaradıcılığını ardıcıl izləməyə başladım. Anladım ki, təbiətən sakit görünən Şahin müəllim, daxilən narahat bir ömür yaşayır. Ağlı, qaralı dünya elə bil ki, bütün dərdləriylə onun içindən keçib gedir. Əslinə baxanda, əsil ziyalı, şair o dərdləri içinə hopdurub, xalqının ağrı-acısıyla yaşamalı, sevinci, fərəhiylə ucalmalıdır. Məgər heç xalqdan, eldən də ayrı ömür-gün olarmı?!

Şair elə özü narahatlıq içində keçən ömrünü xalq şairi Bəxtiyar Vahabzadəyə ithaf etdiyi " Həmişə narahat" şeirində çox gözəl ifadə etmişdir:

*"Yaman narahatsan" mənə deyirlər,*
*A belə deyənlər, başa düşün bir,*
*Narahat deyilsə hər ürək əgər*
*Bir daş parçasıdır, ürək deyildir.*

*Yoxdur rahatlığı bircə anımın,*
*Neyləyim, rahatlıq məndən ötüşüb.*

*Mənim yaranmağım yaradanımın*
*Büsbütün narahat vaxtına düşüb.*

*Bəli, müharibə qızmışdı yaman,*
*Göylər yerə heyran, yerə mat idi.*
*Fəlakət, müsibət, qırğın, ah-aman...*
*Onda bütün cahan narahat idi.*

*Narahat yaşadıq o illəri biz,*
*Hər il ürəyimdə dərin iz salıb.*
*Bir də dəyişilməz şəksiz-şübhəsiz,*
*Məndə narahatlıq ömürlük qalıb.*

*Söyləyirlər mənə hələ cavanam,*
*Gərək, bu vərdişi, hissi atam mən.*
*Amma, bilməyirlər hey nigaranam,*
*Hətta yuxuda da narahatam mən.*

*Sakitlik nədədir, rahatlıq nədir?*
*Vallah təəccübəm buna, matam mən.*
*Gecə də, gündüz də, axşam da fikir,*
*Həmişə beləcə narahatam mən.*

*Rahatlıq verməyən narahatlığın*
*Bir gün zirvəsinə gərək çatam mən.*
*Rahat günlərimi ömrümdən çıxın,*
*Narahat Şahinəm, narahatam mən.*

*Görsəm bir nəfərin ağrıyır başı*
*O saat ürəyim üzülür mənim.*
*Birinin üzündən axan göz yaşı*
*Elə bil gözümdən süzülür mənim.*

*Bədxah hər əməli sayqactək sayır,*
*Bu halda ürəyin nə rahatlığı?*
*Məni bir an belə sakit qoymayır*
*Yetim balaların narahatlığı.*

*Əgər inandığım kələk gəlirsə*
*Dünya gözlərimdə qaralır o dəm.*
*Qonşudan vay səsi eşidilirsə*
*Elə bil ölüyəm, diri deyiləm.*

*Yaman sınamışam, deyim eşidin,*
*Bu sözüm çoxuna təəccüb gəlir.*
*Mən rahat olanda dolaşır işim,*
*Narahat olanda dərhal düzəlir.*

*Belə olmasaydım, doğmaya-yada*
*Hey gərək olmağa cəhd eləməzdim.*
*Arabir olsa da, hərdən olsa da*
*Gözəl insanlara şeir deməzdim.*

*Belə olmasaydım, söz sahilində*
*Arxayın-arxayın yatıb qalardım.*
*Ömür axınında, həyat selində*
*Vurnuxub qalardım, batıb qalardım.*

*Deməyin əbəsdir həmin vərdişim,*
*Başqadır könlümün səsi, sorağı,*
*Rahatlanmayınca hər hansı işim*
*Narahat olmaya bilmirəm axı.*

*Hələ baş tutmayan arzum, diləyim*
*Bir deyil, beş deyil, yığım-yığımdır.*
*Narahat olmayım necə eləyim?*
*Narahatlıq mənim rahatlığımdır!*

Şair Şahin Fazil dilimizin vurğunu, təəssübkeşi, cəfakeşidir. O, qəzəlxanlarımızı təqlid yolunu tutaraq, klassik şairləri yamsılamasını onlara bağışlaya bilmir, xəlqi şeirlər yazmağa çağırır. Bu barədə 1999-cu il aprelin 22-də "Mister-X" qəzeti üçün Z. Məhəmmədoğlu ilə birgə götürdüyümüz " Məni üzmüş bu inadkar qəzəlxanlarımız..." sərlövhəli müsahibəsində Şahin müəllim demişdir: " Bu gün yaranan bir çox qəzəllərin qəliz sözlərini ərəb, fars dilindən xəbəri olmayan ən savadlı adam belə anlamır. Belə olan halda,

qəzəl yazarkən misralara süst ilham yapışqanı ilə anlaşılmaz sözlər yapışdırmağa, milli qəzəl gülüstanımızı alaqla doldurmağa ehtiyac varmı?..."

Ş. Fazilin niyyəti, özünün dediyi kimi, " qəzəl meydanında bügünkü dilimizin imkanlarını sınamaqdır." Buna görə də epiqonçu, mühafizəkar qəzəlxanların xoşlarına gəlməsə də, ədəbi-bədii yaradıcılıq istiqamətində mübarizə apamaqla yanaşı, müasir qəzəlin necə yazılması barədə öz fikrini, mövqeyini açıq-aydın onlara bildirməkdədir.

Şair Ş.Fazilin odlu-alovlu poeziyası təpədən-dırnağa qədər böyük vətənpərvərlik yanğısı ilə köklənmişdir. O, yurdumuzun ictimai- siyasi həyatında cərəyan edən hər bir hadisələrə həssaslıqla yanaşır, xalqımızın başına gətirilən müsibətləri ürək ağrısı ilə qələmə alır. Əfqanıstanda mütərcim kimi fəaliyyət göstərdiyi 13 il ərzində şahidi olduğu əfqan xalqının yaşadığı faciələrin Azərbaycanda da təkrarlanmasını istəmir. Qarabağda müharibə ocağının təzə-təzə çatıldığı zaman fəsadlarını sanki qabaqcadan görür və həyacan təbili çalaraq yazırdı:

*Ya ilahi, öylə et yurdumda əfğan olmasın,*
*Qoy mənim Azər diyarım Əfqanıstan olmasın.*

Şair şeirdə " Əfqanıstan" və " Əf + qanıstan" sözlərini qarşılaşdırmaqla, oxucuda insani heyrət yaradır. Yurdumuzun " ah-fəğan yurdu"na ( "əfğanıstana") çevrilməməsi üçün Allahlıq eşqinə düşən böyük qaniçən rəhbərlərdən yox, Uca Tanrıdan mərhəmət umur, kömək diləyir.

"Vətən döyülür" də əzilən, tapdanan Vətənin harayına getməyə, damarlarda kükrəyən qeyrət dalğasını tüğyana gətirməklə, köməyə qalxmağa çağırır:

*Ürəyim dəmadəm gəlir fəryada,*
*Nə qədər torpağı vermişik bada!..*
*Adam döyüləndə yetirik dada,*
*Niyə dayanmışıq, Vətən döyülür.*

Şahin Fazil narahat bir şair ömrü yaşayır. O, irili-xırdalı əsərlərində, dolaylı- qolaylı həyat yollarında yorulub, usanmadan özünü axtarır. Siqlətdə böyük, mənada dərin mətləblər içində bir fazillik tapmaq istəyir. Min illərlə durula-durula gələn poeziyamızın əngin səmasında şahin kimi süz-

mək üçün. İlk çap işi olan "Qızbənövşə" ( 1958) şeiri ilə şeiriyyətə vurulmuş, bu yolun qız bakirəliyi qədər təmiz, bənövşə gözəlliyi qədər qənirsizliyinə heyranlıq gətirmişdir. Bu, onda onun onuncu sinifdə oxuduğu, fərəhindən yerə-göyə sığmadığı vaxtlar idi. Zarafat deyildi, "Qızbənövşə"si Qubada çıxan "Qızıl Quba" qəzetində çap olunmuşdu. Ömürdən keçən illər yaşının üstünə yaş qoyduqca ümidləri pöhrələndi, arzuları çiçəkləndi. Şahin Fərzəliyev Şahin Fazil oldu. Kiməsə oxşamağa, kimisə təqlid etməyə can atmadı, öz yolu ilə böyük məqsədinə, amalına doğru yol keçdi. Heç vaxt rahatlığa uymadı, ötəri bir şöhrətin, həvəsin əsiri olmadı, boğazdan yuxarı kiməsə tərif deyib, quru ad, quru təltif gözləmədi. Onun üçün ən böyük mükafat çoxsaylı oxucularının qəlbinə yol tapmaq və onların sevgisini qazanmaq oldu. Sözün ilahi qüdrətinə sığınıb, gözəllik səltənətinə öz payını verdi. Lirik şeirləri ilə qəlbləri oxşadı, beş " Divan" bağladı, ondan çox şeirinə bəstələnmiş mahnılar sərhəd tanımadı, ekran, efirləri dolaşdı.Şahin Fazil klassik və müasir ədəbiyyatda indiyə kimi olmayan "Qırxnamə" elegiyası yaratmışdır. Onun "Qırxnamə. Yaxud qırx şeirdən ibarət Elegiya" şeirlər kitabını ədəbiyyatımızda, sözün həqiqi mənasında, ədəbi hadisə hesab edə bilərik. 2001-ci ildə vəfalı həyat yoldaşını itirən şair tənhalığın qırx günündə çəkdiyi əzabları və ağrıları bədii sözə çevirərək içində dolaşan duyğulara iman işığı gətirir.

"Qırxnamə"ni şair Əli Rza Xələfli " İztirabların inikası ", jurnalist Rafiq Əliyev isə " Ədəbi hadisə" adlandırmışdır. Şair Ş. Fazil özü bu barədə belə yazmışdır: " Mən ədəbi janrların çoxunda şeir yazmışam, elegiyadan başqa. Təəssüf ki, qismətimə elegiya yazmaq da düşdü. Mərsiyə tərzində yazılmış şeir, həm də həzin musiqi təsiri bağışlayır. Müasir şeirimizdə elegiya janrına müraciət edənlər az olub. " Qırxnamə" yazan isə olmayıb, desəm, zənnimcə, yanılmaram." Həmçinin " İlnamə" şeirlər toplusunda şairin ömür-gün yoldaşının ölümündən sonra keçən bir il ərzində yaşadığı iztirabların, çəkdiyi ağrı - acıların poetik təsviri öz əksini tapmışdır.

Şair Ş. Fazil artıq 22 ildir ki, bu gün 140 yaşlı " Məcməüş- şüəra" ( "Şairlər məclisi") tarixi ədəbi məclisinin sədridir. Klassik ədəbi ənənələrimizin mənəvi daşıyıcısı olan məclis öz sıralarında ədəbi-mədəni irsimizin ləyaqətli davamçıları olan istedadlı qələm sahiblərini və ədəbiyyatımızın inkişafına töhfələr verməyə səy göstərən dəyərli ziyalılarımızı birləşdirir.

Şair Ş. Fazilin ədəbi yaradıcılığını elmi cəhətdən ətraflı araşdıran tədqiqatçı- Azərbaycan MEA M. Füzuli adına Əlyazmalar İnstitutunun elmi işçisi Qiymət Məhərrəmli "Şahin Fazil " Divan"ı və klassik ədəbi ənənələr"

mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş və həmin elmi iş 2007-ci ildə monoqrafiya şəklində çap olunaraq, geniş oxucu kütləsinin diqqətinə verilmişdir.

Ş. Fazil 1999-2000-ci illərdə İraq ölkəsində keçirilən " əl-Mərbid" şeir festivallarında iştirak etmiş, çoxlu sayda şeirləri xarici ölkələrin mətbuatlarında işıq üzü görmüşdür.

Şahin Fazil istedadlı tarixçidir. Öz sağlam iradəsi, mövqeyi ilə seçilən, mənbələrin dilini bilən tarixçi. Öz milli varlığına köklənib, öz milli ruhu ilə torpağına, xalqına bağlı olan tarixçi. Poeziyasından, yüksək vətəndaşlıq mövqeyindən qaynayıb gələn vətənpərvər, böyük tarixçi. O, Azərbaycanın orta əsrlər dövründən bəhs edən " Azərbaycan və Osmanlı imperiyası ( XV- XVI əsrlərdə)", " XV əsr Azərbaycan dövlətlərinin quruluşu" monoqrafiyalarının, Qubanın IV-XXI əsrləri əhatə edən tarixinin tədqiqinə həsr olunmuş "Quba tarixi" adlı sanballı tədqiqat əsərinin müəllifidir.

Yuxarıda qeyd olunduğu kimi, 1998-ci ildən " Məcməüş-şüəra"nın ( "Şairlər məclisi") sədri olan Ş. Fazil bu ədəbi məclisin tarixini yazaraq, " Təzkireyi- Şahin" adı ilə 2006-cı ildə kitab halında nəşr etdirmişdir.

Ş. Fazil tariximizin müxtəlif problemlərinə həsr edilmiş çoxsaylı məqalələrin müəllifidir. O, istər Azərbaycanda, istərsə də xaricdə ( Moskva, Ankara, İstanbul, Daşkənd, Təbriz, Mahaçqala, Yaponiya, Kipr Respublikası, Polşa və s.) keçirilən beynəlxalq elmi konfrans və görüşlərdə fəal iştirak etməklə, tarix elmimizi ləyaqətlə təmsil etmişdir.

Xatırladırıq ki, 2009-cu ildə Yaponiyanın Sinday Universitetinin dəvəti ilə həmin ölkədə səfərdə olan alim Sinday və Tokio şəhərlərində "XX əsr Azərbaycan milli tarixşünaslığı: tarixi təcrübə və müasir vəziyyət" adlı məruzə ilə çıxış etmiş, "Azərbaycan haykuları" kitabındakı 20-dək şe′ri yapon dilində mətbuatda çap edilmişdir.

Tarix üzrə elmlər doktoru, professor Ş. Fazil şərqşünas alim kimi son vaxtlar tərcüməçilik fəaliyyətini də genişləndirməklə iki böyük Azərbaycan tarixçisinin- İskəndər bəy Münşi və Həsən bəy Rumlunun fars dilində yazdıqları iki böyük əsərlərini doğma dilimizə çevirmişdir. O, həmin əsərləri təkcə tərcümə etməklə kifayətlənməmiş, həmçinin onlara geniş "Ön söz" və sanballı şərhlər də yazmışdır.

Əhəmiyyətli tarixi mənbə olan İsgəndər bəy Münşinin " Tarixe- aləmareye- Abbasi" ( " Dünyanı bəzəyən Abbasın tarixi") əsəri 2505 səhifədən ibarət olub, 2010 və 2014-cü illərdə çap edilmişdir.

Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" ( "Tarixlərin ən yaxşısı" )

əsərinin tərcüməsi başa çatmı və onlar nəşriyyata verilmişdir.

Hər iki əsər Azərbaycan Səfəvilər dövlətinin tarixi üçün çox mühüm və əhəmiyyətli mənbə rolunu oynamaqdadır. Tərcümə ustalıqla həyata keçirilmiş, elmi ictimaiyyatın marağına səbəb olmuşdur.

Ş. Fazil bu əsərlərdən başqa Jozef Tiflisinin " Mir Veys və Şah Sultan Hüseyn" və Yan Tadeuş Krişinskinin " Xristian səyyahın tarixi" əsərlərini də dilimizə çevirmişdir.

Tərcümə yaradıcılıq işi olmaqla bərabər, həm də tərcüməçidən ciddi hazırlıq və məsuliyyət tələb edir. Tərcümə prosesində bacarıqla, istedad üst-üstə düşürsə, orijinal qazanır. Sevindirici hal odur ki, Ş. Fazil dilimizin bütün imkanlarından geniş və məharətlə istifadə etməklə, həmin mənbələri oxucuların, tədqiqatçıların diqqətinə çatdırmışdır.

Ş. Fazil çoxsaylı "Səfərnamələr" müəllifidir. Sanki:" yüz dəfə eşitməkdənsə, bir dəfə görmək hamısından yaxşıdır!" prinsipi, xalq deyimi onun həyat idealına, kredosuna çevrilmişdir. (osmanlı və fars dillərində) Səfərlər öyrənmək, yeniləşmək, zənginləşmək, daha da kamilləşməkdir. "İran səfərnamələri" 30 səfərin 30 səfərnaməsi, " İraq səfərnamələri" ( "Xurma kimi şirin Bağdad" və " Bağdad kimi şirin xurma" ), " Türkiyə səfərnamələri", " Gürcüstan görüşləri", " Dağıstan dəftəri", " Özbəkistan təəssüratları"... Səfərlər bitib tükənmir. Dünya əlvan rəngləriylə şairin yaddaşına köçür, zaman tarix olub kino lenti kimi baxışlarından keçib gedir. Qütblər, iqlimlər arzular önündə kəsişmir, meridianlardan meridianlara səfər yolları uzanır.

Tədqiqatçı-alim Q. Məhərrəmli " Səfərnamələr"in məziyyətlərindən bəhs edərkən yazmışdır: " Səfər xatirələrinə xüsusi oxunaqlıq verən əruz, sərbəst və heca vəznli şeirləridir ki, bunların hər birini şair böyük məhəbbətlə qələmə almış, bir çoxunu həmin ölkələrdəki qələm dostlarına, orada uyuyan dahi söz ustadlarına, qələm sahiblərini ilhama gətirən, yazıb-yaratmağa sövq edən təbiət gözəlliklərinə, saf insani duyğulara, həmçinin səfər yoldaşlarına həsr etmişdir. Təbii ki, tarixçi alim öz səfərlərinin tarixilik baxımından dəyərinə də xüsusi diqqət yetirmiş, Azərbaycanla həmin ölkələrin tarix boyu davam etdirilən dostluq əlaqələrinin daha da möhkəmlənməsinə çalışmışdır."

Tanınmış yazıçı, şərqşünas-alim Ə.Hacızadə: " İran səfərnamələri"nin ayrıca kitab şəklində çapa hazırlanması, mən deyərdim ki, əlamətdar hadisədir, ölkələrarası münasibətlərin daha da genişlənməsinə xidmət edən olduqca faydalı bir addımdır... Kitabı oxuduqca yenə oxumağım gə-

lir, oxumağım gəldikcə yenə oxuyuram...”-demişdir.

Ş. Fazil uzun müddət pedaqoji fəaliyyətlə məşğul olmuş, Bakı Dövlət Universiteti, Sumqayıt Dövlət Universiteti və Lənkaran Dövlət Universitetində bakalavr və magistrlərə mühazirələr oxumuş, diplom və magistr işlərinə rəhbərlik etmişdir.

Professor Ş. Fazilin rəhbərliyi ilə 13 nəfər tədqiqatçı müdafiə edərək tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsinə layiq görülmüşdür. A. A. Bakıxanov adına Tarix İnstitutunda fəaliyyət göstərən İxtisaslaşdırılmış Müdafiə Şurasının üzvüdür. 10-dan çox kitabın elmi redaktoru olmuş, 50-yə yaxın tarix üzrə fəlsəfə doktoru və tarix üzrə elmlər doktoru dissertasiyalarına opponentlik etmişdir.

Tarix İnstitutunun “ Mənbəşünaslıq və tarixşünaslıq” şöbəsinin müdiri, şair, şərqşünas, tərcüməçi, Azərbaycan Yazıçılar Birliyinin üzvü, Əfqanıstanın üç Dövlət medalı, SSRİ-nin Fəxri Fərmanları ilə təltif olunmuş tarix üzrə elmlər doktoru, professor Şahin Fazilin (Ş.F.Fərzəliyev) 38 bədii, elmi və tərcümə kitabları çap edilmişdir.

Şahin Fazil böyük hərflərlə yazılası bir insandır. Xeyirxah, ləyaqətli və qürurlu insan! Bu il martın 27-də mübarək dünyaya gəlişinin 80 illiyi qeyd olunacaq. Sadaladığımız fədakarlıqlar qarşısında 80 il nədir ki?! Zaman anlamına görə bir içim su anı. O illəri bəzəyəsi gör nə qədər işlər görüb Ş. Fazil. Zaman atlı, o piyada, hey yarışıblar. Zamanı əydirib, zamandan pay qoparıb özü olmaq üçün. Gecəsini əridib gündüzünə qatıb, dincəlmək nə olduğunu bilməyib, zəhmət təriylə taleyini naxışlayıb. Halallıq içində poeziya sarayı yaradıb, tarixçi, tərcüməçi, səyyah, müəllim Şahini “ Haqq divanına” çağırıb, həmin saraya naxış vurub, ona bir az da ucalıq, möhtəşəmlik qatıblar. 80 olub, 90-da olacaq, 100 də! Axı Uca Tanrının sevdiyi insanların yaşamağa haqqı var. Mənalı keçən ömür- zirvələrə ucalan, zirvələrdə qocalan qartal ömürlü, qartal qürurlu olur. Şahin Fazilə ucalıq yaraşır, layiq olduğu ucalıq!

*03-04. 02.2020*

**Gülər QAFQAZLI**
*Filologiya üzrə fəlsəfə doktoru*

# "TƏZKİREYİ-ŞAHİN" KİTABI MÜASİR AZƏRBAYCANDA KLASSİK TƏZKİRƏÇİLİYİN DAVAMI KİMİ

"Təzkirə" istilahı əgər ərəb dilində "xatırlamaq", "xatirat" kimi nəzərə çatdırılırsa, məzmunu müxtəlif müəlliflərin həyatı və əsərləri haqqında məlumat verən məcmuə mənasında anlaşılır. Orta əsrlərdə Yaxın Şərq, eləcə də Azərbaycanda geniş yayılmış ədəbi-bədii əsər olan təzkirə, əsasən, ədəbiyyatşünas və tarixçi alimlər tərəfindən yazılır və əlyazma halında yayılırdı. Təzkirələrdə görkəmli şair, yazıçı və alimlərin həyat və yaradıcılıqları haqqında yığcam məlumat və onların əsərlərindən nümunələr verilirdi. Dövlətşah Səmərqəndi, Əlişir Nəvai, Əhdi Bağdadi, Lətifi, Sadiq bəy Əfşar, Lütfəli bəy Azər, Məhəmməd Müctəhidzadə, Mir Möhsün Nəvvab, Seyid Əzim Şirvani, Məhəmmədəli Tərbiyət öz təzkirələni müxtəlif adlarla təqdim etmişlər. Bu müəlliflər sırasında Şah İsmayıl Xətainin ikinci oğlu, atasının sarayında görkəmli alim və şairlərdən təlim-tərbiyə almış Sam Mirzəni də xatırlatmaq vacibdir. O, XV əsrin sonu, XVI əsrin ortalarında yaşamış Azərbaycan və İran şairləri, o cümlədən "qılınc və qələm sahibi" kimi xatırlanan məşhur atası Şah İsmayıl Xətai haqqında ilk məlumat verən şəxsdir və təzkirəsini farsca "Töhfeyi–Sami" ("Samın töhfəsi") adlandırmışdır.

Məlumdur ki, professor Şahin Fazil artıq iyirmi ildir Bakıda fəaliyyət göstərən 140 yaşlı "Məcməüş–şüəra" ("Şairlər məclisi") adlanan tarixi bir məclisə rəhbərlik edir. Bu müddət ərzində Şahin Fazil həmin məclis və onun üzvləri, habelə onların əsərləri haqqında məlumat toplamış, təzkirə yazmış və onu 2006-cı ildə "Təzkireyi-Şahin" adı ilə Bakıda çap etdirmişdir. təzkirənevislikdə özünü Seyid Əzim Şirvani və Mir Möhsün Nəvvabın davamçısı adlandıran Şahin Fazilin əsəri ölkəmizdə yüz ildən çox bir müddət ərzində unudulmuş bir janrın yenidən dirçəlişi kimi qiymətləndirilməlidir.

"Təzkireyi-Şahin" kitabı "Dibaçə" (Ön söz") ilə başlayır və "Xatimə ("Son söz") ilə bitir. Müəllif əsərinin "Ədəbi məclisin tarixi seyri" hissəsində XIX əsrdə Azərbaycanda təşəkkül tapan və ənənəyə uyğun olaraq adlarının əksəriyyəti ərəbcə və farsca olan səkkiz ədəbi məclis, o cümlədən, "Məcməüş–şüəra"nın tarixi haqqında mühüm məlumat ve-

rir, əsas diqqətini XX əsr və XXI əsrin əvvəllərində yaşamış və yaşayan şairlərin həyat və yaradıcılıqlarına yönəldir.

"Təzkireyi-Şahin"in önəmli cəhətlərindən biri də Şah İsmayıl Xətai dövründən başlayaraq lap elə bu günümüzədək Ərdəbil şairləri nəslinin davamçılarından dörd şairin – Seyid Əli Əkbər Ocaqnejadın, Əsgər Şahinin, Mirzə Rəsul İsmayılzadənin (Kamtal) və Adil Mövlayi yaradıcılığının bu kitabda əks etdirilməsidir ki, onlanın hamısı bugünkü "Məcməüş–şüəra" ədəbi məclisinin üzvləri sırasındadır.

Şahin Fazil klassik təzkirəçiliyin müasir davamçısı olsa da, klassik şairlərimizin (məsələn M.Füzulinin, Q.Zakirinin, S.Ə.Şirvaninin, M.Ə,Sabirin və b.) şeir dili ilə şeirlər yazan müasir şairlərlə həmişə mübahisədədir, dilimizin saflığı uğrunda uzun illərdir ki, mübarizə aparır. Mən bu kiçik məqaləmi müəllifin "Təzkireyi-Şahin" kitabındakı bir şeirlə bitirrəm:

MƏŞƏL TUTAN

*"Məşələ işıq üçün təşəkkür et,*
*amma qaranlıqda o məşəl tutanı da unutma"*
***Rabindranat Taqor***

*Oxunur xəlqimizin saf qəzəli,*
*Bəxtiyarəm, yazılır gör necə şəffaf qəzəli.*
*Nə gözəl dil varımızdır, sevinək,*
*Dilimiz, bil, varımızdır, sevinək.*
*Əcnəbi kəlmələrə yoxdu zərurət zərrə,*
*Çıxarıb atmalıyıq onları biz bilmərrə.*
*"Göz" var ikən niyə "çəşm" olmalıdır?*
*"Yun" var ikən niyə "pəşm" olmalıdır?*
*Niyə "aşiqlər"i "üşşaq" eləyək?*
*"Qarğa"nı biz nə üçün "zağ" eləyək?*
*Niyə "xakistər"ə dönsün "kül"ümüz?*
*"Əndəlib"ləşməlidir bəs nə üçün "bülbül"ümüz?*
*Xəlqinin öz dili var, öz sözü var, öz səsi var,*
*Xəlqimin öz dili ilən yazılan nəğməsi var.*
*Xəlqimin qoşması var, təxmisi var, qitəsi var,*
*Xəlqimin səsləri içində səsi var.*
*Oxuyub Vahidi könlüm çağ olur,*

*Oxuyub Bəxtiyarı gör necə həzzim dağ olur.*
*Deməli, öz sözümüzlən qəzəli yazmaq olur,*
*Hər iki şairin saf dilə əl tutmuşlar,*
*Saf qəzəl bayrağını, bəh, nə gözəl tutmuşlar.*
*Qələmin bəs niyə yad kəlmədən imdad gözlər?*
*Demə "ədviyyəsidir şe'rimizin yad sözlər"!*
*Dili təhqir eləmə,*
*Dili təhqir eləyib sən eli təhqir eləmə.*
*Soyunub-geyməlidir*
*Hərə öz paltarmı,*
*Dilimizdən uzaq et əcnəbi söz paltarını.*
*Neçə il bundan əzəl*
*"dilimin xeyli genişdir,—demişəm,—imkanı",*
*Çeviriblər nə gözəl,*
*Nə səlis dillə bizə "Quranı"!*
*Məqsədimdir ki, deyib öz sözümü qadir olum,*
*Dilimin sözlərinə mail, mahir olum.*
*Nə üçün söz dilənən şair olum?*
*Ərəbin şairi türkün sözünə bənd olmur,*
*Şe'ri farsın ki, şirindir şəksiz,*
*Niyə türk sözlərini əxz eləyib qənd olmur?*
*Dilə yersiz yerə olmuş o calaq sözlərdən,*
*O alağ sözlərdən*
*Dil təmizlənməlidir,*
*Dilimin söz gülü üstündə yatan tozlardan,*
*Qaralan tozlardan*
*Gül təmizlənməlidir.*
*İndi yad sözlər ilə söz demək acizlikdir,*
*Yad tələffüz öyey kəlmələri*
*Dilə bənd eyləmək acizlikdir.*
*Dilə böhtan atma,*
*Dilə böhtan ataraq öz-özünü aldatma.*
*Məni şair eləyib öz dilimin imkanı,*
*Öz dilimlən yazılıb əsrimizin "Divan"ı.*
*Əcnəbi sözləri tuti kimi əzbərləmə gəl,*
*Sən mənim saf dilimi şərləmə gəl.*
*Uğur olsun elə şairlərə ki,*

*Dilimin saflığı uğrunda tutublar məşəl.*
*Xəlqimiz var edəcək milli əruz şe'rimizi,*
*Başa düş sən buna gəl,*
*"Söz"ümü bir də "süxən" eyləmə gəl,*
*Əcnəbi kəlməyə ədviyyə-filan söyləmə gəl.*
*Şər atıb şerimizə bir də yalan söyləmə gəl.*
*Şerimizdən düşəcəkdir aralı şər şəksiz,*
*Məni dəxi əl tutanam,*
*Gələcəkdə məni həm yad edəcəklər şəksiz.*

**Qurban CƏBRAYIL**
*Şair, "Nəbz" qəzetinin baş redaktoru*
*AMEA Nizami adına Ədəbiyyat*
*İnstitutunun dissertantı*

## SƏFƏRLƏR VƏ SƏFƏRNAMƏLƏR ŞAHİNİ

*Mən yolçııyam, mən yoldayam.*
*Od nə çəkdi?*
*Küldən soruş.*
*Hansı şeirim, hansı sözüm*
*Yaşayacaq məndən sonra?*
*Mən bilmirəm, eldən soruş!*
***Rəsul Rza***

Çoxdan tanıyıram Şahin Fazili. Lap çoxdan. Tələbəlik vaxtımdan da əvvəl. Qəzet və jurnallarda dərc olunan yazılarının altında ad və təxəllüsünü tez-tez görərdim. Əfqanistan şair və nasirlərini Bakıda, Azərbaycan ədiblərini isə Kabulda tanıtdırırdı, İki ölkə arasına mənəvi körpü idi Şahin Fazil.

Əfqanistanda nə az, nə çox, 13 il işləyib qayıtdı Bakıya. Amma, tərcüməcilik fəaliyyətini dayandırmadı, müxtəlif vəzn və janrlarda çoxsaylı şe'rlər müəllifi oldu, yaradıcılıq dairəsi daha da genişləndi, səfərləri daha da artdı, İrana, Türkiyəyə, İraqa, hətta Yaponiyaya müxtəlif görüşlərə yollandı, səfərnamələr yazdı.

Onun xaricdə ən çox işlədiyi ölkə Əfqanıstan, ən çox səfərə çıxdığı diyar isə İrandır. Şair-səyyah yazır:

*«Getmirəm Kabula, Bağdadə haçandır, amma*
*Məni də'vət eləyir Ankara həm, Tehran həm.*

*Əfqanıstan ilə İranə könwl bağlamışam,*
*Əfqanıstan da əzizdir bu kəsə, İran həm».*

Şahin Fazilin İrana hər səfəri (həmçinin başqa ölkələrə) «Səfərnamə» ilə bitir. Qələmindən çıxan bəzi səfərnamələrin («İran səfərna- mələri»nin) sərlövhələrinə göz yetirirəm:

*"Dəyməsin xətrinə Allahı gərək İranın";*
*"Qoca Şahin, nə çəkir hey qoca İranə səni?";*
*"Şahin, yenə İranə yetişdim, gözüm aydın";*
*"Şahinə qismət olubdur yenə İran səfəri";*
*"Şahinin gözləri Təbrizdə qalıbdır, gözəlimə";*
*"Urmiyə torpağına heyran olubdur Şahin";*
*"On beşinci səfərim başladı İranə mənim";*
*"Qoca dərviş, yenə İranə səfər var dedilər";*
*" Vaxtın ətəyindən tutub İranə tələsdim";*
*"Gördüm nə qədər təntənə Təbriz şəhərində"*
*"Şahin istər hər zaman etsin səni yad," Ərdəbilə...*

Şahin müəllim istər Əfqanıstanda, istər İranda, istər dünyanın o başındakı Yaponiyada olsun, fərqi yoxdur, darıxır. Darıxır doğma diyarı Azərbaycan üçün, Bakı, Quba, Göyçay üçün, əzizləri, dost-yoldaşları üçün. Odlar Yurdu olan ölkəsinin aşiq Məcnunudur Şahin, səyyah Məcnunudur Şahin, şair Məcnunudur Şahin:

*Ey canım Azəribaycan eli, Odlar Yurdum,*
*Seyr edim hər yerini gündə bir az, vacibdir...*

*Gündə yüz dəfə bu Şahin əyilər qarşında,*
*Neyləsin, çünki müsəlmanə nanuız vacibdir.*

Vətənində olduğu kimi xaricdə də vaxtım boş-boşuna keçirmir, özünün təbirincə desək, «vaxt qatili olmur», hər gün yazır, şe'rimizin müxtəlif növlərində qələm işlədir. Məsələn, onun bir varsağısını misal gətirim:

*"Savalandır,*
*Zirvəsi övc alandır,*
*İlhamım, yetiş dada,*
*Şahini havalatıdır".*

İranda Savalan dağından, El gölündən, Sefidrud çayından, Təbriz, Məşhəd, Qum şəhərlərindən yazmaqla bərabər tez-tez yaralı Qarabağını da xatırlayır, yadların xəyanət və rəzaləti nəticəsində işğal olunan doğma torpaqlarının həsrətindən yazır, yazır:

*Dilbər Qarabağ dərdi mənim qəddimi əydi,*
*Çəkmiş vətənim gör nə cəfa yad əlindən.*

Şahin Fazil qiymətli sözün qədrini, dəyərli şe’rin dəyərini bilən şairdir. Bu sadə insan şe’rdə qəlizlikdən (daha doğrusu, qəliz dildən) uzaqdır və müasir dövrdə oxucular tərəfindən çətin anlaşılan, yaxud heç anlaşılmayan kəlmə və ibarə işlətməyin tam əleyhinədir:

*Məndən də bu dünyadə zəngin bir adam varmı?*
*Qiymətli dürüm yoxdur, qimətli kəlamım var.*

*Sə’yimlə, iradəmlə minlərlə şe’r yazdım*
*Vallah, elə şahəm ki, minlərlə qulamım var.*

*Şe’rimdə mənim görməz bir kimsə qəliz kəlmə.*
*Seyr et nə səliqəm var, bir gör nə nizamım var.*

*Şe’r əhli gərək olsun həm milli, həm xəlqi,*
*Düzgünlüyünə fikrin, söz yox ki, inamım var.*

Şahin Fazil keçən əsrin 64-cü ilində Azərbaycan Dövlət Universiteti Şərqşünaslıq fakültəsinin «Fars dili» şöbəsini fərqlənmə diplomu ilə bitirib və o vaxtdan bu günədək fars dilinin gözəllik cazibəsində qalmaqdadır, heç o cazibədən çıxmaq istəmir də. Onun «Beşinci səfərnamə»sində bu cümlələri oxuyuruq: «1995-ci il dekabr ayının ortalarında Tehrandan mənim adıma bir də’vətnamə gəldi. Də’vətnamədə bildirilirdi ki, 1996-cı il yanvarın əvvəllərində (İran təqvimi ilə 1374-cü ilin dey ayının 13-dən 15-dək) Tehranda «Fars dili ustadlarının Birinci Beynəlxalq Konfransı» keçiriləcəkdir və mənim iştirakım arzu olunur. Təbii ki, çox sevindim. Axı İrana etdiyim hər bir səfər (istər ziyarətlər, istərsə də elmi konfrans və simpoziumlar məqsədi ilə) bir iranşünas kimi məni sevindirməyə bilməz».

Şahin Fazil həmin konfransa getdi, bir həftə müxtəlif rəsmi iclas, mədəni tədbir və gəzintilərdə oldu və birinci misrası «Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl» ilə başlayan möhtəşəm bir qəzəl yazdı:

*Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl,*
*Nə qədər cazibədar, sevgili, yarəb, nə gözəl.*

*Nə qədər şairi vardır, əcəba, İranın,*
*Neçə arif yetirib hər ili, yarəb, nə gözəl.*

*Qərq olubdur gülə hər guşəsi, güldən başqa,*
*Bu qədim ölkədə var dil gülü, yarəb, nə gözəl.*

*Adi bir sözdəki məzmun məni ovsunlatmış,*
*Sanki axmaqdadı nıə'na seli, yarəb, nə gözəl.*

*Bu rəvan clikh Nizanıi yaradıb, Sə'di yazıb,*
*Yetirib Ənvərini, Bideli, yarəb, nə gözəl.*

*Bu dilin şöləsi çox qəlbi işıqlatdı, bu dil,*
*Nura qərq eylədi çox mənzili, yarəb, nə gözəl.*

*Hafizin şe'rini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü, yarəb, nə gözəl.*

Bu günün şe'ri bu günün poetik şe'r dilində də yazılmalıdır! Budur Şahin Fazilin şairanə qayə və məqsədi. Klassik şairlərimizə dərin ehtiram bəsləyən bu şair bəzi qəzəlxanlarımız tərəfindən gen-bol işlədilən əcnəbi kəlmə və ifadələrin əleyhinə çıxır və yarım əsrdən çoxdur ki, mühafizəkar qəzəlxanlarla vuruşur. Milli dövlətimizin rəmzlərindən biri olan dilimizin saflığı uğrunda mübarizə onun qanındadır. Şe'rdə dil təmizliyinin zərurəti haqqında dönə-dönə fikirlər söyləyən Şahin belə yazır:

*«Kuh» gəl söyləmə, «dağ» düzgün olar,*
*«Ləb» demə bir də, «dodaq» düzgün olar.*

*Sağsa şair ölümündən sonra,*
*«Zində» gəl söyləmə, «sağ» düzgün olar.*

*Bilməyir türk, a canım, «guş» nədir,*
*Qulaq as, türkcə «qulaq» düzgün olar.*

*Əl-ayaq eyləmə yad sözlər üçün*
*«Dəst» - «əl», «pa əsa - «ayaq» düzgün olar.*

*Dilbərin zülfü daraqlanmalısa,*
*«Şanə» işlətmə, «daraq» düzgün olar.*

*Yad kəlam öldürəcək doğma sözü.*
*Xəlqi sözlə yaşamaq düzgün olar!*

İrana səfərlərim zamanı üç dəfə Kərbəlayi Şahinlə yol yoldaşı olmuşam. Çox məhsuldar adamdır. Qələmi əlindən düşmür. Onun səfəmamələrindən: «2006-cı il. Fələstinlə bağlı Beynəlxalq Tehran Konfransı. «Azadi» adlanan otel. Yüksək mədəni səviyyəli qarşılanma. Hacı Hacıağa ilə Tahir Kərimliyə 1411 -ci. Hacı Qurbanla mənə isə 1413- cü otaqlar ayrılmışdı. 14-cü mərtəbənin 13-cü otağı. Nəhs adlanan bu rəqəm mənə düşür. Səfərimiz yaxşı keçəcək, inşallah!».

Yaxud, «Saat 15.00. Ayətullah Təsxiri ilə görüş. Məqami-müəzzəmi- rəhbər Ayətullah Seyid Əli Xameneyinin beynəlxalq əlaqələr üzrə müavini Ayətullah Təsxirinin yaşı məncə səksən olar. Olduqca mədəni və savadlı şəxsdir. Ərəb dilini gözəl bilir. Şairdir. O, sabah İranın ali dini rəhbəri cənab Xameneyi ilə bizim görüşümüz olacağını bildirərək bir qədər söhbətdən sonra getdi. Mənim «Fələstinnamə» silsiləsindən olan 4 şe'rimin və Hacı Qurban Cəbrayılın bir neçə şe'rinin surətlərini çıxarmaqdan ötrü varaqlarımızı surətçıxarma otağına apardılar. Dayanıb şe'rlərimizi aparan şəxsin qayıtmasını gözləyirik. Bu vaxt Hacı Qurban portağal şirəsi dolu qrafın gətirən bir nəfəri bizə göstərib dedi:

—Budur şe'rlərimizin şirəsini gətirirlər.

Yarı zarafatla cavab verdim:

—Yox, bizim şehlərimizin şirəsi sarı rəngdə ola bilməz, qıpqırmızı olmalıdır. Çünki onlar Fələstinə həsr olunduğundan özlərində qan rəngini əks etdirməlidir.

Gülüşdük».

Başqa səfərimizdən: İmam Rzaya (s) həsr olunmuş növbəti konfrans. 21-24 noyabr, 2006-cı il. «Səfərə tək çıxmayacaqdım. «Nəbz» qəzetinin baş redaktoru şair Qurban Cəbrayıl da mənimlə birgə gedəcəkdi. Bu Hacı yaxşı həmsəfərdir. Mən onunla əvvəllər də İranda olmuş, müxtəlif İran şəhərlərinə səfərlər etmişəm. Sabah yenə birgəyik. Yolumuz işıqlı, səfərimiz uğurlu olar

inşallah.

Gecə sabahdan başlayacaq yeni tran səfərimin - on altıncı səfərnamənin birinci şe'ri yazıldı:

*Qoca dərviş, yenə İranə səfər var, - dedilər,*
*Ləngimə, get, hələ qəlbində təpər var, - dedilər.*

*On beşinci səfərim gendə qalıb çoxdandır,*
*Bixəbərsən, gedişin haqda xəbər var, - dedilər.*

*Oxuyarsan orada şe'rini şövq ilə yenə,*
*Dikilən yollarına doğma nəzər var, - dedilər.*

*Gedəcəkdir Hacı Qurban da səninlə oraya,*
*Bilməyirsənmi o şairdə nələr var, - dedilər...*

Hal-hazırda 2011-ci ilin əvvəlləridir. Günlər şütüyür, aylar ötür, illər bitir. Ağsaqqal dostum, demək olar ki, hər il İrana gedir. Heç olmasa ildə bir dəfə.

*"Hələ çox gəzməliyəm, görməliyəm İranı,*
*Mənə bildir göriiniibdiir bu ilin imkanı"*

deyir Şahin Fazil.

Görüm ki, sənin canın sağ, imkanın geniş, səfərlərin çox, ilhamın yüyrək olsun. Yeni səfərnamələrini gözləyirik...

***(Şahin Fazil. İran səfərnamələri,***
***II nəşr, Bakı, 2013, səh.9-16)***

**Maarif XALIQOV**
*Tarix üzrə fəlsəfə doktoru*

## ÖZÜNƏ ƏBƏDİYAŞAR ABİDƏ UCALTMIŞ ALİM VƏ ŞAİR

Tarix elmləri doktoru, böyük yazar-şair Şahin Fazillə mənim ilk tanışlığım 1978-ci ildə Tarix İnstitutunda olmuşdur.O illərdə mən həmin aspirantı idim.Əfqanıstanda tərcüməçi işləyən Şahin müəllim həmin il geri qayıtdıqdan sonra Tarix İnstitutunda işləməyə başlamışdı.

O vaxtdan 42 il keçir. Bu ilin mart ayında Şahin müəllim ömrünün 80 ilini başa vurdu, doqquzuncu onilliyə qədəm qoydu.Qırx iki il bundan əvvəl İnstitutun əməkdaşları Şahin müəllimi kamil, milli qürur hissi, vətən və torpaq sevgisi yüksək olan, xeyirxah, sözü bütöv, yorulmaz bir insan kimi tanıyırdılar.O, bu gün də həmin keyfiyyətlərini qoruyub saxlayıb. Rəhbərlik etdiyi "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsi Milli Elmlər Akademiyasının 11-ci mərtəbəsində yerləşir. Doqquzuncu mərtəbədə liftdən çıxan Şahin müəllim yorulmaq nə olduğunu bilmədən iki mərtəbəni dəf edir,iş otağına keçərək dəyərli əsərlərini yaradır.

Şahin müəllim elmi fəaliyyətinin xeyli hissəsini Azərbaycanla İranın tarixinin qarşılıqlı cəhətlərinin obyektiv mövqedən öyrənilməsinə həsr etmiş və bu sahədə dəyərli əsəsrlər yaratmışdır.

Mən Şahin müəllimin "İran səfərnamələri" kitabının birinci nəşri ilə tanış idim. 2018-ci ildə olan görüşümüz zamanı Şahin müəllim həmin kitabın üçüncü nəşrini mənə təqdim etdi. Şahin müəllimin İrana birinci səfəri 1992-ci ilin dekabr ayında olmuş, 2016-cı ilin dekabr ayında 13-cü səfəri baş vermişdir. Bu səfərlərlə bağlı işlənmiş 30 səfərnamədə Ulu Şəhriyardan başlayaraq bu günümüzə qədər İranın və Güney Azərbaycanının şairləri, onların bədii yaradıcılığı haqqında ətraflı məlumat verilir. Şahin müəllim eyni zamanda bu səfərlərlə bağlı fikirlərini yazdığı şeir və qəzəlləri ilə işıqlandırır.

Böyük ədib Şahin Fazilin yaradıcılığında bir çox tanınmış şairlərin şeirlərinə yazdığı təzminlər də xüsusi yer tutur. Təzmin bir şairin iki misralıq beytinə yazılan, ya söylənən şeir, bənzətmədir.Şahin Fazil ustad qəzəlxan Əfzələddin Xaqaninin aşağıdakı iki misrasına belə cavab verir:

*“Xaqani sənə yazmayacaqdır daha məktub,*
*Çünki sənə səndən o, şikayət necə yazsın?!”*

***Əfzələddin Xaqani***

*“Həsrət çəkirəm Təbrizə, Urmiyyəyə həsrət,*
*Əsdirsə əgər əlləri həsrət,necə yazsın?!”*

***Şahin Fazil***

Şahin Fazilin “İran səfərnamələri” kitabında iranlı qələm dostları ilə olan şeirləşmələri haqqında çoxsaylı faktlar vardır.Onlardan biri də Ərdəbildə yaşayan, Azərbaycan və fars dilli şair Əsgər Şahidir. “Vahid ədəbi məclisi”nin sədri Hacı Rafiq Şirvani yazır : “ İki toplanan bir cəmdə birləşdiyi kimi, bu iki dost, qardaş, məsləkdaş və amaldaş şair və alim – Şahi və Şahin də iki bədəndə bir qəlb kimidirlər”.

Şahin Fazil bir qəzəlində yazır:

*“Şahi” ilə “Şahin”dəki fərq bircə hərfdir,*
*”Nun” hərfini silmək məni Şahi eləyərmi?”*

Əsgər Şahi buna cavab olaraq bildirir:

*“Gecə gördüm yuxuda Kə’bə qabağında durub*
*Eləyir Şahi dua, söyləyir “Amin” Şahin”.*

Şahin Fazilin İrana hər səfəri iki qonşu, qardaş xalqın arasındakı mədəni əlaqələr körpüsünün dayaqlarını daha da möhkəmlədir.

Bunları bildiyim üçün 2018-ci ildə Tarix İnstitutunda olarkən mən Şahin müəllimlə görüşmək qərarına gəldim.Şahin müəllim məni səmimi qəbul etdi.Mən Ərdəbil Ostanının Sərein şəhərində yaşayan şair Rəhim Əsədullahi ilə yaxından tanış olduğumu,onun bir neçə şeir kitabını özümlə gətirərək MEA-nın kitabxanasına və M.F.Axundzadə adına Milli kitabxanaya təqdim etdiyimi dedim. Eyni zamanda, Rəhim ağanın məndə olan şeir kitabını da Şahin müəllimə verdim.Elə orada Rəhim ağanın bir neçə şeiri ilə tanış olan Şahin müəllim Səreinə nə vaxt gedəcəyimi soruşdu.Tezliklə gedəcəyimi bildirdim. Xahiş etdi ki, bir həftədən sonra bir daha görüşək. 2018-ci ilin iyul ayının 10-da Şahin müəl-

limlə olan görüşümüz zamanı o, Rəhim Əsədullahinin qəzəllərinə yazmış olduğu aşağıdakı təzminləri mənə təqdim edərək xahiş etdi ki, Ərdəbilə olan səfərim zamanı onları Rəhim ağaya verim.

QƏZƏL-TƏZMİNLƏR

I

*"Olacaq şerimi məna mən öləndən sonra,*
*Deyəcək adımı dünya mən öləndən sonra"*[1]

*Sağ ikən qaldım oyaq, çox gecələr az yatdım,*
*Oxusunlar mənə layla mən öləndən sonra.*

*Çağırın saqini gəlsin üzümə mey çiləsin,*
*Gəlməsin üstümə molla mən öləndən sonra.*

*Itirən var məni gözdən, hələ ki, amma varam,*
*Eləyərlər məni peyda mən öləndən sonra.*

*Söyləyən var ki, " döyürsən söz ilə əğyarı!..,"*
*Döyəcəklər məni guya mən öləndən sonra.*

*Olmadı vəsl müyəssər, görərəm: Cənnətdə*
*Qovuşub Məcnuna Leyla mən öləndən sonra,*

*Sağlığında edə ünsiyyətini, faydası yox*
*Mənə göz vursa Züleyxa mən öləndən sonra.*

*Dedi bir qız mənə "evlən", nə böyük səhv elədim!...*
*Gedəcəkdir ərə heyfa, mən öləndən sonra.*

*Mənim ilhamımı ilham pərisindən soruşun,*
*Qopacaqdır neçə dava mən öləndən sonra.*

---

[1] Beyt İran şairi Rəhim Əsədullahi Dərvişinindir.

*Vermişəm şerdə üstünlüyü türk sözlərinə,*
*Söyməsinlər məni əsla mən öləndən sonra.*

*Demişəm ki, "qəzəli sadə yazın", varmı günah?*
*Deməyin söz mənə biça mən öləndən sonra.*

*Qəzəl eşqiylə neçə röya qaçırtdım gözdən,*
*Gözümə qoy gələ röya mən öləndən sonra.*

*Çoxuna bəlli deyildir sözümün mənası,*
*Açılar məndəki məna mən öləndən sonra.*

*Qəzəlimdə hələ gizlin neçə eyham vardır,*
*Atılar qətlimə imza mən öləndən sonra.*

*Mən müasir qəzəli əcnəbi sözdən qorudum,*
*Qoymasınlar düşə qovğa mən öləndən sonra.*

*Məni xulya eləmiş milli qəzəl sultanı!*
*Tapacaq bəs kimi xulya mən öləndən sonra?*

*Şahinə oldu qələm bir neçə durna lələyi,*
*Gəzəcək Şahin durna mən öləndən sonra.*

II

*Kitabım çıxdı, kitab etməyə dəftər gəzirəm,*
*Elə dəftər ki, onu zərləməyə zər gəzirəm.*

*Yazmasam dəftərimi zərli qələmlərlə, sözüm*
*Inciyər, bax bu səbəbdən zəru gövhər gəzirəm.*

*"Tökmərəm hər ətəgə şerimi, el şairiyəm,*
*Tutiyi-təb'imə ehsas ilə şəkkər gəzirəm"*[1]

[1] Beyt Rəhim Əsədullahi Dərvişinindir.

*Harada Raci, hanı Seyyid Əzim Şirvani?*
*Şəhriyar axtarıram, Mirzə Ələkbər gəzirəm,*

*Tərtəmiz dildə qəzəl nəzm eləyənlər azdır,*
*Varmı şair ola Dərvişimə bənzər? Gəzirəm.*

*Çıxmasın bircə kobud söz də dilimdən heç vaxt,*
*Sözü qundaqlamağım var deyə məxmər gəzirəm.*

*Oğru vardır ki,gəlib bağdən alma aparır,*
*Məncə gül vurğunuyam, lalə-sənubər gəzirəm.*

*Mənə göyqurşağı rəngində kəmər lazımdır,*
*Yarıma vermək üçün gör necə zivər gəzirəm!..*

*Ya, üzük tapmalıyam binəzir olsun Yerdə,*
*Dolanıb Yer üzünü indi sərasər, gəzirəm.*

*Ya da, qolbaq gəzirəm olmaya saxta, gözəlim,*
*Onu təcrübəli zərgərlə bərabər gəzirəm.*

*Dedi saqi mənə: "Meyxanəyə gəl, gözləyirəm ",*
*Dedi zahid isə "Və'z etməyə mənbər gəzirəm".*

*Necə ildir ki, əlimdən Qarabağ çıxmışdır,*
*Düşmənin sinəsinə çalmağa xəncər gəzirəm.*

*Vardı Babək və Koroğlu və Nəbi, məlumdur,*
*Bu "ərən yurdu olan ölkədə" mən ər gəzirəm.*

*Ey müsəlman, o qədər kafər olubdur peyda,*
*Onlara atmağa ulduz sanı qənbər gəzirəm.*

*Baxıram gözlərinə çoxlarının, qəmgindir,*
*Min nəfərdən biri vardırmı gülümsər? Gəzirəm!..*

*İntizarəm ki, gedib yurdumu azad eləyək,*
*Şahinəm, hazır edin ləşkəri, səngər gəzirəm!!!*

III

*Günüm vardır, ayım vardır, çırağımdan xəbər yoxdur,*
*Yaxın günlər yaxınlıqda, uzağımdan xəbər yoxdur.*

*Kiməm mən, kimdir əcdadım, nəsil dəftərçəmə baxdım:*
*Köküm qalmış Yer altında, budağımdan xəbər yoxdur.*

*"Qarışmış saclarım tarix kimi toz-torpaq altında,*
*Daransın bu qara tellər, darağımdan xəbər yoxdur".*[1]
*Dedi Həvva nənəm röyadə: "Adəmdən xəbərdarəm,*
*Hanı Habil, hanı Qabil, uşağımdan xəbər yoxdur."*

*Çığırlar otla örtülmüş, keçidlərdən keçənlər yox,*
*Kösövlər yanmamış qalmış, oçağımdan xəbər yoxdur.*

*Hanı Şah İsmayıl əsri? Hanı Şirvanşahın qəsri?*
*Səsim səssizləmiş çoxdan, sorağımdan xəbər yoxdur.*

*Salam söylərdi Türküstan... Qonağım vardı Turandan...*
*Qonaqpərvərliyim varsa, qonağımdan xəbər yoxdur.*

*Yaxınlarda, uzaqlarda ayağım get-gəl eylərdi,*
*Yaxınlar var, uzaqlar var, ayağımdan xəbər yoxdur.*

*Bu gün bağ içrə gəzdikdə Qərabağ keçdi könülümdən,*
*Bu bağımdan xəbər vardır, o bağımdan xəbər yoxdur.*

*Şəhər getdi, bəhər getdi, kəhər getdi, yəhər getdi,*
*O kənd getdi, o bənd getdi, bulağımdan xəbər yoxdur.*

*Calınmır ney, susub zurna, hayanda şeypur avazı?*
*Atın meydanı görsənmir, ulağımdan xəbər yoxdur.*

*Tüfəngimdən topumdan var xəbərlər, hazırıq çəngə,*
*Qılıncımdan, əmudumdan bıçağımdan xəbər yoxdur.*

[1] Beyt Rəhim Əsədullahi Dərvişinindir

*Ötən tarix qalıb gendə və yaddan çıxmayır amma,*
*Bu çağımdan xəbər çoxdur, o çağımdan xəbər yoxdur.*

*Əsər yoxdur mürəkkəbdən, qələmdan içrə qanım var,*
*Qələm işsiz qalıb, Şahin, varağımdan xəbər yoxdur.*

*9-10 iyul 2018*

Şahin müəllim eyni zamanda bir Divanını da Rəhim ağaya çatdırmağı məndən xahiş etdi. Bu mənim böyük sevincimə səbəb oldu. Çünki Quzeyli – Güneyli Azərbaycanın iki şairi arasında ünsiyyətin, ədəbi-bədii əlaqələrin yaranmasının səbəbkarı oldum.

Həmin ilin iyul ayının sonunda mən Ərdəbil ostanının Sərein şəhərində müalicədə olarkən Rəhim Əsədullahi ilə görüşdük. Görüş zamanı mən Azərbaycan Respublikasının tanınmış tarixçi-alimi,şərqşünas, böyük yazar və qəzəlxan Şahin Fazil haqqında ona məlumat verdim. Rəhim Əsədullahinin məndə olan iki şeir kitabını da Şahin müəllimə təqdim etdiyimi dedim. Eyni zamanda, Şahin müəllimin Rəhim Əsədullahinin qəzəllərinə həsr etdiyi təzminləri də ona verdim. Dediklərim Rəhim ağanın böyük sevincinə səbəb oldu. Mən Bakiya qayıdarkən Rəhim Əsədullahi daha bir şeir kitabını Şahin müəllimə çatdırmağımı xahiş etdi. Kitabın ön səhifəsində Şahin müəllimə ünvanlanmış bir şeiri də var idi. Təbii ki, mən Bakıya qayıtdıqdan sonra, sentyabr ayında Tarix İnstitutunda Şahin müəllimlə olan görüşümüz zamanı bu kitabı da ona təqdim etdim.

Mən 2019-cu ilin avqust ayında müalicə məqsədilə Sərein şəhərində olarkən Rəhim Əsədullahi ilə olan görüşümüz zamanı o, mənə ünvanladığı bir yazısını təqdim etdi. Həmin yazısında Rəhim Əsədullahi aşağıdakıları qeyd edir:

" Maarif müəllim məni professor Şahin Fazillə tanış etmişdir. Nəticədə bizim hər ikimiz bir-birimizin ədəbi-bədii əsərlərini əldə etmiş, yaradıcılığımızla tanış olmuşuq. Hətta bir-birimizə şerlərimizlə də müraciət etmişik. Miladi iyul ayının 18-də professor Şahin həzrətlərinə ünvanlanmış şerimi də Maarif müəllimə təqdim etdim.

Əziz Şahin Fazil! Əzgil ildə bir dəfə tapıldığı üçün qiymətlidir."

Bakıya qayıtdıqdan sonra mən bu şeiri də Şahin müəllimə təqdim

etdim. Hətta bu şeir "Kredo" qəzetinin 18 dekabr 2019-cu il tarixli sayında da çap olundu.

Şahin müəllim bu əlaqələrin yaranması haqqında aşağıdakıları deyir:

- Tez-tez Ərdəbilə gedir Maarif. Ərdəbil ziyalıları, əsasən şairləri həmişə gözləyir onu. Keçən il yanıma gəldi. Iki kitab gətirdi mənə. Şair Qartalın Şahinə göndərdiyi iki kitab. Müəllifin tam adı: Rəhim Əsədullahi Səreyn Dərviş Qartal. Oxudum. Hətta bir neçə şeir də həsr etdim şair Qartala, çünki şair Qartal şair Şahini öz mövzun şe'rləri ilə sevindirmişdi. Aramizda müşairə yaradı:

*"Olacaq şe'rimi mə'na mən öləndən sonra,*
*Deyəcək adımı dünya mən öləndən sonra"*

*(Qartal Rəhim)*

*"Qəzəlimdə hələ gizlin neçə mə'na vardır,*
*Atılar qətlimə imza mən öləndən sonra"*

*(Şahin Fazil)*

Yaxud:

*"Tökmərəm hər ətəgə şe'rimi, el şairiyəm,*
*Tutiyi -tə'bimə ehsas ilə şəkkər gəzirəm"*

*(Qartal Rəhim)*

*"Harada Raci, hanı Seyyid Əzim Şirvani?*
*Şəhriyar axtarıram, Mirzə Ələkbər gəzirəm"*

*(Şahin Fazil)*

Yaxud:

*"Qarışmış saçlarım tarix kimi toz-torpaq altında,*
*Daransın bu qara tellər, darağımdan xəbər yoxdur"*

*(Qartal Rəhim)*

*"Kiməm mən, kimdir əcdadım, nəsil dəftərçəmə baxdım,*
*Köküm qalmış Yer altında, budağımdan xəbər yoxdur"*

*(Şahin Fazil)*

Şahin müəllim mənim 70 illiyimlə əlaqədar mənə aşağıdakı qəzəlini də həsr etmişdir:

QƏZƏL

*Yarımçıq arzu-niyyətlər yarımçıq yox, tam olsun kaş,*
*Xudaya, hər çətin dərdə çox asan ənçam olsun kaş.*

*Gözəl torpaqlarım qalmış yad əllərdə, yad ellərdə,*
*O kafərlər kənar olsun, müzəffər—islam olsun kaş.*

*Qarabağ mülkü uğrunda savaşlar qoy davam etsin,*
*Igid kəslər zəfər çalsın, xəbislər bədnam olsun kaş.*

*Didərginlər didərginlik bəlasından xilas olsun,*
*Vətən mülkündə hər insan ömürlük aram olsun kaş.*

*Maarif Xalıqov, ey Xaliqə sadiq olan bəndə,*
*Həyatın elminə layiq işıqlansın, şam olsun kaş.*

*Mənim tək söz deyən çoxdur, sənin tək alim az gördüm,*
*Bu sözlər xudpəsənd alimlərə bərk ehyam olsun kaş.*

*Qələm səndə, qələm məndə, kəlam səndə, kəlam məndə,*
*Edək tərif qoça Şərqi, könüldə ilham olsun kaş.*

*Səhənd-Şahdağ, Bakı-Təbriz məhəbbətlə salam versin,*
*O sahildə, bu sahildə sərasər bayram olsun kaş.*

*Sənə sağlam həyat arzu edir Şahin, yaşa sağlam,*
*Maarif varsa arif var, Maarif sağlam olsun kaş!!!*

Şahin müəllimin həyat yolu bu günkü və sabahkı gənclərimiz üçün böyük nümunədir. Bunu nəzərə alaraq mən 2019-cu ilin sentyabr ayında Tarix İnstitutunda Şahin müəllimlə görüşə gedərkən 5 yaşlı nəvəm Muradı da özümlə apardım. Görüş zamanı Şahin müəllimdən xahiş etdim ki, nəvəm Muradla şəkillərini çəkməyimə razılıq versin. Müraciətim müsbət qarşılandı. İnanıram ki, bu şəkil nəvəmin gələcək həyatında böyük rol oynayacaq. Belə ki, o gələcəkdə Şahin Fazilin elmi, ədəbi-bədii yaradıcılı-

ğı ilə yaxından tanış olacaq, bu isə onun bir insan kimi formalaşmasına özünün müsbət təsirini göstərəcək.

Şahin müəllim "Mən" şeirində yazır:

*Özgəni görürəm şahin gözümlə,*
*Özümü görməksə "müşkül" yaradıb.*
*Deməli, indi də özüm özümlə*
*Tanış olmağımın məqamı çatıb.*

Bəli, Şahin müəllim, bu məqam artıq gəlib çatıb. Amma bu məqam özünüzlə tanışlığın başlanğıcıdır. Qabaqda hələ nə qədər maraqlı, zəngin anlar, günlər var. İnanıram ki, Siz 90- ınızda, 100-ünüzdə də arxada qalan anları nəzərdən keçirəcək, 80-dən keçən sonrakı illərdə də neçə-neçə divanlar yazacaq, oxucularınızı tərcümə etdiyiniz qədim mənbələrlə tanış edəcəksiniz.

Sonda onu demək istəyirəm ki, Şahin müəllim istər Azərbaycan tarix-şünaslığında, istərsə də Azərbaycan ədəbi-bədii xəzinəsində yaratmış olduğu inciləri ilə özünə əbədiyaşar bir abidə ucaltmışdır. Tərəddüd etmədən deyə bilərəm ki, gələcək zamanlarda da Şahin Fazil Azərbaycanın tarixçi-alimi və şair-qəzəlxanı kimi yüksək zirvələrdə parlayacaq!

**Tofiq CAHANGİR**
*Filologiya üzrə fəlsəfə doktoru, dosent*

## ŞAHİN FAZİL, ONUN DƏRİ VƏ FARS DİLLƏRİNDƏ YAZDIĞI ŞEİRLƏR

Şahin Fərzəliyevi 1961-ci ildən tanıyıram. Azərbaycan Dövlət Universitetinin Şərqşünaslıq Fakültəsinin eyni şöbəsində oxuyurduq. Şahin 3-cü, mən isə 1-ci kurs tələbəsi idik, ustad müəllimlərimizdən fars dili dərsini öyrənirdik. Bir gün Şahinə İran yazıçısı Bozorg Ələvinin o vaxtlar məşhur olan «Çeşmhayəş» («Onun gözləri») romanını birlikdə tərcümə etmək təklifini etdim. Amma, tərcümə üzərindəki işimiz yarımçıq qaldı. Şahin 5-ci kursda oxuyarkən onu tərcüməçi kimi işləməkdən ötrü Əfqanıstana ezam etdilər. 3 il orada qaldıqdan sonra Şahin 2 il fakültəmizdə dekan müavini oldu və çox çəkmədən onu yenə Əfqanıstana dəvət etdilər. İllər ötdü. Şahin daha 2 dəfə Əfqanıstanda uzunmüddətli ezamiyyətdə oldu və həyatının 13 ilini, özü demişkən, həmin «əfsanələr və dağlar diyarında» keçirdi. O, Kabul şəhərində işləyərkən mən də bir müddət Qəndəharda – o zaman ölkənin ən təhlükəli və qaynar yerlərindən biri olan bir vilayətdə hərbi tərcüməçi kimi fəaliyyət göstərirdim…

Sonralar Şahin Elmlər Akademiyasında, mən isə Dövlət Universitetində çalışırdıq və yuxarıda adını çəkdiyim «Onun gözləri» əsərinin tərcüməsi üzərində işləməkdən gözümüzü çəkdik. Elmi işlər vaxtımızı çox alırdı. Amma, Şahin təkcə alim deyil, həm də şair idi. Mən fars dilindən dərs deyir, Şahin isə vaxtilə Əfqanıstanda yazmağa başladığı şeirlər silsiləsini (əlbəttə Əfqanıstanın ikinci dövlət dili olan dəri dilində) davam etdirir və mənə göndərirdi.

Fars və əfqan dəri dili. Bir məxəzdən qaynaqlanan iki dil. Aralarında müəyyən fərqlər vardı. Şahin dəri dilini artıq mənimsəmişdi. Mənimsədi və bu dildə şeirlər yazdı. Yazdığı şeirləri Kabulda çıxan jurnal və qəzetlərdə, habelə Bakıda çap etdirdiyi «Divan» kitablarında dərc edən şair sonralar müxtəlif şeir bəhrlərində də qələmini sınadı və beləliklə **müləmme** adlanan yazı nümunələri də yaratdı. Bu haqda bir qədər sonra. İndisə Şahinin əruz, heca və sərbəst vəznlərdəki bir neçə şeirinə oxucu diqqətini yönəltmək istərdim.

Mən şairin dəri dilli poeziya qapısını onun «Qapılar» adlı şeiri ilə açıram:

## QAPILAR

*Sübh-*
*gündüzün qapısını,*
*Gündüz –*
*axşamın qapısını,*
*Axşam –*
*gecənin qapısını,*
*Gecə –*
*sübhün qapısını*
*açmada-bağlamada sərasər,*
*Qapılar gecə-gündüz*
*Açılıb-örtülürlər.*

***

*Mən –*
*sənin qapını,*
*Sən –*
*mənim qapımı,*
*Bu –*
*onun qapısını,*
*O –*
*O bunun qapısını*
*açmada-bağlamada sərasər,*
*Qapılar gecə-gündüz*
*Açılıb-örtülürlər.*

***

*Qapıları açmaqla,*
*qapıları örtməklə*
*ötmədədir günlərim.*
*Bəzi qapıları mən*
*Bağlamamaqdan ötrü*
*örtürəm,*
*Bəzi qapılarısa*
*örtürəm ki,*
*açmayım.*

Qeyd edim ki, Şahinin dəri dilindəki şeirlərinin bədii tərcüməsi də elə onun özü tərəfindən dilimizə çevrilmişdir ki, indi «Qapılar» şeirinin orijinal variantını oxucu nəzərinə yetirirəm:

DƏRVAZEHA

*Sübh dərvazeye-ruz ra,*
*Ruz dərvazaye-şam ra,*
*Şam dərvazeye-şəb ra,*
*Şəb dərvazeye-sobh ra*
*Bazo bəste mikonəd,*
*Dərvazeha dəmadəm*
*Baz bəste mişəvənd.*
***
*Mən dərvazeye-to ra,*
*To dərvazeye – mə ra,*
*İn dərvazeye – an ra,*
*An dərvazeye – in ra*
*Bazo bəste mikonəd,*
*Dərvazeha dəmadəm*
*Bazo bəste mişəvənd.*
***
*Ba bazo bəste kərdəne-dərvazeha*
*Migözərəd ruzhayəm.*
*Baz mikonəm bəzi dərvazeha ra*
*Zira bəste nəkonəm.*
*Bəste mikonəm bəzi dərvazeha ra*
*Zira baz nəkonəm.*

Şahin Fazil dəri şeirlərinin başqa birini «Qarətçilər» adlandırır. «Qapıları» açıb-bağlayan şair indi iki «qarətçi», yəni bir-birinin qəlbini qarət edən sevgilisini öz şeirinin predmeti edir:

## QARƏTÇİLƏR

*Bəli,*
*qarətçisən sən,*
*həmin gün eylədin qarət bu qəlbi,*
*həmin gün ki, tanış olduq səninlə*
*və qoydun qəlbimi talana məruz.*

***

*Bəli,*
*qarətçiyəm mən,*
*həmin gün eylədim qarət o qəlbi,*
*həmin gün ki, tanış olduq səninlə*
*və qoydum qəlbini talana məruz.*

«Qarətçilər» şeirinin orijinalı isə belədir:

## QARƏTGƏRAN

*Ari,*
*to ğarətgəri.*
*to ğarət kərdi qəlbəm ra həman ruz,*
*həman ruzi ke ma aşena gəştim*
*və dər qəlbəm nəmand baqi məhəbbət,*
*to*
*zira*
*an ra ğarət kərdivo bordi təmamən.*

***

*Ari*
*ğarətgərəm mən*
*və ğarət gərdeəm qəlbət həman ruz,*
*həman ruzi ke, ma aşena gəştim*
*və dər qəlbət nəmand baqi məhəbbət*
*və mən*
*ğarət nəmudəm anra vo bordəm təmamən.*

Şahin Fazilin üçüncü şeiri bir məsləhət şeiridir. Kimin məsləhətidir bu şeir? Kimin kimə məsləhətidir bu nəzm? Təəcüblənməyin. Bu şeir diri adama ölülərin məsləhətidir.

## ÖLÜLƏRİN MƏSLƏHƏTİ

*«Ölülər mənə deyirlər:*
*-Yaşamağa tələs!»*
***Jül Renar***
*(Fransa yazıçısı)*

*Xəbərdar ol, ey insan,*
*Vəxt ötüb-gedir yaman,*
*Bu qiymətli vaxtını*
*Keçirmə boş bircə an,*
*Vaxt ötüb-gedir yaman.*

***

*Dayanma işsiz, tələs,*
*Vaxt ötüb-gedir yaman,*
*Qəm-kədərli qəlbini*
*Ver, səni sevə canan,*
*Vaxt ötüb-gedir yaman.*

***

*Tələs, vaxtı fani san,*
*Vaxt ötüb-gedir yaman,*
*Tələs, tələs bəs qədər,*
*Gör nə deyir ölülər:*
*«Vaxt ötüb-gedir yaman…*
*Vaxt ötüb-gedir yaman!»*

Diqqətli oxucu! İndisə şeirin orijinalına diqqətini yönəltməyini rica edirəm:

## MƏSLƏHƏTE-MORDEGAN

*«Mordegan be mən miguyənd:*
*-Be zistən beşetab!...»*
***Jül Renar***

*Han! Baxəbər! Hoşdar!*
*Vəqt şetab mikonəd…*
*Vəqte-geranmaye-ra*
*tir mikon bərhədər,*
*Vəqt şetab mikonəd…*

***

*Kon əcəle, kar kon,*
*Vəqt şetab mikonəd…*
*Qəlbe-ğəməngiz ra*
*aşeqe-deldar kon,*
*Vəqf şetab mikonəd…*

***

*Vəqt ra fani bedan,*
*Vəqt şetab mikonəd…*
*Han! Çeninəst be to*
*Məsləhəte-mordegan:*
*«Vəqt şetab mikonəd…»,*
*«Vəqt şetab mikonəd!».*

Şahinin təqdim etdiyi başqa şeir nümunəsi isə qəzəldir. Şərq poeziyasının ən məşhur və ən oxunaqlı janrlarından olan qəzəl! Bəli şair dəricə qəzəl də yazmışdır:

*Qəlb çenin dər nəmud: Şadiyo matəm çeəst?*
*Əvvəle-adəm çe bud, axere-adəm çeəst?*

*Bud yeki xubru, yare-çenin xub ku?*
*Eşq nəmidəm be u, eşq çe, mobhəm çeəst?*

*Göftəməş: - Ey delroba, aşeqe-xod kon vəfa,*
*Zud begu motləqa ruye-to in qəm çeəst?*

*Mən tora mael şodəm, əmma nə nael şodəm,*
*Bixi ki, zael şodəm, del çevo, xorrəm çeəst?*

*Çoft: - Əzizəm, boro, hiç məşo ruberu,*
*Aşeqe-nik misli-to ruye-zəmin kəm çeəst,*

*Adəme-xub həsti to, hobbe-qolub həsti to,*
*Ca nərəsəd qəsdi-to, mən tora həmdəm çeəst?*

*Aşeqi darəm, vəli hiç nəguyəd «Bəli»,*
*Fəhmidi, ey Fərzəli, ahe-dəmadəm çeəst?*

İndisə həmin qəzəlin şairin özü tərəfindən edilmiş tərcüməsi Azərbaycan oxucularına təqdim olunur:

*Qəlb belə söylədi: Həzz və matəm nədir?*
*Əvvəli məlum bizə, axiri-adəm nədir?*

*Var gözəl bir nigar, öylə gözəl harda var?*
*Məndəki eşq aşikar, eşq nə, mübhəm nədir?*

*Söylədim: -Ey dilrüba, aşiqinə et vəfa,*
*Gizləmə, aç mütləqa, səndəki bu qəm nədir?*
*Meyl elədim mən sənə, yetişmədim eşqinə,*
*Bəllidi mən misginə: Qəlb nə, xürrəm nədir?*

*Söylədi: -Get, ey adam, durma önümdə müdam,*
*Sən kimi məftun olan Yerdə bugün kəm nədir?*

*Aşiq adamsan yəqin, qəlb çalansan yəqin,*
*Zay olacaq niyyətin, mən sənə həmdəm nədir?*

*Var sevənim – sevməli! Amma demir heç «Bəli»,*
*Düş başa, ey Fərzəli, ahi-dəmadəm nədir.*

Şahin Fazilin heca vəznində qələmə aldığı «Mən» adlı şeiri məgər Şərq aləminin 3 klassik aşiqini bir daha xatırlatmaq, onların əzab-əziyyətli eşq yolunda «aşiq-müəllim», «aşiq-ustad» kimi başqa eşq əhlinə nümunə olduqlarını nəzərə çatdırmaq deyilmi? Şeirdə vurğulanır: Elə şairin özü də həmin 3 aşiqdən «eşq dərsi» keçmişdir. Böyük mübaliğə olsa da, ibrətli müqayisə deyilmi?

MƏN

*Kiməm mən, nəçiyəm mən?*
*Aşiqəm mən, aşiqəm!*
*Başdan-ayağa kimi*
*Sevgi və məhəbbətəm.*
*Sədaqət çeşməsindən*
*Su içmişəm bəs qədər.*

*Müəllimlərim mənə*
*Sevgi dərsi keçiblər.*
*Məsləhət eşitmişəm*
*Onlardan olub məftun,*
*Ustadlarımın adı:*
*Xosrov, Fərhad və Məcnun!*

Bu şeirin orijinalını oxuyaq:

MƏN

*Keəm mən? Çe kareəm?*
*Aşeqəm mən. Aşeqəm!*
*Ze sər ta pa bekolli*
*eşqəmo məhəbbətəm.*
*Mən ab nuşideəm*
*ze çeşmeye-sədaqət,*
*Tədrisəm nəmudeənd*
*məra dərse-məhəbbət.*
*Dər bareye-məhəbbət*
*pənd gereftəm muxtəlef,*
*pənd gereftəm gunagun,*
*name-ostadane-mən:*
*Xosrov, Fərhado Məcnun !!!*

İndi bu şair dostumun dəri dilli poeziya nümunələrini geridə qoyaraq, beş il təhsil aldığı fars dilli bir neçə şeir nümunəsinə göz yetirək. Həmin poetik nümunələrin ikisi şairin «İkinci Divan» kitabındadır. Birinci şeir məşhur İran şairi Nəziri Nişapurinin, ikincisi isə Rudəkinin beytlərindən ilhamlanıb doğulan qəzəl-təzminlər deyilmi?

QƏZƏL-TƏZMİN

*Fəsle-gol aməde, oşşaq ra hoşyar konim,*
*Gəşte-golzar rəvim, seyre-çəmənzar konim.*

*Ektefa mostəhəbəst, motəkəfe-yar şəvim,*
*Hər ke hər çe tələbəd, ma tələbe-yar konim.*

*Canəm əz dəst berəfto, şodeəm dəsttohi,*
*Beforuşim çe məta vey ra xəridar konim?*

*Dustan əz tərəfe-man səzavar şodənd,*
*Nasezara çe səzayist səzavar konim.*

*Mordeye-mey şode əyyaş, çe guyəm xizəd?*
*Ma çenin xofte ra əz xab çe bidar konim?*

*«Eyn»imo, «şin»imo «qaf»im ze sər ta pa ma,*
*İn horufi ra horufi şode təkrar konim,*

*Qəzəle-Hafezo Sədi çe geranmayetərəst!..*
*Qəzəliyyate-do Şirazi ra meyar konim.*

*«Nist dər xoşko təri bişeye-mən kutahi,*
*Çube-hər nəxl ke, mənbər nəşəvəd dar konim».*[*]

*Mən betorki qəzəle-xas sorudəm, Şahin,*
*Qəzəli ra ke təqəllod şode, enkar konim.*

İndi görək öz qələmindən fars dilində çıxmış bu qəzəl-təzmin elə onun özü tərəfindən necə tərcümə olunmuşdur:

*Gəldi gül fəsli, gəl aşiqləri hüşyar eləyək,*
*Gülşənə doğru gedək, seyre-çəmənzar eləyək.*

*Qane olmaq nəyəsə düzgün əməldir əlbət,*
*Kim nə istərsə tələb, biz tələbe-yar eləyək.*

*Canım əldən o təhər getdi ki, qaldım əliboş,*
*Nə sataq ki, bəyənən yarı xəridar eləyək?*

*Dostları biz ki, ləyaqətlə cəzavar elədik,*
*Qeyri-layiq kəsi lazımmı səzavar eləyək?*

*Qurşanıbdır meyə əyyaş, gərəkmi oyana?*
*Heç gərəkmi yuxusundan onu bidar eləyək?*

---

[*] Beyt məşhur İran şairi Nəziri Nişapurinindir.

*«Eyn»o «şin»o «qaf» ilə* qəlb əcəb dolmuşdur,*
*Bu üç hərfi bir hüruyi kimi təkrar eləyək.*

*Elə qiymətli ki, Hafiz ilə Sədi qəzəli,*
*İki şirazlı kəsin şerini meyar eləyək.*

*«Meşəm içrə elə çox ki ağacım, hədsizdir,*
*Minbər olmazsa ağac, hər ağacı dar eləyək».***

*Türk dilində nə təmiz nəzm elədim, ey Şahin,*
*Təqlidanə qəzəli səy ilə inkar eləyək!*

Şahinin fars dilində qələmə aldığı başqa şeiri isə yenə də İranın ən böyük şairlərindən olan Əbu Abdullah Rudəkinin məşhur qəzəlinə müraciətidir ki, həmin şeirin birinci beytini, həm də həmin beytin əsasında Şahin Fazil tərcüməsini olduğu kimi bu məqaləmizdə veririk:

QƏZƏL-TƏZMİN

*«Buye-cuye-Mövliyan ayəd həmi,*
*Yad yare-mehriban ayəd həmi»*
***Əbu Abdullah Rudəki***

*Pah dehid, bağiban ayəd həmi,*
*Suye-golo golsetan ayəd həmi.*

*Ferqəte-u kərd məra nagoman,*
*Həst gomanəm goman ayəd həmi.*

*Can ze tənəm rəfte coda gəşte bud,*
*Can ze vorudəş becan ayəd həmi.*

*Pir nəbudəm, şodeəm pirtər,*
*Yare-cəvanəm cəvan ayəd həmi.*

* Qeyd: «Eşq» kəlməsi əgər ərəb hərfləri ilə yazılarsa (hərflərin adları «eyn», «şin» və «qaf»dır – T.C.) irfani istilah olan «eşq» alınar. «Eşq – təriqət yolunun bünövrəsidir ki, eşq məqamını yalnız həmin yolun tərəqqi mərhələlərini keçmiş kamil insan dərk edə bilər» (Bax: Dr. Seyid Cəfər Səccadi. Fərhənge-estelahat və təbirate-erfani, Tehran, hicri, 1386, səh. 551. Fars dilində).

** Beytin farscası Nəziri Nişapurinindir.

*Ruhe-rəvanəm bodi ənduhgin,*
*Ruhe-rəvanəm rəvan ayəd həmi.*

*Aya, koca rəft pərişaniəm?*
*Şad şodəm, şademan ayəd həmi.*

*Çeşm derəxşəndetərəst, guiya*
*Suye-zəmin kəhkəşan ayəd həmi.*

*Dovro bərəm gəşt sefid, Şahina,*
*Mahe-Xoda z-aseman ayəd həmi.*

Təvazokarlıqdan uzaq olsa da, bildirməliyəm ki, mən fars dilini mükəmməl mənimsəmişəm, çünki 21 yaşıma qədər İranda yaşayıb, Tehranda 12 illik orta məktəbdə təhsil almışam. Biz Bakıya köçdükdən sonra bir il Universitetin İqtisad fakültəsində oxumuş, sonra Şərqşünaslıq fakültəsinə keçirilmiş, bildiyim dilin daha ali dərəcədə mənimsənilməsi zərurətində qalmışam. Təəccüb içərisindəyəm Qubadan Bakıya gəlib Universitetin Şərqşünaslıq fakültəsində oxumağa başladığı vaxt fars dilini, həmçinin əlifbasının bircə hərfini də bilməyən Şahin adlı bir tələbə dil fəzasında nə məharətlə qanad çala bilər ki, möhtəşəm fars ustadlarının şeirlərinə təzminlər yazmağa qadir olsun? Sual da mənim, cavab da özümündür: Fars dilini İran vətəndaşlarının hamısı bilir. Şairlik isə hamının qisməti olmur. Şahində bu qabiliyyət o dərəcə güclüdür ki, o öz ana dilindən başqa qeyri dildə də şeirlər yazır və hələ yazacaqdır da! Necə deyərlər, Allah vergisidir vallah!..

İndisə, yuxarıdakı qəzəl-təzminin tərcüməsi, təbii ki, Şahinin öz tərcüməsində:

*Bağibanım bağə bu an gəlmədə,*
*Yol veriniz, qönçədəhan gəlmədə.*

*Birliyə bir zərrə güman vardımı?*
*Var gümanım ki, güman gəlmədə.*

*Can bədənimdən çıxıb olmuş kənar,*
*Gəlsə o yar sanki o can gəlmədə.*

*Ah qocaldım, olaram mən cavan*
*Görsəm əgər yare-cavan gəlmədə.*

*Ey ki, edən ruhimi qəm-qüssəli,*
*Qoy deyələr ruhe-rəvan gəlmədə.*

*Yar gəlir, getdi pərişanlığım,*
*Şadimanam, yar bu an gəlmədə.*

*Bax gözümə, gör necə də parlayır,*
*Sanki Yerə nur hayan gəlmədə.*

*Oldu ağappaq Yer üzü, Şahina,*
*Rəbbin ayı tapdı məkan, gəlmədə.*

Şahinin «İkinci Divan» və «Beşinci Divan» kitablarında gedən və **«müləmme»** adlanan şeirləri də olduqca çətin bir janra olunan müraciətdir. Bəli, Şahin bu şeir növünə də müraciət etmişdir. Onun «Doğruya doğru» əsərində belə bir qeydi vardır: «Müləmme-klassik şeirdə iki-üç dildə olan poetik nümunədir» (Bax: Şahin Fazil. «Doğruya doğru», Bakı, səh. 20-27). Bəli Şahinin müləmmeləri vardır. O, 1995 və 1996-cı illərdə yazdığı müləmmelərində forma və məzmun baxımından özünün «kəşf etdiyi» üç şeiri ilə həqiqətən fəxr edə bilər:

*Qəzəle-taze neveştən ki, zərurəst emruz,*
*Tazə-tər olmasa hər gül, xəzəlindən nə xeyir?*

*Vəzno bəhro həme gər qafeəyəş niktərəst,*
*Anlaşılmırsa, o şerin gözəlindən nə xeyir?*

*Minevisi bezəbani ke, nəmifəhmani,*
*Səni bir kəs başa düşmür, ğəzəlindən nə xeyir?*

Möhtərəm oxucu, diqqət yetirdinizmi? Bu müləmmenin hər beytində birinci misralar farsca, ikincilərsə azərbaycanca yazılmışdır. Orijinallıq bundadır ki, müəllif birinci misraların tərcümələrini də səhifənin iqtibasında dilimizə çevirmiş, müləmmenin yazıldığı rəməl bəhrinin

qayda-qanununa ciddi əməl etmişdir. Müləmmenin bütövlükdə azərbaycancasını sizə təqdim edirik:

*Bizə vacibdi bugün tazə qəzəllər yaradaq,*
*Tazə-tər olmasa hər gül, xəzəlindən nə xeyir?*

*Tutalım qafiyəsi, vəzni gözəl, bəhri gözəl,*
*Anlaşılmırsa, o şerin gözəlindən nə xeyir?*

*Elə bir dildə yazırsan ki, özündən başqa*
*Səni bir kəs başa düşmür, qəzəlindən nə xeyir?*

İkinci mülə

mme:

*Eşqe-an hur ra dər gur nehanəş kərdəm,*[*]
*Aşiq olsam ona mən bir də əgər namərdəm.*

*Məni bica yerə incitdi o dilbər, mənsə*
*Rəveşe-əhdo sədaqətra beca avərdəm*[**]

*Sali yek mərtəbe gər qosse xorənd-bimarənd,*[***]
*Mən isə çəkmədəyəm qüssə, kədər, qəm hər dəm.*

*Axtarıb tapmalıyam baisi gündüz və gecə,*
*Ruzgərdəm ço oğab, həmço pələng şəbgərdəm.*[****]

*Neyləyim, göydə qəmər tək saralıbdır bənizim,*
*Nəkonid hiç soaləmra çera ruzərdəm?*[*****]

*Əhle-meyxane pəsəndəm nənəmayənd, amma*[******]
*Neçə dərd əhli dedi: Şahin ilə həmdərdəm.*

Üçüncü mülə

mme:

[*] Mən o hurinin eşqini dəfn elədim.
[**] Əhd və sədaqət qayda-qanuna əməl etdim.
[***] İldə bir yol qüssələnən adamlar xəstələnirlər.
[****] Qartal kimi gündüz uçan, pələng kimi gecə gəzənəm.
[*****] Məndən soruşmayın ki, niyə bət-bənizim saralıbdır?
[******] Meyxana əhli məni pəsənd etmir, amma…

*Naşad idim şad oldum, etdi cananəm səda,*[*]
*Nistəm şad, şad gəştəm, kərd cananəm səda.*

*Hər sədanı dinləyib canım səda etməkdədir,*
*Hər sədara guş kərde mikonəd canəm səda.*

*Yaş tökür indi vüsalım, amma hicran – səsləyir,*
*Gerye – vəsləm minəmayəd, leyk hecranəm – səda.*

*Başqa imkanım yox olmuş, qaldı imkanım səsə,*
*Qeyre emkanra nəmibinəm ke, emkanəm – səda.*

*Xəstəyəm, loğmanım hərdənbir səda eylər məni,*
*Mən mərizəm, mikonəd gəh-gah loğmanəm səda.*

*Şahina, vəslim yox artıq, səslədi hicran məni,*
*Şahina, vəsləm berəfto kərd hecranəm səda.*

Şahin dostumun daha bir müləmmesi də vardır ki, onun yuxarıda adını çəkdiyim «Doğruya doğru» kitabındadır və mənə – Tofiq Cahangirə həsr olunmuşdur. Həmin mülənmme müəllif tərəfindən «Mülənmme, yaxud Mülənmmeye-Şahin»[**] adlandırılmışdır ki, şerin epiqrafında bu sözlər yazılıb: «Dostlarını tərk edib bir neçə günlüyə Türkiyə səfərinə getmiş Tofiq Cahangir qardaşımızın xiffəti münasibəti ilə». İndi sizə münsərih bəhrində yazılmış «Mülənmmeye-Şahin»i təqdim edirəm:

*U ke rəfiqe-mənəst,*
*Pire-sədiqe - mənəst.*

*Farscanı əla bilir,*
*Varmı bilən böylə pir?*

*Həst şərif adəmi,*
*Şeyx şenasəm həmi.*

[*] Bu mülənmmenin hər beytinin ikinci misrası birinci misranın tərcüməsidir.

[**] Şahin yazır: «Mən bu şeiri fars və azərbaycan dillərində qələmə aldım, bu şeirdə iki şeir yazdım. Mənə xas olan təvazökarlıqdan uzaq olsa da, onu «Mülənmeye-Şahin» adlandırdım. Çünki mənə qədər heç bir ərəb, fars və türk şairi bu düzülüşdə mülənmme yazmağa cəhd etməmişdi» (Həmin kitab, səh. 1027).

*Qəlbi təmizdən təmiz,*
*İzzi əzizdən əziz.*

*Nəcme-derəxşənde şod,*
*Morşede-in bənde şod.*

*Şahinə yol göstərir,*
*Şerinə qiymət verir.*

*Kovno məkandideəst,*
*Pire-cəhandideəst.*

*Etdi səfər çox yana,*
*Türkiyəyə, İrana…*

*Sohbəte-şirine-u*
*Kərd məra dustcu.*

*Helmini çox xoşladım,*
*Elmini alqışladım.*

*Aleme-xavərşenas,*
*Elmo ədəbra əsas.*

*Sözdə kəsər sahibi,*
*İşdə hünər sahibi.*

*Fazelo fərzaneəst,*
*Aşeqe-cananeəst.*

*Beyni işıq, zehni nur,*
*Tofiqə yaddır qüsur.*

*Sərve-golestane-mast,*
*Zinəte-bostane-mast.*

*Dosta sədaqətlidir,*
*Xeyli səxavətlidir.*

*Tovfiqe-İrandust,*
*Torko həm əfqandust.*

*Gəzsə də Avropanı,*
*Azəribaycan – canı!*

*Yavəro həmkare-mən,*
*Sərvəro sərdare-mən.*

*Qəlbi geniş, fəhmi çox,*
*Rəhmi böyük, nəfsi tox.*

*Fərde-həkiməst u,*
*Mərde-həliməst u.*

*Ülfəti baldan şirin,*
*Xaliqinə afərin!*

*U ke rəfiqpərvərəst,*
*Həm zəro həm zərgərəst.*

*Nərd oyununda dərin,*
*Ustadına afərin!*

*Bazikone-qaderəst,*
*Moqtədero maherəst.*

*Varmı onun bənzəri?*
*«Cütləyib» atmaz zəri.*

*Mərde-mozəyyənsoxən,*[*]
*Zinəte-hər əncomən.*

*Dərdimə həmdərd odur,*
*Gördüyüm ən mərd odur.*

[*] Təbriz və Tehrand la yaşadıqları üçün uzun illər ərzində Tofiq Cahangirin atası İmranın soyadı Mozəyyənpur olmuşdur – Ş.F.

*Ust məra eftexar,*
*Mikeşəməş entezar.*

*Xoşxahıyam Tofiqin,*
*Məddahıyam Tofiqin.*

*Nistəm ər nesfe-u,*
*Mikonəməş vəsfe-u.*

*Sirrimə sirdaş odur,*
*Şahinə qardaş odur.*

*Duste-pəsəndideəm,*
*Ura həsən dideəm.*

*Qeyriyyə tay eyləmə,*
*Bənzəri yox heç kimə.*

*Aşeqe-şire-Xoda,*
*Peyrove-şahe-vela.*

*Mən sanıram Tofiqi*
*Rəbb şirinin aşiqi!*

Düşünürəm ki, Şahin Fazil və onun şeirləri haqqında yazdıqlarım hələlik kifayətdir. Görək başqaları nə deyir:

**Akademik Bəkir Nəbiyev:** «Şahin Azərbaycanın son illərdə sıraları seyrəlmiş, indi az qala barmaqla sayılan kamil qəzəlxanlardan biri, yaradıcılıq fəallığı baxımından onların arasında xüsusilə seçilən şairdir» (Bax: Şahinin qanadları. Azərbaycan ədəbi-bədii jurnal, №11, Bakı, 2006, səh. 174-182).

**Professor Qəzənfər Kazımov:** «Ənvər Nəzərli Şahin Fazili «novator şair» adlandırmış, onun «əruzun bütün bəhr və janrlarında» şeir yazdığını bildirir (O.S.Kazımov. Şahin Fazilin «Divan» Xəmsəri və onun dili haqqında. Dilçilik İnstitutunun Əsərləri, Bakı, № 2, 2015, səh. 187).

**Professor Sabir Əliyev:** «Açıq demək lazımdır ki, Şahin az qala qafiyə milyonçusudur; müqəffa (qafiyəli-T.C.) sözlər tapmaq onun əlində, təkrar edirəm, mum kimidir… Bu kitabı (Şahin Fazilin birinci Divan kitabını-

T.C.) oxuyanda istər-istəməz adam belə düşünür ki, Şahinin Divanı heç kəsin Divanından əskik deyil. Şahin bu tipli kitab üçün ancaq təhsinə layiqdir. Şahin bizim çoxdilli şairimizdir; O, Azərbaycan türkcəsi ilə bərabər farsca və dəri dilində müxtəlif formalarda şeirlər yazır. Belə yaradıcılıq yolunda ona uğurlar diləyirik. Şair hər şeyi düz deyir, bircə şeyi səhv deyir:

*«Hanı şerimdə izafət, hanı elmimdə xəta?*
*Şahinin qiymətini Azəribaycan bilmir».*

Xeyir, Azərbaycan xalqı Şahin Fazilin qədrini də bilir, qiymətini də verir. Təki hamının qəzəli Şahininki qədər sadə olaydı» (Bax: Sabir Əliyev. Şahin Fazil Divanının poetikası. «Hikmət Elmi Araşdırmalar toplusu, Bakı, 2005, səh. 210-222).

**Şair-qəzəlxan Ənvər Nəzərli:** «Şahin Fazil klassik poeziyamızın, təkcə türkdilli deyil, həm də farsdilli poeziyamızın bilicisi olmaqla yanaşı, klassik Azərbaycan ədəbi ənənələrini özünəməxsus təfəkkür tərzi ilə davam etdirən novator şairdir… Qələm Şahin Fazilin əlindən düşmür (Bax: Ənvər Nəzərli. Şahin Fazil, Üçüncü Divan, Bakı, 2008, səh. 3-8).

**Filologiya üzrə fəlsəfə doktoru Qiymət Məhərrəmli:** «…Görkəmli şərqşünas və tarixçi alim, tədqiqatçı və şair Şahin Fazil üçün ərəb-fars izafət tərkiblərindən istifadə etməklə qəzəllər yazmaq çətin işdir? Əsla yox!.. Şair ərəb, fars və dəri dillərində neçə-neçə sanballı şeirin müəllifidir… Sübut etməyə çalışmışdır ki, o bu dilləri yaxşı bilir və həmin dillərdə yazıb-yaratmaq onun üçün heç də çətin deyildir. Sadəcə olaraq, ana dilinə bəslədiyi sonsuz sevgi və ehtiram hissi şairi yalnız və yalnız təmiz, saf Azərbaycan dilində yazıb-yaratmağa sövq edir. Və heç şübhəsiz, Şahin Fazil bu ülvi amala ömrünün sonunadək sadiq qalacaqdır» (Bax: Qiymət Məhərrəmli. Şahin Fazil Divanı və klassik ədəbi ənənələr, Bakı, 2007, səh. 41).

Beləliklə, xüsusən qeyd edirəm ki, Şahin Fazil tələbəlik illərindən sonra illərlə Əfqanıstanda, dəfələrlə İranda olmuş, qələmə aldığı hər iki dissertasiyanı müxtəlif dilli mənbələrdən ciddi istifadə etməklə müdafiə etmiş, üç dilin birləşməsindən yaranan (ərəb, fars və türk) osmanlı dilini də diqqətlə öyrənmiş, nəticədə öz doğma dilindən əlavə dəri və farsca onlarla şeir nümunələri yaratmışdır.

**Mübariz AĞALARLI**
*Tarix üzrə fəlsəfə doktoru, dosent*

# AZƏRBAYCANIN ORTA ƏSRLƏR BEYNƏLXALQ MÜNASİBƏTLƏR TARİXİ MƏSƏLƏLƏRİ PROFESSOR ŞAHİN FƏRZƏLİBƏYLİNİN ƏSƏRLƏRİNDƏ

Qədim tarixə və dövlətçilik ənənələrinə malik olan Azərbaycanın dövlətçilik tarixi çox zəngindir. Qədim dövrlərdən başlayan bu dövlətçilik ənənələri tarixin müxtəlif mərhələlərində inkişaf etmiş, formalaşmış və dünya tarixində olduqca əhəmiyyətli iz buraxmışdır. Məlumdur ki, orta əsrlər dövrü Azərbaycan dövlətçilik tarixinin intibah dövrüdür. Bu dövrü Azərbaycan tarixində dövlətçilik ənənələrinin bərpası, inkişafı və möhkəmlənməsi dövrü kimi xarakterizə etmək olar. Bu dövrdə yerli siyasi hakimiyyəti ehtiva edən Eldənizlər, Cəlairilər, Qaraqoyunlu, Ağqoyunlu, Şirvanşahlar və Səfəvi dövlətlərinin yaranması və fəaliyyəti nəticəsində ölkəmizin beynəlxalq münasibətlər sistemində siyasi, iqtisadi mövqeyi və rolu güclənmiş, onun Avropa və Şərq ölkələri ilə qarşılıqlı münasibətləri daha da genişlənmişdir.

Dünya tarix elmində orta əsrlər dövrü Azərbaycan dövlətçilik tarixi məsələlərinə münasibət əksər hallarda qeyri-obyektiv xarakter daşımışdır. XX əsrdə siyasi və ideoloji sifarişlər əsasında yazılan dünya tarixçiliyi Azərbaycanın yerli dövlətçilik ənənələrini inkar etmişdir.

Orta əsrlər dövrü Azərbaycan dövlətçilik tarixinin olduğu kimi, obyektiv əsaslarla və Azərbaycanın milli və dövlətçilik maraqları konteksində araşdırılmasında professor Şahin Fərzəlibəylinin böyük xidmətləri olmuşdur.

**Professor Şahin Fərzəlibəylinin istər Azərbaycanın sovet dövrü, istərsə də müstəqillik dövründə orta əsrlər tarixi ilə bağlı yazdığı elmi tədqiqat əsərləri tariximizin qaranlıq səhifələrini aydınlatmağa, həmçinin obyektiv şəkildə tədqiq etməyə imkan yaratmışdır.**

Onun Azərbaycanın orta əsrlər dövrü dövlətçilik tarixi məsələləri, Qaraqoyunlu, Ağqoyunlu, Səfəvilər və Şirvanşahların timsalında Azərbaycan dövlətlərinin beynəlxalq əlaqələri, xüsusilə, bu dövrdə türk dövlətləri ilə siyasi münasibətləri, diplomatik əlaqələri, həmçinin Azərbaycan dövlətlərinin quruluşu, idarəçilik sistemi, xarici siyasət fəaliyyətini həyata keçirən idarə və təşkilatlar, elçilik sistemi və digər məsələlərlə bağlı apardığı tədqiqatlar Vətən tarixşünaslığında olduqca əhəmiyyət daşımaqdadır.

**Şahin Fərzəlibəylinin fars dilindən tərcümə etdiyi və geniş şərhləri əhatə edən Səfəvilər dövrü Azərbaycan tarixinin ensiklopediyası hesab edilən İsgəndər bəy Münşi Türkmanın "Tarixe - aləmarayi - Abbası", Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsərləri mənbəşünaslıq sahəsində xüsusi çəkiyə malikdir.**

Onun "Azərbaycan XV-XVI əsrlərdə: Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri üzrə", "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə", "XV əsr Azərbaycan dövlətlərinin quruluşu" monoqrafiyaları və yüzlərlə elmi məqalələri Azərbaycan tarixşünaslıq elminin zənginləşməsində mühüm rola malikdir.

**Professor Şahin Fərzəlibəyli elmi tədqiqat əsərlərində həmişə Azərbaycanın dövlətçilik ənənələrini önə çəkmiş, bu dövlətçiliyin qədimliyini, yerli və milli əsaslara söykəndiyini, dövlətyaratma məsələlərində yerli azərbaycan etnosunun əsas amil olduğunu, bu dövlətlərin beynəlxalq münasibətlərdə əhəmiyyətli rol oynadığını dəfələrlə elmi əsaslarla sübut etmişdir.**

Görkəmli alim XV-XVI əsrlər dövrünü Azərbaycanda dövlətçilk tariximizin intibah dövrü hesab edir və bu dövrdə fəaliyyət göstərən dövlətləri bölgənin aparıcı dövlətlərindən olduğunu önə çəkir.

Şahin Fərzəlibəyli "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" monoqrafiyasında yazır: "XV əsrdə Qaraqoyunlu və Ağqoyunlu dövlətlərinin, XVI əsrdə isə Səfəvi dövlətinin yaranması və onların ayrı-ayrılıqda Osmanlı imperiyası ilə münasibətləri, həmçinin göstərilən dövr hadisələrində Şirvanın rolu yalnız Azərbaycanın deyil, eyni zamanda bütün Zaqafqaziya və Yaxın Şərq ölkələrinin tarixində mühüm rol oynamışdır" (Şahin Fazil Fərzəlibəyli. Azərbaycan və osmanlı imperiyası: XV-XVI əsrlərdə. Bakı, 1995. səh. 120).

Görkəmli alim elmi tədqiqatlarında haqlı olaqraq bu elmi qənaətə gəlmişdir ki, XV-XVI əsrlərdə Azərbaycan dövlətləri təkcə Azərbaycanda deyil, həmçinin Cənubi Qafqaqz və Yaxın Şərqin tarixində də mühüm rol oynamışdır.

Professor Şahin Fərzəlibəyli orta əsrlər dövründə Azərbaycanda elçilik sistemi, dövlət aparatında diplomatik institutların mövcudluğu, səfirlər və səfarətxanalar haqqında olduqca əhəmiyyətli tədqiqatlar aparmışdır.

**Şahin Fərzəlibəyli orta əsrlər dövrü Azərbaycan tarixinin tədqiqatçısı olmaqla yanaşı, eyni zamanda dövlətçilik tariximizin, xüsusilə orta əsrlər dövrü Azərbaycan tarixinin təbliğatçısı və himayəçisi ol-**

**muşdur. Görkəmli alim istər ölkə daxilində, istərsə də beynəlxalq səviyyədə təşkil olunan konfrans və elmi tədbirlərdə Azərbaycan tarixinin təbliğ olunmasında yaxından iştirak etmişdir.**

2009-cu ilin noyabr ayında elmi rəhbərim Şahin Fərzəlibəyli ilə birgə iştirak etdiyim İstanbul şəhərində keçirilən "Səfəvilər və Şah İsmayıl" beynəlxalq elmi konfransında o, "Sultan Səlim Yavuz və Şah İsmayıl Səfəvi tərəfindən Çaldıran Savaşı öncəsində yazılmış beş tarixi məktub haqqında" adlı məruzə ilə çıxış edərkən necə ürək ağrısı ilə Səfəvi-Osmanlı münaqişələrindən danışmasının və bu müharibələrin türk dünyası üçün acı nəticələrini təəssüf hissi ilə qeyd etməsinin canlı şahidi olmuşdum. **Bu çıxış Şahin Fərzəlibəylinin Azərbaycana, Türkiyəyə, bütün türk dünyasına bağlılığının bariz nümunəsi idi. Bu simpozyumun açılışında Şahin müəllimin Azərbaycan nümayəndə heyətinin adından çıxışı zamanı dediyi bir qardaşlıq şeiri heç vaxt yaddaşımdan silinməyəcək:**

*Qəhrəman türklərin şərafətinə,*
*Salamlar olsun.*
*Əzminə, izzinə, şücaətinə,*
*Salamlar olsun.*

*İstanbul olubdur əzəldən mətin,*
*Onu fəth eləmək çətindən çətin...*
*Ulu diyarına fateh Mehmetin*
*Salamlar olsun.*

*Dəvət Türkiyədən, səfəri - bizdən,*
*Yan olsun yağının nəzəri bizdən,*
*Mavi Mərmərəyə Xəzərimizdən*
*Salamlar olsun.*

Şahin Fərzəlibəylinin orta əsrlər dövründə Azərbaycan dövlətlərinin digər türk dövlətləri ilə qarşılıqlı siyasi münasibətləri istiqamətində apardığı qiymətli araşdırmaları, həmçinin türk dünyası ilə bağlı dostluq və qardaşlıq hisslərini ehtiva edən onlarla şeir və ədəbi nümunələri, alimin türk dünyasına sevgisini ifadə etməklə yanaşı, həmçinin türk xalqlarının mənəvi birliyinin qorunmasında mühüm rol oynamışdır.

Davamçılarının elmi fəaliyyətində və mənəvi dəyərlərinin inkişafında xüsusi yeri olan görkəmli alim, dəyərli insan Şahin Fərzəlibəyliyə bundan sonra da sağlam ömür və yeni-yeni yaradıcılıq uğurları arzulayıram.

**Babək (Araş) İFTİXARİ**
*Tarix üzrə fəlsəfə doktoru*

## AZƏRBAYCANLAR ARASINDA MƏDƏNİ KÖRPÜ

Dünyanın müxtəlif ölkələri və xalqları arasında mövcud olan mədəni münasibətlərin müsbət funksiyası daim vətənpərvər və sülhsevər insanlar tərəfindən dəstəklənmiş və vurğulanmışdır. Bu vacib ünsiyyət mövzusu üzərində dərindən düşünməklə onun ölkələr arasında olan hərtərəfli münasibətlərdə əsas rola malik olduğuna inanırıq. Müasir tarixi dövrdə parçalanmış Azərbaycan ərazisini və xalqını birləşdiyməyə doğru aparan demokratik və insani yollardan biri də dünya azərbaycanlıları arasında mədəni körpülərin gücləndirilməsindən ibarətdir. Görkəmli alim, şair və müəllim, professor Şahin Fazil parçalanmış Azərbaycanlar arasında mədəni əlaqələrin tədqiqi və təşviqi üçün bariz şəxsiyyətlərdən biridir. Bu gün müxtəlif səbəblərdən azərbaycanlılar yaşayan ölkələr arasındakı münasibətlər haqqında çox yazmaq olar. Məhz belə təzadlı bir zamanda Ş. Fazilin zəngin yaradıcılığı və xoşməramlı niyyətləri həqiqətən onun bu mövzuya böyük səmimiyyətlə yanaşdığından xəbər verir.

**S. Fazilin yaratdığı divanlarında, səfərnamələrində, məqalələrində və tarixi tədqiqat əsərlərində onun insanlara pozitiv baxışları, Azərbaycan xalqına dərindən hörməti, itirilmiş torpaqlarımıza dair həsrəti, düşmənlərimizə qarşı nifrəti, qonşu ölkələrə və xalqlara isə olan xoş niyyəti tamamilə öz əksini tapır. İranı dəfələrlə şairanə və elmi seyr obyektinə çevirən Şahin Fazil çoxları kimi adi bir seyrçi olmamış, oranın tarixini dərindən öyrənmiş, nəticədə böyük həcmli yeni bir səfərnamə kitabının (İran səfərnamələri Təkmilləşdirilmiş III nəşri) müəllifi olmuşdur. Hörmətli alim 2001-ci, 2013-cü və 2017-ci illərdə çap etdirdiyi 3 cilddən ibarət "İran səfərnamələri"ndə (30 səfərnamə) əks etdirdiyi xatirələrini, görüşlərini və dərin təəssüratlarını öz xırdalıqları ilə oxucuya təqdim edir. Ş. Fazil İranda olarkən Azərbaycanın müxtəlif şəhərlərində, o cümlədən Təbizdə, Ərdəbildə, Urmuda, Marağada, Zəncanda, Həmədanda və başqa şəhərlərdə keçirilən Beynəlxalq Konfrans və Simpoziumlarda iştirak edərək, bədii şəkildə öz xatirələrini bir yerə toplamıəşdır.**

Şahin Fazil «Urmiyə torpağina heyran olubdur Şahin» adlı səfərnamidə qədim Azərbaycan haqqındakı təəssüratına aşağıdakı sözlərlə başlayır:

"Gözlərimin önünə üç Azərbaycan gəldi: İrandakı Şərqi və Qərbi Azərbaycan ostanları, bir də mənim Azərbaycan Respublikam. On dördüncü İran səfərnaməmə göz gəzdirirəm: "Bir vaxtlar dünyada bir Azərbaycan vardı - İranın şimal-qərbindən başlayıb İrəvan, Naxçıvan, Gəncə və Qarabağ torpaqlarınadək uzanan böyük bir Azərbaycan. Hal-hazırda isə üç Azərbaycan mövcuddur: Qərbi Asiyada yerləşən İran ostanları və Cənubi Qafqazdakı Azərbaycan Respublikası. 1938-ci ildə İranda keçirilmiş inzibati ərazi bölgüsünə əsasən bu ölkə ostanlara (əyalətlərə) bölündükdə İrandakı Azərbaycan «Şərqi Azərbaycan» və «Qərbi Azərbaycan» ostanlarına ayrılmış oldu»".

Ş. Fazil Ərdəbilin Savalan dağından və Təbrizin El gölündən yazmaqla bərabər yaralı Qarabağını da tez-tez xatırlayır, yadların xəyanət və cinayəti nəticəsində işğal olunan doğma torpaqlarımızın həsrətindən söz açır.

*«Dilbər Qarabağ dərdi mənim qəddimi əydi,*
*Çəkmiş vətənim gör nə cəfa yad əlindən».*

Qocaman Savalan dağı da Şahinin müşahidə obyektlərindən biridir:

*Savalandır,*
*Zirvəsi övc alandır,*
*İlhamım, yetiş dada,*
*Şahini havalandır.*

**Cənubi Azərbaycanın şəhər və kəndlərini sevgi ilə vəsf edən şairin yazdıqlarından: "Həmişəki kimi qələmim əlimdə, dəftərim dizimin üstündədir. Cənubi Azərbaycandakı yaşayış məntəqələrinin adları mənim üçün toponimik baxımdan maraqlıdır: Zərgər, Qaraqoçlar, Göytəpə, Gönpapaq, Fuladlı, Odlu, Muradlı, Xoruzlu, Bəybağlı, Narqışlağı, Əkbər Davud, Əjdərli, Sarı Nəsir, Nəcəfqulukənd, Şəkərab, Keçəllər, Arançı, Germi, Şəhrəke-vəliəsr, Onbirbəyli, Dizac, Onqut, Ağdaş, Əli Məhəmmədli, Hacı Əhməd kəndi, Nəsrulla kəndi, Budaqlı, Qalabərzənd, Əmir kəndi, Alışansuyu, Seyidlər, Keçibulağı, Rəzi. Meşkin şəhəri sağ tərəfdə qaldı. Nağılçılar demiş, sağ getdik, sol getdik, gəlib Ərdəbilə çatdıq".**

**Şair başqa təəssüratlarında Azərbaycan şəhərlərinə və şəxsiyyətlərinə bəslədiyi səmimi hisslərini belə aşıqlayır. "... Cənubi Azər-**

**baycandan Bakıya gələn üç şair qardaşımız. Yadıma hətta o şairlərə yazdığım və orada onlara oxuduğum şe’rimin bir neçə beyti də düşdü. «İkinci Divan» kitabımda getmiş həmin qəzəl budur:**

*"Şövqüylə vüsalın necə sirdaş gəlibdir,*
*Olsun gözüm aydın, gözümə yaş gəlibdir.*

*Əlbəttə, sevinc yaşları axmaqda gözümdən,*
*Qardaş elinə bir neçə qardaş gəlibdir.*

*İlham pərisi qeybə çəkilmişdi yanımdan,*
*Vəsf etməyə eşqi o qələmqaş gəlibdir.*

*Əflakə ucalmış yenə vəslin başı, amma,*
*Hicrin başına dağ uçulub, daş gəlibdir.*

*Təsvir eləyim mən nə təhər? Qəlbimiz içrə,*
*Sevdasını nəqş etməyə nəqqaş gəlibdir.*

*Çox gəlsə də izzətli qonaqlar bizə, amma*
*Təbrizli qonaqlar hamıdan baş gəlibdir.*

*Şahin yenə təkrar eləyir öndəki sətri:*
*Şövqüylə vüsalın neçə sirdaş gəlibdir".*

Ş. Fazil Azərbaycanın bir sıra şəhərləri, görkəmli şəxsiyyətləri və gəzməli-görməli yerləri haqqındakı poetik hissiyyatını müxtəlif səfərnamələrində belə ifadə edir:

*«Ərdəbildə çox kəsə məlumdur eşqim, qardaşım».*

***

*«Ərdəbil bir də çağırmış məni, getmək vacib!».*

***

*«Şəhriyar ölsə də sağdır, dirilik şairidir.».*

***

*«Nəğməsi bitməz-tükənməz nəğməkardır Şəhriyar».*

***

*«Təbrizə gətirmiş bizi ustad Füzuli».*

***

*«Dərviş kimi çox gəzdim, acgöz təki çox baxdım*
*Rəştə, Quma, Təbrizə, Zəncanə məhəbbətlə».*

Şahin Fazil 2005-ci ilin may ayında Əfzələddin Xaqaninin şərəfinə Urmiyə şəhərində təşkil edilmiş Beynəlxalq Elmi Konfransda iştirakı zamanı iştirakçıların təəccübünə səbəb olan bir qitə oxudu. Həmin qitə Nizami Gəncəvinin Xaqani haqqında yazdığı matəm şerinin-ağının təsiri altında fars dilində yazılmışdı. Nizami buyurur:

*«Həmigofiəm ke Xaqani dəriğaguye-mən başəd,*
*Dəriğa, mən şodəm əknun dəriğaguye-Xaqani»**

Ş. Fazil həmin beytə əsaslanaraq, öz qitəsində Xaqaninin onda oyatdığı böyük təəssüratını fars dilində belə ifadə etmişdi:

*«Xoda aməd bexabəm, Əfzələddin-ra beporsidəm»,*
*Begofta: «Cəm ′gəşte dər beheşt orduye-Xaqani».*

*Kəlaməş həmço ətre-gol moəttər saxt donya-ra,*
*Məra həm mikeşəd dər bağe-rezvan buye-Xaqani.*

*Pəsəndidəm mən ahuye-qəsayedra, vəli goftənd:*
*«Moyəssər şod be Qaani * fəqət ahuye-Xaqani!*

*Həme əbyate-vey dorro sədəf, ləlo tela, guyi*
*Xodəş rəft-o vəli baqi bemand incuye-Xaqani.*

*Təvəccoh-ra, negahəm-ra nəmiduzəm be hosne-gol,*
*Təvəccoh suye-Xaqani, negahəm suye-Xaqani.*

*Nezami, ey nezamoş-şe′r, didi Əfzələddinra!*
*Bezudi mən həmixahəm bebinəm ruye-Xaqani».*

---

* *«Deyirdim mən ki, Xaqani deyər ağı ölərkən mən,*
*Təəssüflər ki, mən yazdım bugün Xaqaniyə ağı».*

* *Qacar dövrünün məşhur qəsidəçi şair Mirzə Həbibullah Qaani nəzərdə tutulur-B.İ.*

Xatırladırıq ki, Ş. Fazilin "Beşinci Divan" kitabı artıq çap üçün nəşriyyata təhvil verilmişdir. Müəllif yazır: "Bu günlərdə həmin qitəmi bir də oxudum və onu öz dilimizə tərcümə etdim". Hörmətli oxucular, yuxarıda yer tutmuş həmin qitənin tərcüməsi belədir:

*Yuxumda gördüm Allahı, soruşdum Əfzələddini,*
*Dedi: "Cənnətdə cəm olmuş böyük orduye- Xaqani".*

*Gül ətri var kəlamında və dünyanı ətirlətmiş,*
*Məni həm çəkmədə cənnət baqında buye-Xaqani.*

*Xoşum gəlmiş qəsidə ahusundan, dindilər böylə:*
*Olub Qaaniyə qismət fəqət ahuye-Xaqani.*

*Onun hər beyti dürr olmuş, sədəf olmuş və olmuş zər,*
*Özü getmişsə də, baqi qalıb incuye-Xaqani.*

*Məni gül hüsnü çəkmir bir daha, çünki səbəb məlum:*
*Bütün diqqət yönəlmişdir dəmadəm suye-Xaqani.*

*Nizami, Əfzələddinlə görüşdünmü behest içrə?*
*Görünsün kaş mənə həm tezlik ilə ruye-Xaqani.*

*21.02.2020*

Diqqət yetirdinizmi? 2005-ci ilin may ayında fars dilində yazdığı qitəsini Ş. Fazil 15 ildən sonra öz dilinə, nəhayət ki, çevirdi. Mən Babək İftixari şahidəm ki, müəllifin tərcüməsi on-onbeş dəqiqə ərzində baş tutmuş, şəxsən mənin özümdə belə tez yazıldığına görə dərin təəssürat doğurmuşdu.

**Səfərnamələrində öz görüş və təəssüratlarını səmimiyyətlə nəzərə çatdıran "səyyah Şahin" İranın müxtəlif yerlərində olarkən görüşdüyü Cavad Heyət, Əliəsgər Şe'rdust, Cəlil Təclil, Doktor Xəlici, Mahmud Pədidə, Rəhim Çavuş Əkbəri, Payegozar, Əsgər Şahi, Həbib Yəzdani, Şəkiba, Ehsan Məhəmmədi, Şəhryar Neməti və bir çox başqa şəxsiyyətlərlə görüşlər keçirmişdir. Şair Azərbaycanın Xamnə kəndi haqqında yazır: "Xamnə kəndi. Mirzə Fətəli Axundovun, ustadım Mübariz Əlizadənin və rəhbər vəzifəsini daşıyan ağaye-Xamneyinin**

**ana yurdu Xamnə". Ş. Fazil İran rəsmiləri ilə görüşünü də təsvir etməyi unutmur.**

**Hörmətli şairin öz ana dilinə bəslədiyi sevgisi heç vaxt tükənmir. O, qəzəllərində əcnəbi sözləri işlətməklə fəxr edən qəzəlxanlara və Azərbaycan dilini qəlizləşdirməyə çalışan şairlərə belə xitab edir:**

***"Niyarbəxş əyuri ki, tərq-bərq olacaqdır,***
***Saki-çeşmi-nitafi-tü mehri-talei-pünhan..."***

***Mən öz vicdanıma and içə bilərəm ki, bir belə kəlami-əbədzindəni indiyədək Azərbaycanın bərguzidə şairlərinin heç biri səhneyi-mətbuata çıxarmayıbdır. Mərhəba, Mərhəba! Siz öləsiz, qiyamət eləyib..."***

***Cəlil Məmmədquluzadə***

QƏZƏL

*Söyləsəm gərçi sizə "sübh"ə "səhər" söyləməli,*
*Demərəm mən başa "sər", daşə "həcər" söyləməli.*

*Nə gərəkdir ki, qatılsın dilimə yad sözlər?*
*"Şövhər"in "şövh"ü atılsın, ərə "ər" söyləməli.*

*Özü yoxdur dili yoxdursa əgər bir xalqın,*
*Oğula hansı hüquq ilə "pesər" söyləməli?*

*Inciməzmi balasından ata adlansa "əbu"?*
*Nə "əbu" söyləmək olmaz, nə "pedər" söyləməli.*

*Neçə əyyam keçib, öylə ağacdır ağacım,*
*Ağaca hansı əsas ilə "şəcər" söyləməli.*

*Əruzun ləzzətini türk dili vermir guya,*
*Dilimə, bilməyirəm mən, niyə şər söyləməli?*

*Çox qəlizl dilli qəzəlxanə mən irad etdim:*
*Öz sözüm var, niyə "balta"yə "təbər" söyləməli?*

*Mən dedim onlara "molla", deyəsən incidilər,*
*Hələ yumuşaq dedim, ondan da betər söyləməli!*

*Şahina, zay edəcəkdirsə dili şairlər,*
*Dilimə türk dili yox, "həftəbecər" söyləməli!*

*1994*

Şairin başqa bir qəzəlini də sizə təqdim edirəm:

QƏZƏL

*Çox "qəzəlxan" özünə indi qəzəlxan söylər,*
*Titrəyər, amma nə üçün buna "lərzan" söylər?*

*Bir-iki farsca, ərəbcə sözü əzbərləyərək,*
*"Əndəlib" bülbülə söylər, çörəyə "nan" söylər.*

*Izah etsin bizə bir yol, bacarıqdırmı bu ki,*
*Dirilik çeşməsinə "çeşməyi-heyvan" söylər?*

*Layiq olsun özünə söylədiyi sözlər onun—*
*"Dana" söylər bilənə, bilməzsə "nadan" söylər.*

*Bilmirəm mən bu savaddır, ya savadsızlıqdır!—*
*Suya "ab", torpağa "xak", kipriyə "müjgan" söylər.*

*Batsın oxlar canına kaş o qəzəl söyləyənin,*
*Deməyib ox, nə bilim "tir", ya "pejkan" söylər.*

*Qoy lüğətsiz başa düşsün oxuyanlar qəzəli,*
*Bunu Şahin o "qəzəlxanlara" çoxdan söylər.*

*1986*

Ş. Fazilin ana dilimiz haqqında söylədiyi məzmunlu qəzəlini oxuyarkən Güney Azərbaycandan olan tarixçi alim doktor Məhəmməd Tağı Zehtabinin eyni məzmunda söylədiyi bir şeri yadıma düşdü. Onun 1946-cı il azər ayının 24-də (dekabrın 15-də) Pəhləvi rejimi tərəfindən türk dilində təhsilə və məişətdə hətta danışığa belə yasaq qoyulduğu ədalətsizliyə dair yazdığı "Sən osan, mən də buyam" şeri ilə Ş. Fazilin 1986 və 1994-cü illərdə yazdığı qəzəllər arasında eyni məzmun olduğunu görürik.

*Su deyibdir mənə əvvəldə anam, "ab" ki yox.*
*Yuxu öyrətdi uşaqlıqda mənə, "xab" ki yox.*
*İlk dəfə ki, çörəgi verdi mənə, "nan"demədi.*
*Əzəlində mənə "duzdanə", nəməkdan demədi.*
*Anam "əxtər" deməyibdir mənə, ulduz deyib o,*
*Su donanda deməyib "yəx"di, bala, buz deyib o.*
*Qar deyib, "bərf" deməyib, "dəst" deməyib, əl deyib o,*
*Mənə heç vaxt "biya" söyləməyib, gəl deyib o.*
*Yaxşı xatırlayıram, yaz günü axşam çağılar,*
*Bağçanın günçıxanında ki, ılıq gün yayılar,*
*Gəl deyərdi darayım başıvı, ey nazlı balam,*
*Gəlməsən gər başıvun astaca zülfün dararam.*
*O deməzdi ki, "Biya şane zənəm bər sər-to,*
*Gər nəyayi bezənəm şane sərе- xahəre-to".*
*Bəli, daş yağsa da göydən, sən osan, mən də buyam,*
*Var sənin başqa anan, vardı mənim başqa anam.*
*Özümə məxsus olan başqa elim vardı mənim,*
*Elimə məxsus olan başqa dilim vardı mənim.*
*İstəsən qardaş olaq, bir yaşayaq, birlik edək,*
*Veribən qol-qola bundan sora bir yolda gedək.*
*Əvvəla, özgə küləklərlə gərək axmayasan,*
*Saniyən, varlığıma, xalqıma xor baxmayasan.*
*Yoxsa gər zor deyəsən, millətimi xar edəsən.*
*Gün gələr səhfə çönər, məcbur olarsan gedəsən.*

**Möhtərəm oxucular, məqaləmi Şahin Fazilin 2006-cı ildə Tehranda yazdığı bir qəzəli ilə başa çatdırıram:**

## QƏZƏL

*Min şükürlər, deyirəm mən yenə dildarə salam*
*Və yarım Azəribaycandı, gözəl yarə salam.*

*Ey mənim odlu diyarım, məni odlandırdın,*
*Vətənim, müntəzirəm səndəki rüxsarə, salam.*

*Neçə gündür ki, gözüm səndən uzaq olmuşdu,*
*Tutiya ol gözümə, eylə ona çarə, salam.*

*Axı, viranə olan qəlbi kim abad eylər?*
*Onu abad eləyən sevgili me'marə salam.*

*Şahdağın seyrinə dalmaq dilərəm ləzzətlə,*
*Döşdəki gül-çiçəyə, zirvədəki qarə salam.*

*Etməyim mən nə təhər eşq Qarabağ torpağıma,*
*Deməyim mən nə sayaq Qudyala, Qoşqarə salam?*

*Ey Vətən, başə yetirdim salamı, sən də elə*
*Qoca Şahin kimi bir köhnə vəfadarə salam.*

**Hacı Rafiq ƏLİYEV**
*“Vahid” ədəbi məclisinin sədri,*
*“Say”qəzetinin naşiri və Baş redaktoru*

## ŞAHİN BU TAYDA, ŞAHİ O TAYDA

Biz bu gün İranda , doğma Ərdəbil torpağında, ustad şair böyük mütəfəkkir alim, istər farsdilli, istərsə də Azərbaycandilli ədəbiyyatı dərindən bilən, Hafiz Şirazi, Füzuli kimi dahilərin yaradıcılığında irfanın qapılarını geniş oxucu kütləsinin üzərinə açan bənzərsiz söz və sənət sahibi, bizim dostumuz, qardaşımız, Bakıda fəaliyyət göstərən “Məcməüş-şüəra” və “Vahid” ədəbi məclislərinin, namxuda, bu cavan yaşında ağsaqqal üzvü Əsgər Şahizadə Şahi kimi bir dahini yetirib ərsəyə çatdırmış diyarda olduğumuz üçün bu yazının sərlöhvəsi belə oxunur: “Şahi bu tayda, Şahin o tayda”. İnşallah, bu yazını Azərbaycan mətbuatında dərc etdirəndə, yaxud, Şahi Bakıya gəlib onun yolunu həmişə olduğu kimi həsrətlə gözləyən qardaşlarının arasında, hər iki məclisin üzvlərinin iştirakı ilə bu yubileyi Azərbaycan Respublikasının paytaxtında da bayram kimi keçirdəndə, sərlöhvə bu cür oxunacaq: “Şahin bu tayda, Şahi o tayda”.

Hər iki halda iki toplanan bir cəmdə birləşdiyi kimi, bu iki dost, qardaş, məsləkdaş və amaldaş şair və alim—Şahin və Şahi də iki bədəndə bir qəlb kimidirlər. Hərgah Şahin Fazil

*Xəlq etdi məni, lütf ilə göndərdi cəhanə,*
*Ol lütfü məgər bir də İlahi eləyərmi?!*

mətləli qəzəlində

*“Şahi” ilə “Şahin”dəki fərq bircə hərfdir,*
*“Nun” hərfini silmək məni Şahi eləyərmi?!*

— deyə qardaşına ixlasını bəyan edirsə, Əsgər Şahi də

*Ey dərin şeirləri can kimi şirin Şahin,*
*Dolduran ətr ilə söz zülfünü çin-çin Şahin—*

mətləli qəzlində

*Sən ilən mən salarıq mavi səmalarda səda*
*Olsaq Allah qapısında iki miskin, Şahin.*

*Gecə gördüm yuxuda Kəbə qabağında durub*
*Eləyir Şahi dua, söyləyir "amin" Şahin*

deyə, Allah dərgahında qardaşı Şahin Fazili özü ilə tən və bəlkə də özündən irəlidə görür.

Şahin Fazil və Şahi arasındakı qırılmaz dostluq telləri bu gün bizim üçün xüsusilə əhəmiyyətlidir, münasibətlərimizin inkişafı istiqamətində düzgün yolu, əsl yolu göstərən bir örnəkdir. Dövlətlərarası münasibətlərdə bir soyuqluq yarananda, bədxahlar "kimdir müqəssir?" deyə heç kəsə lazım olmayan bayağı suallar ortaya atıb onlara cavab axtarmaq, əslində isə bu sualları daha da dərinləşdirmək yolunda canfəşanlıq edəndə, hər iki tərəfdən ağıllı, ziyalı adamlar bu soyuqluğu aradan qaldırmağa əzm edirlər. Bəzən peşəkar siyasətçilərin görə bilmədikləri işi xalq diplomatiyasının nümayəndələri uğurla həyata keçirirlər. Çünki xalq diplomatikyası əsrlərlə formalaşmış, bir biri ilə təmasda inkişaf etmiş qarşılıqlı mədəniyyətə, həmişəyaşar bəşəri dəyərlərə söykənir. Mədəniyyət, ədəbiyyat, mənəviyyat həmişə var. Bu günkü siyasət isə sabah yoxdur.

Şahin Fazil və Əsgər Şahinin böyük sələfləri, İran və Azərbaycan xalqlarının eyni haqla və eyni iftixarla bizim şairimiz adlandırdıqları, dünya poeziya kəhkəşanında parlaq bir ulduz tək nur saçan ustad Şəhriyar hələ ötən əsrdə islam inqilabının ilk illərində ölməz misraları ilə xalq diplomatiyasının bayrağını göylərə qaldırmışdır:

*Dostla mürüvvət etməli, düşmən ilə keçinməli—*
*Qayda budur. Heyif deyil bəşər yolun azıb çaşa?!*

*Bizim də ruzigarımız yamandı, bizdə eyb yox,*
*Bəlkə vəzifədir—bəşər qonşular ilə qonuşa!*

Tam əminliklə demək olar ki, Şahin Fazil də, Əsgər Şahi də ustad Şəhriyarın bu arzusuna cavab vermək yolunda qələm çalan şairlərdir. İstər ələsgərin Şahinin Azərbaycana, istərsə də Şahin Fazilin İrana hər

gəlişi iki qonşu, qardaş xalqın arasındakı mədəni əlaqələr körpüsünün dayaqlarını daha da etibarlı edir. Şahin Fazil yaradıcılığından Əsgər Şahi ilə bağlı mövzuda bəzi nümünələr gətirmək istərdim:

*Ölkəmizə Şahi gəlibdir yenə,*
*Şahi kimi dahi gəlibdir yenə.*

Yaxud,

*Səhvim hanı, islah oluram Şahi gələndə,*
*Çox sirrdən agah oluram Şahi gələndə.*

*Gərçi qəzəlin bəndəsiyəm şeirdə, Şahin,*
*Mən Şahi kimi şah oluram Şahi gələndə.*

Yaxud

*Eşq eyləməyə şəm'ə-pərvanə gəlib Şahi,*
*Əncamı üçün meylin imkanə gəlib Şahi.*

Və ya,

*Şahi gəldi təzədən Şirvanə,*
*Az qalır, qəlb fərəhdən yanə.*

*Dolanaq başına pərvanə kimi,*
*O ki şəm' oldu, bizik pərvanə.*

Əziz qardaşımız Əsgər Şahi də Şahin Fazilin bu sevgi və ülfet rayihəli şeir çələngi müqabilində xəcalətli qalmır, onun yaradıcılığını və qardaşlıq təvəccöhünü ülvi bir məhəbbətlə tərənnüm edir:

*Orda ki, tutiyi-təb'in dolanır izzət ilən—*
*Aça bilməz qanad ol ərsədə şahin, Şahin.*

*Bir belə hüsnü lətafətlə sənin şeirlərin—*
*Bilmirəm şeirdi ya nərgisü nəsrin, Şahin.*

*Arizu eylərəm olsun elə qiymətli sözün*
*Ki, mələklər eləsin şerivü təzmin, Şahin.*

Və hər iki şairin yaradıcılığında ictimai motivlər də önəmli yer tutur. Şahin Fazil yazır:

*Şahi, yenə Şirvanə gəlibsən, gözüm aydın,*
*Mərd ölkəyə mərdanə gəlibsən, gözüm aydın.*

Əsgər Şahi cavab verir:

*Bir gün bulud olsam bu qara əsrdə, ey dil,*
*Əfşan sarı sünbülləri xəndan edərəm mən.*

Şahin Fazil Bakıdan yazır:

*Yuxu gördüm ki, gəlir Şahi, yuxum çin olacaq,*
*Mə'nəvi təşnəliyim şe'r ilə təmin olacaq.*

*Tək qəzəl yazmayacaq arif olan şairlər,*
*Şe'rimiz, yox buna şəkk-şübhə ki, rəngin olacaq.*

Əsgər Şahi Ərdəbildən cavab verir:

*Mənliyi yusam da mən, ey sənəm,*
*Onda Şahi olsam da mən, sənəm,*
*Pəs mənim böyük düşmənim mənəm,*
*Bir Araz gətir məndə yu məni.*

Yaxud:

*Gah telivü tök yüzə, gah da ayır, ey cəmil,*
*Bir gözümü qıl Araz, bir gözümü eylə Nil.*

Surət və mə'nanın vəhdətindən xəbərdar olanlar, irfan sahibləri Əsgər Şahinin Araz və Nil çaylarını bir müstəvidə təşbih etməsinin nə rəmz daşıdığını yəqin bilərlər.

Allah insanı azad yaratmışdır və bəşər övladı dünyaya gəldiyi gündən bu ilahi nemətə layiq olmaq, onu əldə saxlamaq, daha da sarsılmaz etmək və gələcək nəsillərə çatdırmaq istiqamətində hərəkət edir. Bu yol heç də həmişə hamar olmur. Bəzən bu yolda insanların qarşısına uçurumlar da çıxır. Gözü, bəsirəti kor olanlar yuvarlanıb bu uçuruma

düşürlər. Canını məqsədindən çox istəyənlər bu uçrumun kənarında düşərgə salır, xalça-palaz sərib od-ocaq qalayır və "təvəkkül Allaha"-deyə ətalət əbasını başlarına çəkib fürsət karvanını gözləyirlər. Zəmanəsini qabaqlayanlar, xalqına, bəşəriyyətə gün ağlamaq məqsədini canından əziz bilənlər isə bu uçurumun üzərindən körpü salır, işığa, tərəqqiyə aparan yolu davam etdirmək üçün möhkəm dayaq, etibarlı vasitə yaradırlar.

Əsgər Şahinin də, Şahin Fazilin də hicrana qənim kəsilən, azadlığa, mənəvi paklığa, dəfələrlə qeyd etdikləri kimi, ölkələrmiz, xalqlarımız arasında dostluğa, qardaşlığa səsləyən şeirləri bu yolda mənəvi körpü rolunu oyanayır.

Həm də bu şeirlər, bunu bir daha vurğulamaq istərdim, ustad Şəhriyarın ölməz misralarından güc alır, onun arzularının çiçəklənməsinə rəvac, səsinə səs verir:

*İndi bizim dövlətlər də yanlaşır,*
*Getbəgetdə çətinlər asanlaşır,*
*Sülhün yeli əsməyə sahmanlaşır!*

Və belə bir yəqinlik izhar etmək estərdim ki, böyük Şəhriyarın ruhunun, Əsgər Şahi və Şahin Fazil İlhamının da güc verdiyi bu sülh yeli İran və Azərbaycan adlı "gəmilərin" yelkənlərinə dolacaq və onları sürətlə dostluq, qardaşlıq, əmniyyət limanına doğru aparacaq.

İndi isə Şahin Fazil qardaşımın mənim 80 illik yubileyimə lütfən həsr etdiyi "Hacı Rafiq" rədifli qəzəlini oxucuların nəzərinə çatdırıram

QƏZƏL

*İmanə olan ləhzə müyəssər Hacı Rafiq,*
*Söylər ulu Allahına "əkbər" Hacı Rafiq.*

*Hər bir adamın oxşarı var! Oxşarı yoxdur,*
*Olmaz Hacı Rafiqlə qoşa hər Hacı Rafiq.*

*İlhamını gündən-günə artırdı səbrlə,*
*Təb'i özünə eylədi şakər Hacı Rafiq.*

*Şirvanilərin nəsli ucalmaqda bu gün də,*
*Şirvanilərə olmada zivər Hacı Rafiq.*

*"Şirvani" təxəllüslü ədibsən demişəm mən,*
*Billah, adına atmamışam şər, Hacı Rafiq.*

*Xaqanini istər oxuya doğma dilində*
*Hüşyar Hacı Rafiq, sinədəftər Hacı Rafiq.*

*Bilməkdə Füzuli babanı nöqtəbənöqtə,*
*Sabirləri, Seyyidləri əzbər Hacı Rafiq.*

*Baxdım Hacının nəsrinə sərraf gözü ilə,*
*Bildim gözümə dəymədə zərgər Hacı Rafiq.*

*Yanmaqda Vətən şəm'inə şövq ilə dəmadəm,*
*Pərvanətəhər oldu sərasər Hacı Rafiq.*

*Etdikcə Vətən tər'ifini sidq-ürəkdən*
*Böhtançılara sapladı xəncər Hacı Rafiq.*

*Daş atmağa hazır dayanan nakəsə qarşı*
*Aldı əlinə qeyz ilə qənbər Hacı Rafiq.*

*Dilbər Qarabağ yurduna vurğun o təhər ki,*
*Gər göndərən olsa gedər əsgər Hacı Rafiq.*

*Bir gün xəbər aldım ki, "Kitab münisi kimdir?"*
*Şahid " Hacı Rafiq" dedi, Ənvər "Hacı Rafiq".*

*Yığmaqda kitabxanəsinə dürlü kitablar,*
*Sanki, daşıyır xanəsinə zər Hacı Rafiq.*

*"Say" adlı qəzet sahibidir ki, sayılandır,*
*"Saysan sayılarsan" dedi sərvər Hacı Rafiq.*

*Əlbət iki-üç başqa qəzet həm yaradıb da,*
*Var-qüvvəsini etdi səfərbər Hacı Rafiq.*

*Zövq almadadır “Bəstənigar” adlı nigardan,*
*Hərdən oxuyur “Şur” ilə “Şüştər” Hacı Rafiq.*

*Sevda odu var, yanğısı vardır sinəsində,*
*Yandı bu oda oldu səməndər Hacı Rafiq.*

*Çöl Məcnunu yox, oldu şəhər Məcnunu dövrün,*
*Tutdu özünü Qeysə bərabər Hacı Rafiq.*

*Çox keçdi həyat məktəbinin mərhələsindən,*
*Hər mə’rəkədən çıxdı müzəffər Hacı Rafiq.*

*Səksən yaşa çatmış, edirik biz onu təbrik,*
*Hər il belə təbrik çiçəyi dər, Hacı Rafiq!*

*Şahin, yaşadır gör neçə ildir ki, fəxrlə*
*“Vahid adına məclisə” rəhbər Hacı Rafiq.*

**Hacı Rafiq ƏLİYEV**
*«Say» qəzetinin baş redaktoru,*
*«Vahid» ədəbi məclisinin sədri*

## ÇOX OXUYAN ÇOX BİLƏR, ÇOX GƏZƏN ONDAN DA ÇOX

Atalar sözüdür: «Çox oxuyan çox bilməz, çox gəzən çox bilər». Bu deyimdə müdrik atalar əslində elə çox oxuyanın da yüksək qiymətini vermiş, necə deyərlər, layiqlini layiqli ilə müqayisə etmişlər: yəni, çox gəzən çox oxuyandan da çox bilər; lap doğrusu: – çox oxuyan çox bilər, çox gəzən ondan da çox!

Və bu şəkildə həmin məşhur atalar sözü mənim çoxillik dostum, qardaşım Şahin Fazilin lap əyninə biçilib. Çox oxuyub – şərqşünas alimdir, tarix elmləri doktorudur, professordur, pedaqoqdur – ali məktəblərdə dərs deyir, dissertantlara rəhbərlik edir; şairdir – 5 divan bağlayıb, şeir toplusundan ibarət onlarla kitab müəllifidir. Bütün bunlar deməyə əsas verir ki, ömrünün çox hissəsini mütaliə ilə, oxumaqla keçirib və indi də bu vəzifə borcunu yüksək ləyaqətlə, səbr və əzmkarlıqla yerinə yetirməyi davam etdirir. Səyyahdır – bir sıra şərq ölkələrini – Türkiyəni, İranı, İraqı qarış-qarış gəzib, elə 13 il Əfqanıstanda yaşayıb və işləyib. Yaponiyayadək gedib çıxıb. Bütün bu səyahətlərin nəticəsi olaraq, səfərnamələr yazıb nəşr etdirib.

Bu səyahətlərin bir çoxunda, xüsusən, İran və İraq səfərlərində demək olar ki, biz bərabər olmuşuq. Hətta, bəzi hotellərdə təkadamlıq nömrələr olmayanda, bir nömrədə iki nəfərin qalması zərurəti ortaya çıxanda Şahin məni, mən isə Şahini, necə deyərlər, qulaq yoldaşı seçmişik. Elə buna görə də cəsarətlə deyə bilərəm ki, Şahinin səfər şeirlərinin əksəriyyəti onun fövqəladə poetik istedadının və mənim yuxusuz gecələrimin sayəsində ərsəyə gəlib. Belə ki, bəzən gecənin yarısı, bəzən də sübh tezdən - dan yeri ağarmamış ehmalca məni oyadaraq:

– Bax gör bu misra, yaxud bu beyt necədir, necə səslənir? – deyə soruşanda, eşitdiyim misranın, yaxud beytin poetikasından aldığım zövq yuxumu ərşə çəkərdi. Bəzən mübahisəmiz də düşürdü.

Bir çox məsələlərə münasibətimiz, xüsusən, Azərbaycan Respublikası ilə İran İslam Respublikası arasında, xalqlarımız arasında dostluq

və qardaşlıq əlaqələrinin daha da möhkəmləndirilməsi, bu yolda xalq diplomatiyasının, onun ən etibarlı dayaqları olan şərikli mədəniyyətimizin, ədəbiyyat və incəsənətimizin üzərinə düşən öhdəliklərlə bağlı mövqelərimiz həmişə üst-üstə düşüb. İran İslam Respublikasına səfərlərimiz əsnasında təzə tanış olduğumuz, istər sadə adamlar, istər dövlət rəsmiləri, istərsə də ədəbiyyat və incəsənət xadimləri arasında dostluq və qardaşlıq mücahidlərinin sayının ayla-illə deyil, günlə-saatla artdığını gördükcə sevincdən ürəyimiz dağa dönüb, belə adamlarla bağlı zənnimiz demək olar ki, həmişə eyni olub.

Təqribən üç il yarım bundan qabaq İran İslam Respublikasının Azərbaycan Respublikasında Səfirliyinin Mədəniyyət Mərkəzinə sədr təyin edilmiş doktor İbrahim İbrahimi ilə ilk tanışlığımızdan aldığımız təəssürat kimi...

...Nə qədər dərin biliyə, savada, geniş dünyagörüşünə malik bir adamdır. Bir çox dillərdə sərbəst danışır. İngilis dilinə doğma ana dili kimi bələddir. 13 il Hindistanda işləyib, orada doktorluq dissertasiyası müdafıə edib. Əsli Təbrizdəndir. İranla Azərbaycan arasında hərtərəfli əlaqələrin daha da möhkəmləndirilməsi ideyasının fanatikidir. İstər farsdilli, istərsə də azərbaycandilli poeziyanı mükəmməl bilir. Elə ilk görüşümüz də poeziya ilə bağlı oldu...

İranın görkəmli qələm sahiblərindən Asim Ərdəbilinin həyat və yaradıcılığına həsr edilmiş tədbirdə iştirak etmək üçün Şahin Fazil ilə məni İİR səfirliyinin Mədəniyyət Mərkəzinə dəvət etmişdilər. Getdik və orada öyrəndik ki, Mərkəzə yeni sədr təyin edilib. Tanış olduq. Bir-birimizə rəsmi «xoşgəldindən», zəruri əhvalpürsanlıqdan sonra söhbətimiz son dərəcə səmimi bir məcraya yönəldi. Sanki uzun illərin tanışı idik.

Səmimi-qəlbdən etiraf edim ki, səfərin son dərəcə uğurlu keçməsində doktor İbrahiminin böyük rolu oldu. O özü də bu səfərdə şəxsən iştirak etdi, dost ölkənin bir çox vilayətlərindən və şəhərlərindən gəlib tədbirdə iştirak edən qələm sahibləri, mədəniyyət xadimləri ilə – şair və yazıçılarla bizi tanış etdi, yeni dostlar qazanmağımıza səbəbkar oldu. Doktor İbrahimi Asim Ərdəbilinin poetik yaradıcılığına dərindən bələd olan bir ədəbiyyatşünas alim mövqeyi nümayiş etdirdi və elə bu mövqedən də şairin əsərlərində bədii təcəssümünü tapan bir çox mətləblərin üzərinə işıq saldı.

Bütün bunları ona görə təfsilatı ilə yazıram ki, doktor İbrahiminin Bakıda üç il yarımlıq fəaliyyəti dövründə təkcə vəzifə borcunu yüksək ləyaqətlə yerinə yetirdiyini yox, eləcə də, bu işi uğurla görməkdən ötrü,

yəni İran-Azərbaycan mədəni əlaqələrini daha da sıxlaşdırmaqdan ötrü ən cüzi imkanlardan belə səmərəli istifadə etməsini nəzərə çatdıra bilim. Elə Şahin Fazilin «İran səfərnamələri» kitabının təkmilləşdirilmiş və əlavələr edilmiş yeni nəşrinin ərsəyə gətirilməsi təşəbbüsü və bu təşəbbüsün, gördüyünüz kimi, yüksək səviyyədə həyata keçirilməsi də doktor İbrahiminin İran-Azərbaycan mədəni əlaqələri salnaməsinə «yazdığı» yeni bir fəsil oldu. Mən yaxşılığı həmişə yüksək qiymətləndirən Şahin Fazilin dostumuz İbrahimiyə həsr etdiyi iki şeirini oxucuların nəzərinə çatdırmaq istərdim:

### DOSTUMUZ İBRAHİMİ YOL ÜSTƏDİR

*Üç ildən çox Azərbaycan Respublikasında İran İslam Cümhuriyyəti Səfirliyi Mədəniyyət Mərkəzinin sədri cənab Dr.* ***İbrahim İbrahiminin*** *xidməti ezamiyyətini bitirib, ölkəsinə qayıdışı münasibəti ilə*

*Bir xəbəri ərz eləyiblər mənə:*
*Dostumuz İbrahimi yol üstədir.*
*Alqışa layiq bu adam, əhsənə!*
*Dostumuz İbrahimi yol üstədir.*

*Kaş qorusunlar onu daş-qaş kimi,*
*Dostlara həmdəm kimi, sirdaş kimi,*
*Getsə də, gəlsin yenə qardaş kimi,*
*Dostumuz İbrahimi yol üstədir.*

*And içirəm sevdiyimiz Allaha,*
*Var dəyəri - qiyməti zərdən baha,*
*Getsə də, getməz yadımızdan daha,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Şöhrəti də var, şanı da üstəlik,*
*Yaxşılığa imkanı da üstəlik,*
*Elmi də var, imanı da üstəlik,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Qəlbi kimi niyyəti saf bir hacı,*
*Olmalıyıq indi onun möhtacı,*
*Neyləyə Rafiq, kəsilib illacı,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Taqəti heyrət bürüyüb indidən,*
*Çox kəsi xiffət bürüyüb indidən,*
*Şahini həsrət bürüyüb indidən,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Sanmamışıq ölkədə mehman onu,*
*Sadiq adam görmüşük hər an onu,*
*Həsrət ilə gözləyir İran onu,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Qoy yetişə hər diləyi hasilə,*
*Dönməyə həzzi, fərəhi nisgilə,*
*Şair, ona rəngi yaşıl yol dilə,*
*Dostumuz İbrahimi yol üstədir.*

*«Gözləyirik daim onu biz» deyək,*
*«Yaxşı qoyubsan Bakıda iz» deyək,*
*«Hifz olunsun! Xüdahafiz» deyək,*
*Dostumuz İbrahimi yol üstədir,*
*Dostumuz İbrahimi yol üstədir.*

*Bakı, 21 fevral 2017*

## QİT'Ə

*Neçə ildir ki, gəlibdir Bakıya Tehrandan*
*Doktor İbrahimi olmuş bizə qardaş əvəzi.*

*Etibarlı bir adamdır, əməli çox saleh,*
*Nəqş edir düzlüyü çox nəqqaşa nəqqaş əvəzi.*

*Elə adəm dəxi var ki, yox adamlıq onda,*
*Kənara tullayaram mən o kəsi daş əvəzi.*

*«Sirrini sirdaşa söylə» deməyibmi babalar?*
*Qeyri kəs görməyirəm mən ola sirdaş əvəzi.*

*Üzümüzdən süzülür mehrü vəfa qətrələri,*
*Gözümüzdən ona ünsiyyət axır yaş əvəzi.*

*Elə kəs göndər, İlahi, ola İbrahim tək,*
*Döşəyək fərş o kəsin səmtinə fərraş əvəzi.*

*Kim gələrsə o cür etsin bizə yoldaşlığını,*
*Yoldaşa yoldaşı həm olmalı yoldaş əvəzi.*

*Tərk edib bizləri İbrahimi Tehranə gedir,*
*Yerinə kim gələcəkdir? Gələ eykaş, əvəzi.*

*Bakı,*
*22 fevral 2017*

Şahin Fazil İrana hələlik son yeddi səfərinin təşkilatçısı və mənəvi dayağı olan dostumuz doktor İbrahim İbrahimini tanıyanların demək olar ki, hamısının adından ona öz səmimi ixlasını, dostluq və məhəbbət hisslərini bu cür səmimi və yüksək poetik misralarla izhar etmişdir.

Qeyd etmək lazımdır ki, Şahin Fazilin İrana səfərləri təkcə avtomobil təkərləri və ya təyyarə qanadları üzərində cismani səyahətlərlə bitmir.

Elmi fəaliyyətinin xeyli hissəsini Azərbaycanla İranın tarixinin qarşılıqlı, əlaqədar cəhətlərinin obyektiv mövqedən öyrənilməsinə və doğru nəticələr əldə edilməsinə həsr etmiş bu istedadlı şərqşünas-alim, fars dilinin kamil bilicisi kimi həm də orijinal mənbələrdən bacarıqla istifadə edir, onların elmi ictimaiyyət üçün, elmi təfəkkürün inkişafı üçün ən vaciblərini Azərbaycan dilinə orijinalın yüksək ədəbi-bədii, tarixi cəhətlərini məharətlə saxlamaqla tərcümə edir. Bu xeyirxah fəaliyyətinin özü də, əslində, İrana, onun keçmişinə, bu gününə və gələcəyinə mənəvi bir səyahətdir.

Bu yaxınlarda tərcüməsini başa çatdırıb, yüksək poliqrafik səviyyədə nəşr etdirdiyi İranın məşhur azərbaycanlı tarixçisi İsgəndər bəy Münşinin 2505 səhifəlik «Tarixe-aləmaraye-Abbasi» («Dünyanı bəzəyən Abbasın tarixi») adlı möhtəşəm bir əsərinin elmi ictimaiyyətə və geniş oxucu kütləsinə təqdim edilməsi bu qəbildən olan ən səciyyəvi misallardan biridir.

Kitabda «Ön söz»ün müəllifi, görkəmli tarixçi-alim və ictimai xadim AMEA Tarix İnstitutunun direktoru, akademik Yaqub Mahmudov bu əsərin Azərbaycan dilinə uğurlu tərcüməsinə və bu işi çox böyük zəhmət bahasına başa çatdıran Şahin Fazilin zəhmətinə yüksək qiymət verərək yazır:

«...Xalqımıza məxsus olan «Tarixe-aləmaraye-Abbasi» kimi qiymətli bir ilk mənbənin doğma dilimizdə bütövlükdə nəşr olunması tarix elmimizə çox mühüm töhfədir. Və bu töhfə oxucularda, keçmişimizlə maraqlanan hər kəsdə doğma tariximizə sevgini daha da artıracaqdır.

Bir neçə söz böyük, olduqca əhəmiyyətli və son dərəcə çətin işi başa çatdıran Şahin Fərzəliyev (Şahin Fazil) haqqında: Şahin ölkəmizdə fars dilinin ən yaxşı bilicilərindəndir. İxtisasca şərqşünasdır. Tarix elmləri doktorudur. Professordur. Tərcümə etdiyi əsərdə bəhs olunan dövrlə bağlı qiymətli tədqiqat əsərlərinin müəllifidir. Ömrünün 13 ilini Əfqanıstanda yaşamış, tərcüməçi olmuşdur. Əfqanıstanın dövlət medalları ilə təltif olunmuşdur. Şahin həm də görkəmli qəzəlxanımızdır. Onlarla şeir kitabı, bir neçə divanı və poemaları var. Azərbaycan şairlərinin əsərlərini farscaya çevirərək Kabulda, əfqan şair və yazıçılarının əsərlərini isə Azərbaycan dilinə çevirərək, Bakıda nəşr etdirmişdir. Şahin Fazil bir sıra beynəlxalq elmi məclislərdə tariximizin ayrı-ayrı məsələlərinə həsr olunmuş məruzələrlə çıxış etmişdir.

Şahin Fazilin «İran səfərnamələri» kitabının ikinci nəşrində də iranlı qələm dostları ilə şeirləşmələrindən çoxlu misallar gətirilir. Onlardan biri də Ərdəbildə yaşayan Azərbaycan və fars dilli şair, alim, pedaqoq, alovlu vətənpərvər, o taylı-bu taylı xalqımızın şadlığına sevinən, kədərinə yanan Əsgər Şahi qardaşımızdır. İran Mədəniyyət Mərkəzinin dəvəti və təşkilatçılığı ilə bu müqtədir şairin yubileyində iştirakımız yaxşı yadımdadır. Bu səfər haqqında təəssüratımı «Xalq qəzeti»nin 15 iyul 2012-ci il tarixli 155-ci sayında oxucularla bölüşmüşəm. «Tarixi və mənəvi bağları qoruyub saxlamalıyıq» adlı məqalədə deyilir:

Əsgər Şahi həm «Məcməüş-şüəra», həm də «Vahid» ədəbi məclislərinin fəal üzvüdür və Bakıya hər gəlişində hər iki məclisin toplantılarında fəal iştirak edir, yeni şeirlərini oxuyur, klassik şeirin incəliklərindən söhbət açır, məclis üzvlərinə dəyərli məsləhətlər verir.

Ona görə də İran dövlətinin ən yüksək dairələrini təmsil edən rütbə və vəzifə sahiblərinin iştirak etdiyi bu hökumət tədbirinə bizim də qatılmağımızdan xeyli məmnun olduq. Ona görə ki, son vaxtlar (o dövr

nəzərdə tutulur –H.R.), gizlətməyin adı yoxdur, bəzən ölkələrimiz arasında baş verən soyuqluğa, qarşılıqlı ittihamlara təkcə rəsmi dairələrin, diplomatların münasibətini yox, ziyalıların da mövqeyini öyrənmək, qiymətləndirmək, eləcə də öz mövqeyimizi ortaya qoymaq fürsəti əldə etdik.

Əsgər Şahinin yubileyinə təkcə Tehrandan deyil, İranın bir çox vilayətlərindən, Təbrizdən, Urmiyadan, Zəncandan xeyli qələm sahibləri - şairlər, yazıçılar, jurnalistlər, mədəniyyət xadimləri gəlmişdi. Onların bir çoxu ilə mən əvvəllər də tanış idim və istər Bakıda, istərsə də İranın bir sıra şəhərlərində müxtəlif səbəblərlə keçirilən məclislərdə xeyli görüşlərimiz olmuşdu.

Ərdəbilin möhtəşəm «Fədək» mədəniyyət sarayında təntənəli yubiley mərasimindən sonra tədbirə gələn qonaqlar şəhərin səfalı bir guşəsində - Şorabil gölünün sahilində yerləşən eyni adlı hoteldə bir araya toplaşdılar və məclis yenidən qızışdı. Şeirlər oxundu, fikir mübadiləsi aparıldı. Təbii ki, Azərbaycan-İran münasibətlərinə də toxunuldu.

Çox ciddi söhbətlərimiz, qızğın mübahisələrimiz oldu. Bir çoxlarının vəziyyəti düzgün qiymətləndirən, soyuqluğu aradan qaldırmağın yollarını həm də mədəni əlaqələri davam və inkişaf etdirməkdə görən fikirlərilə yanaşı, bəzilərinin əsassız ittihamları, böhran və iftiraları ilə də qarşılaşdıq. Belələrinə mənim cavabım qısa və aydın oldu:

– Biz burada qonağıq, mənim əzizlərim və qonaq etikasına qısılıb sizin tarixi təhrif edən bəzi uydurma fikirlərinizə heç də həmişə cavab verməyi məqsədəuyğun saymırıq. Amma, bu o demək deyildir ki, biz bu fikirlərlə razılaşırıq. Siz də ev sahibi etikasını gözləyin və əvvəlcədən bildiyiniz kimi, bizim etirazımıza səbəb ola biləcək, arzu etdiyimiz dostluğa, qardaşlığa xələl gətirə biləcək, ən başlıcası isə, həqiqət olmayan fikirlər irəli sürməyin.

İnsafən, məclis yenə də əvvəlki axarı ilə davam etdi.

Mən münasıbətlərimizin inkişafı yollarına azacıq da olsa şübhə yeri qalmaması üçün Əsgər Şahinin yubileyi münasibətilə təqdim etdiyim esseni azacıq ixtisarla, əziz oxucular, nəzərinizə çatdırıram.

Əsgər Şahi ilə Şahin Fazil arasındakı qırılmaz dostluq telləri bu gün bizim üçün xüsusilə əhəmiyyətlidir, münasibətlərimizin inkişafi istiqamətində düzgün yolu, əsl yolu göstərən bir örnəkdir. Dövlətlərarası münasibətlərdə bir soyuqluq yarananda, bədxahlar «kimdir müqəssir?» - deyə heç kəsə lazım olmayan bayağı suallar ortaya atıb, onlara cavab axtarmaq, əslində isə

bu sualları daha da dərinləşdirmək yolunda canfəşanlıq edəndə, hər iki tərəfdən ağıllı, ziyalı adamlar bu soyuqluğu aradan qaldırmağa əzm edirlər. Bəzən peşəkar siyasətçilərin görə bilmədikləri işi xalq diplomatiyasının nümayəndələri uğurla həyata keçirirlər. Çünki xalq diplomatiyası əsrlərlə formalaşmış, bir-biri ilə təmasda inkişaf etmiş qarşılıqlı mədəniyyətə, həmişəyaşar bəşəri dəyərlərə söykənir. Mədəniyyət, ədəbiyyat, mənəviyyat həmişə var. Bugünkü siyasət isə sabah yoxdur. Əsgər Şahi və Şahin Fazilin böyük sələfləri, İran və Azərbaycan xalqlarının eyni haqla və eyni iftixarla bizim şairimiz adlandırdıqları, dünya poeziya kəhkəşanında parlaq bir ulduz tək nur saçan ustad Şəhriyar hələ ötən əsrdə İslam inqilabının ilk illərində ölməz misraları ilə xalq diplomatiyasının bayrağını göylərə qaldırmışdır:

*Dostla mürüvvət etməli, düşmən ilə keçinməli,*
*Qayda budur. Heyif deyil bəşər yolun azıb çaşa?!*

*Bizim də ruzigarımız yamandı, bizdə eyb yox,*
*Bəlkə vəzifədir - bəşər qonşular ilə qonuşa!*

Tam əminliklə demək olar ki, Əsgər Şahi də, Şahin Fazil də ustad Şəhriyarın bu arzusuna cavab vermək yolunda qələm çalan şairlərdir. İstər Əsgər Şahinin Azərbaycana, istərsə də Şahin Fazilin İrana hər gəlişi iki qonşu, qardaş xalqın arasındakı mədəni əlaqələr körpüsünün dayaqlarını daha da etibarlı edir, hər iki şairin yaradıcılığında ictimai motivlər də önəmli yer tutur.

Şahin Fazil Bakıdan yazır:

*Yuxu gördüm ki, gəlir Şahi, yuxum çin olacaq,*
*Mənəvi təşnəliyim şeir ilə təmin olacaq.*

*Tək qəzəl yazmayacaq arif olan şairlər,*
*Şerimiz, yox buna şəkk-şübhə ki, rəngin olacaq.*

Əsgər Şahi Ərdəbildən cavab verir:

*Gah, telivü tök yüzə, gah da ayır, ey cəmil,*
*Bir gözümü qıl Araz, bir gözümü eylə Nil.*

Surət və mənanın vəhdətindən xəbərdar olanlar, irfan sahibləri Əsgər Şahinin Araz və Nil çaylarını bir müstəvidə təşbih etməsinin nə rəmz daşıdığını yəqin bilərlər.

Allah insanı azad yaratmışdır və bəşər övladı dünyaya gəldiyi gündən bu ilahi nemətə layiq olmaq, onu əldə saxlamaq, daha da sarsılmaz etmək və gələcək nəsillərə çatdırmaq istiqamətində hərəkət edir. Bu yol heç də həmişə hamar olmur. Bəzən bu yolda insanların qarşısına uçurumlar da çıxır. Gözü, bəsirəti kor olanlar yuvarlanıb bu uçuruma düşürlər. Canını məqsədindən artıq bilənlər bu uçurumun kənarında düşərgə salır, xalça-palaz sərib od-ocaq qalayır və «təvəkkül Allaha», - deyə ətalət əbasını başlarına çəkib fursət karvanını gözləyirlər. Zəmanəsini qabaqlayanlar, xalqına, bəşəriyyətə gün ağlamaq məqsədini canından əziz bilənlər isə bu uçurumun üzərindən körpü salır, işığa, tərəqqiyə aparan yolu davam etdirmək üçün möhkəm dayaq, etibarlı vasitə yaradırlar. Əsgər Şahinin də, Şahin Fazilin də hicrana qənim kəsilən, azadlığa, mənəvi paklığa, ölkələrimiz, xalqlarımız arasında dostluğa, qardaşlığa səsləyən şeirləri bu yolda mənəvi körpü rolunu oynayır. Həm də bu şeirlər, 2015-ci il sentyabrın 14-dən 18-dək Təbrizdə keçirilən Şəhriyar Konfransında etdiyim məruzədə göstərdiyim kimi, ustad Şəhriyarın ölməz misralarından güc alır, onun arzularının çiçəklənməsinə rəvac, səsinə səs verir:

*İndi bizim dövlətlər də yanlaşır,*
*Getbəgetdə çətinlər asanlaşır,*
*Sülhün yeli əsməyə sahmanlaşır!*

Və belə bir yəqinlik izhar etmək istərdim ki, böyük Şəhriyarın ruhunun, Əsgər Şahi və Şahin Fazil ilhamının da güc verdiyi bu sülh yeli İran və Azərbaycan adlı «gəmilərin» yelkənlərinə dolacaq və onları sürətlə dostluq, qardaşlıq, əmniyyət limanına doğru aparacaq.

Və inanıram ki, Şahin Fazil bu uğurlu səfərin müsafirləri arasında olacaq və bizi yeni-yeni səfərnamələrlə sevindirəcəkdir.

***(Şahin Fazil. İran səfərnamələri, III nəşri, Bakı, 2017, səh. 16-27)***

**Hacı Rafiq ƏLİYEV (ŞİRVANİ)**

## "QIRXNAMƏ" ELEGİYASI, YAXUD MƏHZUN HİSSLƏRİN BƏDİİ İNİKASI

Dünyanın heç bir ölkəsində "Qırxnamə" adlı elegiya yazan şair yox idi. Əslində klassik və müasir ədəbiyyatda heç belə janr da olmamışdır. Amma indi var: Şahin Fazil "Qırxnamə"si.

Yer üzünün ilk şairi Adəm peyğəmbər idi. Onu dərd şair etmişdi. Şahin isə dərdi olmazdan əvvəl şair olmuşdu. İllərlə qürbət ölkələrdə hicran əzabına mübtəla olan Şahin Fazil sözün əsl mənasında nikbin şairdir, daha doğrusu, nikbin şair idi, lakin indi bədbinləşib. Bədbinlik onun canına, qanına hopub. Amma kədərli əhval-ruhiyyə, mən deyərdim ki, onun şeirlərini daha da cilalayıb, daha mövzun, daha oxunaqlı edib. Fikrimin təsdiqinə misal - "Qırxnamə" elegiyası!

Son illərdə Azərbaycanda, maşallah kitab çapı nəhayətsiz artmışdır, amma təəssüf ki, yaxşı kitablar az, pis kitablar isə lap çoxdur. Təkcə vəzn və qafiyəni bilən (əksər halda heç bunları da bilməyən) pullu, yaxud pullu adamların puluna arxalanan müəlliflər ildə bir neçə "kitab" buraxır, özlərini (bəli, oxucuları yox, yalnız özlərini) feyzyab edirlər.

Mən 1980-ci ildən başlayaraq Bakıda fəaliyyət göstərən "Məcməüşşüəra" ("Şairlər yığıncağı") və cəmi 3 il bundan əvvəl yaradılan "Vahid ədəbi məclisi"ndə tez-tez iştirak edir, əsasən əruz vəzninin müxtəlif janrlarında şeir yazanları dinləyirəm.

Şahin Fazilin saf, təmiz Azərbaycan dilində rahat təblə yazdığı şeirlər özünün yüksək poetikliyi ilə, doğma folklorumuzdan, xalqımızın çoxəsrlik tarixindən, adət və ənənələrimizdən gələn təşbihləri ilə həmişə seçilir, diqqət mərkəzində olur, könül oxşayır, örnək göstərilir.

Şahin Fazil iyirminci əsr Azərbaycan ədəbiyyatında ilk mətbu "Divan" kitabının müəllifidir. İndi isə, kədərli bir hadisə ilə bağlı olsa da, ədəbiyyatımız üçün tamamilə yeni bir addım - "Qırxnamə"!...

...İki ay bundan əvvəl Şahin Fazilə ağır itki üz verdi, ömür-gün yoldaşını itirdi, tək qaldı, özü demişkən "təkləndi":

*Aşiqin sevgi bağı gör nə təhər təkləndi,*
*Daha yox təmtəraqı, gör nə təhər təkləndi...*

*...Titrədərdi bu qəzəlxan çoxunu, indi isə*
*Titrəyir dil-dodağı, gör nə təhər təkləndi...*

*...Qeyri dilbər tuta bilməz yerini, ey dilbər,*
*Şahinin qəlb otağı gör nə təhər təkləndi.*

***(Şahin Fazil. Qırxnamə, yaxud qırx şeirdən ibarət Elegiya. Bakı, 2001, səh. 36)***

Mən Şahin Fazilin "Qırxnamə"sini dönə-dönə oxudum, kövrəldim, qəhərləndim. Lakin cəmi qırx şeirdən ibarət olan bu kiçik həcmli kitabı günlərlə əlimdən yerə qoya bilmədim, şair dostumun qırx gün ərzində keçirdiyi iztirablar qəlbimi göynətdi, ağlar Şahinin halına yandım, yandım:

*Yenə göz yaşına çatmaqda gücü, yar ağlar,*
*Olaraq çarəsi yox dərdə giriftar, ağlar...*

*...Yarının heykəli sınmaqdadı sürətlə bu gün,*
*Çırparaq əllərini başına me`mar ağlar...*

*...Neçə gün cəhd elədim dərdimə bir çarə ola,*
*Tapa bilməzsə təbib çarəni naçar ağlar.*

*Tökdü göz yaşını Şahin günahı var kimi,*
*Kim görübdür günah etməzsə günahkar ağlar.*

Bu qəzəlin tarixinə baxıram: 29 aprel, 2001. Bir gün sonra isə şairin həyat yoldaşı Tamrida xanımın ömür yolu bitdi.

Bəli, Şahin bu kitabını ağlaya-ağlaya yazıb. Qəzəl, qit`ə, qoşma, sürud, habelə müxtəlif heca və sərbəst vəznli şeirlərdən ibarət "Qırxnamə" elegiyası vəfat edən vəfalı qadınının ölümündən keçən qırx gün ərzində Şahin Fazilin göz yaşları (özü isə gözündən süzülən yaşları "mirvari" adlandırır) ilə yazdığı qırx şeiri özündə əks etdirmişdir. Vur-tut qırx şeir, lakin qırx günün nəhayətsiz əzabı, qubarı, kədəri, həsrəti...

*Nə edim, çatdı vida növbəsi yarım getdi,*
*Kədərim gəldi, qəmim gəldi, xumarım getdi.*

*Tuturam nəbzini hiss eyləmirəm vurmağını,*
*Qurudu ot sayağı sanki damarım, getdi.*

*Elə zənn eyləyirəm ki, hava gəlmiş başıma,*
*Havanı neyləyirəm ki, havadarım getdi.*

*Dizimin gəldi əyilmək deyilən əyyamı,*
*Taqətim yoxdu daha, səbrü qərarım getdi.*

Bəli, şair dostum, özü demişkən, üçüncü dəfə yetim qaldı:

*Taleyim bağımda tikan bitirib,*
*Canım hədəf oldu müsibətlərə.*
*Mən ata itirib, ana itirib*
*İndi yetim oldum üçüncü kərə.*

Dostum, qardaşım Şahinə təsəlli vermək istəyirdim. Amma şair Şahin Fazil məni qabaqlayıb:

*Dərd axır qəm buludundan üzümə...Fikr edirəm*
*Yardan başqa bir adəm məni şənləndirməz.*

*Şahini şadman etsə fəqət Allah edəcək...*
*...Yardan başqa bir adəm məni şənləndirməz.*

Allah Tamrida xanıma – gözəl insan, qayğıkeş müəllim, cəfakeş ömür-gün yoldaşı, Ana Tamridaya rəhmət eləsin! Sənə də, qardaşım Şahin, Allah özü yar olsun!

Balaların, nəvələrin üçün yaşa, xalqımız üçün yaz, yarat. Nikbin yaşa, nikbin yaz!

***(Şahin Fazil. Təzkireyi-Şahin,***
***Bakı, 2006, səh. 475-478)***

**Seyid Əliəkbər OCAQNEJAD**
*İran İslam Respublikasının Azərbaycandakı Səfirliyinin Mədəniyyət Mərkəzinin sədri*

## DOST SÖZÜ

*Bismillahir-Rəhmanir-Rəhim!*

Çağdaş dövrdə, müasir şəraitdə insanların bir diyardan başqa diyara getmələri o qədər də müşkil məsələ deyil. Ulu Pərvərdigarın mədədi və yardımı sayəsində qonşu ölkə xalqlarının bir-birləri ilə münasibətlərinin getdikcə genişlənməsi və çoxəsrlik mədəni əlaqələrin daha da dərinləşməsi imkan yaradır ki, ünsiyyət daha əhatəli vüsət tapsın, gediş-gəliş daha da çoxalsım.

Son illərdə İran İslam Respublikası ilə Azərbaycan respublikası arasında bir çox sahələrdə baş verən ürəkaçan, səmimi münasibət və əlaqələr bunu deməyə əsas verir ki, həmkarlığımız qənaətbəxş, dostluğumuz sarsılmazdır. Ölkələrarası münasibətlərin daha da yaxşılaşmasına kömək edən ən mühüm vasitələrdən biri, şübhəsiz ki, dost kəlamı, dost sözüdür.

Iran haqqında dost sözü deyən Şahin Fazili həm Azərbaycanda, həm də İranda yaxşı tanıyırlar. On ildən çoxdur ki, bu şərqşünas, əgər daha dəqiq desəm, bu İranşünas İrana səyahət edir, səfərnamələr yazır. Bu müddət ərzində İranda gah müxtəlif Elmi Konfranslarda, gah sərgilərdə, gah ziyarətlərdə, gah da mədəni gəzintilərdə olan Şahin Fazil ölkəmizdə keçirdiyi günlərin bircəsini də boş keçirməmiş, daim müxtəlif elmi-ədəbi görüşlərdə olmuş, məruzə və şerlərlə çıxış etmiş, fars və Azərbaycan dillərində münasibətlər vermiş, dostlarına öz dost sözünü çatdırmışdır.

Kimdir Şahin Fazil? Mən onu Bakıya gəldiyim ilk günlərdən tanımışam. Gəlin onu bir daha sizə təqdim edim, əziz oxucular. Mən Şahin Fazil barədəki məlumatı elə onun öz mətbu xatirələrindən, məqalələrindən, şerlərindən və bir də Əlibala Hacızadə, Tofiq Cahangirov, İmamverdi Həmidov, Qabil Camalzadə kimi dostlarından öyrənmişəm. Bilmişəm ki, şairdir, tədqiqatçıdır Şahin Fazil. Bilmişəm ki, Azərbaycan Yazıçılar Birliyinin üzvü, "Məcməüş-şüəra" şairlər məclisinin sədridir Şahin Fazil. Bilmişəm ki, tarix elmləri doktoru, professordur Şahin Fazil. Bilmişəm ki, xarici ölkələrlə tez-tez səyahətlər edən səyyahdır Şahin Fazil. Hər şeydən üstünü isə budur ki, sözün tam mənasında ziyalı bir

şəxsdir Şahin Fazil.

İran İslam Respublikasının Azərbaycandakı Səfirliyinin Mədəniyyət Mərkəzi tərəfindən Bakıda Azərbaycan və İran mədəniyyət və elm xadimlərinin iştirakı ilə müxtəlif mədəni tədbirlər \məsələn, görkəmli şərqşünas alim professor Məhəmməd Mübarizin 90 illik, yazıçı Əlibala Hacızadənin 65 illik yubileyləri, böyük şairlər Sədi və Hafizə həsr olunmuş elmi–bədii konfranslar və s. həyata keçirilmişdir. Qeyd etməliyəm ki, bu tədbirlərin hamsının həyata keçrilməsində başqa elm və mədəniyyət işçiləri ilə yanaşı, bir nəfər də olduqca fəal iştirak etmişdir: Şahin Fazil.

Məndə Şahin Fazilin bir neçə kitabı var. Onun "Azərbaycan və Osmanlı impersiyası XV-XVI əsrlərdə" adlı elmi-tədqiqat əsərlərini oxumuşam, "Allah eşqi, Peyğəmbər məhəbbəti, İmam sevgisi" adlanan dini şerlər kitabını mütaliə etmişəm, "Diavan"ı ilə dərindən tanış olmuşam. Onun "Şəhriyar" qəzeti və "Cahan" jurnalında dərc olunan yazıları həmişə mənim diqqətimi özünə cəlb etmişdir. Indi isə Şahin Fazilin növbəti kitabının əlyazma nüsxəsini varaqlayıram. Doqquz səfərnamə və İrana etdiyi hər səfər zamanı yazılan çoxlu şer. Həm məqalələr, həm də şerlər xeyli səmimanə, olduqca oxunaqlı bir dildə yazılmışdır.

Şahin Fazilin İran şerləri onun təkcə İranla olduğu zaman qələmə aldığı şerlərdən ibarət deyil. Şahin Fazil İrana səfərlərindən qayıtdıqdan sonra da bir növ "İrannamələr" yazır, ölkəmizə, mədəniyyətimizə, klassik və müasir şairlərimizə öz isti münasibətini şairanə tərzdə izah edir. Onun lap elə bu günlərdə "İşığa doğru" adlı jurnalda dərc olunmaq üçün təqdim etdiyi yeni qəzəli fikrimizə bariz bir sübutdur:

*Bir çoxları tədric ilə canana vurulmuş,*
*Şahin isə birdən-birə İranə vurulmuş.*

*Əfrasiyabın təxti olan ölkəyə getmiş,*
*Sevdalı xəyalat ilə Tehranə vurulmuş.*

*Uçmuş Həmədan səmtinə, Urmiyyəni gəzmiş,*
*Şövq ilə Quma, vəcd ilə Zəncanə vurulmuş.*

*Qəzvin ilə ünsiyyət edib, Yəzdə tələsmiş,*
*Kaşan ilə Şiraz ilə Kirmanə vurulmuş.*

*Mərdanələri öylə ediblər onu məftun,*
*Mərdanələri var deyə mərdanə vurulmuş.*

*Illərlə imam ölkədə haqsızlığa qarşı,*
*Üsyan eləyibdir deyə üsyanə vurulmuş.*

*Vurğunluq üçün bir yerə çox vəqt gərəkdir,*
*Şahin isə birdən-birə İranə vurulmuş.*

Bəli, belə aşiqdir Şahin Fazil. İrana tədric ilə deyil, birdən-birə vurulan şairdir Şahin Fazil. Birdən-birə vuruldu və ömürlük sevdi İranı. Sədinin, Hafizin, Qövsi Təbriznin, Şəhriyarın şerlərinə təzminlər yazdı. Məryəm Mirəhmədinin "Səfəvilər dövründə din və dövlət" adlı kitabını fars dilindən azərbaycan dilinə tərcümə etdi. Doktor Əli Əkbər Vilayətinin "Şah İsmayıl Səfəvi dövründə İranın xarici əlaqələr tarixi" kitabının tərcümə edəni Əlibaba Hacızadədir redaktoru oldu...

Bir məsələni də qeyd etmək istərdim. Son illər İranın müxtəlif yerlərindən Bakıya təşrif gətirmiş və Şahin Fazillə görüşmüş şair və yazıçılarımız onun şəxsiyyətinə hörmət, şeriyyətinə məftunluqla yanaşmış, onunla ünsiyyətlərindən məmnun olduqlarını bildirmişlər. Biz Şahin Fazil kimi ağır adamları çox sevirik. Onun rəhbərlik etdiyi "Məcməüşşüəra" şairlər məclisi bizim keçirdiyimiz müxtəlif tədbirlərdə fəal iştirak edir. Elə biz də Şahin Fazilin təşkil etdiyi məclislərdə \məsələn, onun 60 illik yubileyində, yaradıcılıq gecələrində şer məclislərində iştirak etmişik. inşallah. O, İrana burdan sonra da dost sözü deyəcək, inşallah. Şahin Fazil haqda bizim yazdığımız bu müxtəlif qeydlər də elə dost sözüdür.

Vəs-səlamu əleykum və rəhmətullahi və bərəkatu!

*(İran səfərnamələri kitabı*
*2003, səh.3)*

**İbrahim NURİ**
*İran İslam Respublikasının Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzinin sədri*

## ŞAHİN FAZİL VƏ İRAN SƏFƏRNAMƏLƏRİ

Səfərə çox adam çıxır. Səfərə çıxmayan adam səfərnamə yazmaz. Amma, bəllidir ki, səfərə yollanan adamların hamısı səfərnamə yazmır. Səfərnamə yazmaq üçün, əlbəttə, diqqətli müşahidəçi olmaq qabiliyyəti zəruridir. Elə müşahidəçilərin birini mən tanıyıram. O, Şahin Fazildir. Şərqşünasdır. Fars dili mütəxəssisidir. Alimdir. Müəllimdir. Professordur. Yazıçıdır. Şairdir. «Məcməüş-şüəra» məclisinin sədridir. Azərbaycan Yazarlar Birliyinin üzvüdür. 20-dən çox kitab, 300-dək elmi məqalə, 3 Divan müəllifidir. İranşünasdır.

Şahin Fazilin ilk səfərnamə kitabı «İran səfərnamələri» adı ilə 2003 - cü ildə çap olundu. Orada 9 səfərnamə vardı. Şahin o vaxtadək 9 dəfə İranda olmuşdu. Hazırda isə onun İrana etdiyi səfərlərin sayı 21 olmuşdur. Deməli, 9 səfərnamədən başqa 12 səfərnamə də yazıldı. Biz belə məsləhət gördük ki, onun bütün (hələlik bütün!) İran səfərnamələrini bir kitabda toplayıb oxuculara təqdim edək.

Budur, Şahin Fazil tərəfindən təkmilləşdirilən ikinci «İran səfərnamələri» kitabının əlyazması qarşımdadır. Varaqlayıram. Maraqla varaqlayıram. Onuncu səfərnamə: «Şahin, yenə İranə yetişdim, gözüm aydın». On birinci səfərnamə: «Bu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?». On ikinci səfərnamə: «Şahinə qismət olubdur yenə İran səfəri». Və sair və ilaxir. Diqqət yetirdinizmi? Hər səfərin öz adı var... Bu kitbdakı sonuncu (hələlik sonuncu) səfərnamə isə Şahinin bir il bundan əvvəl İrana etdiyi səfərin səfərnaməsidir: «Şahin yenə İran ilə sevda həvəsində». Bəli Şahinin İrana xüsusi məhəbbəti var. O, hər zaman İran ilə sevda etmək istəyir. Axı İranşünasdır. Axı bir şair kimi İran poeziyasının vurğunudur. Axı bir tarixçi kimi İran tarixinin bilicisidir.

Axı bir səyyah kimi İran məmləkətinin məftunudur.

İyirmi bir İran səfərnaməsi. Və iyirmi bir İran səfərinin yüzədək şe'ri. Şahin həm əruz, həm heca, həm də sərbəst vəznli şe'rlərində İrana öz münasibətini bildirir. Həm nəsr, həm də nəzm dili ilə bildirilən münasibət.

Onuncu səfərnamənin ikinci şe'ri. Mürəbbe'dir. İkinci şe'rin birinci bəndində Şahin Fazil özü-özünə müraciətlə belə deyir:

*«Ey torpağa acgöz kimi bağlı qoca Şahin,*
*Torpağım seyr etməyə gəldim bu diyarın.*
*Yer Kürrəsi torpaq ilə dolmuşsa da, lakin*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*Dünyadakı çox viranı, abadı da gördüm,*
*Babildəki sahmanı da, bərbadı da gördüm,*
*İstanbulu da, Bəlxi də, Bağdadı da gördüm,*
*Torpağını seyr etməyə gəldim bu diyarın...*

*Göz var ki, doyub sevdiyi cananı seyrdən,*
*Göz var ki, bezib hurini, qılmanı seyrdən,*
*Şahin gözü doymur niyə İranı seyrdən?*
*Torpağını seyr etməyə gəldim bu diyarın»*

Yaxud, onuncu səfərnamənin üçüncü şe*'ri*. Qəzəldir:

*«Verdim canı, canană yetişdim, gözüm aydın,*
*Canam yetib, canə yetişdim, gözüm aydın...*

*İmkan ələ düşmürdü alam busə üzündən,*
*Görcək onu imkanə yetişdim, gözüm aydın.*

*Zənn eyləməsinlər ki, sənəm tə 'rifidir bu,*
*Şahin, yenə İranə yetişdim, gözüm aydın».*

Şahinin hər səfərnaməsi oxunaqlıdır. Gözlərini varaqlardan ayıra bilmirsən. Oxunaqlı kitabdır. Axı hər səfərnaməni onun şe 'rləri daha da oxunaqlı edir. Və oxucu oxuyur:

*«Çoxdu seyri bu diyarın*
*Nağıllar aləmi kimi.*
*Canda mehri bu diyarın,*
*Gəlmişəm həmdəmi kimi.*

*Çox olmuşam Tehranında,*
*Təbriz kimi məkanında...*
*Fikrim tarix ümmanında*
*Üzmədədir gəmi kimi».*

*(«On birinci səfərnamə»dən)*

Yaxud:

*«Qoca dərviş, yenə İranə səfər var», - dedilər,*
*«Ləngimə, get, hələ qəlbində təpər var», - dedilər.*

*«Sən ki, şahinliyi tərk eyləmisən, indi isə*
*Tutisən, tutiyə Təbrizdə şəkər var», - dedilər.*

*(«On altıncı səfərnamə»dən)*

Yaxud:

*«Sözdə surət, həm də mə 'na axtaran bir şairəm,*
*Surətə xor baxmıram, misra, səlam olsun sənə.*

*Gəlmə, ey rö 'ya bugün, qoy ki, şəhidlərdən yazım,*
*Gözlərimdən çıx, çəkil, rö'ya, səlam olsun sənə».*

*(«İyirminci səfərnamə»dən)*

Yaxud, sonuncu səfəmamə:

*Bitməkdə ömür günləri, bitmir zaman amma,*
*Yaş yetmişə yetmişsə də, qıvraqdı can amma.*
*Dağ timsalı qəddim dik olubdur mənim, indi*
*Dağ üstünü almaqda sərasər duman amma.*

*Faidə-ziyan məsələsində belə gördüm:*
*Faidəmiz olmuşsa da, çoxdur ziyan amma.*
*Həzz ilə fəğan fərqi müəyyən ola bilsə,*
*Üstün gələcəkdir neçə həzzə fəğan amma.*

*... Yazmaqda səfərnamə qələm hər səfərimdə,*
*Çox yazmalıyam mən hələ, çoxdur güman amma.*

*Şahin yenə İrandə ilhamə gəlibdir,*
*İranə gedən çoxsa da, azdır yazan amma.*

*(«İyirmi birinci səfərnamə»dən)*

Şahin Fazilin nəsr dili barədə isə bir neçə cümlə verməyim kifayətdir:

«19 oktyabr, 2009. Səhər saat 11 radələri. Biz artıq Mədəniyyət Mərkəzindəyik. Mən, Məmməd və Nəsib. Mərkəzin sədri cənab İbrahim Nuri və əməkdaşı cənab Əlirza Behbudi «Mersedes» markalı maşınla bizi yola saldılar. Biləsuvar səmtinə yollandıq... Salyan arxada qaldı. Qarşıda isə Biləsuvardı. Təbrizə getdiyimizi bilən sürücü dərhal adının Təbriz olduğunu dedi. Məşədi Təbriz. Məşədi İbad yaşında zarafatcıl bir adamdı. Yaman söhbətcildir...

Biləsuvara yetişdik. Yadıma yazıçı və şair Əlibala Hacızadə düşdü. Axı Biləsuvardan idi Əlibala - bizim mərhum dostumuz. Həyat yoldaşı özündən əvvəl dünyasını dəyişdi. Qırxı təzəcə çıxmışdı.

Əlibala ilə Əfqanıstanda mütərcim vəzifəsində işləmişdik. Aramızda dostluq münasibəti yaranmışdı. Müxtəlif münasibətlərlə bir-birimizə o qədər şe'r yazmışdıq ki. Əlibalanın mənə yazdığı şe'rlərin birində belə sözlər var:

*...«Başımı üstündə Allah var» deyib,*
*«Düşmənə düşmənəm, yara yar» deyib...*
*«Sərvətim, xəzinəm düz ilqar» deyib*
*İlahi bir nura bələndi Şahin.*

*Onun kimi həmdəm ara, həyan gəz,*
*Məhəbbəti yerə, göyə edər bəs.*
*Şahin yaxşı deyib: «Sevənlər ölməz»,*
*Məgər bu eşq ilə öləndi Şahin?*

Çox təəssüf ki, sevənlərdən biri öldü. Əlibala dünyasını dəyişdi. Elə yaşamaq istəyirdi ki.

Mən Astara gömrük məntəqəsindən İrana çox gedib-gəlmişəm. Adətən orada İrana gedən və İrandan gələn adam çox olur, sərhədi keçmək «əməliyyatı» çox vaxt aparır. Bu dəfə isə biz Biləsuvardan keçəcə-

yik. Biləsuvardan Biləsuvara. Astara kimi iki hissəyə ayrılmış Biləsuvara (Yaxşı mövzudur, bu barədə şe'r yazmaq olar).

Sərhəddəyik. Bizim gedəcəyimiz Azərbaycan «Şərqi Azərbaycan» adlanırsa da, İrandır. İranda hələ Qərbi Azərbaycan (paytaxtı Urmiya) da vardır.

Sərhədi keçdik. «Pejo» markalı maşının sürücüsü bizi gözləyir...

Yol. Biləsuvar-Ərdəbil yolu. Keçib getdiyim kənd, qışlaq, şəhristan (kiçik şəhər) və başqa yaşayış yerlərinin adlarını dəftərimə qeyd edirəm. Həmişəki kimi qələmim əlimdə, dəftərim dizimin üstündədir. Yaşayış məskənlərinin adları mənim üçün toponimik baxımdan maraqlıdır: Zərgər, Qara qoçlar, Göytəpə, Gönpapaq, Fuladlı, Odlu, Muradlı, Xoruzlu, Bəybağlı, Narqışlağı, Əkbər Davud, Əjdərli, Sarı Nəsir, Nəcəfqulukəndi, Şəkərab, Keçəllər, Arançı Germi, Şəhrəke- vəliəsr, Onbirbəyli, Dizac, Onqut, Ağdaş, Əliməhəmmədli, Hacı Əhmədkəndi, Nəsrullakəndi, Budaqlı, Qalabərzənd, Əmirkəndi, Alışansuyu, Seyidlər, Keçibulağı, Rəzi. Meşkin şəhəri sağ tərəfdə qaldı. Nağılçılar demiş, sağ getdik, sol getdik, gəlib Ərdəbilə çatdıq».

*(«On doqquzuncu səfərnamə»dən)*

Bəli, Şahin Fazilin bütün İran səfərnamələri belə çoxsahəli, çoxşaxəli və oxunaqlıdır. Oxu, oxucu. Oxuyub mənim haqlı olduğumu görəcəksən.

*(Şahin Fazil. İran səfərnamələri, II nəşr,*
*Bakı, 2013, səh.3-8)*

**Dr. İbrahim İBRAHİMİ**
*İran İslam Cümhuriyyətinin Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzinin sədri*

## İRAN ŞAHİN FAZİLİN GÖZÜ İLƏ

Prof. Dr. Şahin Fazilin bir şərqşünas və iranşünas kimi illərlə müşahidə etdiyi İranın görkəmli səxsiyyətləri, o cümlədən şairləri, alimləri, yüksək rütbəli məmurları, jurnalistləri, müəllim və tələbələri və s. başqa adamları ilə görüşlərinin nəticəsi kimi qələmə aldığı «İran səfərnamələri» nin əvvəlki iki nəşri (2003 və 2013-cü illər) və həmin nəşrlərdən başqa İranla bağlı yeni səfərlərinin əlyazma nüsxələri qarşımdadır. Şahin Fazil və onun səfərnamələri haqqında müəyyən qədər yazan bir neçə fikir və söz sahibinin məqalələrindən bəzi misallar gətirməklə öz sözümə başlamaq niyyətimdəyəm.

**Seyid Əli Əkbər Ocaqnejad** – Mədəniyyət Mərkəzinin sabiq sədri: «Kimdir Şahin Fazil? Mən onu Bakıya gəldiyim ilk günlərdən tanımışam. Gəlin onu bir daha sizə təqdim edim, əziz oxucular. Mən Şahin Fazil barədəki məlumatı elə onun öz mətbu xatirələrindən, məqalələrindən, şeirlərindən və bir də Əlibala Hacızadə, Tofiq Cahangirov, İmamverdi Həmidov, Qabil Camalzadə kimi dostlarından öyrənmişəm. Bilmişəm ki, şairdir, təqdiqatçıdır Şahin Fazil. Bilmişəm ki, Azərbaycan Yazıçılar Birliyinin üzvü, «Məcməüş-şüəra» şairlər məcilisinin sədridir Şahin Fazil. Bilmişəm ki, tarix elmləri doktoru, professordur Şahin Fazil. Bilmişəm ki, xarici ölkələrə tez-tez səyahətlər edən səyyahdır Şahin Fazil. Hər şeydən üstünü isə budur ki, sözün tam mənasında ziyalı bir səxsdir Şahin Fazil».

**Əlibala Hacızadə** – Görkəmli Azərbaycan yazıçısı: «Mən Şahin Fazilin qələmindən çıxan çoxlu məqalə oxumuşam. «İran səfərnamələri»ndən başqa «İraq səfərnamələri» («Xurma kimi şirin Bağdad» və «Bağdad kimi şirin xurma»), «Türkiyə səfərnamələri», «Gürcüstan görüşləri», «Dağıstan dəftəri», «Özbəkistan təəssüratları» və s. Vaxtının çoxu müxtəlif səfərlərdə keçən bu dərviş görünüşlü ağsaqqal, ağsaç adamın (şairin, alimin, publisistin, müəllimin) «İran səfərnamələri»nin ayrıca kitab şəklində çapa hazırlanması isə, mən deyərdim ki, əlamətdar ədəbi hadisədir, ölkələrarası münasibətlərin daha da genişlənməsinə xidmət edən olduqca faydalı bir addımdır. Kitabı oxuduqda mən sankı Şahinin İranda olduğu yerlərə baş çəkirəm, görüşdüyü adamlarla

görürşürəm, ziyarət etdiyi ziyarətgahlarda namaz qılıram, dua edirəm... Kitabı oxuduqca sanki İranda Şahinin təmasda olduğu dövlət xadimləri, alimləri, şairləri, nasirləri ilə görüşürəm, üzlərindən və sözlərindən nur yağan ziyalıları ilə ünsiyyətdə olub ziyalılanıram... Kitabı oxuduqca yenə oxumağım gəlir, oxumağım gəldikcə yenə oxuyuram»...

**İbrahim Nuri** – Mədəniyyət Mərkəzinin sabiq sədri «Səfərə çox adam çıxır. Səfərə çıxmayan adam səfərnamə – yazmaz. Amma, bəllidir ki, səfərə yollanan adamların hamısı səfərnamə yazmır. Səfərnamə yazmaq üçün, əlbəttə, diqqətli müşahidəçi olmaq qabliyyəti zəruridir. Elə müşahidəçilərin birini mən tanıyıram. O, Şahin Fazildir.

Şərqşünasdır. Fars dili mütəxəssisidir. Alimdir. Müəllimdir. Prtofessordur. Yazıçıdır. Şairdir. «Məcməüş-şüəra» məclisinin sədridir. Azərbaycan Yazarlar Birliyinin üzvüdür. 20-dən çox kitab, 300-dək elmi məqalə, 3 Divan müəllifidir. İranşünasdır.

Şahin Fazilin ilk səfərnamə kitabı «İran səfərnamələri» adı ilə 2003-cü ildən çap olundu. Orada 9 səfərnamə vardı. Şahin o vaxtadək 9 dəfə İranda olmuşdu. Hazırda isə onun İrana etdiyi səfərlərin sayı 23 olmuşdur. Deməli, 9 səfərnamədən başqa 14 səfərnamə də yazıldı. Biz belə məsləhət gördük ki, onun bütün (hələlik bütün!) İran səfərnamələrini bir kitabda toplayıb oxuculara təqdim edək».

**Qurban Cəbrayıl** – şair, «Nəbz» qəzetinin baş redaktoru: «Şahin müəllim istər Əfqanıstanda, istər İranda, istər dünyanın o başındaklı Yaponiyada olsun, fərqi yoxdur, darıxır. Darıxır doğma diyarı Azərbaycan üçün, Bakı, Quba, Göyçay üçün, əzizləri, dost-yoldaşları üçün. Odlar Yurdu olan ölkəsinin aşiq Məcnunudur Şahin, səyyah Məcnunudur Şahin, şair Məcnunudur Şahin:

*«Ey canım Azəribaycan eli Odlar Yurdum,*
*Seyr edim hər yerini gündə bir az, vacibdir...*

*Gündə yüz dəf'ə bu Şahin əyilər qarşında,*
*Neyləsin, çünki müsəlmanə namaz vacibdir».*

Vətənində olduğu kimi xaricdə də vaxtını boş-boşuna keçirmir, özünün təbirincə desək, «vaxt qatili olmur», hər gün yazır, şeirimizin müxtəlif növlərində qələm işlədir. Məsələn, onun bir xoyratısını misal gətirim:

*Savalandır,*
*Zirvəsi övc alandır.*
*İlhamım, yetiş dada*
*Şahini havalandır.*

İranda Savalan dağından, El gölündən, Sefidrud çayından, Təbriz, Məşhəd, Qum şəhərlərindən yazmaqla bərabər tez-tez yaralı Qarabağını da xatırlayır, yadların xəyanət və rəzaləti nəticəsində işğal olunan doğma torpaqlarının həsrətindən yazır, yazir...»

**Hacı Rafiq Şirvani** – «Say» qəzetinin baş redaktoru, «Vahid ədəbi məclisinin sədri: «İki toplanan bir cəmdə birləşdiyi kimi, bu iki dost, qardaş, məsləkdaş və amaldaş şair və alim - Şahi Ərdəbili və Şahin Qubalı da iki bədəndə bir qəlb kimidirlər. Hərgah Şahin Fazil

*Xəlq etdi məni, lütf ilə göndərdi cəhanə,*
*Ol lütfü məgər bir də İlahi eləyərmi?»*

– mətləli qəzəlində yazır və

*«Şahi» ilə «Şahin»dəki fərq bircə hərfdir.*
*«Nun» hərfini silmək məni Şahi eləyərmi?»*

–deyə qardaşına ixlasını bəyan edirsə, Əsgər Şahi də

*«Ey dərin şeirləri can kimi şirin Şahin,*
*Döndərən ətr ilə söz zülfünü çin-çin Şahin»*

–mətləli qəzəlində yazır:

*«...Sən ilən mən salarıq mavi səmalarda səda*
*Olsaq Allah qapısında iki misgin, Şahin.*

*Gecə gördüm yuxuda Kə'bə qabağında durub*
*Eləyir Şahi dua, söyləyir «Amin» Şahin».*

**Şahin Fazil** özü haqqında: «Səfərə yollanan çox, səfərnamə yazan az. Mən çoxlardanam. Hansı ölkəyə qədəm basıramsa əlim dinc dayanmır və yazıram. Yazmaya bilmirəm».

Şahin Fazilin İrana birinci səfəri 1992-ci ilin dekabr ayının əvvəlində

olmuşdur. O, İran səfərindən əvvəllər və sonra da xarici ölkələrdə çox olmuş, Əfqanıstanda 13 il, başqa yerlərdə isə (Türkiyə, İraq, Yaponiya, keçmiş Sovetlər İttifaqının bir sıra ölkələrində) keçirilən müxtəlif Beynəlxalq Elmi Konfranslarda Azərbaycan Respublikasını təmsil etmiş, müqəddəs ziyarət yerlərinin zəvvarı olmuş, mehmanı olduğu ölkə və şəhərlərin səfərnamələrini yazmış, çoxsaylı şeirlər qələmə almışdır. Mən onun bütün səfərnamələrini oxumuşam və onların hamısından yazmaqla vaxtınızı almaq istəmirəm, möhtərəm oxucular. Düşünürəm ki, mən əgər bu məqaləmdə onun İrana birinci səfərindən müxtəsər bəhs etsəm, siz onun sonrakı səfərnamələrinin məzmunundan müəyyən qədər məlumatlı olacaqsınız.

Beləliklə, birinci səfər və səfərnamə. Bu səfərdə Şahin Fazillə həmsəfər olmuş nümayəndə heyətinin tərkibinə akademiklər Eldar Salayev, Ziya Bünyadov, yazıçı Anar, nəşriyyat direktoru Əlican Əliyev, şairlər Sabir Rüstəmxanlı, Qabil, Qasım Qasımzadə, Fikrət Sadıq, Nazim Rizvan, Sərvinaz Həsənli, məşhur alimlər Bəkir Nəbiyev, Tofiq Hacıyev, Yaşar Qarayev, Rüstəm Əliyev, Rüqiyyə Qəmbərqızı, İmamverdi Həmidov, Şirindil Alıcanov, Kamil Allahyarov, rəssam Fəxrəddin Əli və başqaları daxil idilər.

Şahin Fazil həmən səfər günlərində İranın ən böyük rəhbəri (məqame-müəzzeme-rəhbər) Seyid Əli Xameneyi, Xarici İşlər naziri Əli Əkbər Vilayəti, Mədəniyyət və İslam İrşadı naziri Laricani, ustad Zəkəriyya Tərzəmi, şairlər Müşfiq Kaşani, Mahmud Pədidə, Dəstpiş Valeh, Cəfəri Ürmiyəvi, Saed Baqeri, şairə Solmaz, Səba Firuzkuhi, tədqiqatçı-alimlər Əli Əsğər Şeirdust, Cəlil Təclil, Fərhad Fəxrəddini, Misgənrad, Əsgər Fərdi (Tehranda), Təbrizin baş ruhanisi Aqaye-Mələkuti və şəhrdar Musəvi ilə Təbrizdə görüşmüş, 9 şeir yazmış, çıxışlar etmişdir. Həmin şeirlərin birində Şahinin orada yazdığı ikinci qəzəlinin birinci beyti belədir:

*Dəyməsin xətrinə Allahı gərək İranın,*
*Var isə xar ola bədxahı gərək İranın.*

Ş.Fazilin 1992-ci ildən başlayan səfərlərinin hasili olan 23 səfərnaməsinin adlarına diqqət yetirin, möhtərəm oxucular: «Dəyməsin xətrinə Allahı gərək İranın», «Dilək hasil olub, çünki yenə İranə gəldim mən», «Bülbül kimi şadəm ki, gülüstanə yetişdim», «Nə gözəl dildi bu farsın dili, yarəb, nə gözəl», «Azru eləyən çoxsa da, İranə yetişməz», «Şahin uç-

muş yenə şahin kimi İran tərəfə», «Məşhədin hər daşı mərcanə bərabərmiş ki!..», «Qoca Şahin, nə çəkir hey qoca İranə səni?..», «Şahin, yenə İranə yetişdim, gözüm aydın», «Bu nə hicran ki, yetişməkdə vüsal ətri mənə?», «Şahinə qismət olubdur yenə İran səfəri», «Şahinin gözləri Təbrizdə qalıbdır, gözəlim», «Urmiyə torpağına heyran olubdur Şahin», «On beşinci səfərim başladı İranə mənim», «Qoca dərviş yenə İranə səfər var dedilər», «Vaxtın ətəyindən tutub İranə tələsdim», «Ey möcüzələr yurdu, ey İran, gəlirəm mən», «Gördüm nə qədər təntənə Təbriz şəhərində», «Şahin istər hər zaman etsin səni yad, Ərdəbil», «Şahin yenə İran ilə sevda həvəsində», «Ərdəbil torpağının fəxridi Əsgər Şahi», «Şəhriyar yurdundayıq İranə bizlərdən salam».

Möhtərəm oxucular! Diqqət yetirdinizmi? Yuxarıda hər səfərnamənin əruz vəzinində yazılmış misrası başlıq kimi nəzərə çatdırılır. İndi isə mən «İran səfərnamələri» kitabının yeni nəşrinin, təkmilləşdirilmiş üçüncü nəşrinin əlyazma nüsxəsinə nəzər yetirirəm: Yenə həmin üslub, yenə həmin tərz, yenə Şahin Fazilə xas qələm. Axı müəllif həmin adamdır. Yeni nəşrdə çap olunası yeddi səfərnamə:

*«Ərdəbildə çox kəsə məlumdur eşqim, qardaşım»;*
*«Şəhriyar ölsə də sağdır, dirilik şairidir.»;*
*«Təbrizə gətirmiş bizi ustad Füzuli»;*
*«Istiqamət bizə xoşdur yenə İran tərəfə»;*
*«Nəğməsi bitməz-tükənməz nəğməkardır Şəhriyar»;*
*«Təyyarəyə Təbrizdə minib Yəzdə tələsdim»;*
*«Ərdəbil bir də çağırmış məni, getmək vacib!».*

Şahin Fazilin səfərnamələrinin əvvəlki iki nəşri haqqında, bildiyimiz kimi, bir necə məqalə yazılmış və həmin kitabların təqdimat mərasimləri keçilmişdir. İndi isə yeni yeddi səfərnamə. Cəmi otuz səfərnamə. Özü də hələlik otuz səfərnamə. Allah-təala Şahinə uzun ömr bəxş edər İnşaallah. Yəqin ki, bu «səyyah» qismət olsa yenə İrana gedər və İran səfərnamələrinin sayını bir neçə vahid də artırmış olar. Təki canı sağ-salamat olsun Şahin Fazilin!

Mən indi bu şair-alimin bütün səfərnamələrindən bir neçə beyti misal gətirməklə oxuculara onun İrana olan məhəbbət və ülfətini nəzərə çatdırmaq istərdim:

*Bu gözəllikləri mədh etməyə qadirmi bəyəm?*
*Neçə Şahin kimi məddahı gərək İranın.*
***
*Mənim könlümdə, ey Şahin, bu gün yoxdur dilək başqa,*
*Dilək hasil olub, çünki, yenə İranə gəldim mən.*
***
*Əfqanlərin töhfəsi eşq oldu bu səxsə,*
*Iranlıların töhfəsi gözlər məni indi.*
***
*Tez-tez düşür İranə yolum, söylədilər ki,*
*-Şahindi bu, hər ölkəyə İranı dəyişməz.*
***
*Hafizin şeirini Şahin dedi, bülbül susdu,*
*Fars dili məst elədi bülbülü yarəb, nə gözəl.*
***
*Şahin, yenə bəxtim gətirib,Məşhədə gəldim,*
*Arzu eləyən çoxsa da, İranə yetişməz.*
***
*Niyə sərxoş olmuram mən, mənə sən su vermisənmi?*
*Mənə, saqi, öylə mey ver ola Xəyyamın meyindən.*
***
*Eşidib dostları Şahin Bakını tərk eləyib,*
*Dedilər:- Özgə yerə yox, yenə İranə gəlir.*
***
*İstanbulu, Bağdadı gəzən nötqəbənöqtə,*
*Hərdən də gedən Təbrizə, Tehranə mənəm, mən.*
***
*Zənn eyləməsinlər ki, sənəm tərifidir bu,*
*Şahin, yenə İranə yetişdim, gözüm aydın.*
***
*Dərviş kimi çox gəzdim, acgöz təki çox baxdım*
*Rəştə, Quma, Təbrizə, Zəncanə məhəbbətlə.*
***
*İsmayılzadə Rəsul söylədi «Gəl Təbrizə»,*
*Gəlməyim mən nə təhər bəs bu gözəl Təbrizə?*
***
*Monqolustan qoşunu eylədi çox yanə hücum,*

*Qoca İranə yürüş başladı, Turanə hücum.*
***
*Şərqi nədir, Qəribi nə? Qərbi nədir, Şərqi nə?*
*Bilməyirəm fərqi nə? Azəribaycandır!*
***
*Fürsət var ikən, Şahina, dərviş kimi gəz, gəz-*
*Bir gün deyəcək cismə həzin can: Xudahafiz!*
***
*Qoca dərviş, yenə İranə səfər var,- dedilər,*
*Ləngimə, get, hələ qəlbində təpər var,-dedilər.*
***
*Vaxt ötdü və Şahin, yenə seyranə tələsdim,*
*Vaxtın ətəyindən tutub İranə tələsdim.*
***
*Meylimi sövq eyləyib İstanbula,*
*Səmtimi Tehran eləyənlərdənəm.*
***
*Hər dəf'ə gələndə məni xoş qarşılayıblar,*
*Gördüm nə qədər təntənə Təbriz şəhərində.*
***
*Açsa da İrandə qol və qanad Yəhyəvi,*
*Eylədi çox yandə gör necə ad Yəhyəvi.*
***
*Demişəm ki, bu cahan boyda cahandır Şahi,*
*Yalanım yox, gözümə böylə əyandır Şahi...*
***
*Şəhriyar yurdundayıq, İranə bizlərdən salam,*
*Eşqi ilə olmuşuq məstanə, bizlərdən salam.*

Şahin Fazil və onun xarici ölkələrə, xüsüsən İrana etdiyi səfərlərlə əlaqədar bir məsələni də qeyd etmək istərdim: Bildiyimiz kimi bu şair-mütərcim hansi ölkəyə gedir və mehribanlı ilə qarşılanırsa, oranı hec vaxt unutmur. Buna görə də onun səfərnamələrində tez-tez Kabul, Qəndəhar, Bağdad, Tehran, Təbriz, Daşkənd, Səmərqənd, İstanbul, Ankara və s. yerlər xatırlanır, və onun fikir və düşüncələri həmin səmtlərə yönəlir. Əfqanıstanda 13 il mütərcim işləyən Ş.Fazil, təbii ki, o diyarı indiyədək yadından çıxara bilmir. Elə mən özüm də Hindistanda 13 il yaşa-

mış, elmi təhsil almış, təqdiqatla məşğul olmuşam. Elə mən özüm də Hindistanı unuda bilmirəm.

Məqaləmi Şahin Fazilin özünün İran haqqındakı bəzi fikirlərini misal gətirməklə sona çatdırmaq istərdim:

«Bu gün İranla xudahafizləşmək günümüzdür. Bu günün nisgili həmişəlik məni ağrıdacaqdır. Əlvida, gözəl İran, gözəl Tehran, gözəl Təbriz! Əlvida Şəhriyar yurdu! Sağlıq olsun, yenə görüşərik inşaallah».

***Tehran-Bakı,***
***1-8 dekabr 1992***

«Deməliyəm ki, İran İslam Respublikası Füzuli konfransına olduqca yaxşı hazırlaşmış, böyük şairin xatirəsinə 5 nəfis kitab nəşr etmişdir. Onlar Füzulinin fars və türk divanlarından, o cümlədən Əli Əsgər Sədiqinin «Fələklər yandı ahimdən» və Cəlil Təclilin «Leyli və Məcnuni-Füzuli» və «Nizami» kitablarından ibarətdir.

***Azərbaycan-İran,***
***6-14 dekabr 1995***

«Tehran və Qumda olduğum zaman 10 ədəddən çox şeir yazmışdım. Mayın 9-da qələmə aldığım bir qəzəlimi möhtərəm oxuculara təqdim etmək, zənn edirəm ki, maraqsız olmaz. Çünki bu qəzəldə İranla ayrılıq ərəfəsində keçirdiyim bədii hisslər qələmə alınmışdır:

*Bağiban, getməliyəm, bağda bəhər qurtardı,*
*Söyləyin tutiyə «lal ol ki, şəkər qutardı...»*

Mayın 10-da bizi ehtiramla yola saldılar. Dərsim olduğu üçün mən Lənkəranda səfər yoldaşlarımdan ayrıldım.

Mayın 13-də artıq Bakıdaydım. Gecə birdən-birə yenə telefonum səsləndi. Əsgər Faresi idi. Dedi ki, sabah saat on ikinin yarısında İran Mədəniyyət Mərkəzinin rəisi aqaye-Ocaqnejad İrandan qayıdan nümayəndə heyətinin üzvlərini görüşə dəvət edir. Ona təşəkkürümü bildirdim.

Ertəsi gün deyilən vaxtda görüş başlandı. Sonra biz Mədəniyyət Mərkəzinin yeni mədrəsə binasını (Əhmədli qəsəbəsi) gəzdik, otaqlarla tanış olduq, inşası bitməkdə olan iclas zalını seyr etdik.

Elə həmin gün, yenə saat 23-dən sonra telefonun zəngi məni yuxudan oyatdı. Dərhal düşündüm ki, bu zəng çalan adam, yəqin ki, yenə Əsgər Faresi olacaq. Zənnimdə yanılmamışdım. İranlı dostum məni təbrik edib dedi:

-Aqaye-Şahin, Həzrət Fatimeye-Zəhra səlamullahe-əleyhanın şərəfinə yazdığınız və İran Mədəniyyət Mərkəzi tərəfindən elan olunan şeir müsabiqəsinə göndərdiyiniz şeirlər mükafata layiq görünüb.

İndi Əsgər Faresinin zəngindən üç gün keçir. Amma mən yenə də onun növbəti gecə zəngini gözləyirəm. Xoşxəbər Faresi...»

***Tehran-Lənkəran-Bakı,***
***1-17 may 2000***

«Sübh hələ hava qaranlıq ikən saat 4-də 3 maşınla Təbrizdən çıxıb Astara səmtinə yola düşdük. Sədr Məhəmmədi Sədr yenə bizi müşayət edirdi. Ona zəhmət verməmək istəyimizə baxmayaraq dedi: «Sizi sərhədədək yola salmalıyam».

Sərab şəhəri arxada qaldı. Hava artıq ağarmışdı. Ərdəbilə çatdıq. Şeyx Səfi məqbərəsinin yanından keçdik. Heyran aşırımı. İndi sağda dağ, solda dərə. Dərə boş deyildi, buludla dolu idi. Buludlar bizdən aşağı, maşınlarımız buludlardan yuxarı idi».

***Bakı-Təbriz-Bakı,***
***28 fevral-8 mart 2005***

«İmam Xomeyni adına təyyarə meydanı. Dəmir quş Bakıya tərəf götürüldü. İranla 5 günlük görüşümüz geridə qaldı. İrəlidə isə Odlar diyarımız Azərbaycan, istəkli vətənimiz.

Uğurlu səfər oldu. Yeni tanışlar, təzə ünsiyyətlər. Tofiq məruzə etdi, mən səfərnamə yazdım, Elxan isə «Mələknamə»nin ilk variantını tamamladı. (Yeri gəlmişkən, biz Bakıya qayıtdıqdan sonra o həmin əsəri məşhur şərqşunas alim Vasim Məmmədəliyevə də oxudu və poema akademik tərəfindən təqdir olundu).

Deməli, İranla yeni ayrılıq. Amma, yeni görüşlər də olacaq inşaallah. Bir də gedərik, bir də görüşərik...»

***Bakı-Tehran-Bakı,***
***1-5 may 2008***

«Maşın şütüyür. Təbrizə 45 km. qalır. Kürdlər kəndi. 20 km. qalır. Təbriz şəhəri. Şəhərin mərkəzindəki «Şəms Təbrizi böyük bazarı». Məşhur «El gölü» istirahət bağı.

Sonra bütün gecəni yol getdik. Sürücü arabir maşını yoldan sağa verib gözünün acısını alırdı. Elə biz özümüz də.

Sühb saat 10-da artıq Biləsuvardayıq.

Sərhədi keçdik. Sağ ol, Urmiya! Yaşa Urmiya gölü! Salam, Azərbaycan! Salam, Bakı!»

***Bakı-Urmiya-Bakı,***
***22-26 sentyabr 2012***

«Sübh tezdən dr.İbrahiminin dostu aqaye-İshaqi öz maşını ilə otelə gəldi, bizi sübh yeməyinə dəvət etdi. Kafe. Kəlləpaça...

Yaxınlıqda «Məhəmmədiyyə» məscidi vardı. Aqaye-Ocaqnejad və Ərdəbil imamcüməsi Seyid Həsən Ərdəbili bu məsciddə o qədər xütbə oxuyublar ki...

Otelə qayıtdıq. Bizi aparacaq maşın hazır vəziyyətdə idi. Qərara alındı ki, Azərbaycana Biləsuvar yoluyla qayıdaq.

Üç saatlıq yol. Yarım saatlıq gömrükxana təşrifatı. Artıq Azərbaycan Biləsuvarındayıq.

Axşam saat 18-də Bakıya çatdıq. Salam, Bakı!»

***Bakı-Ərdəbil-Bakı,***
***12-14 mart, 2014***

«Bu gün Bakıya uçmalıyıq. Aeroportda bizi ehtiramla yola saldılar. Təyyarədə bir neçə dəqiqə mürgülədim. Yuxuda yuxu gördüm: Dünya ilə söhbətləşirdim... Oyanıb yeni bir şeir qaraladım:

*Arabir üz-üzə söhbətləşirik, dünya - mən,*
*«- Şəhriyar haqda kitab yazmamışam, heyfa mən...»*

Xudahafiz, Təbriz! Salam, Bakı! Qismət olsa yenə Təbrizlə görüşərik!»

***Bakı-Təbriz-Bakı,***
***16-20 sentiyabr, 2014***

«Sübh tezdən Təbrizdən çıxdıq. Tələsmirdik. Bütün gün müxtəlif yerlərdə dayana-dayana yol getdik. Axşam üstü Biləsuvarların gömrük məntəqələrini keçdik. Hər iki gömrükxananın işçiləri bizimlə olduqca nəvazişlə davranır, ehtiram göstərirdilər.

İki yüngül minik avtomobili ilə Bakıya gedirik. Yağış yağır. «Yağış bərəkətdir» deyilir. Səfərimiz bərəkətli oldu. Üç gün ərzində o qədər yeni simalarla görüşdük, o qədər söhbət etdik, şeir oxuduq və dinlədik ki.

Gələcək görüşədək əlvida Təbriz! Salam Bakı»!

***Bakı-Təbriz-Bakı,***
***18-21 noyabr, 2014***

«Sübh vaxtı Ərdəbildən yola düşdük. Biləsuvar istiqaməti. Günorta üstü sərhədi keçdik Biləsuvar istiqaməti. Sonra Biləsuvar-Bakı yolu.

Qismət olsa, yenə görüşərik, Ərdəbil»!

***Ərdəbil-Biləsuvar-Bakı,***
***24-29 iyul, 2015***

«Sübh tezdən oyanıb bu səfərnaməmin sonuncu – altıncı şeirini yazdım. Təzmindir və təbii ki, ustad Şəhriyarın qəzəlinin təsiri ilə mənim nəzm ipimə düzüldü:

*«Qeyrətin dağ kimidi, dağ dağa əlbət dayanar,*
*Sən də dağlar kimi dağları dayaq eyləmisən».*

***(Şəhriyar)***

*Dedilər ki, məni günlərlə soraq eyləmisən,*
*Qapqaraydı, günümü gör necə ağ eyləmisən.*

*Ey könül, sevgidən inşa eləmə bir də qəzəl,*
*De rəzil qonşuma ki, cəngi nahaq eyləmisən.*

*Nə yaman fitnə yaratdın Qarabağ yurdunda...*
*Neçə ildir ki, məni sən sinədağ eyləmisən.*

Artıq 4 gündür ki, Təbrizdəyik. Bu gün Azərbaycandan Azərbaycana, Təbrizdən Bakıya yola düşməliyik. Bu günlər ərzində bizə can-

başla xidmət göstərən Cavad Kəriminejad bizi yola saldı və yeni görüşlər istəyi ilə Təbrizdən ayrıldıq.

Əlvida, Təbriz! Salam, Bakı!»

***Bakı-Təbriz-Bakı,***
***14-18 sentyabr, 2015***

«Təyyarə meydanından təyyarə meydanına uçduq. Üçüncü təyyarə meydanına (Bakı) çatmağımıza bir neçə saat qalırdı. Tehranda qarşıladılar və orada da yola saldılar.

Tehran – Bakı reysi. Biz Bakıya çatanda sübh ağarırdı. Günün, gündüzün ağ olsun, Bakı»!

***Bakı-Tehran-Yəzd- Tehran-Bakı,***
***22-27 may, 2016***

«Günə baxa-baxa qayıdırıq. Qayıdırıq başqa bir günəşli diyara. Qayıdırıq doğma vətənimizə, öz ev-eşiyimizə. Amma Ərdəbil çağırsa, yenə də bir neçə günlüyə qayıdarıq ora. Təki yas məclisi yox, şadlıq məclisləri olsun inşaallah»!

***Bakı-Ərdəbil-Bakı,***
***29-30 dekabr,2016***

**Beləliklə, Şahin Fazilin «İran səfərnamələri» kitabının üçüncü nəşrinin işıq üzü görməsinə az vaxt qalmışdır. Yeni səfərlər və səfərnamələr arzusu ilə!**

***(Şahin Fazil. İran Səfərnamələri, III nəşr,***
***Bakı, 2017, səh. 3-15)***

**Qurbanəli PURMƏRCAN**
*İran İslam Respublikasının Azərbaycan Respublikasındakı Səfirliyinin Mədəniyyət Mərkəzinin sədri*

## PROFESSOR ŞAHİN FAZİLİN BÖYÜK TƏRCÜMƏLƏRİ HAQQINDA KİÇİK QEYDLƏRİM

Tarix elmləri doktoru, divanlar və səfərnamələr, neçə-neçə kitablar müəllifi, şair, mütərcim, müəllim professor Şahin Fazili artıq 25 ildir ki, tanıyıram.

Xatirimdədir. Bakıdan və Naxçıvandan bir neçə şair, alim və jurnalist Tehrana gəlmişdi. Onların arasında şair-qəzəlxan Həkim Qəni, jurnalist Hacı Rafiq, nasir və şair İsgəndər Etibar, professor İsa Həbibbəyli və başqa səfərdaşlar da vardı. Məqsəd İranın müxtəlif yerlərində olmaq, "Beynalxalq İmam Xomeyni və Aşura Mədəniyyəti Konqresi" adlanan tədbirdə söz söyləmək, həmçinin İran və Azərbaycan şairlərinin birlikdə keçirəcəkləri şeirləşmələri ("müşairə") və başqa tədbirlərdə iştirak etmək idi. Cəmi 5 gün davam edən səfər zamanı Bakıdan təşrif gətirən bir neçə şəxs xüsusilə fərqlənərək, öz çıxışları ilə hamını, necə deyərlər "feyziyab" etdi. Bu haqda Ş.Fazilin "İran səfərnamələri" adlı kitabında oxuyuram:

"Sərhədi keçən kimi saatımın əqrəblərini ölkəmiz arasında vaxt fərqinə görə yarım saat geriyə çəkdim. Bu o demək idi ki, mənim üçün gün yarım saat uzanacaq, gecə yarım saat gec gələcək. Yarım saat az vaxt deyil. Yarım saatda çox gözəllik seyrinə dalmaq olar. İlham pərisi köməyə çatsa yarım saatda gündüz işığında ən azı bir şe'r yazmaq olar:

*Hərdən həzzə dalıb, hərdən nisgilə,*
*Kaş bilim qədrini hər anın belə.*

Bəli, mən yenə İrandayam.

Şair-qəzəlxan Həkim Qəni, jurnalist Hacı Rafiq, tarixçi Anar Muradov, naşir və şair İsgəndər Etibar, iman sahibi və təqvalı insan olan Məhəmməd Hüseynli, mən Şahin Fazil və daha 200 mömin qardaş və bacılarımız yetişdik Tehrana. Qarşıda ayətullah İmam Xomeyni həzrətlərinin 80-ci ildönümü münasibətilə keçriləcək mərasimdə iştirak etmək, Məşhəddə İmam Rzanın, Qumda Həzrət Məsumə xanımın məzarlarının ziyarətinə getmək kimi müqəddəs tədbirlər durdurdu.

Ertəsi gün Tehran Universitetinə gəldik.

İyunun 3-də sübh yeməyindən sonra avtobuslarla Qum şəhəri istiqamətinə "Behişte-Zəhra"ya tərəf yollandıq. Bu gün xordad ayının 15-i, İmam Xomeyninin vəfatının 8-ci ildönüm günüdür.

O gün orada məndən İran televiziyası üçün müsahibə aldılar. İran və İmam barədə fikirlərimi bildirdim.

Əvvəlki səfərlərdə bizi Məşhəd ziyarətinə təyyarə ilə aparmışdılar. Demək, bu dəfə İranın bir neçə şəhərini, qatar pəncərələri arxasından olsa da, seyr eləmək imkanım vardır. Gözlərim bu füsunkar təbiəti seyr etdikcə neçə-neçə şəhəri—Nişapuru, Semnanı, Şahrudu, Vəramini, Səbzvarı, Damğanı və başqa böyük-kiçik şəhərləri ötüb keçdik. Nəhayət, Məşhədə gəlib çatdıq:

*Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,*
*Fikrim, nəzərim sən kimi cananədə qaldı...*

Məşhəddə bizi xüsusi qonaqpərvərlik və mehribanlıqla qarşıladılar. Xorasan ostandarının müavini bizim şərəfimizə böyük bir ziyafət verdi.

Məşhur iki şəxsiyyətin—Firdovsinin və Nadir şahın heykəllərini bir daha seyr etdim, hər ikisinə rəhmət oxudum. Ertəsi gün saat 11-də Tehrana qayıtdıq. Mən "Divan"ımın ilk şeiri olan "Minacat" adlı Allahtəalaya müraciətlə yazdığım böyük həcmli qəsidəmi oxudum. Həmin "Minacat"ın bir neçə beytində dövrümüzün ən faciəli hadisələrindən biri—Qarabağ faciəsi bir daha xatırlandı:

*...Sən Allahsan, kərimsən,*
*Allah, bağışla məni.*
*"Ər-rəhmanu rəhimsən*
*La ilahə illəllah",*
*Allah, bağışla məni.*

*Vəhmin qılınctək kəsir,*
*Əlim-ayağım əsir,*
*Qüsurum az olsa da,*
*Dilim-dodağım əsir,*
*Allah, bağışla məni.*

*Ötməyib ömrüm hədər,*
*Savabım ulduz qədər.*
*Günahlarım da olub,*
*Üzr günahdan betər,*
*Allah, bağışla məni.*

*Özümü öymüşəm də,*
*Özümü döymüşəm də,*
*Bəzən söyüşçülərtək*
*Kimisə söymüşəm də,*
*Allah, bağışla məni.*

*Bəzən əfvə başladım,*
*Hicranı bağışladım,*
*Çox cahili, alçağı,*
*Nadanı bağışladım,*
*Allah, bağışla məni.*

*Ən pis günü də gördüm,*
*Kipriklə od götürdüm,*
*Ağ bəxtim qara oldu,*
*Qarabağı itirdim,*
*Allah, bağışla məni.*

*Yaşım son həddə çatır,*
*Ömür o səddə çatır...*
*Ata minə bilmirəm,*
*Düşmənlər at oynadır,*
*Allah, bağışla məni.*

*Gəldi kədər, cumdu qəm,*
*Gözlərimi tutdu nəm,*
*Özüm öz günahımı*
*Bağışlaya bilmirəm,*
*Allah, bağışla məni,*
*Allah, bağışla məni.*

İyunun 6-da sübh yeməyindən sonra Qum şəhərinə yollanıb "Hərəme-Məsumə"ni ziyarət etdik. Elə həmin gün də Tehrana qayıdaraq, bir qədər dincəldikdən sonra Tehran- Bakı istiqaməti ilə hərəkət etdik. Ertəsi gün artıq Bakıda idik.

Mən bu səfər təəssüratımın sonunda bizim bu ziyarətimizi olduqca yüksək səviyyədə təşkil edən İran İslam Cümhuriyyətinin Azərbaycandakı fövqəladə və səlahiyyətli səfiri ağaye-Bigdeliyə, səfirliyin məsul işçisi ağaye-Hafiziyə, irfani söhbətlərinə heyran olduğum ağaye-Ocaqnejada, bizi böyük qayğıkeşliklə müşayiət edən ağaye-Səduqiyə, İranda xidmətimizdə duran ağaye-Purmərcana, ağaye-Qasimiyə, dostumuz ağaye- Şe'rdusta dərin təşəkkür və minnətdarlığımı bildirməklə sözümü bitirirəm."

Bəli, Şahin Fazil, yuxarıda qeyd etdiyim kimi istedadlı mütərcimdir. O, Ustad Məhəmmədhüseyn Şəhriyarın fars dilinə yazdığı "Pərvanənin ruhu" ("Ruhi-pərvane") poemasını və başqa şerlərini azərbaycan dilinə tərcümə etmişdir. Poemadan bir necə beyt:

*"Qaçdı yerin rəngi-rufu get-gedə,*
*Çünki günəş indi qürub etmədə...*

*Öldü Günəş—nur çiləyən aləmə,*
*Batdı Göyün köksü bu gün həm qəmə...*

*Toy şamı şiddətlə, yaman ağlayır...*
*Ah, Şəfəqin gözləri qan ağlayır...*

*Zülmətə qərq etdi fələk aləmi,*
*Rəngi qara oldu günahkar kimi.*

*Bezmiş idi Çərxi-fələk gör necə*
*Gündüzü etmişdi qaranlıq gecə..."*

Şahin Fazilin bədii tərcümələri çoxdur. Diqqət yetirin ki, onun yenə M.Şəhriyardan etdiyi "Qədir bayramına hədiyyə" adlı şeri bu tərcüməçinin sayəsində azərbaycan dilində necə də gözəl səslənir:

**Məhəmmədhüseyn Şəhriyar**

QƏDİR BAYRAMINA HƏDİYYƏ

*Ya Əli, ismini çəkcək dağılır dərd-sərim,*
*Be əbi əntə və ummi.*[1]
*Tərk olur qəlbimə dolmuş kədərim, qüssələrim,*
*Be əbi əntə və ummi.*

*Pak adın İftixar olmuş mənə, olmuşdur şan,*
*Ey namaz əhlinə qiblə.*
*Vurmayıb oğru sənin köhləninə sanki ziyan,*
*Etməyib cəng səninlə,*
*Be əbi əntə və ummi*

*Olmayıb sanki o cəng faciəsi heç və'də*
*Olmayıb qəm bizə yar.*
*Sanki at tapdağı altda, o şəhid cəngində*
*Yox şəhid insanlar,*
*Be əbi əntə və ummi.*

*Bilirik biz, yaradıb insanı kamil Yaradan,*
*Nə çətin bu, nə asan.*
*Sən özün ülvi gözəllik daşıyan məxluqsan,*
*Ey mükəmməl insan,*
*Be əbi əntə və ummi.*

*Kormudur, karmıdır onlar ki, edirlər inkar*
*Bu qədir bayramını, Quranı?*
*Onlar üçün nə fəxarətli qədir bayramı var,*
*Nə döyüş meydanı,*
*Be əbi əntə və ummi.*

*Bir vilayətdə əgər vali günah işlətsə,*
*Bunu əfv etmək olar.*
*Vay o gündən ki, həmin səhvi siyasətçi edə,*
*Əlitək hakim var,*
*Be əbi əntə və ummi.*

[1] Ərəbcədən tərcüməsi: Sənə atam-anam fəda olsun

*Bəşəriyyət və bəşər həzzi ki, var dünyadə,*
*Ya Əli, səndəndir.*
*Olmasan, bəlli ki, hərcmərclik olar dünyadə,*
*Bu deyil heç kimə sirr,*
*Be əbi əntə və ummi.*

*Ən mükəmməl vücud insandı bu aləmdə, bunu*
*Hər adam yaxşı bilir.*
*Kamilin kamili sənsən, bu təhər olduğunu*
*Hər adam yaxşı bilir,*
*Be əbi əntə və ummi.*

*Adəmin nəsli gələndən bəri ən layiqli*
*Bir adam var o da sən.*
*Qeyri bir elçi olarmı yenə səndən qeyri?*
*Ya Əli, tək sənsən!*
*Be əbi əntə və ummi.*

*Aşiqin hər kim olarsa, onu mədh eyləməli!*
*Ar ola bədxahına!*
*Sənə biganə adam mədhə nə layiq, ey Əli?*
*Ar ola bədxahına,*
*Be əbi əntə və ummi*

*Süfrəmiz, təsbehimiz qismət olub şeytanə*
*Tərk edəndən bəri sən dünyanı.*
*Necə meymundur o şeytan ki, cəmi insanə*
*Eləyir fərmanı?*
*Be əbi əntə və ummi.*

*Sənə tufan kimi eylərsə hücum dünyadə*
*Yığışıb kafərlər,*
*Bircə zərbənlə sənin ömrü verərlər badə,*
*Sənə bundan nə xətər?*
*Be əbi əntə və ummi.*

*Sən o kafərləri qırdıqca qılıncınla, o dəm*
*Od qopur zərbindən.*
*Elə sur'ətlə qılınc calmadasan, görməyirəm*

*O qığılcımları mən*
*O qılıncları mən,*
*Be əbi əntə və ummi.*

Yaxud, görkəmli İran şairi Simin Bəhbəhaninin "Kapitanın ölümü" adlanan şe'rinin tərcüməsinə diqqət yetirin:

KAPİTANIN ÖLÜMÜ

*Ölümdən qorxmayanlara!*

*Bir gün eşitdim ki, batır bir gəmi,*
*Etmədə hər yandan hücum göy sular.*
*Vəlvələ salmış dənizə fırtına,*
*Yırğalanır, dalğalanır göy sular.*

*Dağ kimi dalğa irəli cummada,*
*İstər hücumlarla batırsın onu.*
*Girdab açıb ağzını cəhd eyləyir*
*Mavi dərinlikdə yatırsın onu.*

*Qışqırıq, hay-küy büruyub hər yanı,*
*Culğayıb hər gülşəni fəryad səsi.*
*Həm də qarışmış batan insanların*
*Naləsinə güclü külək naləsi.*

*Fırtına artır, kapitan cəhd edir*
*Istəyir etsin kömək insanlara.*
*Göy sulara hətta qayıq sallayır.*
*Bəlkə bu yolla oluna bir cara*

*Məqsədə yetcək kapitan mərd kimi,*
*Etmək üçün tərk gəmini yollanır.*
*Qəhrəmanın gen sinəsində budur.*
*Asdığı ordenləri par-par yanır.*

*Gözlərə bax, orda işıq var hələ,*
*Üzdə hələ gör ki, təbəssüm yaşar.*
*Keçsə bir az da, olacaqdır fəqət*

*Göy dənizin köksü onunçün məzar.*

*Ətrafa yaydıqda günəş nur, onun*
*Əks edəcək gözlərini mavi su:*
*“Var isə qəlbində dəniz sevgisi*
*Olmaz ölümdən o kəsin qorxusu”.*

*Böylədir ancaq kişilik qanunu,*
*Bax belə də olmalı hər bir zaman!*
*Əhsən ola öylə igid kəslərə,*
*Alqışa layiqdir o cür qəhrəman.*

Şahin Fazilin bir sıra tarixi mənbələri müxtəlif dillərdən tərcümə etməsi, heç sübhəsiz ki, onun Vətəni üçün etdiyi böyük xidmətlərdəndir. İsgəndər bəy Münşi Türkmanın “Tarixe-aləmaraye-Abbasi” (“Dünyanı bəzəyən Abbasın tarixi”), Həsən bəy Rumlunun “Əhsənüt-təvarix” (“Tarixlərin ən yaxşısı”), Jozef Tiflisinin “Vaqiati-Mir Veys və Şah Hüseyn” (“Mir Veys və Şah Hüseynin əhvalatları”) və Yan Tadeuş Kruşinskinin “Tarixi-səyyahi-məsihi” (“Xristian səyyahın tarixi”) kimi əsərlərini azərbaycanlı oxuculara öz dillərində çatdıran mütərcim Şahin Fazilin tərcümə əsərləri böyük nailiyyətlərdir, desəm yanılmaram.

İki həftə bundan əvvəl mənə Tehrandan zəng gəldi: İsfənd ayında Novruza həsr olunan Beynəlxalq bir Konfrans keçiriləcək və İran, həmçinin bir sıra xarici ölkə alimləri novruz bayramı münasibətilə öz fikir və mülahizələrini bölüşəcəklər. Azərbaycandan da bir ustadın çıxışı arzu olunur.

Yadıma dərhal professor Şahin Fazil düşdü. Ona zəng vurdum. Toplantının “online” olacağını bildikdə əvvəlcə razılıq vermədi, sonra bir qədər tərəddüdlə razılaşdı. Hicri-şəmi tarixlə 1399-cu il İsfənd ayının 17-də (7 mart 2021) Ş.Fazil artıq ekran qarşısındaydı.

Əllamə Təbatəbaqi Universitetinin keçirdiyi həmin beynəlxalq tədbirdə bir çox ölkə alimləri, o cümlədən İran, Əfqanıstan, Özbəkistan, Qırğızıstan, Hindistan, Türkiyə, Pakistan, İraq, Tatarıstan və Azərbaycan alimləri novruz bayramı, onun tarixi və öz ölkələrindəki xüsusiyyətləri haqqında fikirlərini bildirdilər.

Məqaləmin sonunda ustad Şahinə təşəkkürümü ərz edir, onun 80 yaşını təbrik edir və ömrünün gələcək illərində möhkəm cansağlığı, necə-necə elmi-bədii uğurlar diləyirəm.

*Doktor* **Bəhram ƏMİRƏHMƏDYAN**
*(İran)*

## O TAYLILARLA BU TAYLILARIN GÖRÜŞÜ

1998-ci ilin may ayının son günlərində, Qafqaz sıra dağlarının yamyaşıl cənub ətəklərində yerləşən Qafqaz gəlini Tiflis şəhərində keçrilən Beynəlxalq "Qafqaz, dünya tarixinin qaynaqlarında" adlı konfransda iştirak edərkən, bir Bakılı alim və şairlə görüşümüz oldu. O, Azərbaycan Respublikasının Tarix İnstututunun professoru Şahin Fazil idi. Eyni zamanda o Azərbaycan şairi və qəzəlsərasıdır olubdur.

Biz birlikdə başqa xarici qonaqlarla "Tabaxmela" adlanan bir mehmanxanada olurduq ki, Tiflis şəhərindən 20 km uzaqlıqda, onun şimal-qərb hissəsində, dağlıq məntəqədə bir gözəl və yaşıl bağ içində yerləşirdi. Gözəl və səfalı bahar axşamında biz ikimiz birlikdə səyahət məqsədi ilə gəzintiyə çıxdıq və yaxınlığdakı bir kiçik kəndə getdik. 55-60 yaşında olan bir gürcü bizi evinə dəvət etdi. Həmin gürcü ilə rus dilində danışarkən, bizə məlum oldu ki, o Azərbaycan dilində də danışa bilir. O varlı olmasa da, bizə olduqca hörmət və qulluğ göstərdi, yemək və içmək hazırladı. Ondan soruşduq ki, gürcü dilində "Tabaxmela" nə mənası verir? O dedi ki, bir zaman burada azərbaycanlılar yaşayır və buraya Azərbaycan dilində "Tabax məhəllə" deyirdilər. Ona görə ki, onların həyat tərzi bağdarlıq və əkinçilik idi. Bu bağlardan tabağlara doldurub Tiflisə meyvə və tərəvəz daşıyardılar. Bu səbəbdən onu azərbaycanlılar "Tabağməhəllə", sonralar gürcülər "tabaxmela" adlandırdılar.

Bildiyiniz kimi, indi Tiflis şəhərində "Şeytanbazar" məhəlləsində (Tiflis məscidi və Axundov küçəsində) çoxlu azərbaycanlı yaşayır və onların məscidləri həmən sünni müəlmanlarının məscididir. Bu səbəbdən məscid iki mehrablıdır, birisi sünnilər, digəri şiələr üçündür. Stalin zamanında şiələr məscidin (Şah Sultan Hüseyin Səfəvi zamanına aid) xiyabanını genişləndirmək üçün dağıdırlar ki, yenidən başqa bir məscid tiksinlər. Bu məscid dünyanın iki mehrablı nadir məscidlərindəndir. Tiflis şəhərində müsəlman qəbrsanlığı var ki, indi həmin məscid onun yaxınlığındadır, "Botanski sad" ("Botanika bağı") parkında yerləşir, Mirzə Fətəli Axundovun özünün və ailəsinin gurgahıdır və Axundovun heykəli ucalır.

Həmin gürcü kişinin səmimiyyəti və qonaqpərvərliyini xoşladıq və Şa-

hin müəllimin ilhamı coşdu, baharın səfalı axşamı, habelə Qafqazın səfalı təbiəti onu duyğulandırdı. Vəsfi-hal olaraq, bir qəzəl yazaraq mənə itihaf etdi. Sonra rica etdi ki, qəzəli Tehranda professor Cavad Heyət müəllimə təqdim edərək, "Varlıq" jurnalında dərc etdirsin.

Indi bu macəradan 14 il keçibdir və mən Şahin müəllimlə dəfələrlə Ankarada, Tehranda, Təbrizdə, Bakıda görüşmüşəm. Ankarada 1999-cu ildə Osmanlı imperiyasının 700-cü ildönümü yubeliyində, Tehranda 2004-cu ildə İkinci Beynəlxalq İransünaslıq konfransında, Təbrizdə 2009-cu ildə Qafqaz konqresində görüşüm üz oldu. Tehran konfransında Şahin müəllimlə birgə Bakıdan və onlarla ölkələrdən gələn iştirakçılarla bir neçə görüş keçirdik. Mən həmin söhbətimizi bir daha yada saldım, əcəba ki, onun qəzəlinin mətni çantamda idi. Yenə oxuduq və o bir daha məndən xahiş etdi ki,onu çap etdirim.

Mən 2005-ci ilin sentyabr ayında Qırğızstansının gözəl paytaxtı Bişkek şəhərində Beynalxalq Türk Mədəniyyətinin ikinci Konqresində iştirak edərkən, "Bişkek Manas Türk universitet"inin rektor müavini professor Çeviklə görüşdüyüm zaman məndən xahiş etdi ki, bir neçə kitabı və foto-şəkilləri professor Cavad Heyətə çatdırım. Professor Cavad Heyətlə yalnız yanvar ayında görüşüm oldu. Bu zaman Şahin müəllimin qəzəlini hörmətli Cavad Heyətə göstərib onu oxudum. Böyük insan olan professor Cavad Heyət dərhal bəyəndi və söz verdi ki, qəzəli "Varlıq" jurnalında dərc etdirəcək. Təəssüf ki, həmin qəzəlin həmin jurnalda dərc olunub-olunmamasından xəbərim yoxdur.

Amma bu qədər bilirəm ki, Doktor Cavad Heyət böyük insan və Azərbaycan ədəbiyyatında tanınmış şəxsiyyətdir, böyük ürək cərrahı kimi dünyada məşhurdur, ona uzun ömr arzu edirəm.

Adı çəkilən qəzəlin mətnini oxuculara təqdim edirəm:

*Qalmadı Sən'an daha səbrü qərarım mənim,*
*Gürcü diyarındayam, yoxdu xumarımm mənim.*

*Gəldi bahar, açdı gül, amma şərab istəməm,*
*Çünki görünmür gözə sevgili yarım mənim.*

*Hicrə edib mübtəla yordu bu Tiflis məni,*
*Saqi, gətir mey yenə, artdı qübarım mənim.*

*Münis olubdur mənə, burda Əmir Əhmədi,*
*Yaxşı ki, Bəhram olub yavərü yarım mənim.*

*Ermənі də qonşudur, gürcü də, çox fərqi var,*
*Ermənidən çox çəkib dərd diyarım mənim.*

*Yadıma hər dəm düşür qonşumuzun yadlığı,*
*Xan Qarabağ yaddadır, sındı vüqarım mənim.*

*Saqi, kədərlənmişəm, sən oxu mən tar çalım,*
*Kimdədi mizrab, gətir, hardadı tarım mənim?*

*Tə'siri yox "sim-sim"in, kim məni tilsimləyib?*
*Bəxt qapısı bağlıdır, yoxdu açarım mənim.*

*Qədd əyilib yay kimi, saç ağarıb qar təkin,*
*Sahibini gözləyir indi məzarım mənim.*

*Şahina, ömrümdə var sanki qatar sür'əti,*
*Olmayacaq saxlayan, getdi qatarım mənim.*

*Bişkek, 2005*

**Doktor ƏBHƏR**
*(Əfqanıstan)*

## DƏRİ DİLİNDƏN TƏRCÜMƏ: SOVET AZƏRBAYCANININ İSTEDADLI ŞAİRİ

Şahin Fazil Fərzəliyev 1940-cı ildə Azərbaycanın Quba şəhərində anadan olmuşdur. 1959-cu ildə orta məktəbi bitirdikdən sonra Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakültəsinə daxil olmuş və 1964-cü ildə bitirmişdir. 1974-cü ildə Azərbaycanının Elmlər Akademiyasında orta əsrlər tarixi ixtisası üzrə elmlər namizədi elmi dərəcəsi almağa nail olmuşdur.

Əfqanistanda uzun illər işləyən Şahin Fazil 1978-ci ildən başlayaraq Əfqanıstan şairlərinin şeirlərini Azərbaycan dilinə tərcümə və nəşr etdirir. Indiyədək 30-dan artıq əfqan şairlərinin şeirlərini, o cümlədən Dəstgir Pəncşiri, Barıq Şəfii, Süleyman Layiq, Ziya Qarizadə və başqa şairlərin şeirləri onun tərəfindən tərcümə edilmiş və Azərbaycanın müxtəlif qəzet və jurnallarında nəşr etdirilmişdir. Azərbaycan şairi Şahin Fazil bu günlərdə Əfqan şairlərinin "Sən mənim eşqimsən" adlandırdığı bir kitabın tərtibi ilə məşğuldur.

Şahin Fazil tərəfindən dəri dilli şeirlərin (əfqan farscası) tərcüməsi xeyli qənaətbəxşdir, bildirməliyəm ki, elə onun özü də dəri dilində şeir yazmaqdadır. Onun dilimizdə yazdığı şeirlər kifayət qədər oxunaqlıdır.

Şahin Fazilin əfqan şairlərinin şeirlərinə marağı yetərincə çoxdur. Indisə onun qələmindən çıxan bir neçə şeiri "Juəndun" "(Həyat)" jurnalından götrülərək, möhtərəm oxuculara yazıldığı kimi təqdim edirəm:

MƏRKƏZİ-EŞQ

Kəsira ke dust darəm
əz qəlb dust darəm,
çeninəst eşqi-mən.
Çeninəst eşqi-mən,
Mən ba qəlb dust darəm,
zira
dər çeşməm nist
dər qəlbəməst
mərkizi-eşqi-mən.

Sətri tərcüməsi:

EŞQİN MƏRKƏZİ

Mən sevdiyim hər kəsi
ürəkdən sevmədəyəm.
Ona görə ki, sevgim
mənim gözümdə deyil,
mənim ürəyimdədir.
Bəli
ürəyimdədir
mərkəzi pak eşqimin.

ƏŞK

Xəbəri şenidəm
dər bareyi-əşk:
Miguyənd əşk
Beçeşm faide darəd,
Miguyənd əşk

Çeşmha ra salem və pak negah midarəd,
dər in surət bayəd bekuşim ta
əz çeşmha
be guneha

modam qətərati-əşk berizəd,
fəqət nə be gerye,
boqzar əşk əz çeşman bərayəd
be xənde və qəhqəhe.

Sətri tərcüməsi:

GÖZ YAŞI

Bir xəbər eşitmişəm
Göz yaşları haqqında
Deyirlər göz yaşının
Gözlərə var faydası.
Deyirlər göz yaşları
Gözləri pak etmədə
Elə buna görə də
Qoy yanağa dəmadəm
Süzülə göz yaşları.
Belə olsa çalışaq
Gözlərdən
Yanaqlara
Tez-tez göz yaşı axsın,
Təkcə ağlamaqla yox
Qoy gözlərdən göz yaşı
Gülüş və qəhqəylə çıxsın.

ENSAN

Zəmin sərmayeyi-mən,
Həva sərvəti-mənəst.
Aya ke goft naçizəm?
Ke miguyəd fəqirəm?
Məgər nəmibinid ke,
dər-balaye sərəm nimparye-aseman,
dər zire-payəm korreye-zəmin?

Sətri tərcüməsi:

İNSAN

Yer mənim sərmayəmdir,
Hava mənim sərvətim.
Kim deyər dəyərsizəm?
Kim deyər ki, yoxsulam?
Görmürsünüz ki, vardır
göydə göyün yarısı,
ayağım altındasa
bu böyük Yer Kürəsi.[1]

İndisə Azərbaycanın görkəmli şairi Nəriman Həsənzadənin Şahin Fazil tərəfindən **"Sığmaz"** adlı bir şeirini ki, Şahin Fazil tərəfindən dəri dilində tərcüməsini olunmuşdur, sizlərə təqdim edirəm:

Yek doxtər
dər intizari-didar...
Bad mivəzəd...
Yek doxtər...
Baran mibarəd...
Və doxtər
nəmidanəd çe konəd:
Dər intezarəş başəd
Ya bexane bərgərdəd?
Yek doxtər
və
dər qəlbəş yek donya məhəbbət,
çenan məhəbbəti ke
hərgez nəmitəvanəd
be yek xane begoncəd.

[1] Qeyd: "İnsan" şe'rini çoxdan yazmışam. Onun sətri tərcüməsini hazırladığım vaxt beynimi "qurdaladım"... və şe'rin orjinalını sətir-sətir xatırladım. Şeri belə yazmışdım.—Ş.F

Sətri tərcüməsi:

## SIĞMAZ

Bir qız
görüş gözləyir...
Külək əsir...
Bir qız...
Yağış yağır...
Və qız
bilmir nə etsin:
Gözləsinmi?
Yaxud evə qayıtsınmı?
Bir qız
Və
ürəyində bir dünya məhəbbət,
Elə bir məhəbbət ki,
heç zaman
sığa bilməz bir evə.

**Nurəngiz RZA (RZAYEVA)**
*Psixologiya üzrə fəlsəfə doktoru, dosent*

## ŞAHİN FAZİL VƏ "MƏN" KONSEPSİYASI

Dəyərli alim, böyük şəxsiyyət, zəhməti ilə istedad çırağına yağ tökən, görkəmli elm cəfakeşi, xeyirxah və əməlisaleh insan Şahin Fazil haqqında danışmaq, onun həyat hekayəsinə səyahət etmək məsuliyyətli, şərəfli həm də çox maraqlıdır. Dərin fəlsəfəsi olan bu hekayətnin ana xəttini özünəməxsus psixoloji çalarlarla xarakterizə olunan "Mən" konsepsiyası təşkil edir. Bu konsepsiya özünün məzmun və mündəricəsi ilə Ulu Tanrının Şahin müəllimə verdiyi dərin zəkanı, elmi, istedadı, zəhməti, xeyirxahlığı, ədaləti, iradəni, xarakter və mədəniyyəti, bir sözlə insanlığı, bütövlükdə şəxsiyyəti özündə ehtiva edir.

**Şahin Fazil şəxsiyyətinin strukturunda "Mən" silsiləsi xüsusilə önəmlidir. Şəxsiyyətin özünütanıma və dərketmə prosesinin əsasını təşkil edən mənlik şüurunda "Mən" obrazı və özünüqiymətləndirmə kimi komponentlər, bunların alimin rəftar və davranışında təzahürü üstünlük təşkil edir. Mən obrazında sanki Şahin Fazilin avtoportreti canlanır. Özünün Divanda dediyi kimi:**

*Ged-gedə çoxalır "mən" silsiləsi,*
*Özümü yazıram yenə özümü.*
*Varmı şairlərin yenə beləsi?*
*"Mən"ə yönəldirəm yenə sözümü.*

*Nə yaman çox imiş məndəki "mən"lər...*
*"Mən"ləri zahirə çıxaran xışam.*
*Hey "mən"dən yazıram, indiyə qədər*
*Deməli, özümü tanımamışam.*

*Deməli "mən"lərim cəbr,həndəsə!*
*Fəhmsız olmuşam mən taleyi kəm,*
*Deməli, olsam da bələd çox kəsə,*
*Mən özüm özümə bələd deyiləm.*

*Təmtəraqa dönmür, cəlala dönmür*
*Günüm,güzəranım bir dərviş kimi.*
*Heç vaxt əlif qəddim suala dönmür,*
*Şöhrət əyə bilməz mənim qəddimi.*

Nəsihətamiz və dəyərli misralarında özünün fəlsəfi- psixoloji düşüncələri ilə baş-başa qalan bu insan bəzən psixikasının dərin qatlarına nüfuz edərək, fəzilət və rəzaləti müqayısə edir, suallarının cavabında "Alo" deyərək Allahla danışmaq istəyir. Və bütün bunları toplayaraq "Doğruya doğru" kitabını ərsəyə gətirərir:

*Bə'zən varlığımı sarır iztirab,*
*Allahla danışmaq istəyirəm mən.*
*Insan verməyəndə suala cavab*
*Allahla danışmaq istəyirəm mən.*

*Niyə güclülərin gücü çoxalsın?*
*Nə üçün gücsüzlər əzilsin gərək?*
*Mərhəmət, mürüvvət niyə yoxalsun?*
*Hərdən göyə döğru "Allo!..." deyərək,*
*Allahla danışmaq istəyirəm mən....*

deyən Şahin Fazil **"Doğru gedə bilməz oğruya doğru, Doğruyam gedirəm Doğruya doğru" kimi fikirləri ilə bütövlükdə oxucunu sanki, sehrə salır, düşüncə qabiliyyətini artırır və bəsirət gözünü açır. Doğruya doğruda da o, "mən"siz dayanmır. Şəxsiyyətin strukturunda pərvaz edən özgüvənini bəyan edir, həqiqətən də doğru yolu olan bir şair kimi, "Allaha aşıq, sözə munis kimi", "meyl və imkan"larının vəhdəti kontekstində Doğruya doğru gedir və doğrularının əhatəsində yaradıcı fəaliyyətindən, sevgi və iztirabından həzz alır.**

*Hələ çox varağı sitəm gözləyir,*
*Hələ çox yanacaq dizim üstə şam,*
*Hələ necə-necə qələm gözləyir*
*"Sevgi və İztirab" adlı poemam.*

*Hələ neçə giley qulağımdadır*
*"Yarımçıq işləri unutma bir an!"*
*"Əhsənüt-təvarix" qabağımdadır,*
*Hələ bitməyibdir "Beşinci Divan"*

deyir bu şair.

Psixoloqlar qeyd edirlər ki, insanda eyni vaxtda dörd mən—obraz "Fiziki-mən", Real-mən", İdeal-mən", Sosial-mən" mövcuddur. Şahin Fazilin "mən" silsiləsindən yazdığı serlərində bu mənləri aydın görmək mümkündür. Psixoloji planda bu mənlər bir-birini tamamlayır və zənginləşdirirlər. Bu kontekstdə Şahin Fazilin fiziki və real "mən"lərində sosial-psixoloji avtoportretin əsas komponentləri seçimlidir. Digər tərəfdən özünün tükənməz zəhməti, elmi və yaradıcı fəaliyyəti, məntiqi təfəkkürü olan bu böyük insanın indiki anda özünü necə təsəvvür etməsi göz önündə canlanır. Proseslərin axarında görəsən Şahın Fazil özünün rollarını, qabiliyyətlərini, istedadını, statusunu necə qavrayır?, O, əslində necə adamdır?, Yazılarında bunları görürmü? və s. Bu kimi suallar onun fiziki və real mənlərinin əsas kredosunu təşkil edir. Divanlarında olduğu kimi!

*Yaxşılıq edənəm qohuma, yada,*
*Kiçik bir eyhamdan məni üzür qəm.*
*"Əmanət kitabçam" daha yoxsa da,*
*Əmanət kitablar müəllifiyəm.*

*Bircə günüm belə se'rsiz deyil,*
*Mən ki bilməyirəm rahatlıq nədir.*
*Mənim hər divanım təb'imə dəlil,*
*Mənim hər səfərim səfərnamədir.*

Şahin Fazilin şəxsi keyfiyyətləri çoxdur. Onun biri-digərinin təkrarı olmayan, hər birində məna çalarları və fərqliliyi ilə seçilən, cild- cild kitabları, minlərlə səhifələri əhatə edən, sözə rəng qatan serlərində hikmət elmi güclüdur. Bu elmin əsas qayəsini vətənbərvərlikdən başlamış, ədalət, xeyirxahlıq, sevgi, məhəbbət, təbiətə vurğunluq, Tanrıya inam, Doğruya doğru getmək və bütövlük təşkil edir.

Şəxsiyyətin mühüm keyfiyyətlərindən biri də özünüdərketmə və

özünüqiymətləndirmədir. **Insan özünü dərk etdikcə, özünü düzgün qiymətləndirdikcə şəxsiyyət kimi göstəriciləri daha qabarıq görünür. Insan özünü və ya başqalarını qavradıqca özünü onlarla müqayisə edir, özünə kənardan nəzər salır, özünü təhlil edir. Şəxsiyyətin özünüdərketməsi və özünüqiymətləndirməsi onun elmi dünyagörüşündən, əqidə və inamından, keçdiyi həyat yolundan maraq və meylindən asılıdır.** Qeyd etmək istəyirəm ki, bütün bunlar Şahin Fazilin dəyərlər sistemi ilə bağlanır ki, bunların vasitəsilə o, özünü təhlil edir. Amerikan alimləri Cozef Luft və Qarri İnğham şəxsiyyəti səciyyələndirərkən dörd pəncərəni xüsusi vurğulayırlar. Tədqiqatçılar qeyd edirlər ki, insan həyatında bu pəncərələrdən özünə baxmağı bacarmalıdır. Bunlar "Coqari" pəncərəsi kimi dəyərlər sistemində mühüm yer tutur. Belə ki, hər pəncərənin bir adı var: Açıq pəncərə, kor pəncərə, gizli pəncərə və bilinməyən pəncərə, bu pəncərələr belə açıqlanır: **Açıq pəncərə**- İnsanın özü tərəfindən və başqaları tərəfindən də bilinən pəncərədir. Bu pəncərədə insanlar ümidlərini, gözləntilərini, ya da qorxularını çəkinmədən digər insanlarla paylaşırlar və insanlar tərəfindən sevilir, dərk olunurlar. **Kor pəncərə** - Bu pəncərə başqaları tərəfindən bilinən ancaq insanın özündə görmədiyi, bilmədiyi pəncərədir. **Gizli pəncərə** - Bu pəncərə insanın özünün bildiyi, ancaq başqalarının bilmədiyi pəncərədir. Daha doğrusu, insanın özünün iradi şəkildə bəzi xüsusiyyətlətini gizlətmək istəməsi deməkdir. **Bilinməyən pəncərə** - Bu pəncərə isə insanın "öz"ünündə, başqalarının da bilmədiyi qaranlıq pəncərədir. **Şahin Fazilin həyatında aşıq pəncərənin spesifikası böyükdür.** Bu pəncərə ilə o, milli-mənəvi dəyərlər sistemi kontekstində özünün və başqalarının davranışına qiymət verir, fikirlərini əsaslandırır və hərəkətlərini tənzimləyir. Ömrü müdriklik, aqillik təcəssümü olan alimin istər "Divan"larında, istər "Səfərnamələrin"də, istərsə də " Dünyanın dağılması, yaxud yaxşı oldu dağıldı", "Ölüm" adlı poemalarında psixoloji planda "mən"lər, mənlik şüuru, özünüdərk, özünütanıma, özünütərbiyə və s. kimi komponentlərlə yanaşı, şüuraltı məsələlərə də rast gəlmək olur. Bir anlıq proseslər sanki şüuraltıdan şüura gəlir və insana "kim idin"?, "kimsən"?, "kim ola bilərsən"? kimi məsələləri anladır. Bu kontekstdə Şahin müəllim sanki məşhur psixoloq Z.Freydin psixoanaliz nəzəriyyəsindən təhlillər apararaq, özünün "sosial mən"i ilə pərvaz edir, özünə başqalarının gözü ilə baxır. Başqaları onu necə görürlər?, O, özünü necə göstərmək istəyir? Necə hərəkət etsə, onu yaxşı adam, yaxud yaxşı mütəxəssis kimi tanıyarlar? Axı o, istər qürbət ölkələr-

də, istərsə də Vətəndə insanların əhatəsində sadə,təmənnasız, özünəməxsus həyat tərzi ilə seçimli olub. Və həmişə də özünə adekvat qiymət verməyə üstünlük verib.

*Özgəni görürəm Şahin gözümlə,*
*Özümü görməksə "müşkil" yaradıb*
*Deməli, indi də özüm özümlə*
*Tanış olmağımın məqamı çatıb.*

*Mənəm dil qədrini bilən qəzəlxan,*
*Sözüm gizli deyil, açıq, aşıkar.*
*Paka pak deyirəm, yamana yaman.*
*Məndə Xaqaninin məğrurluğu var.*

*Sözün qiymətini bilmişəm baha.*
*Artıra bilsəm də söz qiymətimi,*
*Kimliyim bəllidir təkcə Allaha,*
*Hələ almamışam öz qiymətimi.*

*Oxucu, "Mən" serim bitsə də bu an,*
*"Mən"lər silsiləsi davam edəcək.*
*Təzə "Mən"lərimi oxuyacaqsan,*
*Mən məni yaxşıca tanıyım gərək!*

**Bütün qeyd olunanlar yalnız böyük alimin "Divan"larındakı serlərin təhlilləri ilə bağlıdır. Bu, bu böyük yazarın fəaliyyətinin yalnız poeziya ilə bağlı az bir hissəsidir. Məni bir psixoloq kimi bu təhlilərdə fəlsəfi-psixoji çalarlar özünə çəkdiyi üçün bu yazını yazmağa həvəsləndim və bilgilərimi təhlil etməyə çalışdım.** Əlbəttə, minlərlə səhifələri əhatə edən cild-cild tərcümələr, tarix, kitabları, əsərlər, xüsusilə də orta əsrlər tarixi, poetik əsərlər, daha nələr, nələr... Bunları yazdıqca insanı heyrət bürüyür. Adətən deyirlər tarix şəxsiyyətlər yetişdirir. Bu doğrudur. Qədim Qubanın füsunkar təbiəti, möcüzəli Şahdağ və Tufandağının ətəyində Şahin Fazil kimi şəxsiyyətin doğulması, böyüməsi təbiidir. Ancaq bu da digər bir həqiqətdir ki, böyük şəxsiyyətlərin özləri də tarix yazır və əbədiləşirlər. Necə ki, Şahin Fazil şəxsiyyəti nəsillərə, xalqa,etnosa yadigar qalan, dəyəri böyük "Quba tarixi" yazdı və özü də tarixə düşdü.

**Tarix keçmişi bilmək, bu günü dərk etmək və gələcəyə istiqamətlənmək üçün dəyərli məxəzdir.** Necə ki, C.Bayron deyirdi: "Gələcək üçün ən yaxşı peyğəmbər keçmişdir". **Şahin Fazilin qələmindən qopan dəyərli misralar, kəlamlar zaman-zaman xalqın təfəkkür süzgəcindən keçərək əbədiləşəcək və ona alqışlar və təşəkkürlər gətirəcək. Deyirlər nəfsdən və tamahdan uzaq olan, sözü ilə əməli düz gələn Şahin Fazil bütün xəyalları ilə yerlərin bütün rəzalətlərini rədd edən və pisləyən ğöy adamıdır. Elə bu xüsusda onun arzu və xəyallarının ağuşunda yazdığı serində də heyrətamiz misralar diqqəti cəlb edir. "Gəl səni bağlayıb qanadlarıma...." deyən şair ğöyləri elə təsvir edir ki, sanki onun qanadlarında ğöyləri səyr etmək və ğöy adamı olmaq istəyirsən:**

*Yerdəki rəzalət ğöylərdə yoxdur,*
*Yerdəki qan-qada ğöydə ğörünməz.*
*Həqarət, qəbahət ğöylərdə yoxdur,*
*Daha yerdə deyil, ğedək ğöydə gəz.*

*Həya ziya versin ğözlərimizə,*
*Sərvətə, ğümüşə, zərə əlvida.*
*Qoy ulu Yaradan yar olsun bizə,*
*Ğöyə salam deyək Yerə əlvida.*

*Nəfsdən gen düşək, tamahdan uzaq,*
*Söz ilə düz gəlsin hər əməlimiz.*
*Ğöydə ğöylü olaq günahdan uzaq,*
*Yeri yersizlərə bağışlayaq biz.*

*Əsəblər çəkilib yerdə tarıma,*
*Şahin pərvazına ğöy intizar ki....*
*Gəl səni bağlayıb qanadlarıma*
*Aparım ğöylərə yerdə nə var ki?*

Şahin Fazil yaradıcılığı o qədər zəngindir ki, oradan bütün yaş dövrlərindən olan insanlar faydalana bilərlər. Eyni zamanda bu yazılardan istənilən mövzuda maraqlı və hikmətlə dolu fikirlər əldə etmək olar. Onun Vətənə, xalqa, yurduna bağlılığı, təbiətə, insanlara münasibəti, dostlarına sədaqəti, ailəsinə vəfalılığı, öladlarına məhəbbəti və ən

əsası deyərdim ki, işinə, peşəsinə məftunluğu Tanrının ona bəxş etdiyi mənalı, təmənnasız, su kimi duru, ay kimi aydın, ğünəş kimi parlaq ömrünün əsas ğöstəriciləridir. Elə Şahin Fazili şəxsiyyətinə də hörmət və məhəbbət buradan qaynaqlanır.

Əziz və dəyərli Şahin müəllim, uca Allaha çox shükürlər edirəm ki, bu fani dünyada Sizin kimi bir insanı tanıdım. Əlbəttə, bu bir həqiqətdir ki, Siz böyük alim, professor, ətrafı çox geniş olan şəxsiyyətsiniz. Mənim kimi alimlər, tədqiqatçılar sizin həyatınızda çox olub və olacaq. Amma mən Sizdən çox şeyi öyrəndim və nümunə ğötürməyə çalışdım. Ixtisaslarımız fərqli olsa da bizim münasibətlərimiz—Sizin psixologiya elminə, mənim isə poeziya və tarix elminə marağımı artırdı. **Sizin özünüzəməxsus spesifik psixoloji çalarlarla xarakterizə olunan həyat hekayətiniz mənim təfəkkürümdə ilk növbədə sədaqətli dost, qayğıkeş ata, dəyərli ustad, cəfakeş elm xadimi, maarifpərvər ziyalı, zəhmətkeş, ədalətli, xeyixah insan kimi obrazlar haqqında bilğilərimi daha da möhkəmlətdi və zənğinləşdirdi. Bunlara ğörə sağ olun.** Əziz Şahin müəllim! Qeyd etmək istəyirəm ki, bunlar həqiqətdir, gəlişi gözəl sözlər deyil, bunlar özümün və ailəmin adından Sizə və sizin yaradıcı fəaliyyətinizə olan istək və hörmətimizin ifadəsidir. **Yaxşı ki, varsınız!, Yaxşı ki, Sizi tanıdıq.**

Deyirlər xöşbəxt o kəslərdir ki, onların izi qalır dünyada, alim o kəslərdir ki, onların sözü qalır dünyada. Şahin müəllim! Bu gəlimli-gedimli dünyada Sizin iziniz də var, sözünüz də. Ğözəl və tərbiyəli övladlarınız, əhatəniz, xeyirxah əməllərinizlə iz qoymusunuz. Bitib tükənməyən elmi fəaliyyətiniz ğözünüzün nuru, qəlbinizin hərarəti ilə yazdığınız əsərlər, qalaq -qalaq kitablarla isə sözünüzü demisiniz. "Söz böyük şeydir. Ona ğörə böyükdür ki, sözlə insanları birləşdirmək və məhəbbət qazanmaq olar"( L.Tolstoy). Qərinələr, illər bir-birini əvəz edir, dünya bir yandan boşalır, bir yandan dolur. Ancaq deyilən söz, yazılan tarix yadiğar qalır. Elmi faktlar, nəzəriyyələr, ümumiləşdirmələr nəsildən nəsilə zamanın təfəkkür süzgəcindən süzülüb gələrək yeniləşir, əbədiləşir və onları yazanları əbədiləşdirir.

**Şahin Fazilin bənzərsiz elmi fəaliyyəti bütöv bir konsepsiyadır.** Məqalədə yalnız bir sahəni əhatə edən məsələlərə toxunuldu. Qeyd etmək istəyirəm ki, bu konsepsiyada əks olunan digər sahələrdə daha geniş məsələlər; orta əsr tarixindən başlayan və bu ğünümüzə qədər gələn xalqın tarixi, mütəfəkkirlərin ibrətamiz fikirləri, beş "Divan" və daha nələr..., mühüm və zamanı qabaqlayan problemlər ehtiva olunur. Bütün

bunların axarında istər tarixdə, istər xalq yaradıcılıq nümunələrində, dastanlarda, istərsə də mütəfəkkirlərin əsərlərində rast gəldiyimiz ibrət dərslərini prof. Şahin Fazilin şəxsi və elmi fəaliyyətində də öyrənmək mümkündür, zəruridir və olduqca dəyərlidir.

Hörmətli Şahin müəllim! Mən bu kiçik yazıda sizin elmi fəaliyyətinizə, xüsusilə də poeziyanıza olan maraqlarımdan irəli ğələn fikirlərimi, arzu və münasibətimi bildirməyə çalışdım. Sizin həyat hekayətinizə səyahət etmək olduqca şərəfli, məsuliyyətli və maraqlı oldu. İstərdim ki, çox sevə-sevə və məsuliyyətini dərk edərək yazdığım yazı Şahin Fazilin xoşuna gəlsin. Çünki, dahi Nizaminin "Qüvvət elmdədir", Mirzə Cəlilin "Qələmin gücü xalqa xidmət etməkdir", Məhəmməd Tağı Sidqinin " İnsanın qiyməti-həqiqiyyəsi elmi və əməli ilə bilinir. Elmi və əməli nə mərtəbədə olsa, dəyəri və qiyməti o qədərdir" kimi müqəddəs kəlamları Şahin müəllimin şəxsiyyətinin əsas kredosunu təşkil edir. Onun müəllimlik funksiyası mahiyyətcə maarifçilik funksiyasıdır, Azərbaycanda tarix elminin işıqlı və parlaq inkişafına xidmət etmək və bu sahədə mütəxəssislər yetişdirməkdir. Bu yolda ömrü örnək olan Şahin Fazilə ulu Tanrıdan sağlam can və rahat ömür arzulayırıq. Dəyərli və unudulmaz Şahin müəllim, "80"-ci baharınız xoş gəlsin! Sizə bundan sonrakı həyatınızda Yaradan daha da bol sevinc və müjdələr bəxş etsin! Amin!

**Ramiz QUSARÇAYLI**
*Şair*

## MİN İLLƏRİN ŞAHİN FAZİLİ

**Şahin Fazil!..**
*Min illərin o üzündən süzülüb gələn*
*İşıq şair... İşıq alim... İşıq İNSAN!..*
*Qısası – Min illərin Şahin Fazili...*

Təməli böyük mütəfəkkir Abbasqulu ağa Bakıxanov tərəfindən 1835-ci ildə "Gülüstan" ədəbi məclisiylə qoyulan,- "Ay işığı", "Ulduzlar", "Şabran" və "Gülüstan" ədəbi məclisləriylə daha da inkişaf edən bir bölgənin, eləcə də bütöv Azərbaycanımızın ən işıqlı yaradıcı simalarından biri olan Şahin Fazil!

"Divanlar Xəmsə"sinin müəllifi adını qazanaraq beş Divan bağlayan, qırxa yaxın şeir, tərcümə və elmi kitabın, onlarla tarixi araşdırmanın, elmi əsərin, monoqrafiyanın, bir çox bənzərsiz mahnı şeirlərinin müəllifi olan Şahin Fazil!

Yeddi cildlik "Azərbaycan tarixi" kitabının müəlliflərindən biri olan Şahin Fazil!

Dünya xalqlarının dillərində mövcud olan ilkin mənbə və tədqiqatlar əsasında yazılan "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" adlı kitabın müəllifi olan Şahin Fazil!

İsgəndər bəy Münşinin, Həsən bəy Rumlunun, Jozef Tiflisinin və Yan Tadeuş Kruşinskinin əsərlərinin müxtəlif dillərdən Azərbaycan dilinə tərcümə edən Şahin Fazil!

IV əsrdən müasir dövrədək Qubada baş verən etno-siyasi, tarixi, ideoloji, diplomatik hadisələri, ədəbi-bədii və mədəni prosesləri xronoloji ardıcıllıqla özündə əks etdirən "Quba tarixi" kitabının müəllifi Şahin Fazil!

Azərbaycan Milli Elmlər Akademiyası Tarix İnstitutunun "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri, tarix elmləri doktoru, professor Şahin Fazil!

"Məcməüş-şüəra" ədəbi məclisinin sədri, "Ay işığı" ədəbi məclisinin ən yaxın dostlarından biri olan Şahin Fazil!

Gözəl ziyalı, ləyaqətli ağsaqqal, etibarlı dost, böyük qubalı, bütöv

azərbaycanlı Şahin Fazil!

Min illərin Şahin Fazili! Mən "min illərin Şahin Fazili" ifadəsini işlətməklə düşünürəm ki, Şahin Fazil haqqında heç də ifrat mübaliğəyə yol vermirəm. Zənn edirəm ki, başqa qələm əhli haqqında öz səmimi və layiqli ürək sözlərimi yazıb onu "min illərin şairi" hesab edən dəyərli hər şairin özü də elə "min illərin şairi" adlana bilər.

Şahin Fazil mənə ithaf etdiyi "Sözləri ecazdı Qusarçaylının" kitabını, xüsusilə kitabın "Ön söz" ünü yazmaqla məni bir daha Vətən oxucularına tanıtdırdı, eləcə məni mənim özümə də tanıtdırdı və mən təzədən öz qiymətimi aldım sanki. Diqqət yetirin, barəmdə şeir diliylə nə deyir və necə deyir Şahin Fazil:.

"Bu kiçik kitabımın balaca məqaləsi. Qubada yazdım bunu. Vəsf etdim Vətənimin adı Ramiz qoyulan Qusarçaylı oğlunu.

Ramizin şeirləri!.. Şeirlərin Ramizi!.. Bir kitaba sığmayan, beş kitaba sığmayan bəndlərin, misraların, sətirlərin Ramizi".

Misal gətirdiyim bu misralar nəsr cümləlaridirmi? Xeyir! Bunlar və sonradakılar da nəsr cümlələri yox, şairin şeirlə ifadə etdiyi yeni bir şeir nümunəsi deyilmi? Şahin "Ön söz"də sözünə davam edir:

"Mən həmin yazılara, mən həmin sətirlərə qayıtdım yalavac tək, üz çevirdim ac kimi, yön tutdum dönə-dönə, yazdım özümə məxsus neçə-neçə şeirimi... Yazdım bu mərd şairin, bəzən mülayim olan, bəzən də sərt şairin, bəzən çiçəyə vurğun, bəzən arıya məftun, bəzən quşla danışan, bəzən daşla danışan, bəzən Təbrizdən yazan, bəzən Dərbənddən yazan, bəzən əcəmdən yazan, bəzən ərəbdən yazan, Füzulini yad edib, Nəsimini düşünüb Bağdad-Hələbdən yazan, bəzən dağda, dərədə, bəzən bağda dolaşan, çeşmə tək aşıb-daşan, bəzən Qudyal çayının şırıltısından yazan, bəzən ildırımların gurultusundan yazan, çaxnaşan şimşəklərin parıltısından yazan bir səmimi şairin, bir vətəndaş şairin, qəlbi yanar şairin, Qubasevər şairin şeirlərindən coşub, sözlərinə söz qoşub, gah "nəzirə" adlanan, gah "bənzətmə" deyilən, gah" oxşatma" söylənən xəlqi şeirlərimi, milli şeirlərimi".

Indiyəcən bu tərzdə, bu üslubda "Ön söz" yazan görmüsünüzmü-? Şeirlə yazılan məqalə! Şahin kitabın annotasiyasının sonunda elə özü də belə deyir: "Kitabın əvvəlində gedən məqalə nəsr şəklində gözə dəyirsə də, elə bir şeirdir ki, belə məqalə forması məhz Şahin Fazilə məxsusdur".

Budur şair qiyməti, şair səmimiyyəti, şair haqqında söz deyən şair

səlahiyyəti! Mən bu sözləri yazarkən, deyəsən elə Şahinə məxsus ifadə cazibəsinə, ifadə təsirinə və ifadə sehrinə düşdüm. Şahin yenə yazır:

"Ey Ramiz Qusarçaylı, kitabların önümdə cild-cild, qalın-qalındı, bu kiçik məqaləmi yazdım mənsur olmadı, nəsə mənzum alındı, nəsr ola ya nəzm ola mənim gözümdə birdir, şablon məqalə yazmaq qələmimə yaraşmır, hamiya bəlli olsun: Şeirim məqalə deyil, məqaləmsə şeirdir!"

Ey qədirbilən oxucu! Elə mən özüm də şair dostum haqqında qələmə aldığım bu məqaləmi "şablon tərzdə yazmamağa çalışacağam. Alınacaqmı?

Şahin Fazil ilk "şeirini" Qubada oxuduğu 3 saylı orta məktəbin divar qəzeti üçün yazıb. 1952-ci ildə yazıb. Özü də rus yazıçısı N.V.Qoqolun vəfatının 100 illiyi münasibətilə yazıb. Cəmi dörd sətirlik ilk "bədii" qələm təcrübəsi.

Ş.Fazilin ilk mətbu şeiri isə 1958-ci ildə qələmə aldığı, elə özünün sonralar bir bayatısında dediyi kimi

*Ürəyimdə köz qalıb,*
*Dodağımda söz qalıb,*
*Qızlar qadınlaşdılar,*
*"Qızbənövşə" qız qalıb.*

"Qızbənövşə" adlanan cazibədar bir meşə məkanına həsr etdiyi və "Qızıl Quba" qəzetində dərc olunan kiçik bir şeirdir.

Şahinin Universitetin Şərqşünaslıq fakultəsinin Fars dili şöbəsinə qəbul olunduğu 1959-cu il. Tələbəlik həyatı. Özündən 4-5 yaş cavan olan Abbasəli Sarovlu, Əlibala Hacızadə, Əlyar Səfərli, Əli Abbasov (hamısının adında "Əli" var ki) kimi şərqşünaslarla dostluğu. Dostluğu və elə onların təsiri ilə fars ədəbiyyatına məftunluğu...

Sonralar Əfqanıstan həyatı. 5-ci kursda oxuduğu fakultədən birdən-birə göndərildiyi yad ölkədəki tərcüməçilik fəaliyyətinin başlanğıcı. 1963-cu il. Onun ilk qürbəti olan və bu tarixdən başlayaraq fasilələrlə 13 il davam edən (1988-ci ilədək) Əfqanıstan həyatı. Şahin sonralar özünün "Beşinci Divan" kitabında yazmışdır:

"Vətənimə sonsuz məhəbbətim var. Çox-çox illər qürbət ellərdə (Əfqanistan, İran, Türkiyə, Yaponiya, sabiq Sovetlər İttifaqının bir neçə respublikası və s.) yaşasam da, vətənim mənə hər yerdən əziz olub:

*“Hərdən Vətən dərdi çəkmək qürbətdə*
*Mənə taleyimin göstərişidir.*
*Əfqanıstan kimi bir məmləkətdə*
*On üç il yaşamaq kişi işidir”.*

Mən Şahini çoxdan tanıyıram. Ədəbi və elmi yaradıcılığına bələdəm. Bu haqda şair-alimimiz Qiymət Məhərrəmli dissertasiya işi (“Şahin Fazil Divanı və klassik ədəbi ənənələr”) yazıb və 2007-ci ildə filologiya üzrə fəlsəfə doktoru olub. Gözəl şairin gözəl də elmi işi! Onun monoqrafik əsərini bir də oxudum. Qiymət xanım tam haqlı olaraq Şahin Fazili müasir qəzəlin qəliz ərəb-fars sözlərindən, çoxmərtəbəli izafət tərkiblərindən təmizlənməsinin zərurətini dəfərlərlə bildirməsindən söz açır və yazır: “Bəzi qəlizdil şairlər... müasir qəzəl şairləri əruzvəznli ədəbiyyat yaradarkən daha qəliz, daha mürəkkəb yol tutur, qəzəllərini əcnəbi kəlmələrlə yükləməkdən, onları mücərrəd, anlaşılmaz izafətlərlə “bəzəməkdən” sanki zövq alır, onu inkişaf etdirməkdənsə, ədəbi proseslərə daha da mane olurlar. Bu isə dilimizin nufuzuna, qorunub-saxlanmasına, eləcə də, dünya dilləri sıransında məhz poeziya dili kimi hər cür imkanlara malik olmasına bir daha təsdiq edilməsinə əngəl törədir. Şairlər dilimizin təəccübküşləri, cəfakeşləridir. Onu hər cür yad ünsürlərdən qoruyub hifz etmək, dil sadəliyini şerin əsas faktoruna çevirmək söz adamının birbaşa vəzifəsidir”. (Qiymət Məhərrəmli. Şahin Fazil Divanı və klasik ədəbi ənənələr, Bakı, 2007, səh.93-94). Qiymətin təbirincə desəm, “söz adamı” olan Ş.Fazil bütün yaradıcılığı boyu mühafizəkar qəzəlxanları tənqidə məruz qoymuş və bu mücadiləsini bu gün də davam etdirməkdədir. Bu şairin bir qəzəlinin dörd beytinə diqqət yetirin:

*“...Meyarım olubdur sözümün saflığı dildə,*
*Meyarımı dillərdə şüar etməyə gəldim.*

*Nəzmin dili “düşvar” idi, eyvah, qəzəldə,*
*“Düşvar” o dili mənsə hamar etməyə gəldim.*

*Mən doğmalara doğma adam, yadlara yadəm,*
*Yad sözləri şe’r içrə kənar etməyə gəldim.*

*Şahin, cahana bəlkə də heç gəlməyəcəkdim,*
*Xəlqi qəzəli ölkədə var etməyə gəldim.*

Yaxşı ki, Şahin bu cahana gəldi və Azərbaycan qəzəlini öz yaradıcılığında tamamilə saflaşdırdı. Kaş başqaları da elə olaydılar. Kaş onların da qəzəl dili yad ünsürlərdən təmizlənəydi. Axı biz müasir dövrün "söz adamlarıyıq". Qəzəl yaradıcılığında Şahinin kredosu belədir:

*"Yaz sadə ki, düşsün başa alim də, çoban da,*
*Şahin, belə bir yolda sənə qoy uğur olsun".*

Bəli, Şahin Fazil orta əsrlərin oturuşmuş ədəbi şeir dilindən tam uzaqdır. O, yazır: "Keçmişlərin önündə ehtiramla baş əysəm də, mən müasirlik tərəfdarıyam. Bəzi divanlarım haqqında elmi məqalələr, dissertasiya və monoqrafiya yazmış alimlərdən akademik Bəkir Nəbiyev, professorlardan Sabir Əliyev, Tərlan Quliyev, Teymur Əhmədov, yazıcı-publisist Hacı Rafiq Şirvani, şair-tədqiqatçı Qiymət Məhərrəmli... vurğulamışlar: **"Şahin Fazilin qələmindən çıxan divanlar müasir divanlardır".**

**"Məgər belə deyilmi"? deyə Şahin öz-özündən soruşur və sualına cavabını özü də verir: "Müasir dövrdə yaşayan, müasir düşüncə tərzi ilə düşünən, müasir ədəbi mühitin nümayəndəsi olan və müasir divan şövqü ilə qələmlər əridən şair müasir divan bağlamaya bilərmi? Çox-çox təəssüflər olsun ki, müasirimiz olan, lakin ərəb-fars söz və çoxmərtəbəli izafət tərkibləri ilə dolu əruz şeirləri yazan bəzi "qeyri-müasir"qəzəlxanlarımız vardır. Məgər onlar bilmirlərmi ki, müasir oxucu müasir dövrdən çox da uzaq olmayan bir əsrdə XIX əsrdə yaşamış Məşədi Murtuza Qarabağinin bu beytinin mənası bu günün oxucusu üçün anlaşılmazdır.**

***"Qoyub əl pici-nafə bir yavaş növ ilə tərpətsən,***
***Ze sər ta pa həmə ə'za, libasü həm bədən titrər"***

**Müsir oxucu axı nə bilir ki, " piç-qırış, "naf-göbək", "ze"—dan, dən məkilcisi, "pa"-ayaq, "ə'za"—bədən üzvləri deməkdir. Mən məhz bu çətinliyi nəzərə alıb qəzəlimin dilini tam sadələşdirdim". ("Doğruya doğruya" kitabı, Bakı,2018, səh.340-341.)**

Mən məqaləmi şairin bir qəzəli ilə yekunlaşdırıb ona həsr etdiyim bir neçə şeirimlə bitirmək istərdim: Şahin Fazil yazır:

*Söz zərgəri oldum deyə zər var qəzəlimdə,*
*Zər var deyə şe’r içrə zəfər var qəzəlimdə.*

*Gül-bülbülü seyr etmədəyəm tazə nəzərlə,*
*Köhnə nəzərə tazə nəzər var qəzəlimdə.*

*Bəzən mənə yar oldu sevinc hissi təbii,*
*Bəzən də ələm, qüssə, kədər var qəzəlimdə.*

*Üstünlüyümü tazə əsrdə biləcəklər,*
*Bir mən bilirəm indi nələr var qəzəlimdə.*

*Bağçamda çəpər görməyəcəklər mənim, amma*
*Yad kəlmələrə qarşı çəpər var qəzəlimdə.*

*Şahin qəzəli tər axıdıb “divan” edibdir,*
*Vəznim qədəri bəlkə də tər var qəzəlimdə.*

*“Gedəsən dünyanın axrınacan” kitabı,*
*2017, səh.222*

İndi başlayıram Şahin Fazilə ünvanladığım öz şeirlərimə:

I
ŞAHİN FAZİL

*Yenə söz-söz süzülür Qübbədə Şahin Fazil,*
*Qovuşur bir əbədi mə’bədə Şahin Fazil.*

*Ürəyi Şah düzüdü, hər gözü bir Atəşgah,*
*Dayanıb möhkəm olan körpüdə Şahin Fazil.*

*Səsini od həvəsiylə yüz ocaqdan keçirir*
*Bəlkə bir daş ürəyi tərpədə Şahin Fazil.*

*Yazdığı elmi kitablar qalacaq illərlə,*
*Divanı çox divana abidə, Şahin Fazil.*

*Dəb oyun, dəb hava bədlik gətirər fəlsəfəyə,*
*Dəb ilə təb gətirir hər vədə, Şahin Fazil.*

*Yurdumun tarixini*[1] *evdə yazıbdır Ramiz,*
*Quba salnaməsini türbədə, Şahin Fazil.*

II
QƏZƏL

*Deməsinlər qocaman şairimizdir Şahin,*
*Məncə, məndən də cavan şairimizdir Şahin.*

*Təbini bənzədirəm gur sulu Qudyal çayıma,*
*Şah dağımtək ucalan şairimizdir Şahin*

*Qubanın tarixini yazdı vətəndaş sayağı,*
*Adı tarixdə qalan şairimizdir Şahin.*

*Beş Divan yazdı və altıncı da dəftərlərdə,*
*Nəzm edən çoxlu Divan şairimizdir Şahin.*

*Nə qədər elmi sözü millətə qalmış miras,*
*Fikri tam, elmi əyan şairimizdir Şahin.*

*Bir qəzəl mülkü tikibdir özünə saf, şəffaf,*
*Daşı daş üstə qoyan şairimizdir Şahin.*

*Qeyri-xəlqi sözü atmış lüğətindən çoxdan,*
*Söyləyən xəlqiyə "can" şairimizdir Şahin.*

*Yaxşıya qarşı, bilin, yaxşısıdır yaxşıların,*
*Yamana qarşı yaman şairimizdir Şahin.*

*Bir adamdır eləyən cəngi dəmadəm inkar*
*Və edən sülhü bəyan şairimizdir Şahin.*

*Neçə ildir Qarabağ mülkü yad əllərdə qalıb,*
*Nigərandır, nigəran şairimizdir Şahin.*

[1] Azərbaycan tarixinin nəzmlə əks olunduğu epik poemam nəzərdə tutulur. R.Q

*Qayəsi saflıq olubdur həmişə, ey Ramiz,*
*Necə olmuşsa, haman şairimizdir Şahin.*

*21.01.2020*

## III
## MİN İLLƏRİN ŞAHİNİ

*Şah dağının sirr daşı, Şah düzünün dürr daşı,*
*Babadağın pir daşı,Tufandağın hürr daşı,*
*Min illərin Şahini...*

*Ağ zirvədi, ağ bulud, ağ kölgə, ağ qaranlıq,*
*Ağ ulduzdu, ağ üfüq, ağ səhər, ağ toranlıq,*
*Min illərin Şahini...*

*Yeddi çalar, yeddi rəng, yeddi hava, yeddi yol,*
*Yeddi dastan, yeddi səs, yeddi keçid, yeddi qol,*
*Min illərin Şahini...*

*Yerdə yastı balaban, telli saz, qara zurna,*
*Göydə tel-tel bayatı, lələk, üçtelli durna,*
*Min illərin Şahini...*

*Ahı "Kəsmə şikəstə", nərəsi "Mahur-hindi",*
*"Məcməüş-şüəra"dı, "Təzkireyi-Şahin"di*
*Min illərin Şahini...*

*Alim,şair, tarixçi, tərcüməçi, şərqşünas,*
*"Dədə Qorqud", "Koroğlu", "Oğuz Xan", "Alp Ər", "Manas",*
*Min illərin Şahini...*

*Qədim Manna, Midiya, Atopatena, Alban,*
*"Qanlı dərə", "Çənlibel", "Çanaqqala", "Çaldıran",*
*Min illərin Şahini...*

*Otuz yeddi kitabdı, bir "Xəmsə"- beş "Divan"dı,*
*Bu tayda "Sandıq təpə", o tayda "Kənduvan"dı*
*Min illərin Şahini...*

*"Azərbaycan haykusu", canlı "Quba tarixi"*
*Və Həsən bəy Rumlunun "Əhsənüt-təvarix"i*
*Min illərin Şahini...*

*"Səfəvilər dövründə din və dövlət" əsəri,*
*Əfqanıstan notları,- "Zəfər təranələri",*
*Min illərin Şahini...*

*Qəlbində "Allah eşqi, peyğəmbər məhəbbəti, imam sevgisi",*
*"Yenə görüşərik" biz, gülüm, "Əllərini ver mənə",*
*Min illərin Şahini...*

*"Qırxnamə",- qırx şeirdən ibarət elegiya,*
*"İlnamə," sənsizəm mən, nə deyim bu dünyaya...*
*Min illərin Şahini...*

*Kitab-kitab güllənir hər nazın tarixindən,*
*Bu "Dünyanı bəzəyən Abbasın tarixi"ndən*
*Min illərin Şahini...*

*"Mir Veys və Şah Hüseyn"—Tiflisinin naməsi,*
*"İran səfərnaməsi", "Yapon səfərnaməsi",*
*Min illərin Şahini...*

*"Xristian səyyahın tarixi" və "Qəzəllər",*
*Çiçək-çiçək boylanan məlahətli gözəllər,*
*Min illərin Şahini...*
*Əruzun söykənc yeri, hecanın güvənc yeri,*
*"Qoşma"ların nurani, haykuların gənc yeri*
*Min illərin Şahini...*

*"Yazıçı", "Azərnəşr", "Əbilov qardaşları",*
*"Gənclik", "Elm və təhsil",-kitab cəfadaşları,*
*Min illərin Şahini...*

*"Ay işığı", Gülüstan", "Ulduzlar"dı, "Şabran"dı,*
*Bir az bağdı, bir az bar, bir az da "Bağiban"dı,*
*Min illərin Şahini...*

*Təbriz, Daşkənd, İstanbul, konfranslar, çıxışlar,*
*Polşa, Kipr, Rusiya, kürsü-kürsü baxışlar,*
*Min illərin Şahini...*

*Vəlvələdi, Qudyaldı, Qusarçaydı, Samurdu,*
*Ural, Sibir, Tundra, Yeniseydi, Amurdu,*
*Min illərin Şahini...*

*Dağ yolları, dağ çayı, duman-duman pərdələr,*
*Dəli-dolu nə'rələr, havalı kişnərtilər,*
*Min illərin Şahini...*

*Afurca şəlaləsi, Təngə qayalarıdı,*
*Qız bənövşə nağılı, Səttar boyalarıdı*
*Min illərin Şahini...*

*Ömrün səksən yaşında yüzün inadındadır,*
*Sevginin yüyənində, eşqin qanadındadır,*
*Min illərin Şahini...*

*Ramiz Qusarçaylıya yetdi sözün e'cazı,-*
*Bir dünyadı, bir özü, bir də Tanrıdan yazı,*
*Min illərin Şahini...*

*31.01.2020*

Qeyd: Mən bu günlərdə yazdığım bir şeirimi də şairə göndərdim:

QUBAYA AD VERMİRLƏR

Şahin Fazilə!

*Belə gəlib əzəldən,*
*Niyəsi yoxdu,şair.*
*Qubalı yazarların*
*Yiyəsi yoxdu şair,*
*Qubaya ad vermirlər.*

*Əllin yada düşmədi,*
*Altmış yelə getdi,*

*Yetmişin,yetmiş beşin*
*Səksənin elə getdi,*
*Sənə yüz təltif azdı,*
*Yükünü karvan çəkməz*
*Tək sənin...*
*belə getdi,*
*Qubaya ad vermirlər.*

*Təqdimatlar dolabda,-*
*Seyfdə tozlanır,şair,*
*İxtiyar sahibləri*
*Keyfdə tozlanır,şair,*
*İstəyirsən yüz yaşa,*
*Düşən deyilsən yada,*
*Gələn deyilsən xoşa,*
*Qubaya ad vermirlər.*

*Yaltağa,yaltaqlığa,*
*Ədaya ad verirlər,*
*Ötəri dınqıltıya*
*Sədaya ad verirlər,*
*Üzdəniraq məxluqa*
*Gədaya ad verirlər,*
*Adları altdan satan*
*Lotuya ad verirlər,*
*Qubaya ad vermirlər.*

*Əcnəbiyə,gəlməyə,*
*Yada da ad verirlər,*
*Yolun kənarındakı*
*Ota da ad verirlər,*
*İtə də ad verirlər,*
*Ata da ad verirlər,*
*Qubaya ad vermirlər.*

*Verəndə də bir adı*
*Bezdirib verdirirlər,*

*Qovluq-qovluq Bakını*
*Gəzdirib verdirirlər,*
*Ümidini Allahdan*
*Üzdürüb verdirirlər,*
*Qubaya ad vermirlər.*

*Ad Bakıda paylanır,*
*Öy Bakıda paylanır,*
*Yer Bakıda paylanır,*
*Göy Bakıda paylanır...*
*Bakıda ad alanlar,*
*Qubada qeyd edirlər,*
*Bakılı qubalılar*
*Bir-birini yeyirlər,*
*Bir-birini didirlər,*
*Qubaya ad vermirlər.*

*Quba tolerant yerdi,*
*Birdi dağ yəhudiləri,*
*Türklər,ləzgilər,tatlar...*
*Birdi xeyir-şərləri*
*Birdi toylar,büsatlar,*
*Qubanı neynəyirlər,-*
*Qubalı deputatlar...*
*Qubaya ad vermirlər.*

*Dərbənddə Dədə Qorqud,*
*Qubada ozan bizik,*
*Fətəli xan,Mircəfər,*
*Bay Bura,Qazan bizik,*
*Beş divanlıq xəmsəni,-*
*Bayrağı yazan bizik,*
*Qubaya ad vermirlər.*

*Əyir,əyilə bilmir,*
*Döyür,döyülə bilmir,*
*Öyür,öyülə bilmir,*

*Ocağının içində*
*Odunu dondururlar,*
*Quba adı gələndə*
*Adını dondururlar,*
*Qubaya ad vermirlər.*

*Ətəyində Xəzərdi,*
*Kürəyi Şah dağıdı,*
*Bulaqları göz yaşı,*
*Ürəyi ah dağıdı,*
*Min illərin yaşıdı,*
*İlahi ruh dağıdı,*
*Qubaya ad vermirlər.*

*Seçkinin,səsvermənin*
*Başında durub Quba,*
*Vətən adlı üzüyün*
*Qaşında durub Quba,*
*Hara baxırsan,nazir*
*Qarşında durub Quba,*
*Qubaya ad vermirlər?!*

*Adı Allahdan gəlir,*
*Öz adı var,bəsidi,*
*Qüruru,qətiyyəti*
*İnadı var,bəsidi,*
*Qulpu,quyruğu yoxdu*
*Qanadı var,bəsidi,*
*Qubaya ad vermirlər,*
*Qubaya ad vermirlər.*

*07.03.2021*

**Həyat ŞƏMİ**
*Tarix üzrə fəlsəfə doktoru, şair*

## ŞAHİN FAZİLİN ƏFQANISTANLA BAĞLI BİR NEÇƏ SİRRİ

Tarix elmləri doktoru, professor, şair və tərcüməçi Şahin Fazil Fərzəlibəylidə şərqşünaslığa marağı müəllimi Turan Həsənzadə oyadıb. Bu maraqla da ərəb əlifbasına vurularaq fars dilini öyrənib və sevib. Qubadan və Bakıdan başqa heç yeri görməyən bir gənc hələ tələbə ikən Əfqanıstana göndərilib. Tarixçi və arxeoloq professor Masonun kitabını oxuyaraq Əfqanıstanla yaxından tanış olub. İlk dəfə o, 1963-cü ildə Heyrətan və Termez şəhərlərinin Özbəkistanla Əfqanıstanı ayırdığı nöqtədə bu "əfsanəvi" ölkəyə qədəm basıb. Onu birinci "yeriyən qumlar" qarşılayır. Düşdüyü aləmin sehrindən ayrıla bilmir. Gördüyü qəribəliklər yaddaşına həkk olur, ən çox təəccübləndiyi isə işlədiyi Səripol şəhərində müəllimlər tərəfindən şagirdlərin "falaqqalanma" səhnəsi olub: "Şiş çubuqları yığıb onları yonurdular və cəza verilən məktəblilərin ayaqlarının altına döyürdülər".

O, üst-üstə düz 13 il Əfqanıstanda yaşayıb və işləyib. Əfqanıstan onun ikinci vətəni kimidir və onu ikinci vətənində "Şahin sahib" deyə çağırırdılar. Əfqan xalqını comərdliyinə görə çox sevir. Elə bu səbəbdən də, 10 minlərlə əfqanı məhvolma təhlükəsindən xilas edib. Söhbətimizdə Əfqanıstanla bağlı bir neçə sirri açdı bizə. Uzun müddət Əfqanıstanda işləmiş bir insan kimi, onun bu ölkə barəsində olan xatirələrinin tozunu çırpmaq istədik. "Şahin müəllim, Əfqanıstanda hansı maraqlı hadisələrin şahidi olmusunuz? Bizimlə, sadəcə o xatirələri bölüşərdinizmi?" təvəqqemizə bənd imiş kimi bir qədər düşündü və aşağıdakıları açıb tökdü:

Əfqanıstanda olarkən çoxlu sui-qəsd faktları ilə üzləşmişəm. Rusların bəzi görkəmli xadimləri, mütəxəssisləri qətlə yetirilirdilər. Məsələn, mecvhidlər Rusiyanın Əfqanıstandakı komsomol müşavirlərinin başçısını girov götürmüşdülər. Onun diri-diri dərisini soyub çaya atmışdılar. Çaydan çıxan cəsəd qıpqırmızı idi. Digər bir fakt: Sovet İttifaqının məşhur bir geoloqu var idi, Geologiya Nazirliyində baş müşavir işləyirdi. Onu oğurlayıb Pakistana aparmışdılar. Nə qədər cəhdlər oldusa da, geri vermədilər. Əfqanlar Heyrətan bəndərinə gələn yanacaqla dolu çəllləkləri

Amu-Dəryaya boşaldıb boş çəlləyi götürürdülər. Sən demə onların dəmirə böyük ehtiyacı var imiş...

**- Şahin müəllim, uzun müddət Əfqanıstanda tərcüməçi işləmisiniz. Bu neçənci illərə təsadüf edir?**

- Demək olar ki, mənim 48 yaşıma qədərki həyatım Əfqanıstanla bağlı olub. Hələ Şərq fakultəsinin V kursunda oxuyan zaman Moskvadan dəvət aldım və Əfqanıstanda işləməyə getdim. Bu mənim Əfqanıstana birinci səfərim idi. Üç il müddətində mən Əfqanıstanın şimalında, Çinə yaxın bir sərhəddə işlədim və oradan qayıtdıqdan sonra Şərq fakultəsində dekan müavini vəzifəsində çalışdım. Yenidən dəvət aldıqdan sonra bir daha Əfqanıstana gedib Məzari-Şərif şəhərində iki il işləməli oldum. Məzari-Şərifdən 12 km aralıda olan Azot gübrələri zavodu və İstilik Elektrik Stansiyasında tərcüməçi işləyirdim. Rusların Əfqanıstanda çox böyük iqtisadi maraqları var idi. İki il ərzində ruslar Əfqanıstanın böyük bir düzəngahında iri bir zavod və böyük bir stansiya tikib istifadəyə vermişdilər.

Yuri Qaqarinin Əfqanıstanda kabab yediyi kafeni indiyə qədər "Qaqarin kafesi" adlandırırlar və orada hazırlanan yeməklərin dadı həmişə yüksək səviyyədə olurdu. Mən birinci dəfə böyük yazıçımız Əlibala Hacızadə ilə o kafedə tanış olmuşam. Oradan qayıtdıqdan sonra aspiranturaya daxil oldum və 1974-cü ildə namizədlik dissertasiyasını müdafiə etdim. Bir neçə il akademiyada işlədikdən sonra 1978-ci ildə yenə Əfqanıstana getdim. Bu zaman artıq orada "Səvr inqilabı" (Aprel inqilabı) baş vermişdi. 5 il orada qaldım, sonra qayıtdım. Yenidən 85-88-ci illərdə Kabulda işləməli oldum. Əfqanıstanda Müşavirlər qrupu var idi. Əfqanıstanın bütün işlərini sovet müşavirləri idarə edirdilər. Hər əfqan nazirinin bir və ya iki müşaviri olurdu. Mən də Nazirlər Sovetində bir neçə nazirlikdə müşavirlərlə işləyirdim, amma axırıncı dəfə mən baş nazirlərlə işlədim. Axırıncı üç ildə Əfqanıstan Nazirlər Şurasında iki baş nazirlə işləməli oldum.

**- Hansı nazirlərə tərcüməçilik etmisiniz?**

- Üçüncü səfərimdə Maliyyə Nazirliyində, sonra Dövlət İnhisar Komitəsində tərcüməçilik edirdim. Axırıncı dəfə mən baş nazir Sultan Əli Keştməndin tərcüməçisi oldum. Ondan sonra yerinə Hindistanda səfir işləyən Həsən Şərq gəldi. Bir il də onunla işlədim. Bəzən tərcüməçilər azlıq edirdi. Bir nazirin bir neçə tərcüməçisi olurdu. Bizim səfirlikdən başqa digər səfirliklərdə, məsələn, İran, Türkiyə, Amerika, İngiltərə və digərlərin-

də, demək olar ki, heç adam görünmürdü. Amma bizdə beş minə qədər insan çalışırdı. Mən axırıncı dəfə baş tərcüməçi işlədim. Əlimin altında 42 tərcüməçi var idi ki, onların 5-i azərbaycanlı idi. Bir az ruslara xas olan bir xüsusiyyət var axı, hər şeyin dərininə getmək. Buna görə də, çox vaxt nə Əfqanıstana, nə də ruslara aidiyyəti belə olmayan kitabları tərcümə etdirirdilər. Tərcüməçilərə bilərəkdən əziyyət verirdilər. Mən azərbaycanlı tərcüməçiləri müəyyən qədər əhəmiyyətsiz tərcümələrdən azad edirdim.

**- Şahin müəllim, şəxsən mənim üçün əfqan xalqının milli xüsusiyyətləri çox maraqlıdır. Kitablardan oxumaq başqa, əfqan xalqını yaxından tanıyan insanın dilindən eşitmək bir başqadır. Ümumiyyətlə, əfqanlar necə millətdirlər?**

- Əfqanlar, mən deyərdim ki, bənzərsiz millətdir. 63-cü ildə mən Əfqanıstana gedəndə ölkə hələ feodalizmin orta mərhələlərində yaşayırdı. Amma adı gedirdi ki, Əfqanıstan kapitalist ölkəsidir. Halbuki, orada kapitalist münasibətləri yeni-yeni yaranmağa başlayırdı. Yəni, zavodlar, fabriklər təzə-təzə tikilirdi. O vaxtlarda Əfqanıstan, demək olar ki, maldarlıq və əkinçilik ölkəsi idi. Çox maraqlı bir aqrar ölkə idi. O zaman Amerikanın prezidenti Xruşşov ila danışmışdı ki, Əfqanıstan təbii feodal muzeyidir, elə edək ki, Əfqanıstana nə siz, nə də biz dəyməyək. Xruşşov da söz vermişdi ki, Əfqanıstan bizə ən yaxın ölkədir, ona dəymək olmaz, qoy o, təbii muzey kimi də qalsın. Amma, unutmayaq ki, mənafe olan yerdə dostluq, səmimilik, yaxın münasibət ola bilmir. Əfqanıstan da mənafe üçün ən dəyərli ölkələrdən biridir. Ola bilsin ki, Əfqanıstan gələcəkdə dünyanın ən varlı ölkələrindən biri olacaq. Çünki, Əfqanıstanda olduqca çox az ölkədə olan uran var. O uranı sovetlər açdılar və dərhal da qapadılar. Bundan başqa, orada dünyada ikinci yerdə duran mis mədənləri var. Eynək adlı bir yer var ki, orada mis yataqları mövcuddur. Misin oradan tükənməsi üçün bir neçə yüz il lazımdır. Torpağın lap üst qatındadır, kəs götür. Qaz, neft ehtiyatları da var. Mən o zamanlar neftçilərlə də işləmişdim. Çoxlu firuzə mədənləri var. Bu firuzə yataqlarının hamısı Əhməd Şah Məsudun idi. Pənçşir deyilən vilayət var, onun sahibi həmin Məsud idi. Bundan başqa, qəzəllərdə işlədilən "ləli-bədəxşan" sözünü eşitmisən də, Bədəxşan Əfqanıstanın şimalında vilayətdir. Bura çox varlı bir yerdir və orada əsasən, özbəklər, türkmənlər və taciklər yaşayır. Amma, başqa xalqlar da var. Əfqanıstanda çox maraqlı xalq olan hindular da yaşayır. 20 faiz Hindistandan gəlmə hindulardır. Hindular ölülərini yandırırdılar. Külünü isə aparıb öz ölkələrindəki Qanq çayına səpələyirdilər.

Özü də onlar iki təriqətə - sikhlər və hüseynilər təriqətinə qulluq edirdilər. "Baba Guru Nanək" isə onların peyğəmbəridir. Onlar haqqında məqalə yazıb o vaxt Nəriman Həsənzadənin baş redaktor olduğu qəzetə göndərmişdim, o da çap eləmişdi. Mən Əfqanıstanda olarkən Nəbi Xəzri, Xalidə Hasilova, Nəriman Həsənzadə, Seyran Səxavə, Əhməd Elbrus, Zülfüqar Şahsevənli, Rüzgar Əfəndiyevanın şeir və hekayələrini tərcümə və dərc etmişdim.

**- Yeraltı və yerüstü sərvətləri ilə zəngin olan bu ölkənin əhalisi bəs nə dərəcədə zəngindir?**

- Əfqan xalqı çox comərd və qonaqpərvərdir. Amma, təəssüf ki, Şərq xalqlarına xas olan təmizliyə müəyyən inanclar onlarda da var. Məsələn, su əgər axırsa, demək o təmizdir. Görürsən ki, bir əfqan suda, çayda əlini yuyur, ondan aşağıda bir başqası əyilib həmin axar sudan su içir. Əfqan xalqına bənzər ikinci xalq mən çeçenləri hesab edirəm. Bizim xalqla əfqan xalqı arasında fərq çoxdur. Əsrlər boyu mərdanə olmuşuq. Yenə olarıq inşallah!

**- Amma deyirlər ki, zahiri oxşarlıq çoxdur. Elə buna görə də sovet dövründə əsgəri xidmətini keçmək üçün daha çox azərbaycanlı əsgərləri Əfqanıstana göndərirdilər.**

- Azərbaycanlıları ona görə göndərirdilər ki, onlar müsəlmandırlar.

**- Bir də eşitmişdim ki, əfqanlar sovet əsgərini tutanda birinci növbədə kəlimeyi-şəhadətini bilib-bilmədiyini soruşurdular. Əgər əsgər kəlmeyi-şəhadətini əzbərdən deyirdisə, onu buraxırdılar. Bu, nə dərəcədə doğrudur?**

- Yox, bilib-bilmədi öldürürdülər. Əgər bilirdisə, bir güllə vururdular. Bilməyəndə hesab edirdilər ki, o, müsəlman deyil, ona görə də əzabla öldürürdülər.

**- 1979-cu ildə siz Əfqanıstanda idiniz. Sovet qoşunları ora daxil olandan sonra sizlərə sovet vətəndaşı olan tərcüməçilərə münasibət dəyişdimi?**

- Dərhal dəyişmədi, amma hiss edirdik ki, daha bizi görmək istəmirlər. Deyirdilər ki, siz ruslarla gəlmisiniz. Sovet qoşunları daxil olana kimi həm bizə, həm də ruslara böyük hörmət var idi. Xüsusən də bizə, yəni müsəlman olanlara, həm də qədirbilənlik edirdilər. Məsələn, mənim yadıma gəlir ki, Əfqan padşahı Məhəmməd Zahir Şah 66-ci ildə mən işlədiyim yerə gələndə onun maşının təkərləri altında qalan daşları əfqanlar yığıb saxlayırdılar ki, əlahəzrət bu daşların üstündən keçib, bu daşlar

müqəddəsdir. Yəni demək istəyirəm ki, əfqan xalqı bir az da fanat xalqdır. Dini etiqad onlarda çox güclüdür. Quran və İslama, təbii olaraq, böyük ehtiram göstərirlər. Belə ki, ölkədə 400 000-500 000 məscid var. Dünyanın ən böyük məscidlərindən bir neçəsi bu ölkədədir. Məsələn, Məzari-Şərifdə İmam Əli məscidi, Heratda çox böyük cami var.

**- Bəs, sovet qoşunlarının Əfqanıstana daxil olmasına sizin öz reaksiyanız necə oldu?**

- Mənim münasibətim, təbii ki, yaxşı deyildi. Bir halda ki, mən sovetlər ora daxil olana kimi 63-79-cu illərdə fasilələrlə də olsa, onlarla münasibətdə olmuşdum, bu, belə də olmalı idi. Sovet təcavüzündən sonra əvvəllər bizə olan isti münasibətdən daha əsər-əlamət qalmadı. Sovetlər əfqanları məğlub edə bilmirdilər deyə, onlara qarşı kin-küdurət bəsləyirdilər. Kəndləri yerlə-yeksan edirdilər. Yeni silahları Əfqanıstanda sınaqdan keçirirdilər. Məsələn, min bir bəhanə gətirirdilər. Tutaq ki, deyirdilər bu kənddə 5 mücahid gizlətmisiniz, sizə 2 saat vaxt veririk, onları bizə verməsəniz, kəndi yerlə-yeksan edəcəyik. Ultimatumun vaxtı bitən kimi də kəndi bombardman edirdilər. Ruslardan 32 min belə xaraba kənd qalmışdı ki, adı var idi, amma adamı yox idi. Ya hamısı məhv olmuşdu, ya da qaçıb dağılmışdılar. Ruslar Əfqanıstanı tikə-tikə elədilər.

**- Şahin müəllim, bilirik ki, siz Əfqanıstanda olarkən bir neçə medalla təltif edilmisiniz? Bu medalları nəyin şərəfinə, hansı xidmətlərinizə görə almısınız?**

- Əfqanıstandan ikinci səfərimdən qayıdandan sonra gözlənilmədən Moskvadan teleqram aldım. Teleqramda deyilirdi ki, sizin adınıza Əfqanıstandan medal gəlib, təcili gəlin. Mən də getdim. 83-cü il idi, Əfqan səfirliyinin nümayəndəsi təntənəli şəkildə medalı mənə təqdim etdi. Tərcüməçilik xidmətimə görə "Sədaqət" adlı medalla təltif olunmuşdum. Bu medalın şərəfinə bir şeir də yazmışam. Ümumiyyətlə, "əfqan şeirlərim" çoxdur. Bir dəfə eyvanda durub baxırdım, molla azan çəkirdi. Bu zaman raket atdılar və mollanın səsi ağzında qurudu. Məscid mincrəsi yerlə-yeksan oldu. Rusların belə qəddarlıqlarının şahidi olmuşam. Müxtəlif nazirliklərdə işlədiyim vaxt əfqanlara o qədər də köməyim dəymirdi. Elə ki, Əfqanıstan Nazirlər Sovetində işlədim, baş nazir Sultan Əli Keştmənd ilə baş müşavir Stanislov Dvornikov arasında tərcüməçi olduğum illərdə isə işim daha çox idi. O vaxt bəzən gecə saat 12-yə qədər işləyirdim. Birdən elə olurdu ki, baş nazirlə baş müşavirin məsləhətləşmələri 12 saat çəkirdi. Bir dəfə baş müşavir baş nazirlə danışıqlar apardı ki, bəs 10

min əfqanı təcili Sibirə işləməyə göndərmək lazımdır. Onlar meşələri doğrayıb odun istehsal etməli və bunu xaricə göndərməli idilər. Mən də bilirdim ki, əfqanlar isti iqlimə uyğunlaşmış xalqdır və onlar Sibir çöllərində məhv olacaqlar. Qəti qərara gəldim ki, bu işə mane olmalıyam. Keçtməndə dedim ki, bu müqaviləyə qol qoymasın. O da gördü ki, haqlıyam və mənim sözümü eşitdi. Bax bunu əfqan xalqına xidmət hesab edirəm. Bu günə qədər bu işin qarşısını mənim aldığımı heç kəs bilmirdi. Bir gün Dvornikov yenə Keştmənd ilə görüşdü. Dedi ki, vacib söhbətimiz var, mən də tərcümə etməli idim. O bildirdi ki, bəs Almaniyadan məktub almışıq, atom tullantıları var, onları gətirib Əfqanıstan ərazisində basdırmaq istəyirik. Bunun əvəzində isə Əfqanıstana milyonlarla dollar verməli idi. Nə Almaniya, nə də Rusiya bu tullantıları öz torpaqlarında basdırmaq istəmirdilər. Əfqanıstanın isə o zaman pula ehtiyacı var idi. Bu tullantılar isə 100 illərdən sonra da olsa buxarlanıb, yaxud çürüyüb ətraf ərazinin hamısını məhv edə bilərdi. Mən də danışıqlardan sonra Keştməndə yaxınlaşdım və dedim ki, bu işə razı olmayın. Bu, ölkənin gələcəyi üçün böyük təhlükədir, o da mənimlə razılaşdı.

O ki qaldı digər iki medalıma, onlardan biri "Əfqan ingilabının 10 illiyi" medalı, ikincisi isə "Qədirbilən əfqan xalqından" adlı medaldır. Beləliklə, orada üç medal almışam.

**- Əfqanıstanda heç ölüm təhlükəsi ilə üzləşmişdinizmi?**

- O qədər olub ki...Yanımda bomba partlayıb, gözlərimin qarşısında insanlar həlak olub. Hər dəfə də Allah saxlayıb məni. Əfqanlar özlərinə "mücahid" deyirdilər, ruslarsa onları "düşmən" adlandırırdılar. Aleksandr Sergeyeviç Borisov adlı bir rus müşaviri var idi, söhbətlərinin birində o, bir əfqan məmurunun yanında əfqanları "çöllərdə yaşayan düşmən" adlandırdı. Məmur bərk əsəbiləşdi və dedi ki, mənim sözlərimin hamısını ona tərcümə et və de ki, "düşmən sizsiniz, onlar mücahiddirlər"

Əfqanıstanla bağlı o qədər xatirələrim var ki, danışdıqca qurtaran deyil...

**Qeyd:** Mən bu müsahibəmi Şahin Fazildən 2002-ci ildə. Halhazırda 2020-ci ilin son aylarıdır. Bu şairin şe'r yazmadığı gün, demək olar ki, yoxdur. Onun "Dördüncü Divan" kitabı qarşımdadır. "Sıfırdan başlamışam" adlı şe'rini oxudum. Siz də oxuyun.

## SIFIRDAN BAŞLAMIŞAM

*Əzabı, əziyyəti*
*Sıfırdan başlamışam.*
*Qazandığım hörməti,*
*Tapdığım ləyaqəti*
*Sıfırdan başlamışam.*

*Olan hüsn-rəğbəti,*
*İzzəti-şəfəqqəti,*
*Qanımdakı saflığı,*
*Canımdakı qeyrəti,*
*Bəlkə də, gələcəkdə*
*Alacağım qiyməti*
*Sıfırdan başlamışam.*

*Əvvəli öyrənməyi,*
*Axırı öyrənməyi,*
*Və...rəqəmlər nəhəngi*
*Sıfırı öyrənməyi*
*Sıfırdan başlamışam.*

*Bəşərin əvvəli heç,*
*Heçin sonrası sıfır.*
*"1" rəqəminin gücü*
*Sıfırdan başlayıbdır...*
*Sıfırdan başlamışam.*

*Başlayıbdır sıfırdan*
*Dünya mövcud olmağa.*
*Sıfır sonra çevilib*
*Torpağa, dağa, bağa...*
*Sıfırdan başlamışam.*

*Sonsuz kainat içrə*
*Ulduz vardır nə qədər...*
*Sıfırın qüdrətindən*

*Yaranıb səyyarələr...*
*Sıfırdan başlamışam.*

*Sıfır əvvəl, sıfır son!*
*"1"-in solunda heçdir,*
*"1"-in sağındasa "10"...*
*Sıfırdan başlamışam.*

*Rəqəmlər yaza-yaza,*
*Sıfırdan düzə-düzə*
*Keçib sıfırdan "1"-ə,*
*Sonrasa "1"-dən "10"-a,*
*Sonrasa "10"-dan "100"-ə*
*Sıfırdan başlamışam.*

*Aşiq olmaq tərzi nə?*
*Düzü nədir, tərsi nə?*
*Bütün aşiqlər kimi*
*Aşiqliyin dərsinə*
*Sıfırdan başlamışam.*

*Min qədər, milyon qədər*
*Sıfırı da böyük san.*
*Hec vaxt adam adama*
*Deməsin ki, "Sən kimsən?",*
*Söyləməsin "Sıfırsan"...*
*Sıfırdan başlamışam.*

*Qınadam arsızlığı,*
*Söydüm abırsızlığı.*
*Yoxdum sıfırdan əvvəl,*
*Hətta sıfırsızlığı*
*Sıfırdan başlamışam.*

*Tanımırsan sən məni,*
*Tanıyıram mən məni,*
*Ucaldığım məqamı,*

*Yetişdiyim rütbəni*
*Sıfırdan başlamışam.*

*Əvvəli sıfırda gör,*
*Sonu sıfırda ara.*
*Milyardları xırda gör,*
*Ən əzəmətli rəqəm*
*Borcludur sıfırlara...*
*Sıfırdan başlamışam.*

**Gülarə MUNİS**
*şairə-publisist AYB və AİB,*
*həmçinin "Məcməüş-şüəra"*
*ədəbi məclisinin üzvü*

## SƏKSƏNİNCİ BAHARIN MÜBARƏK, USTAD!

*(Professor Şahin Fazilin 80 illik yubileyinə)*

Təsəvvüf—hal elmidir!

Ədəb və mərifət, əxlaq və nəfsi kamilliyə aparan yol, həqiqəti kəşf edən, incəlikləri şərh edən bir hünərdir!

Təsəvvüf iç aləmini təmizləyib, kamala çatmaqdır!

Hal əhli-ariflər, ilahi elmdən, hikmətdən xəbəri olanlardır!

Qal əhli isə zahiri görünüşə uyanlar!

İlahi əxlaqa bürünüb mərifət dəryasına qovuşmaqdan gözəl nə var?

Maddi aləmi elmi fəlsəfəsi ilə yox, qəlbin elmi ilə, bəsirət gözü ilə dünyanı gör. Dünyanı görmək üçün həyata qəlbin gözü ilə baxmaq mütləqdir. Qəlbin gözünün açıq olması üçün isə elm və zəka sahibi olmaq lazımdır. İdrak və fəzilət sahibləri o elmin açarını kitablarda tapdı.

Bal arısı gülə yaxınlaşanda onun şirəsini tez çəkməyə tələsmir, o əvvəl gülün başına dolanır, onu əzizləyir, gülün qəlbini oxşayır, ülfət qurandan sonra onun şirəsini çəkir. Bəlkə ona görə də bal belə şirindir, axı o sevginin məhsuludur. Hətta arı bir güldən başqa gülə tərəf uçub ona qonanda belə, yenə əvvəlki gülə sarı qayıdır, onun ətrafında dövrə vurub, onu unutmadığı bildirir.

Elm sahibləri də kitablarda olan zəka şirəsini beyinlərinə çəkmək üçün vərəqləri çevirir, nəzərlərini sətirlərin üzərində gəzdirirlər.

İllər keçir, kitablardan əxz onunan bilik və savad insanı yeni kitablar yazmağa sövq edir, elə kitablar ki, oxucu bir an belə nəzərlərini ağ vərəqlərə düzülən qara misralardan, sətirlərdən çəkə bilməsin. Vərəqləri çevirdikcə oxucunun ruhunun ehtiyacı ödənsin. O, dərindən nəfəs alıb: "Nə gözəl yazılıb!"-deyə bilsin.

Belə qələm sahiblərindən biri barədə ürək sözlərimi sizinlə bölüşmək istərdim...

Onu ilk dəfə 2001-ci ilin sentyabr ayının 3-də Nizami adına Ədə-

biyyat Müzeyində gördüm. Bəmbəyaz saçları alnına səpələnmişdi, nurani simasında ən tez gözə çarpan zil qara gözlərində dərin bir kədər var idi. Danışığı rəvan, nitqi aydın, söhbəti mənalı...

Məclis başlayandan sonra bildim ki, ağ saçlı bu nurani insan "Məcməüş-şüəra" ədəbi məclisin sədridir. Eyni zamanda universitetdə dərs deyir. Məclis həftədə bir dəfə, çərşənbə axşamları keçirilirdi. Şahin Fazili yaxından tanıdıqca onun tələbələrinə yaxşı mənada qibtə edirdik. Elmi sitatlar gətirməklə danışması, ciddiliyi, son dərəcə nəzakətli və mədəniliyi, ən əsası isə yüksək mənəviyyat sahibi olmasına rəğmən tələbələrə qibtə edirdik ki, onlar Şahin müəllimi daha tez-tez görür, onun elmindən bəhrələnirlər.

Şahin Fazil eyni zamanda əlli ildən artıqdır ki, AMEA Tarix İnstitutunun baş elmi işçisidir. O, həm də uzun illər Bakı, Lənkəran və Sumqayıt Universitetlərində mühazirlər oxumuş, seminarlar keçirmişdir.

2002-ci il dekabr ayının 1-də Şahin müəllim mənə 1996-cı ildə çap etdirdiyi birinci "Divan" kitabını hədiyyə etdi. Bununla da mənim ürəyimdə "Divan" yazmaq həvəsi yarandı.

Həmin kitabı neçə dəfə oxuduğumun sayı yadımdan çıxıb, qəzəllərin hansının hansı səhifədə, sağda ya solda yazıldığını da əzbər bilirəm.

Yeri gəlmişkən birinci "Divan" kitabının "Dibaçə" adlanan hissəsində (səh. 7) oxuyuruq: "Bir də oxucuya demək istəyirəm ki, bu "Divan"mənim işıq üzü görən onuncu və hələlik sonuncu kitabımdır. Bundan sonra yeni "Divan"im çap olunacaqmı, bunu Allah bilir. Ümumiyyətlə :

*"Varmı " Divan" yaradan Seyyid Əzimdən sonra?*
*Əminəm mən neçə "Divan" təzədən gəlməlidir."*

Ən nəhayət, düşünürdüm ki, nə vaxtsa ömür gülüstanım solacaq, həyat qədəhim dolacaq, varlıq Günəşim qaralacaq və "Divan"ım şeir sandığında qalacaq".

Bu sətirləri birinci "Divan" kitabın da yazan Şahin Fazil o vaxt bilmirdi ki, həyat qədəhi dolmayacaq, ömür gülüstanı solmayacaq, Yaradan ondan lütfünü və mərhəmətini əsirgəməyəcək, o, ikinci, üçüncü, dördüncü hətta beşinci "Divan" kitablarınıda yazıb "Divanlar Xəmsəsi" yaradacaq.

Tarix elmləri doktoru, professor, şərqşünas alim, tərcüməçi, qəzəlxan, Azərbaycan Yazıçılar birliyinin üzvü, "Məcməüş-şüəra" ədəbi məclisin sədri Şahin Fazilin qələmindən çıxan əsərlər oxucunun ruhunu sevindirən, ona qəlb rahatlığı gətirən, cəmiyyətə ədəb və əxlaq təlimi tövsiyə edən sənət nümunələridir. **Şahin Fazilin başqa əsərlərini bir kənara qoyub yazdığı beş "Divan" kitablarını göz önünə gətirmək kifayətdir ki, onun Azərbaycan ədəbiyyatına nələr bəxş etdiyinin şahidi olasan.** Yeri gəlmişkən onun "İkinci Divan" kitabına həsr etdiyim mənsur şeirin məqamıdır...

### TOXUNA BİLMƏDİM...

***Şahin Fazilə!***
*"Məcməüş-şüəra" ədəbi məclisin sədri*
*"İkinci Divan"kitabını məclisə*
*gətirəndə çoxu kitabı alıb*
*vərəqlədi, mən kitaba baxıb heyrətləndim,*
*amma toxuna bilmədim.*

***Toxuna bilmədim, təzə kitabına...***
*Əl vura bilmədim görkəmi ilə məni heyrətə salan bu kitaba.*
***Toxuna bilmədim...***
*Hələ oxucu nəfəsi dəyməyən bu "Divan"sanki əfsunlamışdı məni.*
*Yəqin hələ ondan mətbəə qoxusu gəlirdi. Xəyalımdan keçdi ki,*
*görəsən müəlliflər kitabı işıq üzü görəndə ilk olaraq nə edir?*
*Onu əlinə götürəndə öpürmü, yoxsa gül kimi qoxulayır?*
*Ürəyimdən onu gül kimi qoxulamaq keçdi...*
***Amma toxuna bilmədim bu əzəmətli kitaba.***
*Elə bildim kitabı açsam, Haqqın şəninə yazılmış minacatların*
*misralarından "Allahu-Əkbər" sədası yüksələr.*
*Elə bildim Həzrəti peyğəmbərin şərəfinə yazılan nətlərdən gülab ətri yayılar.*
*Elə bildim vətənpərvərlik ruhunda yazılmış şeirlərdən "Cəngi"*
*musiqisinin sədaları yüksələr.*
***Toxuna bilmədim kitaba...***
*Elə bildim vərəqləri çevirsəm qəzəllərdən şairin ahı, fəryadı yüksəlib səmada ağ buluda dönər.*
*Elə bildim lirik şeirlərdən tər bənövşə ətri yayılıb ətrafdakıları bihuş edər...*
***Toxuna bilmədim kitaba...***

***Yəqin ki, bu qalın kitabın incə ruhu incidi məndən...***
*Elə bildim indicə kitab dil açıb deyəcək: " Mənimlə ehtiramla davranın, mən müəllifin kiçik bir dünyasıyam. Tanış olun bu dünya ilə, məndə şairin ürək döyüntüləri, qəriblik niskili, mürgülü xatirələri, ağ günlərinin müjdə sevinci və tənhalığın səsi var. Bu dünya sizə sirli-sehirli bir nağıl danışar, "Divan" nağılı..."*
***Bütün bunları mən kitabın olmayan "dilindən" eşitdim...***
***Eşitdim, amma yenə toxuna bilmədim, bu kitaba...***
***"Bismillah"la başlayan bu kitaba dəstəmazsız toxuna bilmədim...***

***

Şahin Fazilin Azərbaycan ədəbiyyatına, poeziyasına ən dəyərli töhfəsi "Məcməüş-şüəra" adlı ədəbi məclisin tarixi barədə "Təzkirə" yazmasıdır. "Təzkireyi-Şahin" XXI əsrin "Söz qalası"dır-desək, səhv etmərik.

**2006-cı ilin yay aylarında qoca dünyaya cavan bir təzkirə gəldi. Adı qədər əzəmətli olan bu kitab ədəbi aləmə səs saldı.**

Müəllifin bu kitaba qədər olan yaradıcılığına, yazdığı əsərlərə ötəri nəzər salaq...

Elmi monoqrafiyalar, elmi məqalələr, rus, türk, fars dillərində məqalələr, "Azərbaycan Sovet Ensiklopediyası"nın müxtəlif cildlərində çap olunan məqalələr, "Üzeyir Hacıbəyov ensiklopediyası" üçün və " Naxçıvan ensiklopediyası" üçün yazılan məqalələr və sair və ilaxır...

Kitabları "Qəzəllər" (1978), "Azərbaycan XVI-XVII əsrlərdə" (1983), "Qəzəllər" (1986), " Yenə görüşərik" (1989), Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri üzrə"Qəzəllər" (1990), Cozef Tiflisi Vaqiti. Mir Veys və Şah Hüseyn"—(1992) tərcümə, Yan Tadeuş Kruşinski "Xristian səyyahın tarixi" (1993)—tərcümə, "Qəzəllər" (1994), " Divan" (1996), "Əllərini ver mənə" (1998), "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" (Bu yaxınlarda bu kitab Türkiyədə tükr dilində işıq üzü görmüşdür.) —iki nəşr (1995-99), " Allah eşqi, peyğəmbər məhəbbəti, imam sevgisi" (2001), "Quba tarixi " (1-ci nəşr) "Qırxnamə—qırx şeirdən ibarət elegiya", (2001), "İlnamə, yaxud səndən ayrı səninlə" (2002), " XV əsr Azərbaycan Dövlətlərinin quruluşu"-2-ci nəşr (2003), " İran səfərnamələri" (2003), "İkinci Divan" (2005), " Təzkireyi-Şahin" (2006), " Üçüncü Divan", 2008 "Qubadlı tarixi", " Zəngəzur tarixi", "Şəki tarixi" (əməkdaşlarla şərikli). Bunlardan əlavə İsgəndər bəy Münşi "Tarixi-aləmarayi- Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") fars di-

lindən tərcümə, Həsən bəy Rumlunun " Əhsənüt-təvarix" ("Tarixlərin ən yaxşısı") əsərini fars dilindən Azərbaycan dilinə tərcüməsi, "Dördüncü Divan" (2014), "Doğruya doğru" (2018) "Beşinci Divan" (İstehsalatdadır)...

Bu siyahı hələ də davam etməkdədir...

Yenidən qayıdaq "Təzkireyi-Şahin" kitabına, əgər gələcəkdə kimsə "Məcməüş-şüəra" ədəbi məclisi barədə tədqiqat əsəri yazmaq istərsə, adı çəkilən kitab hazır tarixi mənbə və mövzular toplusudur.

Amma, nə vaxtsa XXI əsrin 811 səhifəlik təzkirəsini açıb oxuyan və ya bu mövzuda tədqiqat əsəri yazmaq istəyən bir insan kitabı səhifələyib öyrənmək istəsə ki, görsün 140 yaşlı tarixi bir məclis, özü də əsasən əruz şairlərinin toplaşdıqları məclis öz yığıncaqlarını harada, hansı ünvanlarda keçirib, onda bizə xəcalət gətirən məqam üzə çıxacaq...

**Əgər gələcək nəsillər bilsə ki, məclisin sədri professor Şahin Fazil məclis üzvlərini (ifadəmə görə üzr istəyirəm) pişik balalarını ağzında gəzdirən kimi Mədəniyyət fondundan Azərbaycan Tarixi müzeyinə, oradan Nizami adına Ədəbiyyat Müzeyinə, İçərişəhərdə İtaliya Səfirliyi yanındadı kiçik bir otağa, Şirvanşahlar Müzeyinin divanxana deyilən yerinə və qeyri otaqlarına, hətta dəfələrlə yer olmadığı üçün öz evinə, bir dəfə yay mövsümündə məclis üzvlərindən birinin bağ evinə, "Vahid" poeziya evinin nəzdindəki darısqal bir hücrəyə, "Vahid" adına kitabxanaya və daha haralara aparmaqla məclisi yaşadıb, onu dağılıb məhv olmağa qoymayıb, ustadımıza ürəkdolusu "Əhsən" deyərdi!**

**"Əhsən"- deyərdi bizim poeziyaya, qəzələ və əruz vəzninə olan sevgi-məhəbbətimizə! Köçkünlük gününə düşsək də, məclisdən uzaqlaşmadıq.**

Xoşbəxtəm ki, "Təzkireyi-Şahin kitabının 588-595 səhifələrində mənim yaradıcılığım barədə məlumat və qəzəllərim yer alıb. Mən "Məcməüş-şüəra"ədəbi məclisinə 2001-ci ildə üzv olmuşam. Bir neçə il məclisə gedib-gələndən sonra Şahin müəllimin mənə tövsiyəsi bu oldu ki, "Divan" kitabı yazım. O, israrla deyirdi ki, **Şərqdə təmiz Azərbaycan dilində "Divan" yazan qadın şairə yoxdur. Yaz, qoy ilk "Divan"ı azərbaycanlı qadın yazsın!**

Ustadımızın məsləhəti ilə bu çətin işi boynuma götürdüm, Şahin müəllimin məsləhət və göstərişləri sayəsində 2007-ci ildə "Divan" kitabı başa çatdı. Elə həmin il nəşr olunan birinci "Divan" kitabımın redaktoru

ustadımız Şahin müəllimin olması mənə şərəf oldu. Hazırda iyirmi dörd kitabım işıq üzü görüb və "İkinci Divan" kitabım nəşrdədir. **Ədəbi aləmdə əldə etdiyim bütün uğurlara görə məclisə və şəxsən Şahin Fazilə borcluyam.**

Şahin Fazilin Azərbaycan ədəbiyyatında ən böyük xidmətlərindən biri də dilimizin saflığının keşiyində dayanmasıdır. 50 ildən artıqdır ki, Şahin Fazil Azərbaycan şeirinin klassik janrından ərəb-fars sözlərini təmizləmək uğrunda qəlizdilli qəzəlxanlarla mübarizə aparır və buna qismən də olsa nail olur. Saf dildə, öz dilimizdə qəzəl yazmaq Şahin müəllimin həyat amalıdır. O, bir beytində deyir:

*"Bağibanəm, o alağ sözlərə ziddəm, Şahin,*
*Şeir bağımda mənim varsa alaq, yanmalıdır!"*

**Şərh:**

Hər bir bağban saldığı bağın nazını çəkir, onu daş-kəsəklərdən, yabanı otlardan, bitkilərdən təmizləyir. Saf meyvə, gözəl ətirli güllər əldə etmək üçün bağban gecə-gündüz əziyyət çəkir, barmaqları qabar bağlasa da, zəhmətinin hədər getməsinə yol vermir. Cücərən alağları bağdan birər-birər təmizləyir. Şahin Fazil beytin ikinci misrasında deyir: "Şeir bağımda mənim varsa alaq, yanmalıdır." Adətən bağın alağlarını təmizləyəndə onları bir yerə toplayıb yandırırlar. Yandırırlar ki, alağın toxumları ətrafa səpələnib, yenidən cücərməsin. Ş. Fazil şeirindəki əcnəbi sözlər əgər varsa, o alağlar kimi yanmalıdır ki, qəzəllərdə onlar təzədən cücərməsin. Xoşbəxtlikdən onun şerlərində heç bir alağ yoxdur! Və olmayacaq da!!!

Ustad qəzəlxan məclisə gələn gənc şairlərə bunu dönə-dönə tövsiyə edir. Yad sözlərlə qəzəlləri qəlizləşdirən şairlərə Şahin Fazil doğma dilimizə hörmət və ehtiramla yanaşmağı məsləhət görür və tez-tez deyirdi: "Dil, Dövlətin əsas rəmzlərindən biridir və birincisidir!" Şahin Fazil başqa bir beytində deyir:

*"Bəsdi yazdıq gah ərəbdən, gah farsdan söz yığıb,*
*Gərçi şəkkərdir dilim, mən şəkkəristan eylərəm."*

**Şair fəxrlə "şəkkərdir dilim"- deyib, şəkkəristan yaradır. Əgər bir yerdə şəkkər varsa, orada tutinin olması mütləqdir, həmin tuti Şa-**

**hin Fazilin oxucusudır. Doğma, sadə dilimizdə yazılan qəzəlləri oxumaq üçün oxucuya heç bir lüğət kitabına baxmağa ehtiyacı yoxdur!**

Müəllifin "Üçüncü Divan" kitabının 22-ci səhifəsində çox maraqlı məqama rast gəlirik. Filologiya elmləri doktoru Cənnət xanım Nağıyeva Şahin Fazilə deyir: "Əlişir Nəvai bir neçə divan bağlayıb, hamısına da ad qoyub, sən nə əcəb divanlarına ad qoymursan?"

Şair Cənnət xanıma belə cavab verir: "Divanlara ad qoyulma məsələsinə gəldikdə yenə də birincilik iddiasında oldum. Hələ heç bir şair öz divanını sayla adlandırmayıb".

*"Yazıb üç divanı məqsudimə yetdim, Tanrım,*
*Görəsən qismət olarmı mənə dördüncüsü də?"*

Şükürlər olsun ki, qəlbi yazıb-yaratmaq eşqi ilə alışıb yanan şair divan kitablarının sayını beşə çatdıra bildi.

**Şairin bütün yaradıcılığından vətən sevgisi, yurdsevərlik qırmızı bir xətt kimi keçir,** "Üçüncü Divan" kitabının 129-ci səhifəsində olan qəzəlin məqtə'sinə diqqət edək:

*"Can, can" deyirəm sevgili cananıma, Şahin,*
*"Can, can" dediyim Azəribaycan deyilmi?"*

Və yaxud həmin kitabın 186-cı səhifəsindəki qəzəlin mətlə'sində (ilk beytində) oxuyuruq:

*" Demişəm: Birləşəcək Azəribaycan bir gün,*
*Yenə vahid olacaqdır o iki can bir gün."*

Daha sonra:

*"Bakı-Təbriz arasından itəcəkdir hicran,*
*Mənə "can, can" deyəcəkdir yenə Zəncan bir gün.*

Qəzəlin sonuncu beytində, məqtə'də isə oxuyuruq:

*"Qayıdır bir də bu Şahin sözünün əvvəlinə,*
*Demişəm: Birləşəcək Azərbaycan bir gün!"*

Şairin ürəyini qarsalayan Vətən yanğısını, həsrət acısını xan Araz çayı belə soyuda bilmir. O yazdığı vətənpərvərlik qəzəlləri və başqa yanrda yazdığı ədəbi nümunələrlə təskinlik tapır. Şahin Fazil nə qədər sakit təbiətli, təmkinli, səbirli olsa da, haqsızlığa qarşı həmişə barışmaz mövqedədir. O, yeri gələndə fikrini açıq şəkildə rəngsiz və boyasız üzə deyə bilir. Şair ətrafında olan neqativ fikirli insanları haqqı bəyan etməklə özündən uzaqlaşdırır.

Şahin Fazilin bu xüsusiyyətini çinar ağacı ilə müqayisə etmək yerinə düşərdi. Çinar ağacında heç bir ağacda olmayan qeyri-adilik var, çinar ağacının köklərinin rişələrində xüsusi zəhərli maddə var ki, onu torpağa basdıranda həmin zəhərli maddəni torpağa axıdır ki, ətrafda olan ziyanvericilər məhv olsun və onun inkişafına mane olmasın. Məhz bu səbəbdən çinar ağacı uca qamətli və uzunömürlü olur.

Şahin Fazilin yaradıcılığı çoxşaxəlidir, onun yaradıcılığını təbiətlə müqayisə etsək və ya təbiətə bənzətsək, onun elmi məqalələri yamyaşıl çəmənə, şeir və qəzəlləri çəməndə bitən al-əlvan güllərə, kitabları barlı-bəhrəli ağaclara, beş "Divan"ı isə başı qarlı dağlara bənzəyərdi.

Bu il -2020-ci ilin baharında söz və kəlam aşiqi, qələmi gənclik eşqi ilə külüng vuran professor Şahin Fazilin 80 yaşı tamam olur.

Ömrünün səksəninci baharına qədəm qoyur ruhu cavan ustadımız. Səksəninci baharın, mübarək, Ustad!

Bu məqamda Şahin Fazilin bir qit'əsini oxucuların diqqətinə çatdırmağı da lazım bildik.

Bir vaxt məclis üzvü Əvəz Qurbanlı belə demişdi:

*"Şirvan Sarayı yaxşıdı Tarix Müzeyindən,*
*Şahin keçirir məclisi şahın sarayında."*

Şahin Fazil isə bu günlərdə yazdığı təzə bir şeirində yana-yana deyir:

## QİT'Ə

*"Məcməüş-şüəra"və"Vahid ədəbi məclis"ləri yersizlik ucbatından müvəqqəti olaraq öz məşğələlərini dayandırmışdır.*

*Sönməkdə qəzəl yanğısı, çaxnaşma düşübdür,*
*Şam məclisinin bir neçə pərvanəsi içrə.*

*Aqil adamıq ki, adımız səslənir indi*
*Divanələrin bir neçə divanəsi içrə.*

*Söz məclisinə gəlmə daha, varmı, ey əğyar,*
*Biganələrin sən kimi biganəsi içrə?*

*Meyxanədə mey yox, söz içərdi yığışanlar,*
*Saqi daha dəymir gözə meyxanəsi içrə.*

*Leyla adı başdır və Şirinlər yenə vardır*
*Eşq aləminin bir neçə cananəsi içrə.*

*Heyfa, köçürüldü, yerimiz yox daha artıq,*
*Sabir adına Milli Kitabxanəsi işrə.*

*"Məcməş-şüəra" məclisinə xanə tapılmır,*
*Şahin keçirir məclisi öz xanəsi içrə.*

***

Şahin Fazilin Yaradana olan eşqi divan kitablarında, xüsusən "Beşinci Divan" kitabında bariz şəkildə əks olunub. "Doğruya doğru"adlı kitabın 938-ci səhifəsində oxuyuruq:

"Eşq nədir?.. Cavanlığımda mən özüm də eşqi dünyəvi eşq kimi düşünüb barəsində xeyli "tərifnamələr" yazmışam.

Məsələn,

*"Bir uşaqdan xəbər aldım ki, nədir eşq, dedi:*
*Bunu mən bilməyirəm, bilsə atam yaxşı bilər."*

Yanılmışam, İlahi. Eşq sənsən və şairlərin eşqi sənə doğru istiqamətlənən eşq olmalıdır zənnindəyəm. Sənə olan eşqim yüzlərlə misra və beytimdə öz əksini tapmışdır.

*"Eşqdən yox, qələm istər yaza çox mətləbdən,*
*Neyləsin dinc ola bilmirsə qələmdan içrə.*

*Baxıram göz görə aləm qarışıb bir-birinə*
*Və düşüb səksəkə, təşviş müsəlman içrə".*

Onun minacatlarından həqiqətən Allaha olan eşq süzülür, Allahın onun zehninə vəhy ilə səpdiyi ülvi fikirləri şair misralara düzüb, beytlərə, daha sonra qəzəllərə, qəsidələrə, heca şeirlərinə, daha nələrə, nələrə çevirir...

**Bu gün də Şahin Fazil yazıb-yaratmaqdan doymur, Azərbaycan ədəbiyyatına yeni töhfələr verməkdədir.**

Uzunömürlü "Məcməüş-şüəra" ədəbi məclisinin bütün üzvləri adından, Şahin yaradıcılığının pərəstişkarları adından və şəxsən öz adımdan ustadımızı təbrik edir, ona sağlam və daha uzun ömür arzu edir, Şahin müəllimə həst etdiyim bir qəzəllə məqaləmi tamamlayıram.

QƏZƏL

*"Məcməüş-şüəra " ədəbi məclisinin sədri*
*ustadımız **Şahin Fazilin***
*80 illik yubileyi münasibəti ilə.*

*Şəkk yoxdur gözünün rəngini qətrandan alıb,*
*Çaglayan təb'ini yəqindi ki, ümmandan alıb.*

*Neçə mə'na oxunur bir baxışından, yoxsa,*
*Baxışın cazibəsin Yusifi-Kən'andan alıb?*

*Tökülüb alnına ağ saçları qardan da bəyaz,*
*Saçının rəngini zəhmətlə bu dövrandan alıb.*

*Ehtiyac yoxdu asa boynuna gözmuncuğunu,*
*Susmayan ilhamını Azəribaycandan alıb.*

*Oxuyub, etdi qiraət neçə minlərlə kitab,*
*Onu tə'min eləyən mətləbi Qur'andan alıb.*

*Bir çələng bağlayaram hər qəzəlin beytindən,*
*Qoxlayan söyləyəcək: Ətrini "Divan"dan alıb.*

*Mərhəba! Bir yeni "Təskirə" gəlib dünyayə,*
*Cəm' edib söz gülünü cümlə qəzəlxandan alıb.*

*Munisa, heyrət elə səbrinə ol ustadın,*
*O qədər səbr eləyib,səbrini Sübhandan alıb.*

*20.02.2020*

**Qiymət MƏHƏRRƏMLİ**
*Filologiya üzrə fəlsəfə doktoru, şair-publisist*

## ELMİMİZDƏ VƏ ŞEİRİMİZDƏ ŞAHİN FAZİL İMZASI

Bakının küçələrində ağsaçlı, mütənasib bədən quruluşlu, iti yerişli, qartal baxışlı, ixtiyar yaşlarında olan qəhrəmanımızla rastlaşanda, istər-istəməz dodaqlarımıza təbəssüm qonur. Çünki onu çoxlarımız tanıyır və ehtiram bəsləyirik. Kiminin iş yoldaşı, kiminin ali məktəb müəllimi, kiminin səfər yoldaşı, kiminin şeiriyyatda ustadı, kiminin də sadəcə həyatda nümunə, örnək götürdüyü ziyalılıq, insanlıq məktəbidir o!...

"Şahin Fazil" ədəbi təxəllüsü ilə çoxlarının poetik yaddaşında söz xiridarı kimi, "Şahin Fərzəlibəyli" "elmi titulu" ilə Azərbaycan tarixşünaslığının bünövrə daşlarından biri kimi hər zaman öndə gedən aydınlarımızdan, üzdə olan, sayılıb-seçilən tədqiqatçı-alimlərimizdəndir. Yorulmaq nə olduğunu bilmədən, ilham pərisinin bircə an belə uzaq düşməməsi üçün gecəli-gündüzlü qələmə sarılanlardan, sözə könül verənlərdəndir Şahin müəllim.

"... Şahin yazır. Həmişə yazır. Elmi əsərlər yazır, divanlar yazır, səfərnamələr yazır. Onun yazdıqları uğurludur..." (Mir Cəlal Zəki Məştəqayi). Bu uğurlu əsərləri ilə tanış olduqca heyrət götürür insanı. Bir alimin, bir şairin, bir tərcüməçinin, bir publisistin bu qədər məhsuldar çalışması, əzmlə, yorulmadan, usanmadan, elmə, ədəbiyyata, tarixi keçmişə və bugünə bunca vurğunluğu hansı mənbədən qaynaqlanır?! Necə olur ki, illərin o üzündə qalan gənclik coşqusu, cavanlıq həvəsi bu ixtiyar insanı tərk etməyib bu gün də?! Demək, burda nəsə İlahi bir sirr var...

O sirdən agah olmaq üçünsə sevilən şair Şahin Fazilin ilham çeşməsinin könüllərə təravət bəxş edən o həyat iksirindən bir ovuc sinəmizə çəkməyə dəyər. Elə isə, birlikdə nuş edək o iksiri... Və görəndə ki:

*Bu Şahinin duası var,*
*Ürəyinin sevdası var.*
*Başında eşq havası var,*
*Elə yaxşı hava var ki...*

– bu havadan da ciyərlərinə, nəfəsinə çəkib, yol getməyə başlayırsan ən-

ginliklərə doğru. Bir də görürsən, budur, elə bir yerdəsən ki, burdan o tərəfə nə səs çatır, nə ün. Halbuki şair idrakı, şair təfəkkürü bu əlçatmazlığı da, ünyetməzliyi də yenə bilib. Başında eşq havası, dilində eşq duası kəmənd atmadadır "Göyün yeddinci qatı"na:

*Ora kim kəmənd atır?*
*Kimin əlləri çatır?*
*Görəsən nə boydadır*
*Göyün yeddinci qatı?*

"Laməkana məkan" olan "Göyün yeddinci qatı"dır əslində şair olanın yeri də, məkanı da. Bir də olduğu o uca qatdan İlahiyə səslənməkdi peşəsi Şahinin:

*Göndər, İlahi, göndər –*
*Torpağa saflığı,*
*Suya şəffaflığı,*
*Havaya lətafəti,*
*Oda hərarəti*
*Göndər...*

İnanır bütün varlığıyla bu duanın ünvanına yetəcəyinə şair. Axı, peyğəmbərlərdən sonra Allaha ən yaxın kimsələrdəndi şairlər. Haqq deyən, haqq söyləyən dilləriylə, saflığa, halallığa səcdəyə qanadlanan əlləriylə elə hər zaman dua-sənadadır sözə könül verənlər:

*Verdi cism mənə, verdi can mənə,*
*Verdi ürək mənə, verdi qan mənə.*
*Uzun həyat verdi Yaradan mənə,*
*Mən ona borcumu verə bilmədim.*

Göründüyü kimi, Şahinin nigaranlığı bitmir, tükənmir. Axı, ona bəxş olunan cism və canı, ürək və qanı təyinata uyğun "xərcləməyibsə", demək, Yaradanın hüzurunda borclu qalmışdır yenə də...

*Havanı,*
*Suyu,*
*Odu,*
*Günəşi,*
*Ayı verib...*

*Allah-təala bizə*
*Yeri havayı verib.*
*İlahi, şükr edirik*
*Səxavətinə görə,*
*Sənədir ümidimiz.*
*Və...çox təəssüf ki:*
*Havayı verilənin*
*Qənimiyik amma biz.*

Şairin ən böyük nigaranlığının səbəbi də elə budur: bizə bəxş olunan Tanrı əmanətlərini halallıq, dürüstlük, insanpərvərlik, səxavətlilik, yanımcıllıq kimi müsbət insani keyfiyyətlər əvəzinə, qəddarlıq, zalımlıq, ikiüzlülük, şərəfsizlik kimi mənfiliklərin həyatımızı zəhərə döndərməsi istiqamətində sərf edib tükətməklə məşğuluq. Bəs sonda bunun bədəlini necə ödəyəcəyik? Axı:

*Nuh qabaqdadır hələ,*
*Sel qabaqdadır hələ...*

Bəs niyə:

*Var eləsi Musaya da inanmır,*
*Məhəmmədə, İsaya da inanmır.*
*Məhşər günü cəzaya da inanmır,*
*Cəza ilə dava-dava oynayır.*

Şahin Fazilin son illər yaradıcılığına hakim kəsilən bir aparıcı xətt açıq-aşkar duyulmaqdadır bu şeirlərdə: yaşadığı ömür kəsiyində olmuşlar, olanlar, olacaqlar bir-bir gəlib göz önündən keçdikcə, öz-özünə hesabat verən şair qəlbinin etiraf və umacaqları birər-birər sətirlərin söz yaddaşının tozunu almağa çalışır. Axı, bir zamanlar "Əllərini ver mənə" deyərək, bərk-bərk yapışdığı o sevdalı əllər sahibindən gözlədiklərini ala bilmədi. Taleyin acı zərbəsindən qəddi əyiləcəkdi az qala, lakin şair təbi, yaradıcı ilhamı onun titrək vücuduna yenilməz bir qüdrət bəxş elədi. Doğruldu, qüvvətləndi Şahin. Adı kimi əzəmətli bir göylər qartalına, qüdrətli şahin quşuna dönərək poeziyanın, elmin əsrarəngiz üfüqlərində yüksəlməyə başladı. Artıq bu yüksəlişlərin bəhrəsi olan neçə-neçə şeir kitabı, divan, publisistik və elmi əsərlər müəllifi kimi bu gün Şahin Fazil Fərzəlibəyli adı elmi və ədəbi cameənin fəxrlə, qürurla, sevgi

ilə oxuduğu, öyrəndiyi və istinad etdiyi hikmət xəzinəsinin "ən varlı sahibkar"ına çevrilmişdir.

Şahin Fazil ömrünün ən müdrik çağlarını yaşamaqdadır. Qazandığı uğurlara, ucaldığı insanlıq mərtəbəsinə layiq olan görkəmli tarixçi-alimimizi, sevilən şairimizi qarşıdan gələn yubileyi münasibətilə ürəkdən təbrik edir, möhkəm can sağlığı, bitib-tükənməz yaradıcılıq eşqi, yaradıcılıq uğurları arzulayırıq! Hər zamankı kimi, şeirimizin Şahini ol, Şahin! Necə ki, bir rübaində deyirsən:

*Yurdumun doğruçu bir şairi – mən!*
*Ölü olsam da haçansa, diri – mən!*
*Hər gedən Doğruya doğru getmir,*
*Gedənin Doğruya doğru biri – mən!*

Kaş bütün insanlar Doğruya doğru gedəydilər. Şahin Fazil kimi!!!

**Gülzar NƏNƏ (İBRAHİMOVA)**

## İKİ MÜXƏMMƏS BARƏDƏ BİR MƏQALƏ

Şahin Fazili çoxdan tanıyıram. Bizi mərhum yazıçımız Əlibala Hacızadə tanış etmişdi. Nə yaxşı ki tanış etmişdi və tanışlığımız tezliklə ədəbi dostluğa çevrildi. Hazırda o, "Məcməüş-şüəra" ədəbi şairlər məclisinin sədri, mən isə katibiyəm.

Şahin müəllim yaradıcılıq baxımından çox məhsuldar müəlliflərdəndir. Onu alim, şair, tərcüməçi, publisist, səfərnamələr müəllifi, pedaqoq yaxud bunlar bir yana, səmimi dost adlandırsam yerinə düşər. Arabir televiziya ekranlarında da çıxışlarımız olur. Mən mənsur, o isə mənzum şeirlər yazır, 40-a qədər kitabın müəllifi, bir neçə tarixi əsərin xarici dillərdən (fars, osmanlı) mütərcimidir.

80 yaşı tamam oldu bu yaradıcı İnsanın. Yenə qələmi əlində, varağı önündə, zehni işləməyindədir. Yenə yazır, yazır...

Bu günlərdə Şahin Fazil tərəfindən yazılmış "Təzkirə" kitabını varaqladım. O kitabda mən də varam. Ş.Fazil yazır: "Gülzar. O hərçənd ki, özünü nasir adlandırır, amma mən ona şair deməyə bilmirəm. Məgər bu deyimlər şairanə deyilmi:

Görən insan nədən tapdığın itirir, nədən? Nədən sevinci ani olur kədərdən, nədən? Nədən göz yaşı quruyur, nədən? Nədən sevgi unudulur, nədən? Nədən ümid qırılır, nədən? Bəs arzular nədən puç olur, nədən?

...Nə səbəbdən dünya dolur, boşalır, nə səbəbdən? Nə səbəbdən hər şey yox olur, nə səbəbdən? Nə səbəbdən həyat başlamamış qurtarır, nə səbəbdən? Nə səbəbdən suallar cavabsız qalır, nə səbəbdən? Nə səbəbdən suallar cavabsız qalır, nə səbəbdən?"

Bəs təzkirə nədir? Təzkirə. "Təzkireyi-Şahin". "Məcməüş-şüəra" şairlərinin təzkirəsi. Əsərin "Dibaçə" ("Müqəddimə") hissəsində bu təzkirəçi Allaha üz tutaraq deyir.

*"Bimillahir-rəhmanir-rahim"*
*Sonra isə gəldi : "Əlif, lam, mim"*
*Kainatın ey əbədi sərvəri,*
*Ey həmə rəhbərlərinin rəhbəri,*
*Sən kömək etdin yenə ilhamıma,*
*Yetməli oldum yenə bir kamıma.*

*Başa yetircək təzə divanımı,*
*Toplayaraq səyimi, imkanımı*
*Cəhd elədim tazə əsər yazmağa,*
*Qəlbə adın verdi təpər, yazmağa.*
*Qəlbə adın verdi cəsarət yenə,*
*Qəlbə adın verdi dəyanət yenə.*
*Qəlbə adın verdi dözüm, hövsələ,*
*Bir də götürdüm qələmi mən ələ.*
*Bir də böyük bir əsəri başladım,*
*Bir neçə şe`r əhlini alqışladım.*
*Çəkdi mənim diqqətimi hər biri,*
*Hər biri "Məcməş-şüəra" şairi.*
*Təbimə "ləng olma" dedim, "din" dedim,*
*Mən ona "Təzkireyi-Şahin" dedim.*

*Ey ulu Həqqin uca peyğəmbəri,*
*Bir də götürdüm əlimə dəftəri,*
*Bir də adınla elədim iftixar,*
*Məndə olan təb bu gün kimdə var?*
*Təbimə Allah ilə sənsən səbəb,*
*Görməyirəm qeyri ola, mən, səbəb.*
*Hər ikinizdən gəlibən vəcdə mən,*
*Eyləyirəm Tanrımıza səcdə mən.*
*Eylə kömək, ey uca peyğəmbərim.*
*Ehtiyacım var ki, bu təzkirəmi*
*Bəxş eləyim xəlqimə bəxşiş kimi.*
*Təbimə "ləng olma" dedim, "din" dedim,*
*Mən ona "Təzkireyi-Şahin" dedim.*

Sonra bu təzkirənin "Və sonra" hissəsi gəlir. Əsərdə oxuyuram: "Mən aciz bəndə Kərbəlayi Şahin Fazil gecə-gündüz fikrü xəyala dalıb, könlümə bir şairanə məcmuə odunu salıb və həmçinin 120 yaşlı "Məcməüş-şüəra" ədəbi məclisinin cavan və yaşlı üzvlərinin xahişlərini nəzərə alıb "Təzkireyi-Şahin"i yazmağa niyyət və bu çətin işə cürət etdim. Məlumdur ki, son dövrlərdə təzkirənevislik sahəsində hələm-hələm qələm işlədən və ağ varaq qaralayan ədiblərimizin sayı olduqca azdır və ədəbiyyat maşınımız bu cəhətdən nasazdır.

QİTƏ

*"Təzkirə" bəhrinə baş vurmağa tab lazımdır,*
*Nə böyük işdi bu, yarəb, bu nə qüvvət, tabdır?*

*Birini Seyyid Əzim yazdı ki, min rəhmət ola,*
*Birinin sahibi Mir Möhsun Ağa Nəvvabdır.*

*Biri də Mirzə Hüseyn idi "Qayıb" nəslindən,*
*Bir burulğandı bu təzkirə işi, girdabdır.*

*Başqa təzkirə yazan görməyirəm dövrəmdə,*
*Bir səda gəldi mənə: Onlara Şahin babdır!*

Allah-təala qoy bütün təzkirəçilərə, o cümlədən əgər öz təbiri ilə desək "bəndeyi-qəlilül-bəzaə və şərməndeyi-ədimül-istitaə, mühibbül-ürəfa, xadimüş-şüəra Hacı Seyid Əzim ibn Seyid Məhəmməd Şirvani"yə, Mir Möhsün ibn Hacı Mir Əhməd Ağamirzadə Nəvvab Qarabağiyə, habelə Molla Vəli Vidadinin qız nəvəsi Hüseyn Əfəndi Qayıbova rəhmət eləsin, mən Kərbəlayi Şahin Fazil oğluna isə can sağlığı bəxş eləsin ki, hələlik yarımçıq qalan işlərini bitirsin, bu təzkirənin, "Üçüncü Divan" adlı kitabının və fars dilindən tərcümə etdiyi bir neçə əsərin çapını görə bilsin".

Kitabı varaqlayıram. Orada 120-dən çox qələm əhli haqqında məlumat və əsərlərindən nümunələr verilmişdir. Çətin işdir. Gərək onların hər biri haqqında söz deyəsən.

"Təzkirə"də əks olunan şairlərin biri də Ələmdar Mahirdir. Təzkireçi Şahin Fazil sözünə belə başlayır: "Bəri başdan deyim ki, onunla mənim aramdakı münasibət soyuqdur. Elə soyuqdur ki, qarşılıqlı cəhd olsa da, heç isinə bilmir. Sanki aramıza şeytan girib və bizi mehribanlaşdırmır.

Mən Ə.Mahir barədə "Sələflərin xələfləri..." adlı məqaləmdə öz təəssüratımı bildirib yazmışdım:

"O, qəzəlimizin ələmdarı ola bilər, çünki mahirdir. Hafizəsi də qələmi kimi güclüdür Mahirin: günlərlə, fasilə vermədən şe`r deyər. Şairin şe`rlərində ərəb-fars tərkibli söz və istilahlar boldur. Bəzən Rüstəm Samitdən də qəliz yazır Ələmdar Mahir:

*"Saldı rəhmət nurini bir xaliqi-yekta yerə,*
*Lütf qıldı hüsndə bir şuxü bihəmta yerə.*

*Asitanın xakidir dünyanı xoşbu eyləyən,*
*Ya, düşüb əttar əlindən ənbəri-sara yerə?"*

Bu misralarda hər şey yerli-yerindədir. Vəzn də, qafiyə də əruzun sərt qayda-qanununa tabe edilmişdir, amma qəlizdir, deyilmi? Təbiəti cəhətincə sadə insan olan bu şairin sadə qəzəlləri də yox deyildir:

*"Aşiq sürərsə ömrünü eşq içrə yarsız,*
*Keçmz yəqin ki, bircə günü ahü zarsız".*

Belə yaz, Mahir, belə yaz. Qoy sənin gözəl qəzəllərindəki məna xalq içrə başa düşülsün, qiymətləndirilsin. Əgər sən də, mən də, biz də Məhəmməd Füzulini dönə-dönə iftixar və ehtiramla yad ediriksə, gəlin onun bizə vermiş olduğu məsləhətə əməl edək. Məgər, o nəhəng ustad bizə deməyib ki:

*"Oldur qəzəl ki, feyzi onun am olub müdam*
*Arayişi-məcalisi-əhli qəbul ola.*

*...Ondan nə sud kim, ola mübhəm ibarəti,*
*Hər yerdə istimain edənlər məlul ola?"*

(Bax: Sələflərin xələfləri..., II məqalə).

İndi bu sözlərin yazıldığı vaxtdan 10 il keçir. Nə sən o üsulundan dönürsən, nə də mən öz sözümdən. "Kişinin sözü bir olar" qənaətində israrlıyıq..."

Bəli, yaradıcılıq yolu baxımından bu iki şairin yolu tam müxtəlifdir. Buna baxmayaraq, onların bir-birinə rəğbəti inkarolunmazdır. Misal? Onların bir-birinə yazdıqları iki müxəmməs! İki müxəmməs və iki şairin etirafı.

"Müxəmməs" istilahı ərəbcə "beşlik" deməkdir, lirik şe`r forması olub 5 misralı bəndlərdən ibarətdir. Bəndlərin sayı bəzən 10-15-ə çatır (Azərbaycan Sovet Ensiklopediyası, VII cild, Bakı, 1983, səh. 135). Ə.Mahir müxəmməsində sözə belə başlayır:

*“Ey eşq biyabanının avarəsi Şahin,*
*Ey sözləri çox xəstlərin çarəsi Şahin,*
*Şe`rim sənədir, ey gözümün qarəsi Şahin,*
*Hər yarədən ağırdır sözün yarəsi, Şahin,*
*Əhli-ədəbik olmalıdır nəng aramızda”*

Bu bənddən Ə.Mahirin Ş.Fazilə müsbət münasibəti özünü biruzə verir. Müxəmməsin üçüncü bəndi:

*“Yox əyri nəzər düz görünən şe`rə gözümdə,*
*Yox heç kəsə nə atmaca, nə rəmz sözümdə,*
*Bir az kobud olsam da, həya vardır üzümdə,*
*Əvvəlcə özümdən deyim, az yoxdur özümdə,*
*Çün sələ məniman çox olub cəng aramızda”.*

Ələmdar Mahir özünün “bir az kobud” olduğunu səmimiyyətlə etiraf edir, “Əvvəlcə özümdən deyim, az yoxdur özümdə” deyərək, aralarında “cəng” olduğunu (ədəbi “cəng”!) bildirməyə bilmir.

Müxəmməsin 5-ci bəndi:

*“Boş söhbət ilə verməmişik ömrü hədər biz,*
*Qoyduq hərəmiz bir cürə dünyadə əsər biz,*
*Göstərməliyik olduğumuz yerdə hünər biz,*
*Bir mənzilə zahirdə sığınsaq da əgər biz,*
*Var leyk məsafə neçə fərsəng aramızda”.*

Ə.Mahir şe`rin 7-ci bəndində özü ilə Ş.Fazil arasında vəhdət olmasının tərəfdarıdır:

*“Hər sözdə rümuzat, müəmma biliriksə,*
*Hər gördüyümüz surətə məna biliriksə,*
*Hər iş görürük həddini əla biliriksə,*
*Aləmdə bu gün özmüzü dana biliriksə,*
*Vəhdət işi neyçün yeriyir ləng aramızda?”*

Müxəmməsin son bəndi, əlbəttə, ürəkaçandır, şair “min rəngə boyandığını”, “Mahir kimi qəflətdə olduğunu”, “sanki oyandığını və özündə

min rəngini görcək utandığını" bildirir, Ş.Fazilə "barış" təklifi edir və "Bir çarə edək qalmaya bir rəng aramızda" deyir.

Ə.Mahirin Ş.Fazilə müxəmməsi burada bitir və Ş.Fazil həmin müxəmməsi onun kitabından götürərək öz təzkirəsində dərc etməklə müəllifə öz təşəkkürünü belə bildirir: "Bu gözəl şe`rə görə mən Hacı Ələmdar Mahirə təşəkkür edirəm. Təbii ki, onun bu müxəmməsinə mən də müxəmməslə cavab vermişəm. Klassik şairlərimiz arasında da belı müşairələr olmuşdur və onların etirafları bir-birləri tərəfindən səmimiyyətlə qarşılanmışdır. Bundan yaxşı nə ola bilər?

Şair Ələmdar Mahirin "Müxəmməs"i, əlbəttə, şe`r və şairlik baxımından güclüdür. Oxucuya müsbət təsir bağışlayır. İndi görək Şahin Fazil ona nə cavab verir:

*"Eşq aləminin mən kimi ey sərvəri Mahir,*
*Qoyduq qınına çəkdiyimiz xəncəri, Mahir,*
*Aldıq ələ şövq ilə qələm-dəftəri, Mahir,*
*Söz cənginin ey mən kimi cəngavəri Mahir,*
*Çox yaxşı ki, bitmiş deyəsən cəng aramızda".*

Şair Şahin şair Mahirə cəng yox, barış, məclis üzvləri arasında qarşılıqlı olaraq müharibə yox, səadət və məhəbbət təklif edir:

*"Ən ümdə kəlam oldu hər aqildə– məhəbbət,*
*Ya Rəb, ola hər hücrədə, mənzildə məhəbbət,*
*Dəryadə məhəbbət ola, sahildə– məhəbbət,*
*Qəlb içrə səadət ola, həm dildə– məhəbbət,*
*Məclisdəkilər olmaya diltəng aramızda".*

Qarşılıqlı ünsiyyət və əlbirlik–budur Ş.Fazilin kredosu!

*"Zərgərliyimiz var isə misgər bizə neylər?*
*Olsaq biz əgər tunc kimi, xəncər bizə neylər?*
*Üzmək biliriksə daha Tərtər bizə neylər?*
*Şeytan nə edər bizlərə, kafər bizə neylər*
*Əlbirliyimiz olsa həmahəng aramızda".*

Müxəmməsin 5-ci bəndi hər iki tərəf arasında amal gülünün çiçəklənməsi, qəlb içrə arzu və diləklərin cücərib boy atması, söz gülşəni-

nin ətirlə dolması, şe`r bağının solmaması və nəhayət həmin bağda nərgiz yerinə turşəngin bitməməsi tövsiyyəsi ilə qələmə alınmışdır:

*“Amal gülümüz qoy yenə əvvəlki tək açsın,*
*Qəlb içrə neçə arzu cücərsin, dilək açsın,*
*Söz gülşənimiz ətr ilə dolsun ürək açsın,*
*Qoy solmaya şe`rin bağı, ya Rəb, çiçək açsın,*
*Nərgiz yerinə bitməyə turşəng aramızda”.*

Şair Şahin Fazil kin saxlamağın əleyhinədir, səmimanəlik tərəfdarıdır, “cəncal” yox “sülh” arzulayır, hal əhlinin qeylü qaldan uzaq olmasını təmənna edir:

*“Kin saxlamaq, əlbəttə, bu minval yaraşmaz,*
*Hər sözdə səmimanə olaq, xal yaraşmaz,*
*Sülh arzulayan kəslərə cəncal yaraşmaz,*
*Hal əhlinə, zənnimcə mənim, qal yaraşmaz,*
*Hal əhli daha olmaya qoy dəng aramızda”.*

Hər iki şairin müxəmməsinin son bəndləri rəng (özü də qara yox, ağ rəng) xüsusundadır. Əgər Ə.Mahir “Bir çarə edək qalmaya bir rəng aramızda” deyirsə, Ş.Fazil də rəngsizlik, yəni şəffaf dostluq tərəfdarıdır:

*“Xoşdur ki, kənar eyləmişik cəngi, a Şahin,*
*Mahir dəyişibdir daha ahəngi, a Şahin,*
*Şur ilə çalaq sülh udunu, çəngi, a Şahin,*
*İnkar edirəm mən də qara rəngi, a Şahin,*
*Ağ rəng olacaq olsa əgər rəng aramızda”.*

Beləliklə, vurğulamaq istərdim ki, iki müxəmməs iki şairi biri-birinə xeyli yaxınlaşdırdı. Hazırda həmin müxəməslərin qələmə alınmasından 11 il ötmüşdür. Təəssüf ki, Ə.Mahir dünyasını dəyişmişsə də onun müxəmməsi yaşamaqdadır. Mən Ələmdar Mahirə rəhmət diləyir, Şahin Fazilə isə möhkəm can sağlığı, elmi və poetik uğurlar arzulayıram.

***(29 noyabr, 2020)***

**GÜLƏMAİL**
*AzərbaycanYazıçılar Birliyinin üzvü,*
*Şair-publisist*

## ŞAHİN FAZİLİN "TƏZKİREYİ-ŞAHİN" KİTABI HAQQINDA QEYDLƏRİM

Şahin Fazilin **"Təzkireyi-Şahin"** kitabını bir də oxudum. Özümün də üzv olduğum 140 yaşlı "Məcməüş-şüəra" adlı məşhur bir məclisin təzkirəsi.

**Təzkirə** Yaxın Şərqdə, eləcə də Azərbaycanda geniş yayılmış elmi-ədəbi əsər deməkdir. Təzkirə, çox təssüf ki, XIX əsrdən sonra unudulmağa başladı. Amma bu unutqanlığı Ş.Fazil unutdurmağa cəhd etdi və XX əsrin təzkirə kitabını yaratdı.

Təzkirələr əsasən ədəbiyyatçı və tarixçi alimlər tərəfindən yazılırdı. Şahin müəllim də həm ədəbiyyatçıdır, həm də tarixçi. "Təzkireyi-Şahin"dən əvvəl yazılmış təzkirələrdə müxtəllif şair və yazıçıların həyat və yaradıcılıqlarından nümunələr veririlirdi. Dövlətşah Səmərqəndi, Əlişir Nəvai, Əhdi Bağdadi, Sam Mirzə Səfəvi, Sadiq bəy Əfşar, Lütfəli bəy Azər, Seyid Əzim Şirvani, Mir Möhsün Nəvvab, Hüseyn Əfəndi Qayıbov tərəfindən qələmə alınmış təzkirələr haqqında bu günədək bəhs edilir. Nəhayət XX əsrdə də yeni bir təzkirə yazıldı və təzkirəsizlik qıtlığına son qoyuldu. Güman edirəm ki, gələcəkdə də yeni təzkirələr yazılacaq və oxucu nəzərinə çatdırılacaqdır. Qeyd etməliyəm ki, təzkirə yazmaq olduqca çətindir və müəllifdən geniş mütailə tələb edir.

QİT'Ə

*"Təzkirə" bəhrinə baş vurmağa tab lazımdır,*
*Nə böyük işdi bu, yarəb, bu nə qüvvət, tabdır?*

*Birini Seyyid Əzim yazdı ki, min rəhmət ola,*
*Birinin sahibi Mir Möhsün ağa Nəvvabdır.*
*Biri də Mirzə Hüseyn idi "Qayıb" nəslindən!..*
*Bir burulğandı bu təzkirə işi girdabdır.*

*Başqa təzkirə yazan görməyirəm dövrəmdə,*
*Bir səda gəldi mənə: Onlara Şahin babdır!*

Bəli, Şahin Fazil bu ağır janrın yükünü öz çiyninə götürdü və 791 səhifədən ibarət bir təzkirə kitabı yaratdı.

Kitabın "Dibaçə" ("Ön söz") hissəsində oxuyuruq. "Şahin Fazil yaşının və işinin çoxluğu, həmçinin əzəlki taqətinin yoxluğu üzündən neçə ay (bəlkə də il) böyük əziyyətə qail olub "Təzkirə" yazdı, yox əgər yazmasaydı, Nəvvabın təzkirəsindən 113 il sonra yazılan bu əsər var olmazdı və bu "Təzkirə" olmasaydı vəfat edən (Allah onlara rəhmət eləsin) və hal-hazırda sağ olan (Allah canlarını sağ eləsin) "Məcməüş-şüəra" şairləri barədə, bəlkə də, heç nə yazılmazdı."

Müəllif rəhbərlik etdiyi "Məcməüş-şüəra" ədəbi məclisinə tarixi il saydığım 1880-ci ildən başlamış və 2000-ci ilin əvvəlinədək üzv olan yazarlar haqqında kitab yazası oldu və dedi: "Məcməüş-şüəra" şairləri arasında, təbii ki, həm güclü, həm zəif şairlər vardır və kimin güclü, kimin zəif olması yazılardan aşikardır. Habelə bu məşhur məclisə elə "şairciyəzlər" də üzv olmuşlar ki, onlarda şe'r və şairlik barədə təsəvvür yarana bilmir ki, bilmir. Mən heç bir ayrı-seçkiliyə yol vermədən və bu ayrı seçkiliyə əsas görmədən bütün məclis üzvləri barədə (iclaslarımıza davamiyyətlərindən asılı olmayaraq) söz demişəm, təfərrüata varmadan onların güclü və zəif cəhətlərini öz təzkirəmdə nümayiş etdirmək istəmişəm...

Azərbaycanlılar, ümümiyyətlə, nəğmə oxumağı, rəqs etməyi və... şe'r yazmağı xoşlayırlar. Və xalqımıza "şair xalq" deyənlərin sözlərində həqiqət var. Kaş şair xalq olmayaydı mənim xalqım! Zəif şairlər kaş ki, əllərinə qələm əvəzinə qılınc götürəydilər, düşmən üzərinə şığıyaydılar, vətən torpaqlarını layiqincə qoruyaydılar..."

Təzkirənin **"Ədəbi məclisin tarixi seyri"** adlı hissəsində bir neçə tarixi ədəbi məclislərimiz və onların üzvləri haqqında yığcam məlumatveririlir ki, həmin məclislər bunlardır: "Divani-hikmət", "Gülüstan", "Əncümənüş-şüəra", "Fövcül-füsəha", "Beytüs-Səfa", "Məclisi-üns", "Məclisi-fəramüşan" və... "Məcməüş- şüəra". Elə bir "Məcməüş-şüəra" ki, onun üzvləri içərsində bu məqalə müəllifi də vardır. Təzkirəçinin mənim barəmdə yazdığı məqalədən sətirlər:

"Onun "Güldüm göynəyə-göynəyə" adlı ilk kitabının annotasiyasına nəzər salıram: "Məcməüş-şüəra", "Vahid", "Şam" və "Məhsəti" ədəbi məclislərinin üzvü Güləmailin ilk şe'rlərinin toplandığı "Güldüm göynəyə-göynəyə" kitabı bu şairin poeziya səmasına pərvaz edən ilk qaranquşudur. Kövrək hiss və duyğularını poeziya sözü ilə söyləməyə

çalışan müəllif "Respublika Qadınlar Cəmiyyəti"nin fəal üzvlərindəndir və bu günlərdə "Məhsəti", "İti Qələm Respublika Ədəbi Birliyi"nin "İti Qələm" fəxri diplomu ilə təltif olunmuşdur.

Bəli, öz kövrək hiss və duyğularını poeziya sözü ilə söyləməyə çalışan Güləmail. Çalışmaq başqa, nail olmaq bir başqa. Güləmail nail olan şairlərdəndir. Adı da şe'rləri kimi poetikdir Güləmailin. Bəlkə də elə buna görə şe'rlərində öz adını çox tez-tez işlədir Güləmail:

*"Dərya döyəcləyən sanki sahiləm,*
*Sevdaya söz qoşan Güləmailəm,*
*Bülbülə mailəm, gülə mailəm,*
*Özün köməyim ol, Allahım, özün".*

Məqalənin sondakı absazında şair fikirinə davam edir: "Yaxud onun başqa bir şe'irindəki "Güləmail" adının yeni poetik işlənmə tərzinə göz yetirək:

*"Qoy dünya meylsiz bilə maili,*
*Gözü görə-görə ölə maili...*
*Güldürə bilmədi Güləmaili,*
*Qaçmaq istəyirəm mən bu dünyadan".*

Bu şairin şeirlərindəki bədbinlik həddən çoxdur. Elə götürək onun "dünyadan qaçmaq istəyini". Niyə? Nə üçün? İmkan olduqca dünyada qalıb yazmaq, yazmaq lazımdır. Qələm varsa, ilham varsa, şe'r varsa dünyaya bağlanmaq lazımdır—qələmin xatirinə, ilhamın xatirinə, şeirin xatirinə. Dünyadan gileylənmə, Güləmail.

Mən "Təzkireyi-Şahin" kitabı haqqında çox yaza bilərəm. Xoşbəxtlikdən bu kitab 2006-cı ildə çap olunmuş, yayılmış, oxunmuşdur və... müəllif bu kitabının təkminləşdirilmiş yeni nəşrinin intizarındadır. Hələ ki, Şahin Fazilin qələmi yazmaqdan qalmır. Yeni nəşri görmək arzusundayıq.

Məqaləmim sonunda "Təzkireyi-Şahin" kitabındakı "Təzkireyi-Şahin" şeirini bir daha möhtərəm oxucuların nəzərinə çatdırmaq istədim. Oxuyun:

## "TƏZKİREYİ-ŞAHİN"

*Sağlığında kimə qiymət verilibdir,Şahin?*
*Verilər qiymətimiz bir neçə ildən sonra.*
***Divan**, 1996,səh.25*

*"Təzkireyi-Şahin"!*
*Təzkirə bağında*
*təzkirə gülündən bir əsər qalmamış ikən*
*təzkirəçilik şövqünə düşdüm,*
*günlərlə xəyalən*
*Seyyid ilə, Nəvvabla görüşdüm,*
*yazdım bir əsər mən,*
*yazdım onu şövq ilə, ürəkdən.*
*Yazdım və dedim Seyyidə rəhmət,*
*təzkirəçi idi;*
*Nəvvabı edib yad, elədim əzminə heyrət,*
*təzkirəçi idi.*
*Heyrət elədim ki, nə böyük xidmət ediblər,*
*Şairlərə xidmət eləməklə, Yaradandan*
*Cənnətdə məqam istəməyə fürsət ediblər.*
*Yarəb, o iki şəxsə inayət ki, rəvadır*
*Əhsən Sənə, etdin onu, onlar üləmadır,*
*onlar ürəfadır,*
*Hər dürlü inayət o iki şəxsə rəvadır.*
*Onlar nə gözəl xidmətə iqdam eləyiblər!*
*Ə'nam eləyiblər*
*əlbət gələcək nəslə kitablar,*
*mə'lum ki, kitab çox,*
*minlərlə kitab var,*
*minlərlə kitab var isə, təzkirəsə yoxdu,*
*əlbəttə, bu işdə o iki bilgili şəxsin*
*xidmətləri çoxdu,*
*zəhmətləri çoxdu...*

*Yarəb, neçə illər ötüşübdür o zamandan,*
*Gəlmirdi soraq bir təzə təzkirə yazandan.*

*Mən cəhd elədim öylə işə tazə əsrdə,*
*Allah kömək oldu.*
*Mən cəhd elədim ki, təzə təzkirə kitabı*
*Inşa ola bir də,*
*Allah kömək oldu.*
*Amma nə göründü?*
*Şəm′ yandı və pərvanə göründü.*
*Təzkirəçilik səmtinə doğru qədəm atdım,*
*Şəm tək yanıban bir təzə təzkirə yaratdım.*
*Eykaş, əlim yazmaya idi onu! Əfsus!*
*Qaldım nə qədər töhmətə mə′ruz.*
*Haqq bir işə qarşı*
*Gördüm nə qədər haqsız olan var,*
*Allah özü bilsin.*
*Var razı olanlar ilə narazı olanlar,*
*Allah özü bilsin.*
*Ey Haqq, əgər razı olarsansa işimdən*
*Billəm işim haqdır,*
*Gər öylə olarsa*
*Narazılığımdan bir əsər qalmayacaqdır.*

*"Təzkireyi-Şahin"!*
*Təzkirə bağında*
*təzkirə gülündən bir əsər qalmamış ikən*
*Təzkirəçilik sövqünə düşdüm,*
*Yazdım bir əsər mən,*
*Yazdım onu şövq ilə, ürəkdən...*

**Göyərçin KƏRİMİ**
*Azərbaycan Yazarlar Birliyinin üzvü,*
*Şair-yazıçı-publisist*

## ADƏMDƏN ATOM ƏSRİNƏ, YAXUD ŞAHİN FAZİL POEZİYASI...

*Deyirlər yoxdur aləmdə gözəl günlər gözəllərsiz,*
*Onu təsdiq edərdim, gərçi inkarım görünsəydi...*
***Şahin Fazil***

“Təbiətdə iki cür qocalma var: bəzilərini köhnəldirlər, bəziləri köhnəlir. Birincilərin təkrar istehsalı mümkündür, elə ikincilərin də... Əşyanın yerini əşya, heyvanın yerini heyvan, bitkinin yerini bitki, insanın yerini insan tutur. Lakin şairin yerini heç kim tuta bilmir. Yaradıcılığın digər növünü təmsil edən ayrı-ayrı insanlar misalı hər şair də dünyaya bir dəfə təşrif gətirir. O mənada ki, nə qədər şair, yazıçı var, o qədər də üslub var. Necə ki, ümummilli liderimiz – müdriklik mücəssəməsi H. Əliyev demişdir: “Ziyalılıq kütləvi ola bilməz. Alim, şair, bəstəkar, rəssam, yazıçı, artist – bunlar fitri istedada malik olan nadir insanlardır”.

Mükəmməl kitab yazmaq, həmişəyaşar mövzular seçmək, nümunəvi davranış tərzi, dəyərli tərcümələr müəllifi kimi ad qazanmaq haqqında söhbət açacağım alim-şairin həmişə sabahın sorağında olmaq ənənəsindəndir. O sabah ki, onu ancaq təxəyyülümüzün hüdudları sayəsində yaşaya bilirik.

Şeir nədir? Şeir, subyektiv fikrimizə görə, ödənilməyən hisslərin nəzm şəklində özünü ifadəsinə deyilir; əgər şeir məcburən, yəni şair olmaq niyyətilə yazılmırsa, şairlik taledir. Bu mənada Şahin Fazil xoşbəxt taleli şairdir. O, yazdıqları qədər səmimi, tövsiyələri kimi xeyirxahdır; sadə və aydın yazır. Şairin poetik obrazları gah bu əsrdən xəbər verirlər, gah o biri əsrdən, gah dünyanın bu başından soraq gətirirlər, gah da o biri başından. Yorulan, dincələn şair deyil Şahin Fazil. Gününün qrafiki bir dəfə yazılıb, həm də həmişəlik:

*Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur.*

Eşq olsun! Vaxtın ən qiymətli olduğunu dərk etməkdən böyük məsuliyyət varmı?! İnsan o zaman fərdilik pərdəsini qaldırmağa müvəffəq olur ki, onun üçün zamandan qiymətli heç nə qalmır.

Zaman keçmişi, gələcəyi yox, məhz indini təqib etdiyi üçün canlıdır. Şahin Fazil də nə qədər canında can var, bu canlı zamana ötüb keçmək fürsəti vermir, ya onunla qoşa addımlayır, ya da bir addım irəlidədir.

Şahin Fərzəliyev ziyalıdır; nə zaman nə yazmağın yerini, necə yazmağın yolunu yaxşı bilir. Ziyalı ancaq özünə məlum olan həqiqətlə oxucunun inamına şübhə salan, yaxud kütlənin narazılığına səbəb olan şəxs deyil, ziyalı o kəsdir ki, ancaq özünə məlum olan həqiqəti əks fikirdə olanlara etiraz etmək fürsəti verməmək cəhdilə yazır. Söhbətimizin bu məqamında şairin özünə müraciət edək:

*Bilirəm qiymətini xəlqi sözün, sərrafəm,*
*Xəlqi sözlərlə yazan şe'rini bədnam olmaz,*

Ritm və qafiyə özlüyündə poeziyanın əsas cəhətlərindən sayılır. Oxucunun, yaxud dinləyicinin diqqətini ilk özünə cəlb eləyən, daha doğrusu, oxunan şeri, söylənilən mənzum rəvayəti dinləməyə sövq edən də məhz onlardır. Bu mənada qəzəl yazmaq texniki cəhətdən çox zəhmət tələb edir. Ümumiyyətlə, poeziyanın əhatə dairəsi istifadə etdiyi materialın ümumiliyi baxımından çox genişdir, amma qəzəldə bu imkanlar bir qədər məhdudlaşır. Ötürülməsi nəzərdə tutulan ideyanın təşkil etdiyi sözləri, cümlələri həm ritmə, qafiyəyə salmaq, həm vəznin tələb etdiyi ahəngə uyğunlaşdırmaq, əlbəttə, mürəkkəb işdir. Əruz vəznində yazmağın çətinliklərinə baxmayaraq o, Şahin müəllimin qələmində gah təsvirə, gah hekayətə, gah da dramatik hadisələrin poetik ifadəsinə istiqamət alır. Beləliklə, ayrı-ayrı insani meyl və əməllərin tək qəzəldə yox, müxtəlif janrlarda mümkün təsvirini yaratmaqla şair poeziyanın bilavasitə uzunömürlülüyünə xidmət etməyə çalışır.

Şahin Fazilin üstün yaradıcılığı onunla izah olunur ki, müəllif istənilən hadisəni həm tarixçilər kimi praqmatik, həm də sənətkar gözü ilə poetik olaraq, yəni görünənlərdə yox, ideyada, qarşılıqlı münasibətlərdə yox, mahiyyətdə qavrayır. O, sadəcə, həqiqəti göstərir, onu sübut etməyə ehtiyac hiss etmir. Aşağıdakı misralara diqqət edək:

*Mən həm*
*Yerdə ölmək istəməzdim,*
*şahinəm.*

Misralardan da göründüyü kimi tarixçi-alim bilir ki, özlüyündə var olanın, yəni ideyanın aşkara çıxarılması tarixdən çox poeziyada baş verir. Sonuncu sətirdəki şahin sözünün hansı quş adı ilə əvəz olunmasından asılı olmayaraq ideya dəyişməz olaraq qalacaq. Başqa sözlə, "şahinəm" sözü simvolik mənadadır, bir növ "yerdə ölmək istəməzdim" cümləsinin aydınlaşması üçün vasitə rolunu oynayır. Əlbəttə, vücud göyə daşına bilməz. Burada yerdə ölməsi istənilməyən, əslində, cism deyil, ruhdur; şair cisminin yox, ruhunun öldürülməsindən narahatdır.

Şahin Fazil tarix üzrə elmlər doktoru olsa da, yanaşı olaraq ədəbi şəxsiyyətlərə, ədəbi metod və janrlara ədəbiyyat tarixçisi kimi nəzər salır. O, ayrı-ayrı şairlərin yaradıcılıq prosesini elmi cəhətdən əsaslandırılmış metodla izləyib öz yenilikçi dövrü ilə onların mühiti arasında müqayisəli paralellər aparır, ədəbi aləmin hansı yaradıcılıq prinsiplərilə inkişaf etdiyinin xronoloji ardıcıllığını müəyyən edir ki, bu da ona öz ədəbi istiqamətini təyin etməkdə köməkçi rolunu oynayır.

Şairin "Dünyanın dağılması, yaxud yaxşı oldu dağıldı" poeması oxucuya hələ heç kimin qələmə almadığı bir üslubda təqdim olunub. Əsər fantaziya ilə gerçəkliyin, poeziya ilə nəsrin, keçmişlə gələcəyin sintezindən yaranıb. Obrazlar Yer kürəsi "dağılandan sonra" onun cənnət və cəhənnəmdəki sabiq sakinləridir və bütün hadisələri də onlar nəql edirlər. Müəllif dünyanın dağılma səbəbini insanların cahilliyində axtarır:

*Yeri dağıtmayıbdır*
*Zəlzələ, ya vəlvələ.*
*Olmasaydı adamlar*
*Yaşayacaqdı hələ...*
*Yaxşı oldu dağıldı.*

Şahin Fazil adı çəkilən poemada kimə müraciət edir-etsin, hamının – Allahin da, nəbinin də, şair və yazıçıların, o cümlədən, filosfların da Yerin dağılması məsələsində ortaq məxrəcə gəldikləri yekdil fikir belə olur: "Yaxşı oldu dağıldı!" Lakin iki obrazın – Allahın və onun elçisinin "Yaxşı oldu dağıldı!" deməsi müəllifi yetərincə təəccübləndirir, daha doğrusu, təccüblən-

dirmir, şair gerçək dünyanın puç olmasını oxucuya öz üsulu ilə anlatmağa səy göstərir. Poemanı hərfi mənada bir sıra böyük mütəfəkkirlər haqqında annotasiya da adlandırmaq olar. Əsərin sonunda səsləndirilən ədəbi-fəlsəfi suallar isə Yer kürəsində hələlik cavabsız olaraq qalmaqdadır:

*Heyrətdəydim onda mən:*
*Varlıq vardı, yox varmı,*
*Yoxluq vardı, var varmı?*
*Yerdən yaxşı yer varmı,*
*Ey xudavəndi-aləm?*
*Belə demək olarmı,*
*Yaxşı oldu dağıldı?*

Bir çox şairlərin şeirlərinə təzminlər yazan ustad qəzəlxan Əfzələddin Xaqaninin də poeziyasını yadından çıxarmayıb. Hər iki müəllifin beytini yanaşı oxuyanda bir-birindən fərqləndirmək mümkün olmur, necə ki, eyni həcmli, eyni çəkili, eyni rəngli iki dürrü bir-birindən ayırmaq müşkül məsələdir.

Ə.Xaqani:

*"Xaqani sənə yazmayacaqdır daha məktub,*
*Çünki sənə səndən o, şikayət necə yazsın?!"*

Ş.Fazil:

*Həsrət çəkirəm Təbrizə, Urmiyyəyə həsrət,*
*Əsdirsə əgər əlləri həsrət, necə yazsın?!*

Şahin Fazil əsərlərindən birinə «Ölüm poeması, yaxud qardaş, ölüm nəmənədi?» adını verib. Adından da göründüyü kimi poema varlığın gerçək dünyadan yox olma prosesini əhatə edir, yəni haqqında bəhs olunmaqla ölüm şərəfləndirilir. Bu əsərdə də şeir və nəsr bir-birini qarşılıqlı olaraq tamamlayır. Deyilənlərə əyani misal kimi əsərin özündən sitat gətirmək daha münasib olar.

Nəsr: "... Qardaş, heç nəyi havayı vermirlər, illah ki, bu zamanada. Allah baba ölümü də havayı paylayır. Ölüm... Özü də havayı. Vallah mən havayı heç nə istəmirəm, illah ki, ölümü.

Şeir:

*Allah babadan savayı,*
*Var hamının ölüm payı.*
*O pay paylanır havayı,*
*Qardaş ölüm nəmənədi?*

Əslində, bu poema da cavabsız sualların prozaik və poetik ardıcıllığından ibarətdir. Həmin suallar ki, bir zamanlar alman şairi Matias Klavdi ölümü ilə barışmağının labüd səbəbi kimi onların cavabsızlığından şikayət edirdi. Klavdinin ölümündən yüz doxsan bir il sonra Şahin Fazil də öz nikbin poeziyasında həmin sualların cavabsızlığından narahatlıq ifadə edir, hətta gileylənir də:

*Deməmişdi «gəlim», gəldi,*
*Bir anda min ölüm gəldi,*
*Xocalıya zülüm gəldi,*
*Qardaş, ölüm nəmənədi?*

Göründüyü kimi, qələminin ucundan başlamış qəlbinin sərhədlərinə, dərrakəsinin hüdudlarına qədər vətənpərvər olan alim Şahin yaradıcılığının səciyyəvi obrazına çevrilmiş Xocalı qətliamını ölümün sinonimi kimi tanıyır və tanıdır.

O da bir çox mütəfəkkirlər misalı dünyanın zaman başlanğıcını öyrənməyə can atır, «Sən sondasan, ya əvvəldə? Niyə Yerin aqibəti, Yerə deyil, Göyə bağlı? Suallarım niyə açıq, Cavablarım niyə bağlı?» mənzum sualları ilə sanki həyata məxsus olan «olum-ölüm»ün baş vermə səbəbinin niyə həyatdan uzaqda, Yerdən kənarda gizlənməsini dərk etməyə çalışır. “Yer dövr edir, Yer dövrədir, yer çevrədir, Çevrənin əvvəli harda? Dövrənin əvvəli harda?” misraları ilə bir növ oxucunu düşünməyə vadar edir ki, onların diqqətini hadisələrin gedişatından yayındırıb mahiyyətinə yönəldə bilsin. Axı mahiyyəti dərk etməyə çalışan insan gec-tez özünü də tanımalıdır.

İnsan harada yaşayır-yaşasın, onun taleyi beynəlmiləl olmalı, özünü insan kimi dərk eləyən hər kəsin diqqət mövzusuna çevrilməlidir. Bu mənada Şahin Fazil beynəlmiləl şairdir, onun sevgi prototipi, sadəcə, insandır. Şairi Qarabağ qarışıq işğal olunan məskənlərimizin taleyi

necə narahat edirsə, eləcə də, Fələstində tökülən günahsız qanlar ürəyini yandırır, hətta o qədər yandırır ki, susuzluqdan əzab çəkən yağışsız ölkələrə yağmur arzulayır:

*Qələm, ilhamımı ləngitmə, et çarə, tələs, dindir:*
*– O hansı ölkədir ölkəm təkin parə? Tələs, dindir.*
*– Fələstindir!*

Yaxud:

*Əlbət, yağmasa, olmaz,*
*Yağa, hər yana düşə,*
*Kaş bu yağışdan bir az*
*Ərəbistana düşə...*

Yazarın, ümumiyyətlə, insanın kimliyi səviyyəsinin uyğun gəldiyi cəhətlər, düşüncəsinin üstünlük verdiyi əməllər baxımından təyin edilir: çılğınlıq o dərəcəyə çatmalıdır ki, müvazinəti pozmasın, mühakimə öz qədərini aşmamalıdır ki, çılğınlıq susmasın.

Şair o zaman böyük olur ki, şeirlərində ilahi sevgi ilə bəşəri duyğuların harmoniyasını yaradır. Bu nöqteyi-nəzərdən yanaşanda Şahin Fazil yaradıcılığının Yerlə Göyün vəhdət zolağı boyu uzanan həmişəyaşıl üfüqlərini söz sənətinin məhvərində görürük. Aşağıdakı poetik lövhəyə nəzər salaq:

*Məcnun – səhra dəlisi,*
*Fərhad – dağ dəlisi,*
*Mən – söz!*

Şeir yazmaq təkcə başqalarının görə bilmədiklərini görmək imkanından ibarət deyil, həm də başqalarının danışa bilməyəcəkləri dildə danışmaqdır. Şeirin səmaları genişdir, o, uçduqca uça bilir. Poeziyanın mövzu rəngarəngliyi dünyada baş verən hadisələrin sayı qədər sonsuzdur, lakin əsl şair ayrı-ayrı hadisələri qələmə almaqdansa, onların ümumləşdirilmiş obrazını yaratmaqla aid olduqları anlayışların bədii təsvirini yaradır.

Böyük filosoflar insanları zaman-zaman siniflərə ayırmış, onların

üzərində dahiliyinə, alimliyinə, adiliyinə görə bölgülər aparmışlar. Lakin insanın maddi aləmə qarşı hiss etdiyi ehtiyacları nə qədər azalsa da, sağ qalması üçün vacib olan amillərin hökmündən xilas olması mümkün deyil. Deməli beyninin yaradıcı potensialının necə olmasına baxmayaraq ac qalmasın deyə hər gün həyat ilə mücadiləyə qalxan insan vaxtının olmaması səbəbindən alimliyə, dahiliyə imza ata bilməyəcək. Beləsi, ola bilsin, heç insanlığını da qoruyub saxlaya bilməyəcək. Mənzərə hansı şəkildə olur-olsun, insan üçün başlıca şərt insanilik məsələsidir, təəssüf ki, bölgülər ayrı-ayrı adamlara görə yox, cəmiyyətin təməl prinsiplərinə əsaslandığına görə bu məziyyəti dəstəkləmir.

Öz işini cəmiyyətin təməl prinsipləri üzərində quran Şahin Fərzəliyev, görün, bölgü daxilində bölgüsüz insanların ümumiləşdirilmiş obrazını necə ustalıqla təsvir edir:

*Hambal yük gözləyir məhzun, müntəzir...*
*Hamı yükdən qaçır, hambal yük gəzir:*
*– Gəl, ey yük!*

Fədakarlıq fitrəti insanın təbiətində baş qaldırmalı, qanında olmalıdır. Müharibə də belədir: məhz fədakar insanlar ölümün üzərinə könüllü gedirlər. Fədakarlıq özünü idarə edə bilməmək cəhətilə tərs mütənasiblik təşkil edir və insanın bütün kateqoriyasına aiddir. Vətən sevgisi yeganə hisdir ki, insan şəraiti idarə etmədiyi yox, daha düzgün idarə etdiyi üçün odun içərisinə, ölümün pəncəsinə atılır. Şahin Fazil də mövcud şəraiti düzgün qiymətləndirdiyinə görə işğal olunmuş torpaqlarımız uğrunda döyüşməyə hazırdır. Şair bu mövzuda kitab-kitab şeir yazıb. Onun qəhrəmanlıq poeziyasının yaranmasına səbəb Qarabağın... Şuşanın azad olunması eşqilə qərəmanlığa susamış ürəyidir. Yuxarıda söylədiklərimizin yekunu olaraq müəllifin dahi musiqiçi

Ü. Hacıbəyliyə xitabən qələmə aldığı döyüşkən misralara diqqət yetirək:

*Çarpışmağa hazır bizim əskər!*
*Azad oluna bilməsə, yaddan Qarabağ gər,*
*Ölmüş o şəhidlər təzədən bir də ölərlər, Üzeyir bəy,*
*Qoy "Cəngi" çalınsın!*

Yaxud:

*Unuda bilmərik bu dərdi,*
*Kim əkdi, amma kim becərdi...*
*Üstündə güllələr cücərdi,*
*Xocalı.*

Hamı qələmlə yazır: şagird də, tələbə də, müəllim də, həkim də, alim də, dahi də və s. Lakin qələm sözünün bir sinonimi var: şair. Nədənsə, şair deyəndə adamın yadına qələm, qələm deyəndə şair düşür. Bəlkə bu o səbəbdəndir ki, dünyanın ilk söz adamları şairlər olublar. Əksər filosoflar da yaradıcılığa şeirlə başlayıblar. Şeir danışmağı bacaran hər kəsin dilidir: sərbəsti, hecası, əruzu var, vəzni, qafiyəsi, təfiləsi, bəhri var... Şeirin elə bir növü, elə bir janrı yoxdur ki, Şahin Fazil qələmində sınaqdan keçməsin. Üstəlik özü ədəbiyyata o qədər yeni ölçülü şeir növləri gətirib ki...

Haqqında sevə-sevə danışdığım ustad şairin yaradıcılıq amplitudası o qədər böyük, tarixçi iddiası o qədər səmimi, şeir səması o qədər geniş, poeziyası o qədər rəngarəngdir ki, haradan başlayıb harada qurtarmaq məsələsində lap çaş-baş qalırıq.

Təbiət dəyişkənliyi sevir, amma bitki, heyvan, insan ideyası dəyişməz olaraq qalır. Təbiətin əbədi nəzəriyyəsi əbədi varlıq yarada bilmirsə, əbədi olan nə üçündür? – Öz qısa ömrünü qarşılıq istəmədən min bir əzabla əbədi ideyalara xərcləmək idrakın dərk olunmazlıq göstəricisidir: dərk edən özü dərk olunmur. Suallar çoxdur; insan bilmir, gələcəyini keçmişin ağrısından xilas etsin, yoxsa indisini gələcəyin... Bu arada şeirlər – poetik ideyalar müəllifi Şahin Fazilə uzun ömür, can sağlığı, yeni yaradıcılıq diapazonu arzulayırıq.

Mövzunun davamı olaraq Şahin Fazil şeirinə istinadən yazılmiş eyniadlı şeiri də məqaləyə sonluq kimi əlavə edirik.

## DÜYMƏ

*Doğma qardaşının təhriki nəticəsində*
*on yaşlı əfqan qızı terror məqsədilə əynindəki*
*"barıt köynəyi" partlatmaq istəyərkən, düyməni*
*basmağa gücü çatmayıb və dərhal həbs olunub.*
*Qardaşı qaça bilmişdir.*

***Rəsmi məlumat***

**Şahin Fazil:**

*Köynəyində barıt var,*
*Basma düyməni, basma.*
*Düyməni basan kimi*
*Köynək səni partladar,*
*Basma düyməni, basma.*

-=*=-

*Partlayıcı düymə – sən,*
*Gözlərini döymə, sən,*
*Bu düymə oyununda*
*Bapbalaca düyməsən,*
*Basma düyməni, basma.*

-=*=-

*Düşünürsən ki, haqsan,*
*Cənnətə uçacaqsan...*
*Əl uzatma düyməyə,*
*Gücün çatmaz, uşaqsan,*
*Basma düyməni, basma.*

**Göyərçin:**

*Günəşin qorxudan sönüb işığı,*
*Ölüm gəzdirirsən, axı belində.*
*Şalın altındadır dəmir başlığı,*
*Barıt düymələyib kiçik əlində.*

-=*=-

*Donunun yaxası aralı qalıb,*
*Gözündən yayınmaz naməhrəmlərin.*

*Tərəddüd canına üşütmə salıb,*
*Cəhənnəm görürsən indi hər yeri.*

*-=*=-*

*Düymənin üstündə əllərin əsir,*
*Götür-qoy edirsən, bir az güc gələ.*
*Barmağın yalandan düyməni basır,*
*Axı sən düymədən kiçiksən hələ.*

*-=*=-*

*Gülün ətirlisi əl qanadandır,*
*Amma gül qoxusu var ləçəyində.*
*Qızılgül düyməsi deyil bu andır,*
*Yanğın, kül qoxusu var ləçəyində.*

*-=*=-*

*Bəzən qaşınmayan yerdən qan çıxar,*
*Bilməzsən qan kimin, fərman kimindi.*
*Düymə oyunları yadından çıxar,*
*Böyü, öz-özünə ana ol indi.*

*-=*=-*

*Sağ qalsan, bəxtini qarğayacaqsan,*
*Barmağın düyməyə həsrət qalacaq.*
*Soyuq zindanlarda qarıyacaqsan,*
*Ölməyə bir ömür vaxtın olacaq.*

*-=*=-*

*Düyməni basmasan, yuxuya getmə,*
*Yuxu şirin olmur ömrün sonunda.*
*Ölsən, ədalətdən şikayət etmə,*
*Sən bir yol ölürsən, ədalət gündə.*

**Fəxrəddin QUBALI**
*General-leytenant*

## TANIDIĞIM ŞAHİN

Zərrə qədər dəyişməyib. Keçirdiyi ömür-günün mürəkkəbliyi, qürbətin çətinliyi, çətinliyin əzab-əziyyəti, həyatı boyu təhlükə və təşvişlərin doğurduğu həyəcan, hicranların acısı, vüsalların şirinliyi və yox olma qorxusu, nə bilim nələrin, nələrin təsiri dəyişdirməyib onu. Elə əvvəlki kimidir: səmimi, təmkinli, təvəzökar. Sözü düşünmədən deməz, əgər haqlısa, dediyindən dönməz.

Onun Qubadakı ata evi mənim ata evimin yaxınlığındadır. Mən balacaydım, o, böyük. Mən Qubadaydım, o, Bakıda. Universitetdə oxuyurdu. Mənsə hələ uşaqdım. Beş yaşım vardı. Bir gün dedilər ki, Əfqanistana gedib. Orada işləyir. Orada gün ağlayır özünə. Əfqanıstanın harada olduğunu bilmirdim. Sonralar ali təhsilli coğrafiyaşünas oldum. Coğrafiyaşünas olandan sonra coğrafi Əfqanıstanı tanıdım. Əgər Şahini tanımayasdım Əfqanistanı bəlkə də tanımazdım. Nəyimə gərəkdi Əfqanıstan? Bu adda "fəqan"! sözü var, fəqandansa qan iyi gəlir.

İllər ötdü. Şahin getdi-gəldi, gəldi-getdi. 13 il. Onun həmin ölkəyə səfəri bitdi. Mən də qürbətdən qayıtdım, Şahin də. Mən Rostovdan, Dnepropetrovskdan, o, Əfqanıstandan. Tanış olduq. Yaxından tanıdım onu. Yaş fərqimizin 18 il olmasına baxmayaraq dostlaşdıq.

**Haşiyə: Məni tanıyanlar mənə "Canlı ensiklopediya" deyirlər. Qubanı və qubalıları ev-ev, küçə-kücə, dalan-dalan tanıyıram. Şahin "Quba tarixi"in yazan vaxtlarda tez-tez mənə müraciət edir, bu və ya digər qubalı haqqında məlumat toplayırdı...**

Aramızdakı münasibət və bir-birimizə ehtiramımız qarşılıqlıdır. Onun xahişi mənə əmr kimiydi. Qubanın tarixini bitirdikdən sonra kitabı əlyazma kimi ortada qalmışdı. Çapına kömək etdim. Maddi vəziyyətim pis deyildi, necə deyərlər "əlim gətirirdi". Əlyazmanı Ukraynaya göndərməsini təklif etdim. Göndərdi. Ortaya bir çətinlik çıxdı: çap olunacaq kitabların bizim respublikaya gətirilməsi. Ukraynanın müvafiq orqanları kitabın yazıldığı dili bilmədiklərindən onun sərhəddən çıxarılmasına maneçilik ola biləcəyini bildirdilər. Vətənə qayıtdım. Sağ olsun vətəndaşlarımız. Var olsun "Əbilov, Zeynalov və oğulları" nəşriyyarı. 500 nüsxədən

ibarət Quba tariximiz öz oxucularını tapdı ("Quba tarixi", 2001, 390 səh.)

Fazil oğlu Şahinin bu kitabı həmin vaxtlarda onun üçüncü monoqrafik əsəri idi. Xüsusi olaraq qeyd etməliyəm ki, kitab dərin sevgi hissi ilə yazılmışdı Fazilin oğlu tərəfindən. Kitabda verilən müəllifin portretinin altında bir beyt şeir də yazılmışdı:

*Nə böyük rütbə, nə zər sevmədə Şahin Fazil,*
*Qubanı Kəbə qədər sevmədə Şahin Fazil.*

Kəbə və Quba. Quba Şahinin də, mənim də Kəbəm idi. Cəsarətli bənzətmədir: Quba, Kəbə!..

Olduqca həssas adamdır mənim bu şair-alim dostum. Adətən şairlər dünyadan köçən insanlar haqqında mərsiyə, ağı yazarlar, məsələn, Nizaminin Xaqaniyə yazdığı mərsiyə. Şahin də bir mərsiyə-ağı yazdı. İnsan üçün yox, məktəb üçün. Təəccüblənməyin. Məktəbdən ötrü ağı. Şair "Quba tarixi"ndə yazır: "Yaxşı yadımdadır. Əfqanıstanda 4-cü işgüzar ezamiyyətimi başa vurub (1985-1988) vətənimə qayıtdıqdan sonra Qubaya gəldim. "Qız bənövşə"yə getdim, "Dəvədabanı"ya çıxdım, bağı, parkı seyr etdim, küçələri gəzdim, 10 il şagirdi olduğum "Məsmə müəllimənin məktəbini" isə görmədim. Məktəb yoxa çıxmışdı... Qeyb olmuşdu... Yerində paxlava dükanı tikilmişdi. Öyrəndim ki, mənim məktəbim—3 saylı Quba şəhər orta məktəbi, "Məsmə müəllimənin məktəbi" yanıb. Yanında dayanan qaz balonları yüklənmiş maşın ehtiyatsızlıq üzündən yanaraq böyük partlayışa səbəb olmuş, məktəbi külə döndərmişdi. Mən həmin hadisəni eşidib çox mütəssir oldum və bu şeiri yazdım:

3 SAYLI MƏKTƏB ÜÇÜN AĞI

*Bu Quba, bu küçə, bu da həmin tin,*
*Bu da mən, həyəcan çürüyüb canı.*
*Məktəb isə yoxdur, məktəbimizin,*
*Yerində tikilib şirni dükanı.*

*Bir bəla yan aldı məktəbə sarı...*
*Deyirlər yanında maşın dayandı.*
*Bir anda partladı qaz balonları,*
*Maşın da alışdı, məktəb də yandı.*

*Nə qapısı qalıb, nə löhvəsi,*
*Hasar yoxa çıxıb, çəpər qalmayıb.*
*Başqa məktəblərdən gəlir zəng səsi,*
*Mənim məktəbimdən əsər qalmayıb.*

*A mənim məktəbim, sən yanan zaman,*
*Biz də alışmışıq, biz də yanmışıq.*
*Sənin ağuşuna səmtini tutan,*
*Ləpirdə yanmışıq, izdə yanmışıq.*

*Tüstün bülənd olub ərşə dayandı,*
*O gün mən də yandım cızdağa qədər.*
*Ələziz də yandı, Yaqub da yandı,*
*Məsmə müəllimə onlardan betər.*

*Alışdım, qalmadı daş üsdə bir daş,*
*Kül etdin nə qədər kövrək hissimi.*
*A mənim məktəbim, nə olaydı kaş*
*Qalaydın xatirə məbədi kimi.*

*Istərəm yenə də qapını açım,*
*Səndə iztirab da, həzz də var idi.*
*"Anam doğdu..." deyə Nazilə bacım*
*Səkidən düz sinfə qışqırar idi.*

*Oğlanlar eşidib gülüşərdilər,*
*Qızlar qızarardı, baxardı mənə.*
*Tərs kimi növbəti doğuş xəbəri,*
*Hər il dərs zamanı gələrdi yenə.*

*Ah, bu nə gethaget cahan içində?*
*Zəngsə cingildədi sözü var kimi.*
*Məktəb də ölərmiş bir an içində,*
*Yaxşı ki, görmədi o müdhiş günü.*

*Əlindən nə qədər sənin dad olsun?*
*Ölüm, məktəbin də aldın üstünü.*
*Nəcəf müəllimin ruhu şad olsun,*
*Yaxşı ki, görmədi o müdhiş günü.*

*Bu Quba, o küçə, bu da həmin tin,*
*Bu da mən, həyəcan bürüyüb canı.*
*Məktəb isə yoxdur, məktəbimizin,*
*Yerində tikilib şirni dükanı.*

Şahin sözünə davam edir: "Bəli, mənim Qubamın 3 saylı məktəbi yandısa da, heç də Quba məktəblilərinin qəlblərində alovlanan təhsil alovu sönmədi".

Müşahidə! Şahində müşahidə qabliyyəti güclüdür. Müşahidəçidir Şahin. Kitabında həyat və fəaliyyətlərini yığcam və obyektiv işıqlandırıb. Məsələn, Şahin mənim haqqımda çoxlarının bilmədikləri avtobioqrafık məlumatı az sözlə, lakin dolğun vermişdir:

**"5 may 1958-ci ildə Quba şəhərində doğulmuş, 2 saylı şəhər orta məktəbini bitirib, Azərbaycan Dövlət Universitetinin geoloji coğrafiya fakültəsinə daxil olmuşdur. 1980-ci ildə ali təhsilini başa vuran Fəxrəddin Azərbaycanda və ondan kənar bir çox yerlərdə (Rusiya və Ukraynada) müxtəlif vəzifələrdə çalışmış, Azərbaycanı ləyaqətlə təmsil etmişdir.**

**F.Əliyev Rusiya və Ukraynanın bir sıra orden və medallarına layiq görülmüşdür. Genral-mayor rütbəsini daşıyan F.Əliyev o cümlədən layiq görüldüyü "Долг и честь", "За заслуги перед казачеством" (Rusiya) ordenini, "Козацька слава", "Золота медаль Козацька", "Срибна медаль Козацька слава" III dərəcə ordenini (Ukrayna) və digər dövlət orden və medallarını şəxsi arxivində saxlamaqdadır.**

Bu xeyirxah qubalı Quba Xeyiryyə Cəmiyyətinin ən fəal üzvlərindən biri olmuşdur. Ukrayna Azərbaycanlıları Konqresinin üzvü, Beynəlxalq "Qolden-layn" kompansiyasının MDB üzrə baş nümayəndəsi olan Fəxrəddin Əliyev hazırda Azərbaycanda biznes fəaliyyəti ilə məşğuldur.

Məqaləmdə bir məsələni də oxucu nəzərinə çatdırmağı münasib bilirəm: ölkəmizdə sovet rejimi çökmüş, müstəqillik dövrü yaranmış, bir sıra cəmiyyətlər fəaliyyətə başlamışdı. Biz bir dəstə qubalı da yaratdıq: Cəmiyyət yaratdıq- Quba Xeyriyyə Cəmiyyəti!

Xüsusi qeyd etməliyəm ki, Qubanın müfəssəl tarixinə IV əsrdən başlamış XXI yüzilliyin əvvəllərinə qədər kitabında yer verən Şahin bəzi məsələləri böyük həssaslıq və ürək yanğısı ilə yazmışdır. Belə məsələlərdən biri də yuxarıda adını çəkdiyim Quba Xeyriyyə Cəmiyyətinin yaranması və bir qədər sonra qapanma tarixcəsi oldu. Bu haqda bir qədər ətraflı:

Bu xeyirxah niyyətli cəmiyyət 23 noyabr 1996-cı il tarixində keçrilən təsis yığıncağında təsis olunmuş, Azərbaycan Respublikasının qərarı ilə qeydə alınmışdı.

Nizamnaməsi, İdarə heyəti, Ağsaqqallar Şurası çoxsaylı üzvləri, ünvan və telefon nömrələri əks olunan kitabca qarşımdadır. Vaqif Arzumanlının sədr, İmran Xəlilov və Nizaməddin Şəmszadənin müavin olduqları Cəmiyyətin İdarə üzvləri bu şəxslərdən ibarət idi: Əlimirzə Əhmədov, Tofiq Rüstəmov, Mustafa Bədəlov, Əkrəm Məmmədov, Səid Bilalov, Aydın Babayev, Şahin Fərzəliyev, Məmməd Adilov, Elza Fərhadova, Abdulla Ələsgərov, Rauf Sultanov, Adıgözəl Kərimov, Nazif Qəhrəmanov, Zemfira Qasımbəyova və Xalidə Qaraçaylı (katib)

Şahin yazır: "Cəmiyyətin fəaliyyət göstərdiyi 6 il müddətində hər şey gözəl idi. Vaxtaşırı yığışır,müxtəlif görüşlər keçirir, xeyir-şər məclislərində iştirak edirdik. Cəmiyyətin möhürü, ştampı, blankı vardı.

Bəli, vardı! İndi isə yoxdur! İndi Cəmiyyət fəaliyyətdən qalıb. Cəmiyyəti dağıdıblar. Cəmiyyətin dağıdılması yeni sədrin seçilməsi ilə əlaqədar oldu. Keçirilən ümumi iclasda Cəmiyyət üzvlərinin əksəriyyəti yeni namizədə--Vahid Əhmədova səs verdi. Köhnə sədr Cəmiyyətin möhür, ştamp və sənədlərini ertəsi gün verəcəyini bildirdi. Bildirdi, amma vermədi. Heç birisi gün də vermədi. Beləliklə, Cəmiyyət bir neçə gün sədrsiz qaldı, yeni idarə heyəti seçilmədi və Quba Xeyriyyə Cəmiyyəti öz fəaliyyətini dayandırdı, nəticədə istiqaməti xeyir işlər görülməsinə yönələn xeyirxah bir cəmiyyət xeyir işlərindən qaldı. Məncə, Vaqif Arzumanlı Vahid Əhmədovun sədrliyi ilə razılaşmalı idi. Quba Xeyriyyə Cəmiyyətinin bağlanması kimə lazım idi?! Axı hamımızın marağı, məqsədi, qayəsi xeyriyyəçilik idi".

Şahin hazırda Bakıda yaşayır və işləyir. Professordur. Elmlər Akademiyası Tarix İnstitutunda şöbə müdiridir. "Quba tarixi"-nin II nəşrinin sonunda Quba ilə bağlı bir "Son söz" ü vardır. Oxuyuram: "50 ildən çoxdur ki, Qubadan kənarda yaşayıram. 74 illik ömrümün 13 ilini Əfqanıstanda, bir neçə müddətini İranda, İraqda, Yaponiyada, Türkiyədə, keçmiş Sovet İttifaqının müxtəlif respublikalarında keçirmiş, hazırda isə Bakıda məskunlaşmışam. Amma təbii ki, Quba həmişə xatirimdədir. Imkan tapan kimi Qubama gedib, Şahdağımın qarlı zirvələrini uzaqdan-uzağa, "Qızbənövşə"mi və "Dəvədabanı"mı yaxından-yaxına seyr edir, Qudyalımın şırıltısını həzz ala-ala eşidir, Qəçrəşimin bulaq zümzüməsini heyranlıqla dinləyirəm. Qubada mənim əzizlərim—atam Fazilin, anam Gülcənnətin, qardaşlarım Nərimanın, Maqbetin və Eyyubun qəbirləri var. Qubada mənim ye-

tim xatirələrim qalmışdır. Xatirələr isə unudulmazdır:" Xatirədəri unutmayan Şahin kitabını 10 beytlik bir şeirlə bitirir:

*Ey Qubam, xatirələr qaldı qucaqlar dolusu,*
*Adını çəkmədəyəm gündə dodaqlar dolusu.*

*Var idi yayda sərinlik bizə Qudyal boyda,*
*Qışda Şahdağ soyuğu vardı otaqlar dolusu.*

*Görmədim mən babamı, amma həzin yaddaşda,*
*Nənəmin laylayı həkk oldu qulaqlar dolusu.*

*Dədəmin şalvarının cibləri bomboş, amma*
*Zər görərdim yuxuda saxsı çanaqlar dolusu.*

*Payız olcaq doluşub bağlara qarətçi kimi*
*Gətirərdik evə hey meyvə papaqlar dolusu.*

*Anamın təndiri yandıqca gələrdik həzzə,*
*Isti təndir çörəyi vardı tabaqlar dolusu.*

*Gözləşərdik bulaq üstündə gözəl qızlarla,*
*Tökülüb sözlərimiz qaldı bulaqlar dolusu.*

*Qoca Odlar diyarım odlu ərənlər yetirib*
*Naxçıvanlar, Qarabağlar, Qaradağlar dolusu.*

*Qocalıqdan gileyim var uca Şahdağ boyda,*
*Bir zaman canda alov vardı ocaqlar dolusu*

*Xan çinar timsalı möhkəmdi canım, ey Şahin,*
*Çiçəyim solmadadır indi budaqlar dolusu.*

Ey Şahin Fazil, xeyir, ey mənim məndən yaşlı, lakin ürəyi cavan dostum, "çiçəyim solmadadır" demə. Sənin çiçəyin hələ solmur. Sənin şeirlərin sənin çiçəklərin deyilmi? Hələ necə deyərlər "canında can var", hələ yazırsan, yaradırsan. Yaxın günlərdə 80 yaşın qeyd olunacaq. Yaşını təbrik edirəm!

**Dəstəgül ZAMANLI**
*Azərbaycan Yazıçılar və*
*Jurnalistlər Birliklərinin üzvü*

## AZƏRBAYCAN DİLİNİN TƏƏSSÜBKEŞİ

***Bir insan haqqında düşündüklərim...***

***Bir ata tanıyıram – övladları ilə qürurlanan bir ata...***

***Bir kişi tanıyıram – həyat yoldaşına dünyanın bütün gözəlliklərindən artıq dəyər verən, həyatın, ailənin şirinliyindən tam doymadan bu dünyaya əlvida deyən sevdiyi qadınının həsrəti ilə qovrulan sadiq, mərd bir kişi...***

***Bir dost tanıyıram – həm tələbkar, həm səmimi, həm də təmənnasız, dostcanlı...***

***Bir alim tanıyıram – Azərbaycan adlı dövlətin, xalqın tarixini gələcək nəsillərə çatdırmağa qadir, kamil bir alim...***

***Bir şair tanıyıram – Ulu Yaradanın yaratdığı dünyanın bütün gözəlliklərini, insanın bütün hiss və duyğularını sözün qüdrəti ilə təsvir etməyi bacaran yenilikçi, yetkin bir şair...***

***Bir müəllim tanıyıram – bir neçə dilin bilicisi olsa da, bütün dillərdən ən şirin saydığı Ana dilimizin vurğunu, təəssübkeşi, keşiyində pərvanəyə dönən, ömrünü şam tək əridən, bu günkü yazarlara da doğma dilimizi qorumağı tövsiyə edən vətənpərvər ruhlu bir müəllim...***

***Bir övlad tanıyıram – Şeir dünyasının dahilərinin, klassik şairlərimizin yolunu bir övlad, bir davamçı kimi uğurla davam etdirən, milli-mənəvi dəyərlərimizi gələcək nəsillərə çatdırmağı özünə övlad borcu sayan bir Vətən övladı...***

***Bir İNSAN tanıyıram – Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunun bölmə müdiri, tarix elmləri doktoru, professor, fars dilinin bilicisi, Azərbaycan xalqının tarixdə qalan şairlərindən, "Divan" müəlliflərindən sonra müasir şairləri içərisində ilk olaraq dörd "Divan" kitabının, (artıq 5-ci Divan kitabı da çapa hazırdır) 30-dan çox müxtəlif mövzulu şeir kitanlarının, tarixdən bəhs edən, Əfqanıstana, İraqa, İrana, Türkiyəyə etdiyi səfərlərini tərənnüm edən kitabların, tərcümə və bədii kitabların, 300-ə qədər elmi məqalələrin müəllifi, çoxsaylı elmi konfransların iştirakçısı, 1998-ci ildən "Məcməüş-şüəra" ədəbi məclisinin rəhbəri,***

***mərd kişi, sevimli ata, ustad müəlllim, saf dost və bütün bunların hamısından ucada dayanan- böyük ürəyə, geniş dünyagörüşə malik təvazökar, nəcib, kamil, humanist bir insan... Şahin Fazil...***

Müsair dövrümüzdə yazarlar, alimlər, ziyalılar kifayət qədərdir. Ancaq onu qeyd etmək istəyirəm ki, Şahin Fazil qədər doğma ana dilimizin təəssübkeşi, tərəfdarı yoxdur. Onu tanıdığım vaxtdan daim ana dilimizi qorumaq, təmizliyini saxlamaq üçün çalışmağının şahidiyəm. Rəhbərlik etdiyi məclisin üzvlərinə təmiz ana dilində şeirlər yazmağı tövsiyə edir. Təvazökardır, kiminsə ürəyini sındırmağı xoşlamır. Amma, haqqsızlığa, yalana qarşı barışmazdır. Sözünü adamın düz gözünün içinə deyir. Məclisin hər bir üzvünə müəllim kimi ustalıqla, ürəklə yol göstərir, düzgün istiqamət almasında köməyini əsirgəmir. Geniş dünyagörüşü, dərin müşahidəsi, daxili aləminin zəngin və mükəmməl olması bütün yaradıcılığında özünü əks etdirir. Özünə məxsus deyim tərzi, ifadə üslubu, təsvir forması var. Yaradıcılğında etik normaları qoruyur. Həyatında, ətrafında baş verən hadisələr, sevinci, kədəri, onu düşündürən, ağrıdan, qeyzləndirən hallar şeirlərində öz mükəmməl əksini, təsvirini tapır. Klassik şeir formalarından əlavə müasir şeir formalarının (heca, sərbəst, Azərbaycan hayku şeirləri və s.) da öz öhdəsinədən ustalıqla gəlir. Həyati həqiqətlərin elmi fəlsəfi izahı, Vətən, yurd məhəbbəti, Qarabağ ağrısı, siyasi-ictimai hadisələrə yanaşma tərzi, bu hisslərin özünəməxsus sevgi və ağrı ilə dolğun ifadə olunması, bir sözlə daxili duğuların poetikası-şairin iç dünyasının həyati gerçəkliyidir.

Şahin Fazil həm alim və şair kimi, həm müəllim kimi, həm də insan kimi müqəddəs bir amala xidmət edir. Ana dilimizin keşiyindədir daima... On iki yaşından şeir yazır. Düzdür, Fars dilini də çox sevir, bu dildə tərcümələri də çoxdur. Illərlə Əfqanıstanda yaşayıb, işləyib. Yaxın Şərq ölkələrinə o qədər səfərlər edib ki, hətta "Səfərnamələr şairi" adını alıb:

*"Əfqanıstan ilə İranə könül bağlamışam,*
*Əfqanıstan da əzizdir bu kəsə, İran həm".*

Əfqanıstanla birlikdə İranı, İraqı, Türkiyəni də özünə vətən sayır. Amma, doğma Azərbaycan dilini heç bir dilin kölgəsində qoymur. Çox zəngin, əlvan calarlı ədəbiyyatımızın qorunmasında, xalq ədəbiyyatı ənənələrinin doğma dilimizdə inkişaf etməsində qeyri dillərdən istifadə etmədən, təmiz ana dilimizdə zəngin şeirlər yaratmağın mümkünlüyünü öz ya-

radıcılığı ilə sübut edir. Azərbaycan dilinə qürurla, məsuliyyətlə yanaşır, gənclərdən də bunu tələb edir və təqliddən uzaq olmağı tövsiyə edir:

*Ari"nı "zənbur" edibsən, səni "zənbur" sancsın,*
*Gül kimi "bal" sözünü sən niyə "şəhd" eylərsən?"*

Və ya

*"Şahina, zay edəcəkdirsə dili şairlər,*
*Dilimə türk dili yox,"həftəbecər" söyləməli".*

Mənaca, məzmunca zəngin, poetik, lirik şeirlərində təbiət gözəllikləri ilə insan xüsusiyyətlərinin vəhdət təşkil etməsini, harmoniyasını oxucuya çatdırır. Bir çox müasir yazarların ərəb-fars mənşəli, izafət tərkibli şeirlərindən, təmiz ana dilimizdə yazdığı (bir kəlmə də olsun ərəb-fars və qeyri dildə sözlərdən istifadə etmədən) şeirlərinin nə qədər fərqləndiyini, klassik şairlərin yaradıcılığından da rəvan şeirlər yazmağın mümkünlüyünü sübut edir. Ictimai-siyasi xadim, tarixçi alim, xalqın ziyalı övladı olaraq müəyyən hadisələrə tələbkar mövqedən çıxış etsə də, həm də səmimi və kövrək şairdir Şahin Fazil...

O, mükəmməl insandır. Yaradıcılığı da mükəmməldir. Yaradıcılığında Şahdağ vüqarı, Babadağ əzəməti, Savalan ağrısı, Kür-Araz, Qudyalçay coşğunluğu hiss olunur. Haqqa, inama mənəvi çağırışdır yazdıqları. Haqsızlığa, yalana, xəyanətə qarşı mübariz silahdır qələmi. Kövrək məhəbbəti, isti, həssas duğuları tərənnüm olunur. Hər gün şeir yazır. Nə qədər səfərdə olsa da, elmlə məşğul olsa da, özü demişkən "qələmi əlində, dəftəri dizi üstündədir." Gecə yatanda da qələmi yanındadır. Şair olmaqdan əlavə, mütəfəkkir düşüncəli alim kimi fəlsəfi, dünyəvi fikirləri ilə mükəmməl insan olduğunu bir daha sübut edir:

*"Şahina, vacibdi bəsirət gözü,*
*Üzdə olan gözdə qələt var imiş."*

—deyir.

Qəzəldə "inqilab" edib Şahin Fazil—səlis, rəvan ana dilimizlə...

Və belə deyir:

*"Mən yazıb şerimi saf dildə müasir qəzəlin,*
*Qonmasam zirvəsinə, siz mənə Şahin deməyin"*

Və

*“Saf yarat, sadə yarat şerini Şahin sayağı,*
*Sənə öyrətdi anan dil, a qəzəlxan sadə”.*

Onu da qeyd edim ki, bir neçə il əvvəl Şahin Fazilə həsr ediyim şeirdə mən yazmışdım:

*“ Görmədi tay ola heç yanda bir el, öz elinə,*
*Zəmzəmin ləzzəti hopmuş demə Qudyal selinə”,*

*“Həm heca, həm də əruzdan yaradıb cüt qanadı,*
*Doğma etdi əruzu, Azəribaycan dilinə*”,

Şairin vətəndaş kimi ən böyük dərdi var:

*“Düşmənlərimiz qarə çəkiblər bağım üstə,*
*Qarə bağı bir də Qarabağ etmək olarmı?”*

* * *

*“Qarabağ fikri məni öldürəcək əvvəl-axır,*
*Qarabağda neçə sərsəm qarışıb bir-birinə...”*

Klassik şairlərin sonuncu “Divan” yazanı S.Ə.Şirvanidən sonra müasir ədəbiyyatımızın davamçılarından ilk dəfə “Divan” yaradan şair Şahin Fazildir. Artıq onun 5-ci “Divan”ı da çapa hazırdır. Ən mühümü isə bir insan kimi Allahını tanıyan, İslam dininə etiqadlı olan şair, müsəlmanlar arasında sünni-şiəçiliyə bölünməyin əksinədir. Müsəlmançılıqda Allaha, Peyğəmbərlərə inamlıdır:

*“Nə doğulmuş, nə doğubdur,özü, amma, yaradır,*
*Var edib gördüyümüz hər şeyi vallah, Allah”.*

Və çox xəta etdiyimizi söyləyir-

*“Biz yerdə xəta çox elədik ey qoca Şahin,*
*Allah bu səbəbdən yeri boğmaqdadı Göydən.”*

deyir.

Bir insan kimi, insan günahlarının yüngülləşməsini, bağışlanmasını Allahdan diləyir—

*"Çox olubsa savabımdan günahım, əfv eylə,*
*Hələlik eylə kərəm, vermə cəza, ya Allah!"*

XX və XXI əsrlərin ilk "Divan" müəllifi, həm də ilk "Təzkirə" müəllifi oldu. "Təzkireyi-Nəvvəb" dan sonra ilk dəfə olaraq "Təzkireyi-Şahin" yazıb, yaşı 130-a çatan "Məcməüş-şüara" ədəbi məclisi və bu məclisin ilk üzvlərindən bu günkü üzvlərinə qədər hər kəs barəsində əldə etdiyi məlumatlarla zəngin bir kitab yaratdı. Bu iş həmçinin Şahin Fazilin fədakarlığıdır. Elmi işlərə, xarici ölkələrə səfərlərə, elmi konfranslara başı qarışan, hər gün də şeir yazan bir insan bu çətinliyi də üzərinə götürdü və bu işi də uğurla bitirdi. Bununla da bir tarix yaratdı...

Bəzilərinə təvazökarlıqdan kənar görünə bilər, amma həqiqətən də Şahin müəllimin özünün yazdığı kimi:

*"Yeni Şahin, yeni Fazil yenə peyda olacaq,*
*Amma ki, olmayacaq heç biri Şahin Fazil"*

Əsil Şahin Fazil olmaq üçün insanın içində Şahinin içində olan qədər yurd, vətən, torpaq sevgisi, ana dilinə vurğunluq, ehtiram, təəssüb, məhəbbət, insanlığa insan münasibəti, kamillik, Ulu Yaradana və onun yaratdıqlarına inam, ürəyindəki səmimiyyət, mənəvi saflıq, qayğıkeşlik olmalıdır məncə...

*Qeyd: Mən Şahin Fazili 2000-ci ildən tanıyıram. O vaxtdan onun məclis üzvlərinin hər birinə, şeir yazmaq səviyyəsindən asılı olmayaraq bir müəllim, bir insan, bir ata, bir qardaş kimi səmimi münasibətinə, qayğısına şahid olmuşam. O, məclis üzvlərindən hər birimizin dərdinə, sevincinə şərik olaraq, mənəvi dayağımız olub. Çoxdan idi ki, onun haqqında düşündüklərimi qələmə almaq istəyirdim. Amma, düzü bir az çəkinirdim ki, görəsən ona layiq nəsə deyə bilərəmmi? Yazdıqlarıma onu da əlavə etmək istəyirəm ki, Şahin müəllim həm alim, həm müəllim, həm şair, həm insan kimi xalqımız, dilimiz və dövlətimiz üçün əvəzolunmaz bir ziyalı şəxsiyyətdir. Və ona hələ çox ehtiyacımız var. Bir də, ona da inanıram ki, O layiq olduğu tam qiymətini bir gün mütləq alacaq. Allah ona sağlam ömür versin!*

Sonda elə Şahin Fazilin Allahdan dilədiyini mən də ona diləyirəm:

*"Ələmi əlimdən alsan, qələmi əlimdən alma,*
*Sözümə kəsər gərəkdir, gözümə ziya, İlahi."*

**Əli ƏLƏMİ**
*Texniki elmləri üzrə fəlsəfə doktoru,*
*şair-qəzəlxan*

## DOĞRUYA DOĞRU GEDƏN ŞAHİN FAZİL HAQQINDA DOĞRU SÖZÜM

*Yurdumun doğruçu bir şairi – mən!*
*Ölü olsam da haçansa, diri – mən!*
*Hər gedən Doğruya doğru getmir,*
*Gedənin Doğruya doğru biri – mən!»*

***Şahin Fazil***

Doğruya doğru! Yəni Allaha doğru! Məgər hamı Doğruya doğru gedirmi? Mən bu suala müsbət cavab verə bilmərəm. Amma Şahin Fazil, düşünürəm ki, gedib, gedir və gələcəkdə də getdiyi doğru istiqamətə doğru gedəcək. Çünki bəzilərindən fərqli olaraq doğru adamdır, həyatda özünün müəyyənləşdirdiyi istiqamətdən yönünü gah sağa, gah sola döndərən deyil bu şair. Elə özü demişkən:

*«İstiqamət nə sağ olmuş, nə də sol, düz gedirəm,*
*Bu yolumla səhər-axşam, gecə-gündüz gedirəm».*

«Doğruya doğru!» Şahinin masam üstündə olan hələlik sonuncu bədii kitabının adı. **Bu əsər Şahinin beş Divanında əks olunan müxtəlif məzmunlu minlərlə şeirinin cüzi hissəsini özündə əks etdirən antologiyasıdır desəm yanılmaram. Bir şair və beş Divan! Zor işdir vallah!**

Kitabda birinci sırada dayanan divanlar silsiləsinin birincisi. Birinci Divanın birinci göz oxşayan «Dibaçə» hissəsi. Birinci cümlə: «Ulu Pərvərdigarə şükür olsun ki, nəhayət əlli yaşımdan sonra ilham köhlənimi dördnala çapdım və az bir vaxtda, hal-hazırkı yüzilliyimizdə ana dilimizdə kiçik bir Divan yazaraq böyük bir rahatlıq tapdım». Qafiyəli nəsrdir, deyilmi? «Nəsri-müsəcce» adlanan «qafiyəli nəsr» orta əsrlərin Divan ədəbiyyatında geniş yayılmış bir janr olmuşdur. Şahin də bütün Divanlarında həmin nəsrin qayda-qanuna sərt əməl etmişdir.

Şair yuxarıdakı sözləri 1995-ci ilin 21 sentyabrında yazıb. O zaman hələ bilmirdi ki, illər ötəcək və onun qələmindən daha dörd Divan çıxa-

caq. Buna görə də «Divan» adlandırdığı kitabının adı qarşısında «Birinci» sözünü yazmadı. O hələ bilmirdi ki, onun Divanlar xəzinəsini daha dörd inci bəzəyəcək və ölkəmizdə ilk olaraq «Divanlar Xəmsəsi» yaranışı Şahin Fazilin adı ilə tarixə düşəcək.

Deməli «Birinci Divan». Dibaçə (Müqəddimə), minacat (Allahın tərifi), nə't (peyğəmbərin tərifi), qəsidə, qəzəl, təzmin, təxmis, tərci', qit'ə, səkkizliklər, rübailər və dördlüklər, təkbeytlər, xoyratılar və bayatılar, heca və sərbəst vəznlərdə yazdığı başqa şeirlər… və bu Divanın xatimə (sonluq) hissəsi. Şair oxucuya müraciətlə deyir: «Əziz qiymətli və ədalətli oxucu! Məqamı uca olan Allah-talanın böyük inayəti və ondan daha böyük mərhəməti sayəsində «Divan»ımı bitirdim və onu Sənin ədalət divanına yetirdim. İndi bir «Divan» başqa Divana tapşırılmışdır. İndi Şahin Fazil «Divan»ı Sənin divanının hökmünü gözləməkdədir. Əgər Sənin diqqətinə nail və qiymətinə qail ola bilsəm, bu dünyada şad, o biri dünyada rahat olaram: Zəhməti məndən, qiyməti Səndən… Səndən nə gizlin, mənim üzərinə hələ nəşr işığı düşməyən bir neçə «Divan»lıq şeirlərim var ki, nə zamansa çap olunar inşallah:

*Çox hissəsi qalmış suda bir buz dağıyam mən,*
*Qafillərimiz var hələ bilmir nələrim var.*

Ümidvaram ki, zaman ötdükcə və adım ara-sıra qulaqlara yetdikcə həqiqi qiymətimi alaram və Şimal Azərbaycanında bu əsrdə ilk «Divan» yaradan qəzəlxan kimi yaddaşlarda qalaram:

*Sağlığında kimə qiymət verilibdir, Şahin,*
*Verilər qiymətimiz bir neçə ildən sonra».*

Ş.Fazilin «Doğruya doğru» kitabındakı seçilmiş şeirlərindən ibarət divanlarının səhifələrindəki ondan çox səfərnamə şeirlərindən, üç poemasından, yüzlərlə sonetindən, Əfqanıstanda fars (əfqan ləhcəsində «dəri» dili) dilində qələmə aldığı başqa şeir və başqa bədii nümunələrindən biz bu kiçik məqaləmizdə bəhs edə bilməmişik.

İndi isə Ş.Fazilin «Divan»lar silsiləsinin «İkinci Divan»ı. Çapı 2005-ci il. 1264 səhifə; «Üçüncü Divan». Çapı 2008-ci il. 1381 səhifə; «Dördüncü Divan», Çapı 2014-cü il. 871 səhifə; «Beşinci Divan». 2020-ci il. 2000 səhifəyədək (yaxın günlərdə oxuculara təqdim olunacaq).

Deməli beş Divan! Doğrudur, Şahin daha Divan yazmayacağını bəyan edir, amma inanmıram ki, onun rəvan yerişli qələmi «Altıncı Divan» kitabını yazmaya! Niyə inanmıram? Çünki Ş.Fazil demək olar ki, hər gün yazır. Elə götürək 2020-ci ilin ən qlobal bəlası olan və «Covid-19» adlanan koronavirus pandemiyası dövrünü. Bu 3-4 ay müddətində Şahin nə az, nə çox 70-dən çox şeir yazmışdır ki, bu şeirlərin 50-dən çoxunu internet vasitəsilə oxuculara təqdim etmişdir.

Ş.Fazil ümumiyyətlə olduqca məhsuldardır: elmi işlər, monoqrafik əsərlər, səfərnamələr, qələmə aldığı kitablara elmi şərhlər və s. Onun rəhbərliyi altında 13 nəfər tədqiqatçı dissertasiya yazmışdır ki, onların biri də şair-tədqiqatçı Qiymət Məhərrəmlidir ki, 2007-ci ildə «Şahin Fazil «Divan»ı və klassik ədəbi ənənələr» adlı dissertasiya müdafiə etmişdir. İnanıram ki, Şahin Fazilin sonrakı Divan kitabları bir neçə tədqiqat işinə mövzu olacaqdır.

Bu alim-şair-qəzəlxanın «Doğruya-doğru» kitabı haqqında böyük bir kitab yazmaq olar, lakin hazırda buna lüzum yoxdur, heç imkan da. Çünki onun həyat və yaradıcılığına həsr olunan 3-4 yüz səhifəlik «Şahin Fazil, qocalığın mübarək» adlı yığcam təbrik kitabında qələmə aldığı əsərlər haqqında geniş bəhs etmək mümkün deyildir. Buna görə də mən kiçik bir məqalə və bir qəzəl yazmaqla qələmimin gərdişini saxladım. Amma bu məhsuldar şairin beş Divanındakı (Divanlar Xəmsəsi) bəzi beytlərdən misallar gətirməklə kifayətlənmək məcburiyyətində qaldım. Şahin Fazil deyir:

*Şahina, gül qoparır çoxları gülşənlərdən,*
*Gülşənə gül gətirən tazə qəzəlxanəm mən.*

***

*Bəsdi yazdıq gah ərəbdən, gah farsdan söz yığıb,*
*Gərçi şəkkərdir dilim, mən şəkkəristan eylərəm.*

***

*Bağibanəm, o alağ sözlərə ziddəm, Şahin,*
*Şe'r bağımda mənim varsa alağ, yanmalıdır!*

***

*Bu qələmdirmi, deyildir, elə bil top lüləsi,*
*Nə qədər nanəcibə güllə atıbdır qəzəlim.*

***

*Təbliğə qurşanmaq məndən qaçaqdır,*
*Mənəm müəllifi neçə bəyanın,*
*Həyatda öz izi qalmayacaqdır*
*Başqa iz üstündə addımlayanın.*

***

*Şairin özünü əks edir kitab,*
*Zərin özündədir zərin dəyəri.*
*Böyük olmayacaq qocalsa da lap*
*Böyük şairlərin təqlidçiləri…».*

***

*Yandırıblar məni dünyadə, İlahi, o qədər*
*Daha heç varmı bir hacət ki, cəhənnəmdə yanım».*

***

*Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur.*

***

*Yazmaq ilə beş Divanımı «Xəmsə» yaratdım,*
*Allahə şükürlər ola, beş niyyətə çatdım.*

***

*Zilim fələyə çatır, bəmimi kimə deyim?*
*Allah asimandadır, qəmimi kimə deyim?.*

***

*Mənə Nuh ömrü nəsib olsa idi, ey Şahin,*
*Kim bilir mən yaradırdım neçə «Divan» əsəri.*

***

*Sənə dil bir də kobudluq eləsə,*
*Dişlərim dişləyəcəkdir dilimi»*

***

*Havalanmışdı Məcnun,*
*daş səsləri gəlirdi……*
*Daşlar başa dəydikcə*
*baş səsləri gəlirdi….*
*Eşidən olubmu heç*
*göz yaşının səsini?*
*Leylisi ağlayırdı,*
*yaş səsləri gəlirdi».*

***

*Bildim həqiqəti mən qocalanda:*
*Su səbətdə qalmır, cavanlıq canda.*

***

*Sənə vəsiyyətim belədir, ey yar,*
*Ruhum ayrılanda bədən içindən*
*De ki, kəfənimi bağlamasınlar,*
*Bəlkə çıxacağam kəfən içindən?*

Beləliklə, mən Doğruya doğru gedən Şahin Fazil haqqında sözümü bitirdim. Kaş hamı Doğruya doğru getsin!!!

**Yasin XƏLİL**
*Texniki üzrə fəlsəfə doktoru,*
*şair-qəzəlxan*

## ŞAHİN FAZİL: AZƏRBAYCAN QƏZƏLİNİN SAFLIĞI UĞRUNDA ÇOXİLLİK MÜBARİZƏ

Ədəbi məclislərə ziyarətim tamamilə təsadüfi olmuşdu. 2006-cı ilin aprel ayında bir bazar günü Filarmoniya bağında gəzərkən o zaman bu bağda yerləşən çayxanada əsasən televizordan tanıdığım rəhmətlik qəzəlxan şairimiz Həkim Qənini və ətrafında 10 nəfərə qədər adamın yığışdığını müşahidə edib yaxınlaşdım. İcazə almadan oturub çay sifariş etdim və elə ordaca başa düşdüm ki, bu ciddi bir ədəbi məclis, burda oturanlar isə o zamanın tanınmış əruz şairləridir. Şerlər (əsasən qəzəllər) oxunur və ardınca da ciddi müzakirələr gedirdi. Qoşuldum və beləliklə, mənim ədəbi həyatım başladı. Təbii ki, o vaxta qədər mən, ümumiyyətlə, Bakıda tarixi uzaq keçmişə gedib çıxan, ədəbiyyat dərsliklərindən bildiyim ədəbi məclislərin fəaliyyət göstərdiyini bilmirdim, heç ağlıma da gəlmirdi ki, haçansa Həkim Qəni, Ənvər Nəzərli, Mir Cəlal Zəki, Şahin Fazil, Rafiq Şirvani kimi dövrümüzün nəhəng əruz biliciləri ilə tanış olacaq, klassik şerin sehrinə düşəcək, Həsənoğludan üzü bəri bizim dövrə qədər yazılı ədəbi əsərləri gəlib çatmış Azərbaycan və dünya klassiklərinin ədəbi irsi ilə bağlı ciddi müzakirələrin ən azı dinləyicisi və iştirakçısı olacaq, müasir əruz şerimizdə tendensiya və istiqamətləri müəyyənləşdirən görkəmli simalarla nəinki tanış, hətta yaxın dost ola biləcəyəm. Heç ağlıma gəlməzdi ki, Həkim Qəninin, Mir Cəlal ağanın, Ənvər Nəzərlinin ölüm ayağında görüşüb vidalaşmağı arzuladıqları adamlardan biri olacaq, ilk kitabımın təqdimatını Hacı Rafiq Şirvani aparacaq və günlərin bir günü mən elminə, şairliyinə, insanlığına, müdrikliyinə sözün əsl mənasında pərəstiş etdiyim Şahin Fazil haqqında onun 80 illik yubileyi münasibətilə bir məqalə yazmağa cürət edəcəyəm. **Hələ sonra biləcəkdim ki, əruzda tendensioz, müasirliklə ayaqlaşmayan meyllərdən qurtulma prosesi ağrılı, hətta ciddi mübarizə şəraitində keçir və bu prosesin Şahin Fazil kimi olduqca ciddi, fədakar bir lideri var. Hələ sonra biləcəkdim ki, əruz şairlərinin bir qismi hələ də əsərlərində fars, ərəb izafət birləşmələrindən gen-bol istifadə edərək hər vəchlə öz mühafizakar mövqelərini guya bu dillərin geniş imkanlara malik olması ilə əsas-**

**landırmağa çalışır, az qala təmiz türk dilində qəzəl yazmağın mümkün olmadığını sübut etməyə, digər bir qismi isə öz şəxsi nümunələri ilə bu stereotipləri müvəffəqiyyətlə, inadkarlıqla qırmağa çalışır.** İlk gündən ana dilində qəzəl yazmağa üstünlük verən biri kimi hələ çox sonra böyük anadilli, rəvan təbli şairimiz Ənvər Nəzərli mənə "əruzçular" tərəfindən qəbul edilməm üçün tez-tez qəzəllərimdə fars, ərəb tərkiblərindən istifadə etməmi tövsiyə edəcək. Hələ sonra biləcəkdim ki, təmiz ana dilində klassik şer nümunələri yaratmaq səyləri, bir qism şairlərimizin paxıllıq zəminində Şahin müəllimlə şəxsi düşmənçilik aparmaq üçün bəhanə və əsas olacaq, bu, onlardan birinin hətta şer kitabının özü tərəfindən yazılmış ön sözünün az qala baş mövzusuna çevriləcək, ədəbi diskussiya müstəvisindən iftira, ləkələmə və şərləmə müstəvisinə daşınacaq. Hələ sonra biləcəkdim ki, bəzi cılız, milli köklərindən sıyrılmış şairlərimiz bu gün də arxaik, məzhəbçilik düşüncələrini poeziyaya daşımaqla çağdaş poeziyamızı Kərbəla müsibətinə sürükləyir, bilərəkdən və ya bilməyərəkdən ayrımçılıq ideyalarını təbliğ edir, dini-sxolostik baxışlarının əsiri olmaqla klassik poeziyanın imkanlarını bir sıra mifik, tarixi obrazların tərifi və təbliği ilə məhdudlaşdırırlar. Hələ sonra biləcəkdim ki, bir sıra müasir, hətta gənc şairlərimiz qəzəl yazanda türk-ərəb, türk-fars sözlüklərini və klassik şairlərimizin əsərlərini qarşılarına qoyaraq "üşşaqın" ( yəni "aşiqlərin") tərifi, əğyarın lənətlənməsi üçün ciddi-cəhdlə ərəb, fars sözləri axtarırlar. Başa düşmək istəmirlər ki, obrazlı desək, artıq Həcc ziyarətinə heç kim dəvə üstündə getmir və bu nəinki vaxt baxımından, heç müasir dövlətlərarası əlaqələr və sənədləşmə prosüdürü baxımında mümkün deyil. Və artıq çoxdan pərvanələr şəmin yox, elektrik lampalarının ətrafında dönürlər ( o isə söndürməsən davamlı yanır), baxışlar, terminlər və münasibətlər tamamilə yeni forma və məzmun üzərində, daha çevik və dinamik şəkildə təzahür etməkdədir. Köhnə fikir və düşüncələri çox vaxt sələflərdən qat-qat bəsit şəkildə müasir əruz poeziyasında yaşatmaq cəhdi isə elə onun bilməyərəkdən fatihəsini oxumaq kimi bir şeydir, bəzən hətta müasir oxucuda ironik gülüş doğurur**. Bu "naftalin iyi verən ədəbi zümrə" ilə sistemli, davamlı mübarizəni isə ilk dəfə hörmətli Şahin müəllim başlatdı və bu gün də onu uğurla davam etdirməkdədir.**

İndi, isə necə deyərlər, keçirəm əsas mətləbə. Əslində, əsas mətləb də, elə yuxarıda qeyd etdiyim və əsasən çağdaş ədəbiyyatda ən azı məzmun baxımından aktuallığını itirmiş "ənənəviçili"yi ciddi-cəhd ilə mühafizə edən bir qrup ilə əsasən elə əruz ədəbi dilində, şəxsi nümunələri,

ədəbi polemika üslubu ilə özünə xas ağırlıq, sambal və təmkinlə poeziya dilimizi qorumaq və üstünlüklərini göstərmək uğrunda səylər göstərən professor, tarixçi-alim Şahin Fazilin fəaliyyəti və ədəbi irsi ilə bağlı məhz bu kontekstdən öz fikir və mülahizələrimi yazmaqdan ibarətdir. Düşünürəm ki, az-çox əruz ədəbiyyatına bələd olmağım, daha çox mühafizəkarlığa əks mövqedə duraraq Şahin müəllim kimi poeziyada dünyəviliyi, milli-liberal mövqeyi müdafiə etməyim, şəxsi tanışlığım və uzun müddət bu və ya digər məsələlər üzrə geniş fikir mübadiləsi aparmağımız onun Azərbaycan qəzəlinin saflığı uğrunda çoxillik mübarizəsini daha əhatəli və obyektiv işıqlandırmama imkan verəcək. Yuxarıda Şahin müəllimin tarixçi-alim olmağını qeyd etməyim də əslində təsadüfi deyil. **Bir kimyaçı-texnoloq alimin digər bir tarixçi-alimin klassik poeziya irsi haqqında fikir yürütməsinə cəhdinin özündə bir parodoksallıq olmasına baxmayaraq, bu məqaləni Şahin müəllimin üzünə deyə bilmədiyim, amma ürəyimdən gələn fikirlərimi bildirmək üçün bir fürsət, bir şairin "sağlığında qiymət verin insanlara" məntiqi ilə çıxış edərək poeziyamızın müqtədir ağsaqqalına heç olmasa layiq olduğundan qat-qat az da olsa belə bir dəyərin onun həmkarı və dostu olaraq vaxtında, sağlığında verilməsi üçün həm də bir imkan hesab edirəm**.

Məlumdur ki, xalqın dili onun milli-mədəni varlığının ən mühüm komponentlərindən biridir. Ona görə də ədəbi dilin mühafizəsi, inkişaf etdirilməsi, düzgün istifadə olunması onun beynəlxalq aləmdə də milli mövqelərinin gücləndirilməsində mühüm rol oynayır. Azərbaycan Respublikası öz müstəqilliyini bərpa etdikdən sonra Azərbaycan dili cəmiyyətin ictimai-siyasi, sosial-iqtisadi, elmi və mədəni həyatının bütün sahələrində daha geniş istifadə edilməyə başladı, onun dövlət dili kimi maneəsiz inkişafı üçün münbit zəmin yarandı. 1995-ci ildə qəbul edilmiş Azərbaycan Respublikasının Konstitusiyası, Azərbaycan Respublikası Prezidentinin "Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında" 2001-ci il 18 iyun tarixli və "Azərbaycan əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında" 2001-ci il 9 avqust tarixli fərmanları, 2002-ci ildə qəbul edilmiş "Azərbaycan Respublikasının dövlət dili haqqında" Azərbaycan Respublikasının Qanunu dilimizin hüquqi statusunu, onun işlənməsi, qorunması və inkişafı üçün zəruri olan tədbirləri müəyyənləşdirdi. Azərbaycan Respublikası Prezidentinin "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı haqqında" 2012-ci il 23 may tarixli, "Azərbaycan Milli Elmlər Akademiyasının Nəsimi

adına Dilçilik İnstitutunun maddi-texniki bazasının gücləndirilməsi haqqında" 2012-ci il 29 may tarixli, "Azərbaycan dilinin qloballaşma şəraitində zamanın tələblərinə uyğun istifadəsinə və ölkədə dilçiliyin inkişafına dair Dövlət Proqramı"nın təsdiq edilməsi haqqında" 2013-cü il 9 aprel tarixli, "Azərbaycan dilinin elektron məkanda daha geniş istifadəsinin təmin edilməsi ilə bağlı bir sıra tədbirlər haqqında" 2018-ci il 17 iyul tarixli sərəncamları, həmçinin "Azərbaycan Respublikasının Nazirlər Kabineti yanında Terminologiya Komissiyası haqqında Əsasnamə"nin təsdiq edilməsi barədə" Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2012-ci il 26 noyabr tarixli Qərarı ana dilinə dövlət qayğısının artırılması, dilçilik sahəsində fundamental və tətbiqi araşdırmaların keyfiyyətinin yaxşılaşdırılması üçün əlverişli şərait yaratdı. **Müasir Azərbaycan dili mükəmməl qrammatik quruluşa, zəngin lüğət tərkibinə və ifadə vasitələrinə malikdir. Bununla yanaşı, dilimizin hüdudsuz imkanlarından yetərincə və düzgün istifadə edilməməsi halları təəssüf ki, hələ də kifayət qədər geniş yayılmışdır.** Televiziya və radio kanallarında, internet resurslarında, mətbu nəşrlərdə və reklam daşıyıcılarında ədəbi dilin normalarının kobud şəkildə pozulması, leksik və qrammatik qaydalara əməl edilməməsi, məişət danışığından istifadə olunması**, əcnəbi söz və ifadələrin yersiz işlədilməsi az qala adi hala çevrilmişdir. Belə şəraitdə şairlər ana dilimizin saflığı uğrunda mübarizənin önündə getməli olduqları halda hələ də yuxarıda qeyd etdiyimiz kimi bir çoxlarının şerlərində yabançı söz və fikirlərdən gen-bol istifadə etmələri, əlbəttə ki, təəssüf doğurur. Bu səbəbdən də həyatımızın bütün sahələrində, o cümlədən poeziyamızda və o cümlədən, əruz vəznli şerlərimizdə dilimizin saflığının qorunması uğrunda mübarizə olduqca əhəmiyyətli və aktualdır.** Elə düşünürəm ki, qəzəl dilinin sadələşdirilməsi uğrunda mübarizə elə ilk ana dilli qəzəllər yazıldığı dövrdən başlanmışdır. Əslində elə ana dilində qəzəl yazmaq ənənəsinin başlanması min il bundan əvvəl poetik özünüdərkin aktiv fazaya qədəm qoyması idi. Təbii ki, bu uzun müddət ərzində kimsə özünə qayıda bildi, kimsə də elə köhnə stereotiplərin ağuşunda qaldı. Böyük şairimiz M.Füzuli yazırdı ki:

*"Qəzəldir səfabəxşi-əhli nəzər,*
*Qəzəldir güli-busatini-hünər.*
*Qəzəl de ki, məşhuri-dövran ola,*
*Oxumaq da, yazmaq da asan ola"*

və bununla o qəzəlin oxunuşunu və yazılışını asan görmək istəyirdi. Eyni zamanda təəssüf ki, o dövrün məlum ictimai-siyasi mühiti mükəmməl ana dilli ədəbi cərəyanın formalaşmasına imkan vermirdi.

Bir qitəsində də çətin sözlü qəzəlin faydasız olduğunu, belə şerləri eşidənlərin isə əziyyət çəkdiklərini bildirirdi:

*"Ondan nə sud ki, ola mübhəm ibarəti,*
*Hər yerdə istimain edənlər məlul ola?"*

Bununla belə dahi şair təəssüf ki, bu aludəçilikdən özü də xilas ola bilmir və hətta, bir qitəsində öz narahatçılıq və istəklərini belə ifadə edirdi:

*"Ol səbəbdən farsi ləfzilə çoxdur nəzm kim,*
*Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur.*

*Ləhceyi-türki qəbuli-nəzmi-tərkib etməyib*
*Əksərən əlfazi namərbutü nahəmvar olur.*

*Məndə tovfiq olsa bu düşvarı asan eylərəm,*
*Novbahar olğac tikəndən bərgi-gül izhar olur".*

Şahin Fazil hələ 2004-cü ildə "Füzulinin asanlaşdıra bilmədiyi çətin bir məsələ barədə" məqaləsində ("Azərbaycan" jurnalı, № 1) yazırdı: "Məndə tovfiq olsa bu düşvarı asan eylərəm" deyən Füzuli, həmin düşvarı asan eləyə bilmir, yəni qəzəllərində çətin qavranılan, dərk edilən, indinin özündə də anlaşılmayan ərəb və fars sözləri, ifadələri işlədir". O, bunu heç də Füzulinin şairlik gücünün zəifliyi ilə yox, dövrün ictimai-siyasi konyukturası, islam ənənələrinin və ərəb-fars təsirinin güclü olması, eləcə də şairin buna çox da cəhd və həvəs göstərməməsi ilə izah etməsinə baxmayaraq, o zaman hörmətli tənqidçilərimizdən biri, mənim dərin hörmət etdiyim, əziz dostum Vaqif Yusifli yazdığı məqalənin məqsəd və ruhuyla çox da səslənməyən bir tərzdə hörmətli Şahin müəllimlə razılaşmayıb yazmışdı: "Təbii ki, Füzulinin dili ərəb və farsın ifadə və tərkiblərindən xilas ola bilməzdi. Birincisi, ona görə ki, o dövrün ədəbi dili hələ bu təsirdən xilas ola bilməmişdi. "O, yazırdı": Sizin Füzulidən "asan" hesab etdiyiniz Həsənoğlu da, Bürhanəddin də, Həqiqi də, Seyid Əzimdən "asan"

bildiyiniz Xətai də, Süruri də, Saib Təbrizi də, Vidadi də bu və ya digər dərəcədə ərəb və fars dillərinin təsiri altında olmuşlar. Bəs XX əsr şairi Məhəmməd Hadiyə nə deyirsiniz? Lap elə xalqın çox sevdiyi Sabir də ərəb və fars sözlərindən bol-bol istifadə etmişdir. Siz "Füzuli qəliz yazır" deyəndə yəqin ki, "Füzuli XX və XXI əsr qəzəl şairləri kimi yazmalıydı" deyə düşünürsünüz. Axı, XVI əsrlə XX əsr arasında ədəbi dil nöqteyi-nəzərindən eyniləşmə ola bilməz. Siz Nəsimini Füzulidən "asan" yazan şair hesab edirsiniz. Amma baxın Nəsiminin külliyyatına-hədis, əbəd, ərş, fərş, səlsəbil, sədiəkbər, ruhi-qüds, xəlvəti-ərbəin kimi sırf dini-fəlsəfi söz və ifadələr azmı işlənib? Siz XV əsr şairi Cahanşah Həqiqinin də şeirlərinin Füzuli şeirinə nisbətən sadə olduğunu iddia edirsiniz. Amma baxın C.Həqiqinin şeirlərinə-ülaikə, ayəti-vəşşəmsə, dami-zülfi-dust, nuri-ləmyəzəl, xaki-rahi-məqdəm, abidi-səccaf və s" (Ədalət qəzeti. 2017.- 21 oktyabr.- S.15.). Özlüyündə guya Şahin müəllimə tutarlı cavab verdiyini düşünən müəllif ya Şahin müəllimin nə demək istədiyinin mahiyyətinə varmır, ya da heç varmaq istəmir. Əslində, müxtəlif formada və emosional tərzdə də olsa hər iki alim eyni fikri çatdırır. Əslində, görkəmli tənqidçi alimimizin Şahin müəllimə dəstək olub müasir qəzəl ədəbi dilinin saflaşdırılması, mövzu dairəsinin aktuallaşdırılması üçün gənclərə tövsiyyədə bulunmaq əvəzinə bu məsələdə polemika açması ən azı təəssüf doğurur. Çoxillik şəxsi müşahidələrimə əsaslanaraq deyə bilərəm ki, Şahin müəllim, qüdrətli Füzuli poeziyasının heyranlarından biridir və əlbəttə ki, onun qəliz yazmasını, ərəb-fars izafət tərkiblərindən geniş istifadəsini bəşəriyyətin böyük şairinin əsla zəifliyi və ya acizliyi kimi təqdim etmir, əsla aşağılamır, o bunu Füzulinin spesifik şer dilinin olması ilə izah edir. Apardığı bütün müqayisələr isə, təbii ki, nisbidir. Söhbət yaradıcılıqları müqayisə edilən şairlərin poeziya dilinin orta səviyyəli oxucu tərəfindən anlaşılma səviyyəsindən gedir. Yazıda az qala müdafiyəsinə əsla ehtiyacı olmayan dahi şairə müasir, ana dilli vətənpərvər bir şairin fikirlərini təhrif etməklə az qala sahib çıxma iddiası görünür. Digər bir hörmətli əruz şairimiz, əruz "dilinin" saflaşdırılması uğrunda xeyli işlər görmüş, mənim çox sevdiyim şair İlqar Fəhmi də müsahibələrinin birində (Modern.az saytı. 14 Sentyabr 2013, 11:11 | MƏDƏNİYYƏT.**Qəzəlxan-şair: "Bizim filmdə erotik səhnə yoxdur, qız yalnız üst paltarını soyunur..." – müsahibə)** Şahin Fazili bir mənalı olaraq Azərbaycan qəzəlində dilimizin saflaşdırılması uğrunda mübarizənin flaqmanı olduğunu qeyd etsə də, onun əsərlərinin guya olduqca sadə olduğunu iddia edərək, əslində

onun bu istiqamətdə fəaliyyətinə fikrinin əvvəlində verdiyi düzgün qiyməti, təəssüf ki, elə özü də dəyərdən salmağa çalışır. Fikrimcə, "qəzəlin sadələşdirilməsi" anlayışı özü qüsurludur. Əslində söhbət sadə və ya mürəkkəb (qəliz) yazmaqdan yox, bir türkdilli şairin qəzəli anlaşıqlı, doğma ana dilində və ya böyük əksəriyyətin başa düşmədiyi əcnəbi (fars və ya ərəb sözlərindən bol istifadə etməklə. Belə olan halda elə həmin uğurla məsələn rus, ingilis sözlərindən də istifadə edilə bilər, yəni niyə də yox) dildə yazılmasından gedir. Biz əgər diqqətlə qəliz (və ya mürəkkəb) əcnəbi yad sözlərdən geniş istifadə etməklə qəzəllərini yazan şairlərin (Füzulidən bu günə kimi) əsərlərinə nəzər salsaq, görərik ki, qəzəlin mövzusunda və xüsusilə, dilində ciddi dəyişiklik yoxdur. Leyli və Məcnun, şəm-pərvanə, bülbül-gül əfsanələri və mifik-dini (bəzən irfani rəmzlər və s. kimi şəkilləndirilərək pafosla oxucuya sırınan) baxışların sadəcə və çox vaxt çılız söz oyunu alətiylə "təqdim olunması" min illərdi ki, davam etdirilir. Oxucuya kosmos əsrində hələ də elmi əsası olmayan mifik düşüncələrin aşılanması, özü də hələ yad, yabançı, anlaşılmaz sözlərin köməyi ilə çatdırılması cəhdlərinin bu gün də davam etdirilməsi artıq çağdaş poeziyamızın bir qolunun-əruz qolunun ciddi kanserogen xəstəliyindən xəbər verir. Yəni bizim mürəkkəb, qəliz və ya guya ki, dərin deyə düşündüyümüz qəzəllərin "dərinliyi" sadəcə onların başqa dildə yazılmasındadır. 1000 ildi "çevir tatı, vur tatı" oyunundan başqa ortada heyrətləndirici bir şey yoxdur. Əgər XX əsrin əvvəlinə kimi buna haqq qazandırmaq olardısa, artıq bu gün əruzun ən azı dili orta azərbaycanlıya tanış və aydın olmalıdır.

Şahin Fazil "Təzkireyi-Şahin" kitabında Azərbaycan qəzəl dilinin saflaşdırılmasının zəruriliyi ilə bağlı yazırdı: "Zənnimcə, Füzulidən əvvəl və sonra, lap elə XX əsrədək asan söz və ifadələrlə qəzəl yazmayan şairləri başa düşmək mümkündür. Ümumiyyətlə, qəzəl sadədən-mürəkkəbə və mürəkkəbdən sadəyə doğru uzun bir yol keçmişdir. Məsələn, XIII-XV yüzilliklərin şairləri Nasir Bakuyinin, İzzəddin Həsənoğlunun, Qazi Bürhanəddinin, Ənbəroğlunun, Cahanşah Həqiqinin, İmadəddin Nəsiminin, Kişvərinin, Hidayətullahın şerləri XVI əsrin qəzəl ustadı Füzulinin şerinə nisbətən sadə olmuş, Ş.İ.Xətai, İbrahim Gülşəni, Rəhməti, Zayei-Bağdadi, Sürури, Həqiri, Qövsi Təbrizi, Saib Təbrizi,Molla Vəli Vidadi, Molla Pənah Vaqif , Heyran xanım kimi sonrakı əsrlər şairlərinin şer dilləri isə böyük qəzəlxan S.Ə.Şirvaninin dili kimi qəliz olmamışdır. Əlbəttə, bu tendensiyanın-növbələşmənin müasir dövrümüzdə də davam etdiyini təəs-

süflə qeyd etməkdə fayda var (P.S). Belə ki, S. Şirvanidən sonra Vahid, S. Rüstəm, M.Seyidzadə, Ə.Nəzərli, Ş.Fazil, İlqar Fəhmi kimi şairlərin qəzəl dilinin ədəbi ana dilimizin tələblərinə tam cavab verməsinə baxmayaraq, onun yenidən qəlizləşdirilməsi cəhdləri bəzi müasir qəzəl şairlərinin də əsərlərində özünü qabarıq şəkildə büruzə verir. Bəzi şairlər hətta qəzəllərinin altında müasir oxucuya izahat vermək üçün ərəb-fars sözlərinin tərcüməsini vermək məcburiyyətində qalırlar ki, bu da ən azı müasir oxucuya və ədəbi ana dilimizə sayğısızlıq kimi dəyərləndirilə bilər. Bir neçə nümunə ilə fikrimizi əsaslandırmağa çalışaq:

*"Şanəni şövq ilə çək zülfünə,ey gül,qorxma,bəs*
*Müğri-ruhim incədir,min yol darağından keçib".*

*(İlqar Bizəban)*

*"Yaxıbdır könlümün mülkün mənim, yəğma ilən, bir türk,*
*Qalıbdır odlu müjganı, salıbdır canə şəst, atəş.*

*Mücahid düşmüş İbrahim misalı, narına nurun,*
*Bir ər göstər, onunçün olmamış, cami-ələst, atəş".*

*(Nizami Mücahid)*

*"Ey olan Rəfrəfsəvar, ey seyri-əflak eyləyən,*
*Ey şəbi-əflakı mehri-arizi çak eyləyən.*

**

*Vaqifi-əsrar olan sənsən, çün elmin şəhrisən*
*Həmçinin sənsən bəyani-"maərəfnak" eyləyən."*

**

*"Zülməti-eşq içrə çox üşşaqə ahımdır çıraq,*
*Çünki yandırmaq savabdır, bikəsü-biyarə şəm.*

**

*Ya Əli, ey cümlə xaqanlar, sənə kəmtər qulam,*
*Rahi-eşqində xoça ol aşiqə tutmuş məqam,"*

**

*Mahirəm xaki-dərində bir gəda tək sübhü şam,*
*Tutiyi-dil dəmbədəm təkrar edər biixtiyar.*

*(Ə.Mahir)*

Göründüyü kimi bu günün bəzi əruz şairləri hələ də müasir qəzəlimizdə təqlidçilik və əcnəbi qəliz ifadələri işlətməkdən əl çəkə bilmirlər. Ş.Fazil öz "Təzkireyi-Şahin"ində bu problemin səbəblərini araşdıraraq yazır: ...şairin qəzəl dilinin mürəkkəb və ya sadə olması dövrlərin ədəbi dilindən sıx asılı deyildir və bu, hər şairin spesifik şer dili ilə əlaqədar bir məsələdir. O qeyd edir ki, "biz bu qeydlərimizlə heç də, əsərlərini qəliz Azərbaycan dilində yazmış orta əsrlər dövrü şairlərini təqsirləndirmirik. Doğurdan da həmin dövrün ədəbi dili olduqca çətindir və o çətinliyi asanlaşdırmaq şairin səyindən və bacarığından asılı olmuşdur. Amma bu da danılmazdır ki, asan dilli qəzəl yazmaq, əruz vəzninli şerlərdə izafət tərkiblərinin işlənilməsindən qaçmaq olduqca çətindir, çünki yalnız türk sözlərinin, habelə dilimizdə vətəndaşlıq hüququ qazanmış kəlmə və ifadələrdən istifadə etməklə əruz vəznli şer yaratmaq heç də asan və hamıya müyəssər olan məsələ deyildir, Füzuli demişkən "düşvar"dır (bir var 3 dilin qafiyəsindən bəhrələnəsən, biri də var bir dilin).

Həmmüasirlərinin bir çoxlarından fərqli olaraq Şahin Fazilin fikrincə qəzəli nəinki savadlı adamlar, həmçinin sadə mütaliəni sevən istənilən oxucu başa düşməlidir. O deyir ki, gəlin görək bu günün savadlı adamlarının böyük əksəriyyəti M.Füzulinin və ya S.Ə.Şirvaninin şer və nəsr dilini başa düşürmü? Və bu ritorik suala özü də cavab verərək bildirir ki, "yəqin ki, yox! O böyük alimlərin və qüdrətli söz sahiblərinin şerlərini başa düşməkdən ötrü ərəb, fars və türk dillərini əməlli-başlı bilmək, başqa sözlə desək, savadlı şərqşünas olmaq lazımdır". Şahin müəllim demək olar ki, "Məcməi-şüəra"nın bütün tədbir və görüşlərində inadla və təsirli arqumentləri ilə qəzəl şairlərinə maksimum anlaşıqlı yazmağı tövsiyyə edir. "Bu günkü qəzəlxanların əksəriyyəti elə qəliz yazırlar ki, soruşurkən yazdıqlarının mənasını heç özləri də əməlli-başlı izah edə bilmirlər. Ərəb-fars lüğətlərinin köməyi ilə şer yazmaq kimə və nəyə lazımdır**? Zənnimcə müasir ədəbi dilimizə xor baxan, qəzəllərini qəliz söz, ifadə, ibarə və çoxmərtəbəli izafət tərkibləri ilə anlaşılmaz hala salan hər qəzəlxan yaxşı vətəndaş deyil və Azərbaycan ədəbiyyatına xidmət etmir. Bu baxımdan, hətta fars dilinin hakim olduğu bir məkanda yaşayan müasir Cənubi Azərbaycan qəzəlxanları bizim müasir qəzəlxanlarımızdan daha asan və anlaşıqlı dildə yazırlar",** - deyə professor təəssüf hissi ilə qəzəlxanlarımızı öz ana dilimizi qorumağa, zənginləşdirməyə çağırır.

Şahin Fazil Azərbaycan qəzəlinin saflığı uğrunda mübarizəsini

praktiki olaraq, öz şəxsi nümunələrini-əsərlərini yaratmaqla da uğurla davam etdirir. Birinci divanına Dibaçəsində qeyd etdiyi kimi, “ qəlbi dağlayan budur ki, Füzuli köksündə çağlayan və lap elə bu günün özündə də şerimizdə hönkürtü ilə ağlayan biçarə Şahin Fazil o dahi şairdən beş yüz il sonra bu yolda öz mühafizəkar qələmdaşları tərəfindən maneə ilə qarşılaşır və təəssüf hiisi ilə coşub daşır.

*Qəzəlimdən neçə gövhərşünasın yox xəbəri,*
*Hələ gizlində qalan gövhərə bənzər qəzəlim.*

*Yazıram inci kimi saf qəzəllər, amma*
*Afərinlər yerinə görmədə xəncər qəzəlim.*

*Korlamaz ətrini misramın izafət qoxusu,*
*Təzə nərgiz sayağı rayihəli tər qəzəlim.*

*Bilməyir qədrimi “Məcməş-şüəra” həm hələlik,*
*Eybi yox zərgəri heyran edəcək zər qəzəlim.*

*Ağqoyunlu Həsənin dövrü əgər olsaydı,*
*Neçə ehsan qazanar idi mənim hər qəzəlim.*

deyir.

O başqa bir qəzəlində isə deyir ki,

*Bağibanəm o alaq sözlərə ziddəm, Şahin,*
*Şe’r bağımda mənim varsa alaq, yanmalıdır.*

və ya

*Bilirəm qiymətini xəlqi sözün, sərrafəm,*
*Xəlqi sözlərlə yazan şe’rini bədnam olmaz.*

Şahin Fazil qəliz qəzəllərin xanəndələrin dilində də müəyyən xəta və təhriflərin yol açdığını təəsüflə qeyd edir və

*Sözü düzgün oxumur gör nə qədər xanəndə,*
*Buna, əlbəttə, səbəbkar – qəzəlxanlarımız.*

deyə ağrı ilə, ərkyana müasirlərini məzəmmət edir.

*Bəsdi yazdıq gah ərəbdən, gah farsdan söz yığıb,*
*Gərçi şəkkərdir dilim, mən şəkkəristan eylərəm.*

deyən şair ana dilli əruz şerimizin inkişaf etdirilməsinin vacibliyini bildirir. Şahin Fazil bəzi müasir qəliz dilli qəzəlxanlara daim ağsaqqal nəsihəti verməyi sanki özünə borc bilir, inadkarları ciddi surətdə tənqid edir:

*Xor baxmağı var milli dilə bir neçə şəxsin,*
*Mə'nən elə şair öləcəkdir gələcəkdə.*

*Amma qəzəli xəlqi yazanlar yenə vardır,*
*Söz bayrağımız yüksələcəkdir gələcəkdə.*

deyən şair hər halda gələcəyə ümidlə baxır.

*Bir qəmim var – o da dil saflığıdır şer içrə*
*Ola bilmir qəmə qəmxar qəzəlxanlarımız.*

*Dilimin xeyli genişdir, inanın, imkanı,*
*İmkanı eyləməsin dar qəzəlxanlarımız.*

deyən Şahin Fazil elə bu qəzəllə də Azərbaycan dilinin əruza necə rahat yatdığını bir daha aydın şəkildə göstərir və eyni zamanda müasirlərinə dilə hörmətlə yanaşmalı olduqlarını tövsiyyə edir. Bir qəzəlində şair həmkarlarının birinin qəliz dilli qəzəlinə işarə edərək yazır:

*Bir şerə gözüm dəydi, biganə deyimlər çox,*
*Mən həm bu təhər yazsam, lənət qələmə, lənət.*

*Tiri-müjəsi etmiş mürgi-dilimi məcruh,*
*Bir şey başa düşdümsə, Şahin dədəmə lənət.*

deyərək həm yumor, həm də ironiya ilə həmkarını öz ana dilinə, dövlət dilimizə hörmətlə yanaşmağa çağırır.

Təbii ki, əsərlərini təmiz, şirin ana dilimizdə yazan bir sıra müasir əruz şairlərinin yaradıcılığında birbaşa və ya dolayısı ilə Ş. Fazilin azərbaycan qəzəl dilinin saflaşdırılması uğrunda apardığı mübarizənin təsirini istina etmək olmaz.

*"Ümidləri oyat mənim gözümdə,*
*Məhəbbəti yaşat mənim gözümdə.*

*Itirmişəm zamanı sən gedəndən,*
*Düz işləmir saat mənim gözümdə.*

*Gülüm, gözümdə parlayan Günəşsən,*
*Çıx, həm də sonra bat mənim gözümdə.*

*Gözüm sənə məkandı get dolan, gəz,*
*Yuxun gələndə yat mənim gözümdə.*

*Eşitmişəm rahatlıq axtarırsan,*
*Gəl olginən rahat mənim gözümdə.*

*Həyat mənim gözümdə bir xəyaldı,*
*Xəyal da bir həyat, mənim gözümdə.*

*Əvəz, gözündən özgə göz yalandı,*
*Nə arzun olsa, çat mənim gözümdə!"*

*(Ə.Qurbanlı)*

*"Sevgilim, hər gəlişin qəlbə diləklər gətirər,*
*Dilinə eşqimizi odlu ürəklər gətirər .*

*Bir gözəlsən ki , mələklər də çəkir həsrətivi,*
*Nə verər mislivi dünya, nə fələklər gətirər .*

*Aşiqin dönsə də torpaqlara, səndən dönməz,*
*Onu hər gün qapiva gizli küləklər gətirər .*

*Bil ki , dünyadə qəmindən yixilan aşiqivi,*
*Qaldirib məhşərə çiynində mələklər gətirər .*

*Qəbrimin torpagi, Xaqani, dönər gülzarə,*
*Gündə cənnətdən enib huri, çiçəklər gətirər"*

*(X.Əmini)*

*"O dərd qalmadı tuş etməyə zəmanə məni,*
*Tükəndi səbrü qərarım, gətirdi canə məni.*

*Kimi ki, dost sanıb yandım, ey könül, oduna,*
*Qoşuldu düşmənimə, qoydu yanə-yanə məni.*

*Gəl, ey mələk, səni gözlər gözüm, hərayimə yet,*
*Yerim ki, yox yer üzündə, çək asimanə məni.*

*Bir e'tibarı olan kimsə görmədim, bu fələk,*
*Xəyanət əhli ilə çəkdi imtəhanə məni.*

*Bəla bəlayə calanmış, nə çarə ki,gətirən*
*Gətirdi çəkmək üçün dərdü qəm cahanə məni.*

*Ey Əmri, kimlərə etdim ox atmağı tə'lim,*
*Düşəndə fürsət ələ, aldılar nişanə məni".*

*(A. Əmri)*

*"Gedirəm, gözlərimi bağla mənimçün bu gecə*
*Yoxdu bir ağlayanım, ağla mənimçün bu gecə.*

*Soyuğam, öpmə üzümdən dodağın xəstələnər,*
*Gəl dəyiş yorğanı torpaqla mənimçün bu gecə.*

*Əcəl almış məni ağuşuna, yox fərqi daha,*
*Qoca dünyanın oyuncaqla mənimçün bu gecə.*

*Qəmi təklikdə yedin hər gecə məndən gizlin,*
*Doymusansa, azacıq saxla mənimçün bu gecə.*

*Ağlayıb yolma saçın, yox, eləcə yas saxla*
*Səs-səmirsiz dəli olmaqla mənimçün bu gecə.*

*Fəhminin ömrü bitir, bir də uzat əllərini*
*Son dəfə gözlərimi bağla mənimçün bu gecə."*

*(İ.Fəhmi)*

*Məni çək zirvələrə hər gün, əlimdən yapışıb,*
*De ki, gəl, quc məni sevgiylə, belimdən yapışıb!*

*Arabir qeyb olarıq zirvələrin fövqündə,*
*Çox qınaq eyləmə ha, hər əməlimdən yapışıb!*

*Ölərəm, çox demişəm, mən sənin üçün, ey yar,*
*Sənə qurban, hələ öldürmə dilimdən yapışıb!*

*Ay nədir, gün nə, bir anlıq məni tənha qoyma,*
*Ömr edək, nolar, həyatım, yüz ilimdən yapışıb.*

*"Məni eşqiylə yaratmış bilirəm ki, Yaradan,*
*Ucadan da uca ollam, təməlimdən yapışıb.*

*Doymuram ki, gecələr sənlə olan söhbətdən,*
*Gəl, bəhanə eləyək, bir qəzəlimdən yapışıb!*

*Ələmi, cəzb eləyir, gör nə gözəldir, dünya!*
*Çəkdim əl ondan özüm, öz gözəlimdən yapışıb!"*

*(Ə.Ələmi)*

Bu nümunələr və digər adı çəkmədiyimiz şairlərimizin qəzəlləri doğurdan da ana dilimizin zənginliyindən və geniş imkanlarından xəbər verməkdədir.

Şahin Fazil öz qəzəllərini demək olar ki, əruz vəzninin Azərbaycan dilində işlənmiş bütün bəhrlərində yazaraq sübut etmişdir ki, əruz sadəcə bir formadır. Azərbaycan dili öz geniş poetik inkanları ilə bu formada Şahin Fazil ustalığı ilə özünü kifayət qədər rahat hiss edir.

İstər həzəcdə

*Fikrim ola bilməz yenə inkar yanında,*
*Olmuş yenə əvvəlki təki, yar yanında.*

*Birləşməliyiksə səbəbi Tanrıya məxsus*
*Bizlər naçiyik öylə səbəkar yanında.*

İstər rəməldə

*Bağiban, hər alağı rədd eləyirsən, əhsən,*
*Əcnəbi hər sözə qarşı çəpərim var mənim.*

*Boş xurafatla məni qorxuda bilməz zahid,*
*Aləmin çox xəbərindən xəbərim var mənim.*

*Fras-ərəb mə'xəzinin bir çoxu mə'lumdu mənə,*
*Nəzəri çox deyimə öz nəzərim var mənim.*

*Var adam millətinə bircə bəhər bəxş etməz,*
*On kitabım var isə on bəhərim var mənim.*

*Qubamın tarixini vəcd ilə aldım qələmə,*
*Hələ elm aləminə çox səfərim var mənim.*

*Yazıram tarixini xalqımızın şövq ilə,*
*Bu vətən mülkünə, Şahin, səmərim var mənim.*

İstər münsərihdə

*Versən əgər çiynini sən bu dağın altına*
*Parçalanıb düşməli dağ ayağın altına.*

*Bəsdi daha sevgilim, yazma şer sevgidən*
*Sən qələmi sındırıb qoy varağın altına.*

İstər səridə

*Bir çalağan tək, qoca qartal kimi*
*Sözlə könüllər çalacaqdır yenə.*

*Şeri qəliz dillə yazan şairə*
*Göstərəcək yol ki, çıraqdır yenə..*

İstər xəfifdə

*Bəllisə gər cəzası əğyarın*
*Əhli-Həqqə cəza deyil arzum.*

*İddiam şeri yaxşı yazmaqdır,*
*Başqa bir iddia deyil arzum.*

və başqa bəhr və təfilələrdə Şahin müəllim sadə oxucunun asanlıqla dərk edə biləcəyi tərzdə öz fikirlərini asanlıqla qəzəl diliylə, klassik şerimizin ənənələrinə sadiq qalmaqla çatdıra bilir.

Azərbaycan qəzəlinin saflığı uğrunda mübarizəsini praktiki müstəvidə inadkarlıq və kifayət qədər yüksək professionallıqla aparan Ş.Fazil eyni zamanda qəzəllərində klassik Azərbaycan şerinin poetikasının əksər komponentlərindən (təşbeh, istiarə, məcaz, kinayə, səc', təkrir, cinas, söz sırası, sual-cavab, xitab, mübaliğə, müəmma, təzad, əks, təbdil, qəlb, iştiqaq, inat, məzdus (iczdivac), muvəşşəh (touşih), müdəvvər, müləmmə, tərsi', touzi, həzf, riqta, xeyfa, irsəlül-məsəl, istirdad, iltifat, istihfəm, iham (touriyyə və s) məharətlə istifadə edərək əvəzsiz, bənzərsiz qəzəl nümunələri yaradır.

*Şahinəm, vaxtımı mən boş yerə öldürməmişəm,*
*Vaxtı öldürməyə bir zərrə də vaxtım yoxdur.*

və ya

*Sözünə sünbülü reyhan heyran,*
*Üzünə cümlə gülüstan heyran*

*Nanənin ətrimi var zülfündə*
*Ətrinə gör neçə bağban heyran.*

*Səltənətdə belə canan yoxdur,*
*Bəndənin hökmünə sultan heyran*

bir qəzəlində qara gününü qır sözünə təşbeh edir.

*Bel bükülüb, baş ağarıb, ömrümün*
*Bəlkə də qırdan da qara vaxtıdır.*

və ya

*Mənə adəm kimi insan dedilər, Həvva tək*
*Gəlmisən sanki bu dövranıma göyçək-göyçək.*

və s.

Şahin Fazil həm elmi-publisistik məqalələrində, tənqidi yazılarında, təzkirəsində, eləcə də sayı artıq 6-ya çatmış ancaq Divanlarında, əruz şerlərində dilimizin saflığının qorunması uğrunda illərdi ki, fədakarlıqla mübarizə aparır. Təbii ki, bu mübarizə nəticəsiz deyil. Bu günün əruz ədəbiyyatı artıq ölkəmizdə azərbaycanca daha çox danışır, daha dərin nəfəs alır, azad, sərbəst yaşayır və inkişaf edir. Bu uğurda əməyiniz danılmazdır, hörmətli şairimiz, əruzun **şahini** - **Şahin Fazil**! Bir **Vətəndaş**, bir **şair** və bir **ziyalı-alim** öz ana dilinin zənginləşməsi və inkişafı üçün maksimum nə etməli idisə Siz onu etdiniz və etməkdəsiniz. Çox yaşayın!

**Əli Rza XƏLƏFLİ**
*Şair, publisist,*
*"Kredo"qəzetinin Baş Redaktoru*

## SƏNƏT TAC, SÖZ UCADIR

*"Şahin Fazilin "Divan"larındakı şeirlərin-qəzəl, qəsidə, məsnəvi, qitə, mürəbbe, tərcibənd, müqəttaat, təxmis, təzmin, sürud, müsəbbə', təəsüfnamə, rübailər, təkbeytlər, dördlüklər, səkkizliklər, bayatılar, xoyratılar, mini poemalar və s.-nin əsas məzmunu məhəbbətdir—insana, yerə, göyə, təbiətə məhəbbət. İnsan tənqid edəndə də onu məhəbbətə, məhəbbətlə saflaşmağa, məhəbbətlə yaşamağa çağırır. Özü də deyir: "Hörmətli oxucu! Sən əgər mənim əvvəlki divanlarımı diqqətə oxumusansa, oxuduğun səhifələrdəki şeirlərin, əsasən Eşq mövzusunda olduğunu görmüsən. Yar eşqi, diyar eşqi, ana eşqi, elm eşqi, mütaliə eşqi, millət eşqi, təbiət eşqi və s. Göründüyü kimi, Şərq ədəbiyyatına məxsus yeni şeir formalarından istifadə etmişdir. Əbülqasim Firdovsinin, Əfzələddin Xaqaninin şeirlərinə təzminləri var və ulu Şərqin 50-dən artıq şairinin şerinə təzmin yazmışdır. (Təzmin də qəzəl formasındadır, lakin bir misra və ya bir beyt başqa bir şairdən gətrilir. Belə misra və beytlər şerin əvvəlində, ortasında, sonunda verilə bilir, əksərən şeir həmin beytin rədif və qafiyəsi üzərində qurulur və ya o beyt şerin qafiyə və rədifinə uyğun olur) 17 dəfə İrana səfər etmiş, hər birində silsilə şeirlər ortaya çıxarmışdır. Heca vəznində də bir sıra şeirləri var və "müasir divan" prinsipi ilə onları da divanına daxil etmişdir."*

***Qəzənfər Kazımov***

Azərbaycan ədəbiyyatının elə bir simasından söhbət açmaq istəyirəm ki, onun kimliyini hamı bilsin, hamı onu tanısın və eyni zamanda bildikləri və tanıdıqları qədər də hamı tərəfindən ötəri bir salamla, altdan-altdan xüsusi diqqətdən yayındıraraq ötəri bir nəzərlə "yola salsın".

Təsadüfi deyil buradakı "yol salınsın" sözünü əhatələyən dırnaqlar. Hələ əlli yaşı vardı mən onu tanıyanda. İyirmi il, dədə-baba dili ilə desək, bir igidin tarix yazacaq bir ömrüdür. Və elə yerinə düşən bir etirafdır ki, Şahin Fazil bu iyirmi il ərzində hər ilinə bir igid ömrü yaşayıb öz "Səfərnamə"ləri və "Divan"ları ilə. Qırx günün hər birinə bir əsər yazıb kitab bağlayan Şahin Fazili necə adilər sırasında görmək olar? Əgər

şairin yaradıcılığı onun yaşam yoludursa (tərcümeyi-halıdırsa), elə birinci növbədə bu yaşam yolunun nə demək olduğunu Şahin Fazilin poetik yaradıcılığında görmək olar. "Divan"ları açın, birər-birər çevirin, orada iyirmi ilin, demək olar ki, ayrı-ayrı günləri istisnadır ki, olmaya – hər günün tarixi Şahin Fazilin bir əsərinin altında özünü boy verib göstərir. Poetik bir görüntü ilə dünyanın, həyatın çılğın, mənəvi mühitin poetik mənzərəsi.

Nə demək olar, istedad dəniz dalğasıdır, bəlkə də dənizin sakitlik mərhələsi var,küləksiz anları var. **Amma Şahinin daxili aləmindən sanki əbədi bir alov püskürür, od-alov qalxır.** Açığı, başqalarına deyə bilmərəm, həmişə mənim nəzərimdə Şahin adam cildinə düşmüş bir qırğı kimi görünür. Və həmişə də düşünmüşəm ki, onun insani donu yalançıdır, üzdəgörünəndir. Onun əsl donu tale, bəxt tərəfindən verilmiş və əbədi bir ömrə inamla, güvənclə yaşanan qırğı ömrüdür. Və nə qədər qəribədir ki, onun qırğılığında və şahinliyində mən həmişə bir müdriklik də, fazillik də görürəm. Döyüşkəndir, kiminləsə küçədə mübahisələrdə cəhl etmək onun işi deyil. Onun mübarizəsi də, döyüşü də yaradıcılığında və xüsusilə poeziyasındadır. Qeyrətli kişidir, 20 il bundan əvvəl Şah İsmayılın ünvanına şədyanlar yağış kimi yağanda və bir kimsənin cəsarət edib qabağa durmadığı məqamda Şahin Fazil qırğı cəsarətilə sözün göylərindən süzüb dilindən od yağdırdı. Bəlkə, Vətəni sevməyin, dili sevməyin, sözə əbədi bağlılığın başqa bir görkəmi də var. Qədirşünas bir alim kimi, professor Qəzənfər Kazımov da uzun illərdən bəriki müşahidəkərini "Beş divan" hüzurundakı heyrətqarışıq etirafları ilə günümüzün taleyinə belə yazır: "Qəzəli sadə bir dildə yazmaq, keçmişin qəliz ifadəlik formalarından qaçmaq Şahinin əsas yaradıcılıq prinsiplərindəndir və o, dibaçələrdə təkrar-təkrar qeyd edir ki, onu bu prinsiplərindən uzaqlaşdırmaq olmaz: !Qəzəlimi sadə dillə yazmağım bəzi mühafizəkar qəzəlxanların qəzəbinə səbəb olur və hərdənbir qulağıma onların "tənqidanə" sözləri gəlib çatır. Pərt olmuram. Çünki mən düzgün yoldayam. Qoy yorsunlar öz qəliz dillərini... Ana dili! Anamızın dili! Mən dilimi sidq-ürəkdən sevən adamam. Şeirlərimdən xəbərdar hər bir adam bunu təsdiqləyər". Və təsadüfi deyil ki, professor sözünün sonunu Şahin Fazilin məntiqi ilə yekunlayır.

Bəlkə də, əli qələm tutan hər kəs bu gün Şahin Fazil istedadına, gücünə... onun şahinliyinə, fazilliyinə qibtə edər, daha həsədlərdən, hüsudlardan söhbət açmıram.

Bir Şahin qırğı timsallı nəzərlə (eləcə də ayaqları ilə) bütün Şərqi gəzib-Əfqanıstanı, İraqı, İranı, Türkiyəni... gördüklərini yazıb, duyduqlarını sözə çevirib. Şahin Fazil qədər zamanının ünvanına, tarixin alın yazısına çevrilən ikinci bir sima yoxdur.

... Budur Şahin Fazil, budur Şahinin fazilliyi!

**Səkinə SADİQ**
*Azərbaycan Yazıcılar Birliyinin üzvü,*
*şair-publisist*

## ŞAHİN FAZİLİN "İRAN SƏFƏRNAMƏLƏRİ"

27 noyabr 2013-cü il tarixində İran Mədəniyyət Mərkəzində keçrilən mötəbər görüşdən cəmi bir neçə gün keçir. Görkəmli şərqşünas, İranşünas, tarixçi və tədqiqatçı-alim, professor Şahin Fazilin **"İran səfərnamələri"** adlı möhtəşəm kitabının təqdimatı ilə əlaqədar təşkil olunmuş tədbir təntənəli surətdə və yüksək səviyyədə keçrildi. Mərasimdə Azərbaycanın tanınmış şərqsünas alimləri, yazıçıları, publisistləri, mediya nümaayəndələrilə yanaşı İran İslam Respublikasının da mötəbər şəxsləri və mədəniyyət xadimləri iştirak edirdi. Ibrahim Nuri-İİR-nın Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzinin sədri, təntənəli məclisin açlışını edərək, müfəssəl çıxışından Şahin Fazilin İran səfərləri zamanı tarix, ədəbiyyat və ümümillikdə xalqların mədəniyyətləri qarşısındakı xidmətlərini qeyd etməklə yanaşı onun pak şəxsiyyətindən də söz deməyi unutmadı. Səmimiyyət və qarşılıqlı hörmət ab-havasında keçirilən təqdimat mərasiminin təəssüratı zəngin və eyni zamanda fəxarətvericidir. Hər hansı pafosdan uzaq, duyğulu və eyni zamanda geniş, dolğun, əhatəli çıxışlar, məclisi canlandırdı.

"Nəbz" qəzetinin Baş redaktoru, şair-publisist AMEA Nizami adına Ədəbiyyat İnstitutunun dissertantı Hacı Qurban Cəbrayıl Şahin Fazilin həm məsləkdaşı, həm səfər yoldaşı kimi, yerli-yerində olan müdaxilələri və şairin qəzəllərindən etdiyi iqtibaslarla məclisi məharətlə idarə edirdi. Hacı Qurban Cəbrayıl Şahin Fazillə bir neçə dəfə yol yoldaşı olub və bu səfərlərdə baş vermiş bütün maraqlı hadisələri ciddi xronologiya ilə qələmə alıb. "İran səfərnamələrinin" Ön Söz əvəzindəki yazısında da Qurban Cəbrayıl müəllifin qəzəllərindən sezilən həvəslə, yeri gəldikcə, məharətlə istifadə etmişdir.

Çox hörmətli və sonsuz sayqı duyduğumuz, müəllifin uzun illərin səmimi dostu tədqiqatçı-jurnalisti, "Vahid" poeziya məclisinin rəhbəri Hacı Rafiq Şirvaninin örnək ola biləcək, ən incə diplomatik nöqtələrə toxunan çıxışı, şərqşünas alimlər Tofiq Cahangirovun, Yaşar Əliyevin, Nüşabə Əlizadənin, Əsmət Məmmədovanın...hərarətli çıxışları

məclisi, sözün əsl mənasında, ziynətləndirdi. "Məcməüş-şüəra"nın üzvlərindən hörmətli və əziz şairimiz Gülnara Munisin, gənc və istedadlı şairlər Qasidin, Gülnarə xanımın və bir çox başqalarının çıxışları ilə yadda qalan bu məclis bir daha sözün, şerin qədir-qiymətindən, xalqlar arasında diplomatik körpü yarada biləcəyindən xəbər verdi.

Bu son dərəcə incə və həqiqətən də xalqları yaxınlaşdıran, ülfət yaradan, hətta birləşdirə bilən müqəddəs missiya, bütün dövrlərdə tək-tək yetişən nadir insanların boynuna düşmüşdür. Şahin Fazil məhz o nadir insanlardandır.

Ta qədimdən,bütün dövrlərdə səyyahlar olub və tarix onlara öz yüksək qiymətini vermişdir. Şahin Fazil, möhtərəm Hacı Rafiq Sirvaninin təbirincə desək—zamanəmizin səyyahıdır. Onun müxtəllif beynalxalq elmi konfranslarla, görüş və tədbirlərlə bağlı dünyanın bir çox qitələrinə, Avropa, Asiya, Yaxın və Uzaq şərq ölkələrinə səyahətləri çox məhsuldar olmuş; həm şairin mənəvi dünyasını zənginləşdirmiş, həm ölkənin ədəbiyyat xəzinəsinə yeni-yeni qiymətli səfərnamələr bəxş etmişdir. Şahin Fazil bütün dəvətləri minnətdarlıqla qəbul edir, lakin İrana olan xüsusi məhəbbəti, marağı ona daim yeni İran səfərinin həsrətini yaşadır və belə sətirləri yazmağa sövq edir:

*Göz var ki, doyub sevdiyi cananı seyrdən,*
*Göz var ki, bezib huriyü-qılmanı seyrdən.*

*Şahin gözü doymur niyə İranı seyrdən?*
*Torpağını seyr etməyə gəldim bu diyarın.*

*(Onuncu səfərnamədən)*

Yaxud:

*"Qoca dərviş, yenə İranə səfər var" dedilər,*
*"Ləngimə, get, hələ qəlbində təpər var" dedilər.*

*"Sən ki, şahinliyi tərk eyləmisən, indi isə*
*Tutisən, tutiyə Təbrizdə şəkər var",-dedilər.*

*(On altıncı səfərnamədən)*

Bəllidir ki, bütün zamanlarda, ən şanlı, hüdudsuz hökmranlığı olan hökmdarlar da şeirə, şair sözünə ehtiyac duyublar. Ən zülmkar, qəsbkar hökmdar da anlayırdı ki, onun hökmü yalnız müəyyən bir vaxt kəsiyinə yerləşir. Yalnız poeziya, söz, şeir sultanlığı, zamanın dağıdıcı qüvvəsinin xaricindəndir. Şahın hökmranlığı sərhədlərilə bitir. Söz isə sərhəd tanımır və Şahin Fazil yaradıcılığı buna bariz nümunədir.

Hörmətli alim və tədqiqatçımızın yeni kitabını təqdim edib, yaradıcılığından söz açamamaq məncə qəbahət olar.

**Şahin Fazil yaradıcılığına müxtəsər ekskurs**

Şahin Fazil yaradıcılığı çoxşaxəlidir. O hər janrda öz qələmini istedadına uyğun ustalıqla işlədib: şeir, qəzəl, varsağı, mürəbbe, qitə, sürud, qəsidə... Müəllifin nəsr əsərləri də göz qabağındadır; özünə məxsus dərinliklə, tezisli və konseptual şəkildə ərsəyə gətrilmişdir. Bunlar hamısı öz yerində. Məni Şahin Fazilin yaradıcılığında başqa bir maraqlı nyuans cəlb etdi. Şairin ilkin əsərlərindən tutmuş, "Səfərnamə"lərindəki yazılarınadək nəzər yetirdikdə çox böyük, düşünülmüş və mənalandırılmış patriotizm müşahidə etdim. Onun özünün, şəxsi vətəndaşlıq mövqeyinin olduğunu və bütün sosial hadisələrə məhz öz mövqeyindən reaksiya verdiyini aşkar etdim. Qarabağ, Qara Yanvar, Xocalı faciəsi və s. bu kimi ağrılı-acılı təmkinli, alim və vətəndaş-şair böyük ürək yanqısı ilə ifadə etmişdir:

*Bir gün üzülən canları, al qanları gördüm,*
*Əsgərlərin öldürdüyü insanları gördüm.*

*Gördüm neçə baş cəbr ilə düşmüşdü ciyindən,*
*Qoçlar kimi düşmüş yerə qurbanları gördüm.*

*Çox yerdə ağaclar da üzülmüşdü yerindən,*
*Hətta yaralı evləri, eyvanları gördüm...*

Lakin lirika Şahin Fazil yaradıcılığında öz əsas taxt-tac yerini tutur və həqiqətən də şahanədir.

*Nədir xaliq, nədir məxluq, nədir dövran məhəbbətsiz,*
*Nədir aşiq, nədir mə'şuq, nədir canan məhəbbətsiz.*

*Məhəbbətdir şəfa bəxş eyləyən hər dərdə əlbəttə,*
*Sağalmaz xəstəsi, olsa əgər loğman məhəbbətsiz...*

*Məhəbbət yoxsa adəmda, o adəm xacədir, xacə,*
*Ölər şöhrət, itər qeyrət, susar vicdan məhəbbətsiz...*

*Məhəbbətsiz qocallam mən, məhəbbət duymasam ölləm,*
*Nə ilham xəlq olar canda, nə qaynar qan məhəbbətsiz.*

*Məhəbbətsiz nə vəhdət var, nə birləşmək müyəssərdir,*
*Bir olmaz heç zaman, Şahin, Azərbaycan məhəbbətsiz.*

Onun lirik "mən"i o qədər zəngin və mürəkkəbdir ki, hətta ən intim hissələrindən söz açdıqda belə əsər geniş, dünyəvi panorama ilə birləşib bağlanır. Müəllif hər şeirində, qəzəlində özünü uğurla ifadə edə bilir və hər əsərdə onun zəngin bioqrafiyasının ştrixləri təzahür etmədədir. Necə var, tam səmimiyyətlə.

Şahin Fazil təbiyətinin iki fövqəladə xüsusiyyətini də burada qeyd etmək istərdim: qürur və təvazökarlıq. Adətən, bu xüsusiyyətlər bir-birilə zidiyyətdə olur. Şairdə bu xarakter xüsusiyyətlər rahatlıqla və ən gözəl şəkildə uzlaşır. O, qürurludur, çünki istedadından, intellektual potensialından tam əmindir, lakin rəhbərlik etdiyi "Məcməüş-şüəra"da, müzakirələr zamanı, təkrar edirəm, hələ heç yerdə tanınmayan ən gənc şairlərin də qeydlərini ehtiramla qəbul edir. Bu da onun kübarlığından irəli gəlir.

Ailəsi və qızları ilə bağlı şeirləri xüsusi diqqətə layiqdir və demək olar ki, bütün yaradıcılığını əhatə edir.

*Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,*
*Fikrim, nəzərim sən kimi cananədə qaldı...*

*Dərdim gülü, qeyb eylədi öz ətrini, amma,*
*Yarəb, nə sehrdir ki, ətir nanədə qaldı?..*

*Məşhəddəyəm, hicran yenidən qismətim olmuş,*
*Fikrim yenə Ülviyyə və Şahanədə qaldı...*

Şahin Fazil yaradıcılığı ilə bağlı bir məsələyə də toxunmaq istəyirəm:

**Müəllifin fikrincə bugünkü şeir bu günün dilindən yazılmalıdır. Klassik şairlərimizə böyük ehtiramla yanaşan şair qəzəllərimizdə işlədilən əcnəbi sözlərin əleyhinədir. Dövlətçiliyimizin rəmzlərindən sayılan dilimizin saflığı uğrunda mübarizə onun həyat prinsipidir.**

Mən, oxucularla birlikdə hörmətli alim və qəzəlxan şairimizə perspektivdə olan bütün proyektlərinin uğurla həyata keçirməyini diləyir və yeni-yeni yaradıcılıq zirvələri arzulayıram.

**Zakir MƏMMƏD**
*Şair-publisist*

## ELMİN VƏ ŞEİRİN VƏHDƏTİ

*Tək qəzəl yazmayıram, mən bilirəm quş dili də,*
*Dirilib gəlsə Süleyman, belə e'caz etməz.*

Bu beytin müəllifi şair, qəzəlxan, alim Şahin Fazildir. O bu misralarda özünün ədəbi fəaliyyətinə və janr, üslub barədə ədəbi camedə səslənən müəyyən fikirlərə münasibət bildirir. Klassik üslubun texnologiyalar müasirləşdikcə unudulacağı, oxucu zövqünü cəlb etməyəcəyi barədə müxtəlif cür söz-söhbətlər Sabirdən üzü bu yana deyilməkdədir. Fəqət şeirdə təkcə janr ilə tanınmaq, uğur qazanmaq, yaxud uğursuzluğa düçar olmaq hələ bu vaxtacan heç kəsə müyəssər olmayıbdır. Formadan asılı olmayaraq, ədəbiyyat tarixinə düşmək sənətkarın istedadı və bədii ustalığından asılı olmalıdır. Klassik şairlərimiz təkcə tuyuq, rübai, ya bayatı yazaraq öz varlıqlarını isbat etmişlər. Əruzda, hecada yazıb köhnə sayılmaq, ya yeni şeir şəkilləri ilə müasir olmaq da mümkünsüzdür. Ona görə Şahin Fazil "quş dilini" yaxşı bildiyini deyir və kiçik bir xatırlatma ilə, lakonik formada özünün yaradıcı kredosunu bəyan edir. Doğrudan da, beş divan yaratmış, heca və sərbəst vəzndə yaddaqalan lirik poetik irsə sahib, dərin elmi tədqiqatları ilə tanınan tarix elmləri doktoru, professor Şahin Fazil Fərzəliyevin namı Azərbaycan elmi və mədəniyyəti üçün bir göstəricidir və bu ad hər zaman qəlblərdə iftixar hissi doğurur. Tarix elmi sahəsində araşdırmaları, monoqrafiyaları, dəyərli tərcümələri, o cümlədən, ardıcıl səy və böyük zəhmət hesabına başa gələn mükəmməl "Quba tarixi" əsəri Şahin müəllimin elmi-ədəbi portretini tamamlayan işlərin bir hissəsidir. Şahin bəyin ədəbiyyat sahəsində etdiklərini görmək, göstərmək borcu, vəzifəsi də ədalətli, vicdanlı ədəbiyyat bilicilərinin üzərinə düşür. **Hesab edirəm ki, Şahin Fazilin ədəbi irsinə münasibət hələ onun layiq olduğu səviyyədə müəyyən olunmamışdır.** Şairlərə xas eyhamla özü də bir beytində buna işarə edibdir:

*Hanı şe'rimdə izafət, hanı elmimdə xəta?*
*Şahinin qiymətini Azəribaycan bilmir.*

Bədii sözü araşdırmaq, onun mahiyyətinin nədən ibarət olduğunu öyrənmək və bilmək üçün bir tədqiqat sahəsinin Şahin Fazil olduğunu düşünürəm. İnsanın təfəkkür və nitq mədəniyyətinin ən dərin qatlarını kəşf etməyin ən gözəl vasitəsi ədəbi mətndir. Şahin Fazilin qələmi, üslubu, intonasiyası başqalarından seçilir və oradan müasir həyatımız üçün maraq doğuran, əhəmiyyət kəsb edən çoxlu informasiyaları ala biləcəyimizi qeyd etmək istəyirəm. Yeni çağın rəngbərəng səsli-görüntülü panoram-mənzərələri fonunda orta əsrlər dəbli bir şeir vəzni ilə gündəmə gəlmək riskli sayıla bilər. Hərçənd bu gün qəzəl janrında şeir yazanların sayı az deyil. Lakin "qəzəl köhnədir" fikrini də, "qəzəldə uğur qazanmaq mümkündür" qənaətini də hər adama şamil etmək olmur. Yuxarıda misal gətirdiyimiz beytdə fars dilinə xas qəliz izafət birləşməsindən imtina barədə fikir söylənibdir. Həqiqətən, Şahin Fazilin qəzəl yaradıcılığında müasir həyatımızı əks edən, təmiz, saf ana dilimizin incəliklərinə vaqif olan şair obrazı canlanır.

***Saf şeir yazmaq üçün qəlbə cəfa etdim mən,***
***Nə xeyirxahəm olubdursa cəfanın xeyri.***

Əsərlərini oxuyarkən Ş.Fazilin başdan-başa bu cür cəfalara sinə gərdiyini müşahidə edirik. Ənənəvi divan yaratma təcrübəsinin bədii inersiya ilə yeni formatda nəzərdən keçirilməsi qüdrətli söz adamlarının ixtiyarında və səlahiyyətində olan məsələdir. **Şahin Fazil bütün fəaliyyəti ilə, elm və ədəbiyyat yolunda xidmətləri ilə, dil və poetika xüsusiyyətləri ilə fərqlənən, bəyənilən belə ədəbi simalardan biridir.** Onun böyük zövqlə, həvəslə mütaliə olunmağa layiq qəzəl külliyyatını mən təkcə Şahin Fazil imzası üçün yox, ədəbiyyatımızın tarixi, ədəbi proses üçün lazım olan problematik mənbə və material hesab edirəm. Bizə yaxşı məlumdur ki, qəzəl poetikasına xas romantik üslub uzun illər davam etmiş və məsələ burasındadır ki, bu romantik şeiriyyətin mühafizə olunmasında qəzəlin iştirakı vacib sayılmışdır. Realizm isə heca ilə ədəbiyyatımıza daxil olubdur. Şahin Fazil kimi şairlər qəzəli müasir dünyagörüşün tələblərinə uyğunlaşdıra biliblər. Bir neçə nəfəri istisna etməklə bugünkü qəzəl yazan şairlərimiz Füzuli kimi böyük ustadların cazibəsindən qurtula bilməyiblər və ya qəzəli hələ də əski üsulla – çətin ərəb-fars tərkibləri işlətməklə yazırlar. Şübhəsiz, Şahin Fazil də Füzuli ədəbi məktəbinin davamçısıdır. Hətta məzmunca Füzuli ilə səsləşən

beytləri olsa da, onun öz orijinal dəst-xəttini vaxtında, zamanında təsdiq etdiyini aydın görmək olur. Şahin Fazilin

*Kim sevsə də öz bəslədiyi canı birinci*
*Mən sevmədəyəm sevgili cananı birinci*

beyti Məhəmməd Füzulinin məşhur

*"Canı kim cananı üçün sevsə, cananın sevər,*
*Canı üçün kim ki cananın sevər, canın sevər"*

beytinə yaxın görünsə də, hər şeydən öncə bu iki poetik nümunə arasındakı əsas fərq şeirin ictimai-fəlsəfi məzmunu və bədii metodikası ilə bağlıdır. Birinci beyt aşiqin yüksək səviyyədə fədakarlıq duyğusu, əzmi ilə, ikinci nümunə isə rəy, mövqe, fəlsəfi mühakimə bildirmək xüsusiyyəti ilə diqqət çəkir. Şahin Fazil qəzəli müasir Azərbaycan dilinin qayda-qanunları əsasında yaradan şairlərimizdəndir. Onun qəzəl yaradıcılığının əsas qayəsi realizm örnəklərinə dayaqlanır. Necə deyərlər, onun poeziya gülşənində "ənliyi-kirşanı neylər camalın" yazan M.P.Vaqif realizminin ətri duyulur:

*Sənə bənzər gözələ sün'i gözəllik yaddır,*
*Varmıdır qarə gözə gözdə qəranın xeyri?*

Müxtəlif vəzndə və janrda yazan Şahin Fazilin şeiriyyətinin iki əsas xüsusiyyəti nəzərdən qaçmır. Biz onda "hikmətin fəziləti"(A.Bakıxanov) ilə "nəzmü nazik"in(M.Füzuli) eyni məqamda qərarlaşdığını görürük. Onun tarixşünas fəhmində həyatın həqiqətləri, poetik düşüncəsində həyat təsvirləri, həyatın "əfsanələri" "ələkdən keçirilir", nəticədə kitablara layiq, ürəkləri oxşayan misralar yaranır. Bu misralar onu yazanın sehri, ecazı kimi yadda qalır. Doğrudan da, hər ünlü sənətkarın yazdığı möcüzədir və şairi də, onun təmsil olunduğu toplumu da uzun illər diri saxlayan ədəbiyyatdır.

*Bir zaman mən də əsa gəzdirərəm Musa tək,*
*Dava düşdükdə olar, bəlkə, əsanın xeyri.*

Bu beytin də içəri qatı “qızıldandır”. Sənətçinin çox dərinə baş vurmağı, sözün ən yaxşısını yazıb qoymaq istəyi burada ifadə olunubdur. Şairin, alimin dünya ilə alış-verişi daha çox yaşamaq, ömür sürmək ola bilməz. Elm, sənət adamının davası söz yazmaq, fikir ifadə etməkdir. Bu mücadilədə möcüzə yaratmağın da faydası vardır. Musa Peyğəmbərin sehirli əsasını örnək saymaq şairlərin sözlə təmasındakı özəlliklərlə müqayisə oluna bilər. Bu gün o “sehirli əsaya” sahib olan şairlərdən biri Şahin Fazildir. Digər tərəfdən, bəşəriyyətin uzun-uzun davaları vardır, bundan sonra da olacaqdır və bu böyük davalardan təkcə şairlərin qalib çıxması inandırıcıdır. Başqa şeirində ruhun ölməzliyi barədə fikir söylənir.

*İnsan ölə bilər ruh ölən anda,*
*Elə zənn etməyin öləcəyəm mən.*
*Mənim tabutumu siz aparanda*
*Sizin ardınızca gələcəyəm mən.*

Şahin Fazil poeziyasının Şahin Fazilin adını, imzasını da, ruhunu da hər zaman diri saxlayacağına inanırıq. Şairə uzun ömür, can sağlığı arzulayırıq.

**Sevinc MƏMMƏDOVA**
*Şair-publisist, ZİM.Az-ın xüsusi müxbiri,*
*Azərbaycan Yazıçılar və Azərbaycan*
*Jurnalistlə Birliklərinin üzvü*

## QUBA ƏDƏBİ MÜHİTİ ŞAHİN FAZİLİN SİMASINDA…

Yazıların da şeir kimi gələn vaxtı, ağ vərəqlərə süzülüb taleyini yaşayan zamanı var. Bir də təəssüratın bolluğunda, duyğuların rəngarəng çalarında başını itirməyin… Və yaşantılarından aldığın zövqün zamanını bir qədər uzatmaq istəyin…

Indi o bizdən uzaqdadır və mən duyğularımın durulub, sərbirah olduğu bir fürsətlə onun özü, sözü, şeirləri haqqında bir qədər yazmaq üçün cəməm…

Bizlərdə, "Öz qubalımızdır!" deyirlər dəyər verdikləri insanlar üçün. Bu sözün öz çəkisi, öz ağırlığı var. Barmaqla sayılası qədərdir bəlkə də belə insanlar öz el-obası üçün. Elin bu dəyərinə layiq olan insanlar torpaq qoxulu olur sözün bütün mənalarında. Fitri istedadı ilə ucalır, elinə dəyər gətirir, onun dərdi-səri ilə birgə olur, sevilib seçilir! Uzağa getməyəcəyəm. Tariximizin, sənətimizin Şahin Fazil zirvəsinə boylanacağam bir qədər…

Gəlişinin xoş sorağını almışdıq. Bakıda yaşayır. Sənət adamlarının öz taleyi olur… Ata evləri bizim məhəlləmizdə, evimizdən bir qədər yuxarıda yerləşir. Ana tərəfdən qohumluğumuz da var. Onun haqqında hələ uzun-uzun illər öncə eşitmişdim. Uşaqlıq illərimin ən gözəl xatirələri ilə bağlıdır onların evi. Anamın, nənəmin əlindən tutub bağçaya gedəndə hər səhər bu evin qarşısından keçərdik. Küçə tərəfə açılan, iki-üç pilləkənli balkonları sarmaşıqlı güllərlə əhatələnmişdi. Evin, balkonun qarşısında salınmış dar gül zolağı vardı ki, həmişə çiçəkli, yam-yaşıl olardı. Onların küçəsi də qeyri-adi idi mənim xəyallarımda. Hündür, qocaman ağaclarla sıralanmışdı səkiləri. Göyün üzü görünmürdü baş-başa əyilən ağaçların budaqlarından. Yaşıllıqlar içərsində yerləşən taxta balkonlu, birmərtəbəli kərpic ev sirli görünürdü, sanki… Sonralar mən özüm kiçik bacı və qardaşlarımı bu yolla bağçaya aparıb-gətirər, maraqla bu evin qarşısından keçər, hərdən də balkonun məhəccərinə söykənib dalğın-dalğın siqaret çəkən uca boylu, yaraşıqlı bir şairi seyr edərdim. Bu Şahin müəllimin qardaşı Maqbet Fərzəliyev idi. Hərdən yanında duran dostlarına, yaxınla-

rına şeir söyləməsinə nəfəs dərmədən diqqət kəsilərdim. Şahin müəllimin şeirlərini, qəzəllərini dayım və anam əzbər bilirdi. Nənəm bu ailə haqqında həmişə ehtiramla danışar, Bakıya köçüb gedən, Əfqanıstanda "hörmətli qulluqda" olan şair-qəzəlxan Şahin Fazil haqqında ağız dolusu danışardı. Mən orta məktəbi bitirəndə Şahin Fazili, necə deyərlər, müəyyən qədər oxumuş, haqqında məlumatlanmışdım. Şeirləri, qafiyələri də təbiəti kimi "gəlişi ağır", təmkinli, düşündürücü idi. Dədə Qorqud havası vardı bu şeirlərin, oğuz eli igidlərinin, ərənlərin nəfəsi duyulurdu misralarda…

*Bu haray adi haray,*
*Bu səs adi səs deyil.*
*Nə qədər ağlasaq da*
*Bu gün bizə bəs deyil,*
*Ağlamayaq, kişilər!*

*Harayımda qəzəb var,*
*Qəzəbimə səbəb var:*
*Bu—intiqam harayı,*
*Bu—intiqam səsidir,*
*Bu gün ağlamaq deyil,*
*Savaşmaq vədəsidir,*
*Ağlamayaq, kişilər!*

Sonralar diktor və ədəbi işçi kimi çalışdığım Quba yerli radiosu ilə şeirlərini oxumuşdum çalışdığım redaksiyada, Qırmızı Qəsəbədə yerləşən beynəlxalq "Birlik-Edinstvo" qəzetində dəfələrlə haqqında məqalə, şeir və qəzəllərini dərc eləsək də, özü ilə yaxın tanışlığım yox idi. Ta ki, ustad şair Ramiz Qusarçaylının Qubada təsis və rəhbərlik etdiyi "Ay işiği" ədəbi məclisinə qoşulub, tədbirlərində iştirak edənədək.

Şahin müəllimlə ilk görüşümüz bir neçə il bundan əvvəl Bakıda Səməd Vurğun adına rus dram teatrında keçrilən Quba günlərində oldu. Ramiz müəllim məni təqdim edib, Sevinc də Qubadandır, söylədi, redaksiyada çalışır, jurnalistdir, dedi. Üzümə zəndlə baxıb, mehribanlıqda əlimi sıxdı. Başı qarlı Şah dağını xatırlatdı mənə şair, duruşuyla! Nurani çöhrəsi sanki işıq saçırdı... Gəncliyinin od-alovunu qoruyan canlı gözləri, aydın baxışları zəngin daxili dünyasının güzgüsü idi, elə bil!

Sənət, dostluq görüşləri, kitab təqdimatları davam etdikcə Şahin mü-

əllimlə görüşmək fürsəti əldə edir, bir-birindən maraqlı çıxışlarını, söhbətlərini dinləyir, şeirlərinə qulaq asırdım. Mən bəlkə də sənətdə Şahin Fazil qədər ciddi, tələbkar ikinci bir müəllim görməmişəm. Xoşuna gəlməyən, zəif şeiri həmən üzünə deyəcək, bəyəndiyi sənət nümunələrini xəsislik etmədən tərifləyəcək, fikir söyləyib, rəy bildirəcək, doğru yola yönləndirəcək yazanı.Onun qarşısında şeir oxumaq əməlli-başlı riskdi, imtahandı. Mən bu yazımla bağlı şair haqqında daha ətraflı araşdırma aparmaq üçün onun vikipediyasına müraciət edim. Qısa tanışlığım belə oldu:

"Şahin Fazil oğlu Fərzəliyev 27 mart 1940-ci ildə anadan olmuşdur. 1958-ci ildə orta məktəbi bitirdikdən sonra Bakı Dövlət Universitetinin Şərqşünaslıq fakultəsinə daxil olmuş, 1964-cü ildə oranı fərqlənmə diplomu ilə bitirmişdir. Müxtəlif illərdə Əfqanıstanda tərcüməçi və oxuduğu fakultədə dekan müavini vəzifəsində fəaliyyət göstərmişdir. 1970-1973-cü illərdə Elmlər Akademiyasının Tarix İnstitutunun əyani aspiranturasında təhsil alaraq, 1974-cu ildə namizədlik dissertasiyasını müdafiə etmiş, 1974–78-ci illərdə bu institutun "Orta əsrlər tarixi" şöbəsində elmi işçi vəzifəsində çalışmış, sonra institutun baş elmi işçisi olmuşdur. 1978-82-cü illərdə 3-cü dəfə Əfqanıstanda tərcüməçilik fəaliyyətini davam etdirmiş, vətənə qayıtdıqdan sonra həmin institutda aparıcı və baş elmi işçi vəzifəsində işinə davam etmişdir. 1985-88-ci illərdə 4-cü dəfə Əfqanistanın Nazirlər Şurasında SSRİ-nin Baş Müşaviri və ölkənin Baş Nazirinin mütərcimi olaraq daha 3 il çalışmışdır.

1996-cı ildə "Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə" mövzusunda doktorluq dissertasiyasını müdafiə etmiş, 17 yanvar 1997–ci ildə tarix elmləri doktoru alimlik dərəcəsi almışdır. 2004–cü ildə isə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə professor elmi adına layiq görülmüşdür.

Hazırda Tarix İnstitutunda "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinin müdiri vəzifəsində fəaliyyət göstərir. Həm də görkəmli şair olan Şahin Fazil beş "Divan" bağlayıb... Özünün dili ilə desək, bu "Divanlar" ona ərsəyə gələnə kimi divan tutub... İlk mətbu "Divan"ı 1996–cı ildə çap olunub.

Görkəmli alim 140 yaşlı "Məcməüş–şüəra" ("Şairlər məclisi") ədəbi məclisinin tarixini yazmış və onu "Təzkireyi–Şahin" adı ilə nəşr etdirmişdir. 1998-ci ildən "Məcməüş–şüəra"nın sədridir. Şeirləri Əfqanıstan, Iran, Türkiyə, İraq və Yaponiyada çap olunmuşdur.

Şahin Fazil namizədlik və doktorluq dissertasiyasıyalarının müda-

fiəsindən sonra çoxsaylı elmi məqalə çap etdirmişdir. Azərbaycan Sovet, Naxçıvan və Üzeyir Hacibəyov Ensiklopediyalarında 100–ə qədər məqalənin müəllifidir. Yeddi cildlik "Azərbaycan tarixi" kitabının müəlliflərindən biri olan Şahin Fazil Azərbaycanın orta əsrlər tarixinin müxtəlif məsələlərini araşdıraraq, öz sözünü demişdir. Hazırda İnstitutun yazdığı üç cildlik "Azərbaycan tarixi" kitabının müəlliflərindən biridir.

Şahin müəllim bir neçə monoqrafiyanın, o cümlədən Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsəri Azərbaycan tarixinin mənbəyi kimi (Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" üzrə), "Azərbaycan və Osmanlı imperiyası XV–XVI əsrlərdə", "Quba tarixi", "XV əsr Azərbaycan dövlətlərinin quruluşu", həmçinin bir neçə fənn proqramı və dərs vəsaitinin müəllifidir.

Professor Şahin Fazil son illərdə tərcüməçilik fəsliyyətini daha da genişləndirmiş, fars dilində yazılan iki böyük Azərbaycan tarixçisinin məşhur kitablarını dilimizə çevirmiş, onlara sanballı "On söz" başlıqlı məqalələr, geniş şəhrlər yazmışdır. Həmin kitabların birincisi XVI əsrin ikinci yarısı–XVII əsrin birinci rübündə yaşan və Azərbaycan Səfəvilər dövlətinin tarixinə dair faydalı tarixi qaynaq qələmə alan Isgəndər bəy Münşinin "Tarixe-aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") əsərinin mükəmməl tərcüməsidir. Əsər 2010 və 2014-cü illərdə 2505 səhifədən ibarət çap olunmuşdur. Ikinci qaynaq isə Həsən bəy Rumlu kimi Səfəvi dövrü tarixçisinin məşhur "Əhsənüt–təvarix" (Tarixlərin ən yaxşısı) salnaməsidir. O həm də Jozef Tiflisinin "Vaqiati- Mir Veys və Şah Sultan Hüseyn" və Yan Tadeuş Kruşinskinin "Xristian səyyahın tarixi" kimi dəyərli mənbələrin tərcüməçisidir. (1992-1993-cü illər).

Şahin Fazilin yaradıcılığı, araşdırmaları, göründüyü kimi, çoxşaxəlidir. O bir tərəfdən ümumi tarixlə bağlı kitablar nəşr etdirmiş, digər tərəfdən isə Azərbaycan tarixinə dair müxtəlif dillərdə olan ilkin mənbələrin Azərbaycan dilinə tərcüməsi ilə məşğul olmuş, bunlardan başqa daha iki tarixi əsəri fars və osmanlı dillərindən dilimizə çevirərək çap etdirmişdir. **O Azərbaycan xalqının vətənpərvər övladı və tanınmış alim kimi Azərbaycanın tarixi problemlərini istər ölkə daxilində, istərsə də xaricdə işıqlandırmış, çıxış etdiyi ölkələrdə Azərbaycanın tutduğu mövqeyi cəsarətlə müdafiə etmişdir.**

Şahin Fazil gənc elmi kadrların yetişdirilməsi sahəsində çox səmərəli fəaliyyət göstərir. Ondan çox kitabın elmi redaktoru olmuş, əlliyə yaxın tarix üzrə fəlsəfə doktoru və tarix üzrə elmləri doktoru dissertasiyalarına op-

ponentlik etmişdir. Ümumilikdə otuz səkkiz bədii, elmi və tərcümə kitablarının müəllifi, 1997-ci ildən Azərbaycan Yazıçılar Birliyinin üzvüdür.

*Əsəblər çəkilib yerdə tarıma,*
*Şahin pərvazına göy intizar ki...*
*Gəl, səni götürüb qanadlarıma*
*Aparım göylərə, yerdə nə var ki?*

Ramiz Qusarçaylı zəng edib mənə bildirəndə ki, Şahin müəllimin yerli yazarlarla görüşü olacaq, sevindim. Bilirdim ki, şeirlərinin qanadlarında ustad yenə də bizi yerlərdən ayıracaq...

O yenə də bizimlə idi! Görüşünə onu sevənlər toplanmışdı. Onu təqdim etməyə ehtiyac olmasa da "Ay işığı" ədəbi məclisimizin sədri, şəxsiyyət və yaradıcılığına böyük dəyər verdiyi Ramiz Qusarçaylı şairin yaxın zamanlardakı yaradıcılığından söhbət açdı, nəşr olunan kitablarını, uğurlarını sadaladı. Qeyd eləmək yerinə düşər ki, sənətdə və həyatda yaxın dostu, sirdaşı olan Ramiz Qusarçaylıya 70-a yaxm şeir həsr edən ustad onunla hər zaman qürurludur! "Ramiz" deyərək müraciət etməsində də bir doğmalıq, ehtiram var...

*Gündüzə, axşama ey vurğun yazar,*
*Ey coşqun sənətkar, ey çılğın yazar,*
*Şeir sənin Leylin, ey Məcnun yazar*
*Ramiz Qusarçaylı, axşamın xeyir!*

*Canında çağlayır ilham, yazırsan,*
*Ətalət hissinə e'dam yazırsan,*
*Gündüz düşünürsən, axşam yazırsan*
*Ramiz Qusarçaylı, axşamın xeyir!*

Şair sevgiləri, dostluqları silinməz olur, axar bulaq kimi qurumur, tükənmir. Bu sevginin kökünü araşdırmaq o qədər də asan deyil:

*Bu nəzər səmimi, bu köz səmimi,*
*Bu söz tə'rif deyil, bu söz səmimi,*
*Az şair görürəm indi sən kimi*
*Səni yaşatmağa tələsirəm mən.*

*Mənəm sənin dostun, dost dosta hayan,*
*Şahın, dost yolunda ha çalış, ha yan!*
*Qubiya gəlmişəm çıxıb Bakıdan*
*Səni yaşatmağa tələsirəm məni*

Biz onu dinləmək istəyirdik, o isə bizi… Hər birimiz ustadın qarşısında hesabat verirmiş kimi idik. Quba ədəbi mühiti Şahin Fazil simasında təmsil olunurdu, sanki..!

**Gülnaz QUBALI**
*Şair-publisist*

## ŞAHİN FAZİL YARADICILIĞINA SÖZÜM

"Hər bir insanın üzü bir kitabədir" deyir İmadəddin Nəsimi.Öz qeyri-adi görünüşü ilə insana bağışladığı hisslər elə bu şəxsin qeyri-adiliyindən xəbər verir.Allahdan sonra qeyri-mümkünü mümkün edən insan təfəkkürü nələrə qadir deyil? Yaradıcı-sənətkar şəxsiyyəti bəşəri kamillik kəsb edir ki, bu adı Şahin Fazil öz varlığı və əsərləri ilə insanlara aşılamış, doğrultmuş, sənət dünyasına möhür vurmuşdur.

Şairin ümumilikdə 40 kitab müəllifi və ikinci nəfəs verdiyi tərcümələrinin olduğunun şahidi oldum. Onun 5 divanını isə heç düşünmədən əsrin "5 inci"si adlandırmaq olar.

Bətənindən uzaqlarda Yaponiya və Əfqanıstana səfərləri isə xüsusi diqqət cəlb edir.Eyni zamanda bu xalqlara xidmətləri ilə birlikdə yaradıcılığa geniş yer verməsi, onun nə qədər əhəmiyyətli bir şəxs və şəxsiyyət olduğunu da bariz şəkildə nümayiş etdirir.

Çox elmli, dərin və incə düşüncəli şair çox şaxəli üslublara müraciət edərək 50 il qələmi özünə "həmdəm" seçib, yaradıcılığı ilə beyinlərdə dərin izlər buraxmışdır. Şahin Fazil yaradıcılığı az adama məxsus və qismət olan, ürəkləri çox incəliklə sehrləyən yaradıcılıqdır.

Əgər şair olmaq üçün şair doğulmaq lazım isə, bu" Şahin Fazildir".

Elə bil Allah ona bu uzun ömrü elə yazıb-yaratmaq üçün bəxş etmişdir. Şahin Fazil Azərbaycan xalqı üçün bir tapıntı, kəşfdir. Coşub-daşan, qəlbində dünyalar yerləşən, atəşli bir ürəyə sahib olan Şahin Fazil özünü təsdiqləmiş şair, tükənməz xəzinədir. İsanlığa bəzək vuran yaradıcılığı və öz dəsti-xətti ilə tanınaraq, tam mənası ilə insanın könül dünyasını oxşayır.Tam məsüliyyətimlə deyə bilərəm ki, elə bil bu şair hərflərə, sözlərə deyil, hərflər birləşərək söz əmələ gətirib ona tabe olurlar.Və nəticədə isə ideal ruhlu böyük əsərlər meydana gəlir.

Bu böyük şairin şerlərində məzmun zənginliyi və ideya dərinliyi daha cox diqqəti cəlb edir ki, bu da onun daxili zənginliyindən xəbər verir.Qafil ürəklər dünyasına daxil olaraq, insana həyat eşqi bağışlayır.Xüsusi ahənglə yazılan minacat Allahın mədhi və nətlərindən açıq-aydın peyğəmbərin mədhi görünür ki, Şahin Fazil poeziyasının mehvəri, qibləsi ilk öncə

Allah, sonra peyğəmbərimiz Məhəmməd, daha sonra isə yer üzünün əşrəfi olan insandır.

Əsərlərində mənlik, qürur hissi, təvözakarlıq yaşayır və nadir cəhətləri ilə fərqlənir. "Azərbaycanın cənnəti Qubada ilhama gəlirəm, Quba torpağını Kəbə torpağı qədər sevirəm", deyən şair, elə məhz "Quba tarixi" kitabını yazmaqla, öz xalqına töhfə etmiş, böyük rəğbət qazanmışdır.

Şahin Fazilin kitabları mirasdır və nəsildən-nəsilə ötürülməlidir.

Vicdani səlahiyyətlərini öz üzərinə götürən vətənpərvər, təəsübkeş şair Qarabağ dərdini də öz ürəyində daşıyır.

Bu böyük şairin kitablarını, əsasən stolustü kitablar cərgəsinə aid etmək olar.

Yaradıcılığını yüksək qiymətləndirərək demək istəyirəm ki, "Şairi yaşadan onun sözüdür və tarix elə bir əsrarlı zamandır ki, daşları yerinə qoymağı bacarır, zəhmət isə heç vaxt itmir".

Sözümün sonunda isə deyirəm ki, tarix sizin kimi şəxsiyyətlər yaradır, sizin kimi şəxsiyyətlər isə tarix.

Ad gününüzü təbrik edir və yaradıcılığınızda yeni-yeni nailliyyətlər arzulayıram. Qələmi qiymətləndirən, qələm tutan əlləriniz var olsun, Şahin müəllim.

Sözümü Sizin yaradıcılıq nümunələrinizdən olan sevdiyim "Ömür" adlı şerinizlə bitirirəm.

*Yaxşıdı ki,*
*adamların arasında*
*yaxşı çox,*
*Yamandı ki,*
*yamanların sırasında*
*yaxşı yox.*

*Elə mənhus adam var ki,*
*sinəsində ürək deyil,*
*daş vurur,*
*Biçinçi ot biçən təki*
*Boyun biçir, baş vurur.*

*Elə acı görüş var ki,*
*hicrandan da ap-acı*

*Elə zəqqum öpüş var ki,*
*Dərmandan da ap-acı.*

*Elə ölməz ölüm var ki,*
*elə şərəf, elə şan.*
*Elə məhrəm zülüm var ki,*
*Istəmirik ola yan.*
*Elə uzun ömür var ki,*
*Ömür deyil, kömürdür.*
*Elə qısa ömür də var*
*Ö m ü r d ü r!*

**Murad MURADOV**
*Quba*

## MƏN NECƏ BAĞDAN ÇIXIM...

Bir neçə gün bundan öncə Facebook hesabımın mesaj bölümündə tanınmış şair Ramiz Qusarçaylıdan "Ay işıqı" ədəbi məclisinin növbəti tədbirinə dəvət aldım. Açığı bu mənim üçün gözlənilməz oldu. Adətim üzrə, istirahət günüm olsa da, tədbir başlamazdan əvvəl həmən məkana yetişib tədbirə qatıldım. Qubanın "Gülüstan", Xaçmazın "Ulduzlar", Şabranın "Şabran" ədəbi məclisləri, eyni zamanda bölgənin tanınmış aydınları da "Ay işığı" ədəbi məclisinə dəvətli idilər və çox maraqlı ədəbi görüş olacağı elə ilk andan hiss olunurdu.

Tədbir şair-tərcüməçi, "Divanlar Xəmsəsi" adlandırılan beş divan və qırxa yaxın kitabın müəllifi, şərqşünas–alim, tarix elmləri doktoru, professor Şahin Fazilin qarşıdan gələn səksən illik yubileyi ilə əlaqədar olaraq düzənlənmişdi. Etiraf edim ki, Şahin Fazilin qubalı olduğunu bilsəm də, yaradıcılığı ilə yaxından tanış deyildim və buna görə özümü qınadım da.

Nə gizlədim, tədbir başlamazdan əvvəl iştirakçılar arasında ən çox diqqətimi çəkən orta boylu, çox sadə geyimli, eyni zamanda baxımlı, səliqə-sahmanlı əsil azərbaycan ağsaqqalı– Şahin Fazil oldu...

Nəhayət, maraqla gözlədiyimiz tədbiri istedadlı şairimiz Ramiz Qusarçaylı açıq elan etdi. O, Şahin bəyin uzun illər boyu apardığı zəngin elmi–tədqiqat işlərindən, tərcümələrindən, dolğun bədii yaradıcılığından söhbət açdı, Azərbaycan şərqşünaslığına, tarixinə verdiyi töhfələrdən, ötən əsrin 50-ci illərindən başlayaraq dövrü mətbuatda müntəzəm çap olunan əsərlərindən bəhs etdi. Maraqlı çıxışı əsnasında Ramiz müəllimin vurğuladığı bir detal məndə şok effekti yaratdı. Bu barədə sonra...

Şahin Fazilin özünə məxsus saç düzümü, bənzərsiz saqqal forması ilk baxışdan mötəbər, müdrük azərbaycanlı obrazı yaradır. Bu, danılmazdır. Mənə elə gəldi ki, elə 50-60 il əvvəl də o, bu obrazda olub, dəyişməyib, səksəninə, doxsanına, yüzünə də bu cür müdrik, nurani simalı ağsaqqal kimi qədəm qoyacaq!

Yaxınlaşıb əlini sıxıb görüşəndə əzəməti, insana həyatı sevdirən müsbət aurası elə xoş, isti hisslər yaradırdı ki, ətrafındakılar onunla həmsöhbət olmaqdan yorulmurdu. Şahin baxışlı, Şahdağ əzəmətli, nurani in-

san aram–aram danışdıqca ona heyran olmamaq mümkün deyil. **Sənətkarla ilk görüşüm olduğundan bu isti münasibəti gənc yazar kimi daha çox hiss etdim. Şahin Fazil gənclərin dostudur. Düşünsək ki, adam ömrünün səksənindədi, hələ də yazıb-yaradır, heyran olmaya bilmirsən!**

Mən Şahin Fazil yaradıcılıqından danışmayacam. İstəyən insan internet vasitəsi ilə onun həyat və yaradıcılığı barədə tutumlu, dolğun məlumatlar ala bilər və bu yazdıqlarımın gerçəkliyinə şübhə etməz.

Qayıdaq yuxarıda qeyd etdiyim, Ramiz bəyin məndə, bəlkə də iştirakçıların çoxunda şok effekti yaradan həmən detala.

**El şənliklərində, televiziya kanallarında eşitdiyimiz, dinləyib sevdiyimiz bir mahnı—hamımızın xalq mahnısı kimi tanıdığımız "Bağiban" mahnısı, sən demə hörmətli həmyerlimiz Şahin Fazilin sözlərinə bəstələnibmiş. Sevimli müğənnimiz, rəhmətlik Məmmədbağır Bağırzadənin bəstəsi illərdi ürəklərə yol tapıb, onlarca müğənni tərəfindən indi də sevgiylə oxunur, minlərlə kaset, disk satılıb, amma sözlərin müəllifinin adı çox az qeyd olunur. Bu, məni bir qubalı kimi həm sevindirdi, həm də heyfsləndirdi. Axı necə ola bilərdi ki, illərdi xalq mahnısı kimi dinlədiyimiz, ürəkləri riqqətə gətirən mahnının müəllifi kimlərinsə etinasızlığından, bəlkə də qısqanclığından unudulsun? Bəlkə də bu, Şahin müəllimin ucalığından, təvəzökarlığından irəli gəlib, "bunun müəllifi mənəm!" deməyib?!**

O da var ki, şairlərin çoxu buna məhəl qoymur, yetər ki, tanınan, sevilən bir müğənni sözlərinə musiqi bəstələsin, oxusun.

Mənfur qonşularımızın hər gün bir xalq, bəstəkar mahnımızı özününküləşdirdiyi bir zamanda buna imkan vermək ürək sızladır. "Anonim", çox vaxt da "xalq mahnısı" adıyla.

Mən Şahin Fazil yaradıcılığı ilə tanış olmadıqım üçün özümü qınadım.Və Şahin müəllim mənə daha da doğmalaşmağa başladı.

*Bağiban, ay bağiban, bağə nigarım gəlir.*
*Mən necə bağdan çıxım, indicə yarım gəlir...*

Şahin Fazil cənnətə döndərdiyi məkanda – bağ—baxçasında səbirsizliklə yarının yolunu gözləyən insanın keçirdiyi həyəcanlı təlaşı, yarına olan sevgisini çox möhtəşəm tərənnüm edib. AIlah rəhmət etsin, Məmmədbağır Bagirzadə isə ecaskar səsi ilə bu şeirə bir başqa zənginlik qatıb. Bir diqqət edin:

*Bəslədiyin güllərə, göz ucu da baxmaram,*
*İnsafın olsun sənin, gör necə varım gəlir...*

Sevgilisinin gəlişindən riqqətə gələn bağbanın, hətta, illərlə sevə-sevə bəslədiyi, qulluq etdiyi gül–çiçək də gözündə deyil. Təkcə istədiyi sevgilisinin gəlməsidi. O gələrsə, bağ da bir başqa gözəllik alar. Mən Şahin Fazilin sevgisinin dərinliyini, əzəmətini tərənnüm etmək də çətinlik çəkirəm.

Sonda onu demək istərəm ki, yaşamaq-yaratmaq eşqiylə yanıb-alışan bu insanın içində işıq vardır. Ondan yazmaq belə insana bir ayrı hüzur verir. Mən də gördüklərimdən təsirlənib bu mətndə öz hislərimi tərənnüm etməyə çalışdım.

**İnsanlara sağlığında, yanımızda olarkən qiymət verməliyik, onun sənətini dəyərləndirməliyik. Bunu bacarsaq, hərə layiq olduğu yerdə görünəcək.**

Quba ədəbi mühiti adından gözəl şair, alim, tədqiqatçı Şahin Fazilin qarşıdan gələn səksən illiyini ürəkdən təbrik edir, ona indiki coşquyla yazıb – yaratmağı arzu edirəm.

**Sizi vaxtında, dəyərincə tanımayan gəncliyi bağışla, ustad !**

Şahin Fazil haqqında hələlik son sözüm:

Bağban bağ-bağçada çalışsan zəhmətkeş fərddir. Şahin Fazil də bağbandır. O qəzəl bağbanıdır, çağdaş qəzəl gülüstanının saflığı uğrunda cəngavər kimi cəngə çıxan və mühafizəkar qəzəlxanlarla daim döyüşməkdə olan bağbandır! Bağban onun yaratdığı "əsas qəhrəman" obrazlarındandır. Şair bir qəzəlində bağa daxil olmasından ötrü bağbandan icazə istəyib deyir: Bir qədər siyasi məzmunlu digər qəzəlində də Şahin Fazil ona bağbanlığın həvalə olunasından ötrü yenə icazə istəyir və fikrini belə əlaqələndirir:

*Qoy mən də girim bağına, bağban, ver icazə,*
*Bağ içrə gəzişməkdədi canan, ver icazə.*

*İmkan neçə müddətdi müyəssər deyil idi,*
*Düşmüşdür ələ indisə imkan, ver icazə.*

*Mən tapdamaram gülləri, zillətlə böyütdün,*
*Üzmüş səni zillət, məni hicran, ver icazə.*

*Güllükdə gəzən naz ilə bir güldə gözüm var,*
*Güllər şahı, ey güllərə sultan, ver icazə.*

*Gül hüsnünü güllər bürüyübdür o nigarın ,*
*Görmək dilərəm hüsnünü çoxdan, ver icazə.*

*Vəsf eyləyərəm mən səni bir gün qəzəlimdə,*
*Ey mən kimi zəhmətsevər insan, ver icazə.*

*Bağban, bürüyər aləmi naləm, izn eylə,*
*Yoxsa ucalar göylərə əfğan, ver icazə.*

*Qurban eyləyər kim canı Şahindən əlavə?*
*Şahin sənə, bağban, ola qurban ver icazə.*

**Z.MÜRSƏLOV**

## YENƏ GÖRÜŞƏRİK

“Şahin Fazil”... Bu ad nəinki rayonumuzun, eləcədə respublikamızın oxucularına şeir sevərlərinə yaxşı tanışdır. Ömrünün orta yaşında olan ,bağlar diyarı Qubada dünyaya göz açan, burada orta məktəb bitirən şairin yolu ali məktəbdən , aspiranturadan keçmiş, müxtəlif fasilələrlə 13 il qürbət diyarda — Əfqanıstanda keçirmişdir. Həmyerlimiz onlarca əfqan ədəbini şeir və nəsr nümunələrini doğma dilimizə çevirmiş, eləcədə bizim janr və yazıçıları Kabul oxucusuna onların öz dillərində tanıtdırmışdır.

Qürbətdə xeyli yaşasa da Vətən, ana torpağa, doğma Qubaya, onun gözəlliklərinə sədaqət və məhəbbət Şahini bir anda olsa tərk etməmişdir.

Dəri (fars) dilindən tərcümə edə-edə Ş.Fazil öz yaradıcılığına da diqqət yetirmişdir. Onun şeirlərindəki qürbət mövzusu, vətən yanğısı, lakoniklik; bədii pafos, lirik duyumlar çox güclüdür.

Ötən il «Yazıçı» nəşriyyatı həmyerlimizin «Yenə görüşərik» adlı şeirlər toplusunu çapdan buraxmışdır. Bundan əlavə Ş.Fazil əvvəllər «Qəzəllər», «Dünya», «Zəfər təranələri» almanaxlarında da oxucusu ilə öz kövrək hisslərini bölüşdürmüşdür.

Şairin bu kitabı «Yaralı yuxular», «Qoşmalar», « Bayatılar» və «Qəzəllər» bölmələrində oxucuya təqdim edilmiş, ön sözü isə şair H.Həsənzadə «Təki görüş olsun.. » adı altında yazmışdır.

Məhəbbət lirikası, siyasi fikirlə yanaşı Ş.Fazildə fəlsəfi meyil də çox güclüdür.Onun «Suallar » adlı şeirində oxuyuruq.

*Təbiətdə insan,insanda fikir,*
*Fikirdə suallar yaranmaqdadır.*

«Əfqanıstan fəqanı» silsiləsindən olan şeirlərində qürbətdə Vətənin necə şirinliyi, insanın insana qənim kəsilməsi, qan axıdılması təsvir edilir, lakin qürbət ağrısı daha çoxdur: «Qürbətdə » adlı şeirində biz bunu bir daha görürük:

*Neçənci bahardır mən qürbətdəyəm,*
*Vətən həsrətindən gəlmişəm zara,*
*Ürəkdən pərəstiş edirəm bu dəm*
*Vətəndə çalışan vətəndaşlara,*

Ana təbiətin, göylərin maviliyinin ahənginin pozulması da şairi narahat edir: «Əgər belə getsə... » şeirində yazır:

*Səmanın bağrını mərmi dağıdır,*
*Torpağın ağuşu dərd, ələm çəkir.*

Ş.Fazilin qoşmaları da klassik qoşmalardan fərqlənir, onlarda müasir poeziya, lirizm, lakoniklik daha çoxdur. Şair bu qoşmalarda təbiəti də, məhəbbəti də, Vətəni də,tərənnüm etməyə qadirdir.

*Bu gözəl dünyanın qədrini bilək,*
*Dünyada insanın qədrini bilək,*
*Gözəlim, hər anın qədrini bilək,*
*Məgər ölmürükmü hər an bir azca?*

Şairin bayatılarırna gəlincə isə onlar Azərbaycan xalq yaradıcılığının zənginləşməsinə doğru atılan poetik addımlardandır. «Gəncə bayatıları», Qarabağın tərənnümü , saf sevgi, vətəndaş məfhumu bu bayatıların canı-qanıdır.

Qəzəllərində Ş.Fazil Nizami, Füzuli, Vahid yaradıcılığından bəhrələnmiş, lakin öz poetik üslubunu qoruyub saxlamışdır. Müasirlik—həmin qəzəllərin əsas qayəsidir, ruhudur. Aşiq məşuq iztirabı, təbiətin, onun gözəlliklərinin məharətlə tərənnümü burada da özünü göstərir:

*Gəz ki, Azərbaycanı, ey pəri əntiqədir.*
*Göy gölünə tay hanı? Tərtəri əntiqədir.*

Azərbaycanın gözəl guşələri, eləcə də şairin doğulduğu torpaq klassik şeir forması olan bu qəzəllərdə məharətlə poetik tərzdə qələmə alınıb.

Ümumiyyətlə kitab çox maraqlıdır və biz də Şahin Fazilə ön söz müəllifi Nəriman Həsənzadənin dili ilə deyirik: «Şahin, yenə görüşərik!»

***(Quba. "Şəfəq" qəzeti,***
***25 avqust 1990)***

**Fəridə TAĞIYEVA**
*AMEA A.A.Bakıxanov adına*
*Tarix İnstitutunun əməkdaşı*

## MƏNİM MƏNƏVİ BABAM — ŞAHİN FAZİL

Şahin Fazil deyəndə ağlıma gələn cümlə atalarımızın "Alim olmaq asandır insan olmaq çətin" sözləri gəlir... Bəli, Şahin Fərzəliyev mənim şöbə müdirim gözəl insan yaşı artıq 80 olsa da qəlbinin təmizliyi saflığı sanki bir uşaq...

Şahin müəllimlə ilk tanışlığım 2016-ci ildə oldu. Bakı İslam Universitetini bitirib Azərbaycan Milli Elmlər Akademiyası A.A.Bakıxanov adına Tarix İnstitutununa işə girdiyim il əvvəl başqa şöbədə laborant olaraq çalışırdım. Sonra akademik Yaqub Mahmudovun tövsiyəsi ilə "Mənbəşünaslıq və tarixşünaslıq" şöbəsinə göndərildim. Düzü əvvəl çox həyacanlandım, amma mənə dedilər Şahin müəllim olacaq şöbə müdirin haqqında o qədər gözəl sözlər eşitdim ki, bu müəllimi tanımaq istəyirdim. Və nəhayət İradə xanımla birgə gəldik yuxarıda adını çəkdiyim şöbəyə şöbə hamıdan kənarda sakit və mədəni insanların çalışdığı bir yer idi. Şahin müəllimi görəndə elə ilk baxışdan çox sevindim, üzündəki nur onun artıq necə bir insan, şöbə müdiri olmasından xəbər veriridi. Mənimlə xoş rəftarı, göstərdiyi diqqət, qayğı məni çox sevindirir eyni zamanda da utandırırdı... və beləcə şöbədə laborant kimi çalışmağa başladım. Mənə demişdilər ki, şöbə müdirin həm də şairdir. Deyirdilər ki, dahi Seyid Əzim Şirvanidən sonra ilk şair idi ki, 5 divan kitabı yazmışdır. Onun bir-birindən mənalı şeirləri ilə tanış oldum. O, şeirlərinin dibaçəsində və xatiməsində həmçinin müxtəlif vəznli şeirlərində o qədər Allahı, peyğəmbərləri, əhli-beyti təsvir edib, gözəl şeirlər, minacatlar, nətlər yazmışdı ki, sanki məni ilahi bir aləmə yönəltmişdi.

Düzunu deyim ki, Şahin müəllimin şeirləri ilə tanış olmayana qədər mən şeir sevər olmamışdım. Mənə şeiri sevdirən ilk insan məhz Şahin müəllim oldu. Şahin müəllimin hansısa bir səfərə gedərkən yazdığı saysız-hesabsız səfərnamələrində əks olunan və müxtəlif ölkələrdə aldığı təssüratlatları maraqla qələmə aldığından həqiqətən heyrətamiz idi. Çünki ilk dəfə idi belə yazılar oxuyurdum. Eyni zamanda onun divanlarında mütailə etdiyim yapon janrlı vaka və hayku şeir növləri və bitib-tükənməz qəzəl və başqa şeir növlərində qələmə aldığı poetik fikirləri,

dünya-axirət haqqında düşüncələri, hər hadisəyə fərqli yanaşması Şahin müəllimin orijinal bir şair şəxsiyyət olmasından xəbər verirdi.

Əsasən məhəbbət, eşq və sevgi şairi olan Şahin müəllim eyni zamanda kövrək qəlbli, uca Allahın bir insana verə biləcəyi bütün insani kefiyyətləri özündə birləşdirən dəyərli insandır. Həqiqətən də Şahin müəllim kimi insanlar çox azdır, həm alimlik həm də insanlıq cəhətindən. Bu iki məfhumu özündə birləşdirmək mənə elə gəlir ki, olduqca çətindir. Elə məhz Şahin müəllim elə insandır ki, həm olduqca savadlı alim, gözəl şair və bənzərsiz bir insan, həm də sadə, təvazökar, təkəbbürdən uzaq, dürüst, mehriban, elmi rəhbəri olduğu tədqiqatçılara göstərdiyi diqqət, uşaqla uşaq, gənclə gənc yaşlı ilə yaşlı kimi davranmaqda davam edir.

Deyirlər ideal, hər tərəfli insan yoxdur. Mənə görə var. Dövrə görə "nümunəvi insan kimdir?" sualinin cavabını heç düşünmədən Şahin müəllimin simasında və onun insanlara münasibətində tapdım.

Şahin Fazilin şeirləri olduqca çoxdur. Onlardan bir neçəsini misal gətirirəm.

MƏN

*(Qoşmavari)*

*Sanma ki, məhəbbət gülüstanına*
*Ərinə-ərinə gələcəyəm mən.*
*Ayağım da sınsa, sənin yanına*
*Sürünə-sürünə gələcəyəm mən.*

*Əgər sansan eşqim soyuya,dona,*
*Məni axtarınca, tapınca sına,*
*Qaraca Çobanın yapıncısına*
*Bürünə-bürünə gələcəyəm mən.*

*Öldürsə Şahini bir gün bu fələk,*
*Gözünə yenə də görünəm gərək,*
*Sənin nəzərinə Şahin quşu tək*
*Görünə-görünə gələcəyəm mən.*

## TABUT

*Arzu*
*aparır-gətirir...*
*Duyğu*
*aparır-gətirir...*
*Su*
*aparır-gətirir...*
*Külək*
*aparır-gətirir...*
*Fələk*
*aparır-gətirir...*
*Zaman*
*aparır-gətirir...*
*Yaradan*
*aparır-gətirir...*
*Tabut*
*aparır!*
*Gətirmir!!!*

## MƏHƏBBƏT ŞEİRLƏRİM

*Tarixidir eşqimin*
*Məhəbbət şeirlərim.*
*Nəğməsidir qəlbimin*
*Məhəbbət şeirlərim.*

*Tər-təmizcə arzudur,*
*Ip-isticə duyğudur,*
*Səssiz axan bir sudur*
*Məhəbbət şeirlərim.*

*Könlümün bəzəyidir,*
*Ən zərif çiçəyidir,*
*Məhəbbət diləyirdir.*
*Məhəbbət şeirlərim.*

*Gül-çiçəksiz yaz olmaz,*
*Könüllər dəmsaz olmaz,*
*Sən olmasan yazılmaz*
*Məhəbbət şeirlərim.*

*Sənsiz kəsib səsini,*
*Saxlayib nəğməsini,*
*Tapacaq nöqtəsini*
*Məhəbbət şeirlərim.*

**Xəyalə ƏYRİÇALMALI**
*Tədqiqatçı*

## BİR GÜNLÜK TARİXİMİZİN YAZARI... – XXI ƏSRİN YAŞAYAN ƏFSANƏSİ ŞAHİN FAZİL!!!

**Bakı. 5 aprel 2013-ci il.** Azəri-Türk Qadınlar Birliyinin və Azərbaycan Türkiyə Evinin təşkilatçılığı ilə "Şah Xətai-Sultan Səlim" Beynəlxalq elmi simpoziumu. Tədbirdə Türkiyə və Azərbaycanın tanınmış elm adamları, tarixçiləri və ictimai-siyasi xadimləri iştirak edirdi. ... Söz verildi Azərbaycan Milli Elmlər Akademiyasının A.A. Bakıxanov adına Tarix İnsitutunun "Mənbəşünaslıq və Tarixşünaslıq" şöbəsinin müdiri, professor Şahin Fərzəliyevə (Şahin Fazil).

Təqdimatdan sonra Şahin müəllim əlində varağı, o biri əlində eynəyi ilə ayağa qalxdı. İki böyük türk dünyasının hökümdarı olan Şah İsmayıl Xətai və Sultan Səlim kimliyindən qısaca giriş etdi. Şahin müəllim nitqində bir çox nüanslara toxundu. Lakin mənim xəyalım həmişəki kimi beş əsr geriyə, uzaqlara getdi. Səfəvi Dövləti, Ərdəbil şəhəri, Şeyx Səfiəddin türbəsi, Azərbaycanda vaxtı ilə qurulan bir neçə dövlətlərin paytaxtı olmuş Təbriz şəhəri və Cənubi Azərbaycanın qərbində yerləşən Maku şəhərinin Çaldıran düzünü həsrət və ürək yanğısı ilə xəyallanırdı. Simpoziumun əsas məramı ondan 1514-ci il avqustun 23-də baş vermiş Çaldıran döyüşünün gerçəkliklərini müzakirə etmək və bu günün gözü ilə deyil, məhz o dövrün gözülə baxmaqın zəruriətini anlatmaqdaydı. Əsasən də Şah İsmayıl Xətainin və Sultan Yavuzun oxşar və fərqli xüsusiyyətlərnin müzakirəsi idi. Onu da bildirim ki, Şahin müəllim Səfəvi Dövlətinin və onun xanədanının tarixini araşdıran yazarıdır.

İçimdə qəribə bir hiss oyandı. Sanki mən hər kəsin görmək və arzu etdiyi bu insanla tanış olmaq meylini özümə hiss etdim. Dilə gətirə bilmədiyim bir hiss vardı içimdə. Sanki ayaqlarım özümdən asılı olmayaraq, Şahin müəllimə doğru irəlilmkdəydi. Xəyallar aləmində Xətai eşqini yaşadığım zaman Şahin müəllimin nitqini artıq eşitmirdim.

Qəfil bir qəzəl qulağımı çınlatdı. Şahin müəllimin səsi məni həsrətlə xəyallarda gəzdiyim Ərdəbil torpaqlarından ayırdı. " ... Türkü türkə güldürənmiş Çaldıran." Dərhal gözlərimi Şahin müəllimə dikdim və diqqətlə qəzəl vurğunu kimi bu şairi dinləməyə başladım:

*Bağışlasın oxucu,*
*Sındı qələm, yox ucu.*
*"Çaldıran"ı yazmağa*
*Mənə gərək ox ucu!*

*Qeyb olubdur türkə türkün rəhmi, insaf qeyb olub,*
*Ah, bu mənhus gündə tuğyan qaldıranmış Çaldıran.*

*Ömrü güllər tək açılmış şux cavanlar məhv olur,*
*Ömrü gül tək, bir çiçək tək solduranmış Çaldıran.*

*Əl kəsilmiş, qol üzülmüş, baş yarılmış qeyz ilən,*
*Əl kəsənmiş, qol üzənmiş, baş yaranmış Çaldıran.*

*Kişnəmir köhlən nə vaxtdır, nə'rə çəkmir nər dəvə,*
*Allah-Allah, nər yıxanmış, at qıranmış Çaldıran.*

*Burda ağ daşlar boyanmış büsbütün qan rənginə,*
*Ağ sular al qırmızı olmuşsa, qanmış Çaldıran.*

*Bir tərəfdə qəm neyin, bir yanda şənlik şeypurun,*
*Çaldıranmış, çaldıranmış, çaldıranmış, Çaldıran.*

*Bir tərəfdən qırdıranmış, öldürənmiş Çaldıran,*
*Başqa yandan türkü-türkə güldürənmiş Çaldıran*

Professor Şahin müəllim 7 beytlik 15 hecalıq "Çaldıran" poeması-nı ürək

Yanğısı ilə yazmışdır. Bəli! Səfəvi tarixinin ürək sıxıntısı ilə oxuduğum döyüşlərindən biri olan Çaldıran döyüşünün gedişinə ünvanladığı bu qəzəlini dinləyə-dinləyə sanki içimdəki sızıltıdan Şahin müəllim əvvəlcədən xəbər tutmuşdu:

*Ömrü gül tək, bir çiçək tək soldurarmış Çaldıran.*

Yenə bu sözlərlə xəyallara daldım. Adım kimi Xəyalə oldum!!!

*Bura mənim elimdir,*
*Ayıl qürurum, ayıl.*
*Bir tərəfdə Səlimdir*
*Bir tərəfdə İsmayıl.*

Yenə müəllimin səsi məni xəyallardan ayırdı. Şah İsmayılın öz xitab "Mən"i məni özümə gətirdi. Şahin müəllim poemanın "Bu gün oxuyur ozan..." hissəsini söyləyirdi. Yenə diqqətimi qələm sahibinə yönəltdim:

*Qılınc çalan əlimdir,*
*Sayıl, qılıncım sayıl.*
*Bir tərəfdə Səlimdir,*
*Bir tərəfdə İsmayıl.*

*Şərəf nəsimi əsir,*
*Yayıl şöhrətim, yayıl.*
*Bir tərəfdə Səlimdir,*
*Bir tərədə İsmayıl.*

*Azərbaycan gülümdür,*
*Bayıl düşmənim, bayıl.*
*Bir tərəfdə Səlimdir,*
*Bir tərədə İsmayıl.*

*Bu gün oxuyur ozan,*
*Sabah olacaq avaş.*
*Axıdacaq qızıl qan,*
*Osmanlıyla, qızılbaş.*

*Rum eli, Azərbaycan...*
*Savaşacaq anbaan*
*Müsəlmanla, müsəlman*
*Osmanlıyla, qızılbaş.*

*Sultan zireh geyəcək,*
*Şah əmud istəyəcək.*
*Vur ha...!, Qır ha...! deyəcək*
*Osmanlıyla, qızılbaş.*

*Sultan seyrə dalacaq,*
*Şahsa qılınc çalacaq.*
*Qana qəltan olacaq*
*Osmanlıyla, qızılbaş.*

*Biganə sevinəcək,*
*Qırmızı geyinəcək.*
*Hey qəzəblə dinəcək*
*Osmanlıyla, qızılbaş.*

*Bu gün oxuyur ozan,*
*Sabah olacaq savaş.*
*Axıdacaq qızıl qan,*
*Osmanlıyla, qızılbaş.*

Şair şe′rnin bu yerini bitirdi. Ancaq zalda əyləşənlər ondan gözlərini çəkmirdilər. Şe′r ovsunlamışdı onları. Faciəli tarixi həqiqət! Orta əsrlər dövrünün qan rəngli səhifəsi:

*Sultan seyrə dalacaq,*
*Şahsa qılınc çalacaq,*
*Qana qəltan olacaq*
*Osmanlıyla, qızılbaş.*

Bu sözlər simpoziumda iştirak edən hər kəsi... Azərbaycan və Türkiyə dövlətlərinin tarixçilərini beş əsr əvvələ aparmışdı. Simpoziumun əsas prioritet məsələsi yuxarıda qeyd etdiyim kimi iki Türk dövlətinin hökümdarlarının oxşar və fərqli cəhətlərinin müzakirəsi idi. Türk dünyası tarixində qara hərflərlə yazılmış Çaldıran döyüşünün tarixçilər tərəfindən çox da geniş müzakirə olunmaması və buna biganə yanaşma müzakirə mövzusuna çevrilmişdi.

Şahin müəllimin bu döyüşü təfərrüatla qələmə alması sanki ürəyindən xəbər verirdi:

*Bu gün oxuyur ozan,*
*Sabah olacaq avaş.*
*Axıdacaq qızıl qan,*
*Osmanlıyla, qızılbaş.*

**Saat 13:00 Nahar vaxtı.** Fasilə elan olunduqda mən masadan qalxıb Şahin müəllimə yaxınlaşdım. Ona ilk sualımı nece oldu xatırlamıram. Amma Şah İsmayılla əlaqəli sual olduğu dəqiq yadımdadır. Şahin müəllim Şah İsmayıl Xətaini elə dilə gətirdi ki, necə və nə zamandan aşiqi olduğum Şah Xətaiyə bir daha vuruldum. Bəli! Mən Şah Xətai aşiqiyəm. Necə də gözəl deyib:

*“Xətai can arxına,*
*Əhli-irfan arxına.*
*Mərifətdən su gəlir*
*Tökülür can arxına.”*

6-cı sinifdə öyrəndiyim Xətai bayatıları sonralar Xətai aşiqi olmağıma təkan verdi:

*Xətai işin düşər,*
*Gəlib-gedişin düşər,*
*Dişləmə çiy loğmanı,*
*Yerinə dişin düşər.*
***
*Xətaiyəm xəttaram.*
*Haqq sirrinə səttaram.*
*Həkimlərin dərmanı,*
*Təbiblərə əttaram.*

Şahin müəllim mənim Səfəvi dövlətinə olan marağımı və sevigimi anlayaraq dərhal “Çaldıran” poemasından söz açdı və dedi: “Sənə kitablarımdan bir neçəsini təqdim edəcəm. Onların birində “Çaldıran” poeması yer alıb. O poemanı diqqətlə oxuyarsan. Çıxışımda ifa etdiyim “ Şe′r parçaları da məhz həmin poemadandır”.

Bir həftə sonra... Şahin müəllimlə görüşmək üçün Azərbaycan Milli Elmlər Akademiyasının A.A.Bakıxanov adına Tarix İnstitutundakı müvafiq şöbəyə getim. Şahin müəllimə bir neçə sual ünvanladıqdan cavab aldıqdan sonra o bir neçə kitabını rəfdən götürərək stolunun üstünə qoydu. Kitablardan biri Bakı “Əllərini ver mənə” adlı kitab idi. Şahin müəllim kitabın ilk səhifəsinə imza atıb qeyd etdi... **“Xəyalə! Bu kitabdakı “Çaldıran” poemasını diqqətlə oxu, bir günlük tariximizdir 14.04.2013”**

Bəli! "Çaldıran" poeması Azərbaycan xalqının və ən əsası Türk millətinin bir günlük hərb tarixidir... Bu poemanı oxuduğum zaman içimdə Şahin müəllimə qarşı bir sual doğdu. Görəsən mən daha çox Şah İsmayıl aşiqiyəm, yoxsa Şahin müəllim?... Bu sualın cavabını hələ də tapa bilmirəm. Lakin məktəbli olduğum zamanlarda belə Şah İsmayıl Xətai kimi bir şəxsiyyətin heyranı olmuşam. Onun şairliyi, hökmranlığı və ən əsası millətimizə və dilimizə sevgisi Xətai aşiqi olmağıma yetərli oldu. Şahin müəllimin "Çaldıran" poemasını bütöv oxuduğum zaman isə kimə və nə səbəbə aşiq olmağımı bir daha mənə anlatdı.

*Yenə dilə gəldi könlümün səsi:*
*-Xətai, cahana sən xoş gəlmisən!*
*Ey Uzun Həsənin comərd nəvəsi,*
*Şam tək yana-yana sən xoş gəlmisən.*

*Kama yetəcəksən hər əməlinlə,*
*Əməl məram üçün təməl yarandı.*
*Həyata keçəcək sənin əlinlə,*
*Cüneydin arzusu, Heydərin andı.*

*Ulu bir əzmlə meydana girib,*
*Bəlli olacaqsan bütün cahana.*
*Qədim bir diyarı yeniləşdirib,*
*Rövnəq verəcəksən Azərbaycana.*

*Dəyəcək atdığın hər ox hədəfə,*
*Pələng, şir boğan da, gur vuran da sən.*
*Ömründə ilk dəfə, həm də son dəfə,*
*Məğlub olacaqsan Çaldıranda sən.*

*Uduzmaq İsmayıl vərdişi deyil,*
*Bir cəngi uduzdun qürur ilə sən.*
*Qüruru itirmək mərd işi deyil,*
*Sənin məğrurluğun - sənin qələbən!*

*Şe'rdə yeni bir səs-səda kimi*
*Qədəm qoyacaqsan neçə sabaha.*
*Mənhus məğlubiyyət bir bəla kimi*
*Yaxın düşməyəcək sənə bir daha.*

*Bir əlində qılınc, bir əlində gül,*
*Zəfər çalacaqsan hey yeni-yeni.*
*Şah ölkə fəth edər, şairsə könül,*
*Şah İsmayıl isə hər ikisini.*

Beş əsrdir ki, iki dövlət arasında öz tarixçiləri tərəfindən müzakirə olunan və hələ də müharibə səbəbi bəlli olmayan, Cənubi Azərbaycanın Maku şəhəri yaxınlığında, Çaldıran düzündə 1514-cü il 23 avqust tarixində baş vermiş iki böyük türk hökümdarı Şah İsmayıl və Sultan Səlim arasındakı "Çaldıran döyüşü"nü Şahin müəllim bütün gerçəkliyi ilə, mənə tanıtdı.

Professor Şahin Fərzəliyev haqqında çox sözlər demək olar. Lakin, mən Şahin müəllim haqqında çox söz deyə bilmirəm. Çünki, onunla bir stol arxasında oturmaq, onunla bir otaqda əyləşməklə qarşında müdrik bir şəxsiyyət görürsən və dilin qıfıllanır. Mən Şahin müəllimin ən sonbeşik tələbəsiyəm bəlkə də. Nə zaman Şahin müəllimin yanına kimsə gəlirsə Şahin müəllim haqqında belə deyir: **"-Şahin müəllim bir əfsanədir!!!"** Bəli. Şahin müəllim bir əfsanədir. XXI əsrimizin canlı əfsanəsi. Mən Şahin müəllimi təkcə müəllimim kimi deyil, professor kimi deyil, ustad və mürşidim kimi görürəm. Şahin müəllim həqiqətən də gəncliyimizə, Azərbaycan tarixinə, Türk dünyasının tarixinə əsərlər həsr edən zəngin bir xəzinədarıdır. O xəzinədən mənə də pay düşdüyünə görə Allaha çox Şükür edirəm.

Bu il Şahin müəllimin 80 yaşı tamam olur. Mən bir sonbeşik tələbə kimi ona möhkəm can sağlığı arzulayıram.

Düşünürəm ki, onun sinəsində özünün dediyi kimi iki ürək döyünməkdədir.

*Mənim bədənimdə iki ürək var—*
*Sevinc birindədir, kədər birində.*
*Biri güldürərsə, biri ağladar—*
*Gülüş birindədir, qəhər birində.*

*Biri həyatıma düşməndir açıq,*
*O biri ömrümə verər yaraşıq,*
*Birində zülmət var, birində işıq—*
*Gecə birindədir, səhər birində.*

*Biri yuvasıdır ahın, gileyin,*
*Biri məskənidir əhdin, diləyin,*
*Şahin, bir həyatım iki ürəyin*
*Yaşayar birində, ölər birində.*

*Sənin ürəklərinə dözüm diləyən tələbən*
**Xəyalə Əyriçalmalı**

**Selcan MƏMMƏDZADƏ**
*AMEA Tarix İnstitutunun*
*kiçik elmi işçisi*

# ŞAİR ŞAHİN FAZİLİN KİÇİKLƏRƏ YAZDIĞI KİÇİK ŞEİRLƏR HAQQINDA KİÇİK QEYDLƏRİM

Azərbaycanın ictimai-fikir tarixində özünəməxsus yer tutan, tarixşünaslığımızda əvəzsiz töhfələri olan görkəmli tarixçi-şərqşünas alim ucaldığı insanlıq mərtəbəsinə layiqdir. Xeyirxah və böyük vicdan sahibi olan bu şairin yaradıcılığı olduqca zəngin irsə malikdir. Tükənməz və güclü potensiala malik şair-alim-mütəfəkkirin yaradıcılıq irsində həmçinin folklorşünaslıq nümunələri, hətta tapmacalar da vardır. "Əllərini ver mənə" kitabında şairin metafora şəklində qurulmuş düşündürücü sualları, bəlkə də Azərbaycan uşaq poeziyasının gözəl nümunələrindən sayıla bilər. Kitaba nəzər yetirdikdə oradakı sadə cümlələrə, lakin düşündürücü və mənalı ifadələrə təsadüf edirik:

*Var nəfəsi, var səsi,*
*Tükü paltar əvəzi,*
*Əl yerinə-qanadı,*
*Söyləyin, nədir adı?*

**(Quş)**
***(Şahin Fazil. Əllərini ver mənə,***
***Bakı, Gənclik, 1998, səh.127)***

Şairin zəngin yaradıcılıq irsinin ən böyük üstünlüyündən biri qəsidə və qəzəllərinin, ən önəmlisi isə bütün "Divan"larının xəlqi və hamının başa düşəcəyi dildə yazılmasıdır. Xalq yaradıcılığına yaxından bələd olan şairin qələmə aldığı uşaq şeirlərinin bir çoxu qızlarının kiçik yaş dövrünə təsadüf edir. Bu uşaq şeirlərindən biri uşaqlarda zəruri keyfiyyətlərin formalaşmasına, çətinliklərdən qorxmamağa yönəlib:

QORXMURAM!

*Bacı, sən kimi mən də*
*Qurbağadan qorxmuram.*
*Nənə nağıl deyəndə*
*Əjdahadan qorxmuram.*

*Di bəsdi, hər sözbaşı*
*Lovğalanma sən daha.*
*Əlimlə Alabaşı*
*Yemləyirəm mən daha.*

*İnanmırsan, inanma,*
*Çimdirirəm cücəni,*
*Qorxmağım yoxdur, amma*
*Sabun ağladır məni.*

*Əl-üzümü yuyanda*
*Gözlərimi yandırır.*
*Ağlamağım o anda*
*Məni bərk utandırır.*

*Söyləmə ki, qorxuram*
*Bapbalaca sabundan,*
*Yox, mən özüm qorxmuram,*
*Gözlərim qorxur ondan.*

***(Şahin Fazil. Əllərini ver mənə,***
***səh. 132-133)***

Şairin maraqlı şeirlərindən biri atanın qızcığazına verdiyi suala cavabdır. Həmin dialoq şeirdə belə səslənir və kiçiklərə xas düşündürücüdür:

*– Bir cücə*
*üstəgəl*
*bir cücə*
*Eyləyər de neçə?*

***(dərhal cavab verir)***

*–İki cücə!*
*–Bir damcı*
*üstəgəl*
*bir damcı*
*bəs neçə?*

***(fikirləşir)***

*–Bilmirəm heç neyləyim?*
*Bir deyim, iki deyim?*
*Bir damcının üstünə*
*Bir damcı gəlsəm əgər*
*İki damcı bir olub*
*Birləşər.*
*Bilmirəm heç neyləyim?*
*Bir deyim, iki deyim?*

***(Şahin Fazil, "Əllərini ver mənə",***
***səh. 130-131)***

Dialoqlu şeirlərdən biri də müəyyən qədər uşaqda təəccüb doğuran söhbətlərdəndir. Belə ki, Bacı Şahanə kiçik bacıdan soruşur:

*–Ay Ülviyyə, yenə də*
*ağzındadır barmağın.*
*Gör ki, neçə həftədir*
*Uzanmayır dırnağın.*
*–Mən də çaşıb qalmışam,*
*Təəccüblü işdi bu!..*
*Mənim dırnaqlarımın*
*Dayanıb, çıxmır boyu.*

***(Şahin Fazil, "Əllərini ver mənə",***
***səh. 131)***

Bir mükalimə də tamamilə uşaq düşüncə tərzinə uyğundur. "Dağ keçisi" adlı dörd misralıq şeirdə ata və bala arasındakı sorğu-sual uşağın heyrətinə səbəb olmurmu?

*– Nədir bu şəkildəki?*
*– Qızım dağ keçisidir.*
*– Bağçamızdakı keçi*
*Ata, bağ keçisidir?.*

***(Şahin Fazil. "Əllərini ver mənə",***
***səh. 136)***

Ş.Fazilin "Uşaq şeirləri" silsiləsindən aşağıdakı iki şeir məncə uşaq psixologiyasına uyğundur və böyükləri də düşünməyə sövq edir. Həmin şeirlərin birincisi nəvəsi sevdanın bacısı Tamridaya istiqamətləndiyi sərbəst vəzində qələmə alınmış şeirdir. Hamı yağışın yağdığını seyr edir, balacalar da həmiçinin, amma yağışın nə üçün yağdığı fikri uşaq təsəvvüründə belədir:

*Bu hava*
*xoş gəlir*
*bacı, sənə də,*
*elə mənə də.*
*Şimşək parıltısı,*
*İldırım səsi*
*otağa gəlir.*
*Göydəki yağışlar*
*axıb yenə də*
*Yerdəki palçığı*
*yumağa gəlir.*

Yaxud, kiçik Püstəxanım böyük Fəxriyyəyə deyir:

*Balıq balığı yeyir,*
*Qoyun yemir qoyunu,*
*Qoyun qoyun başına*
*Gətirmir bu oyunu.*
*İnsanınsa onlara,*
*Deyəsən vardır kini–*
*Əlinə keçən kimi,*
*Yeyir hər ikisini.*

***(Şahin Fazil, "Üçüncü Divan",***
***Bakı, 2008, səh. 416)***

Amma Tamridanı isə saat əqrəblərinin, həmçinin həyatda yaşayan adam sonacan əqrəblərin səsi və müqayisəsi düşündürür:

*Həyatın əqrəbləri...*
*Saatın əqrəbləri...*

*Birinin zəhəri var,*
*O biri hey çıqqıldar.*
*Biri həyat içində,*
*Biri saat içində.*

***(Şahin Fazil. "Dördüncü Divan",***
***Bakı, 2014, səh. 506)***

Şahin Fazilin böyüklər üçün yazdığı şeirlərlə müqayisədə, əlbəttə, onun kiçiklər üçün yazdıqları olduqca azdır. Buna baxmayaraq onun kiçik şeirlər haqqında kiçik bir məqalə yazmağa cəhd etdim, lakin düşünürəm ki həmin şeirlər barədə müəyyən böyük məqalə də yaza bilərəm. Bu iş qalsın gələcək illərə!..

**Şahanə ŞAHİNQIZI**
**Ülviyyə ŞAHİNQIZI**

## BİZİM ATAMIZ ŞAHİN

Bu məqaləni 27 martda, atamızın səksən illiyində yazdıq..

Əziz və sevimli atamız. Bu gün sənin doğum günündür və bu münasibətlə səni təbrik edirik. Varlığına görə təşəkkür edirik. Verdiyin həyatımıza görə, tərbiyəmizə, iddiasız ciddiyyətinə, düzgün məsləhətlərinə görə təşəkkür edirik. Yəqin ki, səni nə qədər sevdiyimizi təsvir etmək üçün kifayət qədər epitet və ürək sözləri yoxdur. Sən bizim atamızsan, həyatımızda müəllimimizsən, örnəksən. Dünyanın ən yaxşı atanın övladları olduğumuz üçün qismətimizə şükür edirik. Çoxlarının yalnız xəyal ola biləcəyi ata. Ömür boyu pozitiv, xoşxasiyyətli bir insan. Bu gün, atamızın ad günündə həyatımıza baxırıq, keçmişimizə nəzər salırıq və bir daha əmin olduruq ki, atamız xəyal edə biləcəyimiz talenin ən dəyərli hədiyyəsidir! Bu gün yubileyini qeyd edirik və sənin hər zaman belə qalmağını Tanrıdan diləyirik - vücudu və ruhu güclü, nikbin və azad, cəsarətlə uzaqlara baxan!

2020-ci ilin mart ayının əvvəlləri. Hər dəfə atamıza baş çəkməyə gələndə yazı masasının üstündəki əlyazmalara da göz yetirirdik: Məqalələr, şeirlər, kitablara şərhlər, yeni tərcümələr və s. Bir gün, bir neçə alim və şairin imzası ilə məqalə toplusu da gördük: Yaqub Mahmudov, İsa Həbibəyli, Hacı Rafiq Əliyev, Ramiz Qusarçaylı, Fəxrəddin Qubalı, Əli Ələmi, Yasin Xəlil, Allahverdi Əlimirzəyev, İmamverdi Həmidov və başqalarının məqalələri. Onların hamısı atamıza həsr olunmuşdu. Belə qərarlaşdıq ki, biz də nə isə yazaq. Əlbəttə, onun özü bilmədən. Yazdıq. Yazılarımızı bir-birimizə oxuduq. Hələ atamızın xəbəri yoxdu. Biz də "yazıçı" olduq. Tətbiqi riyaziyyat elmi üzrə ali təhsil almış biz bacılar şərqşünas atamız haqqında məqalə yazmağa həvəslənmişdik. Düşünürük ki alındı. Yazdıqlarımızı birləşdirdik. Üzərində bir az da işlədik. Atamıza verdik. Balalar ataya yazı verdilər. Varaqladı. Fikrə daldı. Gözləri yaşarmışdı...

Həmin müştərək məqaləni siz də oxuyun. Ürəklərimizdən keçənləri yazmışıq. Tanıdıqımız və tanımadığımız atamız haqqında yazmışıq. Əlbəttə, anamız haqqında da müəyyən məqamları əks etdirmişik məqaləmizdə.

Səksən il bundan qabaq doğulub atamız Quba şəhərində.

Qubanın Qəçrəş kəndi. Babamız Fazil kişinin dediyinə görə ata-ba-

baları Dağıstandan köçüb gəliblərmiş bu kəndə.

Atamızın şəcərə (nəsil ağacı) tarixi çox da uzun əsrlərə gedib çıxmır. Onun "Quba tarixi" kitabı iki dəfə nəşr olunub. İkinci nəşr 2016-cı ildə oxucuların istifadəsinə verilib. Kitabda oxuyuruq: "Mən Qubamın tarixi kitabımın yeni nəşri üzərində işləyərkən Rusiya kollec registratoru A.Xotyanovskinin "Quba əyalətinin kameral təsviri" kitabının verdiyi material sayəsində öz şəcərəmə aydınlıq gətirə bildim. Siyahıdan göründüyü kimi, 25 və 26-cı sıralarda Daşdəmir adlı bir şəxsin adı iki dəfə yazılmışdır. Məlum olur ki, Daşdəmirin Babay və Aydəmir adlı iki oğlu olmuşdur və 1831-ci ildə Babayın 40, Aydəmirin isə 25 yaşı vardı. Demək, atam Fazilin şəcərə sırası A.Xotyanovskinin cədvəlindəki yaşı 40 olan Babay Daşdəmir oğluna gedib çıxır. Hesabladıqda bu da məlum olur ki, bu Babay (1-ci Babay) atam Fazildən düz yüz il əvvəl dünyaya gəlmişdir.

Mənim hələlik mənə məlum olan və iki yüz ilədək bir dövrü əhatə edən şəcərəm belədir: Daşdəmir, birinci Babay, Fərzəli, ikinci Babay, Fazil, Şahin (Şahin Fazil. Quba tarixi, TEAS Press Nəşriyyat evi, 2016, səh. 258).

Atamızın Quba şəhərində satın aldığı evdə (1934-cü il) onun dördüncü həyat yoldaşı Gülcənnətdən tədricən səkkiz uşaq doğuldu. İkinci övladı atamız Şahindir.

Fazil və Gülcənnət. Atamızın "Beçinci Divan" kitabındakı iki şeir Fazil və Gülcənnətə həsr olunur:

## ATAM

*Bu gecə atam Fazil Babay oğlu*
*yuxuma gəldi*

*Zəhmli, ürəkli, xətir-hörmətli*
*Kişiydi çox çevik, sərt, ortaboylu.*
*Dalaşqan bir adam, namus-qeyrətli*
*Fazil Babay oğlu-Daşdəmir soylu—*
*Atam.*

*Barəsində onun az yazmışam mən,*
*Qoçaqdı, mərd idi, ərən kişiydi.*
*Yaşına güvənib özü demişkən,*
*"Nikolayı taxtda görən" kişiydi—*
*Atam.*

*Sonra Sovet dövrü, Sovet dövranı,*
*Nədənsə "Sovet"ə "Söy,et" deyərdi.*
*Kolxoz zəbt etmişdi alma bağını,*
*Hirslənib Leninə söyüş söyərdi—*
*Atam.*

*O mədhuş dövrdə, qorxunc zamanda,*
*Elə dövranda ki, xətası vardı,*
*Taxıl qıtlaşanda, pul qurtaranda*
*Kiməsə gizlincə tüfəng satardı—*
*Atam.*

*Deyərdi qaçağa ehtiramı var,*
*Agah eləyərdi məni bu sirdən.*
*Yadına düşəndə qoçaq qaçaqlar*
*Danışardı bizə Qaçaq Kəbirdən—*
*Atam.*

*Xainə, alçağa var idi kini,*
*Söhbəti bilirdi, sözü bilirdi,*
*Haradan almışdı "top-tüfəngini"?*
*Bunu mən bilmirdim, özü bilirdi—*
*Atam.*

*Zirzəmi qazaraq zirzəmi altda*
*Silahı üst-üstə qalaqlamışdı*
*Bir qəmi üstdəydi, yüz qəmi altda,*
*Həmin silahlara bel bağlamışdı—*
*Atam.*

*Sirri özündəndi, sirdaşı bizdən,*
*Amma, hövsələsi səbrindən dardı.*
*Gözünü çəkməzdi zirzəmimizdən,*
*Tez-tez, oğrun-oğrun ora baxardı—*
*Atam.*

*Bəlkə qaçaqların silahlarıydı*
*Bizim gizləncdəki həmin silahlar?*
*Onun var-dövləti silah varıydı,*
*Varını birbəbir satardı naçar—*
*Atam.*

*Sağlamdı, dəmirdi, poladdı canı,*
*Canı bərkimişdi səfərlərində.*
*Qəçrəşdən aldığı ton-ton almanı*
*Satardı Rusiya şəhərlərində—*
*Atam.*

*Gedərdi, gələrdi...Ticarət işi...*
*Narahat yaşardıq gələnə qədər.*
*Hökümət işində işləməmişdi,*
*Maaş almamışdı ölənə qədər—*
*Atam.*

*Dördüncü arvadı-anam Gülcənnət...*
*Üç arvadı olub anamdan əvvəl.*
*Bir tale işiydi itgisi əlbət,*
*Neyləyə bilərdi gələndə əcəl—*
*Atam?*

*Dar gündə kiminsə dadına yetən,*
*Haram tikələrin məsti olmayan,*

*Ləzgiylə, cuhudla ülfət eyləyən,*
*Amma ermənidən dostu olmayan—*
*Atam.*

*Beynimdə, söyləyim sizə mən gərək,*
*Bir fikir dolaşır haçandan bəri,*
*Qarabağ cəngində olardı kömək*
*Əgər satmasaydı o tüfəngləri—*
*Atam.*

*31.08.2013*

Bu silsilədən atamızın ikinci şeiri:

ANAM

*Anamı gördüm. Anam yuxuma gəlmişdi...*

*Haçan tərk edəcək fəğan bülbülü?*
*Nə vaxt dəriləcək həsrətin gülü?*
*Adının mə'nası gerçəkləşdimi?*
*Gülcənnət, yə'ni ki, cənnətin gülü—*
*Anam.*

*"Kim öz anasını tə'rifləməz ki?"*
*Deməyin anamı tə'rifləyəndə,*
*Çox-çox analara nümunə təki*
*Tə'rifinə inam yaradıb məndə—*
*Anam.*

*Buduqda böyük bir külfətin qızı,*
*Buduqda Zurnaçı Hümbətin qızı,*
*Nənələr sonası gözəl nənəmin*
*Sonaxanım kimi afətin qızı—*
*Anam.*

*Təşviş keçirərdi hey əri üçün,*
*Fazil bizə ata, onasa ərdi.*

*Atam hər səfərdən qayıdası gün*
*Üzünə-gözünə əl gəzdirərdi—*
*Anam.*

*Gizləyə bilmirdi "yaman darıxıb",*
*Həyat görünərdi təzə ahəngdə.*
*Güzgü qabağında özünə baxıb*
*Üzünə azacıq çəkərdi rəng də—*
*Anam.*

*Təmkinlə əyləşən, qürurla gəzən,*
*Verilən ruzinin azına dözən,*
*Müxtəlif xislətli səkkiz övladın,*
*Səkkiz balasının nazına dözən—*
*Anam.*

*Elə ki, dərd ona hücum edərdi,*
*Kimsəyə deməzdi, gizlərdi dərdi.*
*Gözu yol çəkərdi, fikrə gedərdi,*
*Hərdənbir əriylə höcətləşərdi—*
*Anam.*

*Sərt ərə, sərt elə mübtəla olan,*
*Ovcu zərlə deyil, yaş ilə dolan,*
*Ümidi Fazildən kəsilən vaxtlar*
*Gümanı oğluna, qızına qalan—*
*Anam.*

*Mən-kövrək, o isə məndən beşbetər,*
*Biruzə verməzdi gələndə kədər...*
*Qəlbi qırılanda vurmazdı üzə,*
*Könlü sınanda da üzü gülümsər—*
*Anam.*

*Uzaq düşdüyüm vaxt obadan, mənə*
*Sovqat göndərərdi Qubadan mənə.*
*Məgər ana-bala eşqi deyilmi,*
*Ona "can" deyərdim, o da "can" mənə—*
*Anam.*

*Adıma yazılan naməsi vardı,*
*Qubadan Kabula məktub yazardı.*
*Arabir məktubda ləkə görərdim,*
*Sanki göz yaşını ora sıxardı—*
*Anam.*

*Bir ömür yaşadı səsli, soraqlı,*
*Acılı, şirinli, vüsal -fəraqlı...*
*Yaman tez ağartdı qara saçını,*
*Ömrü də saçı tək qaralı, ağlı—*
*Anam.*

*Analar Şahindən inciməsinlər,*
*Lap mənə "Gülcənnətpərəst" desinlər.*
*Hər bir ana kimi vardı qiyməti,*
*Hər bir ana kimi inci idi, zər—*
*Anam.*

*2.09.2013*

Atamızın Qubada keçirdiyi 19 il. Orta məktəb həyatı. 1959-cu il. Bakı. Universitet. Şərqşünaslıq fakültəsi. Fars dili şöbəsi. 5-ci kurs. Əfqanıstana göndərildi atamız (1963). Bir illik tərcüməçilik fəaliyyəti. Vətənə qayıdış və bir aydan sonra yenidən Əfqanıstana dönüş (1964). Bu dəfə tələbə-tərcüməçi kimi deyil, fərqlənmə diplomlu mütəxəssis kimi döndü Əfqanıstana. Daha bir il ötdü (1965). Yenə vətənə qayıdış. Atamızın anamızla toyu və atamızın həmin münasibətlə şeiri:

TOY GÜNÜ

*Açırsan qapımı nəzakət ilə,*
*Girirsən içəri sən ürkək-ürkək.*
*Verirsən əlini məhəbbət ilə,*
*Sən də sevincəksən, mən də sevincək.*

*Bu gündən yanımda yuva qurmusan,*
*Yaraşıq vermisən güzəranıma.*
*Mübarək gəlmisən, xoş buyurmusan,*
*Səfa gətirmisən xanimanıma.*

*Sənsizlik var idi bir göz evimdə,*
*Qulaq tutulurdu... Nə səs, nə səda...*
*Sən öz evindəydin, mən öz evimdə,*
*Dururdu ayrılıq səddi arada.*

*Gəlmisən evimə o səddi keçib,*
*Çəkinmə, bəri dur, irəli dayan.*
*Sən qayda-qanunla sərhəddi keçib*
*Mənim dövlətimə daxil olmusan.*

*Təvan qalmamışdı qətiyyətimdə,*
*Qüdrətim bu gündən ərşə yönəldi.*
*Mənim bir nəfərlik səltənətimdə*
*Mələkə yox idi, mələkə gəldi.*

*(Şahin Fazil. Yenə görüşərik, Bakı,*
*Yazıçı nəşriyyatı, 1989, səh. 28).*

Əfqanıstana üç illik ezamiyyətdən qayıdış (1966). Qızlarından birinin- Şahanənin doğuluşu (1966).

1966-1968. Fakültə dekanının müavini. 1968-1970. Əfqanıstana ikinci ezamiyyət. 1970-1973. İkinci qızının dünyaya gəlişi (1973). Aspirantura illəri və dissertasiya müdafiəsi (1974). Dörd illik elmi fəaliyyətdən sonrakı beş illik tərcüməçilik. Yenə Əfqanıstan (1978-1982-ci ilin sonu). Vətən. Tarix İnstitutu. Əfqanıstana dördüncü çağırış. Daha üç illik tərcüməçilik. Qayıdış. Doktorluq müdafiəsi (1996). Professor (2004).

Atamızın gənclik həyatı. Quba şəhəri. “Quba tarixi” kitabı... Qubaya aid atamızın şeirləri çoxdur. Məsələn:

KAŞ GÖZƏ GƏLMƏSİN İLHAMIM MƏNİM.

*Bacım Esmiraya*

*Əleyküm, ey Quba, salam, ey Quba,*
*Gözəllik önündə lalam, ey Quba.*
*İlham elə coşub, qoynunda sənin*
*Gərək neçə müddət qalam, ey Quba*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Gözümə min sevinc təpərəm burda,*
*Nisgilə sədd olan çəpərəm burda,*
*Yeri yox canımda qorxu-hürkünün,*
*İlan gözünü də öpərəm burda,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Əzəllər duyardım özümdə ağrı,*
*Sanki ağrı kimi sözüm də ağrı,*
*Burda bütün günü yazıb-pozuram,*
*Elə bil azalıb gözümdə ağrı,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Burda ceyran mənim, ahu mənimdir,*
*Saf hava mənimdir, buz su mənimdir.*
*Yarımın qoynundan çıxıb gəlmişəm,*
*İndi təbiətin qoynu mənimdir,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Mənə ilham verir bulağın səsi,*
*Yarpağın nəğməsi, budağın səsi.*
*Fikrim yayınmayır səs-küydən daha,*
*Ayə, harda qaldı uşağın səsi?*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Suyun da bal kimi dadı olarmış,*
*Bulağın rübabı, udu olarmış,*
*Qəçrəş bulağıtək qaynayır ilham,*
*Canım, ilhamın da odu olarmış,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*Kərəməm, sanmayın, gözdən qorxuram,*
*Aşığam, deməyin sözdən qorxuram,*
*Deyirlər gözəllik tez gəlir gözə,*
*Mən sözdən qorxmuram, gözdən qorxuram,*
*Kaş gözə gəlməsin ilhamım mənim.*

*(Şahin Fazil. Əllərini ver mənə, Bakı,*
*Gənclik nəşriyyatı, 1998, səh. 5-6).*

Tarix İnstitutuna ömürlük bağlanıb atamız. Müxtəlif ölkələrə (İran, Türkiyə, İraq, Yaponiya, Kipr, Polşa, müxtəlif Sovet Respublikaları...). Elmi-ədəbi səfərlər. Hər səfər bir səfərnamə...

Anamız atamızı sevirdi. Atamız anamızı sevmirdi, ölürdü ondan ötrü. Amma anamız 2001-ci ildə öldü... Və atamız anamızın ölümünə iki kitab yazdı. Akademik Bəkir Nəbiyev yazır: "2001-ci ildə şairin həyatında böyük faciə baş vermiş, onun ömür-gün yoldaşı Tamrida xanım vaxtsız vəfat etmişdir. Bu ağır itki baş verəndən sonra Şahin hər gün özünü yazı masasının arxasında ovundurmuş və bu günlərin hər birində (bircə gün də ara vermədən!) yazdığı şeirləri müsibətin qırxıncı günündə "Qırxnamə, yaxud qırx şeirdən ibarət elegiya" adı altında tərtib edib əzizlərinə, qohumlarına, yaxın dostlarına paylamışdır. Bu elegiya elə həmin ildəcə "Əbilov, Zeynalov və oğulları" nəşriyyatında, müsibətdən keçən bir il ərzində həmin mövzuda yazdığı şeirləri isə 2002-ci ildə "Elnur-P" nəşriyyatında "İlnamə, yaxud səndən ayrı səninlə" adı altında ayrıca kitablar halında buraxılmışdır. Həmin kitabları oxuyarkən mən əzizlərinin vaxtsız itkisi münasibəti ilə görkəmli şairlərin yazdıqları əsərlərdən bəzi nümunələri xatırladım. Əbülhəq Hamidin məşhur "Məqbər" şeiri, xalq şairi Nəbi Xəzrinin Gülarə xanımın, xalq şairi Nəriman Həsənzadənin isə Sara xanımın əziz, unudulmaz xatirələrinə həsr etdikləri çox zərif şeir silsilələri nəzərimdə canlandı. Lakin Şahinin "Qırxnamə" və "İlnamə"si bu fonda da poeziyamız üçün formaca yenidir, məzmunca təsirlidir".

*(Bəkir Nəbiyev. Şahinin qanadları,*
*"Azərbaycan" jurnalı, 2006, № 11, səh. 178).*

Atamızın anamız və bizimlə bağlı çoxlu şeirləri var. Əfqanıstanda ailəvi yaşayıb-işləsə də, bəzi vaxtlarda, xüsusilə Kabul şəhərində siyasi-hərbi vəziyyətlə əlaqədar biz vətənə qayıdırdıq, atamız isə qürbətdə bizsiz qalıb müxtəlif nazirliklərdə, əsasən Əfqanıstan Nazirlər Şurasında öz işində olurdu. Vaxtı ilə onun anamıza yazdığı bir şeir:

GƏL YENƏ GÖRÜŞƏK

*Telefon söhbəti bezdirib məni,*
*Gülüm, gəl görüşək yenə səninlə.*
*Yaxından-yaxına eşidim səni,*
*Yaxından-yaxına sən məni dinlə.*

*Axı neçə vaxtdır biz aralıyıq,*
*Axı nə müddətdir sarıb bizi qəm.*
*Əlimdə telefon dəstəyini yox,*
*Mən sənin əlini tutmaq istərəm.*

*Salma qəribliyə sən istəyimi,*
*İstərəm gözünü gözümlə görüm.*
*Sözünü çatdırır telefon simi,*
*Gəl yetiş, sözünü gözümlə görüm.*

*Ay gündən aralı, aralı biz də,*
*Hicran qılınc çalır, yaralı biz də,*
*Çoxdan qoşalaşmır izlərimiz də,*
*Gəl, sənin izini gözümlə görüm.*

*Fəraq hücum çəkir kənardan mənə,*
*Tənhalıq söz açır qübardan mənə.*
*Neçə şəklin baxır divardan mənə,*
*İstərəm özünü gözümlə görüm.*

*Yubanma, "gəlirəm" xəbərini ver,*
*Qurban kəsəcəyəm sən gələn kimi.*
*Gəl mənə özünün kədərini ver,*
*Mənsə verim sənə hər sevincimi.*

*("Yenə görüşərik" kitabı, səh. 8-9).*

Daha bir qürbət şeiri:

*Səni yola saldım axşam üstü mən,*
*Boşaltdım bu boyda şəhəri sanki.*
*Cumdu qoşun-qoşun üstümə birdən*
*Aləmin qüssəsi, kədəri sanki.*

*Qapqara pərdəyə şəhər büründü,*
*Nisgillə talandı ürəyim necə!...*
*Nə ulduz göründü, nə ay göründü,*
*Nə yaman uzandı gecə bu gecə!...*

*Başladı hicran öz yamanlığına,*
*Belə sanmaz idim mən ayrılığı,*
*Bürünüb gecənin qaranlığına*
*Məndən gizlədibdir özünü yuxu.*

*(“Yenə görüşərik”, səh. 29)*

Yaxud, Kabuldan anamıza göndərdiyi başqa bir “qürbətnamə”:

BİR YERDƏYİK

*Aralıqda neçə dağ var,*
*Neçə dərə,*
*neçə dəniz,*
*Amma yenə bir yerdəyik.*
*Ayrı-ayrı ölkələrdə,*
*Başqa-başqa şəhərlərdə olsaq da biz,*
*İnan mənə,*
*bir yerdəyik.*
*Əgər fikrə dalırıqsa*
*Mən sən haqda,*
*Sən mən haqda*
*bir yerdəyik.*
*Ayrı-ayrı səma altda*
*Cismən ayrı yaşasaq da,*
*bir yerdəyik.*
*Müvəqqəti çəkibsə də*
*Aramıza sərhəd pərdə*
*bir yerdəyik.*
*Məkanımız indi bizim iki yerdə*
*Özümüzsə bir yerdəyik,*
*Bir yerdəyik!*

*(Yenə görüşərik, səh. 24-25)*

Atamızın qürbət haqqında yazdığı şeirləri çoxdur, lap çoxdur. “Kölgə” adlı şeirində bizə müraciətlə yazır.

**Şahanə: "Tez gəl, sən mənə lazımsan..."**
**Ülviyyə: "Tez gəl, darıxmışam sənsiz..."**
*(Qızlarımın məktubundan)*

*Mənim balalarım çəkir intizar,*
*Mənim qoşa qızım mənə müntəzir...*
*Harada olsanız, əziz balalar,*
*Bilin, ardınızca bir kölgə gəzir.*

*O mənəm, sizləyəm olsam hayanda,*
*O mənim kölgəmdir, sizə köməkdir.*
*O kölgə ən ağır, ən çətin anda*
*Sizin hayınıza hay verəcəkdir.*

*Qəlbiniz fəraqdan qübar tutubdur,*
*Mən də darıxmışam sizinçün yaman.*
*Kölgəm üstünüzdə qərar tutubdur,*
*Kölgəm izləmədə sizləri hər an.*

*Eşqin cazibəsi bəllidir mənə,*
*Bilirəm, nə vaxtsa, nə zamansa siz*
*Baxmayıb kölgənin izləməyinə*
*Köçəri quş kimi köçəcəksiniz.*

*Təki xoşbəxt olun, hey şən olun, şən,*
*"Yaxşı yol" deyəcək sizə o kölgə.*
*Əskik olmayacaq başınız üstdən,*
*Uğur diləyəcək sizə o kölgə.*

*Ayrılıq günləri daha azalır,*
*Tezliklə gələrəm, eləməyin qəm.*
*Yanınızda yoxam, kölgəm ki qalır*
*Harada olsanız, haraya getsəm.*

*Kölgə görə bilər, eşidə bilər,*
*Haylayın kölgəni, səsləyin məni.*
*Bilin ki, tək ölüm yox edə bilər.*
*Sizin üstünüzdən həmin kölgəni.*

*(Yenə görüşərik, səh. 11-12).*

"İran səfərnamələri"ni oxuyuruq: Altıncı səfərnamə. Atamızın Məşhəd ziyarətinə getməsi. Orada yazılır:

"Əvvəlki səfərlərdə bizi Məşhəd ziyarətinə təyyarə ilə aparmışdılar. Demək, bu dəfə İranın bir neçə şəhərini, qatar pəncərələri arxasından olsa da, seyr eləmək imkanım vardır. Gözlərim bu füsunkar təbiəti seyr etdikcə neçə-neçə şəhəri - Nişapuru, Semnanı, Şahrudu, Vəramini, Səbzvarı, Damğanı və başqa böyük-kiçik şəhərləri ötüb keçdik. Nəhayət, Məşhədə gəlib çatdıq:

*Ey saqi, gözüm, sanma ki, meyxanədə qaldı,*
*Fikrim, nəzərim sən kimi cananədə qaldı...*

*...Məşhəddəyəm, hicran yenidən qismətim olmuş,*
*Fikrim yenə Ülviyyə və Şahanədə qaldı...*

Bəli, Məşhəddə birdən-birə qızlarım yadıma düşdü. Kaş onlar da bu müqəddəs şəhərə gələydilər, ziyarətgahı ziyarət edəydilər və Məşədi Ülviyyə, Məşədi Şahanə olaydılar..."

İndi isə atamızın anamıza və bizə həsr etdiyi qəzəlindən bir nümunə:

*Canandan ayrı dözdüm hicranə bir tərəfdə,*
*Mən bir tərəfdə qəmli, cananə bir tərəfdə.*

*Görməkdəyəm kədər mən, çəkməkdəyəm nələr mən...*
*Gəlməkdəyəm qəhərdən tüğyanə bir tərəfdə.*

*Yadəm fəraqə, yadəm, Həvvadı yar, mən Adəm,*
*Düşməkdəyəm dəmadəm əfğanə bir tərəfdə.*

*Aşiqlərin var andı: Yar peymanı, yar andı!*
*Bir də gördün yarandı əfsanə bir tərəfdə.*

*Şahin, yıxıl, yan ayrı: Sən qızlarından ayrı—*
*Ülviyyə bir tərəfdə, Şahanə bir tərəfdə.*

*Həsrət qalıb vüsalə qərq olmuşam məlalə,*
*Dözməkdəyəm bu halə mərdanə bir tərəfdə.*

*Qürbətdə yardan ayrı divanədir bu Şahin,*
*Yar bir tərəfdə ağlar, divanə bir tərəfdə.*

*(Qəzəllər. I cild, Azərbaycan nəşriyyatı,*
*Bakı, 1994, səh.85).*

Yuxarıda qeyd etdiyim kimi, atamızın 13 il yaşayıb-işlədiyi Əfqanıstanda yazdığı şeirləri çoxdur. Kabul. Bir gün dan yeri hələ sökülməmişdi. Atamız beş otaqlı mənzilimizin balkonunda dayanmışdı. Sübh azanı vaxtı idi. Birdən-birə atamızın gözləri önündə qonşuluqdakı məscidə bir raket atıldı. Hamımız oyandıq. Atamızın balkondan gördüyü müdhiş bir hadisə elə həmin gün iki bəndlik şeirə döndü.

KABUL SƏHƏR TEZDƏN, 26 MAY, 1988.

*Yayılır avazı həzin bir səsin,*
*Molla azan verir çıxıb minbərə.*
*Üz tutub göyə ki, göydəki kəsin*
*Olsun mərhəməti yerdəkilərə.*

*Atılır bir raket... Minbərə dəyir...*
*Mollanı qov kimi yerə tullayır...*
*Molla bəndə üçün dua eləyir,*
*Bəndə molla üçün raket yollayır.*

*(Şahin Fazil. Divan, Bakı, Azərnəşr,*
*1996, səh. 429).*

1983-cü ilin sonu idi. Əfqanıstana üçüncü səfərdən Vətənə qayıtmışdıq. Moskvadakı Əfqanıstan səfirliyindən bir məktub gəldi. Əfqanıstan medalı ilə təltif olunmuş atamıza həmin medalı təqdim etmək üçün onu səfirliyə dəvət edirdilər. Getdi, qayıtdı və "Təşəkkür" şeirini yazdı:

*Əfqan diyarında çox olmuşam mən,*
*Qürbət on ilimi aldı ömrümün.*
*Məqsədim deyildi eşidim "əhsən",*
*Zəhmət çəkməyirdim "təşəkkür" üçün.*

*Orda sərf etdiyim əməyim mənim*
*Qərəzsiz bir kəsin əməyi idi.*
*İgid əfqanlara köməyim mənim*
*Qardaşın qardaşa köməyi idi.*

*Heç də gizləmirəm, bu gün, bu dəmdə*
*Böyük bir iftixar mənə yar olub.*
*Hüdudu bir qarış olan sinəmdə*
*Hüdudsuz bir sevinc bərqərar olub.*

*Odlar ölkəsinə dağlar ölkəsi*
*Gör necə göndərib təşəkkürünü:*
*Mənə yetsin deyə "təşəkkür" səsi*
*Medala döndərib təşəkkürünü.*

*Bu təltif təb`imi gətirdi dilə,*
*Medalı sinəmə sancaraq bu gün*
*Əfqan ölkəsinə ehtiram ilə*
*Təşəkkür edirəm təşəkkür üçün!*

*(Şahin Fazil. Divan, səh. 427-428).*

Vətən və Qarabağ mövzusu atamızın əsas mövzularındandır. Onun bu günlərdə yazdığı "Qarabağnamə" qəzəli həmin qəbildəndir:

*Ey şanlı diyar, ey Qarabağ, ey ana yurdum,*
*Hökmən düşəcəksən təzədən səhmana, yurdum!*

*Düşmən səni işğal eləmişdir neçə müddət,*
*Tab eyləməyirsən daha sən hicrana, yurdum.*

*Haqsız yerə yadlar özünü haqlı sayıbdır,*
*Car eyləyirik haqqımızı hər yana, yurdum.*

*Artıq "qana-qan" vaxtı yetişmiş, gecə-gündüz*
*Qan uddururuq qarşı çıxıb şeytana, yurdum.*

*"Azər" sözü "Od"! "Od" yəni "Azər"! Deyərək "Can"*
*Birləşdirərik yurdu Azərbaycana, yurdum!*

*İndi o Murovdağda qırov varmı, var isti,*
*Dolmaqda yaşıllıq dərəyə, ormana yurdum...*

*Tərtər çayına axdı yenə su, su qovuşdu,*
*Gəlməkdə yenə təşnə çəmənlər cana, yurdum.*

*Pərvaz edəcəkdir yenə quşlar Göy üzündə,*
*Göz dikməyəcəklər cüyürə, ceyrana, yurdum.*

*Qiymətlidi Xankəndi, Laçın, Ağdərə mülkü,*
*Sahib olarıq biz Şuşatək mərcana, yurdum.*

*Hökmən becərib Kəlbəcəri ruzi yetirrik,*
*Var ehtiyacı Ağdamımın bağbana, yurdum.*

*Vacibdi səfərbərliyimiz, olsa zərurət,*
*Mən həm gedərəm baş əyərək fərmana, yurdum.*

*Alqış ola əsgərlərə, zabitlərə əhsən,*
*Eşq Ali Komandan kimi bir loğmana, yurdum!*

*Tezliklə səni eyləyib azad olarıq şad,*
*Ey şanlı diyar, ey Qarabağ, ey ana yurdum !!!*

*14.10.2020.*

Atamız zəhmətsevər adamdır. Qələm tutmaqdan barmağı qabarlıdır atamızın. Onun bir şeiri ilə məqaləmizi bitiririk.

*Mənim zəhmətimi az olub çəkən,*
*Hey öz əməyimlə ömür sürmüşəm.*
*Enişli-yoxuşlu həyatımda mən*
*Çox qəmi, fərəhi görüşdürmüşəm.*

*Zəhməti etmişəm dilimdə şüar,*
*Daim gözlərimdə o nur olubdur.*
*Hər kiçik, hər böyük uğurum ki var*
*Zəhmətdir, çevrilib uğur olubdur.*

*Mən ki, zəhmətkeşəm, yük olmayacaq*
*Heç vaxt əziyyətim doğmaya, yada.*
*Yığıb son gücümü ölümdən qabaq*
*Özüm qazacağam məzarımı da.*

*(Şahin Fazil. Divan, səh. 449)*

**SƏKSƏNİNCİ BAHARINI TƏBRİK EDİRİK, ATACAN!**

***30 oktyabr 2020.***

**Mahmud PƏDİDƏ**

## QƏZƏL*

*«Salmışdı şuri-şe'rin yeksərcəhanəŞahin,*
*Sən tək doğa çətindir mame-zəmanə, Şahin.*

*Hərçənd əyləşibdir başində bərfe-piri,*
*Müşkil vəli otursun təb'e-cəvanə, Şahin.*

*Əzbəs salıb şərarə hicran odu bu qəlbə,*
*Ney tək rəvadı gəlsəm hər dəm fəğanə, Şahin.*

*Səndən məni ayırsın hicran məhal işdir,*
*Çün mehrin əyləşibdir bu cismü canə, Şahin.*

*Bir min deyil ki, hüsnün ta mən yazım mədihə,*
*Saydan keçibdi, gəlməz bu yerdə sanə, Şahin.*

*Gündüz səninlə getdi, qaldı gecə mənimlə,*
*Bu ev mənə olubdu bir həbsxanə, Şahin.*

*Qoy sözlərin Pədidə bu növ ilə yetirsin,*
*Qalsın bu şe'r məndən sənə nişanə, Şahin».*

***14.09.1371. Təbriz***

---

* Şair Mahmud Pədidə ilə İrana birinci səfərim vaxtı Tehran və Təbriz şəhərlərində "Beynəlxalq Şəhriyar Konfransı"nda tanış olmuşdum. Nümayəndə heyətimizin tərkibinə akademiklər Eldar Salayev, Ziya Bünyadov, yazıçı Anar, şairlər Sabir Rüstəmxanlı, Qabil, Qasım Qasımzadə, Fikrət Qoca, Fikrət Sadıq, Nazim Rizvan, Sərvinaz Həsənli, alimlər Bəkir Nəbiyev, Yaşar Qarayev, Rüstəm Əliyev, Tofiq Hacıyev, Ruqiyyə Qənbərqızı, İmamverdi Həmidov, Şirindil Alışanov, Kamil Allahyarov, rəssam Fəxrəddin Əli və başqaları daxil idilər.
1 dekabr 1992. Tehran. "Talare-Vəhdət" sarayı. Konfransın ilk günü... 4 dekabr. Qum şəhəri. Orada Fikrət Sadıq Şəhriyarın "Azərbaycan" şe`rinin tərcüməsini, mənsə İranı salamladıqdan sonra Tehranda yazdığım beş qəzəlin üçünü oxudum. Alqışlandıq. Görünür bəyənmişdilər... 6 dekabr. Təbriz. Şair Mahmud Pədidə mənə həsr etdiyi bir qəzəlini oxudu. Şeir səmimanə yazılmış misralarla zəngindir və məni mütəəsir etdi".
Həmin şe`r məndə Mahmud Pədidədən nişanə qaldı, amma şe`rin müəllifi həyatda yoxdur. Allah rəhmət eləsin.

***Şahin Fazil. İran Səfərnamələri (Təkmilləşdirilmiş III nəşri),***
*"Elm və təhsil", Bakı, 2017, səh. 28-41.*

**Hacı Məsud İBRAHİMİ**

*(İran)*

## QƏZƏL*

*«Fazil, fəzilət əhlinə dünyadə dəyərsən,*
*Golbange-şəfəq, nəğmeyi-əlhani-səhərsən.*

*Həqq nəğməsi irfan nəfəsin, möhnəte-canlan*
*Sultane-ədəb, bəhre-vəfa, pire-qədərsən.*

*Cananə güvəndin rəhe-eşqin səfərində,*
*Gördün qəme-dünyanı, fərazində bəşərsən.*

*Baş-göz ağarıb, qəm gücünə yoxdu qərarın,*
*Aldın fərəhe-canı, həyatında gülərsən...».*

---

* Mənim "İran səfərnamələri" kitabımda bu qəzəl ilə bağlı aşağıdakı qeydlərim var: İyirmi birinci səfərnamə...26 fevral 2011. Tehran, Beşinci Beynəlxalq Kamil Şeir festivalı. "Səfərnamə"dən qeydlər: "...Bu festivala dünyanın müxtəlif ölkələrindən on yeddi şair dəvət olunub. Rahnumamız (müşayiətçimiz) Puran Hüseyni nüsxəsi komputerdə çıxarılmış bir siyahını mənə verdi. Xaricdən dəvət olunanlar aşağıdakılardır: Ehsan Əkbər (Pakistan), Şəfəq Əlibəyli (Azərbaycan), Fəxri Bouş (Suriya), Məsumə Şirazi (Pakistan), Kadır Turqut (Türkiyə), Naqi Abbas (Hindistan), Mehdi Baqir xan (Hindistan), Tariq Zeynalabdin Əş-Şərif (Sudan), Cəfər Xolmuminov (Özbəkistan), Həmidcan Həmidov (Özbəkistan), Kula N.Əbdül-Həssan (İraq), Cəlal H.Muhammad (İraq), Murtəza Musvi (Pakistan) və Cumaquli Atayev (Türkmənistan)".
"Lalə" oteli. "Kaxe-Sə`dabad" ("Sə`dabad qəsri"), yaxud Pəhləvilər sarayı. Şairlərin çıxışı. Əsgər Şahi də buradadır. O zaman hələ tanımadığım Məs`ud İbrahimi də şairlər arasındadır. "Şe`rləşmə (müşairə)" başlandı... 1 mart. "Ta`lare vəhdət" sarayı. Prezident Mahmud Əhmədinejadın çıxışı... Axşamçağı "Lalə"də Urmiyəli şair Hacı Məs`ud İbrahimi mənə yaxınlaşaraq özünün "Pak eşqin zümzüməsi" ("Zumzumeyi-eşqi-pak") kitabını bağışladı. Kitabın arxasında öz dəst-xətti ilə bir qəzəlin ilk beytləri yazılmışdı.
Qeyd edim ki həmin qəzəlin ardı o zaman əks olunmamışdı. Müəllif qəzəli bitirəcəyini və mənə göndərəcəyini dedi. Amma, aradan doqquz il keçmişdir və nə şair M.İbrahimidən, nə də şa`rinin ardının yazılıb-yazılmadığından xəbərim yoxdur.

***Şahin Fazil. İran səfərnamələri (təkmilləşdirilmiş III nəşri),***
*Elm və təhsil, Bakı, 2017, səh. 580, 583, 585-586*

**Seyyid Əliəkbər OCAQNEJAD**
*(İran)*

## QƏHRƏMAN ŞAHİN

*Gözəl sözündə yaranmış gözəl cahan, Şahin!*
*Əgərçi sözdə cahanı edib nihan Şahin!*

*Ədəb səmasına ulduz kimi berib zinət*
*O sirrlər ki, edir se`r ilən bəyan Şahin!*

*Səfayi-Ruhi mükəmməl, vəfası nöqsansız,*
*Kəlamı möhkəmo cananəvo rəvan Şahin!*

*Fəzayi-eşqini həm də sədaqət aləmini*
*Qəzəllərində verir aləmə nişan Şahin!*

*Bu bir həqiqətə şahiddi "Məcməüş-şüəra"*
*Ki, incə nöqtələri eyləyir əyan Şahin!*

*Dedim ki, kimdi məhəbbət çırağı, Ey Seyyid,*
*Dedi həras eləmə, səslə: Qəhrəman Şahin!*

**Mövlud AĞAMMƏD**
*(Quba)*

## ŞAHİN FAZİLİN "BAĞİBAN" QƏZƏLİNƏ TƏXMİS

*Bağda açılmışdı gül, solmaya, yarım gəlir,*
*Salma, düşər yadıma, atəşi–zarım gəlir*
*Mən necə qəmlənməyim, buyi–qübarım gəlir,*
*"Bağiban, ay bağiban, bağə nigarım gəlir,*
*Mən necə bağdan çıxım, indicə yarım gəlir".*

*Seyri-çəmənzar gözəl, gəlməsə yar çıxmaram,*
*Göz yaşı olsam belə ol yanağa axmaram,*
*Olmasa öz sünbülüm, mən yaxama taxmaram.*
*"Bəslədiyin güllərə gözucu da baxmaram,*
*İnsafın olsun sənin, gör necə varım gəlir".*

*Bağı – gülüstan yeri hər çiçəyin, hərgülün,*
*Qönçəsi mirvaridir tər çiçəyin, tər gülün,*
*Zülfə zərəfşan olar, tazəsini dər gülün.*
*"Təsiri yoxdur gülün, ya da xumar bülbülün,*
*Qəlbi xumar etməyə qəlbi xumarım gəlir".*

*Can ilə candan sevək, ellərə düşsün soraq,*
*Ahu fəğandan, gülüm, gen dolanaq, gen duraq,*
*Qoyma soyuqdan donaq, eşq alovun yandıraq.*
*"Bağə gəlir bir qonaq, sanki yanan bir çıraq,*
*Laləyə bənzər yanaq, tazə nübarım gəlir".*

*Çəkdi qəmin gizlicə, qırmadı dərd Məcnunu*
*Aşiqi dövran olub geydi Kərəm qəm donu.*
*Vəslətə yetmək ilən bitdi bu eşqin sonu,*

*"Darvazana vur kilid,get, açaram mən onu,*
*Bir dəfə sim–sim desəm, bil ki, açarım gəlir".*

*Mövluda ərz eyləyin, güllü baharım gəlir,*
*Dağ çəkilib qəlbinə, laləüzarım gəlir,*
*Mən necə vəsf etməyim, leylü–naharım gəlir.*
*"Möcüzədir, möcüzə, gör necə varım gəlir,*
*Bağiban, ay bağiban, bağə nigarım gəlir".*

**Rahib ALPANLI**

*Ustadımız, görkəmli alim,*
*şair qardaşımız*
***Şahin Fazilə** hörmətlə*

*Ağlayaq, ey qələm, talan dağları,*
*Gözləri yollarda qalan dağları.*

*Haqq deyib, haqqına həsrət qoydular,*
*Günəşi qoynuna salan dağları.*

*Əmanət illərə zirvəsində qar,*
*Əridər bir fitnə, yalan dağları.*

*Utanıb şimşək də udar səsini,*
*Gördümü xəyalə dalan dağları.*

*Yüklənə bu dünya qəm olub, əyməz,*
*Tabını Allahdan alan dağları.*

*Rahib, arzusudur **Şahin Fazilin** -*
*Bayraqla güldürə balan*dağları*

* Azərbaycan əsgəri

**Həkim QƏNİ**

*Şair dostum **Şahin Fazil** bəyin*
***60 illik** yubileyi münasibətilə*

*Sözün əzəmətli qanadlarilə*
*Sənət zirvəsində süzür Şahin Bəy!*
*Ürək deyənləri əqlin gücilə*
*Ömür saplarına düzür Şahin Bəy!*
*Sənət zirvəsində süzür Şahin Bəy!*

*Mənalı illəri əbəs olmadı,*
*Müdriklik kitabı hələ dolmadı,*
*Əkdiyi güllərin biri solmadı,*
*Hələ də mənalar gəzir Şahin Bəy.*
*Ömür saplarına düzür Şahin Bəy.*

*Ağ saçlar ömrünün salnaməsidir,*
*Əfqan hicranının ifadəsidir,*
*Onu danışdıran vicdan səsidir,*
*Qəzəl dəryasında üzür Şahin Bəy,*
*Misraya incilər düzür Şahin Bəy!*

*Artıq o yetişib müdrik yaşına,*
*Sənət vadisində, can sirdaşına,*
*Altmış il dönüb şair başına,*
*Edir əş'arını nəzir Şahin Bəy.*
*Sənət zirvəsində süzür Şahin Bəy!*

*Bu altmış yaşı olsun mübarək!*
*Onu yüz yaşda da belə şux görək,*
*Var olsun bu amal, bu arzu, dilək!*
*Hələ gətirməsin üzür Şahin Bəy!*
*Sənət zirvəsində süzür Şahin Bəy!*
*Divana mənalar düzür Şahin Bəy!*

***(Həkim Qəni Qəzəllər, Bakı, Şirvan nəşr,***
***2005, səh. 357-358)***

**Sona XƏYAL**

**QƏZƏL**

*Gətirib aləmi-şe`rə yeni "Divan" Şahin,*
*Tutacaq çoxlarına şe`rdə divan Şahin.*

*Donmuş idi neçə vaxt şe`rimizin şah damarı,*
*Ona verdi ürəyindən elə bil qan Şahin.*

*Anlamazlar verə bilməz bu işin qiymətini,*
*Düşünürlər başa gəlmiş sənə asan, Şahin.*

*Bu səbəbdən çoxu boş-boş danışıb ardınca*
*Çalışır ki, tuta hər ləhcədə nöqsan Şahin.*

*Hər yeni yaxşı işi daşqalaq eylər adəm,*
*Tarixi sal yadına, olma pərişan, Şahin.*

*Bu qədər arif adamlar ki, verir qiymətini,*
*Deməli, çoxlar olub bu işə heyran Şahin.*

*Şərqşünassan, həmi şairsən, həmi tarixçi,*
*Amma ellər sənə ad verdi "Qəzəlxan Şahin".*

*Qoymadın şe`rimizi əsirdə sən "Divan"sız,*
*Yeri var fəxr eləsin Azəribaycan, Şahin.*

*Nə olar təbriki səncə bu qələm dostlarının,*
*Sonadan şe`rdir ancaq kiçik imkan Şahin.*

***(Şahin Fazil. "Təzkireyi-Şahin, səh. 288-289)***

**Hacı MAİL**

## ŞAHİN FAZİLİN "DİVAN"I MÜNASİBƏTİLƏ QƏSİDƏ

*"...Və nəhayət bu yaxınlarda **Şahin Fazil** tərəfindən yazılan XX əsr Şimal Azərbaycanının 100 ildən çox bir dövrünü əhatə edən ədəbiyyat tarixində ədəbi-bədii bir hadisə baş verdi, ölkəmizdə Seyid Əzim Şirvanidən sonra yazılmayan divan ədəbiyyatımızın ilk nümunəsi, elə müəllifin özünün dediyi kimi "oxucu divanı"na ("mühakiməsinə") tapşırıldı".*

*Şahina, baxdım o gün təzə çıxan "Divan"ə,*
*Xoşuma gəldi inan, and içirəm Qur`anə.*

*Əhli-insaf sənin zəhmətini dərk eləyir,*
*Əhli-xibrə ola bilməz bu işə biganə.*

*Çox əmək sərf eləyibsən bu kitabdan ötrü,*
*Çıxdı bu sə`ylərin axırı ki meydanə.*

*Yoxdu "Divan" əsərindən bir əsər çox illər,*
*Saldın axır bu işi sən təzədən səhmanə.*

*Eşidərkən yanacaq çoxları, qoy yansınlar,*
*Bəlkə çoxlar həsədindən olacaq divanə.*

*Mislsiz töhfədir alimlər üçün amma bu,*
*Siqlətindən sayılır bir əsəri-şahanə.*

*Bu bizim hamımıza aid olan "Divan"dır,*
*Hali olsun hamı qoy bizdə olan imkanə.*

*"Ədəbi məclis"imiz fəxr eləyərsə, yeri var,*
*Şəm` yansa sevinər yanmağına pərvanə.*

*Təki çoxlar yaza "Divan" əsəri biz sevinək,*
*Çatlasın qoy həsədindən bu işə biganə.*

*Sayılır məncə qaranquş bu kitab əsrimizə,*
*Qalmasın leyk o tək, and veririk Sübhanə.*

*Gəlsin ilhamə hamı, eşqə düşüb yansınlar*
*Ki, sədamız düşə bundan belə qoy hər yanə.*

*O gün olsun oturub qeyd eləyək "Divan"ı,*
*Deyirəm bu əsərin layiqi var qurbanə.*

*Yaz, yeni şe`rlərinlə bizi xoşhal eylə,*
*Binəsib olmaya bundan belə hər fərzanə.*

*Şöhrəti qoy yayıla yazdığının, ey dostum,*
*Ərəbistanə çata, Türkiyəyə, İranə,*

*Mir Cəlal *qardaşımı təbrik elə adımdan,*
*O, redaktəylə salıb hər qüsuru səhmanə.*

*Zəhmətin zahir olar kim oxuyarsa kitabı,*
*Zərgər olmazsa, bilinməz ki, nadir dürdanə.*

*Kitabın nəşrinə kimlər kömək etmişsə bu gün,*
*Sayıram cümləsini bu iş üçün mərdanə.*

*Yazdığım bir də ki, tə`rif deyil, dost sözüdür,*
*Dost gərək göz yuma dostunda kiçik nöqsanə.*

*Bu zəif şeiri üçün əfv elə gəl Maili sən,*
*Leyk, diqqət elə hər beytdəki irfanə***

***(Şahin Fazil. "İkinci Divan",***
***Bakı: 2005,-səh. 1216-1217)***

* "Divan"ın redaktoru Mir Cəlal Zəki.
** Bax: Hacı Mail. XX əsrin birinci "Divan"ı, "Ekspress" qəzeti, N 92, 18 may 1999-cu il

**Qiymət MƏHƏRRƏMLİ**
*(Zəlzələ baş verən gecə düşündüklərim)*

## İMTAHAN

*"...Hər bığ tumarlayan kişidir məgər?*
*Az da kişiliyi qalıbsa əgər,*
*Geriyə qaytarın qaçan kişini"*
***Şahin Fazil***

*Haraya qaçırsan taledən, bəxtdən,*
*Qaçmaq igidliksə, qoy namərd olum.*
*İgid bir yol ölür, qorxaq min kərə,*
*Qoy məni arxadan tutmasın ölüm.*

*Dəhşətdən, vəhşətdən gözlər böyümüş,*
*Hərə bir tərəfə üz tutub qaçır.*
*Qorxudan uşaq tək ağlayan kişi*
*Arvadı, uşağı unudub qaçır.*

*Özü öndə gedir, əyalı dalda,*
*Başından papağı sürüşüb düşür.*
*Qeyrəti cibində, xəyalı dalda,*
*Evdəki mal-mülkə ilişib düşür.*

*Arvad tək dabana tüpürən kişi,*
*Dayan bir, özünə gendən bax barı.*
*Bu dərdi gözlərdən göndərən KİŞİ*
*İmtahan eyləyir biz insanları.*

*Ayağın altında qalan balanı*
*Tapdayıb keçməyə ürək istəyir.*
*Yuvasız qalanı, yurdsuz qalanı*
*Dərd deyil, qorxağın tə`nəsi əyir.*

*De, nədən hürkmüsən, nədən qaçırsan,*
*Sərçə ürəyiymiş ürəyin demə.*
*Ayıbdır o boyda bədən, qaçırsan,*
*Dizinin üstəymiş çörəyin, demə.*

*Bu da bir görk oldu görəcək bizə,*
*Yaxşıca ayırdıq yaxşını pisdən.*
*Daha sözüm yoxdur düşmənimizə*
*Qorxaqlar artdıqca öz içimizdən.*

*Vətən talan olar, yurd viran qalar,*
*Qorxub kiçildikcə kişilərimiz,*
*Dözməyib qılınc tək qından sıyrılar,*
*Qeyrətə sığınan "dişilərimiz."*

*Dovşan ürəklilər qurtara bilməz*
*Vicdan töhmətindən, vicdan səsindən,*
*Koroğlu qəbirdə dinc yata bilməz*
*Xəcalət çəkdikcə törəməsindən...*

***28 noyabr, 2000.***
***(Qiymət. Ana səndən doymadım...***
***Bakı: 2001,– səh. 26-27)***

## DƏRDİ

***Şahin Fazil üçün təsəlli şe'ri***

*Tanrım məndən inciməsin,*
*Çəkəmmirəm daha dərdi.*
*Sinəm üstə qəfil çöküb*
*Sevincimin baha dərdi.*

*Gözlədiyim gözə gəldi,*
*Söylədiyim sözə gəldi.*

*Gəzdi... gəzdi... bizə gəldi,*
*Çıxmasın sabaha dərdi.*

*Sərrafı yox satam onu,*
*Tonqallara çatam onu.*
*Atammasam, atam, onu*
*Tapşırım Allaha dərdi.*

***(Şahin Fazil. Təzkireyi-Şahin.***
***Bakı: 2006,– səh. 322)***

**Yaşar CAHİD**

## QƏZƏL

*Şe`r aləminin söz dolu dünyasıdı Şahin,*
*Azər dilinin şe`rdə mənasıdı Şahin...*

*Dəryasını axtarsa sözün, tapmasa qəvvas,*
*Bilsin ki, sözün dalğası, dəryasıdıŞahin.*

*Azər dilinin daima durmuş keşiyində,*
*Xəlqin harayı, həm səsi, ifasıdı Şahin.*

*İlk kəlməsi hər yerdə Vətəndir, Qarabağdır,*
*Güldürsə Vətən bülbüli-şeydasıdı Şahin.*

*Ölmüşsə də Mail kimi bir dahi sənətkar,*
*Vahid ilə Maillərin ehyasıdı Şahin.*

*"Məcməş-şüəra"nı necə təsvir edək onsuz?*
*"Məcməş-şüəra"nın özü , mənasıdı Şahin...*

*Alimliyinə xəlq özü qiymət verib, indi*
*Öz sahəsinin alimi-üzmasıdı Şahin.*

*Cahid, bu gün ifası ilə indiki şe`rin*
*Batindəki, zahirdəki simasıdı Şahin.*

***17 iyun 2003-cü il***

## QƏZƏL

***Yaşar Cahidin** çəkdirdiyi bir klipin*
*təqdimat mərasimində bu hacı qardaşıma*
*həsr etdiyim qəzəlimi oxudum*

*Yəqin ki, tək deyil, Yer Kürrəsində xeyli var Cahid,*
*Buna yoxdur qətiyyən şübhə ki, təkdir Yaşar Cahid!*

*Mənimlə Məşhədə getdi və oldu məşhədi orda,*
*Gedib Həccə hacı oldu iki yol əzmkar Cahid.*

*Bəli ovqatı keçməkdə səyahətlərdə günlərlə,*
*Nə var ki çəkməyə həzzi, çəkibdir intizar Cahid.*

*Baxıb naz ilə, ey saqi, onu meyxanəyə çəkmə,*
*Sürud ilə, qəzəllərlə olur daim xumar Cahid.*

*Həmi şair, həmi xanəndə, həm dərviş olan kimdir?*
*Dilimdən tez səda qopdu: O kəs şəksiz olar Cahid!*

*Sənin mədhində, ya Allah, sürud etdi bizə təqdim,*
*İlahinamələr yazdı, İlahi, bəstəkar Cahid.*

*Neçə övladı var ikən yenə olmaqdadır zahir,*
*Özündən sonra qoymaqda əsərlər yadigar Cahid.*

*İkinci sətrini təkrar edir Şahin bu şe`rində:*
*Buna yoxdur qətiyyən şübhə ki, təkdir Yaşar Cahid!*

***31.03.2004***
***(Şahin Fazil. "Təzkireyi-Şahin", səh. 329, 330)***

**Fəxrəddin SALİM**
*Şahin Fazilə nəzirə*

## QƏZƏL

*"Bir cünun naləsi əks olmada naləmdə mənim"**
*Nalədən özgə nəyim var bu aləmdə mənim.*

*Təkcə qan ağlamadım sineyi-xəlvətdə, könül,*
*Car olur xuni-dilim dideyi-pürnəmdə mənim.*

*Yanıram atəşi-hicranə bu dünyada ikən,*
*Nə işim var dəxi nari-cəhənnəmdə mənim.*

*Mənə kim söylədi vaiz sözünə talib olum ?*
*Nədi azarım axı zahidi-sərsəmdə mənim?*

*Mey içib Kə'beyi-kuyində təvaf eyləyirəm,*
*Yoxdu billah gözüm çeşmeyi-Zəmzəmdə mənim.*

*Çün hülul eyləmişəm növ'i-bəşər cismində,*
*Vardı nurim hələ zürriyyəti-Adəmdə mənim.*

*Şadü xürrəmdi meyi-vəhdət ilən hər ləhzə,*
*Dəxi, ey dil, nə qəmim Salimi-biqəmdə mənim.*

***Şahin Fazil.***
***"Təzkireyi-Şahin", səh. 365-366***

* Misra Ş.Fazilindir.

**Həşim QƏRVƏNDİ**

## TƏCNİS

*"Məcməüş-şüəra"nın sədri, yaradıcı alim,*
*gözəl şair vəfüzulişünas dostum*
***Şahin Fazilin 60 illik** baharına"*

*Zirvələr fəth edər, göylərdə gəzər,*
*Quşların sərdarı, şahıdır şahin,*
*Ötən əsrin divan yazan şairi,*
*Eşq olsun yubiley gününə, Şahin.*

*Haqqın, həqiqətən divanı səndə,*
*Ədalətlə eylə divanı sən də.*
*Tamamla ikinci divanı sən də,*
*Adına bir dastan Füzuli Şahin.*

*Altmış nə yaşdır ki, yüz vurmalısan,*
*Paxıllar başına yüz vurmalısan,*
*O vaxt mənim ilə yüz vurmalısan,*
*Olmasa da pulun bir qara Şahiın.*

*Gecə də, gündüz də yazırsan elə,*
*Yazırsan vətənə, yazırsan elə,*
*Qərvəndi, hər kəs də istəyər elə*
*Bəzəsin sənin tək şahinə, Şahin.*

***Şahin Fazil.***
***"Təzkireyi-Şahin", səh. 305***

**Ələmdar MAHİR (1951)**

*Uzun illər şe`r yazmaq məharətini özündə aşılayan və insafən gözəl şe`rlər yazan Ələmdar Mahirin "Şair dostum Şahin Fazilə" başlığı altında "Səadət intizarında" kitabında gedən bir müxəmməsini sizin yadınıza salmaq istərdim. Bu uğurlu şe`r nümunəsi bir növ Ə.Mahirin etirafı deyilmi? Ş.F*

*"Ey eşq biyabanının avarəsi Şahin,*
*Ey sözləri çox xəstələrin çarəsi Şahin,*
*Şe`rim sənədir, ey gözümün qarəsi Şahin,*
*Hər yarədən ağırdı sözün yarəsi, Şahin,*
*Əhli-ədəbik, olmalıdır nəng aramızda.*

*Bir söz dili-naşadımı qoymur qala rahət,*
*Dərddirmi deyim dildəki, yainki şikayət,*
*Qoy mən danışım sən də elə lütfü inayət,*
*Bu şərt ilə münsif ola bir əhli-ədalət,*
*Təsdiq eləyək Maili pərsəng aramızda.*

*Yox əyri nəzər düz görünən şe`rə gözümdə,*
*Yox heç kəsə nə atmaca, nə rəmz sözümdə,*
*Bir az kobud olsam da, həya vardır üzümdə,*
*Əvvəlcə özümdən deyim, az yoxdur özümdə,*
*Çün sənlə mənim ən çox olub cəng aramızda.*

*Hər kim qulaq asmışsa usanmış səsimizdən,*
*Kim şahidi olmuşsa utanmış səsimizdən,*
*Bu lənətə gəlmiş, oda yanmış səsimizdən,*
*Min cəhl ilə əflakə dayanmış səsimizdən*
*Gör bir nə qədər şair olub dəng aramızda.*

*Boş söhbət ilə verməmişik ömrü hədər biz,*
*Qoyduq hərəmiz bir cürə dünyadə əsər biz,*
*Göstərməliyik olduğumuz yerdə hünər biz,*
*Bir mənzilə zahirdə sığınsaq da əgər biz,*
*Var leyk məsafə neçə fərsəng aramızda.*

*Bizdən həmişə tərif umur qönçə dodaqlar,*
*Bir şe`rə ətəymizdən öpür laləli bağlar,*
*Səf çəkməliyik biz necə durmuş sıra dağlar,*
*Adətdü dayaq olmağa dağ dağı qucaqlar,*
*Layiq deyil olsun bu qədər həng aramızda.*

*Hər sözdə rümuzat, müəmma biliriksə,*
*Hər gördüyümüz surətə məna biliriksə,*
*Hər iş görürük həddini əla biliriksə,*
*Aləmdə bu gün özmüzü dana biliriksə,*
*Vəhdət işi neyçün yeriyir ləng aramızda?*

*Hər quş tanınar səhni-gülüstanda səsiylə,*
*Hər quş oxuyar nəğməsini öz nəfəsiylə,*
*Kim cəh-cəhi ilə, kimi ahəstə səsiylə,*
*Şair də gərək şe`ri deyə öz həvəsiylə*
*Yox eybi əgər olmasa ahəng aramızda.*

*Aşiqlərimiz var ki, sədaqətdə fəsanə,*
*Dilbərlərimiz var ki, gözəllikdə yeganə,*
*Şairlərimizdən gələ bilməz bu cahanə,*
*Var bir Qənimiz tibbdə loğmani-zəmanə,*
*Qoymaz cücərib kök sala xərçəng aramızda.*

*Ey əhli-qələmlər, bura "Məcməş-şüəra"dır,*
*Bu elmü ədəb məktəbi bəzmi-ürəfadır,*
*Bu bəzmə gələnlər şüəradır, üləmadır,*

*Bir-birmizə bu büğzü ədavət nə rəvadır,*
*Hər şeydən əzəl olmalı fərhəng aramızda.*

*Minrəngli dünyadə ki, bir ömür dolandım*
*Heç bilmədim hardan belə min rəngə boyandım.*
*Mahir kimi qəflətdə idim, sanki oyandım,*
*Min rəngə düşüb rəngimi gördükdə utandım,*
*Bir çarə edək qalmaya bir rəng aramızda.*

## MÜXƏMMƏS

*Bu da mənim **Ələmdar Mahirə***
*yazdığım cavab şe`rimdir:*

*Eşq aləminin mən kimi ey sərvəri Mahir,*
*Qoyduq qınına çəkdiyimiz xəncəri, Mahir,*
*Aldıq ələ şövq ilə qələm-dəftəri, Mahir,*
*Söz cənginin ey mən kimi cəngavəri Mahir,*
*Çox yaxşı ki, bitmiş deyəsən cəng aramızda.*

*Ən ümdə kəlam oldu hər aqildə– məhəbbət,*
*Ya Rəb, ola hər hücrədə, mənzildə məhəbbət,*
*Dəryadə məhəbbət ola, sahildə– məhəbbət,*
*Qəlb içrə səadət ola, həm dildə– məhəbbət,*
*Məclisdəkilər olmaya diltəng aramızda.*

*Zərgərliyimiz var isə misgər bizə neylər?*
*Olsaq biz əgər tunc kimi, xəncər bizə neylər?*
*Üzmək biliriksə daha Tərtər bizə neylər?*
*Şeytan nə edər bizlərə, kafər bizə neylər*
*Əlbirliyimiz olsa həmahəng aramızda.*

*Gər Mailə bənzər ola bilsəydi hər insan,*
*Çəkməzdi fəna mülkdə, əlbət, zərər insa,*
*"İmanı olanlardı fəqət bəxtəvər insan"**
*Çox yaxşı ki, vardır Qəni tək mötəbər insan,*
*Çox yaxşı ki, kök atmadı xərçəng aramızda.*

*Amal gülümüz qoy yenə əvvəlki tək açsın,*
*Qəlb içrə neçə arzu cücərsin, dilək açsın,*
*Söz gülşənimiz ətr ilə dolsun ürək açsın,*
*Qoy solmaya şe`rin bağı, ya Rəb, çiçək açsın,*
*Nərgiz yerinə bitməyə turşəng aramızda.*

*Kin saxlamaq, əlbəttə, bu minval yaraşmaz,*
*Hər sözdə səmimanə olaq, xal yaraşmaz,*
*Sülh arzulayan kəslərə cəncal yaraşmaz,*
*Hal əhlinə, zənnimcə mənim, qal yaraşmaz,*
*Hal əhli daha olmaya qoy dəng aramızda.*

*Gizlin diləyim qoy ola zahir, bağışla,*
*Təkzib elədim şe`rini, şair, bağışla,*
*Həcvim də olubdur sənə dair, bağışla,*
*"İ" hərfini atdım, məni Mahir, bağışla,*
*Münsif ola bilmirdi Ərəbzəng aramızda.*

*Xoşdur ki, kənar eyləmişik cəngi, a Şahin,*
*Mahir dəyişibdir daha ahəngi, a Şahin,*
*Şur ilə çalaq sülh udunu, çəngi, a Şahin,*
*İnkar edirəm mən də qara rəngi, a Şahin,*
*Ağ rəng olacaq olsa əgər rəng aramızda.*

***01.01.1999***
***Şahin Fazil. "Təzkireyi-Şahin",***
***Bakı, 2006, səh. 198-200, 201-202***

---

* Misra Ələmdar Mahirindir.

**Ənvər NƏZƏRLİ**
*Şair dostum **Şahin Fazilə** ithaf*

*Biz məhəbbət göylərin fəth eyləyən şahinlərik,*
*Eşqimiz tək ülvi bir aləmdə biz sakinlərik.*

*Eşqdən qeyri nə söz var dəhrdə yaddır bizə,*
*Həq deyər, həq söyləyər, həqqin kəlamın dinlərik.*

*Əhli-fəqrik, varımız yoxdur məhəbbətdən səva,*
*Sidq ilə, iman ilə zəngin olan miskinlərik.*

*Atəş içrə yaxsalar da zarü giryan olmarıq,*
*Hicr əlindən hər nəfəs çəkdikcə ney tək inlərik.*

*Yarımız mə'budumuzdur, kuyi-canan qibləmiz,*
*Eşqü sevda mə'bədində can qoyan kahinlərik.*

*Saqi də, meyxanə də, peymanə də məhrəm bizə,*
*Qoy desin əğyar ki, biz yoldan çıxan bidinlərik.*

*Kimsənin könlün yıxıb təlx etmərik ovqatını,*
*Hər sözü, hər söhbəti Ənvər kimi şirinlərik.*

***Şahin Fazil. "Təzkireyi-Şahin",***
***Bakı, 2006, səh. 190***

**Çingiz TALISTAN**

## I
## BU DÜNYA -- DƏLİXANA

*"Bu dünya–dəlixana,*
*Adəmisə Baş həkim,*
*Baş həkimsə--baş dəli,*
*Həvva -- şəfqət bacısı.*
*Bu dünya --dəlixana,*
*axı şirinliyindən*
*çoxdur onun acısı…"*
*Prof.* ***Ş.Fazil***

*Adəm-- baş həkimsə,*
*Həvva şəfqət bacısı.*
*Xəstə kim?*
*-- Xəstə -- İblisdir.*
*İblis çoxdan xəstədir.*
*Xəstəyə baxan -- Həvva,*
*Adəm -- məsləhət verən.*
*....İblis -- Həvva xəstəsi.*
*...Nə deyim, dəlixana?*
*Bəli dəlixana,*
*Bu dünya dəlixana...!*

*...Dünyanın getməyə yoxdur yeri də,*
*O, hara gedirsə, tutur ağlamaq.*
*Bəla var, küləyi yıxar Yeri də,*
*Lazımdır bəlanın yolun bağlamaq...*

***31.08.2003***

## II
## QƏZƏL

*"Əndəlib" yazmadadır "bülbülü"şairlərimiz ,*
*Bülbülü mən "solovey" yazsam əgər, düzmü olar?..."*
***Şahin Fazil***

*Kərəmin yanğısı hicrin dadıdır, düzmü dedim?*
*Sevəninnaləsi vəslin adıdır, düzmü dedim ?*

*Varmı aşiq Kərəm olsun, yanıb oddan kül ola?*
*Gördüyüm çöldə yanan sap, çatıdır, düzmü dedim?*

*Yalan olmaz nə desəm, çünki özüm eşq oduyam,*
*Aşiq olmaq ürəyin qəm çatıdır, düzmü dedim?*

*Çox desəm artıq olar, qiyməti olmaz sözümün,*
*İndi Məcnun kimilər bil, hadıdır, düzmü dedim?*

*And içib, söz veribən, mən yazıram bir monolit,*
*Otuz illik işi var, "El qatıdır" düzmü dedim?*

*Qıymagöz İnqaya məxsus-köç ediblər başa düş,*
*Türkə baxsan, yada sal o Batıdır, düzmü dedim?*

*Çingizin qəlbinə dağ basma gülüm, məlhəmə keç,*
*Bil, onun yanğısı yer-göy qatıdır, düzmü dedim?*

***15.03.2005***

**Əsgər ŞAHİ**
*(İran)*

## I
## MƏST İLƏ MƏSTANƏ

***Ş.Fazilin şeiri***

*Eşq ilə yenə şəm'ə pərvanə gəlib Şahi,*
*Əncamı üçün meylin imkanə gəlib Şahi.*

*Məlum ki, var fərqi məstanə ilən məstin*
*Saqi, ona mey vermə, məstanə gəlib Şahi.*

*Sən mehrü məhəbbətlə sevda eləsən, qaçmaz,*
*Zənn eyləmə sevdayə biganə gəlib Şahi.*

*Mərdanəsə ülfətdə namərd ona neylər ki?*
*Mərd ölkəyə, əlbəttə, mərdanə gəlib Şahi.*

*Vardır yeri göz üstə, gəlmiş Bakıya bir də,*
*Şahanə qədəmlərlə şahanə gəlib Şahi.*

*Şahin, dəli bir başqa, divanəsə bir başqa,*
*Leyla gəzən aşiq tək divanə gəlib Şahi.*

***Bakı, 16 iyul 2003***

## II
## SƏSSİZ DUA

***Ə.Şahi Ərdəbilinin şe'ri***

*Ey dərin şeirləri can kimi şirin Şahin!*
*Dolduran ətr ilə söz zülfünü çin-çin Şahin!*

*Qəlbüvün isti qanında yuyunub çıxmasa söz,*
*Şeirüvün telləri olmaz belə zərrin, Şahin!*

*Orda ki, tutiyi-təb'ün dolanır izzətilən*
*Aça bilmir qanad ol ərsədə şahin, Şahin!*

*Bir belə hüsnü lətafətlə sənün şeirlərün*
*Bilmirəm şe'ridi ya nərgizü nəsrin, Şahin.*

*Arizu eylirəm olsun elə qiymətli sözün*
*Ki, mələklər eləsin şeirüvi təzmin Şahin!*

*Sən ilən mən salaruq mavi səmalərdə səda,*
*Olsaq Allah qapısında iki miskin, Şahin.*

*Gecə gördüm yuxuda Kə'bə qabağında durub*
*Eləyir Şahi dua, söyləyir amin Şahin!*

***Payız 1382 (2003)***

## III
## TÜKƏNMƏZ FEYZ

*Ruhimə rövnəq verən reyhandı Şahin qardaşım,*
*Qəlbimi abad edən sultandı Şahin qardaşım.*

*Həm ədəb mülkün edib təsxir, həm elm ölkəsin,*
*Fəxri- əsrü fazili-dövrandı Şahin qardaşım.*

*Həm sözü insanı məstü valeh eylər, həm özü,*
*Böylə ki şirindi, guya candı Şahin qardaşım.*

*Minnəti- dünyanı çəkməz, sərvi tək azadədir,*
*Qəhr etməz, gül kimi xəndandı Şahin qardaşım.*

*Feyziyab eylir qələmlən aləmi bir ömrdür,*
*Bir tükənməz feyzdir, ehsandı Şahin qardaşım.*

*Elmilən ömrün sürən pir olsa da, olmaz məlul,*
*Alnına çin düşsə də, xaqandı Şahin qardaşım.*

*Şahidən sordum qəmi-hicranı Şahindən, dedi:*
*Sinəm içrə qəlbtək pünhandı Şahin qardaşım.*

***Qış, 1382 (2004)***

**IV**
**MƏ'NA BAZARI**

*Qəlbimdə mənim hər dəm izharə gələr Şahin,*
*Mə'nadən açıb söhbət, goftarə gələr Şahin.*

*Hər mülkdə ki canan, üşşaqdən istər can,*
*Can əldə edib ehsan, isarə gələr Şahin.*

*Ey sinə, şərərbar ol, od gəldi xəridar ol!*
*Dön cənnətə gülzar ol, gülzarə gələr Şahin.*

*Hər kim edə nəfsin xar, dünyadən olar bizar,*
*Mə'nadə açar bazar, bazarə gələr Şahin.*

*Yandır ürəyi nar et, sındır bədəni xar et,*
*Can mülkünü dərbar et, dərbarə gələr Şahin.*

*Şahi ki minib bəxtə, ulduz da çıxar təxtə*
*Iclal ilə ol vəqtə didara gələr Şahin.*

***Bahar 1383 (2004)***

***Əsgər Şahi. Külün bağışla yelə, Ərdəbil, 1390 hicri-şəmsi, səh. 75-78***

**Beytullah CƏFƏRİ**
*(İran)*

*"Ey vətəndaşlar, bu gün siz İrana xoş gəlmisiz,*
*Səngəre-islamə, eşqi-Qur'ana xoş gəlmisiz.*

*Nisgil oldu Şəhriyarə Gəncə, Bakı, Naxçıvan,*
*Şəhriyarın yurdu Azərbaycana xoş gəlmisiz.*

*Sinələrdə ayrılıq dərd olmuş idi bir ömür,*
*Sinələr dərdin yetirdiz dərmana, xoş gəlmisiz.*

*Şairin zövqü gəzər hər halda güllər ardıcan,*
*Nazlı bülbüllər səyaqi gülşana xoş gəlmisiz.*

*Qardaşıq, birdi bizim tale müasir dünyada,*
*Qanı qanə qatmısız, canı cana, xoş gəlmisiz.*

*Bizdəki eşqü məhəbbət örnək oldu aləmə,*
*Bəsləsin ta sevgi insan insana, xoş gəlmisiz.*

*Qondu Fazil zirvəmizdə zəhmli şahin kimi,*
*Cəfəri qurbandı böylə mehmana, xoş gəlmisiz".*

***Hicri tarixlə 02.07.1391***
***Miladi tarixlə 23.09.2012***

**Əlibala HACIZADƏ**

## İLAHİ BİR NURA BƏLƏNDİ ŞAHİN

*Dost yolunda şirin candan keçəndi,*
*Dostla ağlayandı, güləndi Şahin.*
*Bir yetim sızlasa qəlbi göynəyər,*
*Yetim göz yaşını siləndi Şahin.*

*"Başının üstündə Allah var" deyib,*
*"Düşmənə düşmənəm, yara yar" deyib,*
*"Sərvətim, xəzinəm düz ilqar" deyib,*
*Ilahi bir nura bələndi Şahin.*

*Şair ömrü ilk bahara bənzəyir,*
*Ağ saçları dağda qara bənzəyir,*
*Xəyalları buludlara bənzəyir,*
*Göylər aləmindən gələndi Şahin.*

*Onun kimi həmdəm ara, həyan gəz,*
*Məhəbbəti yerə, göyə edər bəs...*
*Şahin yaxşı deyib: Sevənlər ölməz,*
*Məgər bu eşq ilə öləndi Şahin?*

***13 mart 2003***

***Şahin Fazil. İran səfərnamələri, I nəşr,***
***Bakı, səh.7-10***

**Mir Cəlal Zəki MƏŞTƏQAYİ**

## QİT`Ə

***Alim və şair dostum Şahin Fazilə***

*Ey ədəb bəzminə verən rövnəq,*
*Tazə etdin bu bəzmi ziba sən.*

*Bağlayıb xidmətə, hünər kəmərin*
*Xidmət etdin hünərlə peyda sən.*

*Xəlqə xidmət həmişə cilvə qılır,*
*Et şərəf bürcünə təmaşa sən.*

*Tazə səpk ilə saldın avazə,*
*Fərd oldun bu yolda tənha sən!*

*Gah şahintək eylədin pərvaz,*
*Gah xəlvətdə oldun ənqa sən.*

*Sən dedin "Əhsənüt-təvarix"dən,**
*Etdin Əbbası aləmara** sən.*

*Kim ələm, kim qələmlə fəth qılır,*
*Nə mən İsgəndərəm, nə Dara sən.*

*Taci-zər iddia edən çoxdur,*
*Taci-zər etmədin təmənna sən.*

* Şahin Fazilin tərcüməsi üzərində 10 ildən bəri çalışdığı əsərin adı.

** Böyük Azərbaycan tarixçisi İsgəndər bəy Münşinin (1560-1634) 14 ildə yazdığı və Ş.Fazilin 14 il müddətində fars dilindən doğma dilimizə tərcümə etdiyi və 2010, 2014-cü illərdə nəşrini tapan "Tarixi-aləmaraye-Abbasi" ("Dünyanı bəzəyən Abbasın tarixi") adlı tarixi kitabının həsr olunduğu şəxsə–I Şah Abbas Səfəviyə işarədir – Ş.F.

*Səni yad eyləyən mənəm tənha,*
*Nə mənəm yad olan , nə tənha sən.*

*Məqsədim yad qılmaq idi səni,*
*Gəzmə şe`rimdə özgə mə`na sən.*

*Bircə saatdə nəzm tapdı bu dürr,*
*Dürr üçün seyr qılma dərya sən.*

***Şahin Fazil. Doğruya doğru, Elm və təhsil, Bakı, 2018, səh. 1192-1193***

**Əli ƏLƏMİ**

## TƏBRİK

*Şahin Fazilin 80 illik yubileyi*
*münasibəti ilə.*

*Ey könül, şövqlə təbrik eləyək ustadı,*
*Yüzə yetsin dizi altında qoyub həştadı!*

*O, gözəl ömrünü həsr eyləmiş elmə, şe'rə,*
*Şair-alimdi, şərəflə daşıyır bu adı.*

*Tarix elmində onun zəhmətinin bəhrəsi çox,*
*Alimi alim edib zəhməti, istedadı!*

*Keşiyində dayanıbdır Vətənin tarixinin,*
*Vətənin əsl vətəndaşı, sevən övladı!*

*İncə söz vurğunudur, sözləri eşq ilə seçir,*
*Qoymur heç gözdən, o mənalı sözün səyyadı!*

*Beşdi divanı bugün, altı olar istərsə,*
*Zirvədən söz yığır hikmət dağının Fərhadı!*

*"Sadələşdir dili, xəlqin səni sevsin" deyir o,*
*Kim ki, sevmir dilini, şübhəlidir əcdadı!*

*Söykənib Həqqə,sözün həqqini söylər hərvaxt,*
*Ona Həqdən yetişib, Həqq eləyib imdadı!*

*Üzə de fikrini, gizlətmə, səni dinləyəcək,*
*Əsla rədd etməyəcək haqlı olan iradı!*

*Etsə tənqid əgər o, haqlıdısa, susmalıyıq,*
*Susmadıqca ucalıb bir çoxunun fəryadı !*

*Sayəsində neçə illər yaşayır məclisimiz**
*Sözün uğrunda bu məclisdə hələ davadı!*

*Nə deyim, baş vura bilməmki, onun elminə mən,*
*Mircəlal*** ağa demişkən: "Bu kişi dəryadı !"*

*Özünə heykəl ucaltmışdır olub Heykəl Adam,*
*Yazdığı saysız əsərlərdir onun bünyadı !*

*Böyük ustadımız olmuş bizə Şahin Fazil,*
*Ələmi, şövqlə təbrik eləyək USTADI!*

* "Məcməüş-şüəra" ədəbi məclisi nəzərdə tutulur-Ə.Ə

** Mİr Cəlal Zəki Məştəğayi- Nizami Gəncəvinin əsərlərini əruz vəznində tərcümə etmiş məşhur mütərcim, əruz bilicisi (1945-2019)

**Rəhim Əsədullahi DƏRVİŞ**
*(İran)*

*Şeyda bülbül kimi gəlmiş dilə Şahin Fazil,*
*Dil verir bağçadakı bülbülə Şahin Fazil!*

*Tutdu yetmiş beş ilin izzət ilə bayramın,*
*Çata sağlamlıq ilə yüz ilə Şahin Fazil!*

*Şah əsərlər yaradıb Molla Füzulilər tək,*
*Yetirib karvanı son mənzilə Şahin Fazil!*

*Nəzm edib nəğməli divanları Od yurdunda,*
*Yaradıb şer ilə min silsilə Şahin Fazil!*

*Fəxridir doğma Azərbaycanımın bu şair,*
*Yaraşıqdır qocaman məhfilə Şahin Fazil!*

*Qorqudun son nəfəsi almış ələ Divanın,*
*Qələbə çaldı olan müşkülə Şahin Fazil!*

*Şah damardır Arazım, düşməninə çövlan edir,*
*Salmayır ortalığa fasilə Şahin Fazil!*

*Vətənin qulluğuna el tanıyır qulluqçu,*
*Sözlərin düşdü qızıl sünbülə, Şahin Fazil!*

*Yol salıb Təbrizə gəlsən, kəsərəm qurbanı,*
*Çək dənizdən gəmimi sahilə, Şahin Fazil!*

*Atalıq haqqı varındır sanıram boynumda,*
*Ağır işlərdi salıb yüngülə Şahin Fazil!*

*Simdə mizrabını gəzdir, segahın səsləndir,*
*Şuru Şahnaz elə, sal Zabilə, Şahin Fazil!*

*Bir də gəl Təbrizə, Bağlar bağına sal mənzil,*
*Dər apar qırmızı salxım gilə, Şahin Fazil!*

*Duyğunun damcılarından çilə, könlüm dindir,*
*Sal işıq, çək kəpənək qəndilə, Şahin Fazil!*

*Açılıb duyğuların pəncərəsi Şirvandan,*
*Qartalı eylə qonaq əzgilə, Şahin Fazil!*

*AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun*
*"Tarixin nəzəriyyəsi, mənbəşünaslıq və tarixşünaslıq"*
*şöbəsinin müdiri, tarix elmləri doktoru, professor*
***Şahin Fazil oğlu Fərzəliyevin***
*nəşr olunmuş əsərlərinin*

# SİYAHISI

## – I –

## AZƏRBAYCAN DİLİNDƏ:
### *Kitablar*


1. Azərbaycan XV-XVI əsrlərdə (Həsən bəy Ruminin "Əhsənüt-təvarix" əsəri üzrə), Red.O.Əfəndiyev. Bakı, "Elm" 1983, 151 s.
2. Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə (Red. O.Əfəndiyev). I nəşr. Bakı, "Elm", 1995, 197 s.
3. Azərbaycan və Osmanlı imperiyası XV-XVI əsrlərdə (Red. O.Əfəndiyev). II nəşr. Bakı, "Elm", 1999, 241 s.
4. Quba tarixi (Red.V.Arzumanlı). I nəşr. Bakı: "Əbilov, Zeynalov və oğulları", 2001, 388 s.
5. XV əsr Azərbaycan dövlətlərinin quruluşu. Dərs vəsaiti, I nəşr (Red. Y.Mahmudov). Bakı "Elm və təhsil". 2003, 78 s.
6. XV əsr Azərbaycan dövlətlərinin quruluşu. Dərs vəsaiti, II nəşr (Red. Y.Mahmudov). Bakı: Elm-Təhsil nəşriyyatı, 2003, 118 s.
7. Quba tarixi. (Redaktorlar: Akademik Yaqub Mahmudov; tarix üzrə elmlər doktoru, prof. Tofiq Mustafazadə) II nəşr. TEAS Press Nəşriyyat evi, 2016, 700 s.


### *Tərcümə əsərləri*


8. Tiflisi Jozef.Vaqiati – Mir Veys və Şah Hüseyn, əlyazma nüsxəsi (Osmanlı dilindən tərc. və ön söz Ş.Fazil). Bakı, Azərnəşr, 1992, 56 s.
9. Kruşinski Y.T. Xristian səyyahın tarixi (Səfəvi dövlətlərinin tarixinə dair ilkin mənbə), (Fars dilindən tərc. və ön söz Ş.Fazil). Bakı, Azərnəşr, 1993, 103 s.
10. İsgəndər bəy Münşi Türkman. Dünyanı bəzəyən Abbasın tarixi. I kitab (Fars dilindən tərc. və ön söz Ş.Fazil). Bakı, "Şərq-Qərb", 2010, 1906 s.
11. İsgəndər bəy Münşi Türkman. Dünyanı bəzəyən Abbasın tarixi. II kitab (Fars dilindən tərc. və ön söz Ş.Fazil). Bakı, "Şərq-Qərb", 2014, 1109 s.
12. Həsən bəy Rumlu. "Əshənüt-təvarix" ("Tarixlərin ən yaxşısı"). I cild. (Fars dilindən tərc. və ön söz Ş.Fazil) - istehsalatdadır.
13. Həsən bəy Rumlu. "Əshənüt-təvarix" ("Tarixlərin ən yaxşısı"). II cild. (Fars dilindən tərc. və ön söz Ş.Fazil) - istehsalatdadır.


### *Məqalələr*


14. Həsən bəy Rumlu xətt və xəttatlar haqqında. ADU əsərləri, Şərqşünaslıq ser., 1971, № 2, s.45-53
15. Həsən bəy Rumlunun "Əhsənüt-təvarix" əsərinin tədqiq olunması tarixin-

